# صَحِيحُ مُسْلِمٍ

المسنَد الصَّحيح المختَصَر مِن السنَنِ بنقل العدل عن العدل عن رسول الله ﷺ

للإِمَام الحَافظ أَبِي الحسَين مُسلم بن الحَجَّاج بن مُسلم

الْقُشَيْرِيُّ النِّيسَابُورِي – رَحِمَهُ الله –

(٢٠٦-٢٦١ هـ)

المترجم إلى اللغة الأذرية/ علي خان موسابيف

المجلد الأول

قَالَ رَسُولُ اللَّهِ ﷺ:

﴿أَلا إِنِّي أُوتِيتُ الْقُرْآنَ وَمِثْلَهُ مَعَهُ﴾

**Peyğəmbər ﷺ buyurmuşdur:**

**﴾Bilin ki, mənə Quran və onun bənzəri verilmişdir﴿**

# Səhih Muslim

**v ə ş ə r h i**

**İmam Əbul-Huseyn**
**Muslim ibn Həccac ibn Muslim**
**əl-Quşeyri ən-Nisaburi**
**(206-261 h)**

**Ərəb dilindən tərcümə edən**
**Əlixan Musayev**

**1-ci cild**

**Redaksiya heyəti**

**Ə. Z. Musayev**
**M. N. Qarayev**
**A. X. Salehli**
**S. Z. Səfərbəyov**
**S. Q. Hacı**
**R. M. Ağayev**
**H. N. Mahmudov**
**G. İ. Musayeva**

**Kompüter tərtibatı**

**Ə. Z. Musayev**
**M. N. Qarayev**
**E. Q. Rüstəmov**

*Şübhəsiz ki, bu tərcümə insan əməyinin bəhrəsidir. Demək, burada xətaların olması da labüddür. Odur ki, öz düzəlişlərini, qeyd və mülahizələrini aşağıdakı elektron ünvana göndərəcək oxuculara əvvəlcədən təşəkkürümüzü bildiririk. Sizin dəyərli məsləhətləriniz bu kitabın gələcək nəşrlərində mütləq nəzərə alınacaqdır.*

**Burhan@feqih.com**

**Bu kitab Azərbaycan Respublikası Dini Qurumlarla İş üzrə Dövlət Komitəsinin razılığı ilə çap edilmişdir.**

**(DK-519/B 10.08.2010)**

بِسْمِ ٱللَّهِ ٱلرَّحْمَٰنِ ٱلرَّحِيمِ

## *Mərhəmətli və Rəhmli Allahın adı ilə!*

## *Müqəddimə*

Həqiqətən şükür və tərif yalnız Allaha məxsusdur! Biz Ona həmd edirik, Onu köməyə çağırırıq, Ondan bağışlanma və bizi doğru yola yönəltməyi diləyirik, nəfslərimizin şərindən və pis əməllərimizdən qorunmaq üçün yalnız Ona pənah aparırıq. Allah kimə hidayət verərsə o, doğru yolda olar, kimi azdırarsa onu doğru yola yönəldən tapılmaz. Mən şahidlik edirəm ki, Allahdan başqa ibadətə haqqı olan məbud yoxdur, Onun şəriki yoxdur və şahidlik edirəm ki, Muhəmməd Onun qulu və elçisidir.

﴿يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُوا۟ ٱتَّقُوا۟ ٱللَّهَ حَقَّ تُقَاتِهِۦ وَلَا تَمُوتُنَّ إِلَّا وَأَنتُم مُّسْلِمُونَ﴾

**“Ey iman gətirənlər! Allahdan Ona layiq olan tərzdə qorxun və ancaq müsəlman olduğunuz halda ölün!”**[1]

﴿يَٰٓأَيُّهَا ٱلنَّاسُ ٱتَّقُوا۟ رَبَّكُمُ ٱلَّذِى خَلَقَكُم مِّن نَّفْسٍ وَٰحِدَةٍ وَخَلَقَ مِنْهَا زَوْجَهَا وَبَثَّ مِنْهُمَا رِجَالًا كَثِيرًا وَنِسَآءً ۚ وَٱتَّقُوا۟ ٱللَّهَ ٱلَّذِى تَسَآءَلُونَ بِهِۦ وَٱلْأَرْحَامَ ۚ إِنَّ ٱللَّهَ كَانَ عَلَيْكُمْ رَقِيبًا﴾

**“Ey insanlar! Sizi tək bir candan xəlq edən, onun özündən zövcəsini yaradan və onlardan da bir çox kişi və qadın *törədib yer üzünə* yayan Rəbbinizdən qorxun! Adı ilə birbirinizdən *cürbəcür şeylər* istədiyiniz Allahdan və qohumluq əlaqələrini kəsməkdən çəkinin! Həqiqətən, Allah sizə nəzarət edir”.**[2]

﴿يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُوا۟ ٱتَّقُوا۟ ٱللَّهَ وَقُولُوا۟ قَوْلًا سَدِيدًا ﴿٧٠﴾ يُصْلِحْ لَكُمْ أَعْمَٰلَكُمْ وَيَغْفِرْ لَكُمْ ذُنُوبَكُمْ ۗ وَمَن يُطِعِ ٱللَّهَ وَرَسُولَهُۥ فَقَدْ فَازَ فَوْزًا عَظِيمًا ﴿٧١﴾﴾

**“Ey iman gətirənlər! Allahdan qorxun və doğru söz danışın ki, O, əməllərinizi islah etsin və günahlarınızı bağışlasın. Kim Allaha və Onun Elçisinə itaət etsə, böyük bir uğur qazanar”.**[3]

---

[1] “Ali-İmran” surəsi, 102.

[2] “ən-Nisa” surəsi, 1.

[3] “əl-Əhzab” surəsi, 70-71.

Bizi müsəlman kimi yaradan, düz yola yönəldərək hidayət verən, aləmlərin Rəbbi, haqq-hesab gününün Hökmdarı olan Allaha şükürlər və həmdsənalar olsun!

Müsəlmanların öz dinlərinə qayıdışı sevindirici hal olmaqla yanaşı çox ciddi və məsuliyyətlidir. İslam dininə elmi cəhətdən yiyələnmək məhz onun əsl qaynaqlarından olan Qurani Kərim və Sünnəni (Muhəmməd peyğəmbərin ﷺ dedikləri, əməlləri və təsdiq etdikləri) tam təfsilatı ilə öyrənildikdə mümkündür. Dini bilgilərdən məhrum olmuş bir nəsildən sonra indi bu elmə nail olmaq üçün gözəl fürsət yaranmış və son zamanlar Qurani Kərimin mənaca tərcüməsi, Səhih Buxari və İslam dininə aid digər elmi kitablar buna sübutdur. Belə olduğu halda, yəni İslamın təməlini olduğu kimi öyrənməklə müsəlman qardaşlarımız bütün batil inanclardan, təhlükəli yollardan, bidətlərdən (dinə əlavə olunmuş yeniliklərdən), təfriqələrdən, cəhalətdən qorunmuş olur. Sünnənin əsasını Muhəmməd peyğəmbərin ﷺ hədisləri, xüsusən də səhih hədisləri təşkil edir. Səhih hədislərin toplusu sahəsində "Səhih Muslim" kitabı xüsusi əhəmiyyət kəsb edərək, dəyərli və fundamental sayılan ən önəmli yerlərdən birini tutur. Bu kitabda toplanmış səhih hədislər İslamın təməli sayılan – Muhəmməd peyğəmbərə ﷺ itaətin hansı qaydada və həmçinin vacibliyini bizlərə göstərir. Allahın Kitabı Qurani Kərimdən sonra yer üzərində ən səhih və etibarlı kitablar "Səhih Buxari" və "Səhih Muslim" sayılmaqdadır.

Allah Qurani Kərimdə möminlərə və bütün insanlara daima dəlillərə əsaslanmağı əmr edir:

﴿قُلۡ هَلۡ مِن شُرَكَآئِكُم مَّن يَبۡدَؤُاْ ٱلۡخَلۡقَ ثُمَّ يُعِيدُهُۥۚ قُلِ ٱللَّهُ يَبۡدَؤُاْ ٱلۡخَلۡقَ ثُمَّ يُعِيدُهُۥۖ فَأَنَّىٰ تُؤۡفَكُونَ ٣٤ قُلۡ هَلۡ مِن شُرَكَآئِكُم مَّن يَهۡدِيٓ إِلَى ٱلۡحَقِّۚ قُلِ ٱللَّهُ يَهۡدِي لِلۡحَقِّۗ أَفَمَن يَهۡدِيٓ إِلَى ٱلۡحَقِّ أَحَقُّ أَن يُتَّبَعَ أَمَّن لَّا يَهِدِّيٓ إِلَّآ أَن يُهۡدَىٰۖ فَمَا لَكُمۡ كَيۡفَ تَحۡكُمُونَ ٣٥﴾

**"De: "*Allaha* qoşduğunuz şəriklərdən eləsi varmı ki, *hər hansı bir* məxluqu ilk dəfə yaratsın, *öldükdən* sonra onu *əvvəlki halına* qaytarsın?" De: "Məxluqu ilk dəfə Allah yaradır, *öldükdən* sonra onu *əvvəlki halına* qaytarır. Siz necə də *haqdan* döndərilirsiniz! De: "*Allaha* qoşduğunuz şəriklər arasında haqqa yönəldən bir kimsə varmı?" De: "Allah *Öz qullarını* haqqa yönəldir. Elə isə *deyin görək* haqqa yönəldən kəs arxasınca gedilməyə daha**

**çox layiqdir, yoxsa özünə doğru yol göstərilməyincə onu tapa bilməyən kəs? Sizə nə olub? Necə mühakimə edirsiniz?”[1]**

Həmçinin buyurur:

﴿ أَفَمَن كَانَ عَلَىٰ بَيِّنَةٍ مِّن رَّبِّهِۦ كَمَن زُيِّنَ لَهُۥ سُوٓءُ عَمَلِهِۦ وَٱتَّبَعُوٓاْ أَهْوَآءَهُم ﴿١٤﴾ ﴾

**“Məgər öz Rəbbindən *vəhy edilmiş* aydın dəlilə istinad edən kimsə pis əməli özünə gözəl göstərilən və öz nəfslərinə uyan kimsələr kimi ola bilərmi?!”[2]**

İnsanlığın dünya və Axirət həyatı üçün lazım olan ən vacib dəlillər Allah Kəlamı olan Qurani Kərim və peyğəmbərin səhih hədisləridir. İlk dövrlərdə olan müsəlmanlar yekdilliklə Peyğəmbərin ﷺ sünnəsini islam şəriətinin bütün sahələrində Qurandan sonra ikinci olaraq tanımış və qəbul etmişlər. Onlar sünnəni istər etiqadi, istər əməli, əxlaqi və digər məsələlərdə özlərinə örnək tutmuşlar. Rəy, ictihad və ya müqayisə ilə sünnəyə qarşı çıxmağı və ona müxalif olmağı isə haram hesab etmişlər. İmam Şafii رحمه الله "Risalə" kitabında bu barədə demişdir: "Hədis olan yerdə müqayisə etmək olmaz", "Hədis olan yerdə nəzəriyyə batildir", "Quran və sünnə olan yerdə ictihad edilməz" və sairəni indiki mötəbər alimlər də qeyd edirlər. Peyğəmbər ﷺ yalnız Allahdan nazil olan ayələri insanlara çatdırmaqla kifayətlənmirdi. O, həmçinin bu ayələri izah edir və onları özündə tətbiq edərək bizlərə nümunə olmuşdur. Bu səbəbdən də Peyğəmbər ﷺ canlı Quran adlandırılmışdır. Onu da qeyd etmək lazımdır ki, Peyğəmbərin ﷺ sözləri öz nəfsi ilə deyil, yalnız Allahdandır. Bu xüsusda Uca Allah Qurani Kərimdə buyurur:

﴿ وَمَا يَنطِقُ عَنِ ٱلْهَوَىٰٓ ﴿٣﴾ إِنْ هُوَ إِلَّا وَحْىٌ يُوحَىٰ ﴿٤﴾ ﴾

**“O, öz istəyi ilə danışmır. Bu, ona təlqin edilən bir vəhydir”[3].**

Peyğəmbər ﷺ demişdir:” Mənə Kitab və Onun bənzəri verilmişdir”.[4]

Göründüyü kimi Peyğəmbərə ﷺ itaət edib onun sünnəsinə riayət etmək bizə əmr edilmişdir. Hədis elminin vacibliyi də buradan meydana gəlir.

---

[1] “Yunus” surəsi, 34-35.

[2] “Muhəmməd” surəsi, 14.

[3] “ən-Nəcm” surəsi, 3-4.

[4] “Sunən Əbu Davud” 4604.

Hədis sözü lüğəti mənada yeni, həmçinin, xəbər vermək mənalarında da istifadə edilir. İstilahi mənada isə bu, söz, əməl, əxlaq və fitrətilə Peyğəmbərə ﷺ aid edilən hər bir şey nəzərdə tutulur. Hədislə yanaşı bu anlamda sünnə termini də geniş istifadə edilməkdədir. Sünnə lüğəti mənada yol deməkdir.

Hədis ilk növbədə iki hissədən ibarətdir: Sənəd (isnad) və mətn.

İsnad lüğətdə mənbə, dəlil-sübut, dayaq mənaları ifadə edir. İstilahda isə bu kəlmənin iki mənası var:

– Hədisi istinad edərək rəvayət edənə aid etmək;

– Hədisin mətninə gətirib çıxaran ravilərin silsiləsi. Bu mənada o "sənəd"in sinonimi hesab olunur.

Mətn isə rəvayət olunan hədisin sözləridir. Etibarlıq dərəcəsinə görə hədislər üç yerə bölünür: Səhih, Həsən və Zəif. **Səhih** kəlməsi lüğəti mənada sağlam, möhkəm və s. mənaları ifadə edir. İstilahi mənada isə səhih hədis, isnadının əvvəlindən axırına qədər dəqiq olan insaflı və ədalətli ravinin aramsız, sapdırmadan (şazz olmadan) və qüsursuz (müəlləl) olmayaraq özü kimisindən xəbər verdiyi hədisdir. Bu tərifi beş hissəyə bölüb şərh etmək olar:

1. İsnadın aramsız olması: yəni isnadın əvvəlindən axıra qədər hədisin ravilərindən hər biri onu özündən əvvəlki ravidən bilavasitə götürmüş (eşitmiş) olsun.
2. Ravinin insaflı, ədalətli olması: yəni hədisin ravilərindən hər biri müəyyən dəyərlərə malik olmalıdır. Belə ki, o müsəlman, həddi-buluğa çatmış, şüurlu olmalı, fasiq və əxlaqsız olmamalıdır.
3. Ravinin dəqiq olması: yəni hədisin ravilərindən hər biri tam dəqiq olmalıdır. Belə ki, onun ya yaddaşı möhkəm olmalı, ya da yazdıqlarını qorumaqla dəqiq olmalıdır.
4. Şazz olmaması: Hədis şazz olmamalıdır. Belə ki, rəvayəti "məqbul" ("səhih" və ya " həsən") sayılan ravinin özündən də nüfuzlu raviyə müxalif olması şazz adlanır.
5. Müəlləl olmaması: Hədisdə (sənəddə və ya mətndə) "illət" olmamalıdır. "İllət" hədisin mötəbər olmasında naqislik əmələ gətirən gizli, anlaşılmaz səbəbdir.

**Həsən** - bu kəlmə lüğətdə yaxşı, çox gözəl və s. mənaları ifadə edir. İstilahi mənada isə İbn Həcərin tərifinə əsaslanıb belə demək olar: " Həsən hədis, is-

nadının əvvəlindən axırına qədər (mühafizə və ya yazdıqlarını qorumaq baxımından) dəqiqliyi az olan insaflı, ədalətli ravinin aramsız, sapdırmadan (şazz olmadan) və qüsursuz (müəlləl) olaraq özü kimisindən xəbər verdiyi hədisdir.

**Zəif** - bu kəlmə lüğətdə zəif, gücsüz, qeyri-qənaətbəxş və s. mənaları ifadə edir. İstilahi mənada isə - nəql etdiyi hədisə etimad olunmayan, etibarsız raviyə “ daif” – deyilir. Hədis alimləri hədisə “ daif” dedikdə, həsən hədisdən aşağı dərəcədə yerləşən, yaxud özündə həsən hədisin vəsfini cəm etməyən, hər hansı şərtlərdən biri olmayan hədisi qəsd edirlər.

Peyğəmbərimiz ﷺ hədislərin möminlər tərəfindən əzbərlənib gələcək nəsillərə təbliğ edilməsini əmr etmişdir. Peyğəmbər ﷺ ilk illərdə hədislərin yazılmasını qadağan etmiş, lakin onları bir birinə nəql etməyi tövsiyə etmişdir. Qadağanın səbəbi həmin dövrdə yazılan ayələrlə qarışıb səhv düşməsi, yazıb oxumağı bilən səhabələrin az sayda olması ilə izah oluna bilər. Sonralar Peyğəmbərimiz ﷺ gadağaya səbəb olan amillər aradan qalxdıqda hədislərin yazılmasına icazə vermişdir. Belə ki, hədisləri yazan təxminən 30-40 səhabədən olan Abdullah ibn Amr ibn As ؓ 1000-dən çox hədisi bir yerə yazaraq “əs-Səhifətu əs-Sadiqa” adlandırmışdır. Bundan başqa Abu Hureyrənin ؓ “Sahifətu Səhihə”, Əli ibn Abutalibin ؓ “Səhifə”sini, Cabir ibn Abdullahın ؓ “Səhifə”sini, Ənəs ibn Malikin ؓ “Səhifə”sini, Abdullah ibn Abbasın رضي الله عنهما “Səhifə”lərini və Səmurə ibn Cundəbin ؓ “Sahifə”sini qeyd etmək olar.

Peyğəmbərdən ﷺ ən çox hədis rəvayət edən yeddi səhabə bunlardır:

1. Əbu Hureyrə ؓ – 5374 hədis
2. Abdullah ibn Ömər رضي الله عنهما – 2630 hədis
3. Ənəs ibn Malik ؓ – 2286 hədis
4. Aişə رضي الله عنها – 2210 hədis
5. Abdullah ibn Abbas رضي الله عنهما – 1660 hədis
6. Cabir ibn Abdullah ؓ – 1540 hədis
7. Əbu Səid əl-Xudri ؓ – 1170 hədis

Hədis tarixinin ikinci əhəmiyyətli dövrü “Tədvin əs-Sunnə” adlanır. Bu işin başlanğıcı əsasən hicrətin ikinci əsrinə aiddir. Tədvin lüğəti mənada cəm edib kitab halına gətirmək deməkdir. Xüsusən də bu iş İslam dövlətinin bilavasitə dəstəyi ilə həyata keçirilmişdir. İlk növbədə İslamda öz elmi, əxlaqı və

ədaləti ilə məşhur xəlifə Ömər ibn Abdulaziz Sünnəni yaşadıb gələcək nəsillərə ötürməyi və həmçinin bu yolda təhlükəli amilləri aradan qaldırmaq məqsədi ilə alimləri hədisləri toplayaraq bir kitab şəklində tərtib etməyə sövq edir. Həmçinin xəlifə olaraq valilələrə bu işi yüksək səviyyədə aparmaq üçün müvafiq əmrlər verir. Bu xüsusda maraq doğuran onun Mədinə valisi Əbu Bəkir ibn Həzmə göndərdiyi məktubdur. Məktubda deyilir: "Şəhərində Peyğəmbərlə ﷺ bağlı rəvayətləri araşdır, topla və yaz. Mən hədislərin yox olmasından və alimlərin tükənməsindən qorxuram. Bu işi yerinə yetirərkən yalnız Peyğəmbərin ﷺ sünnəsi qəbul edilsin. Alimlər məscid kimi hər kəsə açıq və məlum olan yerlərdə oturaraq elmi insanlara yaysınlar, bilməyənlərə tədris etsinlər. Belə ki, elm gizli qalmadıqca yox olmaz". Təbii ki, xəlifənin hədislərin qorunmasına, sünnənin yayılmasına belə diqqət yetirməsi bu sahənin daha da inkişaf edərək hədis tarixində "Təsnif əs-Sunnə", "İfrad əs-Sunnə" və s. elmlərinin yaranmasına zəmin olmuşdur.

Peyğəmbərdən ﷺ rəvayət olunan hədislərin özlərində sünnənin öyrənilib təbliğ olunması açıq aşkar görünməkdədir. Abdullah ibn Məsud ﷠ demişdir: "Şübhəsiz ki, sözlərin ən gözəli Allahın Kitabı, yolların ən gözəli isə Muhammədin ﷺ yoludur".

Peyğəmbərdən ﷺ mütəvatir gələn hədislərdən başa düşüldüyünə görə o, xütbələrində səhabələrinə hədisi eşidib (öyrəndikdən) sonra onu eşitməyənlərə təbliğ etmələrini və yenə onlara bir çox təbliğ edilən var ki, dinləyənlərdən daha qavrayandır ("Ola bilər ki, təbliğ edilən kimsə eşidərək təbliğ edən kimsədən daha yaxşı qavrayar") buyurduğu başa düşülür. Bu tövsiyələrdən biri də Buxari və Muslimdə olan hədisdir: Peyğəmbər ﷺ Vida həccində Ərafatda olarkən müsəlmanlara xitabən buyurmuşdur: "Qoy burada olanlar (eşitdiklərini) aramızda olmayanlara təbliğ etsinlər. Ola bilsin ki, burada olan kəs (bunu) daha yaxşı qavrayan bir kimsəyə çatdırsın"[1]. Əgər Sünnə əməl edənə və təbliğ edilənə dəlil olmasaydı və əgər Sünnə Qiyamət gününə qədər qalmasaydı Peyğəmbər ﷺ onu başqasına təbliğ etməyi səhabələrinə əmr etməzdi. Bununla da başa düşülür ki, Sünnə onu Peyğəmbərin ﷺ ağzından eşidən və özünə səhih sənədlə təbliğ edilən hər kəs üçün dəlil hesab edilir. Peyğəmbərin ﷺ səhabələri onun əməli və qövli sünnələrini əzbərləyib tətbiq edərək, ta-

[1] "Səhih əl-Buxari" 67.

biinə, tabiin də onlardan sonra gələnlərə təbliğ etmişlər. Beləliklə də güvənilən alimlər onu nəsildən-nəsillərə, əsirdən-əsirlərə ötürmüşlər.

Peyğəmbər ﷺ demişdir: " Mənim sözümü eşidib əzbərləyənin, sonra eşitdiyi kimi əməl edənin Allah üzünü ağ etsin!"

Abu Hureyrə  rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "İslam (dini) qərib olaraq başlamış və yenə başlanğıcda olduğu kimi qəribliyə qayıdacaqdır. (O dövrdə yaşayacaq) qəriblərin xoş halına!" Peyğəmbərdən ﷺ soruşdular: "Ya Rasulullah! Bu qəriblər kimlərdir?" Peyğəmbər dedi:" Məndən sonra mənim sünnəmi yaşadanlar və onu Allahın qullarına öyrədənlərdir".

Digər bir hədisdə Peyğəmbər ﷺ buyurmuşdur: "Ümmətimdən hər kəs Cənnətə daxil olacaq. Yalnız (bundan) imtina edən kimsələrdən başqa." (Səhabələr təəccüblə) soruşdular: "Ya Rəsulullah, kim imtina edəcək?!" Peyğəmbər ﷺ buyurdu: "Mənə itaət edən kimsə Cənnətə girər, mənə asi olan kimsə isə imtina etmiş olar"[1].

Peyğəmbər ﷺ həmçinin demişdir: "Hər kim bilərəkdən mənim adımdan yalan danışarsa, atəşdən olan yerini hazırlasın".

Buna baxmayaraq yalançı, uydurma hədislər meydana gəlmiş və bu hərakat səhabələrdən sonrakı dövrlərə təsadüf etmişdir. Uydurma hədislərin yaranma səbəblərindən alimlər aşağıdakıları qeyd edirlər:

1. Firqə, məzhəb və qəbilə təəssübkeşliyi;
2. İslam dinini sarsıtmaq arzusu;
3. Rəhbərlərə yaltaqlanmaq və onlara xoş görünmək həvəsi;
4. Maddi qazanc istəyi;
5. Öz zənninə görə Allahdan savab qazanmaq düşüncəsi;
6. Öz dövründə məşhur olmaq arzusu.

Bu mənada milyonlarla hədislərdən yalnız səhih olanları seçib bir kitab halına salaraq min ildən çox keçməsinə baxmayaraq bizləri bu gün də faydalandiran, həyatımızı Peyğəmbərin ﷺ sünnəsinə uyğun qurmağa kömək edən, Peyğəmbərin ﷺ etmədiyi, bidət və yanlışlardan bizi uzaq edən imam Buxari və imam Muslim İslam ümmətinə dəyərli töhfə vermişlər. Sünnəni təhrifçilərin təhrifindən, cahillərin təvilindən qorumaq üçün, şübhələri dəf edə biləcək alimləri ona mühafizəçi etmişdir. Cahillər, yadlar və dinsizlər uydurma sözlərlə Sün-

[1] "Səhih əl-Buxari" 7280.

nəyə hücum etdikcə o alimlər onu pərvanə kimi qoruyarlar. Çünki Allah bu Sünnəni Uca kitabının təfsiri və hökümlərinin açıqlayanı etmiş və Qurani Kərimdə açıq şəkildə zikr etmədiyi bəzi hökümləri Sünnə ilə bildirmişdir.

Həqiqətən də Peyğəmbərə ﷺ itaət etmək müsəlmanın həyatında müstəsna əhəmiyyətə malikdir.

Allah onu vəhy nazil etməklə şərəfləndirdiyini Quranda belə buyurur:

﴿وَكَذَٰلِكَ أَوۡحَيۡنَآ إِلَيۡكَ رُوحٗا مِّنۡ أَمۡرِنَاۚ مَا كُنتَ تَدۡرِي مَا ٱلۡكِتَٰبُ وَلَا ٱلۡإِيمَٰنُ وَلَٰكِن جَعَلۡنَٰهُ نُورٗا نَّهۡدِي بِهِۦ مَن نَّشَآءُ مِنۡ
عِبَادِنَاۚ وَإِنَّكَ لَتَهۡدِيٓ إِلَىٰ صِرَٰطٖ مُّسۡتَقِيمٖ ٥٢﴾

“**Biz sənə Öz əmrimizdən olan Ruhu** (Quranı) **vəhy etdik. Sən kitab nədir, iman nədir bilmirdin. Lakin Biz onu, qullarımızdan istədiyimizi doğru yola yönəltmək üçün, bir nur etdik. Həqiqətən, sən** *onları* **doğru yola yönəldirsən**”[1].

Biz peyğəmbərin qərarlarını öz qərarlarımızdan üstün tutmalı, onu bütün işlərimizdə özümüzə nümunə qəbul etməli, özümüzü ona təslim etməliyik.

Bu xüsusda Uca Allah buyurur:

﴿فَلَا وَرَبِّكَ لَا يُؤۡمِنُونَ حَتَّىٰ يُحَكِّمُوكَ فِيمَا شَجَرَ بَيۡنَهُمۡ ثُمَّ لَا يَجِدُواْ فِيٓ أَنفُسِهِمۡ حَرَجٗا مِّمَّا قَضَيۡتَ
وَيُسَلِّمُواْ تَسۡلِيمٗا ٦٥﴾

**“Xeyr! Sənin Rəbbinə and olsun ki, onlar öz aralarında baş verən çəkişmələrdə səni hakim hesab etməyincə, sonra da verdiyin hökmlərə görə özlərində bir sıxıntı duymadan tam təslim olmayınca iman gətirmiş olmazlar”[2].**

﴿وَمَا كَانَ لِمُؤۡمِنٖ وَلَا مُؤۡمِنَةٍ إِذَا قَضَى ٱللَّهُ وَرَسُولُهُۥٓ أَمۡرًا أَن يَكُونَ لَهُمُ ٱلۡخِيَرَةُ مِنۡ أَمۡرِهِمۡۗ وَمَن يَعۡصِ ٱللَّهَ وَرَسُولَهُۥ فَقَدۡ
ضَلَّ ضَلَٰلٗا مُّبِينٗا ٣٦﴾

**“Allah və Onun Elçisi bir işə hökm verdiyi zaman heç bir mömin kişi və mömin qadın öz işlərində istədikləri qərarı verə bilməzlər. Allaha və Onun Elçisinə asi olan kəs, əlbəttə ki, açıq-aydın azğınlığa düşmüşdür”[3].**

---

[1] “əş-Şura” surəsi, 52.
[2] “ən-Nisa” surəsi, 65.
[3] “əl-Əhzab” surəsi, 36.

Nə üçün? Çünki Uca Allah Peyğəmbəri ﷺ bizim üçün Allaha yaxınlaşmaq və ibadət etmək üçün nümunə etmişdir. Allah buyurur:

﴿لَّقَدۡ كَانَ لَكُمۡ فِي رَسُولِ ٱللَّهِ أُسۡوَةٌ حَسَنَةٞ لِّمَن كَانَ يَرۡجُواْ ٱللَّهَ وَٱلۡيَوۡمَ ٱلۡأٓخِرَ وَذَكَرَ ٱللَّهَ كَثِيرٗا ٢١﴾

**“Allahın Elçisi sizlərə – Allaha və Axirət gününə ümidini bağlayanlara və Allahı çox zikr edənlərə gözəl nümunədir”[1].**

Bu ayə Allahın elçisinin sözlərindən, əməllərindən nümunə götürməyin vacib olduğunu sübut etmək üçün böyük bir əsasdır. Peyğəmbərdən ﷺ nümunə götürmək onun hərəkətlərini onun özünün etdiyi kimi etmək deməkdir. Şəhadət kəlməsinin “Muhəmmədən rasulullah” (Muhəmməd Allahın elçisidir) hissəsinin mənası da elə budur. Müsəlman buna əməl etmədən müsəlman ola bilməz. Bu elə bir meyardır ki, insanların hərəkətləri, sözləri, əqidələri və başqa işləri onunla ölçülməlidir. Peyğəmbərdən ﷺ nümunə götürmək bütün din işlərində onun göstərdiyi doğru yolu, onun özünün həyat yolunu, hədislərini öyrənib onlara əməl etməyə əsaslanır. Buna görə də Uca Allah ona dayaq olmağı və onun böyüklüyünü, hörmətini saxlamağı bizə fərz buyuraraq deyir:

﴿إِنَّآ أَرۡسَلۡنَٰكَ شَٰهِدٗا وَمُبَشِّرٗا وَنَذِيرٗا ٨ لِّتُؤۡمِنُواْ بِٱللَّهِ وَرَسُولِهِۦ وَتُعَزِّرُوهُ وَتُوَقِّرُوهُ وَتُسَبِّحُوهُ بُكۡرَةٗ وَأَصِيلًا ٩﴾

**“Həqiqətən, Biz səni şahid, müjdəçi və xəbərdarlıq edən *elçi* kimi göndərmişik. *Biz belə etdik* ki, siz Allaha və Onun Elçisinə iman gətirəsiniz, ona kömək edəsiniz, onun hörmətini saxlayasınız və gecə-gündüz *Allahı* tərifləyəsiniz”[2].**

Biz bir şey haqqında ixtilaf edərək müxtəlif fikirlərdə olsaq, bu barədə hökm vermək üçün Peyğəmbərə ﷺ müraciət etməliyik.

Bu xüsusda Uca Allah buyurur:

﴿يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُوٓاْ أَطِيعُواْ ٱللَّهَ وَأَطِيعُواْ ٱلرَّسُولَ وَأُوْلِي ٱلۡأَمۡرِ مِنكُمۡۖ فَإِن تَنَٰزَعۡتُمۡ فِي شَيۡءٖ فَرُدُّوهُ إِلَى ٱللَّهِ وَٱلرَّسُولِ إِن كُنتُمۡ تُؤۡمِنُونَ بِٱللَّهِ وَٱلۡيَوۡمِ ٱلۡأٓخِرِۚ ذَٰلِكَ خَيۡرٞ وَأَحۡسَنُ تَأۡوِيلًا ٥٩﴾

---

[1] “əl-Əhzab” surəsi, 21.

[2] “əl-Fəth” surəsi, 8.

**“Ey iman gətirənlər! Allaha və Elçisinə itaət edin, həm də özünüzdən olan rəhbərlərə *şəriətə uyğun şəkildə itaət edin*. Əgər bir şey haqqında mübahisə etsəniz, Allaha və Axirət gününə inanırsınızsa, Allaha və *Onun* Elçisinə müraciət edin. Bu, *sizin üçün* daha xeyirli və nəticə etibarilə daha yaxşıdır”**[1].

Siz ayədə olan ifadələrə fikir verin: “Allaha itaət edin” - Onun Kitabında olanlara riayət edin, “Allahın elçisinə itaət edin” - onun Sünnəsini özünüzə nümunə götürün deməkdir.

Allaha məhəbbət isə yalnız Peyğəmbərə ﷺ itaətlə mümkündür. Belə ki, Allah buyurur:

﴿قُلۡ إِن كُنتُمۡ تُحِبُّونَ ٱللَّهَ فَٱتَّبِعُونِي يُحۡبِبۡكُمُ ٱللَّهُ وَيَغۡفِرۡ لَكُمۡ ذُنُوبَكُمۡۚ وَٱللَّهُ غَفُورٞ رَّحِيمٞ ٣١﴾

**“De: “Əgər siz Allahı sevirsinizsə, mənim ardımca gəlin ki, Allah da sizi sevsin və günahlarınızı bağışlasın. Allah Bağışlayandır, Rəhmlidir”[2].**

Ey müsəlman bəndə! Sənin Allaha olan məhəbbətin Peyğəmbərin ﷺ sözlərinə və əməllərinə bağlılığının dərəcəsi ilə ölçülür. O isə Allaha hamıdan çox ibadət edən, Allahdan ən çox qorxan, Allahı ən yaxşı tanıyan insandır. Cənnətə gedən yol onun yoludur. Allah Öz elçisinin r yoluna uyğun gəlməyən heç bir əməli qəbul etməz. Bu xüsusda Allah buyurur:

﴿مَّآ أَفَآءَ ٱللَّهُ عَلَىٰ رَسُولِهِۦ مِنۡ أَهۡلِ ٱلۡقُرَىٰ فَلِلَّهِ وَلِلرَّسُولِ وَلِذِي ٱلۡقُرۡبَىٰ وَٱلۡيَتَٰمَىٰ وَٱلۡمَسَٰكِينِ وَٱبۡنِ ٱلسَّبِيلِ كَيۡ لَا يَكُونَ دُولَةَۢ بَيۡنَ
ٱلۡأَغۡنِيَآءِ مِنكُمۡۚ وَمَآ ءَاتَىٰكُمُ ٱلرَّسُولُ فَخُذُوهُ وَمَا نَهَىٰكُمۡ عَنۡهُ فَٱنتَهُواْۚ وَٱتَّقُواْ ٱللَّهَۖ إِنَّ ٱللَّهَ شَدِيدُ ٱلۡعِقَابِ﴾

**“Allahın Öz Peyğəmbərinə kəndlərin əhalisindən verdiyi qənimətlər Allaha, Peyğəmbərə, qohum-əqrəbaya, yetimlərə, yoxsullara və müsafirlərə məxsus edilmişdir ki, o, aranızdakı zənginlərin var-dövləti olub qalmasın. Peyğəmbər sizə nə verirsə, onu götürün, nəyi də qadağan edirsə, ondan çəkinin. Allahdan qorxun. Həqiqətən, Allah şiddətli cəza verəndir”[3].**

﴿لَّا تَجۡعَلُواْ دُعَآءَ ٱلرَّسُولِ بَيۡنَكُمۡ كَدُعَآءِ بَعۡضِكُم بَعۡضٗاۚ قَدۡ يَعۡلَمُ ٱللَّهُ ٱلَّذِينَ يَتَسَلَّلُونَ مِنكُمۡ لِوَاذٗاۚ
فَلۡيَحۡذَرِ ٱلَّذِينَ يُخَالِفُونَ عَنۡ أَمۡرِهِۦٓ أَن تُصِيبَهُمۡ فِتۡنَةٌ أَوۡ يُصِيبَهُمۡ عَذَابٌ أَلِيمٌ ٦٣﴾

---

[1] “ən-Nisa” surəsi, 59.
[2] “Ali-İmran” surəsi, 31.
[3] “əl-Həşr” surəsi, 7.

**“Peyğəmbəri, öz aranızda bir-birinizi çağırdığınız kimi çağırmayın. Allah sizin aranızdan daldalanaraq xəlvətcə çıxıb gedənləri bilir. Qoy onun əmrinə qarşı çıxanlar başlarına bir bəla gəlməsindən, yaxud özlərinə ağrılı-acılı bir əzab üz verməsindən qorxsunlar”[1].**

Bu ayənin təfsirində İbn Kəsir buyurur: “Yəni Peyğəmbərin ﷺ əmrinə müxalif olmaqdan həzər edin. Onun əmri, onun yolu, Sünnəsi və şəriətidir. Sözlər və əməllər onun söz və əməlləriylə ölçülür (dəyər qazanır). Söz və əməlinə uyğun söylənən sözlər, edilən əməllər, Allahın dinində qəbul edilir. Peyğəmbərin ﷺ söz və əməllərinə zidd olan sözlər və əməllər kimdən gəlirsə gəlsin, kim tərəfindən işlənirsə işlənsin sahibinə rədd edilir”.

Peyğəmbrin ﷺ hədisləri Allahın əmrlərini bizə izah edir,bütün incəlikləri ilə ibadətlər bizə göstərilir. Peyğəmbərin ﷺ hədisləri – Qurani Kərimin təfsiridir. Çünki Qurani Kərimin ilk müfəssiri (yəni təfsir edəni) və Quranda mucməl (təfsilatsız) olaraq ifadə olunan hökümlərin söz, əməl və görüb qadağan etmədiyi Sünnəsi ilə açıqlayan məhz Peyğəmbərimiz ﷺ olmuşdur. Sünnə olmasaydı, müsəlmanlar namazın rükət sayını, qılınma şəkilini, onu qılarkən vacib olan şərtlərini bilməzdilər. Yenə Sünnə olmasaydı oruc, zəkat, həcc, cihad, yaxşılığı əmr edib, qadağalardan çəkinmək xüsusunda olan hökmləri müsəlmanlar təfsilatı ilə öyrənə bilməzdilər. Yenə hədis (Sünnə) olmasaydı, müsəlmanların müamilələri, haramlar, Allahın qadağa və cəzalarla bağlı qoyduğu hökmləri açıq olaraq bilmələri mümkün olmazdı. Uca Allah buyurur:

﴿وَمَآ أَرۡسَلۡنَا مِن قَبۡلِكَ إِلَّا رِجَالٗا نُّوحِيٓ إِلَيۡهِمۡۚ فَسۡـَٔلُوٓاْ أَهۡلَ ٱلذِّكۡرِ إِن كُنتُمۡ لَا تَعۡلَمُونَ ٤٣ بِٱلۡبَيِّنَٰتِ وَٱلزُّبُرِۗ
وَأَنزَلۡنَآ إِلَيۡكَ ٱلذِّكۡرَ لِتُبَيِّنَ لِلنَّاسِ مَا نُزِّلَ إِلَيۡهِمۡ وَلَعَلَّهُمۡ يَتَفَكَّرُونَ ٤٤﴾

**“Biz səndən əvvəl də, özlərinə vəhy etdiyimiz məhz kişiləri *elçi* göndərmişdik. Əgər bilmirsinizsə, Zikr əhlindən soruşun. *Biz onları* aydın dəlillər və kitablarla *göndərdik*. Sənə də Zikri nazil etdik ki, insanlara, onlara nazil olanı izah edəsən və bəlkə onlar fikirləşələr”[2].**

Səhabə, tabiin və onlardan sonra gələn elm əhlinin Peyğəmbərin ﷺ Sünnəsinə önəm vermək, onunla əməl etməyin vacibliyi və ona zidd hərəkət etməyin təhlükəli olduğuna dair sözləri çoxdur.

---

[1] “ən-Nur” surəsi, 63.
[2] “ən-Nəhl” surəsi, 43-44.

İmam Sovri ﵀ demişdir: "Elmin tamamı hədis elmidir". İmam Əbu Hənifə ﵀ demişdir: "Peyğəmbərdən ﷺ gələn hədisin başımız və gözümüz üstə yeri vardır". İmam Malik ﵀ demişdir: "Bizim içtihadlarımız kimsə tərəfindən rədd edilə də bilər, qəbul edilə də bilər". Sonra o, Peyğəmbərin ﷺ qəbrinə işarə edərək: "Yalnız bu qəbrin sahibinin dedikləri müstəsnadır"– dedi. İmam Şafii ﵀ demişdir: "Mənə Peyğəmbərdən səhih bir hədis rəvayət edildiyi halda onunla əməl etməsəm ağlımın getdiyini xəbər verin". Yenə o demişdir: "Mənim söylədiyim bir söz Allahın Rəsulundan ﷺ gələn bir hədisə zidd olarsa, mənim sözümü divara çırpın". İmam Əhməd ﵀ tələblərindən birinə belə demişdir: "Məni, Maliki, Şafiini, Əvzaini, Sovrini təqlid etmə. Sən də onların elm aldığı qaynaqlardan elm al". Yenə o demişdir: "Mən, sənədini və Allahın Rəsulundan ﷺ gələn hədisin səhihliyini bildikləri halda Sufyanın sözünə uyanlara məətəl qalıram".

Bütün bunlar bir daha sübut edir ki, həqiqi İslamı yaşamaq – Allahın Kitabı olan Qurani Kərimə və Peyğəmbərin ﷺ sünnəsinə, yəni səhih hədislərə tabe olmaqdır. Qeyd etdiyimiz kimi, səhih hədislərin toplandığı kitablar arasında "Səhih Muslim" kitabı ən önəmli yerlərdən birini tutur.

İmam Muslimin bu əsəri, heç bir əksiltməyə və artırmaya yol verilmədən, olduğu kimi tərcümə edilmişdir. Yalnız hədislərin isnadlarından başqa. Belə ki, isnadlarda olan ravilər silsiləsi, hər bir hədisin əvvəlində gələn nöqtələrlə (məsələn: **[93] 1-(8) ........**) əvəz edilmişdir. Aşağıdakı hədisin isnadına diqqət yetirin:

**[٩٤]** ٢–(...) حَدَّثَنِي مُحَمَّدُ بْنُ عُبَيْدٍ الْغُبَرِيُّ وَأَبُو كَامِلٍ الْجَحْدَرِيُّ وَأَحْمَدُ بْنُ عَبْدَةَ الضَّبِّيُّ قَالُوا: حَدَّثَنَا حَمَّادُ بْنُ زَيْدٍ عَنْ مَطَرٍ الْوَرَّاقِ، عَنْ عَبْدِ اللَّهِ بْنِ بُرَيْدَةَ، عَنْ يَحْيَى بْنِ يَعْمَرَ قَالَ:...

Əslində bu hədisin isnadı belədir:

**[94]-2-(...)** (Muslim demişdir:) "Bizə Muhəmməd ibn Ubeyd əl-Ğubəri, Əbu Kamil əl-Cəhdəri və Əhməd ibn Ubeydə əd-Dabbi rəvayət etmişdir; bizə Həmmad ibn Zeyd Mətər əl-Vərraqdan, o da Abdullah ibn Bureydədən rəvaət etmişdir ki, Yəhya ibn Yəmər demişdir:..."

Əsərdə keçən hər bir hədisin isnadını, ərəbcədə olduğu kimi saxlayıb, dilimizdə onları nöqtələrlə əvəz etməkdə əsas səbəb odur ki, bu tərcümə oxucu-

nu yormasın. Onu da qeyd etmək lazımdır ki, isnadın bağlılığını, digər isnadlara zidd olmadığını, isnaddakı ravilərin etibarlı olub-olmadıqlarını və isnadla bağlı digər məsələləri araşdırmaq, sıravi oxuculara yox, məhz bu elmlə məşğul olan mühəddislərə aiddir.

Qeyd edək ki, kvadrat mötərizələr arasında **[.....]** verilən rəqəmlər bu əsərdəki hədislərin əvvəldən-axıradək, təkrarlar da daxil olmaqla verilən sırasını bildirir.

Adi mötərizələr arasında **(.....)** verilən rəqəmlər isə bu kitabda tam şəkildə nəql edilmiş hədislərin sırasını bildirir.

Kvadrat mötərizə ilə **[.....]** adi mötərizə **(.....)** arasında verilən rəqəmlərə gəlincə, bu, hər kitabda nəql olunmuş hədislərin sayını bildirir. Məsələn: İman kitabının axırına baxdıqda burada **[533]-380-(...)** ........ yazıldığını görürük ki, bu da həmin kitabda 380 hədisin olduğunu bildirir. Bəzən də bu mötərizələr arasında heç bir rəqəmin verilməməsi **[678] (...)** ........ həmin kitabdakı eyni rəvayətin başqa isnadla rəvayət edilməsinə və ya hədisin mətnində naqisliklər, yaxud əlavələr olduğunu bildirir.

Qeyd etmək lazımdır ki, bu sıralama məşhur mühəddis Muhəmməd Fuad Abdul-Baqinin tərtibinə müvafiqdir.

Muslimin tərcümeyi-halında mötərizələr (h. 507) arasında verilmiş tarixlər isə müəlliflərin vəfat etdiyi tarixləri bildirir.

Haşiyədə verilən şərhlər xüsusən Nəvəvinin “Minhac Şərh Səhih Muslim ibn Həccac” adlı əsərindən, İbn Həcərin “Fəth əl-Bari” əsərindən və digər hədis kitablarından götürülmüşdür.

Bəzi hədislərin qeydlərində filan saylı hədisə hədisə bax yazılır ki, bu hədislər inşaAllah növbəti cildlərdə nəşr olunacaq.

Əlixan Musayev
02.07.2010

# *İmam Muslimin tərcümeyi-halı*

### ❉ Adı və kunyəsi[1]:

İmam, mühəddis Əbul-Huseyn Muslim ibn Həccac ibn Muslim ibn Vərd ibn Kuşaz əl-Quşeyri ən-Nisaburi.[2]

### ❉ Mənsubiyyəti:

İmam Muslim böyük və məşhur Quşeyr qəbiləsinə mənsubdur. Bu qəbilə isə Quşeyr ibn Kəb ibn Rəbiə ibn Amir ibn Səsəanın adı ilə bağlıdır.[3]

### ❉ Doğulduğu yer və tarix:

Muslim ibn Həccac, Xorasanın Nisabur şəhərində anadan olmuşdur.

İbn Xəlkan demişdir: "Mən, onun tərcümeyi-halını yazan alimlərin heç birinin onun doğulduğu tarix barədə dəqiq bir söz söylədiyinə rast gəlməmişəm. Şeyximiz Əbu Amr ibn əs-Səlah onun hicrətin 206-cı (m. 821-ci) ilində anadan olduğunu, Əbu Abdullah əl-Hakim ən-Nisaburinin "Ulamə əl-Ənsar" kitabından nəql etmişdir".[4]

İmam əz-Zəhəbi isə bu xüsusda demişdir: "Deyilənə görə İmam Muslim (hicrətin) 204-cü ilində anadan olmuşdur".[5]

### ❉ Elm öyrənmək üçün getdiyi məmləkətlər:

İmam Muslim Nisaburda yetərincə elm öyrəndikdən sonra biliyini artırmaq və hədisləri toplamaq məqsədilə Hicaz, Misir, Suriya, İraq və digər məmləkətlərə səyahət etmiş və aşağıda qeyd etdiyimiz alimlərdən elm almışdır:

---

[1] Kunyə: ismin əvvəlinə "əbu (ata)", yaxud "ummu (ana)", yaxud "ibn (oğul)", yaxud da "bint (qız)" sözlərindən birini qoşmaqla əmələ gələn ləqəb və ya ayamadır.

[2] "əl-Ənsab", 10/155; "əl-Bidayə vən-Nihayə", 11/33; "Tarix Bağdağ", 13/101; "Təzkiratul-Huffaz", 2/588; "Təhzib ət-Təhzib", 10/126; "Təhzib əl-Kəmal", 27/499; "Təqrib ət-Təhzib", 2/245; "Siyər Əlam ən-Nubələ", 12/557; "Təbəqatul-Huffaz", 260; "Vəfəyatul-Əyan", 2/91; "əl-Vafi bil-Vəfəyat", 5/194.

[3] "əl-Lubab fi Təhzib əl-Ənsab", 3/37-38.

[4] "Vəfəyatul-Əyan", 5/195.

[5] "Siyər Əlam ən-Nubələ", 12/558.

Xorasanda - Yəhya ibn Yəhya, İshaq ibn Rahuyə, Quteybə ibn Səid və digərləri. Reydə - Muhəmməd ibn Yəhya, Əbu Ğəssan və başqaları. Bağdadda - Əhməd ibn Hənbəl, Bəsrədə - Abdullah ibn Məsləmə əl-Qənəbi, Kufədə - Həfs ibn Ğiyas və digərləri. Mədinədə - İsmail ibn Əbu Uveys, Məkkədə - Səid ibn Mənsur, Əbu Musab və başqaları. Misirdə - Amr ibn Səvad, Hərmələtu ibn Yəhya və digərləri.[1]

### ❁ Ustadları:

Muslimin elm öyrəndiyi alimlərin sayı iki yüzdən çoxdur. Onlardan ən tanınmışları isə bunlardır:

Abdullah ibn Məsləmə əl-Qənəbi;
Abdullah ibn Abdur-Rəhman əd-Darimi;
Abdullah ibn Muhəmməd əz-Zuhri;
Abdullah ibn Muhəmməd ibn Əsma;
Abdur-Rəhman ibn Səllam əl-Cuməhi;
Amr ibn Həfs ibn Ğiyas;
Amr ibn Muhəmməd ən-Naqid;
Amr ibn Səvad əl-Amiri;
Amr ibn Zurara ən-Nisaburi;
Əbu Asim Əhməd ibn Ğəvvas;
Əbu Bəkr ibn Əbu Şeybə;
Əbu Xeysəmə Zuheyr ibn Hərb;
Əbu Kureyb Muhəmməd ibn əl-Əla ibn Kueryb;
Əbu Qudamə əs-Sərxəsi;
Əbu ər-Rəbi əz-Zəhrani;
Əbu Musab əz-Zuhri;
Əbu Zurə ər-Razi;
Əhməd ibn Abdur-Rəhman ibn Vəhb əl-Misri;
Əhməd ibn Hənbəl;
Əhməd ibn İsa ət-Tustəri;

[1] "Təhzib əl-Əsma vəl-Luğat", 2/91.

Əhməd ibn Munzir əl-Qəzzaz
Əhməd ibn Yunus;
Əli ibn Həcər əs-Sədi;
Həmmad ibn İsmail ibn Uleyyə;
Hərmələtu ibn Yəhya ət-Tucibi;
Xələf ibn Hişam əl-Bəzzar;
İbrahim ibn Dinar ət-Təmmar;
İbrahim ibn Munzir;
İbrahim ibn Musa əl-Fərra;
İshaq ibn Rahuyə;
İshaq ibn Mənsur əl-Kosəc;
İsmail ibn Əbu Uveys;
Quteybə ibn Səid;
Malik ibn İsmail ən-Nəhdi;
Mənsur ibn Əbu Muzahim;
Muhəmməd ibn Abdullah ibn Numeyr;
Muhəmməd ibn Bəkkar ibn Rəyyan;
Muhəmməd ibn Bəşşar Bundər;
Muhəmməd ibn Hatim əs-Səmin;
Muhəmməd ibn İsmail əl-Buxari;
Muhəmməd ibn Fərəc;
Muhəmməd ibn Mihran ər-Razi;
Muhəmməd ibn Musənnə;
Muhəmməd ibn Rumh ət-Tucibi;
Muhəmməd ibn Rafi ən-Nisaburi;
Muhəmməd ibn Sələmə əl-Muradi;
Muhəmməd ibn Yəhya ibn Əbu Ömər;
Muhəmməd ibn Yəsar;
Osman ibn Muhəmməd ibn Əbu Şeybə;
Səid ibn Mənsur;
Şeyban ibn Fərrux;

Yəhya ibn Məin;

Yəhya ibn Yəhya ət-Təmimi;

Ubeydullah ibn Muaz ibn Muaz;

Ubeydullah ibn Ömər əl-Qəvariri.[1]

Yuxarıda adları keçən mühəddislərdən ən məşhuru on mühəddisdir ki, imam Muslim bunların hər birindən kifayət qədər hədis rəvayət etmişdir:

Əbu Bəkr ibn Əbu Şeybədən 1540 hədis, Əbu Xeysəmə Zuheyr ibn Hərbdən 1281 hədis, Əbu Kureyb Muhəmməd ibn əl-Əla ibn Kureybdən 556 hədis, Əli ibn Həcər əs-Sədidən 188 hədis, Quteybə ibn Səiddən 668 hədis, Muhəmməd ibn Abdullah ibn Numeyrdən 573 hədis, Muhəmməd ibn Bəşşar Bundərdən 460 hədis, Muhəmməd ibn Hatim əs-Səmindən 300 hədis, Muhəmməd ibn Rafi ən-Nisaburidən 362 hədis və Muhəmməd ibn Musənnədən 772 hədis.

Qeyd etmək lazımdır ki, bunların hamısı – Muhəmməd ibn Hatim istisna olmaqla – həm də Buxarinin şeyxləridir.[2]

### ❆ Muslimin Buxari ilə münasibəti:

Bir çox əsərlərində imam Muslim, Buxarinin elmindən istifadə etdiyini etiraf etmiş və hədis elmində onun bənzəri olmadığını söyləmişdir. Hərçənd Muslimin "Səhih" əsərində Buxaridən heç bir hədis rəvayət edilməmişdir, lakin onun başqa kitablarında Buxarinin neçə-neçə rəvayətləri nəql edilmişdir.

İmam Buxari Nisabur şəhərinə gəldikdə, Əbu Hatim və Əbu Zurə tez-tez onun yanına gələr və ondan hədis elmini öyrənərdilər. Həmin vaxt imam Muslim hələ onun yanına gedib-gəlmirdi.[3] Lakin sonralar Muslim mütəmadi olaraq onun məclislərində iştirak etmiş, ondan heç ayrılmamış və onun elmindən bəhrələnmişdir.[4] Muslim həmişə Buxarini müdafiə etmiş, onu pisləyənlərin cavabını vermiş, hətta ona qarşı edilən haqsızlığı gördükdə, öz ustadı Muhəmməd ibn Yəhya əz-Zuhlini tərk etmişdir.

---

[1] "Təhzib əl-Kəmal", 27/499.

[2] Abdul-Muhsin Abbadın "Səhih Muslim"ə verdiyi şərh, 6/3.

[3] "əl-Bidayə vən-Nihayə", 11/26; "Tarix Bağdad", 2/30; "Siyər Əlam ən-Nubələ", 12/436.

[4] "Vəfəyat əl-Əyan", 5/194; "Təzkiratul-Huffaz", 2/589; "əl-Bidayə vən-Nihayə", 11/34.

Əbu Abdullah Muhəmməd ibn Yəqub rəvayət edir ki, Buxari Nisabur şəhərində gəldikdə, Muslim tez-tez onun yanına gedər və ondan elm alardı. Nəhayət, Muhəmməd ibn Yəhya əz-Zuhli ilə Buxari arasında "ləfz" məsələsində[1] ixtilaf düşdü və Zuhli camaata ondan uzaq durmağı məsləhət gördü. Nisaburluların əksəriyyəti ondan uzaq gəzməyə başladılar. Elə bu səbəbdən də Buxari Nisabur şəhərindən çıxıb getdi.[2] Bütün bunlara baxmayaraq Muslim onunla həmfikir idi. İş o yerə gəlib çatdı ki, bir gün Zuhli öz məclisindəki adamlara dedi: "Kim Quranın ləfzi xüsusunda Buxarinin fikrini dəstəkləyir və onun sözünü təsdiqləyirsə, qoy bizim məclisimizə ayaq basmasın". Bunu eşidəndə Muslim dərhal ayağa qalxdı və hamının gözü önündə məclisi tərk edib evinə getdi. Evinə çatan kimi, vaxtı ilə Zuhlidən eşidib yazdığı hədislərin məcmuəsini bir yerə topladı, sonra da bir hambal çağırıb o kitabları onun kürəyinə şəllədi və onu Zuhlinin yanına göndəri. Beləliklə, Muslim Zuhlini həmişəlik tərk etdi və bir daha onun məclisinə getmədi. İmam Muslim nə "Səhih" əsərində, nə də başqa əsərlərində ondan hədis rəvayət etməmişdir.[3]

Xətib əl-Bağdadi demişdir: "Muslim (hədis elmində) Buxarinin yolunu tutub getmiş, onun elmini gözdən keçirmiş və (bu sahədə) addımbaaddım onu izləmişdir".

Əd-Daraqutni demişdir: "Əgər Buxari olmasaydı, Muslim də olmazdı".

Əhməd Həmdun əl-Qəssar demişdir: "Mən Muslim ibn Həccacın Buxarinin yanına gəlib onun alnından öpdüyünü və ona: "Qoy sənin ayaqlarından öpüm, ey ustadlar ustadı, mühəddislər mühəddisi, hədis illətlərinin təbibi!" söylədiyini eşitdim".[4]

Bir dəfə Muslim Nisaburda, Buxarinin məclisində ikən bir nəfər Həccac ibn Muhəmmədə istinad edərək: "İbn Cureyc, Musa ibn Uqbədən, o da Suheyl ibn Salehdən, o da atasından, o da Əbu Hureyrədən ﷺ belə rəvayət etmişdir ki: "Bir adam dedi-qodu məclisindən qalxdığı zaman "Subhanəkəllahummə və

[1] Burada Quranı tələffüz edən kimsənin tələffüz etdiyinin məxluq olması nəzərdə tutulur. Belə ki, imam əl-Buxari "Xəlqu Əfal əl-İbad" adlı kitab təlif etmiş və həmin kitabda Quran oxuyan adamın ağzından çıxan kəlmələrin və səsin məxluq olduğunu söyləmişdir.

[2] "Siyər Əlam ən-Nubələ", 12/566; "Təzkiratul-Huffaz", 2/589; "Tarix Bağdad", 13/101.

[3] "əl-Bidayə vən-Nihayə", 11/34; "Tarix Bağdad", 13/103.

[4] "Tarix Bağdad", 13/102; "əl-Bidayə vən-Nihayə", 11/26.

bihəmdikə, əşhədu ən lə ilahə illə ənt, əstəğfirukə və ətubu ileyk[1]"– desə, bu, onun üçün həmin məclisin kəffarəsi olar" hədisini danışdı və bunun (nə dərəcədə mötəbər olub-olmadığı) haqda Buxaridən soruşdu. Bu vaxt Muslim məsələyə müdaxilə edib dedi: "Dünyada bundan mötəbər isnad ola bilərmi: İbn Cureyc, Musa ibn Uqbədən, o da Suheyl ibn Əbu Salehdən rəvayət etmişdir. Heç bu cür mötəbər isnadla rəvayət edilmiş hədis görmüsənmi?!" Muhəmməd ibn İsmail əl-Buxari isə ona belə cavab verdi: "Düzdür, (isnadındakı ravilər etibarlı ravilərdir), lakin hədisin illəti[2] vardır". Bunu eşidəndə Muslim həyacan içində dedi: "Lə ilahə illəllah! Söylə görək, bu hədisin illəti nədədir?" Buxari, Muslimə bu hədisin digər isnadlarını zikr etdi, sonra da ona: "Allahın örtülü saxladığını sən də örtülü saxla. Bu, camaatın Həccac ibn Muhəmməddən, onun da İbn Cureycdən rəvayət etdiyi məşhur hədisdir" – dedi və həmin rəvayətin illətini bəyan etməkdən boyun qaçırtdı. Lakin Muslim israr etdi, onun başından öpdü və ondan hədisin illətini ona bəyan etməsini xahiş etdi. Buxari onun olduqca israr etdiyini görəndə dedi: "Elə isə yaz: bizə Musa ibn İsmail xəbər vermişdir; bizə Vuheyb xəbər vermişdir; bizə Musa ibn Uqbə xəbər vermişdir; o da Avn ibn Abdullahdan rəvayət etmişdir ki, Peyğəmbər ﷺ belə buyurmuşdur:.." Bunu eşidəndə Muslim heyrətə gəldi və Buxarini mədh edib dedi: "Sənə ancaq paxıl adam nifrət edə bilər. Mən isə, bu dünyada sənin misli-bərabərin olmadığına şəhadət verirəm".[3]

---

[1] Ərəbcəsi:

سُبْحَانَكَ اللَّهُمَّ وَبِحَمْدِكَ، أَشْهَدُ أَنْ لاَ إِلَهَ إِلاَّ أَنْتَ، أَسْتَغْفِرُكَ وَأَتــُوبُ إِلَيْكَ

Tərcüməsi: Allahım, Sən pak və müqəddəssən! Sənə həmd olsun. Şahidlik edirəm ki, Səndən başqa məbud yoxdur. Səndən bağışlanma diləyir, Sənə tövbə edirəm.

[2] İllət: hədisin mötəbər olmasında naqislik əmələ gətirən gizlin, anlaşılmaz amildir.

[3] "Tarix Bağdad", 13/100-104; "əl-Bidayə vən-Nihayə", 11/33-34.

Bu hədisin isnadlarına diqqət yetirin:

١ – عن ابن جريج عن موسى بن عقبة عن سهيل بن صالح عن أبيه عن أبي هريرة

٢ – حدثنا موسى بن إسماعيل حدثنا وهيب حدثنا موسى بن عقبة عن عون بن عبد الله قال: قال رسول الله ﷺ

Hədisin isnadlarından birincisi zəif, ikincisi isə səhihdir. Belə ki, Buxarinin zəif saydığı isnad "muanən" isnadla – (müqəddimədəki 6-cı fəslin qeydlərinə bax) – rəvayət edilmişdir. İkincisi isə Avn ibn Abdullaha qədər "hədəsənə (bizə rəvayət etmişdir)" ləfzi ilə nəql edilmiş və sonunda Əbu Hureyrənin ﵁ adı çəkilmədən Peyğəmbərə ﷺ istinad edilmişdir ki, bu da "mursəl" isnad sayılır...

Bu hədisi Hakim "Mustədrək" əsərində (1970), Təbərani "Mocəm" əsərində (1/79) və Beyhəqi "Şoəb əl-İman" əsrində (628) rəvayət etmişlər. Hədis, tam isnadı ilə "səhih" sayılır. Bax: "Silsilətul-Əhadis əs-Səhihə", 81; "Səhih əl-Cami", 4487.

### ❈ Tələbələri:

Muslimdən hədis öyrənmiş və bu hədisləri rəvayət etmiş bir çox ravilər vardır ki, onlardan ən tanınmışları bunlardır:

Abdullah ibn Muhəmməd əş-Şərqi;
Abdullah ibn Yəhya əs-Sərxəsi;
Abdur-Rəhman ibn Əbu Hatim ər-Razi;
Əbu Abbas Muhəmməd ibn İshaq ibn Sirac;
Əbu Amr Əhməd ibn Mubarək əl-Mustəmli;
Əbu Bəkr Muhəmməd ibn İshaq ibn Xuzeymə;
Əbu Bəkr Muhəmməd ibn Nədr əl-Carudi;
Əbu Əvanə Yəqub ibn İshaq əl-İsfəraini;
Əbu Hamid Əhməd ibn Həmdun əl-Aməşi;
Əbu Hamid Əhməd ibn Muhəmməd əş-Şərqi;
Əhməd ibn Sələmə əl-Hafiz;
Əli ibn Huseyn ibn Hərb;
Əli ibn İsmail əs-Səffar;
Hatim ibn Əhməd əl-Kindi;
Huseyn ibn Muhəmməd ibn Ziyad əl-Qubbani;
İbrahim ibn Əbu Talib;
İbrahim ibn İshaq əs-Seyrəfi;
İbrahim ibn Muhəmməd ibn Sufyan əl-Fəqih;
Məkki ibn Abdan ət-Təmimi;
Muhəmməd ibn İshaq əs-Səqəfi əs-Sərrac;
Muhəmməd ibn Abd ibn Humeyd;
Muhəmməd ibn Abdul-Vəhhab əl-Fərra;
Muhəmməd ibn Məxləd əl-Əttar;
Musa ibn Harun;
Nəsr ibn Əhməd əl-Hafiz;
Saleh ibn Muhəmməd əl-Bağdadi;
Səid ibn Amr əl-Bərzəi;[1]
Yəhya ibn Səid;

---

[1] Bərzə və ya Bərdə, Azərbaycanın şəhərlərindən biridir. ("Siyər Əlam ən-Nubələ", 14/77; "Təzkiratul-Huffaz", 742; "əl-Ənsab", 1/315; "Tədrib ər-Ravi", 1/238; "Mocəm əl-Buldan", 1/379).

Zəkəriyya ibn Davud əl-Xəffaf.[1]

Yeri gəlmişkən qeyd etmək lazımdır ki, məşhur "Kutubu-Sittə"nin[2] müəlliflərindən biri – Əbu İsa ət-Tirmizi "Sunən" əsərində Muslimdən cəmi bir hədis rəvayət etmişdir. İmam Əbu İsa Oruc kitabında istinad edərək demişdir: "Bizə Muslim ibn Həccac Yəhya ibn Yəhyadan, o da Əbu Müaviyədən, o da Muhəmməd ibn Amrdan, o da Əbu Sələmədən, o da Əbu Hureyrədən rəvayət etmişdir ki, Peyğəmbər ﷺ belə buyurmuşdur: "Şaban ayının hilalını Ramazan ayı üçün hesab edin". Mubarəkfuri "Tohfətul-Əhvəzi" əsərində İraqinin belə dediyini nəql etmişdir: "Sunən" əsərinin müəllifi öz kitabında "Səhih"in müəllifi olan Muslimdən bu hədisdən başqa bir hədis rəvayət etməmişdir. Bu da həmkarların bir-birindən rəvayət etdiyi hədislərdəndir".[3]

### ❆ Muslimin alimlər arasında məqamı və alimlərin onu tərif etməsi:

Alimlər Muslimin hörmətli şəxsiyyət və möhtərəm imam, habelə hədis elmində yüksək bacarıq və ali məqam sahibi olmasında ittifaq etmişlər. Gəlin onların Muslim ibn Həccac haqqında dediklərinə nəzər salaq:

Hakim demişdir: "Mən Əbu Abdur-Rəhman əs-Silminin belə dediyini eşitdim: "Mən yarlı-yaraşıqlı və gözəl görkəmli bir şeyx gördüm. Əynində gözoxşayan bir bürüncək var idi, əmmaməsinin ucunu da çiyinləri arasına salmışdı. (Məsciddəkilər): "Bu, Muslimdir"– dedilər. Elə bu vaxt əmirin adamları qabağa keçib: "Möminlərin əmiri, Muslim ibn Həccacın müsəlmanlara imamlıq etməsini buyurur"– dedilər. Beləliklə, Muslim qabağa keçib təkbir gətirdi və camaata namaz qıldırdı".[4]

Əbu Qureyş demişdir: "Mən Muhəmməd ibn Bəşşarın belə dediyini eşitmişəm: "Dünyada dörd hafiz vardır: "Reydə – Əbu Zurə, Nisaburda – Muslim, Səmərqənddə – Abdullah əd-Darimi və Buxarada – Muhəmməd ibn İsmail".[5]

---

[1] "Təhzib əl-Kəmal", 27/503.

[2] "Kutubu-Sittə" (yəni "Altı-Kitab") deyildikdə aşağıdakı hədis kitabları nəzərdə tutulur:

1) Səhih əl-Buxari; 3) Sunən Əbu Davud;
2) Səhih Muslim; 4) Sunən ət-Tirmizi;
5) Sunən ən-Nəsai; 6) Sunən ibn Macə.

[3] Abdul-Muhsin Abbadın "Səhih Muslim"ə verdiyi şərh, 6/4.

[4] "Siyər Əlam ən-Nubələ", 12/566.

[5] "Tarix Bağdad", 2/16; "Təzkiratul-Huffaz", 2/589; "Siyər Əlam ən-Nubələ", 12/564; "Təhzib ət-Təhzib", 10/128.

Əhməd ibn Sələmə demişdir: “Mən Əbu Zurədən və Əbu Hatimdən eşitdim. Onlar Muslim ibn Həccacı, səhih hədisləri bilmək xüsusunda öz əsrlərindəki şeyxlərdən üstün tuturdular”.[1]

İshaq ibn Mənsur Muslimə demişdir: “Allah səni müsəlmanlar arasında saxladığı müddətcə, biz xeyirdən məhrum olan deyilik”.[2]

Əbu Amr ibn Həmdan demişdir: “Mən Hafiz ibn Əqdədən Buxari və Muslim haqqında: “Onlardan hansı biri daha çox bilir?”– deyə soruşdum. Dedi: “Muhəmməd (böyük) bir alim olub, Muslim də alimdir”.[3]

İbn əl-Əxrəm demişdir: “Bizim şəhər üç (böyük) hədis alimi yetişdirib. Bunlar: Muhəmməd ibn Yəhya, İbrahim ibn Əbu Talib və Muslim”.[4]

Zəhəbi demişdir: “Əbul-Huseyn ən-Nisaburi hədis sütunlarından biridir”.[5]

### ❁ Vəfatı:

İmam Muslim hicrətin 261-ci ilində Rəcəb ayının 24-ü bazar günü vəfat etmiş və bazar ertəsi ayın 25-i Nisaburda dəfn edilmişdir.[6]

### ❁ Alimlərin onun “Səhih” əsəri barəsində dedikləri təriflər:

Nəvəvi demişdir: “Hədis elmində iki nümunəvi imamın – Əbu Abdullah Muhəmməd ibn İsmail əl-Buxarinin və Muslim ibn Həccac əl-Quşeyrinin “Səhih” əsərləri ən mötəbər kitablar sayılır. Həqiqətən də, onların bu əsərlərinin misli-bərabəri yoxdur”. Həmçinin demişdir: “Alimlər ittifaq etmişlər ki, Buxari və Muslimin “Səhih” əsərləri, möhtəşəm Qurandan sonra ən səhih kitablar hesab edilir. Müsəlman ümməti bu iki kitabı tərəddüdsüz qəbul etmişlər”.[7]

İbn əş-Şərqi demişdir: “Mən Muslimin belə dediyini eşitmişəm: “Mən bu kitaba yazdığım hər bir hədisi ancaq dəlil-sübutla yazmışam. Bu kitabdan sildiyim hər bir hədisi də habelə”.[8]

---

[1] “Tarix Bağdad”, 13/101; “Təzkiratul-Huffaz”, 2/589; “Təhzib əl-Əsma vəl-Luğat”, 2/91; “əl-Bidayə vən-Nihayə”, 11/33.

[2] “Təhzib ət-Təhzib”, 10/127; “Siyər Əlam ən-Nubələ”, 12/563.

[3] “Tarix Bağdad”, 13/102; “Təzkiratul-Huffaz”, 2/589; “Siyər Əlam ən-Nubələ”, 12/565.

[4] “Təhzib ət-Təhzib”, 10/128.

[5] “əl-İbər”, 2/29.

[6] “Siyər Əlam ən-Nubələ”, 12/580.

[7] “əl-Minhac”, 1/123-128.

[8] “Təzkiratul-Huffaz”, 2/590.

Əhməd ibn Məsləmə demişdir: “Muslim “Səhih” əsəri yazdığı müddətcə mən onun yanında olmuşam. O bu kitabı on beş ilə yazmışdır. Və bu kitabda on iki min hədis vardır”.[1]

Muhəmməd ibn əl-Masərcəsi demişdir: “Mən Muslimin belə dediyini eşitmişəm: “Mən bu səhih hədislər toplusunu, üç yüz min hədisin içindən seçib yazmışam”[2]

**❁ Muslimin yazdığı əsərlər:**

Muslimin hədislər xüsusunda təlif etdiyi əsərlərin ən məşhuru, ən əsaslısı və ən dəyərlisi heç şübhəsiz, “əl-Cami əs-Səhih” adlı hədislər məcmuəsidir ki, imam Buxarinin “Səhih” əsərindən sonra ən səhih hədis kitabı sayılır. Qeyd edək ki, imam Muslim bundan başqa fiqh elminə və ravilərin həyat tarixçəsinə dair əsərlər də yazmışdır. Həmin kitablardan bəzilərinin adları bunlardır:

Kitab əl-Cami əl-Kəbir aləl-Əbvab;
Kitab əl-Əfrad;
Kitab Əfrad əş-Şamiyyin;
Kitab əl-Əqran;
Kitab əl-Əsma vəl-Kunə;
Kitab Əvham əl-Muhəddisin;
Kitab Əvlad əs-Səhabə;
Kitab Hədis Amr ibn Şueyb;
Kitab əl-İntifa bi Uhub əs-Siba;
Kitab əl-İləl;
Kitab Mən leysə ləhu illə Ravin Vahid;
Kitab Məşayix Malik;
Kitab Məşayix əs-Sovri;
Kitab Məşayix Sobə;
Kitab əl-Muxədrəmin;
Kitab Sualət Əhməd ibn Hənbəl;

---

[1] “Siyər Əlam ən-Nubələ”, 12/566.
[2] “Tarix Bağdad”, 13/101.

Kitab ət-Təmyiz;

Kitab Təbəqat ət-Tabiin;

Əl-Musnəd əl-Kəbir alə Əsma ər-Rical.[1]

**❄ Muslimin "Səhih" əsərinə yazılan şərhlər:**

Muslimin "Səhih" əsərinə dair həm müxtəsər, həm də müfəssəl olan bir çox şərhlər yazılmışdır. Bunlardan bəziləri aşağıdakılardır:

"əl-Mufhim fi Şərhi Ğəribi Muslim" Abdul-Ğafir ibn İsmail əl-Farisi (h. 529);

"Şərhu Muslim" İsmail ibn Muhəmməd əl-İsfəhani (h. 535);

"əl-Mulim bi Fəvaidi Kitabi Muslim" Əbu Abdullah Muhəmməd ibn Əli əl-Maziri (h. 536);

"əl-İkmal əl-Mulim bi Fəvaidi Muslim" Qazı İyad ibn Musa əl-Yəhsubi əl-Maliki (h. 544);

"Şərhu Muslim" İmadud-Din Abdur-Rəhman ibn Abdul-Ali əl-Misri (h. 624);

"Siyanətu Səhihi Muslim minəl-İxlali vəl-Ğələti və Himayətihi minəl-İsqati vəs-Səqti" Əbu Amr Osman ibn əs-Səlah əş-Şəhrəzuri (h. 643);

"əl-Mufsih əl-Mufhim vəl-Muvəddih əl-Mulhim li Məani Səhihi Muslim" Əbu Abdullah Muhəmməd ibn Yəhya ibn Hişam əl-Ənsari (h. 646);

"Şərhu Muslim" Yusuf Şəmsuddin Əbul-Muzəffər (h. 654);

"əl-İkmal fi Şərhi Muslim" Şəmsuddin Muhəmməd ibn Yusuf əl-Kunəvi (h. 656);

"əl-Mufhim lima Əşkələ min Təlxisi Kitabi Muslim" Əbul-Abbas Əhməd ibn Ömər əl-Ənsari əl-Qurtubi (h. 656);

"əl-Minhac fi Şərhi Səhihi Muslim ibnul-Həccac" Əbu Zəkəriyya Yəhya ibn Şərəf ən-Nəvəvi (h. 676);

"Fədl əl-Munim fi Şərh Səhih Muslim" Əbu Abdullah Muhəmməd ibn Ətaullah ibn Muhəmməd ər-Razi (h. 767);

"İkmalu İkmal əl-Mulim" Əbu Abdullah Muhəmməd ibn Xəlifə əl-Vustani əl-Ubbi (h. 827);

---

[1] "Təzkiratu əl-Huffaz", 2/590; "Siyər Əlam ən-Nubələ", 12/579; "Təhzib əl-Əsma vəl-Luğat", 2/91.

"Şərhu Muslim" Təqiyyud-Din Əbu Bəkr ibn Muhəmməd əl-Hisni əd-Diməşqi (h. 829);

"Tohfətu əl-Muncid vəl-Mufhim fi Ğəribi Səhihi Muslim" İbrahim ibn Muhəmməd ibn Sibt ibn əl-Əcəmi (h. 841);

"Şərhu Muslim" Əbul-Fərəc İsa ibn Məsud əz-Zəvavi (h. 844);

"Mukəmmilu İkmal əl-İkmal" Muhəmməd ibn Yusuf əs-Sənasi (h. 892);

"Əd-Dibac alə Səhih Muslim ibnul-Həccac" Cəlaləddin əs-Suyuti (h. 911);

"Minhac əl-İbtihac fi Şərhi Muslim ibnul-Həccac" Şihabuddin Əhməd ibn Muhəmməd əl-Xətib əl-Qəstəllani (h. 923);

"Şərhu Muslim" Zeynud-Din Zəkəriyya ibn Muhəmməd əl-Ənsari (h. 926);

"Buğyətul-Qari vəl-Mutəfəhhim" Yəhya ibn Muhəmməd əs-Sənabiti (h. 958);

"Şərhu Muslim" Ali əl-Qari əl-Hərəvi (h. 1016);

"əs-Sirac əl-Vəhhac min Kəşfi Məsalibi Səhih Muslim ibnul-Həccac" Siddiq Həsənxan (h. 1307);

"İnayətu əl-Məlik əl-Munim li Şərhi Səhih Muslim" Abdullah ibn Muhəmməd Yusuf Əfəndi (h. 1167).[1]

### ❋ Muslimin "Səhih" əsərinin bəzi qisimlərinə yazılan şərhlər:

"əl-Misbah fi Uyun əs-Sihah" Abdul-Ğəni ibn Abdul-Vahid ibn Əli əl-Məqdisi (h. 600);

"Ğəniyyətul-Muhtac fi Xətmi Səhihi Muslim ibnul-Həccac" Muhəmməd ibn Abdur-Rəhman əs-Səxavi (h. 902);

"Şərh Xutbətu Muslim ibnul-Həccac" Əhməd ibn Muhəmməd ibn Əbu Bəkr əl-Qəstəllani (h. 923).[2]

### ❋ Muslimin "Səhih" əsərinin ixtisar edilmiş variantları:

"Muxtəsər Səhih Muslim" Əbu Abdullah Muhəmməd ibn Abdullah ibn Tomərt (h. 524);

"Təlxis Səhih Muslim" Əhməd ibn Amr əl-Ənsari (h. 656);

[1] "Kəşf əz-Zunun", 1/555.

[2] "Brokelman", 1/356; 2/34; 2/73.

**[21]** ........ Mücahid rəvayət edir ki, Buşeyr əl-Ədəvi, İbn Abbasın yanına gəlib: "Rəsulullah ﷺ demişdir ki.... Rəsulullah ﷺ buyurmuşdur ki...."– deyə hədis danışmağa başladı. İbn Abbas isə onun danışdıqlarına qulaq asmır və buna məhəl qoymurdu. Onda Buşeyr ona: "Ey Abbas oğlu! Görürəm, sən mənim danışdıqlarıma əhəmiyyət vermirsən?! Mən sənə Rəsulullahdan ﷺ hədis danışıram, sən isə dinləmirsən". İbn Abbas (ona) belə cavab verdi: "Biz (elə bir dövrdə yaşayırdıq ki,) o vaxt bir kimsənin: "Rəsulullah ﷺ belə buyurmuşdur..."– dediyini eşitdikdə gözlərimiz ona dikilər və biz dərhal ona qulaq verərdik. Elə ki insanlar səb və zəlulə minməyə başladılar, artıq onlardan bildiyimizdən başqa heç nə qəbul etmədik".

**[22]** ........ İbn Əbu Muleykə demişdir: "Mən ibn Abbasa məktub yazıb ondan mənə məktubla (öyüd-nəsihət) verməyini xahiş etdim. O, bəzi şeyləri məndən gizlədirdi, yazmırdı. (Bir dəfə o, bir məclisdə mənim haqqımda): "O, nəsihət verən oğuldur. Mən bəzi şeyləri onun üçün seçib yazıram, (bir çox şeyləri də) ondan gizlədirəm"– dedi.

İbn Abbas "Qadau-Əli"ni[1] gətizdirdi və bundan (mənim üçün) bir çox şeyləri yazmağa başladı. Fəqət bəzi şeylərin üstündən keçərkən: "Vallahi ki, Əli bununla hökm etməmişdir. Bununla ancaq sapmış adam hökm verə bilər"– deyirdi.

**[23]** ........ Tavus demişdir: "İbn Abbasa içində Əlinin ﷺ hökmləri yazılmış bir kitab gətirildi. İbn Abbas – bir ərəş[2] uzunluğu qədər istisna olmaqla – bu kitabı məhv etdi". (Ravi) Süfyan ibn Uyeynə qolunu göstərdi.

**[24]** ........ Əbu İshaq demişdir: "(İfratçılar) Əlidən ﷺ sonra bu şeyləri uydurub ortaya çıxartdıqları zaman Əlinin məsləkdaşlarından biri belə dedi: "Allah onların canını alsın! (Gör, Əlidən varid olmuş) elmi necə zay ediblər".

**[25]** ........ Əbu Bəkr (yəni İbn Ayyaş) demişdir: "Mən Muğiranın belə dediyini eşitdim: "Əlidən ﷺ hədis rəvayət edənlər arasında Abdullah ibn Məsudun məsləkdaşlarından başqa heç kəs ondan doğru-düzgün (bir söz) söyləməmişdir".

---

[1] Burada "Qadau-Əli" deyildikdə Əli ibn Əbu Talibin ﷺ verdiyi hökmlərin cəm edildiyi bir kitab nəzərdə tutulur.

[2] Dirsəkdən barmaqların ucuna qədər uzunluqda olan qədim ölçü.

## 5-ci fəsil. İsnadın[1] (bu) dindən olmasının, hədisin ancaq etibarlı ravilərdən rəvayət olunmasının, özündə qüsur olan raviləri töhmətləndirməyin caiz, hətta vacib olmasının və bunun haram buyurulmuş qeybətlərdən olmayıb, əksinə, bu möhtərəm şəriəti qoruyan vasitə sayılmasının bəyan edilməsi

**[26]** ........ Muhəmməd ibn Sirin demişdir: "Şübhəsiz ki, bu elm[2] dindir. Dininizi kimdən öyrəndiyinizə diqqət edin".

**[27]** ........ (Yenə) İbn Sirin demişdir: "(Müsəlmanlar) isnad barəsində sual verməzdilər. Ara qarışdıqdan sonra isə onlar: "Ravilərinizin adlarını bizə söyləyin"– deməyə başladılar. Beləcə, sünnə[3] əhlinə diqqət yetirilər və onların hədisləri qəbul edilər, habelə bidət əhlinə diqqət yetirilər və onların hədisləri rədd edilərdi.

**[28]** ........ Süleyman ibn Musa demişdir: "Mən Tavusa: "Filankəs mənə filan və filan hədisi rəvayət etdi"– dedim. (Tavus) dedi: "Əgər dostun (hədis sahəsində) inanılmış adamdırsa,[4] ondan hədis qəbul elə".

**[29]** ........ Səid ibn Abdul-Aziz, Süleyman ibn Musadan (yuxarıdakı hədisi eynilə) rəvayət etmişdir.

**[30]** ........ Əsməi, Əbu Zinaddan, o da atasından belə rəvayət etmişdir: "Mən Mədinədə yüz (kişiyə) rast gəldim, hamısı sədaqətli adam idi. Fəqət onlardan hədis qəbul edilmirdi, (üstəlik hər biri haqda): "O, hədis əhlindən deyildir"– deyilirdi.

**[31]** ........ Əbu Bəkr ibn Xəllad əl-Bahili demişdir: "Mən Süfyan ibn Uyeynənin, Misərdən belə rəvayət etdiyini eşitmişəm: "Mən Səd ibn İbrahimin belə dediyini eşitdim: "Peyğəmbərdən ﷺ yalnız etibar ediləsi ravilər hədis rəvayət edə bilər"[5].

**[32]** ........ Abdan ibn Osman demişdir: "Mən Abdullah ibn Mübarəkin belə dediyini eşitmişəm: "İsnad dindəndir və əgər isnad olmasaydı, əlbəttə ki, (hər) istəyən istədiyi sözü danışardı".

---

[1] Hədisin mətninə gətirib çıxaran ravilərin silsiləsi.

[2] Yəni hədis elmi.

[3] 179-cu hədisin qeydlərinə bax.

[4] Burada inanılmış deyildikdə etibar edilməyə layiq olan, öyrəndiyi hədisləri hifz edən, ustad kimsələr nəzərdə tutulur.

[5] Yəni ancaq etibar olunası ravilərin hədisləri qəbul edilir.

........ Abbas ibn Əbu Rizmə demişdir: “Mən Abdullah ibn Mübarəkin isnadı qəsd edərək belə dediyini eşitmişəm: “Bizimlə hədis nəql edən ravilər arasında ayaqlar[1] vardır”.

........ Əbu İshaq ibn İsa ət-Taləqani demişdir: “Mən Abdullah ibn Mübarəkə dedim: “Ey Əbu Abdur-Rəhman! (Bu:) “Namazınla bərabər valideynlərin üçün namaz qılmağın və orucunla bərabər onlar üçün oruc tutmağın xeyirxahlıqdan sonra xeyirxahlıq etməkdir”– sözləri nəql olunmuş bir hədisdir. Abdullah (məndən): “Ey Əbu İshaq! Bu (hədis) kimdəndir?”– deyə soruşdu. Ona: “Bu, Şihab ibn Xiraşdan rəvayət edilən bir hədisdir”– dedim. Dedi: “O, etibarlı ravidir. Bəs o kimdən (rəvayət etmişdir)?” Dedim: “Həccac ibn Dinardan”. (Yenə) dedi: “O, etibarlı ravidir. Bəs o kimdən (rəvayət etmişdir)?” Dedim: “Peyğəmbər ﷺ buyurmuşdur”. Dedi: “Ey Əbu İshaq! Həccac ibn Dinarla Peyğəmbər ﷺ arasında elə (keçilməz) çöllər vardır ki, orada minik dəvələrinin boynu qırılar.[2] Lakin (valideynlərin adından) sədəqə verməkdə heç bir ixtilaf yoxdur”[3].

........ Muhəmməd ibn Abdullah demişdir: “Mən Əli ibn Şəqiqin belə dediyini eşitmişəm: “Mən Abdullah ibn Mübarəkin camaata belə xitab etdiyini eşitdim: “Amr ibn Saibin rəvayət etdiyi hədisi tərk edin. Çünki o, sələfləri[4] söyürdü”.

**[33]** ........ Buheyyənin dostu Əbu Əqil demişdir: “Mən Qasım ibn Ubeydullah və Yəhya ibn Səidin yanında oturmuşdum. Yəhya Qasıma dedi: “Ey Əbu Muhəmməd! Bu dinə aid bir məsələ haqda sənə sual verildiyi zaman, sənin bununla bağlı bir elmin və cavabın, yaxud buna dair bir bilgin və çıxış yolun yoxdursa, bu sənin kimisi üçün eyib və qüsur sayılır”. Qasım ondan:

---

[1] İbn Mübarək bununla demək istəmişdir ki, “əgər səhih bir isnad gətirərsə, hədisini qəbul edərik, yoxsa onu tərk edərik”. Burada o, isnadsız hədisi ayaqları olmayan heyvana bənzədir. Ayaqları olmayan heyvan da ayaq üstə dura bilməz.

[2] Həccac ibn Dinar tabiinlərdən sonra gələn nəsildəndir. Demək, onunla Peyğəmbərin ﷺ arasında ən azı iki nəfər – səhabə və tabiin – vardır. Elə buna görə də İbn Mübarək onların arasında bağlılıq olmadığını söyləmişdir.

[3] Bu hədisi dəlil olaraq gətirmək düzgün deyil. Lakin qeyd etmək lazımdır ki, dünyadan köçmüş valideynlərinə yaxşılıq etmək istəyən kəs onların adından istədiyi qədər sədəqə verə bilər. Belə ki, bunun savabının ölüyə çatmağında müsəlmanlar ixtilaf etməmişlər.

[4] Ümumiyyətlə, sələf deyildikdə hər hansı bir sahədə, işdə, mövqedə fəaliyyəti o birindən daha qabaq olmuş, yaxud qabaq yaşamış adam nəzərdə tutulur. Burada isə xüsusilə Peyğəmbər ﷺ, onun səhabələri və onların ardıcılları nəzərdə tutulur. Peyğəmbər ﷺ ölüm ayağında ikən qızı Fatiməyə رضي الله عنها belə buyurmuşdur: “Mən sənin üçün nə gözəl sələfəm!” (“Səhih əl-Buxari”, 6285).

"Niyə belə olsun ki?"– deyə soruşdu. Yəhya dedi: "Çünki sən doğru yol göstərən iki imamın – Əbu Bəkr və Ömərin övladlarındansan". Onda Qasım ona dedi: "Allahı düşünən adamın yanında elmsiz olaraq danışmağım, yaxud etibarlı olmayan bir ravidən hədis rəvayət etməyim bundan da pisdir".

**[34]** ........ Buheyyənin dostu Əbu Əqildən rəvayət edilir ki, Abdullah ibn Ömərin oğlanları ondan bəzi şeylər soruşdular. Onun buna dair bir bilgisi yox idi. Onda Yəhya ibn Səid ona belə dedi: "Sən doğru yol göstərən iki imamın, yəni Ömərin və oğlu Abdullahın – oğlu olduğun halda səndən söz soruşurlar, sən isə bunun cavabını bilmirsən. Vallahi, mən sənin bu səviyyədə olmağını böyük qüsur hesab edirəm". O dedi: "Həm Allah yanında, həm də Allahı düşünən kimsələr yanında elmsiz olaraq danışmağım və ya etibarlı olmayan bir ravidən (hədis) rəvayət etməyim, vallahi ki, bundan da böyük qüsurdur".

(Ravi demişdir:) "Onlar bunu söyləyərkən Əbu Əqil Yəhya ibn Mütəvəkkil buna şahid olmuşdur.

**[35]** ........ Yəhya ibn Səid demişdir: "Mən Süfyan əs-Sövridən, Şobədən, Malikdən və İbn Uyeynədən soruşdum ki: "Əgər bir nəfər yanıma gəlib məndən səbatlı olmayan bir ravi barədə soruşarsa, mən nə cür hərəkət etməliyəm?" Hamısı: "Onun səbatlı ravi olmadığını, (soruşan adama) xəbər ver"– deyə buyurdu.

**[36]** Ubeydullah ibn Səid bizə belə rəvayət etmişdir: "Mən Nədrin belə dediyini eşitmişəm: "(Bir dəfə) İbn Aun qapının kandarında dayanarkən ondan Şəhrin rəvayət etdiyi hədis barədə soruşdular". O, belə cavab verdi: "Həqiqətən, (mühəddislər) Şəhrə tənə vurmuşlar və əlbəttə ki, Şəhri məzəmmət etmişlər".

Əbul-Huseyn Muslim ibn Həccac ﷺ demişdir: "(Beləliklə, İbn Aun) dildən-dilə düşdü və mühəddislər onun verdiyi hökm barədə danışmağa başladılar"[1].

---

[1] Şübhəsiz ki, Şəhr hədisləri tərk edilmiş ravilər qrupuna aid deyil. Əksinə, böyük sələf alimlərinin əksəriyyəti onun etibarlı ravi olduğunu söyləmişlər. Əhməd ibn Hənbəl, Yəhya ibn Məin və başqa bu kimi böyük alimlər onu etibarlı ravi hesab etmişlər. Əhməd ibn Hənbəl: "Onun hədisləri necə də gözəldir!"– demiş və onun etibarlı ravi olduğunu təsdiqləmişdir. Əhməd ibn Abdullah əl-İcli: "O, inanılmış tabiindir"– demişdir. İbn Əbu Xeysəmə, Yəhya ibn Məinin belə dediyini rəvayət etmişdir: "Şəhr, etibar ediləsi bir ravidir". Əbu Zurə demişdir: "O, qənaətbəxş ravidir". Tirmizi rəvayət etmişdir ki, Muhəmməd ibn İsmail əl-Buxari demişdir: "Şəhr hədisi doğru-düzgün rəvayət edən və işini möhkəm tutan adamdır. Hərçənd İbn Aun onu məzəmmət etmişdir, lakin sonra Hilal ibn Əbu Zeynəbin Şəhrdən nəql etdiyi hədisi rəvayət etmişdir". Yəqub ibn Şeybə demişdir: "Şəhr etibar olunası bir ravidir". Saleh ibn Muhəmməd demişdir: "Kufə, Bəsrə və Şam əhlindən bir çoxları Şəhrdən hədis rəvayət etmişlər.

**[37]** ........ Şobə demişdir: "Mən Şəhr ilə rastlaşdım, fəqət ona elə də böyük əhəmiyyət vermədim".

**[38]** ........ Abdullah ibn Mübarək demişdir: "Mən Süfyan əs-Sövriyə dedim: "Abbad ibn Kəsir sənin tanıdığın adamdır. Buna rəğmən hərdən ağlasığmaz şeylər danışır. De görüm, mən camaata: "Ondan hədis qəbul etməyin"– deyə bilərəmmi?" Süfyan: "Bəli!"– deyə buyurdu.

Abdullah dedi: "Mən Abbadın anıldığı məclisdə olduğum zaman dindarlığı baxımından onu tərifləyərdim. Ancaq bununla bərabər: "Ondan hədis qəbul etməyin" sözünü də söyləyərdim".

Abdullah ibn Mübarək dedi: "Mən Şobənin yanına gəldikdə o, (Abbada işarə edib) dedi: "Bu, Abbad ibn Kəsirdir, ondan (hədis qəbul etməkdən) çəkinin".

**[39]** Fədl ibn Səhl mənə rəvayət etmişdir ki: "Mən Müəllə ər-Razidən Abbadın hədis qəbul etdiyi Muhəmməd ibn Səid barədə soruşdum. O mənə İsa ibn Yunusdan (eşitdiyini) belə rəvayət etdi: "İsa demişdir: "Mən onun qapısının önündə idim. Süfyan da onun yanında idi. Süfyan bayıra çıxdığı zaman, mən ondan Muhəmməd ibn Səid barədə soruşdum. Süfyan mənə onun yalançı olduğunu xəbər verdi".

**[40]** ........ Yəhya ibn Qəttan demişdir: "Biz əməlisaleh kimsələri hədis xüsusunda olduğu qədər başqa bir şeydə yalançı saymazdıq"[1].

İbn Əbu Əttab demişdir: "Mən Muhəmməd ibn Yəhya ibn Səid əl-Qəttana rast gəldim və ondan bu haqda soruşdum. O, atasının belə dediyini nəql etdi: "Sən xeyirxah adamların hədis xüsusunda olduğu qədər başqa bir şeydə yalan danışdığını görməzsən".

**Muslim** (bu sözləri belə) **açıqlamışdır**: "Yəhya ibn Səid əl-Qəttan demək istəmişdir ki: "Onlar yalan danışmaq istəmədikləri halda dillərinə yalan gətirirlər".

**[41]** ........ Xəlifə ibn Musa demişdir: "Mən Ğalib ibn Ubeydullahın yanına daxil oldum. O mənə: "Məkhul mənə belə rəvayət etmişdir... Məkhul mənə belə rəvayət etmişdir..." – deyə (hədis) yazdırmağa başladı. Bu dəmdə o, təbii ehtiyacını rəf etmək istədi və qalxıb (ayaqyoluna getdi). Mən də (fürsətdən

---

[1] Yəni bu adamlar özləri də bilmədən yalan hədislər danışır və heç bunun fərqinə də varmırlar. Çünki onlar hədis əhli kimi elmi araşdırma aparmırlar. Elə bu səbəbdən də hədis rəvayət etdikdə xətalara yol verir, öz gözlərilə yalanı görür, lakin onun yalan olduğunu bilmirlər.

istifadə edib) onun dəftərinə nəzər saldım. Bir də baxdım ki, orada: "Əban, Ənəsdən rəvayət etmişdir... Əban filankəsdən rəvayət etmişdir..." yazılmışdır. Elə bu səbəbdən də mən onu tərk edib getdim".

(Muslim demişdir:) "Mən Həsən ibn Əli əl-Hülvaninin belə dediyini eşitdim: "Mən Əffanın kitabında Əbu Miqdam Hişamın və Ömər ibn Abdul-Azizin hədislərini gördüm. Hişam demişdir: "Yəhya ibn filankəs adlı birisi mənə Muhəmməd ibn Kəbdən belə rəvayət etmişdir". Mən Əffana dedim: "Onlar, Hişam bunu Muhəmməd ibn Kəbdən eşitdi"– deyirlər. (Əffan) dedi: "O, bu hədislə bağlı sorğu-suala çəkilmiş və zəif hesab edilmişdir. O, (əvvəllər): "Mənə Yəhya, Muhəmməddən rəvayət etmişdir"– deyirdi. Sonra isə onu (bilavasitə) Muhəmməddən eşitdiyini iddia etməyə başladı".

**[42]** ........ Abdulah ibn Osman ibn Cəbələ demişdir: "Mən Abdullah ibn Mübarəkdən: "Adından, Abdullah ibn Amrın: *"Bayram günü, hədiyyələr günüdür"* hədisini rəvayət etdiyin bu adam kimdir?"– deyə soruşdum. Dedi: "Süleyman ibn Həccacdır. (Onu tərifləmək üçün) ona aid öz əlinin içinə qoyduğun şeyə bir bax".

İbn Quhzaz demişdir: "Mən Vəhb ibn Zəmanın Süfyan ibn Abdul-Malikdən (hədis) rəvayət etdiyini eşitdim. Dedi: "Abdullah ibn Mübarək belə rəvayət etmişdir: "Mən: "Dirhəm qədər qan..." hədisini[1] rəvayət edən Rövh ibn Ğuteyfi gördüm və məclislərin birində onun yanında oturdum. Fəqət onun hədisinə nifrət bəslənildiyi üçün məsləkdaşlarımın məni onun yanında görəcəklərindən utandım".

**[43]** ........ Abdullah ibn Mübarək demişdir: "Hərçənd Bəqiyyə düzdanışan adamdır, lakin o, hər yoldan ötəndən (etibarlı-etibarsızına, ağına-bozuna baxmadan) hədis rəvayət edir".

**[44]** ........ Şəbi demişdir: "Haris əl-Əvər əl-Həmdani mənə hədis rəvayət etmişdir. Halbuki o, yalançı idi".

**[45]** ........ Muğira demişdir: "Mən Şəbinin belə dediyini eşitdim: "Haris əl-Əvər mənə hədis rəvayət etmişdir".

Bununla yanaşı, o, Harisin yalançılardan olduğuna da şahidlik etdi.

---

[1] Abdullah ibn Mübarək bu hədislə Rövh ibn Ğuteyfi vəsf etmək və tanıtdırmaq istəmişdir. Belə ki, Rövh: "Dirhəm qədər qan (çıxarsa), namaz yenidən qılınmalıdır" hədisini Zuhridən, o da Əbu Sələmədən, o da Əbu Hureyrədən, o da Peyğəmbərdən ﷺ eşitdiyini iddia etmişdir. (Nəvəvi). Bu, əsli olmayan uydurma bir rəvayətdir ("Silsilətul-Əhadis əd-Daifə vəl-Movduə", 148).

**[46]** ........ İbrahim rəvayət edir ki, Əlqəmə belə demişdir: "Mən Quranı iki il ərzində oxudum". (Bundan xəbər tutan) Haris dedi: "Oxumaq asan, yazmaq isə daha çətindir"[1].

**[47]** ........ İbrahim rəvayət edir ki, Haris: "Mən kitab oxumağı üç ilə, yazı yazmağı isə iki ilə öyrəndim", yaxud: "Yazı yazmağı üç ilə, oxumağı isə iki ilə öyrəndim"– demişdir.

**[48]** ........ İbrahim, Harisin (etibarsızlıqda) ittiham edildiyini söyləmişdir.

**[49]** ........ Həmzə əz-Zəyyat demişdir: "Murra əl-Həmdani, Harisdən bəzi şeylər eşitmişdi. Odur ki, ona: "Qapının ağzında otur"– deyə buyurdu, sonra da gedib qılıncını götürdü. Haris vəziyyətin gərginləşdiyini hiss etdi və dərhal durub getdi.

**[50]** ........ İbn Aun demişdir: "İbrahim bizə belə buyurmuşdur: "Muğira ibn Səiddən və Əbu Abdur-Rəhmandan həzər edin. Çünki onlar yalançıdırlar".

**[51]** ........ Asim demişdir: "Biz yeniyetmə gənc ikən Əbu Abdur-Rəhman əs-Süləminin yanına gələrdik və o, bizə: "Əbul-Əhvəs müstəsna olmaqla, nağıl danışanlarla bir məclisdə oturmayın, Şəqiqdən də uzaq durun!"– deyərdi. Həmçinin deyərdi: "Bu, xəvariclərlə həmfikir olan Şəqiq, Əbu Vail (Şəqiq ibn Sələmə əl-Əsədi) deyildir".

**[52]** ........ Cərir demişdir: "Mən Cabir ibn Yezid əl-Cufinin yanında oldum, lakin ondan hədis yazmadım. Çünki o, "rəc'ə"yə[2] inanırdı".

**[53]** ........ Misər demişdir: "Cabir ibn Yezid uydurduğu bidətləri uydurmazdan öncə bizə hədis rəvayət etmişdir".

**[54]** ........ Süfyan rəvayət edir ki, Cabir uydurduğu bidətləri uydurmazdan əvvəl mühəddislər ondan hədis alardılar. (Nəhayət,) o, iç üzünü aşkara çıxartdığı zaman, mühəddislər hədis xüsusunda onu ittiham etdilər, hətta bəziləri onu (biryolluq) tərk etdilər".

Süfyandan: "O nə uydurmuşdur?" – deyə soruşduqda, o: "Rəc'ə"yə iman gətirmək"– deyə cavab vermişdir.

**[55]** ........ Cərrah ibn Məlih demişdir: "Mən Cabirin belə dediyini eşitmişəm: "Məndə Əbu Cəfərin Peyğəmbərdən ﷺ rəvayət etdiyi yetmiş min hədis vardır".

---

[1] Yəni yazılmış yazını oxumaq asan, onu yazmaq isə çətindir.

[2] Rəc'ə: Əli ibn Əbu Talibin ؓ yenidən dünyaya dönüşünə etiqad etməkdir. Bu, rafizilərin iddia etdiyi batil bir inancdır.

**[56]** ........ Zuheyr belə rəvayət etmişdir: "Cabir demişdir və ya mən Cabirin belə dediyini eşitdim: "Məndə əlli min hədis vardır ki, mən hələ onlardan heç birini danışmamışam". Bundan sonra bir gün o, bir hədis danışdı və: "Bu, əlli mindən biridir"– dedi.

**[57]** ........ Cabir əl-Cufu demişdir: "Məndə Peyğəmbərdən ﷺ əlli min hədis vardır".

**[58]** ........ Humeydi rəvayət edir ki, Süfyan demişdir: "(Bir dəfə) bir nəfər Cabirdən Uca Allahın: **"Atam mənə izin verməyincə və ya mənə aid Allah hökm verməyincə mən bu yerdən ayrılmayacağam. O, hökm verənlərin ən yaxşısıdır"**[1] ayəsi barədə soruşdu. Cabir: "Bu ayənin təfsiri varid olmamışdır"– deyə cavab verdi.

Süfyan: "Halbuki Cabir yalan danışdı"– deyə etirazını bildirdi. Biz Süfyandan: "Cabir bununla nə demək istəmişdir?"– deyə soruşduq. O, belə cavab verdi: "Rafizilər[2] deyirlər ki, Əli buludların içindədir. Səmadan bir nida gəlməyincə onun oğullarından meydana çıxanlarla birlikdə meydana çıxmayacağıq. Onlar Əlinin: "Filankəslə birlikdə xüruc edin!"– deyə səsləyəcəyini nəzərdə tuturlar. Cabir: "Bu əmr həmin ayənin təfsiridir"– demiş və beləliklə də, yalan danışmışdır. Belə ki, bu əmr Yusufun ﷺ qardaşlarına aid idi.

**[59]** ........ Süfyan demişdir: "Mən Cabirin otuz minə yaxın hədis söylədiyini eşitdim. Bu hədislərdən hər hansı birini rəvayət etməyi və: "Mən filan və filan hədisi bilirəm"– deməyi özümə halal saymıram".

(Muslim demişdir:) "Mən Əbu Ğəssan Muhəmməd ibn Amr ər-Razinin belə dediyini eşitdim: "Mən Cərir ibn Abdul-Həmiddən: "Sən Haris ibn Həsirəyə rast gəlmisənmi?"– deyə soruşdum. Dedi: "Bəli, o, ağır məsələdə israr edən, uzunçuluq etməyən bir şeyxdir".

---

[1] "Yusuf" surəsi, 80.

[2] Rafizi kəlməsi ərəbcə «rəfədə» ( رَفَضَ ) felinin məlum növündən əmələ gəlmiş feli isimdir. Bu kəlmə inkar etmək, rədd etmək, qəbul etməmək kimi mənaları ifadə edir.

Burada rafizilər deyildikdə özlərini şiə adlandıran, Peyğəmbərin ﷺ əhli-beytini ifrat dərəcədə sevən, onları həddən ziyadə şişirdən və Əli ibn Əbu Talibi ﷺ səhabələrin hamısından üstün tutan bir firqə nəzərdə tutulur. İçərilərində Əlini ﷺ Peyğəmbərdən ﷺ üstün sayanlar, hətta onun Rəbb olduğunu iddia edənlər də vardır. Onlar əhli-beytin tərəfini saxladıqlarına görə şiə adlandırılmışlar. Rafizi adlandırılmalarına gəlincə, bu ona görə idi ki, onlar Zeyd ibn Əli ibn Huseyn ibn Əli ibn Əbu Talibdən, Əbu Bəkr ﷺ və Ömərin ﷺ barəsində soruşduqda Zeyd onların ikisini də tərifləyib: "Onlar mənim babamın – (yəni Peyğəmbərin ﷺ) ən yaxın məsləkdaşları olmuşlar"– demişdir. Elə bu səbəbdən də onu tərk edib getmiş və inkar etmişlər ("Məcmu Fətava və Rəsail", 4/201).

**[60]** ........ Həmmad ibn Zeyd demişdir: "Bir gün Əyyub[1] bir nəfərin adını çəkdi və onun haqqında: "Düzdanışan dili olmayan bir adamdır"– dedi. Sonra başqa birini yad etdi və: "O, "rəqəmlərdə"[2] artırmaya yol verir"– söylədi.

**[61]** ........ Həmmad ibn Zeyd rəvayət edir ki, (bir dəfə) Əyyub: "Mənim qonşum var"– dedi. Sonra onun fəzilətindən danışdı və axırda: "Əgər o (mənim yanımda) iki xurmaya şahidlik etmiş olsaydı, mən onun şahidliyini caiz görməzdim"– dedi.

**[62]** ........ Məmər demişdir: "Mən heç vaxt Əyyubun, Əbu Umeyyə Abdul-Kərimdən başqa bir kimsənin dalınca danışdığını görmədim. Əyyub (ara-sıra) onu xatırlayıb deyərdi: "Allah ona rəhmət eləsin, etibar qazanmış adam deyildi. Məndən İkrimənin hədisini eşitmiş, sonra da: "İkrimədən eşitdim" deyə[3] rəvayət etmişdir".

**[63]** ........ Həmmam rəvayət edir ki, (bir dəfə) kor Əbu Davud bizim yanımıza gəldi və: "Bizə Bəra rəvayət etmişdir, bizə Zeyd ibn Ərqəm rəvayət etmişdir"– deməyə başladı. Biz bunu Qətadəyə xəbər verdikdə o dedi: "Yalan danışır. O, Bəra və Zeyddən hədis eşitməmişdir. O sadəcə bir dilənçi idi. Çox kişiləri süpürləyib aparan taun[4] zamanında[5] insanlara əl açıb dilənirdi".

---

[1] Söhbət Əyyub əs-Sixtiyanidən gedir.

[2] Burada "rəqəm" deyildikdə kitab nəzərdə tutulur.

[3] Buna ərəbcə tədlis ( تَدْلِيسٌ ), bunu edənə isə müdəllis ( مُدَلِّسٌ ) deyilir. Müdəllis: ərəbcə «dəlləsə» ( دَلَّسَ ) felinin məlum növündən əmələ gəlmiş feli sifətdir. Bu da adamaldadan, yalançı, fırıldaqçı, kələkbaz və s. mənaları ifadə edir ("Mocəm əl-Vəsit", səh. 293).

İstilahi mənada isə – bu, ravinin «tədlis» etməsi deməkdir. «Tədlis» kəlməsi lüğətdə yalan, fırıldaq, kələk və s. mənaları ifadə edir. İstilahi mənada isə «tədlis» üç növdür:

**–** tədlis əl-isnad: bu, ravinin başqa bir ravidən eşitmədiyi rəvayəti elə bir formada rəvayət etməsidir ki, həm eşitməsi, həm də eşitməməsi ehtimal edilir;

**–** tədlis ət-təsviyə: bu, «müdəllis» ravinin öz şeyxindən "eşitdim" deməklə hədis rəvayət etməsidir ki, o, isnadın tərkibində olan, bir-birilə rastlaşmış iki etibarlı ravinin arasında (hədisi birindən eşidib digərinə çatdırmaqda vasitə) olan etibarsız ravinin adını vurğulamır və onlardan birincisi «müdəllis» də deyildir. Odur ki, «müdəllis» ravi (şeyxindən eşitdiyi hədisin isnadını sadaladıqda) elə bir ləfz gətirir ki, o iki etibarlı ravinin birinin digərindən həmin hədisi eşitməsi ehtimal edilir və beləliklə də isnadın tərkibi yalnız etibarlı ravilərdən ibarət olur.

**–** tədlis əş-şuyux: bu, bir ravinin digərindən eşitdiyi hədisi rəvayət etməsidir ki, həmin ravi öz şeyxinin tanınmaması üçün onu ya məşhur olmadığı adı ilə, ya kunyəsi ilə, ya nəsəbi ilə, ya da xassəsi ilə qeyd edir ("Ulum əl-Hədis", səh. 167; "Nukət", 2/261; "Fəth əl-Muğis", 1/190; "Dəvabitu əl-Cərh vət-Tədil", səh. 120-121).

[4] Qusma və ishal şəklində təzahür edən, yoluxucu ağır epidemik xəstəlik.

[5] Qazı İyad ﷺ demişdir: "Bu xəstəlik hicrətin yüz on doqquzuncu ilində Bəsrədə yayılmışdı. Bir çox insanların ölümünə səbəb olduğundan ona "Taun əl-Carif" – "süpürləyib aparan taun" deyərdilər.

**[64]** ........ Həmmam rəvayət edir ki, (bir dəfə) kor Əbu Davud Qətadənin yanına daxil oldu. (Bir qədər oturduqdan) sonra qalxıb getdi və oradakılar (Qətadəyə): "Bu adam Bədr döyüşündə iştirak edən səhabələrdən on səkkizini gördüyünü iddia edir"– dedilər. Qətadə dedi: "Bu adam (bir çoxlarını) süpürləyib aparan taun dövründən əvvəl dilənçi idi. Hədis elminə əhəmiyyət verməz və bu xüsusda əsla danışmazdı. Vallahi ki, heç Həsən (əl-Bəsri) və Səid ibn Museyyib Bədrdə iştirak edən səhabələrin dilindən (hədis) eşitməmişlər.[1] Yalnız Səd ibn Malik istisnadır"[2].

**[65]** ........ Rəqəbə rəvayət edir ki, Cəfər əl-Haşimi əl-Mədəni bir çox doğru və hikmətli sözləri hədis olaraq rəvayət edərdi. Hərçənd bu sözlər Peyğəmbərin ﷺ hədislərindən deyildi, lakin Cəfər bunu Peyğəmbərin ﷺ hədisi kimi rəvayət edirdi.

**[66]** ........ Yunus ibn Ubeyd demişdir: "Amr ibn Ubeyd hədis xüsusunda yalan danışardı".

**[67]** ........ Muaz ibn Muaz demişdir: "Mən Auf ibn Əbu Cəmiləyə dedim: "Amr ibn Ubeyd[3] bizə Həsən (əl-Bəsridən) rəvayət etmişdir ki, Peyğəmbər ﷺ belə buyurmuşdur: "Bizə qarşı silah qaldıran adam bizdən deyildir". Auf dedi: "Vallahi ki, Amr yalan söyləyir.[4] O, bu hədislə sadəcə öz xəbis etiqadını[5] əsaslandırmaq istəmişdir".

---

[1] Yəni yaşda Əbu Davuddan böyük olduqlarına baxmayaraq, o səhabələri görməmişlər. Əbu Davud necə görə bilərdi?!

[2] Burada Səd ibn Malik deyildikdə məşhur səhabə Səd ibn Əbu Vəqqas nəzərdə tutulur. Belə ki, Əbu Vəqqasın adı Malik ibn Uheyb olmuşdur.

[3] Hərçənd Amr ibn Ubeyd, Həsən əl-Bəsridən dərs almışdı, lakin qədəri və mötəzili əqidəsində olan bir adam idi.

[4] Qeyd etmək lazımdır ki, bu hədis səhih hədisdir. Hədisi Buxari və Muslim öz "Səhih" əsərlərində rəvayət etmişlər. Lakin Auf: "Vallahi ki, Amr yalan söyləyir" deməklə, hədisin isnadının etibarsız olduğunu, ravilər arasında bağlılıq olmadığını və nəhayət, Həsən əl-Bəsrinin bu hədisi Peyğəmbərdən ﷺ eşitmədiyini bildirmək istəmişdir.

[5] Amr ibn Ubeyd motəzilə əqidəsində olmuşdur. Motəzilə ilk dəfə Bəsrədə Vasil ibn Ətanın (vəfatı h. 748) öz müəllimi Həsən əl-Bəsrinin (vəfatı h. 728) dərsini tərk etməsindən, onun məşğələlərindən ayrılmasından sonra təşəkkül tapmışdır.

Bir gün Həsən əl-Bəsrinin dərs dediyi Bəsrə camesinə gələn bir şəxs böyük günah etmiş adama (murtəkibul-kəbirəyə) bəzilərinin (xəvariclərin) kafir, bəzilərinin (murciilərin) isə mömin dediklərini söyləmiş və ondan bu barədə öz fikrini söyləməsini xahiş etmişdi. Həsən əl-Bəsri belə bir adamın münafiq (zahiri ilə batini eyni olmayan, dilində bir söz deyib, ürəyində ayrı şey deyən, imanı ilə əməli bir-birinə uyğun gəlməyən) olduğunu bildirmişdi. Bu zaman

özündən heç bir şey soruşulmayan Vasil ibn Əta müəllimi Həsən əl-Bəsrinin cavabını gözləmədən, böyük günah işləmiş adamın nə həqiqi mömin, nə də həqiqi kafir olduğunu, onun imanla küfr arasında orta mövqedə olduğunu (əl-mənzilətu beynəl-mənzilətyn) durduğunu söyləmişdi. Bununla da Vasil böyük günah işləmiş adam barəsində o zamana qədər İslam aləmində mövcud olan bütün fikirləri rədd edib yeni bir fikir irəli sürmüşdü. Bunu görən Həsən əl-Bəsri təəccüblə: "Qəd itəzələ ənna Vasil", yəni "Vasil bizdən ayrıldı" demişdi. Həmin hadisədən sonra Vasil ibn Əta ustadı Həsən əl-Bəsrinin məşğələlərini tərk etmiş, tezliklə dostu Amr ibn Ubeyd də (vəfatı h. 761) ona qoşulmuşdu. Beləliklə, Vasil ibn Ətaya və tərəfdarlarına "ayrılanlar", "tərk edənlər" mənasında olan "əl-Mutəzilə" adı verilmişdir...

İslam fikir tarixində kəlam elminin banisinin motəzilə olduğu yekdilliklə qəbul edilir. Motəzilə məzhəbinin yaranmasının əsas səbəblərindən biri İslam dünyasında zaman-zaman meydana çıxan əqidə ixtilafları və siyasi ixtilaflardır. Mötəzililər bu ixtilafları kəskin tənqid edir və mübahisəli məsələlər barəsində özlərinin yeni mülahizə və müddəalarını irəli sürürdülər. Ona görə də mötəzililərin görüşlərinin əksəriyyəti ixtilafda olduqları cərəyanlarla mübahisə zamanı meydana çıxmışdır. Məsələn, mötəzililər böyük günah işləmiş şəxs və imanın həqiqəti mövzusunda bir tərəfdən xaricilərin, digər tərəfdən isə murciilərin əleyhinə çıxırdılar. Xaricilər imanı əməlin bir hissəsi hesab edirdilər. Başqa sözlə, xaricilərin fikrincə, kəlmeyi-tövhidi və şəhadəti təsdiq edib söyləyən bir kimsə şəriətin vacib buyurduğu şeylərdən birini yerinə yetirməsə, yaxud böyük bir günah etmiş olsa, kafir hesab edilir. Xaricilər onların bu fikri ilə razılaşmayanları özlərinin qəti düşməni hesab edirdilər. Belə ki, xaricilərdən Nafi ibn Əzrəq özünə tabe olanlardan başqa hamını təkfir edir, onlarla evlənməyə icazə vermir, onların kəsdiyi heyvanların ətini yeməyi qadağan edir, özlərinin isə qanlarının halal olduğunu söyləyirdi.

Murciilər isə imanı mücərrəd bir etiqad halına gətirmişdilər. Onlar əməlin imanın bir hissəsi olmadığını, buna görə də böyük günah işləmiş bir kimsənin imandan (müsəlmanlıqdan) çıxmadığını elan edirdilər. Təbii ki, murciilərin bu tezisindən onların Əməvilərə loyal münasibət bəslədikləri, hətta onların hərəkətlərinə bəraət qazandırdıqları hiss olunurdu.

Məşhur ilahiyyatçı Şəhristaninin obrazlı ifadəsi ilə desək, murciilər belə güman edirdilər ki, küfrlə birlikdə iman yarayar, imanla birlikdə günah zərər verməz...

Mötəzililər ortodoksal İslamın əleyhinə çıxaraq Qurani Kərimi məxluq (yaradılmış) hesab edir, bununla da Quranın Allahın əzəli kəlam sifəti olduğunu inkar edirdilər. Burada yeri gəlmişkən qeyd etmək lazımdır ki, Quranın məxluq olduğu ideyasını ilk dəfə yəhudilər ortaya atmışlar. Yəhudilərdən Ləbid ibn Əsəm əvvəlcə Tövratın məxluq olduğu fikrini irəli sürmüş, sonra bunu Qurana da aid etmişdir. Ləbidin bu ideyası mötəzililiyə dövrünün tanınmış kəlam mütəxəssisi Səd ibn Dirhəmdən keçmişdir.....

Etiqad məsələlərində əqlə bu qədər üstünlük vermələri mötəzililəri əsas hədəflərindən yayındırmış, onlar tədriclə ümdə vəzifələrini unudub dini məsələlərdən daha çox fəlsəfi mövzularla məşğul olmuşlar. Məhz buna görə də mötəzililərə ilk İslam filosofları demək olar (Z. Bünyadov, "Dinlər, Təriqətlər, Məzhəblər", səh. 197-199).

Qurani Kərim ağlını və nəfsinin istəklərini şəriətdən üstün tutan kimsələr barədə belə buyurur: **"Nəfsinin istəyini ilahiləşdirən şəxsi gördünmü? Allah *əzəli* elmi sayəsində onu azğınlığa saldı, qulağını və qəlbini möhürlədi, gözünə də pərdə çəkdi. Allahdan başqa kim onu doğru yola yönəldə bilər? Məgər düşünüb anlamırsınız?"** (əl-Casiyə, 23)**; "Nəfsinin istəyini ilahiləşdirən kimsəni gördünmü? Sən ona vəkillikmi edəcəksən? Yoxsa elə hesab edirsən ki, onların əksəriyyəti eşidəcək və ya anlayacaq? Onlar heyvan kimidirlər, hətta, *haqq* yoldan daha çox uzaqlaşmışlar"** ("əl-Furqan" surəsi, 43-44).

**[68]** ........ Həmmad ibn Zeyd demişdir: “Həmişə Əyyubun yanında olan və ondan hədis dinləyən bir adam var idi. (Bir gün) Əyyub onun (məclisdə) iştirak etmədiyini görüb (onu xəbər aldı). Əyyuba: “Ey Əbu Bəkr! İndi o, Amr ibn Ubeydlə oturub-durur”– dedilər.

Həmmad dedi: “Bir gün mən Əyyubun yanına düşüb səhər tezdən bazara getdik. (Orada) bir nəfər onun qarşısına çıxdı. Əyyub ona salam verdi və hal-əhval tutdu. Sonra ona dedi: “Mənə xəbər çatıb ki, sən Amrla oturub-durursan”. O, belə cavab verdi: “Bəli, ey Əbu Bəkr. O, bizə əcaib-qəraib şeylər danışır. (Bu da bizim xoşumuza gəlir)”. Əyyub ona: “Biz isə elə əcaib şeylərdən qaçırıq (yaxud uzaq dururuq)– dedi”.

**[69]** ........ Həmmad ibn Zeyd rəvayət edir ki, (bir dəfə) Əyyuba dedilər: “Amr ibn Ubeyd, Həsən (əl-Bəsridən) hədis rəvayət etmiş (və Həsən): “Nəbizdən[1] sərxoş olan adam şallaqlanmaz”– demişdir”. Əyyub isə belə cavab verdi: “Amr yalan danışır. Mən Həsənin: “Nəbizdən sərxoş olmuş adama şallaq vurulmalıdır”– dediyini eşitmişəm.

**[70]** ........ Səllam ibn Muti demişdir: “Əyyuba xəbər çatmışdı ki, mən Amrın yanına gedib-gəlirəm. Bir gün o, yanıma gəldi və (mənə etirazını bildirib) dedi: “Bir de görüm, əqidəsindən əmin olmadığın bir adamın rəvayət etdiyi hədisdən necə əmin ola bilərsən axı?”

**[71]** ........ Süfyan demişdir: “Mən Əbu Musanın belə dediyini eşitmişəm: “Amr ibn Ubeyd hələ bidət etməmişdən (mötəzili olmamışdan) əvvəl bizə hədis rəvayət etmişdir”.

**[72]** ........ Muaz əl-Ənbəri demişdir: “Mən Şobəyə məktub yazıb ondan Vasit[2] qazısı Əbu Şeybənin halını soruşdum”. Mənə yazdı ki: “Ondan (eşitdiyin) heç bir hədisi yazma, mənim məktubumu da cır, (at)!”

---

[1] Əbu əs-Sədan Mübarək ibn Muhəmməd əl-Cəzəri demişdir: “Nəbiz: xurmadan, kişmişdən, buğdadan, arpadan və başqa şeylərdən (üzərinə su tökməklə) hazırlanan şirədir... Bu şirə sərxoşedici olsa da, olmasa da ona nəbiz deyilir. Qeyd etmək lazımdır ki, üzümdən düzəldilmiş şəraba (çaxıra) nəbiz də deyilir” (“ən-Nihayatu fi Ğərib əl-Hədis”, 5/15).

[2] “Vasit” ərəbcə (وَسَط) “vəsətə” felindən əmələ gəlmiş isimdir. Hərfi tərcümədə “ortada olan” mənasını ifadə edir. Lakin bu rəvayətdə “Vasit” deyildikdə İraqın məşhur şəhərlərindən biri nəzərdə tutulur. O şəhər ortaiqlimli olduğuna görə ona belə bir ad verilmişdir. (“Misbah əl-Munir”, 1/340).

**[73]** ........ Əffan demişdir: “Mən Həmmad ibn Sələməyə Saleh əl-Murrinin Sabitdən rəvayət etdiyi hədisi söylədim. Həmmad: “O, yalan danışır”– dedi. Mən Həmmama da Saleh əl-Murrinin rəvayət etdiyi hədisi danışdım. O da: “Yalan danışır”– dedi”.

**[74]** ........ Əbu Davud rəvayət edir ki, (bir dəfə) Şobə mənə belə buyurdu: “Cərir ibn Hazimin yanına get və ona: “Həsən ibn Əmmaradan rəvayət etmək sənə halal deyildir. Çünki o, yalan danışır”– de”. Mən Şobədən: “Axı bu necə ola bilər?”– deyə soruşdum. Dedi: “O, bizə Həkəmdən əslini tapmadığım bir çox şeylər rəvayət etmişdir”. Ondan: “Nə şeylərdir elə?”– deyə soruşdum. Dedi: “Mən Həkəmdən: “Peyğəmbər ﷺ Uhud şəhidlərinə cənazə namazı qılıbmı?”– deyə soruşdum. (Həkəm): “Peyğəmbər ﷺ onlara cənazə namazı qılmayıb”– deyə cavab verdi. Halbuki Həsən ibn Əmmara Həkəmdən, o da Miqsəmdən, o da İbn Abbasdan rəvayət etmişdir ki, (guya) Peyğəmbər ﷺ Uhud şəhidlərinə cənazə namazı qılmış, sonra da onları dəfn etmişdir”.

Mən Həkəmdən: “Zinadan doğulmuş körpələr haqda nə deyə bilərsən?”– deyə soruşdum. Dedi: “Onlara cənazə namazı qılınmalıdır”. Ondan: “Bu hədis kimdən rəvayət edilir?”– deyə soruşdum. (Mənə): “Həsən əl-Bəsridən rəvayət olunur”– dedi. Həsən ibn Əmmara isə: “Həkəm (bu hədisi) bizə Yəhya ibn Cəzzardan, o da Əlidən rəvayət etmişdir”[1]– demişdir.

**[75]** Həsən əl-Hülvani bizə demişdir: “Mən Yezid ibn Harunun, Ziyad ibn Məymunun adını çəkdikdən sonra belə dediyini eşitdim: “Mən ondan və Xalid ibn Məhducdan heç bir şey rəvayət etməyəcəyimə dair and içmişəm”.

Yezid həmçinin demişdir: “(Bir dəfə) mən Ziyad ibn Məymuna rast gəldim və ondan bir hədis barəsində soruşdum. O, bu hədisi mənə Bəkr əl-Muzənidən rəvayət etdi. (Bir müddətdən) sonra mən yenə onun yanına gəldim. Bu dəfə o, mənə hədisi Muvərriqdən rəvayət etdi. Sonuncu kərə onun yanına döndükdə hədisi mənə Həsəndən rəvayət etdi”.

Yezid ibn Harun hər ikisinin[2] yalançı olduğunu söyləyərdi.

---

[1] Bu, Həsən ibn Əmmaranın yalançı olduğunu bir daha sübuta yetirir. Belə ki, o, əslində Həsən əl-Bəsriyə aid olan bir hədisi, istinad edərək Əlinin adından rəvayət etmişdir. Həsən ibn Əmmaraya gəlincə, etibarsız, həm də tərk olunmuş bir ravidir.

[2] Burada ikisi deyildikdə Ziyad ibn Məymun və Xalid ibn Məhduc nəzərdə tutulur.

Hülvani demişdir: “Mən Abdus-Samədən eşitmişəm. (Bir dəfə) onun yanında Ziyad ibn Məymunun adını çəkdim. (Abdus-Saməd) onun yalançı olduğunu bildirdi”.

**[76]** Mahmud ibn Ğeylan bizə demişdir: “(Bir dəfə) mən Əbu Davud ət-Təyalisidən: “Sən Abbad ibn Mənsurdan neçə-neçə hədis rəvayət etmisən. Bəs nə əcəb Nədr ibn Şumeylin ondan bizə rəvayət etdiyi “əttar”[1] hədisini eşitməmisən?”– deyə soruşdum. O, mənə belə cavab verdi: “Sus! Mən Abdur-Rəhman ibn Mehdi ilə birgə Ziyad ibn Məymunla görüşdük və ondan: “Bu rəvayət etdiyin hədislər Ənəsdəndirmi?”– deyə soruşduq. Dedi: “Bir deyin görək əgər bir adam günah işlətdikdən sonra tövbə etsə, Allah onun tövbəsini qəbul etməzmi?” Dedik: “Əlbəttə, (qəbul edər)”. Onda o, belə buyurdu: “Mən bu hədislərdən nə az, nə də çox – heç bir hədisi Ənəsdən eşitməmişəm. Mənim Ənəslə görüşmədiyimi (avam) adamlar bilmir-bilmir, siz də bilmirsiniz?!”

Əbu Davud demişdir: “Bundan sonra bizə xəbər çatdı ki, o yenə (həmin hədisləri) rəvayət edir. Mən bir daha Abdur-Rəhmanla birgə onun yanına gəldim və o (yenə): “Tövbə edirəm”– dedi. Bir müddət keçdikdən sonra o, (yenə) bu hədisləri rəvayət etməyə başladı. Artıq (bundan sonra) biz onu tərk etdik.

**[77]** Həsən əl-Hülvani bizə demişdir: “Mən Şəbabənin belə dediyini eşitmişəm: “Abdul-Quddus bizə rəvayət edərdi ki: “Suveyd ibn Əqələ[2] belə demişdir...” Şəbabə demişdir: “Mən Abdul-Quddusun belə dediyini eşitdim: “Peyğəmbər ﷺ küləyin ərz edilməsini[3] qadağan etmişdir”. Ondan: “Bu nə deməkdir?” – deyə soruşulduqda, o belə cavab vermişdir: “Yəni küləyin girib-çıxması üçün divarda dəlik açmaq”.

---

[1] Əttar – ətriyyat, ətirli şeylər, ədviyyat və s. satan adam.

Qazı İyad رحمه الله demişdir: “Bu, Ziyad ibn Məymunun Ənəsdən رضي الله عنه rəvayət etdiyi bir hədisdir. Hədisdə deyilir ki, Mədinədə Hövla adlı əttar bir qadın var imiş. Bir gün o, Aişənin yanına girib əri ilə öz arasında baş vermiş hadisəni ona danışmış və Peyğəmbər ﷺ onun ərinin fəzilətindən bəhs etmişdir... Bu, səhih olmayan uzun bir hədisdir.

[2] Əslində, bu Əqələ yox, Ğəfələdir. Abdul-Quddus ərəbcə bir-birinə oxşar (عَقَلَةُ) və (غَفَلَةُ) kəlmələrini qarışıq salmış, beləliklə də, isnadı təhrif etmişdir.

[3] Burada da Abdul-Quddus oxşar kəlmələri qarışıq salıb hədisin mənasını təhrif etmişdir. Əslində, hədisdə (أَنْ يُتَّخَذَ الرُّوْحُ غَرَضًا) “yəni Peyğəmbər diri heyvanı bir yerə bağlayıb onu oxla vurmaq üçün hədəf seçməyi qadağan etmişdir”– deyilir. Abdul-Quddus isə “ruh” sözünü “rəvh” sözü ilə, “hədəf seçmək” sözünü də “ərz etmək” sözü ilə qarışıq salmışdır.

**Muslim demişdir:** "Mən Ubeydullah ibn Ömər əl-Qəvaririnin belə dediyini eşitmişəm: "Mehdi ibn Hilal bir neçə gün Həmmad ibn Zeydin (elm məclisində) oturduqdan sonra mən Həmmadın bir nəfərə belə dediyini eşitdim: "Sizin tərəfinizdən qaynayan bu duzlu bulaq nədir?" O: "Elədir, Ey Əbu İsmail"[1]– deyə cavab verdi.

**[78]** ........ Əbu Əvanə demişdir: "Həsəndən mənə rəvayət edilən elə bir hədis yoxdur ki, mən onu Əban ibn Əbu Ayyaşa danışmayım və o da onu mənə oxumasın".

**[79]** ........ Əli ibn Mushir demişdir: "Mən və Həmzə ibn Zəyyat, Əban ibn Əbu Ayyaşdan minə yaxın hədis eşitmişik".

Əli (ibn Mushir) demişdir: "(Bir dəfə) mən Həmzəyə rast gəldim və o, mənə yuxuda Peyğəmbəri ﷺ gördüyünü və Əbandan eşitdiklərini ona ərz elədiyini, Peyğəmbərin ﷺ də bu rəvayətlərdən ancaq az bir şey – beş, yaxud altı hədisi bildiyini xəbər verdi".[2]

**[80]** Bizə Abdullah ibn Abdur-Rəhman əd-Darimi demişdir: "Zəkəriyya ibn Ədi bizə xəbər verib demişdir: "(Bir dəfə) Əbu İshaq əl-Fəzari mənə belə buyurdu: "Bəqiyyənin tanınmış ravilərdən rəvayət etdiklərini yaz, lakin tanınmamış kimsələrdən rəvayət etdiklərini yazma. İsmail ibn Ayyaşdan isə nə tanınmış kimsələrdən, nə də başqa birilərindən rəvayət etdiklərini yazma".

**[81]** ........ İbn Mübarək demişdir: "Bəqiyyə (ravilərin) adlarını kunyələrlə,[3] kunyələri də adlarla əvəz etməsəydi,[4] nə gözəl insan olardı. O, Əbu Səid əl-

---

[1] Əbu İsmail, Həmmad ibn Zeydin kunyəsidir. O, burada: "duzlu bulaq" deməklə Mehdi ibn Hilalın etibarsız və ittiham edilmiş ravi olduğunu bildirir, onun müraciət etdiyi adam isə cavabında "elədir" deməklə Həmmad ibn Zeydin sözünü təsdiq edir.

[2] Qazı İyad ﵀ demişdir: "Bunu deməkdə məqsəd Əbanın zəif ravi olduğuna diqqəti cəlb etmək və bunu aşkara çıxarmaq idi. Yoxsa yuxu vasitəsilə bir şeyin haqq və ya batil olduğuna hökm vermək, habelə şəriətdə sabit olmuş bir hökmü ləğv etmək və ya sabit olmamış bir hökmü qüvvəyə mindirmək qəti qadağandır. Bu da alimlərin yekdil fikridir".

[3] Kunyə: ismin əvvəlinə "əbu (ata)", yaxud "ummu (ana)", yaxud "ibn (oğul)", yaxud da "bint (qız)" sözlərindən birini qoşmaqla əmələ gələn ləqəb və ya ayamadır.

[4] Belə ki, Bəqiyyə adı ilə tanınmış bir ravidən hədis rəvayət etdikdə onun adını deyil, sadəcə kunyəsini, kunyəsi ilə tanınmış bir ravidən hədis rəvayət etdikdə də onun kunyəsini yox, ancaq adını zikr edərdi. Bu, tədlisin bir növüdür və töhmətə layiq çirkin bir üslubdur. Çünki mühəddis bunu etməklə insanları çaşbaş salır və onlarda elə təsəvvür yaradır ki, guya onun qəsd etdiyi ravi həmin etibarsız ravi deyildir. Bununla da, ona bəraət qazandırmağa cəhd göstərir... Dolayısı ilə o, etibarsız ravini etibarlı bir ravinin oxşar və ya məşhur adı və ya kunyəsi ilə zikr etməklə rəvayətin mötəbər olduğunu sübuta yetirməyə çalışır.

Vühazidən bizə hədis rəvayət edən bir dərya idi. Bir də baxıb gördük ki, bu Abdul-Quddus imiş”[1].

**[82]** ........ Abdur-Rəzzaq demişdir: “Mən İbn Mübarəkin kiminsə haqqında “yalançı” sözünü açıq-aşkar işlətdiyini eşitməmişəm. Yalnız Abdul-Quddusdan başqa. Mən, həqiqətən də, Abdur-Rəzzaqın Abdul-Quddus barədə: “(O,) yalançıdır”– dediyini eşitmişəm”.

**[83]** Bizə Abdullah ibn Abdur-Rəhman əd-Darimi demişdir: “Mən Əbu Nueymdən eşitdim, o, Muəllə ibn Urfanı zikr edib dedi: “Muəllə ibn Urfan rəvayət etmişdir ki, Əbu Vail bizə: “Siffində[2] ikən İbn Məsud bizim yanımıza gəldi”– dedi. Əbu Nueym isə (ona etiraz edib) demişdir: “Olmaya sən onun öldükdən sonra dirildiyini zənn edirsən?!”

**[84]** Mənə Amr ibn Əli və Həsən əl-Hülvani – hər ikisi Əffan ibn Muslimdən rəvayət etmişlər ki, o (belə) demişdir: “Biz İsmail ibn Uleyyənin yanında ikən bir nəfər başqa birisinin adından hədis rəvayət etdi və mən ona: “Bu adam səbatlı (ravi) deyildir”– dedim. O da (mənə): “Sən onun qeybətini qırdın”– dedi. (Bunu eşidəndə) İsmail dedi: “O, onun qeybətini eləmədi, fəqət onun səbatlı olmadığına hökm verdi”.

**[85]** ........ Bişr ibn Ömər demişdir: “Mən Malik ibn Ənəsdən, Səid ibn Museyyibdən hədis rəvayət edən Muhəmməd ibn Abdur-Rəhmanın, Tov'əmənin mövlası Salehin, habelə Əbul-Huveyrisin, İbn Əbu Zibin istinad etdiyi Şobənin və Həram ibn Osmanın barəsində soruşdum. Hər biri haqqında: “Etibarlı ravi deyildir”– dedi. Mən yenə Malikdən bu beşi haqqında soruşdum. Dedi: “Onlar rəvayət xüsusunda etibar olunmağa layiq deyillər”. Mən Malikdən adını unutduğum başqa birisi haqqında da soruşdum. (Məndən:) “Onun adını mənim kitablarımda görmüsənmi?”– deyə soruşdu. Dedim: “Xeyr, (görməmişəm)”. Dedi: “Əgər etibarlı olsaydı, adını mənim kitablarımda görərdin”.

---

[1] Vühazə, Həmir düzəngahı yaxınlığındakı yer adıdır. Bu Abdul-Quddus isə şamlıdır. Bu, zəif və bietibar sayılan Abdul-Quddus ibn Həbib Kəlaidir. (Bəqiyyənin nəzərdə tutduğu) Əbu Səid əş-Şami də Kəlaidir”.

[2] Siffin: Hicrətin 37-ci ilində iraqlılarla şamlılar arasında, daha dəqiq desək, Əli ibn Əbu Talibin ordusu ilə Müaviyə ibn Əbu Süfyanın ordusu arasındakı döyüşün baş verdiyi yerin adıdır.

**[86]** ........ Həccac demişdir: "İbn Əbu Zib bizə Şurəhbil ibn Səddən hədis rəvayət etmişdir. Halbuki o, ittiham edilmiş bir kimsə idi".

**[87]** ........ İbn Mübarək demişdir: "Əgər mənə Cənnətə daxil olmaq ilə Abdullah ibn Muhərrərlə görüşmək arasında seçim verilsəydi, əvvəlcə onunla görüşməyi, sonra Cənnətə daxil olmağı seçərdim. Lakin onu gördükdən sonra artıq dəvənin peyini mənim üçün ondan daha əziz oldu".

**[88]** ........ Ubeydullah ibn Amr demişdir: "Zeyd – yəni Əbu Uneysənin oğlu demişdir: "Qardaşımdan[1] hədis götürməyin!"

**[89]** ........ Ubeydullah ibn Amr demişdir: "Yəhya ibn Uneysə yalançıdır".

**[90]** ........ Həmmad ibn Zeyd demişdir: "(Bir dəfə) Əyyubun yanında Fərqədin adı çəkildi və (Əyyub): "Şübhə yoxdur ki, Fərqəd mühəddis deyildir "– dedi.

**[91]** Mənə Abdur-Rəhman ibn Bişr əl-Abdi belə rəvayət etmişdir: "Mən Yəhya ibn Səid əl-Qəttandan eşitdim, onun yanında Muhəmməd ibn Abdullah ibn Ubeyd ibn Umeyr əl-Leysinin adı çəkildikdə Yəhya onun olduqca etibarsız ravi olduğunu söylədi. Yəhyadan: "Yəqub ibn Ətadan da zəifdirmi?"– deyə soruşdular. O: "Bəli!"- deyə cavab verdi, sonra da bunu əlavə etdi: "Mən kimsənin Muhəmməd ibn Abdullah ibn Ubeyd ibn Umeyrdən hədis rəvayət etdiyini güman etmirəm".

**[92]** Mənə Bişr ibn Həkəm belə rəvayət etmişdir: "Mən Yəhya ibn Səid əl-Qəttanın (bəzi ravilər barədə verdiyi hökmü) eşitdim. O, Həkim ibn Cubeyrin və Abdul-Əlanın etibarsız ravilər olduqlarını bildirdi. Habelə Yəhya ibn Musa ibn Dinarın etibarsız olduğunu bildirdi və: "Onun hədisi havadır (boş bir şeydir)"– dedi. Həmçinin Musa ibn Dihqanın və İsa ibn Əbu İsa əl-Mədəninin də etibarsız olduğunu bildirdi. Dedi: "Mən Həsən ibn İsanın belə dediyini eşitmişəm: "İbn Mübarək mənə demişdir: "Cəririn yanına getsən, ondan eşitdiyin hər bir şeyi yaz. Yalnız üç nəfərin hədislərindən başqa. Ondan Ubeydə ibn Muəttibin, Sərri ibn İsmailin və Muhəmməd ibn Salimin hədislərini yazma".

**Muslim demişdir:** "Hədis ravilərinin ittiham edilməsi və naqis cəhətləri xüsusunda elm əhlinin kəlamlarından və söylədiklərindən xəbər verdiyimiz şeylərin bənzərləri çoxdur. Hərgah bunların hamısı tədqiq edilmiş şəkildə qeyd edilərsə, kitabın həcmi artar. Mühəddislərin bu xüsusda söylədiklərini

---

[1] Burada Yəhya ibn Uneysə nəzərdə tutulur (90-cı rəvayətə bax).

və izah etdiklərini anlayan, habelə onların üslubunu qavrayan kəslərə zikr etdiyimiz (bu misallar) kifayət edər.

Bu işdə böyük təhlükə olduğuna görə mühəddislər hədis ravilərinin və xəbərləri nəql edənlərin eyiblərini üzə çıxarmağı özlərinə borc bilmiş və bu xüsusda soruşulduqları zaman fitva vermişlər. Çünki din xüsusundakı xəbərlər, halal buyurmaq, haram saymaq, əmr etmək, qadağan etmək, həvəsləndirmək, yaxud da (günahlardan) çəkindirmək (kimi hökmləri meydana) gətirir. Bu xəbərlərin ravisi doğruluq və əminlik mənbəyi olmadığı, üstəlik onu tanıyan adam onda olan eyibləri bilə-bilə onu tanımayanlara bəyan etmədən o ravidən rəvayət etməyə girişdiyi zaman, bu əməli üzündən günah qazanmış və sıravi müsəlmanlara kələk gəlmiş sayılar. Çünki bu xəbərləri eşidən bəzi adamların bunların hamısından, yaxud bəzisindən istifadə etməsinə arxayın olmaq olmaz. Ehtimal var ki, bunların hamısı və ya əksəriyyəti əsli olmayan yalan (rəvayətlər) olsun. Halbuki etibarlı və qənaətbəxş ravilərin rəvayət etdiyi səhih xəbərlər, etibarsız və qeyri-qənaətbəxş kəslərin nəql etdiyi xəbərlərə ehtiyac duyulmayacaq qədər çoxdur.

Vəsf etdiyimiz zəif hədislərə və məchul isnadlara meyil edəcək, onlardakı qeyri-mötəbərliyi və zəifliyi bildikdən sonra bu rəvayətlərə istinad edəcək insanların çox olacağını güman etmirəm. Lakin insanları onları rəvayət etməyə və onlara istinad etməyə təhrik edən şey, avamların gözündə çox hədis bilən adam kimi görünmək, habelə (barəsində): “Filankəs nə qədər çox hədis toplayıb və nə qədər çox hədis tərtib edib!”– deyilməsi istəyidir. Elmdə hər kim bu məzhəbə uyar və bu yolu tutub gedərsə, elmdən heç bir nəsibi olmaz. Belə olduğu təqdirdə, onun cahil adlandırılması, elm (əhlinə) aid edilməsindən daha münasibdir.

Əsrimizin dırnaqarası mühəddislərindən bəzisi isnadların səhihliyini tədqiq etmək və qüsurlarını araşdırmaq xüsusunda elə söz söyləmişdir ki, əgər biz bunu və bunun fəsadını zikr etməkdən vaz keçsək, bu, sağlam bir fikir və doğru bir yol olar. Çünki atılmış sözdən üz çevirmək, onu tamamilə yox etməkdən və yiyəsinin adını batırmaqdan daha münasib, bundan qafil olanları ayıltmamaq üçün daha əlverişlidir. Lakin biz pis aqibətlərdən, cahillərin bidətlərlə aldanmasından, xətakarların yanlış etiqadlarına və alimlər yanında

dəyərsiz olan sözlərə uymasından narahat olduğumuzda onun sözünün[1] fəsadını üzə çıxartmağı və layiq olduğu şəkildə onu rədd etməyi insanlara daha faydalı və aqibət baxımından inşaAllah daha məqbul olacağını uyğun gördük.

Sözünü danışmağa və düşüncəsinin yanlışlığını xəbər verməyə dair (barəsində) söhbət açdığımız adam iddia edir ki, sənədində "filankəs filankəsdən" sözü keçən hər bir hədisin isnadı belədir: bu iki ravinin bir əsrdə yaşadığı elmi cəhətdən sübuta yetirildiyi təqdirdə, birinin digərindən rəvayət etdiyi o hədisi bu ravinin o birisindən eşitmiş, üstəlik onunla şifahi söhbət etmiş olması mümkündür.

Lakin biz bu ravinin o birisindən (hədis) eşitdiyini bilmirik və heç bir rəvayətdə onların nə vaxtsa görüşdüklərinə, yaxud birinin digərinə hədisi ağızdan söylədiyinə rast gəlməmişik. Bunların öz dövrlərində bir kərə və ya daha çox görüşdüklərinə, yaxud hədisi öz aralarında şifahi olaraq söylədiklərinə dair bir məlumat olmadıqca, yaxud öz dövrlərində bir və ya bir neçə dəfə bir yerdə görüşdüklərini bildirən bir xəbər varid olmadıqca, bu "filankəs filankəsdən" isnadıyla varid olmuş xəbər, onun yanında dəlil-sübut sayılmaz. Və əgər rəvayəti araşdıran şəxsin əlində onların görüşdüklərinə dair bir məlumatı yoxdursa, dostundan rəvayət edənin (heç olmasa) bir dəfə onunla görüşdüyünü və ondan bir şey eşitdiyini xəbər verən səhih bir rəvayət də varid olmamışdırsa, deməк, (hədisini) rəvayət etmək istədiyi ravidən həmin xəbəri nəql etməsinə dair bir dəlili yoxdur. Halbuki vəsf etdiyimiz qaydaya əsasən, bu qəbildən olan rəvayət dəlil sayıla bilər. Nəql edilmiş xəbərə bənzər bir rəvayət içində heç olmasa bir, yaxud iki hədisi ondan eşitdiyi varid olmayınca belə bir xəbər sözü gedən ravinin düşüncəsinə görə "mövquf"[2] sayılır.

---

[1] "Sözünün" deyildikdə qondarma mühəddislərin dedikləri nəzərdə tutulur.

[2] Bu kəlmə ( مَوْقُوفٌ ) ərəbcə «vəqəfə» ( وَقَفَ ) felinin məchul növündən əmələ gəlmiş feli sifətdir və «dayandırılmış» mənasını ifadə edir ("Mocəm əl-Vəsit", səh. 1051).

İstilahi mənada isə – səhabəyə istinad edilən kəlmə, ya hərəkət, ya da təsdiq etmə «mövquf" hədis adlanır. ("Tədrib ər-Ravi", 1/156-158; "Təysir əl-Mustələh əl-Hədis", səh. 130).

## 6-cı fəsil. Muan′inlərin[1] bir-biri ilə görüşməsi mümkün olduğu və aralarında müdəllis[2] olmadığı təqdirdə muan′ən[3] hədisi dəlil gətirməyin səhihliyi

Bax, bu söz – Allah sənə rəhmət eləsin! – isnadlara tənə vurmaq xüsusunda qondarılmış, sonradan meydana gətirilmiş, üstəlik yiyəsindən əvvəl kimsənin demədiyi və elm əhli tərəfindən dəstəyi olmayan bir sözdür. Hədislərdən və rəvayətlərdən anlayışı olan, həm qədim, həm də müasir alimlərin, üzərində ittifaq etdikləri, geniş yayılmış söz belədir: etibar olunası hər bir ravi özü kimi etibarlı bir ravidən hədis rəvayət etdiyi və hər ikisinin eyni əsrdə yaşadığına görə bu ravinin o birisi ilə görüşüb ondan (hədis) eşitməsi caiz və mümkün olduğu üçün, onların görüşmələri və kəlmə kəsmələri barədə qəti bir xəbər varid olmasa belə, bu rəvayət mötəbər sayılır və dəlil-sübut olmağa lazım gəlir. Yalnız burada bu ravinin, hədisini rəvayət etdiyi ravi ilə görüşmədiyinə, yaxud ondan heç bir şey eşitmədiyinə dair açıq-aydın bir dəlilin olması halı istisnadır. Lakin açıqladığımız imkandan istifadə etmək mümkün olmasa, bəyan etdiyimiz (qəti) dəlil-sübut varid olmadıqca həmin rəvayətin eşidilmiş olması ehtimal ediləcəkdir.

Məğzini vəsf etdiyimiz bu sözün sahibinə, yaxud onu dəstəkləyənə belə deyilir: "Sənin sözündən belə çıxır ki, etibarlı tək bir ravinin (digər) etibarlı tək bir ravidən nəql etdiyi xəbər dəlil-sübutdur və ona əməl etmək gərəkdir. Sonra da belə bir şərt əlavə edib deyirsən ki: "Biz o ikisinin bir dəfə və ya daha çox bir-birilə görüşdüyünü, yaxud (bu ravinin) o birisindən bir şey eşit-

---

[1] **Muan'in:** Bu kəlmə ( مُعَنْعِنٌ ) ərəbcə «an'ənə» ( عَنْعَنَ ) felinin məlum növündən əmələ gəlmiş feli sifətdir. Hərfi tərcümədə "filankəs filankəsdən" deyərək bir neçə ravidən rəvayət etmək mənasını ifadə edir və bu üslubla rəvayət edən adama muan'in deyilir (Mocəm əl-Vəsit, 2/631).

İstilahi mənaya gəlincə, "filankəs filankəsdən" deyərək isnaddakı həmin filankəslərin birinin digərindən rəvayət etdiyini, yaxud xəbər verdiyini, yaxud da eşitdiyini açıqlamadan onların adından hədis rəvayət edən adama muan'in deyilir ("əl-İsnad və İləluhu", 1/17).

[2] 62-ci hədisin qeydlərinə bax.

[3] **Muan'ən:** Bu kəlmə ( مُعَنْعَنٌ ) ərəbcə «an'ənə» ( عَنْعَنَ ) felinin məchul növündən əmələ gəlmiş feli sifətdir ("Mocəm əl-Vəsit", 2/631).

İstilahi mənaya gəlincə, "filankəs filankəsdən" deyilərək isnaddakı həmin filankəslərin birinin digərindən rəvayət etdiyi, yaxud xəbər verdiyi, yaxud da eşitdiyi bəyan edilmədən onların adından rəvayət olunmuş hədisə muan'ən deyilir ("əl-İsnad və İləluhu", 1/17).

diyini bilməliyik". Yaxşı, de görüm, sən qoyduğun bu şərti, sözü dəlil olaraq götürüləcək bir kimsənin dediklərində tapa bilərsənmi?! Əks halda, haydı, iddia etdiyin şeyi sübuta yetirmək üçün dəlil gətir.

Əgər xəbərin sübuta yetirilməsi mövzusunda dediyi şərti ona aid etməyə dair sələf alimlərindən birinin sözünü iddia edərsə, ondan bunun isbat edilməsi tələb olunar. Belə olduqda, nə o, nə də qeyrisi bu dəlili ortaya qoymağa bir yol tapa bilməyəcəkdir. Və əgər o, söylədiyi xüsusda əsaslandırılacaq bir dəlil iddia edərsə, (ona): "Bu nə dəlildir?"– deyilər. Əgər o, desə ki: "Mən bunu ona görə dedim ki, həm qədim, həm də yeni xəbərləri nəql edən (bir çox) ravilərin bir-birilərini görmədiyi və bir-birilərindən eşitmədiyi halda, birinin digərindən hədis rəvayət etdiyinin şahidi oldum. Habelə onların öz aralarında beləcə bir-birilərindən eşitmədikləri halda mursəl[1] isnadla hədis rəvayət etməyə icazə verdiklərini gördükdə – halbuki bizim qoyduğumuz qaydaya görə və bu xəbərləri (bilən) elm əhlinin sözünə əsasən mürsəl rəvayətlər dəlil sayılmır – mən də vəsf etdiyim illət[2] üzündən hər bir xəbəri çatdıran ravinin öz ravisindən eşidib-eşitmədiyini araşdırmağa ehtiyac duydum. Əgər mən onların bir-birilərindən cüzi bir şey eşitdiyini taparamsa, artıq birinin digərindən rəvayət etdiyi xəbərlərin hamısı mənim nəzərimdə sübuta yetirilmiş sayılar. Yox əgər görüşdüklərini bilmək xüsusu məndən gizli qalarsa, onda bu xəbəri mövquf hesab edərəm və üstəlik bu xəbərin mürsəl olması mümkün olduğundan, artıq o, mənim nəzərimdə dəlil-sübut sayıla bilməz".

(Bu sözünə cavab olaraq) ona deyilir ki, əgər sənin (hər hansı bir) rəvayəti zəif hesab etməyinin və onu dəlil olaraq qəbul etməkdən vaz keçməyinin səbəbi onun mürsəl olduğu ehtimalıdırsa, onda sənə isnadın əvvəlindən axırınadək (keçən ravilərin bir-birindən) eşitdiyini bilmədikcə muan′ən bir isnadı təsbit etməməyin gərəkdir?!

Bu ona görədir ki, biz "Hişam ibn Urva atasından, o da Aişədən..." isnadı ilə bizə varid olan hədisi (eşidəndə) yəqin bilirik ki, Hişam (onu) öz atasından

---

[1] **Mursəl:** Bu kəlmə ( مُرْسَلٌ ) ərəbcə «ərsələ» ( أَرْسَلَ ) felinin məchul növündən əmələ gəlmiş feli sifətdir. Bu söz göndərilmiş, yollanmış və s. mənaları ifadə edir ("Mocəm əl-Vəsit", səh. 344).

İstilahi mənada isə – bu, o hədisdir ki, isnadının sonunda tabiindən sonra gələn (Peyğəmbərlə ﷺ tabiin arasında olan) ravi buraxılmışdır ("Tədrib ər-Ravi", 1/167; "Təysir Mustələh əl-Hədis", səh. 71).

[2] İllət – hədisin mötəbər olmasında naqislik əmələ gətirən gizlin, anlaşılmaz səbəbdir.

eşitmişdir. Atası da Aişədən eşitmişdir. Həmçinin bilirik ki, Aişə Peyğəmbərdən ﷺ eşitmişdir. Buna baxmayaraq, əgər Hişam öz atasından rəvayət etdiyi hədisdə "eşitdim" və ya "mənə xəbər verdi" deməzsə, həmin rəvayətdə onunla atasının arasında başqa bir adamın olması mümkündür. O, bu rəvayəti atasından eşitmədiyi halda, həmin adam bunu ona atasından xəbər verir. (Demək,) onu mürsəl isnadla rəvayət etmək və hədisini eşitdiyi kimsəyə isnad etməmək istədiyi zaman (bunun olması mümkündür). Bu, Hişamın atasından rəvayət etməsində mümkün olduğu kimi, atasının da Aişədən rəvayət etməsində mümkündür. Eləcə də (ravilərinin) bir-birilərindən eşitdikləri bildirilməyən bir hədisin hər bir isnadı belədir. Bu ravilərin hər birinin öz həmkarından dəfələrlə (hədis) eşitdiyi məlum olmuş olsa da, onlardan hər birinin bəzi rəvayətlərdə aşağı təbəqəyə enib yuxarıdakının başqa bəzi hədislərini həmin aşağıdakı ravidən eşitməsi, üstəlik bəzən hədisi ona danışan ravinin adını söyləmədən onu mürsəl isnadla rəvayət etməsi, bəzən də canfəşanlıq göstərərək hədisini nəql etdiyi ravinin adını çəkməsi və irsaldan[1] vaz keçməsi ehtimal edilir.

Söylədiyimiz bu şeylər mötəbər mühəddislərin və böyük alimlərin gördüyü işlər olaraq (bir çox) hədislərdə mövcuddur. İnşaAllah onların rəvayətlərindən, zikr etdiyimiz mövzuya dəlil gətirilə biləcək hələ neçə-neçə misallar da çəkəcəyəm. Bu qəbildən olan müsallar bunlardır:

Əyyub əs-Sixtiyani, İbn Mübarək, Vəki, İbn Numeyr və bunlardan başqa bir qrup adam Hişam ibn Urvadan, o da atasından, o da Aişədən رضي الله عنها (hədis) rəvayət etmişlər. Aişə رضي الله عنها demişdir: "Mən Rəsulullaha ﷺ istər ehramda[2] olsun, istərsə də olmasın tapa bildiyim ən gözəl ətiri vurardım".

Bu rəvayəti eyni ilə Leys ibn Səd, Davud əl-Əttar, Humeyd ibn əl-Əsvəd, Vuheyb ibn Xalid və Əbu Usamə, Hişamdan rəvayət etmişlər. Hişam belə demişdir: "Mənə Osman ibn Urva, Urvadan, o da Aişədən, o da Peyğəmbərdən ﷺ xəbər vermişdir".

(Yenə) Hişam öz atasından, o da Aişədən rəvayət etmişdir ki, Aişə belə demişdir: "Peyğəmbər ﷺ (məsciddə) etikaf[3] edərkən başını mənim (hücrəmə) daxil edər və mən onun saçlarını darayardım".

---

[1] İrsal – göndərmə, yollama mənasında, klassik ədəbiyyatda işlənən sözdür.

[2] Ehram – hacıların Allahın evini və (Mina, Ərəfat, Müzdəlifə kimi) ətraf yerləri ziyarət müddətində büründükləri tikişsiz xüsusi libas, ziyarət geyimidir.

[3] 684-cü hədisin qeydlərinə bax.

Bu hədisi eynilə Malik ibn Ənəs Zuhridən, o da Urvadan, o da Əmrədən, o da Aişədən, o da Peyğəmbərdən ﷺ rəvayət etmişdir.[1]

Zuhri və Saleh ibn Əbu Həssan, Əbu Sələmədən, o da Aişədən rəvayət etmişlər ki, Peyğəmbər ﷺ oruc tutduğu halda (zövcəsini) öpərdi. Yəhya ibn Əbu Kəsir isə öpmək haqqında (varid olmuş) bu xəbərə dair bunu söyləmişdir: "Mənə Əbu Sələmə (ibn Abdur-Rəhman) xəbər vermişdir. Ona Ömər ibn Abdul-Aziz, ona da Urva, ona da Aişə xəbər vermişdir ki, Peyğəmbər ﷺ oruc tutduğu halda onu öpərdi".

İbn Uyeynə və qeyrisi Amr ibn Dinardan, o da Cabirdən rəvayət etmişdir. Cabir demişdir: "Peyğəmbər ﷺ bizə at əti yedirtmiş, ev eşşəyinin ətini yeməyi isə haram buyurmuşdur".

Həmmad ibn Zeyd, Amrdan, o da Muhəmməd ibn Əlidən, o da Cabirdən, o da Peyğəmbərdən ﷺ rəvayət etmişdir.

Rəvayətlər içində bu qəbil şeylər çoxdur. Bunları birbəbir sadalamaq çox vaxt aparar. Fəqət bizim gətirdiyimiz misallar ağıl sahiblərinə kifayət edər.

Bir qədər əvvəl sözünü vəsf etdiyimiz kimsənin fikrinə görə, bir ravinin (hədisi) digərindən eşitdiyi bəlli olmadığı təqdirdə, hədisin qeyri-mötəbər və zəif hesab edilməsi xüsusundakı nöqsan, ancaq hədisdəki irsal ehtimalı olarsa, onda ona – öz sözünə əsasən – hədisini rəvayət etdiyi kimsədən eşitdiyi bəlli olan kəslərin rəvayətlərini dəlil gətirməkdən vaz keçməsi lazım gələr. Yalnız isnadında (bir ravinin digərindən) eşitdiyi yəqin bilinən xəbərlər müstəsnadır.

Bir az əvvəl xəbərləri nəql edən imamlar barədə (danışıb) bəyan etdik ki, onlar bəzən hədisi mürsəl isnadla rəvayət edir və onu kimdən eşitdiklərini zikr etmir, bəzən də bu xüsusda səy göstərib hədisi eşitdikləri tərzdə isnad edir və əgər (ravilər) enmişlərsə, enişi, yüksəlmişlərsə, yüksəlişi[2] olduğu kimi xəbər verirlər. (Əvvəldə) biz onların halı barədə müfəssəl danışdıq. Xəbərlərdən istifadə edən və sənədlərin səhihliyini və zəifliyini araşdıran Əyyub əs-Sixtiyani, İbn

---

[1] İsnaddan açıq-aydın görünür ki, Urva ilə Aişənin رضي الله عنها arasında Əmrə adlı bir ravi vardır.

[2] Burada imam Muslim "eniş" deyəndə (ravinin hər hansı bir hədisi) həmkarlarından, eyni təbəqədə və ondan da aşağı dərəcədə olan mühəddislərdən, yaxud isnadı daha ali və (silsiləsindəki) ravilərin sayı daha az olan sənədlə rəvayət etməsini nəzərdə tutur. "Yüksəliş" deyəndə isə (hədisin) Peyğəmbərə ﷺ daha yaxın olan – (silsiləsindəki) ravilərin sayı daha az olan ali sənədlə və ya tanınmış imamdan rəvayət edilməsini nəzərdə tutur ("İkmal əl-Mulim Şərh Səhih Muslim", 1/138).

Aun, Malik ibn Ənəs, Şobə ibn Həccac, Yəhya ibn Səid əl-Qəttan, Abdur-Rəhman ibn Mehdi kimi sələf imamlarından və onlardan sonrakı hədis alimlərindən heç birinin, bir az əvvəl sözünü vəsf etdiyimiz adamın iddia etdiyi qaydada isnadlardakı (ravilərin) eşidib-eşitmədiyini araşdırmış olduğunu bilmirik.

Hədis ravilərinin hədisi rəvayət etdikləri kimsələrdən eşidib-eşitmədiyini araşdıranlar, ancaq o zaman araşdırma aparardılar ki, ravi mühəddislər arasında müdəllis kimi tanınmış və ya bu sifətlə şöhrət qazanmış olsun. Belə olduğu təqdirdə (tədqiqatçılar), bu qəbil ravilərin adından tədlis bədnamlığının tamamilə silinməsi üçün onun bu rəvayəti eşidib-eşitmədiyini axtarır və bunu ciddiyyətlə araşdırırlar.

Hər kim sözünü nəql etdiyimiz kişinin iddia etdiyi tərzdə müdəllis olmayan bir ravidən belə bir şərt tələb edərsə, (bilsin ki,) biz adlarını söylədiyimiz və söyləmədiyimiz (məşhur) imamların heç birindən belə bir şey eşitməmişik. (Aşağıdakı rəvayəti) buna misal çəkmək olar:

Peyğəmbəri ﷺ görmüş Abdullah ibn Yezid əl-Ənsari, həm Huzeyfədən, həm də Əbu Məsud əl-Ənsaridən (hədis) rəvayət etmiş və onların hər birindən rəvayət etdiyi hədisi Peyğəmbərə ﷺ isnad etmişdir. Halbuki Abdullah ibn Yezidin o iki səhabədən danışdığı rəvayətində onlardan eşitdiyi bildirilməmişdir. Həmçinin rəvayətlərdən heç birində Abdullah ibn Yezidin (hər hansı) bir hədis barəsində Huzeyfə və Əbu Məsud ilə kəlmə kəsdiyini əsla hifz etməməşik. Və heç bir rəvayətdə Abdullahın onları əyani surətdə gördüyünün zikr edildiyinə rast gəlməmişik.

Nə keçmiş, nə də indiki alimlərin heç birindən Abdullah ibn Yezidin Huzeyfədən və Əbu Məsuddan rəvayət etdiyi bu iki xəbər xüsusunda Abdullahı zəiflikdə ittiham etdiyini eşitməmişik. Əksinə, bu iki rəvayət və buna bənzər rəvayətlər gördüyümüz hədis alimlərinin nəzərində səhih və tutarlı isnadlardan sayılırlar. Onlar bu isnadla nəql edilmiş xəbərlərin istifadə olunmasını, bu qəbildən olan hədisləri və əsərləri dəlil götürməyi məqsədəuyğun hesab edirlər. Halbuki bu isnadlar az öncə sözünü nəql etdiyimiz kimsənin iddiasına görə, ravinin (hədisi) rəvayət etdiyi kimsələrdən eşitməsi təsdiq edilməyincə zəif və qeyri-mötəbər sayılırlar.

Və əgər bu fikri yürüdən adamın iddiasına görə zəif xəbərləri elm əhli yanında səhih sayılan xəbərlərlə bərabər tutmağa qalxsaydıq, onların hamısını

bir-bir sadalamaqdan və bir yerə cəm etməkdən aciz qalardıq. Lakin biz barəsində susduğumuz bu cür şeylər üçün bir əlamət olacaq ədədi göz qabağına qoymaq istədik.

Bax, Əbu Osman ən-Nəhdi və Əbu Rafi əs-Saiğ – hər ikisi həm cahiliyyət dövrünü görmüş, həm də Peyğəmbərin ﷺ Bədr döyüşündə iştirak etmiş və başqa neçə-neçə səhabəsi ilə həmsöhbət olmuş və onlardan hədislər rəvayət etmişlər. Hətta Əbu Hureyrə, İbn Ömər və onların bənzərlərinə qədər enmişlər. Onların[1] hər biri Ubey ibn Kəbdən, o da Peyğəmbərdən ﷺ hədis rəvayət etmişdir. Halbuki biz heç bir rəvayətdə açıq-aşkar onların Ubeyi gördüklərinə və ya ondan bir şey eşitdiklərinə rast gəlməmişik.

Cahiliyyət dövrünü görmüş və Peyğəmbərin ﷺ dövründə (tanınmış) bir şəxsiyyət olmuş Əbu Amr əş-Şeybani və bir də Əbu Məmər Abdullah ibn Şəcərə – bunların hər biri Əbu Məsud əl-Ənsariyə istinad edərək Peyğəmbərdən ﷺ iki hədis rəvayət etmişlər.

Ubeyd ibn Umeyr Peyğəmbərin ﷺ zövcəsi Ummu Sələməyə istinad edərək Peyğəmbərdən ﷺ bir hədis rəvayət etmişdir. Halbuki Ubeyd ibn Umeyr Peyğəmbərin ﷺ zamanında dünyaya gəlmişdir.

Peyğəmbərin ﷺ dövründə yaşamış Qeys ibn Əbu Hazim Əbu Məsud əl-Ənsariyə istinad edərək Peyğəmbərdən ﷺ üç hədis rəvayət etmişdir.

Ömər ibn Xəttabdan رضي الله عنه (hədislər) əzbərləmiş və Əlinin رضي الله عنه dostu olmuş Abdur-Rəhman ibn Əbu Leyla Ənəs ibn Malikə istinad edərək Peyğəmbərdən ﷺ bir hədis rəvayət etmişdir.

Ribi ibn Hiraş İmran ibn Husaynə istinad edərək Peyğəmbərdən ﷺ iki hədis, bir də Əbu Bəkrəyə istinad edərək Peyğəmbərdən ﷺ bir hədis rəvayət etmişdir. Halbuki Ribi Əli ibn Əbu Talibdən (hədis) eşitmiş və ondan rəvayət etmişdir.

Nafi ibn Cubeyr ibn Mutim Əbu Şureyh əl-Xuzaiyə istinad edərək Peyğəmbərdən ﷺ bir hədis rəvayət etmişdir.

Nomən ibn Əbu Ayyaş Əbu Səid əl-Xudriyə istinad edərək Peyğəmbərdən ﷺ üç hədis rəvayət etmişdir.

Əta ibn Yezid əl-Leysi Təmim əd-Dariyə istinad edərək Peyğəmbərdən ﷺ bir hədis rəvayət etmişdir.

---

[1] Söhbət Əbu Osman ən-Nəhdi və Əbu Rafi əs-Saiğdən gedir.

Süleyman ibn Yəsar Rafi ibn Xədicə istinad edərək Peyğəmbərdən ﷺ bir hədis rəvayət etmişdir.

Humeyd ibn Abdur-Rəhman əl-Himyəri Əbu Hureyrəyə istinad edərək Peyğəmbərdən ﷺ bir çox hədislər rəvayət etmişdir.

Bax, adlarını çəkdiyimiz səhabələrdən (nəql etdikləri) rəvayətlərini sübuta yetirdiyimiz bu tabiinlərin hamısının nə onlardan (hədis) eşitdikləri açıq-aydın bir rəvayətdə göstərilmiş, nə də ki onlarla görüşdükləri açıq-aydın bir xəbərdə varid olmuşdur. (Buna rəğmən) bunların hamısı xəbərləri və rəvayətləri bilənlər yanında səhih isnadlardan sayılır. O alimlərin bu isnadlardan hər hansı birini zəif hesab etdiklərini və bu isnadlardakı ravilərin bir-birindən eşidib-eşitmədiyini araşdırdıqlarını da bilmirik. Belə ki, bu ravilərin eyni əsrdə yaşadıqlarından dolayı, onların hər birinin öz dostundan (hədis) eşitmiş olması mümkündür və bu imkan da rəddedilməzdir.

(Bir qədər əvvəl) barəsində söhbət açdığımız adamın vəsf etdiyi nöqsan səbəbilə hədisi zəif hesab etmək xüsusunda uydurduğu bu sözü müzakirə etməyə və onun haqqında danışmağa dəyməz. Çünki bu, qədim alimlərdən heç birinin söyləmədiyi, onlardan sonra yaşamış kimsələrin də münkər saydığı uydurma bir söz və yöndəmsiz bir kəlamdır. Elə buna görə də onu rədd etmək xüsusunda verdiyimiz açıqlamadan artıq şərh etməyə ehtiyacımız yoxdur. Çünki bu sözün və onun yiyəsinin dəyəri elə vəsf etdiyimiz qədərdir.

Alimlərin yoluna müxalif olan fikirləri dəf etmək üçün kömək diləniləcək və təvəkkül ediləcək (varlıq) yalnız Allahdır.

بِسۡمِ ٱللَّهِ ٱلرَّحۡمَٰنِ ٱلرَّحِيمِ

*Mərhəmətli və Rəhmli Allahın adı ilə!*

# ١ – كِتابُ الإيمان

# 1 – İman kitabı

## (١) – بَابُ بَيَانِ الإِيمَانِ وَالإِسْلاَمِ وَالإِحْسَانِ وَوُجُوبِ الإِيمَانِ بِإِثْبَاتِ قَدَرِ اللَّهِ سُبْحَانَهُ وَتَعَالَى، وَبَيَانِ الدَّلِيلِ عَلَى التَّبَرِّي مِمَّنْ لاَ يُؤْمِنُ بِالقَدَرِ وَإِغْلاَظِ القَوْلِ فِي حَقِّهِ

قَالَ الإِمَامُ أَبُو الْحُسَيْنِ مُسْلِمُ بْنُ الْحَجَّاجِ الْقُشَيْرِيُّ رَحِمَهُ اللَّهُ: بِعَوْنِ اللَّهِ نَبْتَدِئُ وَإِيَّاهُ نَسْتَكْفِي وَمَا تَوْفِيقُنَا إِلاَّ بِاللَّهِ جَلَّ جَلاَلُهُ:

## 1-ci fəsil. İman,[1] İslam[2] və ehsanın bəyan olunması, bütün eyib və nöqsanlardan xali olan Uca Allahın qəzavü-qədərinə iman gətirməyin

[1] İmanın tərifi: İmam Əbul-Huseyn Əli ibn Xələf ibn Bəttal əl-Maliki əl-Məğribi "Səhih əl-Buxari"ni şərh edərkən demişdir: "Sələflərdən və xələflərdən (keçmiş və indiki nəsildən) olan əhli-sünnə alimləri ittifaq etmişlər ki, iman həm sözdür, həm də əməldir, həm artır, həm də azalır. İmanın artıb-azalmasına sübut isə Buxarinin ("Səhih" əsərində) dəlil gətirdiyi ayələrdir: **"Mömінlərin imanı üstünə iman artırmaq üçün onların qəlbinə rahatlıq göndərən Odur"** (əl-Fəth, 4); **"Onlar Rəbbinə iman gətirmiş gənclər idi. Biz də onların hidayətini artırdıq"** (əl-Kəhf, 13); **"Allah doğru yolda olanların hidayətini artırar"** (Məryəm, 76); **"Doğru yolla gedənlərə gəldikdə isə, *Allah* onlara hidayətini artırar və onları təqvalı olmağa müvəffəq edər"** (Muhəmməd, 17); **"...iman gətirənlərin imanı artsın"** (əl-Muddəssir, 31); **"İman gətirənlərə gəldikdə isə, *o surə* onların imanını artırır"** (ət-Tovbə, 124); **"*Bəzi* adamlar** (möminlərə)**: "Camaat sizə qarşı *ordu* toplayıbdır, onlardan qorxun!"– dedilər. Bu, onların imanını daha da artırdı..."** (Ali-İmran, 173); **"Bu, onların yalnız imanını və itaətini artırdı"** (əl-Əhzab, 22) Nəvəvi, 1/103.

İbn Həcər "Fəth əl-Bari" əsərində iman kəlməsini belə izah etmişdir: "Sələflər demişlər: "İman, qəlb ilə təsdiq etmək, dil ilə tələffüz etmək və bədən əzaları ilə əməl etmək deməkdir". (Yəni "Lə ilahə illəllah, Muhəmmədun Rəsulullah" deyən adam, bunu təkcə dili ilə deyil, qəlbi ilə də Allahdan başqa ibadətə layiq məbudun olmadığına və Muhəmmədin Onun elçisi olduğuna etiqad etməli, Allahın və Onun rəsulunun buyuruqlarını yerinə yetirməli və qadağan etdikləri əməllərdən çəkinməlidir.) Sələflər demək istəmişlər ki, əməllər imanın kamil olması üçün şərtdir. Elə buradan da imanın artıb-azalması məsələsi ortaya çıxmışdır" 1/46.

[2] İslam: lüğəti mənada ram olmaq, boyun əymək, itaət etməkdir, istilahi mənada isə, Allahın tək məbud olduğunu qəbul etmək, Ona boyun əyərək itaət etmək, şirkdən uzaq olmaq və müşriklərə nifrət etmək deməkdir. Uca Allah buyurur: **"De: "Şübhəsiz ki, mənim namazım da, qurbanım da, həyatım da, ölümüm də aləmlərin Rəbbi Allah üçündür! Onun heç bir şəriki yoxdur. Mənə belə buyurulmuşdur və mən müsəlmanların birincisiyəm"** (əl-Ənam, 162-163); **"İslamdan başqa bir din axtaran şəxsdən, o *din* heç vaxt qəbul olunmaz və o, axirətdə ziyana uğrayanlardan olar"** (Ali-İmran, 85). "Usulul-İman", 1/338.

**vacibliyi, habelə qədərə[1] inanmayan kimsədən uzaq olmağa və onun haqqında ağır söz söyləməyə dair dəlilin bəyan edilməsi**

İmam Əbul-Huseyn Muslim ibn Həccac əl-Quşeyri – Allah ona rəhmət eləsin – demişdir: "Yalnız Allahın köməyi ilə başlayır və (hər bir işdə) yalnız Ona arxayın oluruq. (Yaxşı işlər görməyə) müvəffəq olmağımız da ancaq və ancaq Uca və Ulu Allahın istəyi ilədir".

**[٩٣] ١**–(٨) حَدَّثَنِي أَبُو خَيْثَمَةَ زُهَيْرُ بْنُ حَرْبٍ: حَدَّثَنَا وَكِيعٌ عَنْ كَهْمَسٍ، عَنْ عَبْدِ اللَّهِ بْنِ بُرَيْدَةَ، عَنْ يَحْيَى بْنِ يَعْمَرَ، ح: و حَدَّثَنَا عُبَيْدُ اللَّهِ بْنُ مُعَاذٍ الْعَنْبَرِيُّ، وَهَذَا حَدِيثُهُ: حَدَّثَنَا أَبِي: حَدَّثَنَا كَهْمَسٌ، عَنْ ابْنِ بُرَيْدَةَ، عَنْ يَحْيَى بْنِ يَعْمَرَ قَالَ: كَانَ أَوَّلَ مَنْ قَالَ فِي الْقَدَرِ بِالْبَصْرَةِ مَعْبَدٌ الْجُهَنِيُّ، فَانْطَلَقْتُ أَنَا وَحُمَيْدُ بْنُ عَبْدِ الرَّحْمَنِ الْحِمْيَرِيُّ حَاجَّيْنِ أَوْ مُعْتَمِرَيْنِ فَقُلْنَا: لَوْ لَقِينَا أَحَدًا مِنْ أَصْحَابِ رَسُولِ اللَّهِ ﷺ فَسَأَلْنَاهُ عَمَّا يَقُولُ هَؤُلَاءِ فِي الْقَدَرِ، فَوُفِّقَ لَنَا عَبْدُ اللَّهِ بْنُ عُمَرَ بْنِ الْخَطَّابِ دَاخِلاً الْمَسْجِدَ، فَاكْتَنَفْتُهُ أَنَا وَصَاحِبِي، أَحَدُنَا عَنْ يَمِينِهِ وَالآخَرُ عَنْ شِمَالِهِ، فَظَنَنْتُ أَنَّ صَاحِبِي سَيَكِلُ الْكَلَامَ إِلَيَّ، فَقُلْتُ: يَا أَبَا عَبْدِ الرَّحْمَنِ! إِنَّهُ قَدْ ظَهَرَ قِبَلَنَا نَاسٌ يَقْرَءُونَ الْقُرْآنَ وَيَتَقَفَّرُونَ الْعِلْمَ – وَذَكَرَ مِنْ شَأْنِهِمْ –، وَأَنَّهُمْ يَزْعُمُونَ أَنْ لاَ قَدَرَ، وَأَنَّ الأَمْرَ أُنُفٌ قَالَ: فَإِذَا لَقِيتَ أُولَئِكَ فَأَخْبِرْهُمْ أَنِّي بَرِيءٌ مِنْهُمْ، وَأَنَّهُمْ بُرَآءُ مِنِّي، وَالَّذِي يَحْلِفُ بِهِ عَبْدُ اللَّهِ بْنُ عُمَرَ! لَوْ أَنَّ لأَحَدِهِمْ مِثْلَ أُحُدٍ ذَهَبًا فَأَنْفَقَهُ، مَا قَبِلَ اللَّهُ مِنْهُ حَتَّى يُؤْمِنَ بِالْقَدَرِ، ثُمَّ قَالَ: حَدَّثَنِي أَبِي عُمَرُ بْنُ الْخَطَّابِ قَالَ: بَيْنَمَا نَحْنُ عِنْدَ رَسُولِ اللَّهِ ﷺ ذَاتَ يَوْمٍ، إِذْ طَلَعَ عَلَيْنَا رَجُلٌ شَدِيدُ بَيَاضِ الثِّيَابِ، شَدِيدُ سَوَادِ الشَّعَرِ، لاَ يُرَى عَلَيْهِ أَثَرُ السَّفَرِ، وَلاَ يَعْرِفُهُ مِنَّا أَحَدٌ، حَتَّى جَلَسَ إِلَى النَّبِيِّ ﷺ. فَأَسْنَدَ رُكْبَتَيْهِ إِلَى رُكْبَتَيْهِ، وَوَضَعَ كَفَّيْهِ عَلَى فَخِذَيْهِ، وَقَالَ: يَا مُحَمَّدُ! أَخْبِرْنِي عَنْ الإِسْلَامِ؟ فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: ((الإِسْلَامُ أَنْ تَشْهَدَ أَنْ لاَ إِلَهَ إِلاَّ اللَّهُ وَأَنَّ مُحَمَّدًا رَسُولُ اللَّهِ ﷺ، وَتُقِيمَ الصَّلَاةَ، وَتُؤْتِيَ الزَّكَاةَ، وَتَصُومَ رَمَضَانَ، وَتَحُجَّ الْبَيْتَ إِنْ اسْتَطَعْتَ إِلَيْهِ سَبِيلاً)) قَالَ: صَدَقْتَ. قَالَ: فَعَجِبْنَا لَهُ، يَسْأَلُهُ وَيُصَدِّقُهُ. قَالَ: فَأَخْبِرْنِي عَنْ الإِيمَانِ؟ قَالَ: ((أَنْ تُؤْمِنَ بِاللَّهِ، وَمَلَائِكَتِهِ، وَكُتُبِهِ، وَرُسُلِهِ، وَالْيَوْمِ الآخِرِ، وَتُؤْمِنَ بِالْقَدَرِ خَيْرِهِ وَشَرِّهِ)) قَالَ: صَدَقْتَ. قَالَ: فَأَخْبِرْنِي عَنْ الإِحْسَانِ؟ قَالَ: ((أَنْ تَعْبُدَ اللَّهَ كَأَنَّكَ تَرَاهُ، فَإِنْ لَمْ تَكُنْ تَرَاهُ، فَإِنَّهُ يَرَاكَ)) قَالَ: فَأَخْبِرْنِي عَنْ السَّاعَةِ؟ قَالَ: ((مَا الْمَسْئُولُ عَنْهَا بِأَعْلَمَ مِنْ السَّائِلِ)) قَالَ: فَأَخْبِرْنِي عَنْ أَمَارَتِهَا؟ قَالَ: ((أَنْ تَلِدَ الأَمَةُ رَبَّتَهَا، وَأَنْ تَرَى الْحُفَاةَ الْعُرَاةَ، الْعَالَةَ، رِعَاءَ الشَّاءِ، يَتَطَاوَلُونَ فِي الْبُنْيَانِ)) قَالَ: ثُمَّ انْطَلَقَ، فَلَبِثْتُ مَلِيًّا، ثُمَّ قَالَ لِي: ((يَا عُمَرُ! أَتَدْرِي مَنْ السَّائِلُ؟)) قُلْتُ: اللَّهُ وَرَسُولُهُ أَعْلَمُ. قَالَ: ((فَإِنَّهُ جِبْرِيلُ أَتَاكُمْ يُعَلِّمُكُمْ دِينَكُمْ)).

---

[1] Tale, qismət, alın yazısı, müqəddərat. Uca Allah buyurur: **"Şübhəsiz ki, biz hər şeyi qədərincə yaratdıq"** ("əl-Qəmər" surəsi, 49).

**[93]-1-(8)** ........ Yəhya ibn Yəmər demişdir: "İlk dəfə qədər xüsusunda (küfr) danışan adam Bəsrədə[1] (yaşayan) Məbəd əl-Cuhəni olmuşdur.[2] (O vaxt) mən və Humeyd ibn Abdur-Rəhman əl-Himyəri həcc yaxud ümrə ziyarətinə getdik və: "Kaş Rəsulullahın ﷺ səhabələrindən birinə rast gələydik və ondan bunların qədər haqqında söylədiklərini soruşaydıq"– dedik.[3] (Nəhayət, gəlib) məscidə girdikdə Abdullah ibn Ömər ibn Xəttabı görməyə müvəffəq olduq. Mən dostumla birgə – birimiz sağına, digərimiz də soluna keçərək onun yanına düşüb getdik. Dostumun sözü mənə verəcəyini düşünüb dedim: "Ey Əbu Abdur-Rəhman![4] Bizim tərəflərdə Quran oxuyan və elm öyrənməyə səy göstərən (qədər xüsusunda bəlli edilməmiş məsələləri araşdırmağa çalışan) bir dəstə adam peyda olub. (Yəhya ibn Yəmər onları vəsf etdikdən sonra dedi:)[5] Onlar iddia edirlər ki, qəzavü-qədər cəfəngiyatdır və Allah (bütün) işlərdən yalnız baş verdiyi an xəbər tutur". (İbn Ömər) dedi: "Onları görsən, deyərsən ki, mən onlardan uzağam, onlar da məndən uzaqdırlar. Abdullah ibn Ömərin and içdiyi Allaha and olsun ki, əgər onlardan birinin Uhud dağı[6] boyda qızılı olsaydı və o bunu (Allah yolunda) xərcləsəydi, qədərə iman gətirməyincə Allah bunu ondan qəbul etməzdi".[7]

Sonra (ibn Ömər) dedi: "Atam Ömər ibn Xəttab mənə rəvayət edib demişdir: "Bir dəfə biz Peyğəmbərin ﷺ yanında oturmuşduq. Birdən ağappaq pal-

---

[1] Səmani demişdir: "Bəsrə İslamın qübbəsi və ərəblərin xəzinəsi sayılır. Bu şəhər Ömər ibn Xəttabın ؓ xilafəti dövründə Peyğəmbərin ﷺ Utbə ibn Ğəzvan ؓ adlı səhabəsi tərəfindən təsis edilmişdir. O, bu şəhərin binasını hicrətin 17-ci ilində qoymuş və 18-ci ilində insanlar oraya köçməyə başlamışlar..."

[2] Məbəd ibn Xalid əl-Cuhəni Allahın əzəldən yazdığı qədəri inkar etməklə dinə yenilik gətirmiş, beləliklə də, haqq yolda olan möminlərə müxalif olmuşdur. Bundan sonra "qədərilər" firqəsi meydana gəlmişdir. Onlar hər şeyin müqəddəratının Allah tərəfindən əzəldən müəyyən edildiyini inkar etmiş və Allahın gələcəkdə baş verəcək hadisələrdən xəbərsiz olduğunu iddia etmişlər. Peyğəmbər ﷺ demişdir: "Bu ümmətin məcusiləri Allahın qədərini inkar edən kəslərdir. Əgər xəstələnsələr, onlara baş çəkməyin, ölsələr, onların dəfnində iştirak etməyin" ("Sunən Əbu Davud", 4691).

[3] Buradan açıq-aydın görünür ki, tabiinlər əqidəyə və ya başqa bir şeyə aid olan qəliz məsələlərin hökmünü öyrənmək üçün səhabələrə müraciət edərdilər. Deməк, hər bir müsəlman öz dinini öyrənmək üçün bu dini bilən səhabələrə və onların yolunda olan alimlərə müraciət etməlidir.

[4] Əbu Abdur-Rəhman, Abdullah ibn Ömərin ؓ kunyəsidir.

[5] Çox güman ki, bu, hədisi danışan ravinin – ibn Bureydənin sözüdür.

[6] Mədinədə məşhur dağ. Onun yaxınlığında hicri təqviminin 3-cü ilində Məkkə bütpərəstləri ilə müsəlmanlar arasında irimiqyaslı döyüş baş vermişdir.

[7] İbn Ömərin ؓ bu sözü "qədərilərin" kafir olduğuna dəlalət edir. Qazı İyad ؒ demişdir: "O dövrdəki "qədərilər" Allahın hər şeyi bildiyini inkar edirdilər. Buna etiqad edən kəs, heç şübhəsiz ki, kafir sayılır. Qədəri inkar edən bu şəxslər isə məhz filosoflardır".

tarlı, zil qara saçlı, üst-başında da səfərdən bir əsər-əlamət görünməyən və heç birimizin tanımadığı bir adam yanımıza gəldi. Nəhayət, o yaxınlaşıb Peyğəmbərlə ﷺ üzbəüz oturdu, dizlərini onun dizlərinə dayadı, əllərini də öz budunun üstünə qoyub dedi: "Ey Muhəmməd, mənə İslam haqqında xəbər ver!" Peyğəmbər ﷺ buyurdu: "İslam (odur ki,) Allahdan başqa (haqq) məbud olmadığına və Muhəmmədin Onun elçisi olduğuna şəhadət gətirəsən, namaz qılasan, zəkat verəsən,[1] ramazan[2] ayını oruc tutasan və imkanın olduğu təqdirdə Kəbəni[3] ziyarət edəsən". Adam: "Doğru söylədin!"– dedi.

(Ömər ibn Xəttab dedi:) "Biz ona təəccüb etdik, o həm soruşur, həm də təsdiq edirdi. Sonra o dedi: "Mənə iman haqqında xəbər ver". Peyğəmbər ﷺ buyurdu: "(İman odur ki,) Allaha, Onun mələklərinə, kitablarına, elçilərinə və Axirət gününə iman gətirəsən, habelə qədərə – onun xeyrinə və şərinə iman gətirəsən". Adam: "Doğru söylədin!"– dedi. (Sonra) soruşdu: "Mənə ehsan haqqında xəbər ver". Peyğəmbər ﷺ buyurdu: "(Ehsan odur ki,) Allaha, sanki Onu görürmüşsən kimi ibadət edəsən. Sən Onu görməsən də, (bil ki,) O səni görür". Adam soruşdu: "Mənə Qiyamət saatı haqqında xəbər ver". Peyğəmbər ﷺ buyurdu: "Bu haqda soruşulan soruşandan çox bilmir".[4] Adam soruşdu: "Mənə onun əlamətləri haqqında xəbər ver". Peyğəmbər ﷺ buyurdu: "(O

---

[1] Varlı müsəlmanlar tərəfindən hər il ödənilən var-dövlətin bir hissəsidir. O, qoyulmuş qayda-qanunlara müvafiq olaraq, müəyyən dərəcələrə bölünmüş adamlardan alınır və "ət-Tovbə" surəsinin 60-cı ayəsində zikr olunmuş insanlara verilir.

[2] Ay təqviminin doqquzuncu ayıdır. Bu ay ərzində müsəlmanlar *fərz* olan oruc tuturlar. Bu ayda müqəddəs Quran nazil edilmişdir və bu ayda Böyük Bədr döyüşü baş vermişdir.

[3] İbrahim عليه السلام və onun oğlu İsmail عليه السلام peyğəmbərin ucaltdığı daş tikili. Bu, Allaha ibadət etmək üçün yer üzündə tikilən ilk məbəd olmuşdur. Bütün müsəlmanlar namaz qılarkən üzlərini ona doğru çevirirlər və hər il milyonlarla müsəlman yaşadığı ölkədən Məkkəyə gələrək onu ziyarət edir, qədim ibadətgahın ətrafına dolanırlar.

[4] Uca Allah buyurur: **"Səndən Qiyamət saatı barəsində soruşurlar ki, nə vaxt qopacaq? De: "Bu haqda bilgi ancaq Rəbbimə aiddir. *Qopacağı* vaxtı, yalnız O aşkara çıxara bilər. *Bu bilgi* göylərə və yerə də ağır gəlir. O *saat* sizə qəflətən gələcəkdir". Sanki onu bilirmişsən kimi səndən soruşurlar. De: "Bu haqda bilgi ancaq Allaha aiddir. Lakin insanların çoxu *bunu* bilmir". De: "Mən Allahın istədiyindən başqa, özümə nə bir fayda, nə də bir zərər yetirməyə qadir deyiləm. Əgər qeybi bilsəydim, əlbəttə, *özüm üçün* xeyir artırardım və mənə pislik toxunmazdı. Mən sadəcə, iman gətirən bir qövm üçün qorxudan və müjdələyən *bir peyğəmbərəm*"** ("əl-Əraf" surəsi, 187).

Bundan belə nəticə çıxır ki, alim, mufti və qeyriləri bilmədiyi bir şey haqqında soruşulduqda: "Bilmirəm"– deyə cavab verməlidir. Bu da onun əsl dindar, Allahdan qorxan və elmli bir şəxsiyyət olduğuna dəlalət edir.

vaxt) ki, cariyə[1] öz ağasını dünyaya gətirəcək[2] və sən ayaqyalın, çılpaq və kasıb çobanların hündür binalar tikməkdə yarışdıqlarını görəcəksən".

Ömər dedi: "Sonra o çıxıb getdi. Mən bir müddət (yerimdəcə) donub qaldım. Sonra Peyğəmbər ﷺ məndən soruşdu: "Ey Ömər, sual verənin kim olduğunu bilirsənmi?" Mən: "Allah və Onun rəsulu daha yaxşı bilir!"– dedim. Peyğəmbər ﷺ buyurdu: "O, Cəbrail idi. Sizə dininizi[3] öyrətməyə gəlmişdi".

**[٩٤] ٢**–(...) حَدَّثَنِي مُحَمَّدُ بْنُ عُبَيْدٍ الْغُبَرِيُّ وَأَبُو كَامِلٍ الْجَحْدَرِيُّ وَأَحْمَدُ بْنُ عَبْدَةَ الضَّبِّيُّ قَالُوا: حَدَّثَنَا حَمَّادُ بْنُ زَيْدٍ عَنْ مَطَرٍ الْوَرَّاقِ، عَنْ عَبْدِ اللَّهِ بْنِ بُرَيْدَةَ، عَنْ يَحْيَى بْنِ يَعْمَرَ قَالَ: لَمَّا تَكَلَّمَ مَعْبَدٌ بِمَا تَكَلَّمَ بِهِ فِي شَأْنِ الْقَدَرِ، أَنْكَرْنَا ذَلِكَ، قَالَ: فَحَجَجْتُ أَنَا وَحُمَيْدُ بْنُ عَبْدِ الرَّحْمَنِ الْحِمْيَرِيُّ حَجَّةً، وَسَاقُوا الْحَدِيثَ بِمَعْنَى حَدِيثِ كَهْمَسٍ وَإِسْنَادِهِ، وَفِيهِ بَعْضُ زِيَادَةٍ وَنُقْصَانُ أَحْرُفٍ.

**[94]-2-(...)** ........ Yəhya ibn Yəmər demişdir: "Məbəd qədər barəsində (əsassız) şeylər danışdığı zaman biz bunu inkar etdik. Sonra mən və Humeyd ibn Abdur-Rəhman əl-Himyəri həcc ziyarətinə getdik....."

(Rəvayətçilər) bu hədisi[4] (yuxarıda keçən) Kəhməsin hədisinə yaxın mənada, həm də onun istinad etdiyi isnadla[5] rəvayət etmişlər. Hədisdə bəzi əlavələr və hərf naqislikləri vardır.

**[٩٥] ٣**–(...) و حَدَّثَنِي مُحَمَّدُ بْنُ حَاتِمٍ: حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ الْقَطَّانُ: حَدَّثَنَا عُثْمَانُ بْنُ غِيَاثٍ: حَدَّثَنَا عَبْدُ اللَّهِ بْنُ بُرَيْدَةَ عَنْ يَحْيَى بْنِ يَعْمَرَ وَحُمَيْدِ بْنِ عَبْدِ الرَّحْمَنِ قَالاَ: لَقِينَا عَبْدَ اللَّهِ بْنَ عُمَرَ، فَذَكَرْنَا

---

[1] Cariyə – keçmiş zamanlarda azadlıqdan məhrum edilən, pulla alınıb-satıla bilən, hər cəhətdən sahibinin arzularına tabe olan qız və ya qadındır.

[2] Cariyənin öz ağasından dünyaya gətirdiyi uşaq böyüyüb anasına ağalıq edəcək.

[3] Hədisdən görünür ki, iman, İslam və ehsan – bunların hamısı din adlanır. Bilin ki, bu hədis bir çox elmləri, bilikləri, ədəb qaydalarını və digər incə məsələləri özündə cəm edir. Əslində, bu, İslamın təməlidir. Qazı İyad ﷺ demişdir: "Bu hədis imanın əslinə, aşkarda görülən işlərə, gizlində səmimi olmağa və günah işlərdən çəkinməyə dair bütün zahiri və batini ibadətlərin yerinə yetirilməsini açıqlayır, hətta şəriət elmlərinin hamısını özündə cəm edir".

[4] Muhəmməd Peyğəmbərin ﷺ dediyi, etdiyi və ya bəyəndikləri haqqında rəvayət. Hədislər onları nəql edən *ravilərin* silsiləsindən və mətndən ibarətdir. Hədisin səhih və etibarlı olması, onu nəql edən ravilərin silsiləsinin etibarlılıq dərəcəsindən və hədisin mətninin Quran ayələrinə və digər mötəbər hədislərə uyğun gəlməsindən asılıdır.

[5] İsnad kəlməsi lüğətdə istinad, mənbə, dəlil-sübut, dayaq və s. deməkdir. İstilahda isə bu kəlmə iki mənadan birini ifadə edir:

a) Hədisi istinad edərək rəvayət edənə aid etmək.

b) Hədisin mətninə gətirib çıxaran ravilərin silsiləsi.

الْقَدَرَ وَمَا يَقُولُونَ فِيهِ، فَاقْتَصَّ الْحَدِيثَ كَنَحْوِ حَدِيثِهِمْ عَنْ عُمَرَ رَضِيَ اللَّهُ عَنْهُ عَنْ النَّبِيِّ ﷺ، وَفِيهِ شَيْءٌ مِنْ زِيَادَةٍ وَقَدْ نَقَصَ مِنْهُ شَيْئًا.

**[95]-3-(...)** ........ Yəhya ibn Yəmər və Humeyd ibn Abdur-Rəhman belə rəvayət etmişlər: "Biz Abdullah ibn Ömərə rast gəldik və (ona) qəzavü-qədər və (bunu inkar edənlərin) bu xüsusda dediklərini xəbər verdik..."

(Ravi) bu hədisi (digər) ravilərin Ömərə ﵁ istinadən Peyğəmbərdən ﷺ rəvayət etdikləri hədisə yaxın mənada söyləmişdir. Bu hədisdə bəzi əlavələr olduğu kimi, naqisliklər də vardır.

**[٩٦] ٤**–(...) و حَدَّثَنِي حَجَّاجُ بْنُ الشَّاعِرِ حَدَّثَنَا يُونُسُ بْنُ مُحَمَّدٍ حَدَّثَنَا الْمُعْتَمِرُ عَنْ أَبِيهِ عَنْ يَحْيَى بْنِ يَعْمَرَ عَنْ ابْنِ عُمَرَ عَنْ عُمَرَ عَنْ النَّبِيِّ ﷺ بِنَحْوِ حَدِيثِهِمْ.

**[96]-4-(...)** ........ Motəmir (bu hədisi) atasından, o da Yəhya ibn Yəmərdən, o da İbn Ömərdən, o da Ömərdən, o da Peyğəmbərdən ﷺ əvvəlki ravilərin söylədikləri hədisə yaxın mənada rəvayət etmişdir.

## الإِيمَانُ مَا هُوَ؟ وَ بَيَانُ خِصَالِهِ

## İman nədir? İmanın xüsusiyyətləri

**[٩٧] ٥**–(**٩**) حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ وَزُهَيْرُ بْنُ حَرْبٍ، جَمِيعًا عَنْ ابْنِ عُلَيَّةَ، قَالَ زُهَيْرٌ: حَدَّثَنَا إِسْمَعِيلُ بْنُ إِبْرَاهِيمَ عَنْ أَبِي حَيَّانَ، عَنْ أَبِي زُرْعَةَ بْنِ عَمْرِو بْنِ جَرِيرٍ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ: كَانَ رَسُولُ اللَّهِ ﷺ يَوْمًا بَارِزًا لِلنَّاسِ، فَأَتَاهُ رَجُلٌ فَقَالَ: يَا رَسُولَ اللَّهِ! مَا الإِيمَانُ؟ قَالَ: ((أَنْ تُؤْمِنَ بِاللَّهِ وَمَلاَئِكَتِهِ وَكِتَابِهِ وَلِقَائِهِ وَرُسُلِهِ وَتُؤْمِنَ بِالْبَعْثِ الآخِرِ)) قَالَ: يَا رَسُولَ اللَّهِ! مَا الإِسْلاَمُ؟ قَالَ: ((الإِسْلاَمُ أَنْ تَعْبُدَ اللَّهَ وَلاَ تُشْرِكَ بِهِ شَيْئًا، وَتُقِيمَ الصَّلاَةَ الْمَكْتُوبَةَ، وَتُؤَدِّيَ الزَّكَاةَ الْمَفْرُوضَةَ، وَتَصُومَ رَمَضَانَ)) قَالَ: يَا رَسُولَ اللَّهِ! مَا الإِحْسَانُ؟ قَالَ: ((أَنْ تَعْبُدَ اللَّهَ كَأَنَّكَ تَرَاهُ، فَإِنَّكَ إِنْ لاَ تَرَاهُ فَإِنَّهُ يَرَاكَ)) قَالَ: يَا رَسُولَ اللَّهِ! مَتَى السَّاعَةُ؟ قَالَ: ((مَا الْمَسْئُولُ عَنْهَا بِأَعْلَمَ مِنْ السَّائِلِ، وَلَكِنْ سَأُحَدِّثُكَ عَنْ أَشْرَاطِهَا: إِذَا وَلَدَتْ الأَمَةُ رَبَّهَا فَذَاكَ مِنْ أَشْرَاطِهَا، وَإِذَا كَانَتْ الْعُرَاةُ الْحُفَاةُ رُءُوسَ النَّاسِ فَذَاكَ مِنْ أَشْرَاطِهَا، وَإِذَا تَطَاوَلَ رِعَاءُ الْبَهْمِ فِي الْبُنْيَانِ فَذَاكَ مِنْ أَشْرَاطِهَا، فِي خَمْسٍ لاَ يَعْلَمُهُنَّ إِلاَّ اللَّهُ)) ثُمَّ تَلاَ ﷺ:

﴿ إِنَّ ٱللَّهَ عِندَهُۥ عِلْمُ ٱلسَّاعَةِ وَيُنَزِّلُ ٱلْغَيْثَ وَيَعْلَمُ مَا فِى ٱلْأَرْحَامِ ۖ وَمَا تَدْرِى نَفْسٌ مَّاذَا تَكْسِبُ غَدًا ۖ وَمَا تَدْرِى نَفْسٌۢ بِأَىِّ أَرْضٍ تَمُوتُ ۚ إِنَّ ٱللَّهَ عَلِيمٌ خَبِيرٌۢ ﴾

قَالَ: ثُمَّ أَدْبَرَ الرَّجُلُ: فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: ((رُدُّوا عَلَيَّ الرَّجُلَ)) فَأَخَذُوا لِيَرُدُّوهُ فَلَمْ يَرَوْا شَيْئًا، فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: ((هَذَا جِبْرِيلُ جَاءَ لِيُعَلِّمَ النَّاسَ دِينَهُمْ)).

**[97]-5-(9)** ........ Əbu Hureyrə[1] ﷺ demişdir: "Bir gün Peyğəmbər ﷺ camaatın arasında oturmuşdu. Bir nəfər onun yanına gəlib: "Ey Allahın elçisi! İman nədir?"– deyə soruşdu. Peyğəmbər ﷺ buyurdu: "(İman odur ki,) Allaha, Onun mələklərinə, Onun Kitabına, Onunla qarşılaşacağına və Onun elçilərinə iman gətirəsən, habelə (öldükdən sonra) diriləcəyinə inanasan". Adam: "Ey Allahın elçisi! İslam nədir?"– deyə soruşdu. Peyğəmbər ﷺ buyurdu: "İslam (odur ki,) Allaha ibadət edib heç bir şeyi Ona şərik qoşmayasan, fərz[2] buyurulmuş namazları (vaxtlı-vaxtında[3]) qılasan, vacib buyurulmuş zəkatı verəsən və Ramazan ayını oruc tutasan". O: "Ey Allahın elçisi! Ehsan nədir?"– deyə soruşdu. Peyğəmbər ﷺ buyurdu: "(Ehsan odur ki,) Allaha, sanki, Onu görürmüşsən kimi ibadət edəsən, sən Onu görməsən də, (bil ki,) O, səni görür". O: "Ey Allahın elçisi! Qiyamət nə zaman qopacaq?"– deyə soruşdu. Peyğəmbər ﷺ buyurdu: "Bu haqda soruşulan soruşandan çox bilmir. Lakin onun əlamətlərini sənə xəbər verəcəyəm: cariyənin öz ağasını dünyaya gətirməsi Qiyamətin əlamətlərindəndir. Habelə çılpaq, ayaqyalın (səfillərin[4]) xalqa rəhbərlik etməsi Qiyamətin əlamətlərindəndir. Həmçinin qoyun-quzu otaran çobanların hündür binalar tikməkdə bir-biri ilə yarışması Qiyamətin əlamətlərindəndir. (Qiyamət saatı) yalnız Allahın bildiyi beş şeydən biridir". Sonra Peyğəmbər ﷺ (bu ayəni[5]) oxudu: **"Həqiqətən, *Qiyamətin qopacağı* vaxtı ancaq Allah bilir. Yağışı *istədiyi vaxt* göydən O yağdırır, bətnlərdə olanı O bilir. Heç kəs səhər nə qazanacağını bilməz. Heç kəs harada öləcəyini bilməz. Allah isə, şübhəsiz ki, *hər şeyi* Biləndir, *hər şeydən* Xəbərdardır!"[6]**

---

[1] Əbu Hureyrə ﷺ Peyğəmbərin ﷺ səhabəsidir. Adı: Abdur-Rəhman ibn Səxr əd-Dovsidir. Hicrətin 59-cu ilində 87 yaşında vəfat etmişdir.

[2] Dini baxımdan yerinə yetirilməsi vacib olan. Qurani Kərimin bir çox ayələrində keçən bu sözün başqa mənaları da vardır.

[3] Quranda buyurulur ki: **"...namaz möminlərə müəyyən olunmuş vaxtlarda vacib edilmişdir"** ("ən-Nisa" surəsi, 103).

[4] Səfalət içərisində yaşayan, avara, sərgərdan, sərsəri, dılğır.

[5] Ayə sözü bir neçə mənanı ifadə edir. Bunlar: (a) Quran surələrinin ibarət olduğu hissələr; (b) möcüzə; (c) əlamət; (d) ibrət.

[6] "Loğman" surəsi, 34.

Sonra o adam dönüb getdi. Peyğəmbər ﷺ: "O adamı geri qaytarın!"– deyə buyurdu. (Səhabələr onun dalınca getdilər,) lakin ondan bir əsər-əlamət görmədilər. Onda Peyğəmbər ﷺ dedi: "Bu, Cəbrail idi. İnsanlara dinlərini öyrətməyə gəlmişdi".

**[٩٨]** ٦–(...) حَدَّثَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللَّهِ بْنِ نُمَيْرٍ: حَدَّثَنَا مُحَمَّدُ بْنُ بِشْرٍ: حَدَّثَنَا أَبُو حَيَّانَ التَّيْمِيُّ بِهَذَا الإِسْنَادِ مِثْلَهُ، غَيْرَ أَنَّ فِي رِوَايَتِهِ: ((إِذَا وَلَدَتْ الأَمَةُ بَعْلَهَا)) يَعْنِي السَّرَارِيَّ.

**[98]-6-(...)** ........ Əbu Həyyan ət-Teymiy[1] hədisi bu isnadla eyni ilə rəvayət etmişdir. Fəqət onun rəvayətində: "Kəniz ağasını doğacağı zaman" ifadəsi keçir ki, burada (kəniz deyildikdə) cariyələr nəzərdə tutulur.

## الإِسْلاَمُ مَا هُوَ؟ وَ بَيَانُ خِصَالِهِ

## İslam nədir? İslamın xüsusiyyətləri

**[٩٩]** ٧–(١٠) حَدَّثَنِي زُهَيْرُ بْنُ حَرْبٍ: حَدَّثَنَا جَرِيرٌ عَنْ عُمَارَةَ وَهُوَ ابْنُ الْقَعْقَاعِ، عَنْ أَبِي زُرْعَةَ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((سَلُونِي)) فَهَابُوهُ أَنْ يَسْأَلُوهُ، فَجَاءَ رَجُلٌ فَجَلَسَ عِنْدَ رُكْبَتَيْهِ فَقَالَ: يَا رَسُولَ اللَّهِ! مَا الإِسْلاَمُ؟ قَالَ: ((لاَ تُشْرِكُ بِاللَّهِ شَيْئًا، وَتُقِيمُ الصَّلاَةَ وَتُؤْتِي الزَّكَاةَ، وَتَصُومُ رَمَضَانَ)) قَالَ:صَدَقْتَ، قَالَ: يَا رَسُولَ اللَّهِ! مَا الإِيمَانُ؟ قَالَ: ((أَنْ تُؤْمِنَ بِاللَّهِ وَمَلاَئِكَتِهِ وَكِتَابِهِ وَلِقَائِهِ وَرُسُلِهِ وَتُؤْمِنَ بِالْبَعْثِ، وَتُؤْمِنَ بِالْقَدَرِ كُلِّهِ)) قَالَ: صَدَقْتَ، قَالَ: يَا رَسُولَ اللَّهِ! مَا الإِحْسَانُ؟ قَالَ: ((أَنْ تَخْشَى اللَّهَ كَأَنَّكَ تَرَاهُ، فَإِنَّكَ إِنْ لاَ تَكُنْ تَرَاهُ فَإِنَّهُ يَرَاكَ)) قَالَ: صَدَقْتَ، قَالَ: يَا رَسُولَ اللَّهِ! مَتَى تَقُومُ السَّاعَةُ؟ قَالَ: ((مَا الْمَسْئُولُ عَنْهَا بِأَعْلَمَ مِنْ السَّائِلِ، وَسَأُحَدِّثُكَ عَنْ أَشْرَاطِهَا: إِذَا رَأَيْتَ الْمَرْأَةَ تَلِدُ رَبَّهَا، فَذَاكَ مِنْ أَشْرَاطِهَا، وَإِذَا رَأَيْتَ الْحُفَاةَ الْعُرَاةَ الصُّمَّ الْبُكْمَ مُلُوكَ الأَرْضِ، فَذَاكَ مِنْ أَشْرَاطِهَا، وَإِذَا رَأَيْتَ رِعَاءَ الْبَهْمِ يَتَطَاوَلُونَ فِي الْبُنْيَانِ، فَذَاكَ مِنْ أَشْرَاطِهَا، فِي خَمْسٍ مِنْ الْغَيْبِ لاَ يَعْلَمُهُنَّ إِلاَّ اللَّهُ)) ثُمَّ قَرَأَ:

﴿ إِنَّ ٱللَّهَ عِندَهُۥ عِلْمُ ٱلسَّاعَةِ وَيُنَزِّلُ ٱلْغَيْثَ وَيَعْلَمُ مَا فِى ٱلْأَرْحَامِ ۖ وَمَا تَدْرِى نَفْسٌ مَّاذَا تَكْسِبُ غَدًا ۖ وَمَا تَدْرِى نَفْسٌۢ بِأَىِّ أَرْضٍ تَمُوتُ ۚ إِنَّ ٱللَّهَ عَلِيمٌ خَبِيرٌۢ ﴾

[1] Adı: Yəhya ibn Səid ibn Həyyandır.

قَالَ ثُمَّ قَامَ الرَّجُلُ، فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: ((رُدُّوهُ عَلَيَّ)) فَالْتُمِسَ، فَلَمْ يَجِدُوهُ، فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: ((هَذَا جِبْرِيلُ أَرَادَ أَنْ تَعَلَّمُوا إِذْ لَمْ تَسْأَلُوا)).

**[99]-7-(10)** ........ Əbu Hureyrə ﷺ rəvayət edir ki, (bir dəfə) Peyğəmbər ﷺ (səhabələrinə): "Mənə sual verin!"- deyə buyurdu. Səhabələr ondan söz soruşmaqdan ehtiyat etdilər. Elə bu vaxt bir nəfər gəlib Peyğəmbərin ﷺ dizlərinin yanında (yerə) oturdu və: "Ey Allahın elçisi! İslam nədir?"– deyə soruşdu. Peyğəmbər ﷺ buyurdu: "Heç bir şeyi Allaha şərik qoşmamalısan, (fərz buyurulmuş) namazları (vaxtlı-vaxtında) qılmalısan, (vacib buyurulmuş) zəkatı verməlisən və Ramazan ayını oruc tutmalısan". Adam: "Doğru söylədin!"– dedi. Sonra o: "Ey Allahın elçisi! İman nədir?"– deyə soruşdu. Peyğəmbər ﷺ buyurdu: "Allaha, Onun mələklərinə, Onun Kitabına, Onunla qarşılaşacağına və Onun elçilərinə, habelə (öldükdən sonra) diriləcəyinə və qədərin hamısına iman gətirməlisən". Adam: "Doğru söylədin!"– dedi. Sonra o: "Ey Allahın elçisi! Ehsan nədir?"– deyə soruşdu. Peyğəmbər ﷺ buyurdu: "Allahdan, sanki, Onu görürmüşsən kimi qorxmalısan; sən Onu görməsən də, (bil ki,) O, səni görür". Adam: "Doğru söylədin!"– dedi. Sonra o: "Ey Allahın elçisi! Qiyamət nə zaman qopacaq?"– deyə soruşdu. Peyğəmbər ﷺ buyurdu: "Bu haqda soruşulan soruşandan çox bilmir. Lakin onun əlamətlərini sənə xəbər verəcəyəm: qadının öz ağasını dünyaya gətirməsini görsən, (bil ki,) bu, Qiyamətin əlamətlərindəndir. Habelə ayaqyalın, çılpaq, səfil cahillərin yer üzündə ağalıq etməsi Qiyamətin əlamətlərindəndir. Həmçinin (qoyun-quzu) otaran çobanların hündür binalar tikməkdə bir-biri ilə yarışması Qiyamətin əlamətlərindəndir. (Qiyamətin vaxtı isə) yalnız Allahın bildiyi beş qeybi (məsələdən) biridir. Sonra Peyğəmbər ﷺ (bu ayəni) oxudu: **"Həqiqətən, *Qiyamətin qopacağı* vaxtı ancaq Allah bilir. Yağışı *istədiyi vaxt* göydən O yağdırır, bətnlərdə olanı O bilir. Heç kəs səhər nə qazanacağını bilməz. Heç kəs harada öləcəyini bilməz. Allah isə, şübhəsiz ki, *hər şeyi* Biləndir, *hər şeydən* Xəbərdardır!"**

Sonra bu adam qalxıb getdi. Peyğəmbər ﷺ: "Onu yanıma gətirin!"– deyə buyurdu. (Səhabələr) onu axtardılar, lakin tapa bilmədilər. Onda Peyğəmbər ﷺ dedi: "Bu, Cəbrail idi. İstəyirdi ki, (dininizi) öyrənəsiniz. (Çünki) siz sual verməkdən çəkindiniz".

## (٢) – بَابُ بَيَانِ الصَّلَوَاتِ الَّتِي هِيَ أَحَدُ أَرْكَانِ الإِسْلَامِ

## 2-ci fəsil. İslamın rüknlərindən biri sayılan namazların bəyan edilməsi

**[١٠٠]** ٨–(١١) حَدَّثَنَا قُتَيْبَةُ بْنُ سَعِيدِ بْنِ جَمِيلِ بْنِ طَرِيفِ بْنِ عَبْدِ اللَّهِ الثَّقَفِيُّ، عَنْ مَالِكِ بْنِ أَنَسٍ – فِيمَا قُرِئَ عَلَيْهِ – عَنْ أَبِي سُهَيْلٍ، عَنْ أَبِيهِ، أَنَّهُ سَمِعَ طَلْحَةَ بْنَ عُبَيْدِ اللَّهِ يَقُولُ: جَاءَ رَجُلٌ إِلَى رَسُولِ اللَّهِ ﷺ مِنْ أَهْلِ نَجْدٍ، ثَائِرُ الرَّأْسِ، نَسْمَعُ دَوِيَّ صَوْتِهِ، وَلاَ نَفْقَهُ مَا يَقُولُ، حَتَّى دَنَا مِنْ رَسُولِ اللَّهِ ﷺ فَإِذَا هُوَ يَسْأَلُ عَنْ الإِسْلَامِ، فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: ((خَمْسُ صَلَوَاتٍ فِي الْيَوْمِ وَاللَّيْلَةِ)) فَقَالَ: هَلْ عَلَيَّ غَيْرُهُنَّ؟ قَالَ: ((لاَ، إِلاَّ أَنْ تَطَّوَّعَ، وَصِيَامُ شَهْرِ رَمَضَانَ)) فَقَالَ: هَلْ عَلَيَّ غَيْرُهُ؟ فَقَالَ: ((لاَ، إِلاَّ أَنْ تَطَّوَّعَ)) وَذَكَرَ لَهُ رَسُولُ اللَّهِ ﷺ الزَّكَاةَ، فَقَالَ: هَلْ عَلَيَّ غَيْرُهَا؟ قَالَ: ((لاَ، إِلاَّ أَنْ تَطَّوَّعَ)) قَالَ: فَأَدْبَرَ الرَّجُلُ وَهُوَ يَقُولُ: وَاللَّهِ! لاَ أَزِيدُ عَلَى هَذَا وَلاَ أَنْقُصُ مِنْهُ، فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: ((أَفْلَحَ إِنْ صَدَقَ)).

**[100]-8-(11)** ........ Təlhə ibn Ubeydullah ؓ demişdir: “Nəcd[1] əhlindən olan, saçları dağınıq bir nəfər Peyğəmbərin ﷺ yanına gəldi. Biz uzaqdan onun gurultulu səsini eşidir, amma nə dediyini anlamırdıq. Nəhayət, o, Peyğəmbərə ﷺ yaxınlaşdı və (bizə) aydın oldu ki, o, İslam barəsində soruşur.[2] Peyğəmbər ﷺ buyurdu: “Gündəlik olaraq beş vaxt namaz (qılmalısan)”. Adam soruşdu: “Mənə bundan başqası vacib buyurulubmu?” (Peyğəmbər ﷺ) dedi: “Xeyr, yalnız könüllü olaraq qıldığından başqa. Habelə Ramazan orucunu da (tutmalısan)”. Adam soruşdu: “Mənə bundan başqası vacib buyurulubmu?” (Peyğəmbər ﷺ) dedi: “Xeyr, yalnız könüllü olaraq tutduğundan başqa”. Peyğəmbər ﷺ ona zəkatın vacibliyini də bildirdi. Adam soruşdu: “Mənə bundan başqası vacib buyurulubmu?” (Peyğəmbər ﷺ) dedi: “Xeyr, yalnız könüllü olaraq verdiyindən baş-

---

[1] Nəcd deyildikdə Məkkə ilə İraq arasında olan ərazilər nəzərdə tutulur.

[2] İbn Həcər demişdir: “Hədisdə həcc ziyarəti zikr olunmur. Səbəbi də budur ki, ya həmin vaxt hələ həcc ziyarəti vacib buyurulmamışdır, ya da hədisi nəql edən ravilərdən biri bunu ixtisar etmişdir. İkinci ehtimalın daha doğru olduğunu Buxarinin Oruc kitabında nəql etdiyi, İsmail ibn Cəfərin atası Əbu Suheyldən rəvayət etdiyi hədis sübuta yetirir. Bu hədisdə deyilir ki, Peyğəmbər ﷺ ona şəriət əhkamlarını xəbər verdi. Buna da yerdə qalan fərz əməllər, hətta (bəzi) müstəhəblər də aiddir” (“Fəth əl-Bari”, 1/73).

qa". Adam: "Vallahi ki, mən buna (heç nə) artırmayacağam[1] və bundan (heç nə) əskiltməyəcəyəm"– dedi və dönüb getdi. Peyğəmbər ﷺ buyurdu: "Əgər doğru deyirsə,[2] nicat tapacaqdır".

**[١٠١] ٩**–(...) حَدَّثَنِي يَحْيَى بْنُ أَيُّوبَ وَقُتَيْبَةُ بْنُ سَعِيدٍ، جَمِيعًا عَنْ إِسْمَعِيلَ بْنِ جَعْفَرٍ، عَنْ أَبِي سُهَيْلٍ، عَنْ أَبِيهِ، عَنْ طَلْحَةَ بْنِ عُبَيْدِ اللَّهِ عَنْ النَّبِيِّ ﷺ بِهَذَا الْحَدِيثِ، نَحْوَ حَدِيثِ مَالِكٍ، غَيْرَ أَنَّهُ قَالَ، فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: ((أَفْلَحَ وَأَبِيهِ، إِنْ صَدَقَ)) أَوْ ((دَخَلَ الْجَنَّةَ وَأَبِيهِ، إِنْ صَدَقَ)).

**[101]-9-(...)** ........ (rəvayətçilər) bu hədisi Malikin rəvayət etdiyi isnadla – Təlhə ibn Ubeydullahdan, o da Peyğəmbərdən ﷺ rəvayət etmişlər. Sadəcə olaraq (bu hədisin axırında) Peyğəmbər ﷺ: "Onun atasına and olsun,[3] əgər doğru deyirsə, nicat tapacaqdır", yaxud: "Onun atasına and olsun, əgər doğru deyirsə, Cənnətə girəcəkdir"– demişdir.

## (٣) – بَابُ السُّؤَالِ عَنْ أَرْكَانِ الإِسْلَامِ

## 3-cü fəsil. İslamın rüknləri haqqında sual vermək

**[١٠٢] ١٠**–(١٢) حَدَّثَنِي عَمْرُو بْنُ مُحَمَّدِ بْنِ بُكَيْرٍ النَّاقِدُ: حَدَّثَنَا هَاشِمُ بْنُ الْقَاسِمِ أَبُو النَّضْرِ: حَدَّثَنَا سُلَيْمَانُ بْنُ الْمُغِيرَةِ عَنْ ثَابِتٍ، عَنْ أَنَسِ بْنِ مَالِكٍ، قَالَ: نُهِينَا أَنْ نَسْأَلَ رَسُولَ اللَّهِ ﷺ عَنْ شَيْءٍ، فَكَانَ يُعْجِبُنَا أَنْ يَجِيءَ الرَّجُلُ مِنْ أَهْلِ الْبَادِيَةِ، الْعَاقِلُ، فَيَسْأَلَهُ وَنَحْنُ نَسْمَعُ، فَجَاءَ رَجُلٌ مِنْ أَهْلِ الْبَادِيَةِ، فَقَالَ: يَا مُحَمَّدُ! أَتَانَا رَسُولُكَ فَزَعَمَ لَنَا أَنَّكَ تَزْعُمُ أَنَّ اللَّهَ أَرْسَلَكَ؟ قَالَ: ((صَدَقَ)) قَالَ: فَمَنْ خَلَقَ السَّمَاءَ؟ قَالَ: ((اللَّهُ)) قَالَ: فَمَنْ خَلَقَ الأَرْضَ؟ قَالَ: ((اللَّهُ)) قَالَ: فَمَنْ نَصَبَ هَذِهِ الْجِبَالَ، وَجَعَلَ فِيهَا مَا جَعَلَ؟ قَالَ: ((اللَّهُ)) قَالَ: فَبِالَّذِي خَلَقَ السَّمَاءَ، وَخَلَقَ الأَرْضَ، وَنَصَبَ هَذِهِ الْجِبَالَ، آللَّهُ أَرْسَلَكَ؟ قَالَ: ((نَعَمْ)) قَالَ: وَزَعَمَ رَسُولُكَ أَنَّ عَلَيْنَا خَمْسَ

---

[1] İbn Həcər demişdir: "Peyğəmbər ﷺ onun bu cür and içməyinə, yəni digər xeyirxah əməlləri yerinə yetirməyəcəyinə etiraz etməmişdir. Ola bilsin ki, bu məqamda Peyğəmbər ﷺ onun İslamda təzə olduğunu nəzərə alıb, onu ağır yüklə yükləmək istəməmişdir" ("Fəth əl-Bari", 8/241).

[2] Yəni dediyinə əməl edər və vacib buyurulanları yerinə yetirərsə, Cənnətə daxil olar.

[3] Bu hədisdə Peyğəmbər ﷺ həqiqi mənada and içməmiş, əksinə, bu sözü ərəblərin adətinə uyğun olaraq dilucu söyləmişdir. Bu xüsusda Uca Allah buyurur: **"Allah sizi qəsdiniz olmadan içdiyiniz andlara görə cəzalandırmaz..."** ("əl-Maidə" surəsi, 89).

Və ola da bilsin ki, bu, Allahdan qeyrisinə and içmək qadağan edilməmişdən əvvəl baş vermişdir, yaxud bununla Peyğəmbər ﷺ: "Onun atasının Rəbbinə and olsun!" demək istəmişdir. ("Fəth əl-Bari", 1/73; "Avnul-Məbud", 9/57).

صَلَوَاتٍ فِي يَوْمِنَا، وَلَيْلَتِنَا، قَالَ: ((صَدَقَ)) قَالَ: فَبِالَّذِي أَرْسَلَكَ، آللَّهُ أَمَرَكَ بِهَذَا؟ قَالَ: ((نَعَمْ)) قَالَ، وَزَعَمَ رَسُولُكَ أَنَّ عَلَيْنَا زَكَاةً فِي أَمْوَالِنَا، قَالَ: ((صَدَقَ)) قَالَ: فَبِالَّذِي أَرْسَلَكَ، آللَّهُ أَمَرَكَ بِهَذَا؟ قَالَ: ((نَعَمْ)) قَالَ: وَزَعَمَ رَسُولُكَ أَنَّ عَلَيْنَا صَوْمَ شَهْرِ رَمَضَانَ فِي سَنَتِنَا، قَالَ: ((صَدَقَ)) قَالَ: فَبِالَّذِي أَرْسَلَكَ، آللَّهُ أَمَرَكَ بِهَذَا؟ قَالَ: ((نَعَمْ)) قَالَ: وَزَعَمَ رَسُولُكَ أَنَّ عَلَيْنَا حَجَّ الْبَيْتِ مَنْ اسْتَطَاعَ إِلَيْهِ سَبِيلاً، قَالَ: ((صَدَقَ)) قَالَ: ثُمَّ وَلَّى، قَالَ: وَالَّذِي بَعَثَكَ بِالْحَقِّ! لاَ أَزِيدُ عَلَيْهِنَّ وَلاَ أَنْقُصُ مِنْهُنَّ، فَقَالَ النَّبِيُّ ﷺ: ((لَئِنْ صَدَقَ لَيَدْخُلَنَّ الْجَنَّةَ)).

**[102]-10-(12)** ........ Ənəs ibn Malik ﷛ demişdir: "Bizə Peyğəmbərdən ﷺ (hər hansı) bir şey haqqında soruşmaq qadağan edilmişdir.[1] (Odur ki,) çöl əhalisindən ağıllı[2] bir adamın gəlib qulağımız eşidə-eşidə Peyğəmbərə ﷺ sual verməsi bizə xoş gəlirdi. Bir dəfə bir bədəvi gəlib dedi: "Ey Muhəmməd![3] Göndərdiyin adam yanımıza gəldi və söylədi ki, guya sən, Allahın səni (bəşəriyyətə) elçi göndərdiyini deyirsən?" Peyğəmbər ﷺ: "O, doğru söyləmişdir"– dedi. Adam soruşdu:

– Göyü yaradan kimdir?
– Allahdır!
– Yeri yaradan kimdir?
– Allahdır!
– Bu dağları dikəldən və onların üstündə yaratdıqlarını yaradan kimdir?
– Allahdır!

---

[1] Burada "qadağan edilmişdir" deyildikdə heç bir zərurət olmadan yersiz sual vermək nəzərdə tutulur. Rəvayətlərin birində Peyğəmbər ﷺ buyurmuşdur: "Allah sizlərə anaların üzünə ağ olmağı, qız uşaqlarını diri-diri yerə gömməyi, (borcu qaytarmaqdan) boyun qaçırmağı və "ver"– deyərək (haqqınız olmayan bir şeyi) tələb etməyi qadağan etmişdir. Habelə söz gəzdirməyinizi, çox sual verməyinizi və var-dövləti israf etməyinizi xoşlamır" ("Səhih əl-Buxari", 2408). Haqqı öyrənmək məqsədilə sual verməkdə isə heç bir qəbahət yoxdur. Uca Allah buyurur: **"Əgər bilmirsinizsə, Zikr əhlindən soruşun"** ("ən-Nəhl" surəsi, 43).

[2] "Ağıllı" deyildikdə ədəb-ərkanla sual verən, həm də mühüm məsələlər barədə soruşan və gözəl tərzdə müraciət edən kimsə nəzərdə tutulur. Belə ki, çöl əhlinin əksəriyyəti cahil və kobud olur. Əbu Hureyrənin ﷛ bu xüsusda rəvayət etdiyi hədisdə Peyğəmbər ﷺ buyurmuşdur: "Çöldə yaşayan adam nəzakətsiz olar. Ova aludə olan adam (haqdan) qafil olar. Padşahın qapısına gələn adam (ya oradakı naz-nemətləri görüb bunlara tamah salmaqla, ya da onun etdiyi haqsızlıqlara göz yummaqla) fitnəyə məruz qalar. Bir də ki, adam padşaha (yaltaqcasına) nə qədər çox yaxınlaşarsa, bir o qədər də Allahdan uzaq düşər" ("Müsnəd imam Əhməd", 2/371; "Silsilətul-Əhadis əs-Səhihə", 1272).

[3] Ola bilsin ki, bu hadisə Allahın: **"Peyğəmbəri, öz aranızda bir-birinizi çağırdığınız kimi çağırmayın..."** ayəsi (ən-Nur, 63) nazil olmamışdan əvvəl baş vermişdir. Ola da bilsin ki, ayə nazil olduqdan sonra baş vermiş, lakin həmin bədəvinin bu qadağadan xəbəri olmamışdır.

– Səni and verirəm göyü və yeri yaradan, dağları dikəldən Allaha, de görüm, doğrudanmı Allah səni peyğəmbər göndərib?

– Bəli!

– Göndərdiyin adam gecə və gündüz beş vaxt namaz qılmağın bizə vacib buyurulduğunu söylədi.

– Doğru söyləmişdir.

– Səni and verirəm səni elçi göndərən Allaha, de görüm, bunu sənə Allahmı əmr edib?

– Bəli!

– Göndərdiyin adam malımızdan zəkat verməyin bizə vacib buyurulduğunu söylədi.

– Doğru söyləmişdir.

– Səni and verirəm səni elçi göndərən Allaha, de görüm, bunu sənə Allahmı əmr edib?

– Bəli!

– Göndərdiyin adam (hər gələn) ilimizdə Ramazan ayını oruc tutmağın bizə vacib buyurulduğunu söylədi.

– Doğru söyləmişdir.

– Səni and verirəm səni elçi göndərən Allaha, de görüm, bunu sənə Allahmı əmr edib?

– Bəli!

– Göndərdiyin adam bizlərdən imkanı olan kimsəyə (Allahın) Evini ziyarət etməyin vacib buyurulduğunu söylədi.

– Doğru söyləmişdir.

(Ənəs) dedi: “Sonra o adam: “Səni haqq ilə göndərən Allaha and olsun ki, mən buna (heç nə) artırmayacağam və bundan (heç nə) əskiltməyəcəyəm”– dedi və dönüb getdi. Peyğəmbər ﷺ buyurdu: “Əgər doğru deyirsə, mütləq Cənnətə girəcəkdir”.

**[١٠٣] ١١**–(...) حَدَّثَنِي عَبْدُ اللَّهِ بْنُ هَاشِمٍ الْعَبْدِيُّ: حَدَّثَنَا بَهْزٌ: حَدَّثَنَا سُلَيْمَانُ بْنُ الْمُغِيرَةِ عَنْ ثَابِتٍ قَالَ: قَالَ أَنَسٌ: كُنَّا نُهِينَا فِي الْقُرْآنِ أَنْ نَسْأَلَ رَسُولَ اللَّهِ ﷺ عَنْ شَيْءٍ، وَسَاقَ الْحَدِيثَ بِمِثْلِهِ.

**[103]-11-(...)** ........ Ənəs ﷺ: "Quranda[1] bizə Peyğəmbərdən ﷺ (hər hansı) bir şey haqqında soruşmaq qadağan edilmişdi"- dedi və hədisi yuxarıdakı kimi rəvayət etdi.

## (٤) – بَابُ بَيَانِ الإِيمَانِ الَّذِي يُدْخَلُ بِهِ الْجَنَّةَ وَأَنَّ مَنْ تَمَسَّكَ بِمَا أُمِرَ بِهِ دَخَلَ الْجَنَّةَ

## 4-cü fəsil. Cənnətə aparan imanın, habelə əmr olunan şeylərdən möhkəm yapışan kimsənin Cənnətə girəcəyinin bəyan olunması

**[١٠٤] ١٢-(١٣)** حَدَّثَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللَّهِ بْنِ نُمَيْرٍ: حَدَّثَنَا أَبِي: حَدَّثَنَا عَمْرُو بْنُ عُثْمَانَ: حَدَّثَنَا مُوسَى بْنُ طَلْحَةَ قَالَ: حَدَّثَنِي أَبُو أَيُّوبَ، أَنَّ أَعْرَابِيًّا عَرَضَ لِرَسُولِ اللَّهِ ﷺ وَهُوَ فِي سَفَرٍ، فَأَخَذَ بِخِطَامِ نَاقَتِهِ أَوْ بِزِمَامِهَا، ثُمَّ قَالَ: يَا رَسُولَ اللَّهِ! - أَوْ يَا مُحَمَّدُ! - أَخْبِرْنِي بِمَا يُقَرِّبُنِي مِنْ الْجَنَّةِ وَمَا يُبَاعِدُنِي مِنْ النَّارِ، قَالَ: فَكَفَّ النَّبِيُّ ﷺ، ثُمَّ نَظَرَ فِي أَصْحَابِهِ، ثُمَّ قَالَ: ((لَقَدْ وُفِّقَ - أَوْ لَقَدْ هُدِيَ -)) قَالَ: ((كَيْفَ قُلْتَ؟)) قَالَ: فَأَعَادَ، فَقَالَ النَّبِيُّ ﷺ: ((تَعْبُدُ اللَّهَ لاَ تُشْرِكُ بِهِ شَيْئًا، وَتُقِيمُ الصَّلاَةَ، وَتُؤْتِي الزَّكَاةَ، وَتَصِلُ الرَّحِمَ، دَعْ النَّاقَةَ)).

**[104]-12-(13)** ........ Əbu Əyyub[2] ﷺ demişdir: "Peyğəmbər ﷺ səfərdə ikən bir bədəvi onun qarşısına çıxdı və onun dəvəsinin ovsarından (və ya noxtasından) tutub dedi: "Ya Rəsulullah, (yaxud ey Muhəmməd), məni Cənnətə yaxınlaşdıracaq və atəşdən uzaqlaşdıracaq şey barədə mənə xəbər ver". Peyğəmbər ﷺ özünü toxtaq saxladı, sonra səhabələrinə tərəf göz gəzdirib: "(Adam) haqqa yönəldildi, (yaxud hidayətə[3] qovuşduruldu)"– dedi, sonra da (ondan): "Necə dedin?"– deyə soruşdu. Adam sualını təkrar etdikdən sonra Peyğəmbər ﷺ buyurdu: "Gərək Allaha ibadət edəsən və heç bir şeyi Ona şərik qoşmayasan, namaz qılasan, zəkat verəsən və qohum-əqrəba ilə əlaqə saxlayasan![4] (İndi isə) dəvənin ovsarını burax".

---

[1] Uca Allah buyurur: **"Ey iman gətirənlər! Sizə agah olunca xoşunuza gəlməyəcək şeylər barəsində soruşmayın..."** ("əl-Maidə" surəsi, 101).

[2] Əbu Əyyub əl-Ənsari əl-Xəzrəci ﷺ Peyğəmbərin ﷺ səhabəsidir. Adı: Xalid ibn Zeyddir. O, hicrətin 52-ci ilində Konstantinopolun fəthi uğrunda gedən döyüşdə şəhid olmuşdur.

[3] Maarifləndirmək, doğru yol göstərmək, rəhbərlik etmək, azğınlıqdan xilas edilib İslamın nurlu yoluna yönəlməkdir.

[4] İmkan daxilində qohum-əqrəbaya yaxşılıq etmək, onlara əl tutmaq, qarşılaşdıqda onlara salam vermək, onları ziyarət etmək və başqa bu kimi haqlarını ödəmək hər bir müsəlmanın borcudur.

**[١٠٥] ١٣**-(...) و حَدَّثَنِي مُحَمَّدُ بْنُ حَاتِمٍ وَعَبْدُ الرَّحْمَنِ بْنُ بِشْرٍ قَالاَ: حَدَّثَنَا بَهْزٌ، حَدَّثَنَا شُعْبَةُ: حَدَّثَنَا مُحَمَّدُ بْنُ عُثْمَانَ بْنِ عَبْدِ اللَّهِ بْنِ مَوْهَبٍ وَأَبُوهُ عُثْمَانُ أَنَّهُمَا سَمِعَا مُوسَى بْنَ طَلْحَةَ يُحَدِّثُ عَنْ أَبِي أَيُّوبَ عَنْ النَّبِيِّ ﷺ، بِمِثْلِ هَذَا الْحَدِيث.

**[105]-13-(...)** ........ Muhəmməd ibn Osman ibn Abdullah ibn Məvhəb və atası Osman, Musa ibn Əbu Təlhənin Əbu Əyyubdan, o da Peyğəmbərdən ﷺ bu hədisin bənzərini rəvayət etdiyini eşitmişlər.

**[١٠٦] ١٤**-(...) حَدَّثَنَا يَحْيَى بْنُ يَحْيَى التَّمِيمِيُّ: أَخْبَرَنَا أَبُو الأَحْوَصِ؛ ح: و حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا أَبُو الأَحْوَصِ عَنْ أَبِي إِسْحَقَ، عَنْ مُوسَى بْنِ طَلْحَةَ، عَنْ أَبِي أَيُّوبَ قَالَ: جَاءَ رَجُلٌ إِلَى النَّبِيِّ ﷺ فَقَالَ: دُلَّنِي عَلَى عَمَلٍ أَعْمَلُهُ يُدْنِينِي مِنْ الْجَنَّةِ وَيُبَاعِدُنِي مِنْ النَّارِ. قَالَ: ((تَعْبُدُ اللَّهَ لاَ تُشْرِكُ بِهِ شَيْئًا، وَتُقِيمُ الصَّلاَةَ، وَتُؤْتِي الزَّكَاةَ، وَتَصِلُ ذَا رَحِمِكَ)) فَلَمَّا أَدْبَرَ، قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((إِنْ تَمَسَّكَ بِمَا أُمِرَ بِهِ دَخَلَ الْجَنَّةَ)). وَفِي رِوَايَةِ ابْنِ أَبِي شَيْبَةَ: ((إِنْ تَمَسَّكَ بِهِ)).

**[106]-14-(...)** ........ Əbu Əyyub ﷺ demişdir: “Bir nəfər Peyğəmbərin ﷺ yanına gəlib dedi: “Məni Cənnətə yaxınlaşdıracaq və oddan uzaqlaşdıracaq bir əməli mənə öyrət ki, onu yerinə yetirim”. Peyğəmbər ﷺ buyurdu: “Gərək Allaha ibadət edəsən və heç bir şeyi Ona şərik qoşmayasan, namaz qılasan, zəkat verəsən və qohum-əqrəbana yaxşılıq edəsən!” Adam dönüb getdikdən sonra Peyğəmbər ﷺ dedi: “Əgər əmr edilənlərdən möhkəm yapışsa, Cənnətə daxil olar”.

Digər rəvayətdə: “Əgər bundan möhkəm yapışsa...”– demişdir.

**[١٠٧] ١٥**-(١٤) و حَدَّثَنِي أَبُو بَكْرِ بْنُ إِسْحَقَ: حَدَّثَنَا عَفَّانُ: حَدَّثَنَا وُهَيْبٌ: حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيد، عَنْ أَبِي زُرْعَةَ: عَنْ أَبِي هُرَيْرَةَ أَنَّ أَعْرَابِيًّا جَاءَ إِلَى رَسُولِ اللَّهِ ﷺ فَقَالَ: يَا رَسُولَ اللَّهِ! دُلَّنِي عَلَى عَمَلٍ إِذَا عَمِلْتُهُ دَخَلْتُ الْجَنَّةَ. قَالَ: ((تَعْبُدُ اللَّهَ لاَ تُشْرِكُ بِهِ شَيْئًا، وَتُقِيمُ الصَّلاَةَ الْمَكْتُوبَةَ، وَتُؤَدِّي الزَّكَاةَ الْمَفْرُوضَةَ، وَتَصُومُ رَمَضَانَ)) قَالَ: وَالَّذِي نَفْسِي بِيَدِهِ لاَ أَزِيدُ عَلَى هَذَا شَيْئًا أَبَدًا، وَلاَ أَنْقُصُ مِنْهُ، فَلَمَّا وَلَّى، قَالَ النَّبِيُّ ﷺ: ((مَنْ سَرَّهُ أَنْ يَنْظُرَ إِلَى رَجُلٍ مِنْ أَهْلِ الْجَنَّةِ، فَلْيَنْظُرْ إِلَى هَذَا)).

**[107]-15-(14)** ........ Əbu Hureyrə ﷺ demişdir: “(Bir dəfə) bir bədəvi Peyğəmbərin ﷺ yanına gəlib dedi: “Ya Rəsulullah! Mənə elə bir əməl öyrət ki, onu yerinə yetirəcəyim təqdirdə Cənnətə daxil olum”. Peyğəmbər ﷺ buyurdu: “Allaha ibadət et və Ona heç kəsi şərik qoşma, fərz buyurulmuş namazları qıl, vacib buyurulmuş zəkatı ver və Ramazan ayını oruc tut!” Bədəvi dedi: “Canım Əlində olan *Allaha* and olsun ki, mən heç vaxt buna heç nə artırmayacağam və bundan

heç nə əskiltməyəcəyəm". O gedəndən sonra Peyğəmbər ﷺ buyurdu: "Cənnət əhlindən olan bir adama baxıb zövq almaq istəyəniniz varsa, qoy buna baxsın"[1].

**[١٠٨] ١٦-(١٥)** حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ وَأَبُو كُرَيْبٍ - وَاللَّفْظُ لأَبِي كُرَيْبٍ قَالاَ: حَدَّثَنَا أَبُو مُعَاوِيَةَ عَنْ الأَعْمَشِ، عَنْ أَبِي سُفْيَانَ، عَنْ جَابِرٍ ﷺ قَالَ: أَتَى النَّبِيَّ ﷺ النُّعْمَانُ بْنُ قَوْقَلٍ، فَقَالَ: يَا رَسُولَ اللَّهِ! أَرَأَيْتَ إِذَا صَلَّيْتُ الْمَكْتُوبَةَ، وَحَرَّمْتُ الْحَرَامَ، وَأَحْلَلْتُ الْحَلاَلَ أَأَدْخُلُ الْجَنَّةَ؟ فَقَالَ النَّبِيُّ ﷺ: ((نَعَمْ)).

**[108]-16-(15)** ........ Cabir ﷺ demişdir: "Nomən ibn Qovqəl Peyğəmbərin ﷺ yanına gəlib dedi: "Ya Rəsulullah! De görüm, əgər mən vacib buyurulmuş namazları qılsam, haramı haram sayıb[2] (ondan uzaq olsam), halalı da halal qəbul etsəm, Cənnətə girərəmmi?" Peyğəmbər ﷺ: "Bəli!"– deyə cavab verdi.

**[١٠٩] ١٧-(...)** و حَدَّثَنِي حَجَّاجُ بْنُ الشَّاعِرِ وَالْقَاسِمُ بْنُ زَكَرِيَّاءَ، قَالاَ: حَدَّثَنَا عُبَيْدُ اللَّهِ بْنُ مُوسَى عَنْ شَيْبَانَ، عَنْ الأَعْمَشِ عَنْ أَبِي صَالِحٍ، وَأَبِي سُفْيَانَ، عَنْ جَابِرٍ قَالَ: قَالَ النُّعْمَانُ بْنُ قَوْقَلٍ: يَا رَسُولَ اللَّهِ! بِمِثْلِهِ، وَزَادَا فِيهِ: وَلَمْ أَزِدْ عَلَى ذَلِكَ شَيْئًا.

**[109]-17-(...)** ........ Cabir ﷺ: "Nomən ibn Qovqəl dedi: "Ya Rəsulullah!..." deyə (yuxarıdakı) hədisi eynilə rəvayət etmiş və bu hədisdə: "və buna heç nə artırmasam..." sözünü əlavə etmişdir.

**[١١٠] ١٨-(...)** و حَدَّثَنِي سَلَمَةُ بْنُ شَبِيبٍ: حَدَّثَنَا الْحَسَنُ بْنُ أَعْيَنَ: حَدَّثَنَا مَعْقِلٌ وَهُوَ ابْنُ عُبَيْدِ اللَّهِ عَنْ أَبِي الزُّبَيْرِ، عَنْ جَابِرٍ، أَنَّ رَجُلاً سَأَلَ رَسُولَ اللَّهِ ﷺ فَقَالَ: أَرَأَيْتَ إِذَا صَلَّيْتُ الصَّلَوَاتِ الْمَكْتُوبَاتِ، وَصُمْتُ رَمَضَانَ، وَأَحْلَلْتُ الْحَلاَلَ وَحَرَّمْتُ الْحَرَامَ، وَلَمْ أَزِدْ عَلَى ذَلِكَ شَيْئًا، أَأَدْخُلُ الْجَنَّةَ؟ قَالَ: ((نَعَمْ)) قَالَ: وَاللَّهِ لاَ أَزِيدُ عَلَى ذَلِكَ شَيْئًا.

**[110]-18-(...)** ........ Cabir ﷺ demişdir: "Bir nəfər Peyğəmbərdən ﷺ soruşdu: "De görüm, əgər mən vacib buyurulmuş namazları qılsam, Ramazan ayını oruc tutsam, halalı halal qəbul etsəm, haramı da haram (sayıb ondan uzaq olsam) və

---

[1] Hədisdən açıq-aydın görünür ki, Peyğəmbər ﷺ bu adamın ölənədək vacib buyurulanları yerinə yetirəcəyini və Cənnətə daxil olacağını bilirdi.

[2] İbn Useymin demişdir: "Haramı tərk edən adam onun haram olduğunu etiqad etmədən tərk edərsə, bu, Allah üçün yerinə yetirilmiş ibadət sayıla bilməz. Məsələn, əgər bir adam şərabı haram buyurulduğuna görə yox, xoşlamadığından dolayı tərk edərsə, buna görə savab qazanmaz və əgər onu haram sayıb tərk edərsə, buna görə savab qazanar" ("Şərhul-Ərbəin", 1/23).

buna heç nə artırmasam, Cənnətə daxil olarammı?” Peyğəmbər ﷺ: “Bəli!”– deyə cavab verdi. Onda adam dedi: “Vallahi ki, mən buna heç nə artırmayacağam”.

## (٥) – بَابُ بَيَانِ أَرْكَانِ الإِسْلاَمِ وَدَعَائِمِهِ الْعِظَامِ

## 5-ci fəsil. İslamın rüknlərinin və əsas dayaqlarının bəyan olunması

**[١١١] ١٩**–(١٦) حَدَّثَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللَّهِ بْنِ نُمَيْرٍ الْهَمْدَانِيُّ: حَدَّثَنَا أَبُو خَالِدٍ يَعْنِي سُلَيْمَانَ بْنَ حَيَّانَ الأَحْمَرَ، عَنْ أَبِي مَالِكٍ الأَشْجَعِيِّ، عَنْ سَعْدِ بْنِ عُبَيْدَةَ، عَنِ ابْنِ عُمَرَ عَنِ النَّبِيِّ ﷺ قَالَ: ((بُنِيَ الإِسْلاَمُ عَلَى خَمْسَةٍ: عَلَى أَنْ يُوَحَّدَ اللَّهُ، وَإِقَامِ الصَّلاَةِ، وَإِيتَاءِ الزَّكَاةِ، وَصِيَامِ رَمَضَانَ، وَالْحَجِّ)) فَقَالَ رَجُلٌ: الْحَجُّ وَصِيَامُ رَمَضَانَ؟ قَالَ: لاَ، صِيَامُ رَمَضَانَ وَالْحَجُّ، هَكَذَا سَمِعْتُهُ مِنْ رَسُولِ اللَّهِ ﷺ.

**[111]-19-(16)** ........ İbn Ömər رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “İslam beş (əsas) üzərində qurulmuşdur: təkAllahlılığı qəbul etmək, namaz qılmaq, zəkat vermək, Ramazan orucunu tutmaq və həcc etmək”.

Bir nəfər (ibn Ömərdən) soruşdu: “(Məgər bu hədis) həcc etmək və Ramazan orucunu tutmaq (tərtibi ilə rəvayət edilməmişdirmi)?” İbn Ömər dedi: “Xeyr, Ramazan orucunu tutmaq və həcc etmək! Mən hədisi Peyğəmbərdən ﷺ bu tərtiblə də eşitmişəm”.

**[١١٢] ٢٠**–(...) و حَدَّثَنَا سَهْلُ بْنُ عُثْمَانَ الْعَسْكَرِيُّ: حَدَّثَنَا يَحْيَى بْنُ زَكَرِيَّاءَ بْنِ أَبِي زَائِدَةَ: حَدَّثَنَا سَعْدُ بْنُ طَارِقٍ قَالَ: حَدَّثَنِي سَعْدُ بْنُ عُبَيْدَةَ السُّلَمِيُّ عَنِ ابْنِ عُمَرَ عَنِ النَّبِيِّ ﷺ قَالَ: ((بُنِيَ الإِسْلاَمُ عَلَى خَمْسٍ: عَلَى أَنْ يُعْبَدَ اللَّهُ، وَيُكْفَرَ بِمَا دُونَهُ، وَإِقَامِ الصَّلاَةِ، وَإِيتَاءِ الزَّكَاةِ، وَحَجِّ الْبَيْتِ، وَصَوْمِ رَمَضَانَ)).

**[112]-20-(...)** ........ İbn Ömər رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “İslam beş (əsas) üzərində qurulmuşdur: Allaha ibadət etmək və Ondan başqa (mövcud olan bütün qondarma tanrıları) inkar etmək, namaz qılmaq, zəkat vermək, həcc etmək və Ramazan orucunu tutmaq”.

**[١١٣] ٢١**–(...) حَدَّثَنَا عُبَيْدُ اللَّهِ بْنُ مُعَاذٍ: حَدَّثَنَا أَبِي: حَدَّثَنَا عَاصِمٌ وَهُوَ ابْنُ مُحَمَّدِ بْنِ زَيْدِ بْنِ عَبْدِ اللَّهِ بْنِ عُمَرَ، عَنْ أَبِيهِ قَالَ: قَالَ عَبْدُ اللَّهِ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((بُنِيَ الإِسْلاَمُ عَلَى خَمْسٍ: شَهَادَةِ أَنْ لاَ إِلَهَ إِلاَّ اللَّهُ، وَأَنَّ مُحَمَّدًا عَبْدُهُ وَرَسُولُهُ، وَإِقَامِ الصَّلاَةِ، وَإِيتَاءِ الزَّكَاةِ، وَحَجِّ الْبَيْتِ، وَصَوْمِ رَمَضَانَ)).

**[113]-21-(...)** ........ İbn Ömər ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "İslam beş (əsas) üzərində qurulmuşdur: Allahdan başqa (ibadətə haqqı olan) məbudun olmadığına və Muhəmmədin Allahın qulu və elçisi olduğuna şahidlik etmək, namaz qılmaq, zəkat vermək, həcc etmək və ramazan orucunu tutmaq".

**[١١٤] ٢٢**-(...) و حَدَّثَنِي ابْنُ نُمَيْرٍ: حَدَّثَنَا أَبِي: حَدَّثَنَا حَنْظَلَةُ قَالَ: سَمِعْتُ عِكْرِمَةَ بْنَ خَالِدٍ يُحَدِّثُ طَاوُسًا، أَنَّ رَجُلاً قَالَ لِعَبْدِ اللَّهِ بْنِ عُمَرَ: أَلاَ تَغْزُو؟ فَقَالَ: إِنِّي سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ: ((إِنَّ الإِسْلاَمَ بُنِيَ عَلَى خَمْسٍ: شَهَادَةِ أَنْ لاَ إِلَهَ إِلاَّ اللَّهُ، وَإِقَامِ الصَّلاَةِ، وَإِيتَاءِ الزَّكَاةِ، وَصِيَامِ رَمَضَانَ، وَحَجِّ الْبَيْتِ)).

**[114]-22-(...)** ........ Tavus rəvayət edir ki, bir nəfər Abdullah ibn Ömərə dedi: "(Allah yolunda) vuruşmayacaqsanmı?!" İbn Ömər (ona) belə cavab verdi: "Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: "İslam beş (əsas) üzərində qurulmuşdur: Allahdan başqa (ibadətə haqqı olan) məbudun olmadığına şahidlik etmək, namaz qılmaq, zəkat vermək, Ramazan orucunu tutmaq və həcc etmək".

## (٦) – بَابُ الأَمْرِ بِالإِيمَانِ بِاللَّهِ تَعَالَى وَرَسُولِهِ ﷺ وَشَرَائِعِ الدِّينِ وَالدُّعَاءِ إِلَيْهِ وَالسُّؤَالِ عَنْهُ وَحِفْظِهِ وَتَبْلِيغِهِ مَنْ لَمْ يَبْلُغْهُ

## 6-cı fəsil. Uca Allaha, Onun elçisinə ﷺ və dinin hökmlərinə iman gətirməyi əmr etmək, dinə dəvət etmək, din haqqında sual vermək, dini qorumaq və dindən bixəbər olanlara onu təbliğ etmək

**[١١٥] ٢٣**-(١٧) حَدَّثَنَا خَلَفُ بْنُ هِشَامٍ: حَدَّثَنَا حَمَّادُ بْنُ زَيْدٍ عَنْ أَبِي جَمْرَةَ قَالَ: سَمِعْتُ ابْنَ عَبَّاسٍ؛ ح: و حَدَّثَنَا يَحْيَى بْنُ يَحْيَى – وَاللَّفْظُ لَهُ –: أَخْبَرَنَا عَبَّادُ بْنُ عَبَّادٍ، عَنْ أَبِي جَمْرَةَ، عَنْ ابْنِ عَبَّاسٍ قَالَ: قَدِمَ وَفْدُ عَبْدِ الْقَيْسِ عَلَى رَسُولِ اللَّهِ ﷺ فَقَالُوا: يَا رَسُولَ اللَّهِ! إِنَّا هَذَا الْحَيَّ مِنْ رَبِيعَةَ، وَقَدْ حَالَتْ بَيْنَنَا وَبَيْنَكَ كُفَّارُ مُضَرَ، فَلاَ نَخْلُصُ إِلَيْكَ إِلاَّ فِي شَهْرِ الْحَرَامِ، فَمُرْنَا بِأَمْرٍ نَعْمَلُ بِهِ، وَنَدْعُو إِلَيْهِ مَنْ وَرَاءَنَا. قَالَ: ((آمُرُكُمْ بِأَرْبَعٍ، وَأَنْهَاكُمْ عَنْ أَرْبَعٍ: الإِيمَانِ بِاللَّهِ)) ثُمَّ – فَسَّرَهَا لَهُمْ فَقَالَ –: ((شَهَادَةِ أَنْ لاَ إِلَهَ إِلاَّ اللَّهُ وَأَنَّ مُحَمَّدًا رَسُولُ اللَّهِ، وَإِقَامِ الصَّلاَةِ، وَإِيتَاءِ الزَّكَاةِ، وَأَنْ تُؤَدُّوا خُمُسَ مَا غَنِمْتُمْ. وَأَنْهَاكُمْ عَنْ الدُّبَّاءِ، وَالْحَنْتَمِ، وَالنَّقِيرِ، وَالْمُقَيَّرِ)) وَ زَادَ خَلَفٌ فِي رِوَايَتِهِ: ((شَهَادَةِ أَنْ لاَ إِلَهَ إِلاَّ اللَّهُ)) وَعَقَدَ وَاحِدَةً.

**[115]-23-(17)** ........ İbn Abbas ﷺ demişdir: "(Bir dəfə) Abdul-Qeys (qəbiləsinin) nümayəndələri Peyğəmbərin ﷺ yanına gəlib dedilər: "Ya Rəsulullah! Bizim

bu camaat Rəbiə qəbiləsindəndir. Səninlə bizim aramızda Mudər qəbiləsinin kafirləri durur. Bu səbəbdən də biz sənin yanına yalnız haram aylarda[1] gələ bilirik. Odur ki, bizə elə bir şey əmr et ki, onu həm özümüz yerinə yetirək, həm də geridə qalanlarımıza xəbər verək". Peyğəmbər ﷺ buyurdu: "Sizə dörd şeyi əmr edirəm və dörd şeyi qadağan edirəm: (sizə) Allaha iman gətirməyi; (sonra o bunu onlara izah edib dedi:) Allahdan başqa (ibadətə haqqı olan) məbudun olmadığına və Muhəmmədin Allahın elçisi olduğuna şahidlik etməyi, namaz qılmağı, zəkat verməyi və əldə etdiyiniz qənimətlərin beşdə birini (xums[2]) verməyi (əmr edirəm). Və sizlərə dubbanı[3], həntəmi[4], nəqiri[5] və muqəyyəri[6] qadağan edirəm".

Xələf (ibn Hişam) öz rəvayətində bunu da əlavə etmişdir: "Allahdan başqa (haqq) məbud olmadığına" – dedi və bir (barmağını) qatladı".

**[١١٦] ٢٤**–(...) وَ حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ وَمُحَمَّدُ بْنُ الْمُثَنَّى وَمُحَمَّدُ بْنُ بَشَّارٍ. وَأَلْفَاظُهُمْ مُتَقَارِبَةٌ – قَالَ أَبُو بَكْرٍ: حَدَّثَنَا غُنْدَرٌ: عَنْ شُعْبَةَ، و قَالَ الآخرَان: حَدَّثَنَا مُحَمَّدُ بْنُ جَعْفَرٍ: حَدَّثَنَا – شُعْبَةُ عَنْ أَبِي جَمْرَةَ قَالَ: كُنْتُ أُتَرْجِمُ بَيْنَ يَدَيْ ابْنِ عَبَّاسٍ وَبَيْنَ النَّاسِ، فَأَتَتْهُ امْرَأَةٌ تَسْأَلُهُ عَنْ نَبِيذِ الْجَرِّ فَقَالَ: إِنَّ وَفْدَ عَبْدِ الْقَيْسِ أَتَوْا رَسُولَ اللَّهِ ﷺ، فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: ((مَنْ الْوَفْدُ؟ – أَوْ مَنْ الْقَوْمُ؟ –)) قَالُوا: رَبِيعَةُ. قَالَ: ((مَرْحَبًا بِالْقَوْمِ – أَوْ بِالْوَفْدِ – غَيْرَ خَزَايَا وَلاَ النَّدَامَى)). قَالَ: فَقَالُوا: يَا رَسُولَ اللَّهِ! إِنَّا نَأْتِيكَ مِنْ شُقَّةٍ بَعِيدَةٍ، وَإِنَّ بَيْنَنَا وَبَيْنَكَ هَذَا الْحَيَّ مِنْ كُفَّارِ مُضَرَ، وَإِنَّا لاَ نَسْتَطِيعُ أَنْ نَأْتِيَكَ إِلاَّ فِي شَهْرِ الْحَرَامِ، فَمُرْنَا بِأَمْرٍ فَصْلٍ نُخْبِرْ بِهِ مَنْ وَرَاءَنَا نَدْخُلُ بِهِ الْجَنَّةَ. قَالَ: فَأَمَرَهُمْ بِأَرْبَعٍ، وَنَهَاهُمْ عَنْ أَرْبَعٍ: قَالَ: أَمَرَهُمْ بِالإِيمَانِ بِاللَّهِ وَحْدَهُ، وَقَالَ: هَلْ تَدْرُونَ مَا الإِيمَانُ بِاللَّهِ وَحْدَهُ؟ قَالُوا: اللَّهُ وَرَسُولُهُ أَعْلَمُ. قَالَ: ((شَهَادَةُ أَنْ لاَ إِلَهَ إِلاَّ اللَّهُ وَأَنَّ مُحَمَّدًا رَسُولُ اللَّهِ، وَإِقَامُ الصَّلاَةِ وَإِيتَاءُ الزَّكَاةِ، وَصَوْمُ رَمَضَانَ، وَأَنْ تُؤَدُّوا خُمُسًا مِنَ الْمَغْنَمِ)) وَنَهَاهُمْ عَنْ الدُّبَّاءِ وَالْحَنْتَمِ وَالْمُزَفَّتِ

---

[1] Peyğəmbər ﷺ demişdir: "Zaman Allah göyləri və yeri yaratdığı gündən bəri heç dəyişmədən dövran etməkdədir. İl on iki aydan ibarətdir. Bunlardan dördü haram aylardır. (Haram aylardan) üçü – Zülqədə, Zülhiccə və Muhərrəm dalbadal gəlir. (Dördüncüsü isə) Mudər qəbiləsinin (digər on bir aydan üstün tutduğu) və Cümadəl-axir ilə Şaban (ayları) arasında keçən Rəcəb ayıdır" ("Səhih əl-Buxari", 3197).

[2] Xums – hərbi qənimətlərin beşdə bir hissəsi. Bu bir hissə yenə də beş hissəyə bölünür və sonra onun beşdə bir hissəsi müsəlman hökmdarının əlində qalır, qalan beşdə dörd hissə isə Quran bölgüsünə uyğun olaraq Muhəmməd Peyğəmbərin ﷺ qohumları – Haşimin zürriyyəti, yetimlər, kasıblar və ehtiyac içində olan müsafirlər arasında paylanır.

[3] Dubba – şərab saxlamaq üçün qurudulmuş boranıdan düzəldilmiş qab.

[4] Həntəm – tərkibinə yun və qan qatılmış gildən düzəldilmiş yaşıl rəngli cürdək. Əvvəllər bu cür qablarda şərab saxlayardılar.

[5] Nəqir – şərab saxlamaq üçün içi oyulmuş xurma kötüyündən düzəldilmiş qab.

[6] Muqəyyər – şərab saxlamaq üçün yanları qatranla malalanmış qab.

– قَالَ شُعْبَةُ–: وَرُبَّمَا قَالَ: النَّقِيرِ – قَالَ: شُعْبَةُ –: وَرُبَّمَا قَالَ: الْمُقَيَّرِ. وَقَالَ: ((احْفَظُوهُ وَأَخْبِرُوا بِهِ مِنْ وَرَائِكُمْ)). و قَالَ أَبُو بَكْرٍ فِي رِوَايَتِهِ: ((مَنْ وَرَاءَكُمْ)) وَلَيْسَ فِي رِوَايَتِهِ الْمُقَيَّرِ.

**[116]-24-(...)** ........ Əbu Cəmrə demişdir: “(Bir dəfə) mən ibn Abbasın önündə oturub (gələn) adamların dediklərini ona, onun dediklərini də onlara tərcümə[1] edirdim. Elə bu vaxt bir qadın ibn Abbasın yanına gəlib ondan saxsı qabda saxlanılan (meyvə) şirəsi barədə soruşdu.[2] İbn Abbas dedi: “(Bir dəfə) Abdul-Qeys (qəbiləsinin) nümayəndələri Peyğəmbərin ﷺ yanına gəldilər və Peyğəmbər ﷺ (onlardan): “Siz kimi təmsil edirsiniz? (yaxud siz kimlərdənsiniz)?”– deyə soruşdu. Onlar: “Rəbiə (qəbiləsindənik)”– deyə cavab verdilər. (Peyğəmbər ﷺ) buyurdu: “Xoş gəlib, səfa gətirmisiniz! Allah sizi utandırmasın, peşman eləməsin!” Onlar dedilər: “Ya Rəsulullah! Biz sənin yanına uzaq səfərdən gəlmişik. Səninlə bizim aramızda Mudər qəbiləsinin kafirləri durur. Bu səbəbdən də biz sənin yanına yalnız haram aylarda gələ bilirik. Odur ki, bizə (haqqı batildən ayırd edən) bəlli bir şey əmr et ki, onu geridə qalanlarımıza xəbər verək, onun sayəsində Cənnətə girək”. Peyğəmbər ﷺ onlara dörd şeyi əmr etdi, dörd şeyi qadağan etdi: Onlara Tək Allaha iman gətirməyi əmr etdikdən sonra soruşdu: “Bilirsinizmi, Tək Allaha iman gətirmək nə deməkdir?” Onlar: “Allah və Onun rəsulu daha yaxşı bilir!”– dedilər. Peyğəmbər ﷺ buyurdu: “(Bu,) Allahdan başqa (ibadətə haqqı olan) heç bir məbudun olmadığına və Muhəmmədin Onun elçisi olduğuna şəhadət gətirmək, namaz qılmaq, zəkat vermək, Ramazan orucunu tutmaq və qənimətlərdən beşdə birini verməyinizdir”. (Peyğəmbər ﷺ) onlara dubbanı, həntəmi, muzəffəti[3] (yaxud nəqiri, ya da muqəyyəri)[4] qadağan etdi. (Sonra) dedi: “Buyurduqlarımı yadda saxlayın və bunları arxanızda qalanlara xəbər verin”.

Əbu Bəkr (ibn Əbu Şeybə) öz rəvayətində: “Arxanızdakılara”– demişdir və onun rəvayətində “muqəyyər” sözü yoxdur.

---

[1] Deyilənə görə, Əbu Cəmrə fars dilini bilirmiş və əcnəbilərin dediklərini İbn Abbasa tərcümə edirmiş. Lakin Əbu Amr ibn əs-Səlah bunu başqa cür izah edib demişdir: “Düşünürəm ki, Əbu Cəmrə İbn Abbasın sözünü izdihamdan dolayı onu eşitməyən kimsələrə çatdırır və ya İbn Abbasın söylədiklərini anlamayan kimsələrə onun sözlərinin məğzini başa salırdı”.

[2] Bu hədis qadının öyrənmək məqsədilə naməhrəm kişiyə bilavasitə sual verməyinin caiz olduğuna dəlalət edir.

[3] Muzəffət, yaxud muqəyyər – şərab saxlamaq üçün yanları qatranla malalanmış qab.

[4] Bu, Şobənin ؓ sözləridir.

**[١١٧] ٢٥**-(...) و حَدَّثَنِي عُبَيْدُ اللَّهِ بْنُ مُعَاذ: حَدَّثَنَا أَبِي؛ ح: و حَدَّثَنَا نَصْرُ بْنُ عَلِيٍّ الْجَهْضَمِيُّ قَالَ: أَخْبَرَنِي أَبِي، قَالاَ جَمِيعًا: حَدَّثَنَا قُرَّةُ بْنُ خَالِد، عَنْ أَبِي جَمْرَةَ، عَنْ ابْنِ عَبَّاسٍ عَنْ النَّبِيِّ ﷺ بِهَذَا الْحَدِيث نَحْوَ حَدِيث شُعْبَةَ، وَقَالَ: أَنْهَاكُمْ عَمَّا يُنْبَذُ فِي الدُّبَّاءِ وَالنَّقِيرِ وَالْحَنْتَمِ وَالْمُزَفَّت. وَزَادَ ابْنُ مُعَاذ فِي حَدِيثِه عَنْ أَبِيهِ قَالَ: وَقَالَ رَسُولُ اللَّهِ ﷺ لِلأَشَجِّ - أَشَجِّ عَبْدِ الْقَيْسِ -: ((إِنَّ فِيكَ خَصْلَتَيْنِ يُحِبُّهُمَا اللَّهُ الْحِلْمُ وَالأَنَاةُ)).

**[117]-25-(...)** ........ Qurrə ibn Xalid bu hədisi Əbu Cəmrədən, o da İbn Abbasdan, o da Peyğəmbərdən ﷺ, Şobənin Əbu Cəmrədən rəvayət etdiyi hədisə bənzər bir şəkildə rəvayət etmişdir. (Bu rəvayətdə Peyğəmbər ﷺ) demişdir: "Mən sizə dubbanın, nəqirin, həntəmin və muzəffətin içində hazırlanan şərabı qadağan edirəm". İbn Muaz öz atasından rəvayət etdiyi hədisə bunu da əlavə etmişdir: "Peyğəmbər ﷺ Əşəc Abdul-Qeysə[1] belə demişdir: "Səndə iki xislət vardır ki, Allah onları sevir. (Bu,) mülayimlik və təmkinli olmaqdır".

**[١١٨] ٢٦**-(١٨) حَدَّثَنَا يَحْيَى بْنُ أَيُّوبَ: حَدَّثَنَا ابْنُ عُلَيَّةَ: حَدَّثَنَا سَعِيدُ بْنُ أَبِى عَرُوبَةَ، عَنْ قَتَادَةَ قَالَ: حَدَّثَنَا مَنْ لَقِىَ الْوَفْدَ الَّذِينَ قَدِمُوا عَلَى رَسُولِ اللَّهِ ﷺ مِنْ عَبْدِ الْقَيْسِ - قَالَ سَعِيدٌ: وَذَكَرَ قَتَادَةُ أَبَا نَضْرَةَ - عَنْ أَبِى سَعِيدٍ الْخُدْرِىِّ فِى حَدِيثِهِ هَذَا، أَنَّ أُنَاسًا مِنْ عَبْدِ الْقَيْسِ قَدِمُوا عَلَى رَسُولِ اللَّهِ ﷺ فَقَالُوا: يَا نَبِىَّ اللَّهِ! إِنَّا حَىٌّ مِنْ رَبِيعَةَ، وَبَيْنَنَا وَبَيْنَكَ كُفَّارُ مُضَرَ، وَلاَ نَقْدِرُ عَلَيْكَ إِلاَّ فِى أَشْهُرِ الْحُرُمِ، فَمُرْنَا بِأَمْرٍ نَأْمُرُ بِهِ مَنْ وَرَاءَنَا، وَنَدْخُلُ بِهِ الْجَنَّةَ، إِذَا نَحْنُ أَخَذْنَا بِهِ، فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: ((آمُرُكُمْ بِأَرْبَعٍ: وَأَنْهَاكُمْ عَنْ أَرْبَعٍ، اعْبُدُوا اللَّهَ وَلاَ تُشْرِكُوا بِهِ شَيْئًا، وَأَقِيمُوا الصَّلاَةَ، وَآتُوا الزَّكَاةَ، وَصُومُوا رَمَضَانَ، وَأَعْطُوا الْخُمُسَ مِنَ الْغَنَائِمِ. وَأَنْهَاكُمْ عَنْ أَرْبَعٍ: عَنِ الدُّبَّاءِ، وَالْحَنْتَمِ، وَالْمُزَفَّتِ، وَالنَّقِيرِ)). قَالُوا: يَا نَبِىَّ اللَّهِ! مَا عِلْمُكَ بِالنَّقِيرِ؟ قَالَ: ((بَلَى! جِذْعٌ تَنْقُرُونَهُ، فَتَقْذِفُونَ فِيهِ مِنَ الْقُطَيْعَاءِ)) - قَالَ سَعِيدٌ: أَوْ قَالَ: ((مِنَ التَّمْرِ - ثُمَّ تَصُبُّونَ فِيهِ مِنَ الْمَاءِ، حَتَّى إِذَا سَكَنَ غَلَيَانُهُ شَرِبْتُمُوهُ، حَتَّى إِنَّ أَحَدَكُمْ - أَوْ إِنَّ أَحَدَهُمْ - لَيَضْرِبُ ابْنَ عَمِّهِ بِالسَّيْفِ)). قَالَ: وَفِى الْقَوْمِ رَجُلٌ أَصَابَتْهُ جِرَاحَةٌ كَذَلِكَ، قَالَ: وَكُنْتُ أَخْبَأُهَا حَيَاءً مِنْ رَسُولِ اللَّهِ ﷺ، فَقُلْتُ: فَفِيمَ نَشْرَبُ يَا رَسُولَ اللَّهِ؟ قَالَ: ((فِى أَسْقِيَةِ الأَدَمِ الَّتِى يُلاَثُ عَلَى أَفْوَاهِهَا)). قَالُوا: يَا رَسُولَ اللَّهِ! إِنَّ أَرْضَنَا كَثِيرَةُ الْجِرْذَانِ، وَلاَ تَبْقَى بِهَا أَسْقِيَةُ الأَدَمِ، فَقَالَ نَبِىُّ اللَّهِ ﷺ: ((وَإِنْ أَكَلَتْهَا الْجِرْذَانُ، وَإِنْ أَكَلَتْهَا الْجِرْذَانُ، وَإِنْ أَكَلَتْهَا الْجِرْذَانُ)). قَالَ: وَقَالَ نَبِىُّ اللَّهِ ﷺ لأَشَجِّ عَبْدِ الْقَيْسِ: ((إِنَّ فِيكَ لَخَصْلَتَيْنِ يُحِبُّهُمَا اللَّهُ الْحِلْمُ وَالأَنَاةُ)).

**[118]-26-(18)** ........ Qətadə demişdir: "Abdul-Qeys qəbiləsindən Peyğəmbərin ﷺ yanına gələn nümayəndələr arasında olanlardan birisi bizə belə rəvayət etmişdir. Səid ibn Ərubə demişdir: "Qətadə bu hədisi Əbu Nədrə-

---

[1] Adı: Munzir ibn Aizdir ﷺ.

dən, o da Əbu Səid əl-Xudridən[1] rəvayət etmişdir ki, Abdul-Qeys qəbiləsindən bir dəstə adam Peyğəmbərin ﷺ yanına gəlib dedi: "Ey Allahın peyğəmbəri! Biz Rəbiə qəbiləsindənik. Səninlə bizim aramızda Mudər qəbiləsinin kafirləri durur. Buna görə də biz sənin yanına yalnız haram aylarda gələ bilirik. Odur ki, bizə elə bir şey əmr et ki, onu geridə qalanlarımıza xəbər verək və ona əməl edəcəyimiz təqdirdə Cənnətə daxil olaq". Peyğəmbər ﷺ buyurdu: "Sizə dörd şeyi əmr edirəm və dörd şeyi qadağan edirəm: Allaha ibadət edin və heç bir şeyi ona şərik qoşmayın, namaz qılın, zəkat verin, Ramazan ayını oruc tutun və (əldə etdiyiniz) qənimətlərin beşdə birini (xums) verin.[2] Və sizlərə dörd şeyi – dubbanı, həntəmi, muzəffəti və nəqiri qadağan edirəm". Onlar: "Ey Allahın peyğəmbəri, nəqir haqqında nə bilirsən?" Peyğəmbər ﷺ dedi: "Bəli! Bu bir kötükdür ki, siz onda oyuq açıb içinə quteya[3], yaxud quru xurmalar atırsınız, sonra da üstünə su tökürsünüz. Nəhayət, onun qıcqırması dayandıqdan sonra ondan içirsiniz.[4] Beləcə, iş o yerə çatır ki, biriniz (keflənib) öz əmisi oğlunu qılıncdan keçirir"[5].

(Əbu Səid) dedi: "Camaat arasında belə bir hadisə ilə üzləşmiş (və ayağından) yara almış bir adam var idi. Bu adam deyirdi ki: "Mən utandığımdan yaranı Peyğəmbərdən ﷺ gizlədirdim".

---

[1] Əbu Səid əl-Xudri əl-Ənsari əl-Xəzrəci رضي الله عنه Peyğəmbərin ﷺ səhabəsidir. Adı: Səd ibn Malikdir. O, hicrətin 74-cü ilində vəfat etmişdir.

[2] Hədisdə Peyğəmbər ﷺ: "Sizə dörd şeyi əmr edirəm..." demiş, lakin beş şey sadalamışdır. Bunun izahı belədir ki, Peyğəmbər ﷺ onlara daimi olaraq Allaha ibadət edib heç bir şeyi ona şərik qoşmamağı, namaz qılmağı, zəkat verməyi və oruc tutmağı əmr etmiş, xumsu isə yalnız cihad olacağı təqdirdə verməyi buyurmuşdur. Ya da ki, zəkatı ümumi şəkildə, xumsu isə xüsusi şəkildə qeyd etmiş və onu da zəkata aid etmişdir.

[3] Quteya – xurma növüdür, bu xurmaya "şihriz" də deyilir.

[4] Xurmadan və başqa bu kimi meyvələrdən hazırlanmış içki qıcqırdıqdan sonra şəraba çevrilir deyə, şəriət onu içməyi haram buyurur. Buna ərəbcə "xamr" (خَمْر) – xumarlandırıcı deyilir. Lakin istənilən meyvə şirəsini qıcqırmamışdan əvvəl içmək halaldır. Onu da qeyd etmək lazımdır ki, şərabın çox və ya az içilməsində heç bir istisna yoxdur, haram elə haramdır. Hədislərin birində Peyğəmbər ﷺ buyurmuşdur: "Çoxu sərxoş edən hər bir şeyin azı da haramdır" ("Səhih əl-Cami əs-Səğir", 10467).

[5] Uca Allah buyurur: **"Ey iman gətirənlər! Şübhəsiz ki, sərxoşedici *içki* də, qumar da, *tapınmaq məqsədilə* dik qoyulmuş daşlar da, fal oxları da şeytan əməlindən olan murdar şeylərdir. Bunlardan çəkinin ki, bəlkə nicat tapasınız. Həqiqətən, şeytan sərxoşedici *içki* və qumar vasitəsilə sizin aranıza ədavət və kin salmaq, sizi Allahı yad etməkdən və namazdan ayırmaq istəyər. Siz *buna* son qoyacaqsınızmı?"** ("əl-Maidə" surəsi, 90-91).

Mən soruşdum: “Bəs nədə içək, ya Rəsulullah?” Dedi: “Ağızları iplə bağlanan tuluqlarda”[1] (Gələn adamlar) dedilər: “Ya Rəsulullah! Bizim ərazilərimiz siçovulla doludur. Onların əlindən dəri qablar salamat qalmır”. Peyğəmbər ﷺ buyurdu: “Siçovullar onları yesələr də, siçovullar onları yesələr də, siçovullar onları yesələr də!”

(Sonra) Peyğəmbər ﷺ Əşəc Abdul-Qeysə dedi: “Səndə iki xislət vardır ki, Allah onları sevir. (Bu,) mülayimlik və təmkinli olmaqdır”.

**[١١٩] ٢٧**–(...) حَدَّثَنِى مُحَمَّدُ بْنُ الْمُثَنَّى وَابْنُ بَشَّارٍ قَالاَ: حَدَّثَنَا ابْنُ أَبِى عَدِىٍّ عَنْ سَعِيدٍ، عَنْ قَتَادَةَ قَالَ: حَدَّثَنِى غَيْرُ وَاحِدٍ لَقِىَ ذَاكَ الْوَفْدَ – وَذَكَرَ أَبَا نَضْرَةَ – عَنْ أَبِى سَعِيدٍ الْخُدْرِىِّ أَنَّ وَفْدَ عَبْدِ الْقَيْسِ لَمَّا قَدِمُوا عَلَى رَسُولِ اللَّهِ ﷺ، بِمِثْلِ حَدِيثِ ابْنِ عُلَيَّةَ، غَيْرَ أَنَّ فِيهِ: ((وَتَذِيفُونَ فِيهِ مِنَ الْقُطَيْعَاءِ أَوِ التَّمْرِ وَالْمَاءِ)). وَلَمْ يَقُلْ: قَالَ سَعِيدٌ: أَوْ قَالَ: ((مِنَ التَّمْرِ)).

**[119]-27-(...)** ........ Qətadə: “O heyətdə olanlardan bir çoxları bu hədisi mənə rəvayət etmişdir”– demiş və Əbu Nədrənin Əbu Səid əl-Xudridən rəvayət etdiyi: “Abdul-Qeys qəbiləsinin nümayəndələri Peyğəmbərin ﷺ yanına gəldikdə.....” hədisini İbn Uleyyənin rəvayət etdiyi kimi rəvayət etmişdir. Ancaq bu hədisdə: “Onun içində quteya və ya xurma ilə suyu qarışdırırsınız” deyilir. Bu hədisdə: “Əbu Səid dedi: “Yaxud xurma qatırsınız” zikr edilməmişdir.

**[١٢٠] ٢٨**–(...) حَدَّثَنِى مُحَمَّدُ بْنُ بَكَّارٍ الْبَصْرِىُّ: حَدَّثَنَا أَبُو عَاصِمٍ عَنِ ابْنِ جُرَيْجٍ؛ **ح**: وَحَدَّثَنِى مُحَمَّدُ بْنُ رَافِعٍ، وَاللَّفْظُ لَهُ: حَدَّثَنَا عَبْدُ الرَّزَّاقِ: أَخْبَرَنَا ابْنُ جُرَيْجٍ قَالَ: أَخْبَرَنِى أَبُو قَزَعَةَ، أَنَّ أَبَا نَضْرَةَ أَخْبَرَهُ، وَحَسَنًا أَخْبَرَهُمَا أَنَّ أَبَا سَعِيدٍ الْخُدْرِىَّ أَخْبَرَهُ، أَنَّ وَفْدَ عَبْدِ الْقَيْسِ لَمَّا أَتَوْا نَبِىَّ اللَّهِ ﷺ قَالُوا: يَا نَبِىَّ اللَّهِ! جَعَلَنَا اللَّهُ فِدَاءَكَ، مَاذَا يَصْلُحُ لَنَا مِنَ الأَشْرِبَةِ؟ فَقَالَ: ((لاَ تَشْرَبُوا فِى النَّقِيرِ)). قَالُوا: يَا نَبِىَّ اللَّهِ! جَعَلَنَا اللَّهُ فِدَاءَكَ، أَوَتَدْرِى مَا النَّقِيرُ؟ قَالَ: ((نَعَمِ، الْجِذْعُ يُنْقَرُ وَسَطُهُ – وَلاَ فِى الدُّبَّاءِ، وَلاَ فِى الْحَنْتَمَةِ، وَعَلَيْكُمْ بِالْمُوكَى)).

**[120]-28-(...)** ........ Əbu Səid əl-Xudri رضي الله عنه demişdir: “Abdul-Qeys qəbiləsinin nümayəndələri Peyğəmbərin ﷺ yanına gəldikləri vaxt dedilər: “Ey Allahın peyğəmbəri! Allah bizi sənə fəda eləsin, (de görək,) içiləcək şeylərdən bizə nələr məsləhətdir?” (Peyğəmbər ﷺ): “Nəqirdə[2] içməyin!”– dedi. Onlar soruş-

---

[1] İçində maye, yağ və s. saxlamaq üçün qab kimi işlədilən, aşılama ilə hazırlanmış bütöv qoyun və ya keçi dərisi.

[2] 115-ci hədisin qeydlərinə bax.

dular: “Ey Allahın peyğəmbəri! Allah bizi sənə fəda eləsin, nəqirin nə olduğunu bilirsənmi?” (Peyğəmbər ﷺ) dedi: “Bəli, (bu,) ortasında oyuq açılmış bir kötükdür, eləcə də dubbada və həntəmdə (içməyin). Ancaq ağzı iplə bağlanan (dəri) qablardan istifadə edin!”

## (٧) – بَابُ الدُّعَاءِ إِلَى الشَّهَادَتَيْنِ وَشَرَائِعِ الإِسْلاَمِ

## 7-ci fəsil. Kəlmeyi-şəhadətə və İslam qayda-qanunlarına dəvət etmək

**[١٢١] ٢٩–(١٩)** حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ وَأَبُو كُرَيْبٍ وَإِسْحَقُ بْنُ إِبْرَاهِيمَ، جَمِيعًا عَنْ وَكِيعٍ – قَالَ أَبُو بَكْرٍ: حَدَّثَنَا وَكِيعٌ، عَنْ زَكَرِيَّاءَ بْنِ إِسْحَقَ قَالَ: حَدَّثَنِي يَحْيَى بْنُ عَبْدِ اللَّهِ بْنِ صَيْفِيٍّ، عَنْ أَبِي مَعْبَدٍ، عَنْ ابْنِ عَبَّاسٍ، عَنْ مُعَاذِ بْنِ جَبَلٍ – قَالَ أَبُو بَكْرٍ: رُبَّمَا قَالَ وَكِيعٌ –: عَنْ ابْنِ عَبَّاسٍ، أَنَّ مُعَاذًا قَالَ: بَعَثَنِي رَسُولُ اللَّهِ ﷺ قَالَ: ((إِنَّكَ تَأْتِي قَوْمًا مِنْ أَهْلِ الْكِتَابِ، فَادْعُهُمْ إِلَى شَهَادَةِ أَنْ لاَ إِلَهَ إِلاَّ اللَّهُ وَأَنِّي رَسُولُ اللَّهِ، فَإِنْ هُمْ أَطَاعُوا لِذَلِكَ فَأَعْلِمْهُمْ أَنَّ اللَّهَ افْتَرَضَ عَلَيْهِمْ خَمْسَ صَلَوَاتٍ فِي كُلِّ يَوْمٍ وَلَيْلَةٍ، فَإِنْ هُمْ أَطَاعُوا لِذَلِكَ فَأَعْلِمْهُمْ أَنَّ اللَّهَ افْتَرَضَ عَلَيْهِمْ صَدَقَةً تُؤْخَذُ مِنْ أَغْنِيَائِهِمْ فَتُرَدُّ فِي فُقَرَائِهِمْ، فَإِنْ هُمْ أَطَاعُوا لِذَلِكَ، فَإِيَّاكَ وَكَرَائِمَ أَمْوَالِهِمْ، وَاتَّقِ دَعْوَةَ الْمَظْلُومِ، فَإِنَّهُ لَيْسَ بَيْنَهَا وَبَيْنَ اللَّهِ حِجَابٌ)).

**[121]-29-(19)** ........ Muaz ﵁ demişdir: “Peyğəmbər ﷺ məni (Yəmənə) göndərdi və dedi: “Sən Kitab əhlindən olan bir qövmün yanına gedirsən. Onları Allahdan başqa (ibadətə haqqı olan) məbudun olmadığına və mənim Allahın elçisi olduğuma şəhadət verməyə dəvət et. Əgər bu işdə sənə itaət etsələr, onlara xəbər ver ki, Allah onlara gündəlik olaraq beş vaxt namaz qılmağı vacib buyurmuşdur. Əgər bu işdə sənə itaət etsələr, onları xəbərdar et ki, Allah onlara zəkat verməyi, varlılarından götürülüb kasıblarına paylanılmasını vacib buyurmuşdur. Əgər bu işdə də sənə itaət etsələr, onda onların mallarının ən qiymətlisini götürməkdən çəkin və məzlumun bədduasından qorx. Çünki onunla Allah arasında (bu bədduanın qarşısını ala biləcək) heç bir pərdə yoxdur”[1].

---

[1] Bu hədisdən belə nəticələr çıxır ki, bir nəfərdən rəvayət edilmiş xəbəri qəbul etmək olar. Hədis Muazın ﵁ dini əhkamları yaxşı bildiyinə, həm də fəzilətli bir səhabə olduğuna dəlalət edir. Üstəlik hədis, kafirlərlə döyüşməmişdən əvvəl onları İslama dəvət etmək, İslama dəvət etdikdə də ilk əvvəl tövhiddən, sonra da ən mühüm işlərdən başlamağa da dəlalət edir. Hədisdən beş vaxt namaz qılmağın vacib buyurulması, zülm etməyin haram olması, zəkatı yığan adama malların ən qiymətlisini götürməyinin qadağan edilməsi açıq-aydın görünür.

**[١٢٢]** ٣٠-(...) حَدَّثَنَا ابْنُ أَبِي عُمَرَ: حَدَّثَنَا بِشْرُ بْنُ السَّرِيِّ: حَدَّثَنَا زَكَرِيَّاءُ بْنُ إِسْحَقَ، ح: و حَدَّثَنَا عَبْدُ بْنُ حُمَيْدٍ: حَدَّثَنَا أَبُو عَاصِمٍ عَنْ زَكَرِيَّاءَ بْنِ إِسْحَقَ، عَنْ يَحْيَى بْنِ عَبْدِ اللَّهِ بْنِ صَيْفِيٍّ، عَنْ أَبِي مَعْبَدٍ، عَنْ ابْنِ عَبَّاسٍ، أَنَّ النَّبِيَّ ﷺ بَعَثَ مُعَاذًا إِلَى الْيَمَنِ فَقَالَ: ﷺ قَالَ: ((إِنَّكَ سَتَأْتِي قَوْمًا)) بِمِثْلِ حَدِيثِ وَكِيعٍ.

**[122]-30-(...)** ........ Əbu Məbəd bu hədisi Vəkinin hədisinə yaxın mənada rəvayət etmişdir. (Hədisdə) İbn Abbas demişdir: "Peyğəmbər ﷺ Muazı Yəmənə göndərərkən demişdir: "Sən Kitab əhlindən olan bir qövmün yanına gedirsən..."

**[١٢٣]** ٣١-(...) حَدَّثَنَا أُمَيَّةُ بْنُ بِسْطَامَ الْعَيْشِيُّ: حَدَّثَنَا يَزِيدُ بْنُ زُرَيْعٍ: حَدَّثَنَا رَوْحٌ وَهُوَ ابْنُ الْقَاسِمِ، عَنْ إِسْمَعِيلَ بْنِ أُمَيَّةَ، عَنْ يَحْيَى بْنِ عَبْدِ اللَّهِ بْنِ صَيْفِيٍّ، عَنْ أَبِي مَعْبَدٍ، عَنْ ابْنِ عَبَّاسٍ أَنَّ رَسُولَ اللَّهِ ﷺ لَمَّا بَعَثَ مُعَاذًا إِلَى الْيَمَنِ قَالَ: ((إِنَّكَ تَقْدَمُ عَلَى قَوْمٍ أَهْلِ كِتَابٍ، فَلْيَكُنْ أَوَّلَ مَا تَدْعُوهُمْ إِلَيْهِ عِبَادَةُ اللَّهِ عَزَّ وَجَلَّ، فَإِذَا عَرَفُوا اللَّهَ، فَأَخْبِرْهُمْ أَنَّ اللَّهَ فَرَضَ عَلَيْهِمْ خَمْسَ صَلَوَاتٍ فِي يَوْمِهِمْ وَلَيْلَتِهِمْ، فَإِذَا فَعَلُوا فَأَخْبِرْهُمْ أَنَّ اللَّهَ قَدْ فَرَضَ عَلَيْهِمْ زَكَاةً تُؤْخَذُ مِنْ أَغْنِيَائِهِمْ فَتُرَدُّ عَلَى فُقَرَائِهِمْ، فَإِذَا أَطَاعُوا بِهَا فَخُذْ مِنْهُمْ، وَتَوَقَّ كَرَائِمَ أَمْوَالِهِمْ)).

**[123]-31-(...)** ........ İbn Abbas رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ Muaz ibn Cəbəli Yəmənə göndərərkən demişdir: "Sən Kitab əhlindən olan bir qövmün yanına gedirsən. Elə isə ilk əvvəl onları İzzətli və Qüdrətli Allaha ibadət etməyə dəvət et. Əgər Allahı tanısalar,[1] onlara xəbər ver ki, Allah onlara gecə-gündüz beş vaxt namaz qılmağı vacib buyurmuşdur. Əgər buna əməl etsələr, onları xəbərdar et ki, Allah onlara zəkat verməyi – varlılarından götürülüb kasıblarına paylanılmağı vacib buyurmuşdur. Buna itaət etsələr, (zəkatı) onlardan götür.[2] Lakin insanların mallarının ən qiymətlisini götürməkdən çəkin!"

---

[1] Qazı İyad رحمه الله demişdir: "Bu, Kitab əhlinin Allah Təaləni tanımadığına dəlalət edir. Onlar zahirdə Allaha ibadət etdiklərini və Onu tanıdıqlarını göstərsələr də, əslində, Onu tanımırlar..."

Yenə o demişdir: "Yəhudilərdən Allahı məxluqata bənzədən və Ona surət verən, yaxud Onun səhv etdikdən sonra düzgün qərar verdiyini deyən, yaxud özlərinin Onun övladları olduğunu iddia edən, habelə xristianlardan Ona övlad və ya zövcə isnad edən, Onun məxluqata qarışdığını deyən, həmçinin məcusilərdən və müşriklərdən Onu layiqincə vəsf etməyən, yaxud Ona şərik qoşan və Onun Xaliq olduğunu inkar edən kimsələr, Allahı tanıya bilməzlər. Onlar tapındıqları məbudu Allah çağırsalar da, O, Allah ola bilməz. Çünki o, vəsf edilməsi vacib buyurulmuş ilahi sifətlərlə vəsf edilməmişdir. Deməli, onlar pak və müqəddəs Allahı tanımırlar".

[2] Bu dəlildir ki, mal sahibi zəkat verməkdən imtina etmiş olsa belə, onun malından zəkat çıxartmaq vacibdir.

# (٨) – بَابُ الأَمْرِ بِقِتَالِ النَّاسِ حَتَّى يَقُولُوا لاَ إِلَهَ إِلاَّ اللَّهُ مُحَمَّدٌ رَسُولُ اللَّه، وَيُقِيمُوا الصَّلاَةَ، وَيُؤْتُوا الزَّكَاةَ وَيُؤْمِنُوا بِجَمِيعِ مَا جَاءَ بِه النَّبِيُّ ﷺ، وَأَنَّ مَنْ فَعَلَ ذَلِكَ عَصَمَ نَفْسَهُ وَمَالَهُ إِلاَّ بِحَقِّهَا، وَوُكِّلَتْ سَرِيرَتُهُ إِلَى اللَّهِ تَعَالَى. وَقِتَالِ مَنْ مَنَعَ الزَّكَاةَ أَوْ غَيْرَهَا مِنْ حُقُوقِ الإِسْلاَمِ، وَاهْتِمَامِ الإِمَامِ بِشَعَائِرِ الإِسْلاَمِ

## 8-ci fəsil. İnsanlar: “Lə ilahə illəllah,[1] Muhəmmədun Rəsulullah”[2] deyincəyə, namaz qılıb zəkat verincəyə və Peyğəmbərin ﷺ təbliğ etdiyi hər bir şeyə iman gətirincəyə qədər onlara qarşı vuruşmağın əmr edilməsi, hər kim bunu (aşkarda) yerinə yetirsə – İslam haqqı[3] istisna olmaqla – canını və malını qorumuş olar, gizli saxladıqları[4] isə Allaha aiddir, habelə zəkat verməkdən və ya İslam haqlarından birini yerinə yetirməkdən boyun qaçıran kimsələrə qarşı vuruşmaq və bir də əmirin İslam qayda-qanunlarına ciddi əhəmiyyət verməsi

---

[1] TəkAllahlılığın sübutu və şəhadəti. Mənası “Allahdan başqa *ibadətə layiq olan* məbud yoxdur” deməkdir. Müsəlmanlar Uca Allahdan başqa heç kəsə və heç nəyə ibadət etmirlər. Çünki təkcə Allah ilahi xilqətlər yaratmağa qadirdir və həqiqi Allaha məxsus kamil sifətlərə malik olan da Odur. Müsəlmanlar bütlərə, ulduzlara, müqəddəs varlıqlara, peyğəmbərlərə və yaxud mələklərə ibadəti rədd edirlər. Çünki bütün bu saydıqlarımız yaradılmış olub Xaliqə, Yaradana möhtacdırlar. O isə yenilməz qüdrət və qüvvət Sahibidir və heç kimə və heç nəyə möhtac deyildir. Lakin bu şəhadətə iman gətirmək və müsəlman olmaq üçün yeddi şərt yerinə yetirilməlidir. Əks təqdirdə tövhid şəhadəti o kimsəyə fayda verməz. Bunlar: (1) bu şəhadətin mahiyyəti haqqında bilikdir ki, nadanlıqla bir araya sığmaz; (2) bu şəhadətin doğruluğuna iman gətirməkdir ki, şəkk gətirməklə bir araya sığmaz; (3) qəlblə və dil ilə bu şəhadətin qəbul edilməsidir ki, onun sözlərini deməkdən boyun qaçırmaqla bir araya sığmaz; (4) bu şəhadətin bütün tələblərinə mütiliklə tabe olmaqdır ki, Allaha və Muhəmməd Peyğəmbərə ﷺ asi olmaqla bir araya sığmaz; (5) bu şəhadəti dilə gətirərkən təbii olan səmimiyyətdir ki, – yalanla bir araya sığmaz; (6) bu şəhadətə və onu yerinə yetirənlərə bəslənilən məhəbbətdir ki, – tövhidə və onu yerinə yetirənlərə qarşı kin və ikrahla bir araya sığışmaz; (7) Allahdan başqa hər bir şeyə ibadətdən əl çəkmək.

[2] Allahdan başqa (ibadətə haqqı olan) məbud yoxdur və Muhəmməd Allahın elçisidir.

[3] Yəni cinayətə görə veriləcək cəza. Şövkani demişdir: “Burada “İslam haqqı” deyildikdə şəriətin buyurduğu qisas, dul zinakarın daşqalaq edilməsi və başqa bu kimi cəzalarla qan tökmək nəzərdə tutulur. (Belə hallarda qan tökmək isə məqsədəuyğundur)...” (“Neylul-Əvtar”, 1/364).

[4] Burada söhbət niyyətdən və bu kimi gizli əməllərdən gedir.

**[١٢٤]** **٣٢-(٢٠)** حَدَّثَنَا قُتَيْبَةُ بْنُ سَعِيد: حَدَّثَنَا لَيْثُ بْنُ سَعْد عَنْ عُقَيْلٍ، عَنْ الزُّهْرِيِّ قَالَ: أَخْبَرَنِي عُبَيْدُ اللَّه بْنُ عَبْد اللَّه بْنِ عُتْبَةَ بْنِ مَسْعُود، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ: لَمَّا تُوُفِّيَ رَسُولُ اللَّه ﷺ وَاسْتُخْلفَ أَبُو بَكْرٍ بَعْدَهُ،وَكَفرَ مَنْ كَفرَ منْ الْعَرَب، قَالَ عُمَرُ بْنُ الْخَطَّاب لأَبي بَكْرٍ: كَيْفَ تُقَاتلُ النَّاسَ، وَقَدْ قَالَ رَسُولُ اللَّه ﷺ: ((أُمرْتُ أَنْ أُقَاتلَ النَّاسَ حَتَّى يَقُولُوا: لاَ إِلَهَ إِلاَّ اللَّهُ، فَمَنْ قَالَ: لاَ إِلَهَ إِلاَّ اللَّهُ، فَقَدْ عَصَمَ منِّي مَالَهُ وَنَفْسَهُ إِلاَّ بحَقِّه، وَحسَابُهُ عَلَى اللَّه تَعَالَى))؟ فَقَالَ أَبُو بَكْرٍ: وَاللَّه لأُقَاتلَنَّ مَنْ فَرَّقَ بَيْنَ الصَّلاَة وَالزَّكَاة، فَإِنَّ الزَّكَاةَ حَقُّ الْمَال، وَاللَّه! لَوْ مَنَعُوني عقَالاً كَانُوا يُؤَدُّونَهُ إِلَى رَسُول اللَّه ﷺ لَقَاتَلْتُهُمْ عَلَى مَنْعه، فَقَالَ عُمَرُ بْنُ الْخَطَّاب: فَوَاللَّه! مَا هُوَ إِلاَّ أَنْ رَأَيْتُ اللَّهَ عَزَّ وَجَلَّ قَدْ شَرَحَ صَدْرَ أَبِي بَكْرٍ للْقتَال، فَعَرَفْتُ أَنَّهُ الْحَقُّ.

**[124]-32-(20)** ........ Əbu Hureyrə ﷺ demişdir: “Peyğəmbərin ﷺ vəfatından sonra Əbu Bəkr[1] xəlifə seçildikdə və ərəblərdən bəziləri küfr etdikdə[2] Ömər ibn Xəttab Əbu Bəkrə[3] dedi: “Peyğəmbər ﷺ: “İnsanlar “lə ilahə illəllah” deyincəyə qədər onlara qarşı vuruşmaq mənə əmr edildi.[4] Odur ki, kim: “Lə ilahə illəllah” desə – İslam haqqı istisna olmaqla – canını və malını məndən qorumuş olar. Onun (gizli saxladıqlarının) haqq-hesabı isə Uca Allaha aiddir”[5]– buyurduğu halda sən nə deyib onlarla vuruşacaqsan?!” Əbu Bəkr dedi: “Vallahi, mən namazla zəkatı bir-birindən ayıran (hər) kəslə vuruşacağam. Çünki zəkat malın haqqıdır. Vallahi, əgər onlar Rəsulullaha ﷺ verdikləri zəkatı məndən əsirgəsələr, buna görə onlarla hökmən vuruşacağam”. Ömər ibn Xəttab dedi: “Vallahi ki, mən izzət və qüdrət sahibi olan Allahın Əbu Bəkrin

---

[1] Əbu Bəkr əs-Siddiq ﷺ Peyğəmbərin ﷺ səhabəsidir. Adı: Abdullah ibn Osmandır. Hicrətin 13-cü ilində 63 yaşında vəfat etmişdir.

[2] Mürtəd olanlar üç qisim idilər: bir qismi cahiliyyət dövründəki etiqadlarına – bütpərəstliyə qayıtdılar, bir qismi peyğəmbərlik iddiasında olan Museyləməyə və Əsvəd əl-Ənəsiyə uydular, bir qismi də müsəlman olduqlarını iddia etdikləri halda, zəkat verməkdən boyun qaçırdılar və bunu inkar etdilər.

[3] Həmin vaxt Əbu Bəkr ﷺ mürtədlərə qarşı vuruşmağa hazırlıq görürdü.

[4] İbn Useymin demişdir: “Bu hədis, ümumiyyətlə, kafirlərin hamısına şamil edilir. Lakin “ət-Tovbə” surəsinin 29-cu ayəsi Kitab əhlini istisna edir. Ayədə belə buyurulur: **“Kitab verilənlərdən Allaha və Axirət gününə iman gətirməyən, Allahın və Onun Elçisinin haram buyurduğunu haram saymayan və həqiqi din *olan İslama* etiqad etməyənlərlə, zəlil günə qalıb öz əlləri ilə cizyə verməyə məcbur oluncaya qədər vuruşun”.** (Ayədən görünür ki, Kitab əhlindən cizyə verənlərlə vuruşmaq qadağandır)” (“Şərhul-Ərbəin”, 1/17).

[5] Tiybi demişdir: “Biz: “Lə ilahə illəllah” deyən və zahirən müsəlman olduğunu göstərən heç bir kimsəyə qarşı vuruşmamalı, habelə onun səmimi olub-olmadığını araşdırmamalıyıq” (“Tohfətul-Əhvəzi”, 7/283).

köksünü bu döyüş üçün açıb genişləndirdiyinə şahid oldum və bunun haqq olduğunu başa düşdüm”.[1]

**[١٢٥] ٣٣-(٢١)** و حَدَّثَنَا أَبُو الطَّاهِرِ وَحَرْمَلَةُ بْنُ يَحْيَى وَأَحْمَدُ بْنُ عِيسَى – قَالَ أَحْمَدُ: حَدَّثَنَا، و قَالَ الآخَرَانِ: أَخْبَرَنَا – ابْنُ وَهْبٍ قَالَ: أَخْبَرَنِي يُونُسُ عَنْ ابْنِ شِهَابٍ: قَالَ حَدَّثَنِي سَعِيدُ بْنُ الْمُسَيَّبِ؛ أَنَّ أَبَا هُرَيْرَةَ أَخْبَرَهُ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: ((أُمِرْتُ أَنْ أُقَاتِلَ النَّاسَ حَتَّى يَقُولُوا: لاَ إِلَهَ إِلاَّ اللَّهُ، فَمَنْ قَالَ: لاَ إِلَهَ إِلاَّ اللَّهُ، عَصَمَ مِنِّي مَالَهُ وَنَفْسَهُ إِلاَّ بِحَقِّهِ، وَحِسَابُهُ عَلَى اللَّهِ)).

**[125]-33-(21)** ........ Əbu Hureyrə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “İnsanlar “lə ilahə illəllah” deyincəyə qədər onlarla vuruşmaq mənə əmr edildi. Odur ki, kim “lə ilahə illəllah” desə – İslam haqqı istisna olmaqla – canını və malını məndən qorumuş olar. Onun (gizli saxladıqlarının) haqq-hesabı isə Allaha aiddir”.

---

[1] İbn Həcər demişdir: “Bu hədisdən belə nəticə çıxır ki, şəriət hökmləri barədə ictihad etmək caiz və bunu Allaha və Onun Peyğəmbərinə ﷺ həvalə etmək (yəni Kitab və Sünnəyə müraciət) etmək vacibdir, habelə bu xüsusda mübahisə etmək, lakin sonunda daha doğru rəyə qayıtmaq, üstəlik mübahisəni ədəblə, kobudluğa yol verməməklə və mülayim şəkildə aparmaq (müsəlman əxlaqına) uyğundur. Mübahisə edən kəs doğru rəyi anlayanadək ona hüccət gətirmək vacib. Əgər dəlil-sübutdan sonra inadkarlıq edərsə, ona sərt münasibət göstərmək caizdir. Eləcə də bir fikri sübuta yetirmək üçün Allaha and içmək məqsədəuyğundur. Hədisdən həmçinin belə nəticə də çıxır ki, sadəcə “lə ilahə illəllah” deyən (və şəhadətin ikinci tərəfini,) yəni “Muhəmmədən Rəsulullah” deməyən) kimsəni (kafir sayaraq) qətlə yetirmək qadağandır. Bəli, bu, danılmaz həqiqətdir. Yaxşı bəs “lə ilahə illəllah” deməklə o kəs müsəlman sayılırmı? Daha doğru rəy odur ki, xeyr, sayılmır. Əksinə, bu adam imtahan edilənədək, sadəcə onu öldürmək qadağandır. Əgər o, Muhəmmədin Allahın elçisi olduğuna şəhadət gətirsə və İslam əhkamlarını yerinə yetirsə, onun müsəlman olduğuna hökm vermək olar. Buna da dəlil: “(Peyğəmbərin ﷺ): “İslam haqqı istisna olmaqla” sözüdür. Bəğəvi (bu xüsusda) demişdir: “TəkAllahlılığı qəbul etməyən bütpərəst kafir “lə ilahə illəllah” dediyi zaman (zahirən) onun müsəlman olduğuna hökm verilsə də, sonradan ona İslamın əhkamlarının hamısını qəbul etməyi və bu dinə zidd olan batil inancların hamısından uzaq olmağı məcbur etmək gərəkdir. Qaldı ki, təkAllahlılığı təsdiqləyib Peyğəmbəri ﷺ inkar edən kimsəyə, beləsi “Muhəmmədun Rəsulullah” deməyincə onu müsəlman saymaq olmaz. Əgər o, Muhəmmədin ﷺ ancaq ərəblərə peyğəmbər göndərildiyini etiqad edirmişsə, onun bütün insanlara elçi göndərildiyini deməlidir. Və əgər İslamda vacib buyurulmuş bir hökmü inkar edərsə, yaxud haram buyurulmuş bir şeyi halal sayarsa, ona etiqadından dönmək əmr edilməlidir”. Bəğəvinin: “məcbur etmək gərəkdir” sözündən belə çıxır ki, əgər həmin adam İslam qayda-qanunlarını inkar edərsə, mürtəd sayılar...” (“Fəth əl-Bari”, 19/382).

**[١٢٦] ٣٤**–(...) حَدَّثَنَا أَحْمَدُ بْنُ عَبْدَةَ الضَّبِّيُّ: أَخْبَرَنَا عَبْدُ الْعَزِيزِ يَعْنِي الدَّرَاوَرْدِيَّ، عَنْ الْعَلَاءِ؛ ح: و حَدَّثَنَا أُمَيَّةُ بْنُ بِسْطَامَ – وَاللَّفْظُ لَهُ –: حَدَّثَنَا يَزِيدُ بْنُ زُرَيْعٍ: حَدَّثَنَا رَوْحٌ عَنْ الْعَلَاءِ بْنِ عَبْدِ الرَّحْمَنِ بْنِ يَعْقُوبَ، عَنْ أَبِيهِ عَنْ أَبِي هُرَيْرَةَ عَنْ رَسُولِ اللَّهِ ﷺ قَالَ: ((أُمِرْتُ أَنْ أُقَاتِلَ النَّاسَ حَتَّى يَشْهَدُوا أَنْ لَا إِلَهَ إِلاَّ اللَّهُ، وَيُؤْمِنُوا بِي وَبِمَا جِئْتُ بِهِ، فَإِذَا فَعَلُوا ذَلِكَ عَصَمُوا مِنِّي دِمَاءَهُمْ وَأَمْوَالَهُمْ إِلاَّ بِحَقِّهَا، وَحِسَابُهُمْ عَلَى اللَّهِ)).

**[126]-34-(...)** ........ Əbu Hureyrə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "İnsanlar Allahdan başqa (haqq) məbudun olmadığına şahidlik etməyincə, üstəlik mənə və mənim təbliğ etdiyimə iman gətirməyincə onlarla vuruşmaq mənə əmr edildi. Əgər buna əməl etsələr – İslam haqqı istisna olmaqla – canlarını və mallarını məndən qorumuş olarlar. Onların (gizli saxladıqlarının) haqq-hesabı isə Allaha aiddir".

**[١٢٧] ٣٥**–(...) و حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا حَفْصُ بْنُ غِيَاثٍ عَنْ الْأَعْمَشِ، عَنْ أَبِي سُفْيَانَ، عَنْ جَابِرٍ – وَعَنْ أَبِي صَالِحٍ – عَنْ أَبِي هُرَيْرَةَ قَالَا: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((أُمِرْتُ أَنْ أُقَاتِلَ النَّاسَ)) بِمِثْلِ حَدِيثِ ابْنِ الْمُسَيَّبِ عَنْ أَبِي هُرَيْرَةَ ح:

**[127]-35-(...)** ........ Cabir və Əbu Hureyrə ﷺ, İbn Museyyibin Əbu Hureyrədən rəvayət etdiyi hədisin bənzərini belə rəvayət etmişlər ki, Peyğəmbər ﷺ buyurmuşdur: "İnsanlarla vuruşmaq mənə əmr edildi..."

**[١٢٨]** و حَدَّثَنِي أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا وَكِيعٌ: ح: و حَدَّثَنِي مُحَمَّدُ بْنُ الْمُثَنَّى: حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ يَعْنِي ابْنَ مَهْدِيٍّ قَالَا جَمِيعًا: حَدَّثَنَا سُفْيَانُ عَنْ أَبِي الزُّبَيْرِ، عَنْ جَابِرٍ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((أُمِرْتُ أَنْ أُقَاتِلَ النَّاسَ حَتَّى يَقُولُوا: لَا إِلَهَ إِلاَّ اللَّهُ، فَإِذَا قَالُوا: لَا إِلَهَ إِلاَّ اللَّهُ عَصَمُوا مِنِّي دِمَاءَهُمْ وَأَمْوَالَهُمْ إِلاَّ بِحَقِّهَا، وَحِسَابُهُمْ عَلَى اللَّهِ)). ثُمَّ قَرَأَ: ﴿فَذَكِّرْ إِنَّمَآ أَنتَ مُذَكِّرٌ ﴿٢١﴾ لَّسْتَ عَلَيْهِم بِمُصَيْطِرٍ﴾

**[128]** ........ Cabir ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "İnsanlar "lə ilahə illəllah" deyincəyə qədər onlarla vuruşmaq mənə əmr edildi. Əgər onlar "lə ilahə illəllah" desələr – İslam haqqı istisna olmaqla – canlarını və mallarını məndən qorumuş olarlar. (Gizli saxladıqlarının) haqq-hesabı isə Allaha aiddir". Sonra Peyğəmbər ﷺ (bu ayəni) oxudu: **"*Onlara* öyüd-nəsihət ver! Sən yalnız öyüd-nəsihət verənsən. Sən onların üzərində hökmdar deyilsən"[1].**

[1] "əl-Ğaşiyə" surəsi, 21-22.

**[١٢٩] ٣٦-(٢٢)** حَدَّثَنَا أَبُو غَسَّانَ الْمِسْمَعِيُّ مَالِكُ بْنُ عَبْدِ الْوَاحِدِ: حَدَّثَنَا عَبْدُ الْمَلِكِ بْنُ الصَّبَّاحِ عَنْ شُعْبَةَ، عَنْ وَاقِدِ بْنِ مُحَمَّدِ بْنِ زَيْدِ بْنِ عَبْدِ اللَّهِ بْنِ عُمَرَ، عَنْ أَبِيهِ، عَنْ عَبْدِ اللَّهِ بْنِ عُمَرَ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((أُمِرْتُ أَنْ أُقَاتِلَ النَّاسَ حَتَّى يَشْهَدُوا أَنْ لاَ إِلَهَ إِلاَّ اللَّهُ وَأَنَّ مُحَمَّدًا رَسُولُ اللَّهِ، وَيُقِيمُوا الصَّلاَةَ، وَيُؤْتُوا الزَّكَاةَ، فَإِذَا فَعَلُوا عَصَمُوا مِنِّي دِمَاءَهُمْ وَأَمْوَالَهُمْ [إِلاَّ بِحَقِّهَا]، وَحِسَابُهُمْ عَلَى اللَّهِ)).

**[129]-36-(22)** ........ Abdullah ibn Ömər ﵄ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "İnsanlar Allahdan başqa (haqq) məbudun olmadığına və Muhəmmədin Onun elçisi olduğuna şəhadət gətirməyincə, namaz qılıb zəkat verməyincə, (onlarla) vuruşmaq mənə əmr edildi. Əgər (aşkarda bunu) yerinə yetirsələr – [İslam haqqı istisna olmaqla] – canlarını və mallarını məndən qorumuş olarlar. Onların (gizli əməllərinin) haqq-hesabı isə Allaha aiddir".

**[١٣٠] ٣٧-(٢٣)** و حَدَّثَنَا سُوَيْدُ بْنُ سَعِيدٍ وَابْنُ أَبِي عُمَرَ قَالاَ: حَدَّثَنَا مَرْوَانُ يَعْنِيَانِ الْفَزَارِيَّ، عَنْ أَبِي مَالِكٍ، عَنْ أَبِيهِ قَالَ: سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ: ((مَنْ قَالَ: لاَ إِلَهَ إِلاَّ اللَّهُ، وَكَفَرَ بِمَا يُعْبَدُ مِنْ دُونِ اللَّهِ، حَرُمَ مَالُهُ وَدَمُهُ، وَحِسَابُهُ عَلَى اللَّهِ)).

**[130]-37-(23)** ........ Əbu Malik[1] atasından rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Kim "lə ilahə illəllah" desə və Allahdan qeyrisinə ibadət etməyi inkar etsə, onun malı və canı toxunulmaz olar. (Gizli əməllərinin) haqq-hesabı isə Allaha aiddir".

**[١٣١] ٣٨-(...)** و حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا أَبُو خَالِدٍ الأَحْمَرُ؛ ح: وَحَدَّثَنِيهِ زُهَيْرُ بْنُ حَرْبٍ، حَدَّثَنَا يَزِيدُ بْنُ هَارُونَ، كِلاَهُمَا عَنْ أَبِي مَالِكٍ، عَنْ أَبِيهِ أَنَّهُ سَمِعَ النَّبِيَّ ﷺ يَقُولُ: ((مَنْ وَحَّدَ اللَّهَ)) ثُمَّ ذَكَرَ بِمِثْلِهِ.

**[131]-38-(...)** ........ Əbu Malikin atası: "Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: "Kim təkAllahlılığı qəbul etsə..." dedi və bu hədisin bənzərini rəvayət etdi.

---

[1] Adı: Səddir, atasının adı isə Tariq ibn Əşyəmdir ("Əhkam əl-Kubra", 1/86).

## (٩) – بَابُ الدَّلِيلِ عَلَى صِحَّةِ إِسْلَامِ مَنْ حَضَرَهُ الْمَوْتُ مَا لَمْ يَشْرَعْ فِي النَّزْعِ وَهُوَ الْغَرْغَرَةُ وَنَسْخِ جَوَازِ الاسْتِغْفَارِ لِلْمُشْرِكِينَ وَالدَّلِيلِ عَلَى أَنَّ مَنْ مَاتَ عَلَى الشِّرْكِ فَهُوَ فِي أَصْحَابِ الْجَحِيمِ وَلاَ يُنْقِذُهُ مِنْ ذَلِكَ شَيْءٌ مِنْ الْوَسَائِلِ

## 9-cu fəsil. Ölüm ayağında olan kimsənin canı boğazına yetişməyincə – (yəni) xırıldamayınca İslamı qəbul etməsinin səhih olduğuna, müşriklərə bağışlanma diləməyin ləğv edilməsinə,[1] habelə Allaha şərik qoşaraq ölən adamın Cəhənnəm əhlindən olmasına və onu bundan heç bir vəsilənin qurtarmayacağına dair dəlillər

**[١٣٢] ٣٩-(٢٤)** و حَدَّثَنِي حَرْمَلَةُ بْنُ يَحْيَى التُّجِيبِيُّ: أَخْبَرَنَا عَبْدُ اللَّهِ بْنُ وَهْبٍ قَالَ: أَخْبَرَنِي يُونُسُ عَنْ ابْنِ شِهَابٍ قَالَ: أَخْبَرَنِي سَعِيدُ بْنُ الْمُسَيَّبِ عَنْ أَبِيهِ قَالَ: لَمَّا حَضَرَتْ أَبَا طَالِبٍ الْوَفَاةُ، جَاءَهُ رَسُولُ اللَّهِ ﷺ، فَوَجَدَ عِنْدَهُ أَبَا جَهْلٍ وَعَبْدَ اللَّهِ بْنَ أَبِي أُمَيَّةَ بْنِ الْمُغِيرَةِ، فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: ((يَا عَمِّ قُلْ لاَ إِلَهَ إِلاَّ اللَّهُ كَلِمَةً أَشْهَدُ لَكَ بِهَا عِنْدَ اللَّهِ)) فَقَالَ أَبُو جَهْلٍ، وَعَبْدُ اللَّهِ بْنُ أَبِي أُمَيَّةَ: يَا أَبَا طَالِبٍ! أَتَرْغَبُ عَنْ مِلَّةِ عَبْدِ الْمُطَّلِبِ؟ فَلَمْ يَزَلْ رَسُولُ اللَّهِ ﷺ يَعْرِضُهَا عَلَيْهِ وَيُعِيدُ لَهُ تِلْكَ الْمَقَالَةَ، حَتَّى قَالَ أَبُو طَالِبٍ آخِرَ مَا كَلَّمَهُمْ: هُوَ عَلَى مِلَّةِ عَبْدِ الْمُطَّلِبِ، وَأَبَى أَنْ يَقُولَ: لاَ إِلَهَ إِلاَّ اللَّهُ، فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: ((أَمَا وَاللَّهِ! لأَسْتَغْفِرَنَّ لَكَ مَا لَمْ أُنْهَ عَنْكَ)) فَأَنْزَلَ اللَّهُ تَبَارَكَ وَ تَعَالَى:

﴿ مَا كَانَ لِلنَّبِيِّ وَالَّذِينَ آمَنُوا أَنْ يَسْتَغْفِرُوا لِلْمُشْرِكِينَ وَلَوْ كَانُوا أُولِي قُرْبَى مِنْ بَعْدِ مَا تَبَيَّنَ لَهُمْ أَنَّهُمْ أَصْحَابُ الْجَحِيمِ ﴾ وَأَنْزَلَ اللَّهُ تَعَالَى فِي أَبِي طَالِبٍ فَقَالَ لِرَسُولِ اللَّهِ ﷺ:

﴿ إِنَّكَ لَا تَهْدِي مَنْ أَحْبَبْتَ وَلَكِنَّ اللَّهَ يَهْدِي مَنْ يَشَاءُ وَهُوَ أَعْلَمُ بِالْمُهْتَدِينَ ﴾

---

[1] Ləğv edilmiş Quran ayələri və ya dini hökmlər ərəbcə mənsux adlanır. Quranın üç növ ləğv edilmiş ayələri mövcuddur:

*Birincisi,* ayədə verilən göstəriş ləğv edilir və ayə özü müqəddəs Kitabın mətnindən çıxır. Bu qayda ilə Uca Allah yad qadının əmizdirdiyi uşağa öz döşündən on dəfə doyurana qədər süd verməsi ilə süd qohumluğunun yaranması haqqında hökmünü ləğv etmişdir.

*İkincisi,* ayədə olan hökm saxlanılır, amma ayə Quran mətnindən düşür. Bu qayda ilə Uca Allah, beş dəfə tam əmizdirmədən sonra süd qohumluğu yaranması barədə xatırlatma olan ayəni, habelə zinakarlıq etmiş evli kişi ilə ərli qadını ölənədək daşqalaq etməklə qətlə yetirmək haqqında ayəni də ləğv etmişdir.

*Üçüncüsü,* ayənin tərkibində olan hökm ləğv edilir, amma ayə müqəddəs Quranın mətnində saxlanılır. Bu qayda ilə şərab içmək haqqında ayə və Quranın bir çox digər hökmləri ləğv edilmişdir. Quran ayələri və Muhəmməd Peyğəmbərin ﷺ əmrləri Allahın elçisinin yaşadığı dövrdə Uca Rəbbin iradəsi ilə ləğv edilmişdir və Muhəmməd Peyğəmbərin ﷺ vəfatından sonra dəyişdirilə bilməz.

**[132]-39-(24)** ........ Museyyib ibn Həzn ﵁ demişdir: “Əbu Talib[1] ölüm ayağında ikən[2] Peyğəmbər ﷺ onun yanına gəldi[3] və orada Əbu Cəhl və Abdullah ibn Əbu Ümeyyə ibn Muğiranı[4] gördü. Peyğəmbər ﷺ dedi: “Əmican, “lə ilahə illəllah” kəlməsini de ki, Allah yanında sənin (dediyinə) şahidlik edim”. (Bunu eşidəndə) Əbu Cəhl və Abdullah ibn Əbu Ümeyyə dedilər: “Ey Əbu Talib, Abdul-Muttəlibin[5] dinindən dönməkmi istəyirsən?!” Peyğəmbər ﷺ tövhid[6] kəlməsini, (onlar da öz dediklərini) ta o vaxta qədər təkrar etdi ki, axırda Əbu Talib onlara son sözünü deyib, Abdul-Muttəlibin dinində qalacağını bildirdi və “lə ilahə illəllah” deməkdən imtina etdi. (Onda) Peyğəmbər ﷺ (əmisinə) dedi: “Biləsən, vallahi ki, mənə qadağan edilənədək sənin üçün bağışlanma diləyəcəyəm”. Uca və Ulu Allah da onun barəsində bu ayəni nazil etdi: **“Müşriklərin Cəhənnəm sakinləri olduqları bəlli olduqdan sonra qohum olsalar belə, Peyğəmbərə və möminlərə onlar üçün bağışlanma diləmək yaraşmaz”.**[7]

Uca Allah Əbu Talib barəsində ayə nazil etdi və Öz elçisinə ﷺ belə buyurdu: **“Şübhəsiz ki, sən istədiyini doğru yola yönəldə bilməzsən. Amma Allah istədiyini doğru yola yönəldir. O, doğru yolda olanları daha yaxşı tanıyır”**[8].

---

[1] Əbu Talib Peyğəmbərin ﷺ əmisi, həm də Əlinin ﵁ atasıdır.

[2] Əbu Talib Məkkədə, hələ Peyğəmbər ﷺ Mədinəyə hicrət etməmişdən əvvəl vəfat etmişdir. O zaman Peyğəmbər ﷺ əlli yaşın içində idi. Həmçinin qeyd etmək olar ki, onun vəfatından üç gün sonra Peyğəmbərin ﷺ ən sevimli zövcəsi, möminlərin anası Xədicə ﵂ də vəfat etmişdir. Peyğəmbər ﷺ ona dayaq olmuş bu iki nəfəri eyni vaxtda itirdiyindən və bunun ardından müşriklərin onlara olan təzyiqləri artdığından dolayı həmin il “hüzn ili” və ya “iztirab ili” adlandırılmışdır. Bu ağır itkidən sonra Peyğəmbər ﷺ səhabələrinin işgəncələrə məruz qaldıqlarını görüb onlara Həbəşistana hicrət etməyi məsləhət görmüşdür (“Şərh Buluğ əl-Məram”, 5/118).

[3] Hərgah Əbu Talibin canı boğazına yetişmiş olsaydı, Peyğəmbər ﷺ ona “lə ilahə illəllah” kəlməsini təlqin etməzdi. Çünki kafirin ölümqabağı “lə ilahə illəllah” deməsinin ona heç bir faydası yoxdur. Quranda bu xüsusda belə buyurulur: **“Günah işlər görməkdə davam edənlərdən birinə ölüm gəldiyi zaman: “Mən indi tövbə etdim!”– deyənlərin də, kafir kimi ölənlərin də tövbəsi qəbul deyildir. Biz onlar üçün ağrılı-acılı bir əzab hazırlamışıq”** (“ən-Nisa” surəsi, 18).

[4] Hər ikisi Peyğəmbərin ﷺ qatı düşməni olmuşdur.

[5] Abdul-Muttəlib Peyğəmbərin ﷺ babası və Əbu Talibin atasıdır.

[6] İbadətdə, hökmranlıqda, ən gözəl adlara və sifətlərə (atributlara) malik olmaqda Uca Allahın təkliyini təsdiq etmə.

[7] “ət-Tovbə” surəsi, 113.

[8] “əl-Qəsəs” surəsi, 56.

**[١٣٣] ٤٠**-(...) و حَدَّثَنَا إِسْحَقُ بْنُ إِبْرَاهِيمَ وَعَبْدُ بْنُ حُمَيْدٍ قَالاَ: أَخْبَرَنَا عَبْدُ الرَّزَّاقِ: أَخْبَرَنَا مَعْمَرٌ؛ ح: و حَدَّثَنَا حَسَنٌ الْحُلْوَانِيُّ وَعَبْدُ بْنُ حُمَيْدٍ قَالاَ: حَدَّثَنَا يَعْقُوبُ وَهُوَ ابْنُ إِبْرَاهِيمَ بْنِ سَعْدٍ قَالَ: حَدَّثَنِي أَبِي عَنْ صَالِحٍ، كِلاَهُمَا عَنْ الزُّهْرِيِّ بِهَذَا الإِسْنَادِ مِثْلَهُ، غَيْرَ أَنَّ حَدِيثَ صَالِحٍ، انْتَهَى عِنْدَ قَوْلِهِ: فَأَنْزَلَ اللَّهُ تَبَارَكَ وَ تَعَالَى فِيهِ، وَلَمْ يَذْكُرْ الآيَتَيْنِ، وَقَالَ فِي حَدِيثِهِ: وَيَعُودَانِ فِي تِلْكَ الْمَقَالَةِ. وَفِي حَدِيثِ مَعْمَرٍ مَكَانَ هَذِهِ الْكَلِمَةِ، فَلَمْ يَزَالاَ بِهِ.

**[133]-40-(...)** ........ Məmər və Saleh – hər ikisi (yuxarıdakı) hədisin bənzərini Zuhridən bu isnadla rəvayət etmişlər. Fəqət Salehin rəvayətində (bu hədis): "Uca və Ulu Allah onun barəsində ayə nazil etdi" sözü ilə tamamlanmış və ayələr zikr edilməmişdir. Habelə bu rəvayətində: "onlar öz dediklərini təkrar etdilər"– demişdir. Məmərin rəvayətində isə bu sözün yerinə: "onlar bunu təkrar etdilər"– (deyilir).

**[١٣٤] ٤١**-(٢٥) حَدَّثَنَا مُحَمَّدُ بْنُ عَبَّادٍ وَابْنُ أَبِي عُمَرَ قَالاَ: حَدَّثَنَا مَرْوَانُ عَنْ يَزِيدَ وَهُوَ ابْنُ كَيْسَانَ عَنْ أَبِي حَازِمٍ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: لِعَمِّهِ عِنْدَ الْمَوْتِ: ((قُلْ لاَ إِلَهَ إِلاَّ اللَّهُ، أَشْهَدُ لَكَ بِهَا يَوْمَ الْقِيَامَةِ)) فَأَبَى– قَالَ –: فَأَنْزَلَ اللَّهُ: ﴿ إِنَّكَ لَا تَهْدِى مَنْ أَحْبَبْتَ ﴾ الآيَةَ

**[134]-41-(25)** ........ Əbu Hureyrə ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ əmisinə ölüm ayağında ikən: "(Əmican,) "lə ilahə illəllah" de ki, Qiyamət günü sənin (dediyinə) şahidlik edim"– demiş, o isə (bundan) imtina etmişdir. Onda Allah (bu ayəni) nazil etmişdir: **"Şübhəsiz ki, sən istədiyini doğru yola yönəldə bilməzsən. Amma Allah istədiyini doğru yola yönəldir. O, doğru yolda olanları daha yaxşı tanıyır"[1].**

**[١٣٥] ٤٢**-(...) و حَدَّثَنِي مُحَمَّدُ بْنُ حَاتِمِ بْنِ مَيْمُونٍ: حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ: حَدَّثَنَا يَزِيدُ بْنُ كَيْسَانَ، قَالَ أَخْبَرَنَا أَبُو حَازِمٍ الأَشْجَعِيُّ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ لِعَمِّهِ: ((قُلْ لاَ إِلَهَ إِلاَّ اللَّهُ، أَشْهَدُ لَكَ بِهَا يَوْمَ الْقِيَامَةِ)) قَالَ: لَوْلاَ أَنْ تُعَيِّرَنِي قُرَيْشٌ – يَقُولُونَ: إِنَّمَا حَمَلَهُ عَلَى ذَلِكَ الْجَزَعُ – لأَقْرَرْتُ بِهَا عَيْنَكَ، فَأَنْزَلَ اللَّهُ: ﴿ إِنَّكَ لَا تَهْدِى مَنْ أَحْبَبْتَ وَلَكِنَّ ٱللَّهَ يَهْدِى مَن يَشَآءُ ﴾

**[135]-42-(...)** ........ Əbu Hureyrə ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ əmisinə demişdir: "(Əmican,) "lə ilahə illəllah" de ki, Qiyamət günü sənin (dediyinə) şahidlik edim". (Əmisi) isə belə cavab vermişdir: "Qureyşlilərin[2] mənə eyib

[1] Əvvəlki ayə.

[2] Peyğəmbərin ﷺ mənsub olduğu ərəblər arasında ən məşhur və hörmətli qəbilələrdən biri.

tutmaları və (barəmdə): “(İradəsinin) zəif olması onu bu sözü deməyə sövq etmişdir” dемələri olmasaydı, bu kəlməni təsdiqləməklə səni sevindirərdim. Onda Allah (bu ayəni) nazil etdi: **“Şübhəsiz ki, sən istədiyini doğru yola yönəldə bilməzsən. Amma Allah istədiyini doğru yola yönəldir”**[1].

## (١٠) – بَابُ الدَّلِيلِ عَلَى أَنَّ مَنْ مَاتَ عَلَى التَّوْحِيدِ دَخَلَ الْجَنَّةَ قَطْعًا

## 10-cu fəsil. Tövhidi[2] qəbul edərək ölən kimsənin qəti olaraq Cənnətə daxil olacağına dair dəlillər[3]

**[١٣٦] ٤٣–(٢٦)** حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ وَزُهَيْرُ بْنُ حَرْبٍ، كِلاَهُمَا عَنْ إِسْمَعِيلَ بْنِ إِبْرَاهِيمَ – قَالَ أَبُو بَكْرٍ: حَدَّثَنَا ابْنُ عُلَيَّةَ – عَنْ خَالِد، قَالَ: حَدَّثَنِي الْوَلِيدُ بْنُ مُسْلِمٍ، عَنْ حُمْرَانَ، عَنْ عُثْمَانَ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((مَنْ مَاتَ وَهُوَ يَعْلَمُ أَنَّهُ لاَ إِلَهَ إِلاَّ اللَّهُ دَخَلَ الْجَنَّةَ)).

**[136]-43-(26)** ........ Osman ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Hər kim Allahdan başqa (ibadətə layiq) məbudun olmadığını bildiyi halda ölərsə, Cənnətə girər”[4].

---

[1] “əl-Qəsəs” surəsi, 56.

[2] 132-ci hədisin qeydlərinə bax.

[3] Nəvəvi demişdir: “Bilin ki, sələflərdən və xələflərdən haqq yolda olan əhli-sünnə alimləri ittifaq etmişlər ki, tövhidi qəbul edərək ölən kimsə hökmən Cənnətə daxil olacaq. Əgər bu adam uşaq, yaxud məcnun, yaxud şirkdən və başqa günahlardan tövbə etmiş birisi kimi günahsızdırsa və tövbə etdikdən sonra günah etməyibsə, Cəhənnəmdən uzaq olub Cənnətə girəcək... Kim də böyük günah edər və tövbə etmədən dünyadan köçərsə, Allah Təalənin istəyi altında olar. İstəsə, onu bağışlayar və Cənnətə daxil edər. İstəsə də, ona Cəhənnəmdə istədiyi qədər əzab verər, sonra da onu Cənnətə daxil edər. Allah tövhid üzərində ölən heç bir kəsi – həmin adam nə qədər günah edirsə etsin – əbədi olaraq Cəhənnəmdə saxlamaz. Necə ki, kafir olaraq ölən kimsəni – həmin adam nə qədər yaxşılıqlar edirsə etsin – Cənnətə daxil etməz...”

[4] Süleyman ibn Abdullah Ali-Şeyx demişdir: “Hərçənd “lə ilahə illəlah” demək Cənnətə daxil olmaq və Cəhənnəm əzabından qurtulmaq üçün səbəbdir, həm də tələb olunan bir şeydir, lakin tələb olunan (hər) bir iş özünəməxsus şərtlərə riayət etməklə və buna əngəl törədəcək maneələrdən çəkinməklə yerinə yetirilməlidir. Bu şərtlərdən hər hansı birinin yerinə yetirilmədiyi və ya əmması çıxdığı təqdirdə, (Cənnəti) qazanmaq mümkün deyildir. Odur ki, Həsən (əl-Bəsridən): “Bəzi adamlar deyirlər ki: “Kim: “lə ilahə illəllah”– desə, Cənnətə daxil olar?”– deyə soruşduqda, o belə cavab vermişdir: “Kim: “lə ilahə illəllah”– desə, sonra da bu kəlmənin haqqını ödəsə və buna aid olan vacibləri yerinə yetirsə, Cənnətə daxil olar”. Vəhb ibn Munəbbih isə ondan: “Məgər “lə ilahə illəllah” (kəlməsi) Cənnətin açarı deyilmi?”– deyə soruşan adama belə cavab vermişdir: “Elədir, lakin hər bir açarın dişləri vardır. Və əgər sən dişli bir açar gətirsən, o sənin üçün (qapını) açar, yoxsa açmaz” (“Təysirul-Azizil-Həmid”, 1/111).

**[١٣٧]** حَدَّثَنَا مُحَمَّدُ بْنُ أَبِي بَكْرٍ الْمُقَدَّمِيُّ: حَدَّثَنَا بِشْرُ بْنُ الْمُفَضَّلِ: حَدَّثَنَا خَالِدٌ الْحَذَّاءُ عَنِ الْوَلِيدِ أَبِي بِشْرٍ قَالَ: سَمِعْتُ حُمْرَانَ يَقُولُ: سَمِعْتُ عُثْمَانَ يَقُولُ: سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ مِثْلَهُ سَوَاءً.

**[137]** ........ Vəlid ibn Bişr: "Humranın belə dediyini eşitdim", o da: "Osmanın belə dediyini eşitdim" Osman da: "Peyğəmbərin ﷺ belə dediyini eşitdim" deyə istinad edərək eyni ilə bu hədisin bənzərini rəvayət etmişdir.

**[١٣٨] ٤٤-(٢٧)** حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ النَّضْرِ بْنِ أَبِي النَّضْرِ قَالَ: حَدَّثَنِي أَبُو النَّضْرِ هَاشِمُ بْنُ الْقَاسِمِ: حَدَّثَنَا عُبَيْدُ اللَّهِ الأَشْجَعِيُّ، عَنْ مَالِكِ بْنِ مِغْوَلٍ، عَنْ طَلْحَةَ بْنِ مُصَرِّفٍ، عَنْ أَبِي صَالِحٍ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ: كُنَّا مَعَ النَّبِيِّ ﷺ فِي مَسِيرٍ قَالَ: فَنَفِدَتْ أَزْوَادُ الْقَوْمِ، قَالَ: حَتَّى هَمَّ بِنَحْرِ بَعْضِ حَمَائِلِهِمْ قَالَ: فَقَالَ عُمَرُ: يَا رَسُولَ اللَّهِ! لَوْ جَمَعْتَ مَا بَقِيَ مِنْ أَزْوَادِ الْقَوْمِ، فَدَعَوْتَ اللَّهَ عَلَيْهَا، قَالَ: فَفَعَلَ. قَالَ فَجَاءَ ذُو الْبُرِّ بِبُرِّهِ، وَذُو التَّمْرِ بِتَمْرِهِ، قَالَ: وَقَالَ مُجَاهِدٌ -: وَذُو النَّوَاةِ بِنَوَاهُ، قُلْتُ: وَمَا كَانُوا يَصْنَعُونَ بِالنَّوَاةِ؟ قَالَ: كَانُوا يَمُصُّونَهُ وَيَشْرَبُونَ عَلَيْهِ الْمَاءَ، قَالَ: فَدَعَا عَلَيْهَا، حَتَّى مَلأَ الْقَوْمُ أَزْوِدَتَهُمْ - قَالَ - فَقَالَ عِنْدَ ذَلِكَ: ((أَشْهَدُ أَنْ لاَ إِلَهَ إِلاَّ اللَّهُ وَأَنِّي رَسُولُ اللَّهِ، لاَ يَلْقَى اللَّهَ بِهِمَا عَبْدٌ غَيْرَ شَاكٍّ، فِيهِمَا إِلاَّ دَخَلَ الْجَنَّةَ)).

**[138]-44-(27)** ........ Əbu Hureyrə ﷺ belə rəvayət etmişdir: "Biz Peyğəmbərlə ﷺ birlikdə səfərdə idik. Bu əsnada camaatın azuqəsi qurtardı. İş o yerə gəlib çatdı ki, Peyğəmbər ﷺ onlardan bəzilərinin yük dəvələrini kəsmək qərarına gəldi.[1] Bu vaxt Ömər dedi: "Ya Rəsulullah, bəlkə camaatın qalan azuqəsini bir yerə toplayasan və Allahdan bunun üçün (bərəkət) diləyəsən".[2] Peyğəmbər ﷺ belə də etdi. Beləcə, buğdası olan, buğdasını, xurması olan, xurmasını, (çəyirdəyi olan da çəyirdəyini gətirdi.[3] Təlhə ibn Musərrif dedi:) "Çəyirdəklər onların nəyinə lazım idi?" (Mücahid) dedi: "Onlar çəyirdəyi sorur, üstündən də su içirdilər".

(Əbu Hureyrə) dedi: "Peyğəmbər ﷺ yığılmış ərzağın (yanında durub buna) dua etdi. Nəhayət, camaatın xurcunları ağızbaağız doldu". Onda Peyğəmbər ﷺ dedi: "Mən şahidlik edirəm ki, Allahdan başqa (ibadətə layiq olan) məbud yoxdur və mən Allahın elçisiyəm! Bu iki (şəhadət kəlməsinə) şəkk etməyərək bunlarla Allaha qovuşan hər bir bəndə mütləq Cənnətə girəcəkdir".

---

[1] Peyğəmbərin ﷺ bu cür hökm verməsi, bizə, (belə hallarda camaatın) rifahını nəzərə almağı, ən mühüm olanı ön plana çəkməyi və iki zərərdən zərəri daha az olanı seçməyi öyrədir.

[2] Bu, dəlildir ki, bir adam məsləhət bildiyi bir şeyi özündən üstün olan birisinə təklif edə bilər. Belə olduqda, həmin adam bu təklifi götür-qoy etməli və əgər məsləhət bilərsə, ona uyğun hərəkət etməlidir.

[3] Bu, Mücahidin sözüdür.

**[١٣٩] ٤٥**–(...) حَدَّثَنَا سَهْلُ بْنُ عُثْمَانَ وَأَبُو كُرَيْبٍ مُحَمَّدُ بْنُ الْعَلاَءِ جَمِيعًا عَنْ أَبِي مُعَاوِيَةَ قَالَ أَبُو كُرَيْبٍ: حَدَّثَنَا أَبُو مُعَاوِيَةَ عَنْ الأَعْمَشِ، عَنْ أَبِي صَالِحٍ، عَنْ أَبِي هُرَيْرَةَ أَوْ عَنْ أَبِي سَعِيد – شَكَّ الأَعْمَشُ – قَالَ: لَمَّا كَانَ غَزْوَةُ تَبُوكَ أَصَابَ النَّاسَ مَجَاعَةٌ، قَالُوا: يَا رَسُولَ اللَّه! لَوْ أَذِنْتَ لَنَا فَنَحَرْنَا نَوَاضِحَنَا، فَأَكَلْنَا وَادَّهَنَّا، فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: ((افْعَلُوا)) قَالَ: فَجَاءَ عُمَرُ فَقَالَ: يَا رَسُولَ اللَّه! إِنْ فَعَلْتَ قَلَّ الظَّهْرُ، وَلَكِنْ ادْعُهُمْ بِفَضْلِ أَزْوَادِهِمْ، ثُمَّ ادْعُ اللَّهَ لَهُمْ عَلَيْهَا بِالْبَرَكَةِ، لَعَلَّ اللَّهَ أَنْ يَجْعَلَ فِي ذَلِكَ. فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: ((نَعَمْ)) قَالَ: فَدَعَا بِنِطَعٍ فَبَسَطَهُ، ثُمَّ دَعَا بِفَضْلِ أَزْوَادِهِمْ قَالَ: فَجَعَلَ الرَّجُلُ يَجِيءُ بِكَفِّ ذُرَةٍ، قَالَ: وَيَجِيءُ الآخَرُ بِكَفِّ تَمْرٍ، قَالَ: وَيَجِيءُ الآخَرُ بِكَسْرَةٍ، حَتَّى اجْتَمَعَ عَلَى النِّطَعِ مِنْ ذَلِكَ شَيْءٌ يَسِيرٌ قَالَ: فَدَعَا رَسُولُ اللَّهِ ﷺ عَلَيْهِ بِالْبَرَكَةِ، ثُمَّ قَالَ: ((خُذُوا فِي أَوْعِيَتِكُمْ)) قَالَ: فَأَخَذُوا فِي أَوْعِيَتِهِمْ، حَتَّى مَا تَرَكُوا فِي الْعَسْكَرِ وِعَاءً إِلاَّ مَلَئُوهُ، قَالَ: فَأَكَلُوا حَتَّى شَبِعُوا، وَفَضَلَتْ فَضْلَةٌ فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: ((أَشْهَدُ أَنْ لاَ إِلَهَ إِلاَّ اللَّهُ وَأَنِّي رَسُولُ اللَّهِ، لاَ يَلْقَى اللَّهَ بِهِمَا عَبْدٌ غَيْرَ شَاكٍّ، فَيُحْجَبَ عَنْ الْجَنَّةِ)).

**[139]-45-(...)** ........ Əbu Hureyrə yaxud, Əbu Səid[1] ﷺ demişdir: "Təbuk[2] döyüşündə camaata aclıq üz vermişdi. Onlar (Peyğəmbərin ﷺ yanına gəlib) dedilər: "Ya Rəsulullah! İzn versəydin, yük dəvələrimizi kəsib ətindən yeyər, yağından da istifadə edərdik".[3] Peyğəmbər ﷺ: "Elə də edin!"– deyə buyurdu. Bu vaxt Ömər gəlib dedi: "Ya Rəsulullah! Əgər belə etsək, miniyimiz azalacaq. (Yaxşı olar ki,) camaata ərzaqlarının qalanını sənin yanına gətirməyi buyurasan, sonra da onlar üçün Allahdan buna bərəkət diləyəsən. Yəqin ki, Allah bunun bərəkətini artırar". Peyğəmbər ﷺ: "Bəli!"– dedi. Sonra bir döşənək gətizdirdi və onu yerə sərdi. Sonra da camaata artıq qalmış ərzaqlarını gətirib (onun içinə qoymağı) buyurdu. (Onlardan) kimisi bir ovuc darı, kimisi bir ovuc xurma, kimisi də bir tikə yemək gətirməyə başladı. Nəhayət, döşənəyin üstündə az miqdarda ərzaq yığıldı. Peyğəmbər ﷺ yığılmış (ərzaq komasına) bərəkət dilədikdən sonra (camaata): "Xurcunlarınızı doldurun!"– deyə buyurdu. Onlar da xurcunlarını doldurmağa başladılar. Nəhayət, orduda olan xurcunların hamısını (ağızbaağız) doldurdular. Üstəlik (bu yeməkdən) doyuncaya qədər yedilər. Hələ artıq da qaldı. Onda Peyğəmbər ﷺ dedi:

[1] Ravi Aməş hədisin kim tərəfindən rəvayət edildiyinə şəkk etmişdir.

[2] Mədinədən 700 km şimalda yerləşən şəhər.

[3] Bu, dəlildir ki, ordu başçısının izni olmadan heç bir əsgər döyüşdə istifadə etdiyi miniyi kəsməməlidir. Başçı da yalnız xeyir əldə etmək və ya fəsadın qarşısını almaq üçün buna izin verə bilər.

"Mən şahidlik edirəm ki, Allahdan başqa (ibadətə layiq olan) məbud yoxdur və mən Allahın elçisiyəm! Bu iki (şəhadət kəlməsinə) şəkk etməyərək bunlarla Allaha qovuşan hər bir bəndə mütləq Cənnətə girəcəkdir".

**[١٤٠] ٤٦-(٢٨)** حَدَّثَنَا دَاوُدُ بْنُ رُشَيْدٍ: حَدَّثَنَا الْوَلِيدُ يَعْنِي ابْنَ مُسْلِمٍ عَنْ ابْنِ جَابِرٍ قَالَ: حَدَّثَنِي عُمَيْرُ بْنُ هَانِئٍ. قَالَ: حَدَّثَنِي جُنَادَةُ بْنُ أَبِي أُمَيَّةَ: حَدَّثَنَا عُبَادَةُ بْنُ الصَّامِتِ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((مَنْ قَالَ: أَشْهَدُ أَنْ لاَ إِلَهَ إِلاَّ اللَّهُ وَحْدَهُ [لاَ شَرِيكَ لَهُ]، وَأَنَّ مُحَمَّدًا عَبْدُهُ وَرَسُولُهُ، وَأَنَّ عِيسَى عَبْدُ اللَّهِ وَابْنُ أَمَتِهِ وَكَلِمَتُهُ أَلْقَاهَا إِلَى مَرْيَمَ وَرُوحٌ مِنْهُ، وَأَنَّ الْجَنَّةَ حَقٌّ، وَأَنَّ النَّارَ حَقٌّ، أَدْخَلَهُ اللَّهُ مِنْ أَيِّ أَبْوَابِ الْجَنَّةِ الثَّمَانِيَةِ شَاءَ)).

**[140]-46-(28)** ........ Ubadə ibn Samit ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Hər kim Allahdan başqa heç bir məbudun olmadığına, Onun Tək olduğuna [və heç bir şəriki olmadığına], Muhəmmədin Onun qulu və elçisi olduğuna, İsanın Allahın qulu, kənizinin oğlu, Məryəmə göndərdiyi kəlməsi və Onun ruhundan olduğuna, Cənnətin haqq, Cəhənnəmin də haqq olduğuna şahidlik etsə, Allah Cənnətin səkkiz qapısının hansından diləsə, onu oradan (Cənnətə) daxil edər"[1].

**[١٤١]** (...) و حَدَّثَنِي أَحْمَدُ بْنُ إِبْرَاهِيمَ الدَّوْرَقِيُّ: حَدَّثَنَا مُبَشِّرُ بْنُ إِسْمَعِيلَ عَنْ الأَوْزَاعِيِّ، عَنْ عُمَيْرِ بْنِ هَانِئٍ فِي هَذَا الإِسْنَادِ بِمِثْلِهِ غَيْرَ أَنَّهُ قَالَ: ((أَدْخَلَهُ اللَّهُ الْجَنَّةَ عَلَى مَا كَانَ مِنْ عَمَلٍ)) وَلَمْ يَذْكُرْ ((مِنْ أَيِّ أَبْوَابِ الْجَنَّةِ الثَّمَانِيَةِ شَاءَ)).

**[141] (...)** ........ Amr ibn Hani (yuxarıdakı) isnadla bu hədisin bənzərini rəvayət etmişdir. Fəqət bu rəvayətdə: "nə əməl etmiş olursa-olsun,[2] Allah onu Cənnətə daxil edər"– demiş və "Cənnətin səkkiz qapısının hansından diləsə" sözünü zikr etməmişdir.

---

[1] Bu hədis, dərin mənalı bir hədisdir. Əqidə məsələlərini özündə əks etdirən bu hədisdə Peyğəmbər ﷺ fərqli-fərqli (batil) etiqadlarda olan kafir ümmətlərin hamısından uzaq bir etiqadı cəm etmişdir. Peyğəmbər ﷺ bu hədisdə İsanı ﷺ Allahın Kəlməsi adlandırmışdır. Belə ki, İsanın ﷺ anasına insan toxunmamış və o, sadəcə "Ol" kəlməsi ilə olmuşdur. (Bu xüsusda Quranda belə buyurulur: **"Allaha övlad götürmək yaraşmaz. O, pak və müqəddəsdir! O, bir işin olmasını istədikdə, ona ancaq "Ol!"– deyər, o da dərhal olar"** ("Məryəm" surəsi, 35).

[2] Bu, ümumiyyətlə, tövhid əhlindən olan günahkarın mütləq şəkildə Cənnətə daxil olacağına aiddir. Belə ki, etdiyi günahlara görə tövbə etməyən hər kəs Allahın istəyi altındadır. Allah ona Cəhənnəm əzabını daddırsa da, (həmin adam tövhid əhli olduğundan) axırda onu Cənnətə daxil edəcək.

**[١٤٢] ٤٧-(٢٩)** حَدَّثَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ: حَدَّثَنَا لَيْثٌ عَنِ ابْنِ عَجْلاَنَ، عَنْ مُحَمَّدِ بْنِ يَحْيَى بْنِ حَبَّانَ، عَنِ ابْنِ مُحَيْرِيزٍ، عَنِ الصُّنَابِحِيِّ، عَنْ عُبَادَةَ بْنِ الصَّامِتِ أَنَّهُ قَالَ: دَخَلْتُ عَلَيْهِ وَهُوَ فِي الْمَوْتِ، فَبَكَيْتُ، فَقَالَ: مَهْلاً، لِمَ تَبْكِي؟ فَوَاللَّهِ! لَئِنْ اسْتُشْهِدْتُ لأَشْهَدَنَّ لَكَ، وَلَئِنْ شُفِّعْتُ لأَشْفَعَنَّ لَكَ، وَلَئِنْ اسْتَطَعْتُ لأَنْفَعَنَّكَ، ثُمَّ قَالَ: وَاللَّهِ! مَا مِنْ حَدِيثٍ سَمِعْتُهُ مِنْ رَسُولِ اللَّهِ ﷺ لَكُمْ فِيهِ خَيْرٌ إِلاَّ حَدَّثْتُكُمُوهُ، إِلاَّ حَدِيثًا وَاحِدًا، وَسَوْفَ أُحَدِّثُكُمُوهُ الْيَوْمَ وَقَدْ أُحِيطَ بِنَفْسِي، سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ: مَنْ شَهِدَ أَنْ لاَ إِلَهَ إِلاَّ اللَّهُ وَأَنَّ مُحَمَّدًا رَسُولُ اللَّهِ، حَرَّمَ اللَّهُ عَلَيْهِ النَّارَ)).

**[142]-47-(29)** ........ Sunabihi[1] demişdir: "Ubadə ibn Samit ölüm ayağında ikən mən onun yanına gəldim və (onun bu halını görüb) ağlamağa başladım. Dedi: "Sakit ol görüm, niyə ağlayırsan? Vallahi, əgər məni şahid tutsalar, sənin lehinə şahidlik edərəm, işdir, mənə şəfaət etmək hüququ versələr, səndən ötrü şəfaətçi olaram və əgər gücüm yetərsə, sənə yardım edərəm. Vallahi, mən Peyğəmbərdən ﷺ eşitdiyim, (məzmunu) xeyirli olan hər bir hədisi sizə danışmışam. Yalnız bir hədisdən başqa.[2] Bu gün mən artıq ölüm ayağında ikən o hədisi sizə danışacağam. Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: "Kim Allahdan başqa (haqq) məbudun olmadığına və Muhəmmədin Onun elçisi olduğuna şahidlik etsə, Allah Cəhənnəm odunu ona haram edər".

**[١٤٣] ٤٨-(٣٠)** حَدَّثَنَا هَدَّابُ بْنُ خَالِدٍ الأَزْدِيُّ: حَدَّثَنَا هَمَّامٌ: حَدَّثَنَا قَتَادَةُ: حَدَّثَنَا أَنَسُ بْنُ مَالِكٍ، عَنْ مُعَاذِ بْنِ جَبَلٍ قَالَ: كُنْتُ رِدْفَ النَّبِيِّ ﷺ لَيْسَ بَيْنِي وَبَيْنَهُ إِلاَّ مُؤْخِرَةُ الرَّحْلِ، فَقَالَ: ((يَا مُعَاذَ بْنَ جَبَلٍ!)) قُلْتُ: لَبَّيْكَ يَا رَسُولَ اللَّهِ وَسَعْدَيْكَ، ثُمَّ سَارَ سَاعَةً، ثُمَّ قَالَ: ((يَا مُعَاذَ بْنَ جَبَلٍ!)) قُلْتُ لَبَّيْكَ يَا رَسُولَ اللَّهِ وَسَعْدَيْكَ، ثُمَّ سَارَ سَاعَةً، ثُمَّ قَالَ: ((يَا مُعَاذَ بْنَ جَبَلٍ!)) قُلْتُ: لَبَّيْكَ يَا رَسُولَ اللَّهِ وَسَعْدَيْكَ، قَالَ: ((هَلْ تَدْرِي مَا حَقُّ اللَّهِ عَزَّ وَ جَلَّ عَلَى الْعِبَادِ؟)) قَالَ: قُلْتُ: اللَّهُ وَرَسُولُهُ أَعْلَمُ. قَالَ: ((فَإِنَّ حَقَّ اللَّهِ عَلَى الْعِبَادِ أَنْ يَعْبُدُوهُ

[1] Adı: Əbu Abdullah Abdur-Rəhman ibn Useylə əl-Muradidir. Əbu Bəkri ؓ və bir çox səhabələri ؓ görmüş tabiindir. Sunabih – Murad qəbiləsi yaxınlığındakı vadidir. Vaxtı ilə Sunabihi (İslam dinini qəbul etmək məqsədilə) Peyğəmbərin ﷺ yanına yollanmış, lakin gəlib Cöhfəyə yetişdikdə, artıq Mədinəyə çatmağa beş gün qalmış Peyğəmbər ﷺ vəfat etmişdir. Qeyd etmək lazımdır ki, hədis elmində təcrübəsi olmayan kimsələr bu tabiini Sunabih ibn Ə'sər ؓ adlı səhabə ilə səhv salırlar.

[2] Qazı İyad ؒ demişdir: "Hədisdən açıq-aydın görünür ki, Ubadə ibn Samit ؓ hər kəsin düzgün anlamayacağından ehtiyat edib hədisi gizlətmişdir. Bu da ancaq etiqadla bağlı olan məsələlərə aiddir. Şəriətin qoyduğu hədlərin isə buna heç bir aidiyyəti yoxdur..."

وَلاَ يُشْرِكُوا بِهِ شَيْئًا)) ثُمَّ سَارَ سَاعَةً، ثُمَّ قَالَ: ((يَا مُعَاذَ بْنَ جَبَلٍ!)) قُلْتُ: لَبَّيْكَ يَا رَسُولَ اللَّهِ وَسَعْدَيْكَ، قَالَ: ((هَلْ تَدْرِي مَا حَقُّ الْعِبَادِ عَلَى اللَّهِ إِذَا فَعَلُوا ذَلِكَ؟)) قَالَ: قُلْتُ: ((اللَّهُ وَرَسُولُهُ أَعْلَمُ. قَالَ: ((أَنْ لاَ يُعَذِّبَهُمْ)).

**[143]-48-(30)** ........ Ənəs ﷺ rəvayət edir ki, Muaz ibn Cəbəl demişdir: "(Bir dəfə) mən Peyğəmbərlə ﷺ birlikdə onun (mindiyi heyvanın) tərkində idim.[1] Mənimlə onun arasında yəhərin söykəyindən başqa heç nə yox idi. (Peyğəmbər ﷺ məni): "Ey Muaz ibn Cəbəl!"– deyə çağırdı. Dedim: "Buyur, əmrinə müntəzirəm, ya Rəsulullah!" Bir az getdikdən sonra o, yenə: "Ey Muaz ibn Cəbəl!"– deyə çağırdı.[2] Dedim: "Buyur, əmrinə müntəzirəm, ya Rəsulullah!" Bir qədər getdikdən sonra o, yenə: "Ey Muaz ibn Cəbəl!"– deyə çağırdı. Dedim: "Buyur, əmrinə müntəzirəm, ya Rəsulullah!" Dedi: "Bilirsənmi, Allahın qulları üzərindəki haqqı[3] nədir?" Dedim: "Allah və Onun rəsulu daha yaxşı bilir!" Dedi: "Allahın qulları üzərindəki haqqı, qulların Ona ibadət edib heç kəsi Ona şərik qoşmamalarıdır". Bir qədər getdikdən sonra yenə: "Ey Muaz ibn Cəbəl!"– deyə çağırdı. Dedim: "Buyur, əmrinə müntəzirəm, ya Rəsulullah!" Dedi: "Bilirsənmi, qulları bunu yerinə yetirəcəkləri təqdirdə onların Allah üzərindəki haqqı nədir?" Dedim: "Allah və Onun rəsulu daha yaxşı bilir!" Dedi: "(Ona heç nəyi şərik qoşmayan) qullarına əzab verməməsidir".

**[١٤٤] ٤٩**-(...) حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ، حَدَّثَنَا أَبُو الأَحْوَصِ سَلاَّمُ بْنُ سُلَيْمٍ عَنْ أَبِي إِسْحَقَ، عَنْ عَمْرِو بْنِ مَيْمُونٍ، عَنْ مُعَاذِ بْنِ جَبَلٍ قَالَ: كُنْتُ رِدْفَ رَسُولِ اللَّهِ ﷺ عَلَى حِمَارٍ يُقَالُ لَهُ عُفَيْرٌ قَالَ: فَقَالَ: ((يَا مُعَاذُ! أَتَدْرِي مَا حَقُّ اللَّهِ عَلَى الْعِبَادِ وَمَا حَقُّ الْعِبَادِ عَلَى اللَّهِ؟ قَالَ: قُلْتُ: اللَّهُ وَرَسُولُهُ أَعْلَمُ. قَالَ: ((فَإِنَّ حَقَّ اللَّهِ عَلَى الْعِبَادِ أَنْ يَعْبُدُوا اللَّهَ وَلاَ يُشْرِكُوا بِهِ شَيْئًا وَحَقُّ الْعِبَادِ عَلَى اللَّهِ [عَزَّ وَجَلَّ] أَنْ لاَ يُعَذِّبَ مَنْ لاَ يُشْرِكُ بِهِ [شَيْئًا])) قَالَ: قُلْتُ: يَا رَسُولَ اللَّهِ! أَفَلاَ أُبَشِّرُ النَّاسَ؟ قَالَ: ((لاَ تُبَشِّرْهُمْ، فَيَتَّكِلُوا)).

---

[1] Bu, Muazın nə dərəcədə fəzilətli olduğunu, habelə bir kimsəni heyvanın tərkinə almağın caiz olduğunu göstərir.

[2] Nəvəvi demişdir: "Peyğəmbərin ﷺ Muazı təkrar çağırması, ona söyləyəcəyinə diqqət yetirməsi və onu axıra kimi dinləməsi üçün idi. Rəvayət edilir ki, Peyğəmbər ﷺ bir söz söylədiyi zaman, (söylədiklərini) başa düşsünlər deyə, onu üç dəfə təkrar edərdi, habelə bir tayfanın yanına gəlib onları salamladıqda, üç kərə salam verərdi" ("Səhih əl-Buxari", 94).

[3] Mövcud olan və ya olacaq hər bir şey haqdır (və ya həqiqətdir). Allah Subhanəhu və Təalə də Haqdır, əbədi və əzəli varlıqdır. Habelə ölüm və Qiyamət saatı, Cənnət və Cəhənnəm də haqdır. Və əgər düz sözə haqq deyilirsə, bu, o deməkdir ki, barəsində xəbər verilən şey mövcuddur.

**[144]-49-(27)** ........ Muaz ibn Cəbəl ﵁ demişdir: “Mən Ufeyr[1] adlı uzunqulağın üstündə Peyğəmbərin ﷺ tərkində idim. (Peyğəmbər ﷺ) dedi: “Ey Muaz, bilirsənmi, Allahın qulları üzərindəki haqqı və qulların da Allah üzərindəki haqqı nədir?” Dedim: “Allah və Onun rəsulu daha yaxşı bilir!” O buyurdu: “Allahın qulları üzərindəki haqqı, qulların Ona ibadət edib heç kəsi Ona şərik qoşmamalarıdır. Qulların [qüdrət və qüvvət sahibi olan] Allah üzərindəki haqqı isə, Ona [heç bir şeyi] şərik qoşmayan qullarına əzab verməməsidir”. Dedim: “Ya Rəsulullah, bu xəbərlə camaatı müjdələyimmi?” O buyurdu: “Müjdələmə, (yoxsa) onlar arxayınlaşacaqlar”.

**[١٤٥] ٥٠**–(...) حَدَّثَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى وَابْنُ بَشَّارٍ – قَالَ ابْنُ الْمُثَنَّى: حَدَّثَنَا مُحَمَّدُ بْنُ جَعْفَرٍ: حَدَّثَنَا شُعْبَةُ، عَنْ أَبِي حَصِينٍ وَالأَشْعَثِ بْنِ سُلَيْمٍ، أَنَّهُمَا سَمِعَا الأَسْوَدَ بْنَ هِلاَلٍ يُحَدِّثُ عَنْ مُعَاذِ بْنِ جَبَلٍ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((يَا مُعَاذُ! أَتَدْرِي مَا حَقُّ اللَّهِ عَلَى الْعِبَادِ؟)) قَالَ: اللَّهُ وَرَسُولُهُ أَعْلَمُ. قَالَ: ((أَنْ يُعْبَدَ اللَّهُ وَلاَ يُشْرَكَ بِهِ شَيْءٌ)) قَالَ: ((أَتَدْرِي مَا حَقُّهُمْ عَلَيْهِ إِذَا فَعَلُوا ذَلِكَ؟)) فَقَالَ: اللَّهُ وَرَسُولُهُ أَعْلَمُ. قَالَ: ((أَنْ لاَ يُعَذِّبَهُمْ)).

**[145]-50-(...)** ........ Muaz ibn Cəbəl ﵁ demişdir: “(Bir dəfə) Peyğəmbər ﷺ: “Ey Muaz, bilirsənmi, Allahın qulları üzərindəki haqqı nədir?”– deyə soruşdu. Dedim: “Allah və Onun rəsulu daha yaxşı bilir!” Dedi: “(Allahın qulu üzərindəki haqqı) onun Allaha ibadət edib heç kəsi Ona şərik qoşmamasıdır”. Sonra soruşdu: “Bilirsənmi, qulları bunu yerinə yetirəcəkləri təqdirdə onların Allah üzərindəki haqqı nədir?” Dedim: “Allah və Onun rəsulu daha yaxşı bilir!” Dedi: “(Qulların Allah üzərindəki haqqı Ona heç bir şeyi şərik qoşmayan) qullarına əzab verməməsidir”.

**[١٤٦] ٥١**–(...) حَدَّثَنَا الْقَاسِمُ بْنُ زَكَرِيَّاءَ: حَدَّثَنَا حُسَيْنٌ عَنْ زَائِدَةَ، عَنْ أَبِي حَصِينٍ، عَنْ الأَسْوَدِ بْنِ هِلاَلٍ قَالَ: سَمِعْتُ مُعَاذًا يَقُولُ: دَعَانِي رَسُولُ اللَّهِ ﷺ فَأَجَبْتُهُ، فَقَالَ: ((هَلْ تَدْرِي مَا حَقُّ اللَّهِ عَلَى النَّاسِ)) نَحْوَ حَدِيثِهِمْ.

**[146]-51-(...)** ........ Muaz ibn Cəbəl ﵁: “Peyğəmbər ﷺ məni çağırdı və mən ona cavab verdikdə, o mənə belə buyurdu: “Bilirsənmi, Allahın insanlar üzərindəki haqqı nədir?...” deyə (yuxarıdakı) hədisin bənzərini rəvayət etmişdir.

**[١٤٧] ٥٢**–(**٣١**) حَدَّثَنِي زُهَيْرُ بْنُ حَرْبٍ: حَدَّثَنَا عُمَرُ بْنُ يُونُسَ الْحَنَفِيُّ: حَدَّثَنَا عِكْرِمَةُ بْنُ عَمَّارٍ قَالَ: حَدَّثَنِي أَبُو كَثِيرٍ قَالَ: حَدَّثَنِي أَبُو هُرَيْرَةَ قَالَ: كُنَّا قُعُودًا حَوْلَ رَسُولِ اللَّهِ ﷺ – مَعَنَا أَبُو بَكْرٍ وَعُمَرُ –

[1] Hərfi tərcüməsi: “qırmızımtıl-bəyaz” deməkdir.

فِي نَفَرٍ فَقَامَ رَسُولُ اللَّهِ ﷺ مِنْ بَيْنِ أَظْهُرِنَا، فَأَبْطَأَ عَلَيْنَا وَخَشِينَا أَنْ يُقْتَطَعَ دُونَنَا، وَفَزِعْنَا وَقُمْنَا، فَكُنْتُ أَوَّلَ مَنْ فَزِعَ، فَخَرَجْتُ أَبْتَغِي رَسُولَ اللَّهِ ﷺ، حَتَّى أَتَيْتُ حَائِطًا لِلأَنْصَارِ لِبَنِي النَّجَّارِ، فَدُرْتُ بِهِ هَلْ أَجِدُ لَهُ بَابًا، فَلَمْ أَجِدْ، فَإِذَا رَبِيعٌ يَدْخُلُ فِي جَوْفِ حَائِطٍ مِنْ بِئْرٍ خَارِجَةٍ - وَالرَّبِيعُ: الْجَدْوَلُ - فَاحْتَفَزْتُ [كَمَا يَحْتَفِزُ الثَّعْلَبُ] فَدَخَلْتُ عَلَى رَسُولِ اللَّهِ ﷺ، فَقَالَ: ((أَبُو هُرَيْرَةَ؟)) فَقُلْتُ: نَعَمْ، يَا رَسُولَ اللَّهِ! قَالَ: ((مَا شَأْنُكَ؟)) قُلْتُ: كُنْتَ بَيْنَ أَظْهُرِنَا، فَقُمْتَ فَأَبْطَأْتَ عَلَيْنَا، فَخَشِينَا أَنْ تُقْتَطَعَ دُونَنَا، فَفَزِعْنَا، فَكُنْتُ أَوَّلَ مَنْ فَزِعَ، فَأَتَيْتُ هَذَا الْحَائِطَ، فَاحْتَفَزْتُ كَمَا يَحْتَفِزُ الثَّعْلَبُ، وَهَؤُلاَءِ النَّاسُ وَرَائِي، فَقَالَ: ((يَا أَبَا هُرَيْرَةَ!)) وَأَعْطَانِي نَعْلَيْهِ قَالَ: ((اذْهَبْ بِنَعْلَيَّ هَاتَيْنِ فَمَنْ لَقِيتَ مِنْ وَرَاءِ هَذَا الْحَائِطِ يَشْهَدُ أَنْ لاَ إِلَهَ إِلاَّ اللَّهُ، مُسْتَيْقِنًا بِهَا قَلْبُهُ، فَبَشِّرْهُ بِالْجَنَّةِ)) فَكَانَ أَوَّلَ مَنْ لَقِيتُ عُمَرُ، فَقَالَ: مَا هَاتَانِ النَّعْلاَنِ يَا أَبَا هُرَيْرَةَ؟ فَقُلْتُ: هَاتَانِ نَعْلاَ رَسُولِ اللَّهِ ﷺ بَعَثَنِي بِهِمَا، مَنْ لَقِيتُ يَشْهَدُ أَنْ لاَ إِلَهَ إِلاَّ اللَّهُ مُسْتَيْقِنًا بِهَا قَلْبُهُ، بَشَّرْتُهُ بِالْجَنَّةِ. فَضَرَبَ عُمَرُ بِيَدِهِ بَيْنَ ثَدْيَيَّ ضَرْبَةً، فَخَرَرْتُ لاِسْتِي، فَقَالَ: ارْجِعْ يَا أَبَا هُرَيْرَةَ! فَرَجَعْتُ إِلَى رَسُولِ اللَّهِ ﷺ، فَأَجْهَشْتُ بُكَاءً، وَرَكِبَنِي عُمَرُ، فَإِذَا هُوَ عَلَى أَثَرِي، فَقَالَ [لِي] رَسُولُ اللَّهِ ﷺ: ((مَا لَكَ يَا أَبَا هُرَيْرَةَ؟)) قُلْتُ: لَقِيتُ عُمَرَ، فَأَخْبَرْتُهُ بِالَّذِي بَعَثْتَنِي بِهِ، فَضَرَبَ بَيْنَ ثَدْيَيَّ ضَرْبَةً خَرَرْتُ لاِسْتِي، قَالَ: ارْجِعْ. قَالَ لَهُ رَسُولُ اللَّهِ ﷺ: ((يَا عُمَرُ! مَا حَمَلَكَ عَلَى مَا فَعَلْتَ؟)) قَالَ: يَا رَسُولَ اللَّهِ! بِأَبِي أَنْتَ وَأُمِّي، أَبَعَثْتَ أَبَا هُرَيْرَةَ بِنَعْلَيْكَ، مَنْ لَقِيَ يَشْهَدُ أَنْ لاَ إِلَهَ إِلاَّ اللَّهُ مُسْتَيْقِنًا بِهَا قَلْبُهُ، بَشَّرَهُ بِالْجَنَّةِ، قَالَ: ((نَعَمْ)) قَالَ: فَلاَ تَفْعَلْ، فَإِنِّي أَخْشَى أَنْ يَتَّكِلَ النَّاسُ عَلَيْهَا، فَخَلِّهِمْ يَعْمَلُونَ، قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((فَخَلِّهِمْ)).

**[147]-52-(31)** ........ Əbu Hureyrə ﵁ demişdir: “(Bir dəfə) biz bir dəstə adamla Peyğəmbərin ﷺ ətrafında oturmuşduq. Əbu Bəkr və Ömər də bizimlə idi.[1] Bu vaxt Peyğəmbər ﷺ aramızdan qalxıb getdi və (geri qayıtdıqda) bir qədər ləngidi. Biz onun başına bir iş gələcəyindən qorxub təşvişə düşdük və (dərhal hamımız) ayağa qalxdıq. (Hamıdan) əvvəl mən narahat oldum və qalxıb onu axtarmağa getdim. Nəhayət, ənsardan[2] olan Nəccar oğullarının bostanına gəldim. Bostanın ətrafına hərləndim ki, bəlkə bir qapı tapıb (oraya girim), amma tapa bilmədim. Bir də baxdım ki, çöldəki su quyusundan bostanın içinə bir arx gedir. Mən yerə yatıb (tülkü kimi) sürünərək Peyğəmbərin ﷺ yanına daxil ol-

---

[1] Səhabələr adətən bir toplumdan xəbər verdikdə, onların hamısının adlarını çəkməz, ən hörmətlilərinin və ya bunlardan bəzilərinin adlarını çəkməklə kifayətlənər və “başqaları” deyərdilər.

[2] İslamı qəbul etmiş və Muhəmməd Peyğəmbərin ﷺ sədaqətli silahdaşları olmuş Mədinənin yerli sakinləri. Onlar Məkkədən və başqa şəhərlərdən gələn mühacirləri evlərinə qəbul edir və onları zəruri əşyalarla təmin edirdilər.

dum. Peyğəmbər ﷺ: “Əbu Hureyrədirmi?”– deyə soruşdu. Dedim: “Bəli, ya Rəsulullah!” Soruşdu: “Sənə nə olub?” Dedim: “Sən aramızdan qalxıb getdin və bir qədər ləngidin deyə, başına bir iş gələcəyindən qorxub təşvişə düşdük. Hamıdan əvvəl mən narahat oldum, qalxıb bu bostana gəldim və yerə yatıb tülkü kimi sürünərək bura daxil oldum. Oradakı camaat da arxamca gəlir”. Peyğəmbər ﷺ: “Ey Əbu Hureyrə!”– deyib nəleyinlərini[1] mənə verdi və dedi: “Götür apar bu nəleyinlərimi![2] Bu bostanın çölündə, Allahdan başqa (haqq) məbudun olmadığına şahidlik gətirən və yəqinliklə buna inanan kəsə rast gəlsən, onu Cənnətlə müjdələ”[3]. Mənim ilk rast gəldiyim adam Ömər oldu. O soruşdu: “Bu nə nəleyinlərdir, ey Əbu Hureyrə?” Dedim: “Bu, Peyğəmbərin ﷺ nəleyinləridir. Bunları mənə verərək göndərib ki, Allahdan başqa (haqq) məbudun olmadığına şahidlik gətirən və yəqinliklə buna inanan hər kəsi Cənnətlə müjdələyim”. (Bunu eşidəndə) Ömər sinəmə bir zərbə vurdu və mən arxası üstə yerə dəydim. Sonra (mənə): “Geri dön, ey Əbu Hureyrə!”– dedi, mən də Peyğəmbərin ﷺ yanına qayıtdım. Mən az qala ağlayacaqdım. Ömər də arxamca gəlirdi. Peyğəmbər ﷺ (məndən): “Sənə nə olub, ey Əbu Hureyrə?”– deyə soruşdu. Dedim: “Mən Ömərə rast gəldim və sənin mənə tapşırdığını ona xəbər verdim. (Buna rəğmən) o mənim sinəmə bir zərbə vurdu və mən arxası üstə yerə düşdüm. (Sonra mənə): “Geri dön!”– dedi”. Peyğəmbər ﷺ ondan: “Ey Ömər, bunu etməyə səni nə vadar etdi?”– deyə soruşdu. Ömər dedi: “Atam-anam sənə fəda olsun,[4] ya Rəsulullah! Doğrudanmı, sən nəleyinlərini Əbu Hureyrəyə verib göndərmisən ki, Allahdan başqa (haqq) məbudun olmadığına şahidlik gətirən və yəqinliklə buna inanan hər kəsi Cənnətlə müjdələsin?” Peyğəmbər ﷺ: “Bəli”– deyə cavab verdi. Ömər dedi: “Belə etmə, (ya Rəsulullah)! Düzü, mən insanların buna arxayın olacağından qorxuram.

---

[1] Nəleyin: başmağa oxşar ayaqqabı.

[2] Peyğəmbərin ﷺ nəleyinləri Əbu Hureyrəyə verməkdə məqsədi bu idi ki, bunlar səhabələr üçün zahiri bir əlamət olsun və onlar Əbu Hureyrənin Peyğəmbərə ﷺ rast gəldiyini bilsinlər və onun söylədiklərini daha tez qəbul etsinlər. Halbuki onlar bunsuz da onun dediyini qəbul edirdilər (“Mişkatul-Məsabih”, 1/298).

[3] Onlara xəbər ver ki, bu sifətləri özündə cəm edən hər kəs Cənnət əhlindən olacaq. Hədisdən açıq-aydın görünür ki, nə tövhid kəlməsinə iman gətirmədən onu tələffüz etməyin, nə də tələffüz etmədən ona inanmağın faydası var. Əksinə, bunları cəm etmək labüddür.

[4] Bu ifadə tövhidə heç bir xələl gətirmir, əksinə, nəvaziş, mehribanlıq, yalvarış bildirir.

Burax onları, (yaxşı) işlər görməyə çalışsınlar[1]". Peyğəmbər ﷺ: "Yaxşı, qoy çalışsınlar!"– deyə buyurdu".

**[١٤٨] ٥٣-(٣٢)** حَدَّثَنَا إِسْحَقُ بْنُ مَنْصُورٍ: أَخْبَرَنَا مُعَاذُ بْنُ هِشَامٍ قَالَ: حَدَّثَنِي أَبِي عَنْ قَتَادَةَ قَالَ: حَدَّثَنَا أَنَسُ بْنُ مَالِكٍ: أَنَّ نَبِيَّ اللَّهِ ﷺ – وَمُعَاذُ بْنُ جَبَلٍ رَدِيفُهُ عَلَى الرَّحْلِ – قَالَ: ((يَا مُعَاذُ!)) قَالَ: لَبَّيْكَ يَا رَسُولَ اللَّهِ وَسَعْدَيْكَ، قَالَ: ((يَا مُعَاذُ!)) قَالَ: لَبَّيْكَ يَا رَسُولَ اللَّهِ وَسَعْدَيْكَ، قَالَ: ((يَا مُعَاذُ!)) قَالَ: لَبَّيْكَ يَا رَسُولَ اللَّهِ وَسَعْدَيْكَ، قَالَ: ((مَا مِنْ عَبْدٍ يَشْهَدُ أَنْ لاَ إِلَهَ إِلاَّ اللَّهُ وَأَنَّ مُحَمَّدًا عَبْدُهُ وَرَسُولُهُ، إِلاَّ حَرَّمَهُ اللَّهُ عَلَى النَّارِ)) قَالَ: يَا رَسُولَ اللَّهِ! أَفَلاَ أُخْبِرُ بِهَا [النَّاسَ] فَيَسْتَبْشِرُوا؟ قَالَ: ((إِذًا يَتَّكِلُوا)) فَأَخْبَرَ بِهَا مُعَاذٌ عِنْدَ مَوْتِهِ تَأَثُّمًا.

**[148]-53-(32)** ........ Ənəs ﷺ demişdir: "Muaz ibn Cəbəl Peyğəmbərin ﷺ tərkində ikən Peyğəmbər ﷺ: "Ey Muaz!"– deyə (onu) çağırdı. Muaz: "Buyur, ya Rəsulullah, əmrinə müntəzirəm"– deyə cavab verdi. O (yenə): "Ey Muaz!"– deyə çağırdı. Muaz: "Buyur, ya Rəsulullah, əmrinə müntəzirəm"– deyə cavab verdi. O (bir daha): "Ey Muaz!"– deyə çağırdı. Muaz (yenə): "Buyur, ya Rəsulullah, əmrinə müntəzirəm"– deyə cavab verdi. Rəsulullah ﷺ dedi: "Allahdan başqa (haqq) məbudun olmadığına və Muhəmmədin Onun qulu və elçisi olduğuna şahidlik edən hər bir bəndəyə Allah Cəhənnəm odunu haram buyurmuşdur". Muaz dedi: "Ya Rəsulullah, bunu [insanlara] xəbər verimmi ki, sevinsinlər?" Rəsulullah ﷺ buyurdu: "Belə etsən, onlar arxayınlaşacaqlar". Muaz ölüm ayağında ikən, (elmi gizlətməyin) günah olduğundan (qorxub) bunu (camaata) xəbər vermişdir[2]".

---

[1] Qazı İyad ﷺ və bir çox başqa alimlər (Allah onların hamısına rəhmət eləsin!) demişlər: "Ömərin ﷺ hərəkəti və Peyğəmbərə ﷺ etdiyi müraciəti, heç də onun Peyğəmbərə ﷺ etiraz etməsi və onun əmrinə qarşı çıxması demək deyildir. Çünki Peyğəmbərin ﷺ Əbu Hureyrəyə tapşırdığı bu iş ancaq ümmətin könlünü açacaq və onları müjdələyəcək bir xəbər idi. Lakin Ömər ﷺ bunun gizli saxlanmasını insanlar üçün daha məqsədəuyğun və onların arxayınlaşmamaları üçün daha əlverişli hesab etmiş, habelə bunun o müjdədən daha xeyirli olduğunu güman etmişdir. Nəhayət, Ömər ﷺ bu məsələni Peyğəmbərə ﷺ ərz etdikdə, o, Ömərin ﷺ təklifi ilə razılaşmışdır. Bu da dəlildir ki, imam və ya rəhbər şəxs bir şeyi məsləhət gördüyü, tabeçiliyində olan kimsənin isə bunun tam əksini məsləhət bildiyi təqdirdə, tabeçilikdə olan adam məsələni rəhbər şəxsə bildirməlidir. Bildirməlidir ki, o, buna bir daha nəzər salsın və əgər tabeçiliyində olan adamın dediyi məqsədəuyğundursa, onu dəstəkləsin, əks halda isə ona yanlış düşündüyünü başa salsın".

[2] Şeyx Əbu Amr ibn əs-Səlah ﷺ demişdir: "Peyğəmbər ﷺ, həyat təcrübəsi və savadı olmayan kimsələrin bu müjdədən xəbər tutub çaş-baş qalacaqlarından və arxayınlaşacaqlarından qorxub, bunu ümumi şəkildə qadağan etmişdir. Halbuki özü bunu Muaza, Əbu Hureyrəyə, Ömərə və digərlərinə – aldanmayacaqlarına və arxayınlaşmayacaqlarına əmin olduğu səhabələrinə xəbər vermişdir. Muaz da öz növbəsində bunu etibar etdiyi yaxın adamlarına xəbər vermişdir".

**[١٤٩] ٥٤-(٣٣)** حَدَّثَنَا شَيْبَانُ بْنُ فَرُّوخَ: حَدَّثَنَا سُلَيْمَانُ يَعْنِي ابْنَ الْمُغِيرَةِ، قَالَ: حَدَّثَنَا ثَابِتٌ عَنْ أَنَسِ بْنِ مَالِكٍ قَالَ: حَدَّثَنِي مَحْمُودُ بْنُ الرَّبِيعِ عَنْ عِتْبَانَ بْنِ مَالِكٍ قَالَ: قَدِمْتُ الْمَدِينَةَ، فَلَقِيتُ عِتْبَانَ فَقُلْتُ: حَدِيثٌ بَلَغَنِي عَنْكَ. قَالَ: أَصَابَنِي فِي بَصَرِي بَعْضُ الشَّيْءِ، فَبَعَثْتُ إِلَى رَسُولِ اللَّهِ ﷺ أَنِّي أُحِبُّ أَنْ تَأْتِيَنِي فَتُصَلِّيَ فِي مَنْزِلِي فَأَتَّخِذَهُ مُصَلًّى، قَالَ: فَأَتَى النَّبِيُّ ﷺ وَمَنْ شَاءَ اللَّهُ مِنْ أَصْحَابِهِ، فَدَخَلَ وَهُوَ يُصَلِّي فِي مَنْزِلِي، وَأَصْحَابُهُ يَتَحَدَّثُونَ بَيْنَهُمْ، ثُمَّ أَسْنَدُوا عُظْمَ ذَلِكَ وَكُبْرَهُ إِلَى مَالِكِ بْنِ دُخْشُمٍ قَالَ: وَدُّوا أَنَّهُ دَعَا عَلَيْهِ فَهَلَكَ، وَوَدُّوا أَنَّهُ أَصَابَهُ شَرٌّ، فَقَضَى رَسُولُ اللَّهِ ﷺ الصَّلَاةَ وَقَالَ: ((أَلَيْسَ يَشْهَدُ أَنْ لاَ إِلَهَ إِلاَّ اللَّهُ وَأَنِّي رَسُولُ اللَّهِ؟)) قَالُوا: إِنَّهُ يَقُولُ ذَلِكَ، وَمَا هُوَ فِي قَلْبِهِ. قَالَ: ((لاَ يَشْهَدُ أَحَدٌ أَنْ لاَ إِلَهَ إِلاَّ اللَّهُ وَأَنِّي رَسُولُ اللَّهِ، فَيَدْخُلَ النَّارَ، أَوْ تَطْعَمَهُ)) قَالَ أَنَسٌ: فَأَعْجَبَنِي هَذَا الْحَدِيثُ، فَقُلْتُ لاِبْنِي: اكْتُبْهُ، فَكَتَبَهُ.

**[149]-54-(33)** ........ Ənəs ibn Malik ﷺ demişdir: “Mahmud ibn Rəbi, İtban ibn Malikdən[1] eşitdiyini belə rəvayət etmişdir: “Mən Mədinəyə[2] gəlib çatdıqda İtbana rast gəldim və (ona): “Səndən mənə bir hədis çatmışdır”– dedim. O da mənə belə rəvayət etdi: “Mənim gözlərim zəifləmişdi. Və mən istəyirdim ki, Peyğəmbər ﷺ bizim evə gəlib orada namaz qılsın, mən də həmin yeri namazgah edim. (Ertəsi gün səhər tezdən) Peyğəmbər ﷺ səhabələrindən Allahın dilədiyi kimsələrlə birlikdə gəldi və içəri daxil oldu. O mənim evimdə namaz qılır, səhabələr də öz aralarında (münafiqlərin iyrənc əməlləri barədə) söhbət edirdilər. Bunların çoxunu və böyüyünü Malik ibn Duxşuma isnad etdilər. Sonra da (Malik) həlak olsun deyə Peyğəmbərin ﷺ ona bəddua etməsini istədiklərini və onun şərə düşməsini arzuladıqlarını söylədilər. Peyğəmbər ﷺ namazı bitirdikdən sonra dedi: “Məgər o, Allahdan başqa (haqq) məbudun olmadığına və mənim Allahın elçisi olduğuma şahidlik etmirmi?!” Onlar dedilər: “O bunu desə də, qəlbi ilə bunu təsdiqləmir”.[3] Peyğəmbər ﷺ buyurdu: “Allah-

---

[1] Bu isnadda iki incəlik var. Biri budur ki, bu hədisi üç səhabə – Ənəs, Mahmud və İtban – biri-birindən rəvayət etmişdir. İkincisi də odur ki, səhabə bu hədisi yaşca özündən kiçik olan səhabədən rəvayət etmişdir. Belə ki, Ənəs Mahmuddan yaşda böyük idi.

[2] Mədinə, Səudiyyə Ərəbistanında şəhərdir. Müsəlmanların müqəddəs ziyarətgahı olan Muhəmməd Peyğəmbərin ﷺ məscidi orada yerləşir. Məhz bu şəhərə Muhəmməd Peyğəmbər ﷺ və onun səhabələri hicrət etmişlər. İslamdan əvvəlki zamanlarda bu şəhər Yəsrib adlanırdı.

[3] Nəvəvi demişdir: “(Başqa bir rəvayətdə) Peyğəmbər ﷺ səhabələrinə Malikin qəlbən iman gətirmiş olduğunu və münafiq olmadığını xəbər vermişdir. Mahmud ibn Rabi əl-Ənsari ﷺ rəvayət edir ki, Peyğəmbərin ﷺ səhabəsi və Bədr döyüşünün ənsardan olan iştirakçısı İtban ibn Malik Peyğəmbərin ﷺ yanına gəlib dedi: “Ya Rəsulallah! Mənim gözlərim zəifləyib. Özüm də qövmümə namaz qıldırıram. Yağış yağdığı zaman mənimlə onların arasında olan vadini su basır deyə,

dan başqa (haqq) məbudun olmadığına və mənim Allahın elçisi olduğuma şahidlik etməyən kimsə Cəhənnəm oduna girər, yaxud onu dadar”.[1]

Ənəs dedi: “Bu hədis mənim xoşuma gəldi və mən oğluma: “Bunu yaz!”– dedim, o da onu yazdı.

**[١٥٠] ٥٥**–(...) حَدَّثَنِي أَبُو بَكْرِ بْنُ نَافِعٍ الْعَبْدِيُّ: حَدَّثَنَا بَهْزٌ: حَدَّثَنَا حَمَّادٌ: حَدَّثَنَا ثَابِتٌ عَنْ أَنَسٍ قَالَ: حَدَّثَنِي عِتْبَانُ بْنُ مَالِكٍ أَنَّهُ عَمِيَ، فَأَرْسَلَ إِلَى رَسُولِ اللَّهِ ﷺ فَقَالَ: تَعَالَ فَخُطَّ لِي مَسْجِدًا فَجَاءَ رَسُولُ اللَّهِ ﷺ وَجَاءَ قَوْمُهُ، وَتَغَيَّبَ رَجُلٌ مِنْهُمْ يُقَالُ لَهُ مَالِكُ بْنُ الدُّخْشُمِ، ثُمَّ ذَكَرَ نَحْوَ حَدِيثِ سُلَيْمَانَ بْنِ الْمُغِيرَةِ.

**[150]-55-(...)** ........ Ənəs ؓ demişdir: “İtban ibn Malik mənə belə rəvayət etmişdir: “Gözlərim kor olduqdan sonra mən Peyğəmbərə ﷺ: “Gəl mənim üçün bir namazgah təyin et”– deyə xəbər göndərdim. Peyğəmbər ﷺ və (yerli) adamlardan bəziləri bizə gəldilər. Malik ibn Duxşum adlı birisi onların arasında yox idi...”

Sonra o bu hədisi Süleyman ibn Muğiranın hədisinə bənzər rəvayət etmişdir.

---

məscidlərinə gedib onlara namaz qıldıra bilmirəm. Ya Rəsulullah! Mən istəyirəm ki, sən bizim evə gəlib orada namaz qılasan, mən də həmin yeri namazgah edim”. Peyğəmbər ﷺ ona: “Allah qoysa, mən (bunu) edərəm!”– dedi.

İtban ؓ dedi: “Ertəsi gün səhər tezdən Peyğəmbər ﷺ Əbu Bəkrlə birlikdə bizə gəldilər. Peyğəmbər ﷺ evə girməyə izin istədi, mən də ona izin verdim. Evə girdikdə oturmadan dərhal soruşdu: “Evin harasında namaz qılım?” Mən ona evimdə bir yer göstərdim. Peyğəmbər ﷺ orada durub “Allahu Əkbər”– dedi (və namaz qılmağa başladı). Biz də onun arxasında cərgəyə durduq. O, iki rükət namaz qıldı və salam verib (namazı bitirdi)”. Sonra biz Peyğəmbəri ﷺ bir qədər yubatdıq ki, onun üçün hazırladığımız xəzirəni (yeyə bilsin). Bu yerin əhalisindən bir çoxları (Peyğəmbərin ﷺ gəlişindən xəbər tutan kimi) gəlib evə doluşdular. Onlardan biri soruşdu: “Malik ibn Duxeyşin (və ya ibn Duxşun) haradadır?” Oradakılardan biri dedi: “O, münafiqdir, Allahı və Onun elçisini sevmir.” Peyğəmbər ﷺ dedi: “Belə demə! Məgər sən bilmirsən ki, o, Allahın Üzünü diləyərək “lə ilahə illəllah”– demişdir?!” (O adam) dedi: “Allah və Onun Elçisi daha yaxşı bilir!” İtban dedi: “Biz onun münafiqlərə qarşı (mehriban) mövqedə olduğunu və onlara məsləhət verdiyini görürük.” Peyğəmbər ﷺ dedi: “Allah, həqiqətən də, Onun Üzünü diləyərək “lə ilahə illəllah” deyən kimsəyə, Cəhənnəm odunun toxunmasını haram etmişdir” (“Səhih əl-Buxari”, 425).

[1] Hədisdən belə nəticə çıxır ki, alimlərin, hörmətli şəxsiyyətlərin və böyüklərin öz ardıcıllarını ziyarət etməsi və onlara xeyir-bərəkət diləməsi bəyənilən əməllərdəndir. Hədis həmçinin nafilə namazının camaat şəklində qılınmasının və namaz qılanların yanında – onları namazdan yayındırmamaq şərtilə – söhbət etməyin, habelə yad yerdə yalnız ev sahibinin razılığı ilə imamlıq etməyin (camaata namaz qıldırmağın) caiz olduğuna da dəlalət edir. Bir də ona dəlalət edir ki, əgər rəhbər şəxs öz tabeçiliyində olan kimsənin təqsirləndirildiyini eşitsə (və bunun əsassız olduğunu yəqin bilsə, onu müdafiə etməli və əsassız danışan adamları) bundan çəkindirməlidir.

## (١١) – بَابُ الدَّلِيلِ عَلَى أَنَّ مَنْ رَضِيَ بِاللَّهِ رَبًّا وَبِالإِسْلاَمِ دِينًا وَبِمُحَمَّدٍ ﷺ رَسُولاً فَهُوَ مُؤْمِنٌ وَإِنْ ارْتَكَبَ الْمَعَاصِيَ الْكَبَائِرَ

## 11-ci fəsil. Allahın Rəbb, İslamın din və Muhəmmədin ﷺ peyğəmbər olduğundan razı qalan kimsənin – böyük günahlar etsə belə – mömin olduğuna dair dəlil

**[١٥١] ٥٦–(٣٤)** حَدَّثَنَا مُحَمَّدُ بْنُ يَحْيَى بْنِ أَبِي عُمَرَ الْمَكِّيُّ وَبِشْرُ بْنُ الْحَكَمِ قَالاَ: حَدَّثَنَا عَبْدُ الْعَزِيزِ وَهُوَ ابْنُ مُحَمَّدٍ الدَّرَاوَرْدِيُّ، عَنْ يَزِيدَ بْنِ الْهَادِ، عَنْ مُحَمَّدِ بْنِ إِبْرَاهِيمَ، عَنْ عَامِرِ بْنِ سَعْدٍ، عَنْ الْعَبَّاسِ بْنِ عَبْدِ الْمُطَّلِبِ أَنَّهُ سَمِعَ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ: ((ذَاقَ طَعْمَ الإِيمَانِ مَنْ رَضِيَ بِاللَّهِ رَبًّا وَبِالإِسْلاَمِ دِينًا وَبِمُحَمَّدٍ رَسُولاً)).

**[151]-56-(34)** ........ Abbas ibn Abdul-Muttəlib ﷺ Peyğəmbərin ﷺ belə dediyini eşitmişdir: "Allahın Rəbb, İslamın din və Muhəmmədin peyğəmbər olduğundan razı qalan kimsə imanın tamını dadmış olar!"[1]

## (١٢) – بَابُ بَيَانِ عَدَدِ شُعَبِ الإِيمَانِ وَأَفْضَلِهَا وَأَدْنَاهَا وَفَضِيلَةِ الْحَيَاءِ وَكَوْنِهِ مِنْ الإِيمَانِ

## 12-ci fəsil. İman şöbələrinin[2] sayının, onun ən üstün və ən aşağı dərəcəsinin, habelə həyanın fəzilətinin və onun imandan olmasının bəyan edilməsi

**[١٥٢] ٥٧–(٣٥)** حَدَّثَنَا عُبَيْدُ اللَّهِ بْنُ سَعِيدٍ وَعَبْدُ بْنُ حُمَيْدٍ قَالاَ: حَدَّثَنَا أَبُو عَامِرٍ الْعَقَدِيُّ: حَدَّثَنَا سُلَيْمَانُ بْنُ بِلاَلٍ عَنْ عَبْدِ اللَّهِ بْنِ دِينَارٍ، عَنْ أَبِي صَالِحٍ، عَنْ أَبِي هُرَيْرَةَ عَنْ النَّبِيِّ ﷺ قَالَ: ((الإِيمَانُ بِضْعٌ وَسَبْعُونَ شُعْبَةً وَالْحَيَاءُ شُعْبَةٌ مِنْ الإِيمَانِ)).

---

[1] Bir şeydən razı qaldım demək, ona qane oldum və onunla kifayətləndim, onunla yanaşı başqa bir şey istəmədim deməkdir. Hədisdə razı qalmaq deyildikdə Allah Taalədən başqa məbud axtarmamaq, İslam yolundan başqa bir yol tutmamaq və Muhəmmədin ﷺ şəriətindən başqa bir şəriət qəbul etməmək qəsd edilir. Şəkk yoxdur ki, bu sifətləri özündə cəm edən kimsə imanın şirinliyini qəlbinə salmış və onun tamını dadmış olar.

[2] Burada "bir neçə" deyildikdə üçdən doqquzadək olan say, "şöbə" deyildikdə isə xislət və imanın hissələri nəzərdə tutulur.

**[152]-57-(35)** ........ Əbu Hureyrə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “İman yetmiş və bir neçə şöbədən[1] ibarətdir. Həya da imanın şöbələrindəndir”.

---

[1] Qazı İyad demişdir: “Bəzi alimlər ictihad edib burada bəhs edilən imanın şöbələrini sadalamağa çalışmışlar. Lakin hədisdə qəsd edilənin məhz bunlar olduğunu söyləmək çox çətindir. Burada sayı göstərilən şöbələri izahlı şəkildə bilməmək imana xələl gətirməz”.

Alimlərin bu xüsusda söylədiklərini bir araya gətirərək imanın şöbələrini aşağıdakı şəkildə açıqlayıram; bu şöbələr qəlbin, dilin və bədənin əməlləri olaraq üç qismə bölünür:

**I. Qəlbin əməlləri:** qəlbə aid olan əməllər etiqad və niyyətlə bağlı xüsusları əhatə edir. Bu qismə iyirmi dörd xislət aiddir:

1. Allaha iman gətirmək. Allahın zatına, sifətlərinə, Tək olduğuna, Onun heç bir bənzəri olmadığına, Ondan başqa hər bir şeyin yaradılmış olduğuna iman gətirmək də buna aiddir.
2. Mələklərə iman gətirmək;
3. (Allahın nazil etdiyi) kitablara iman gətirmək;
4. (Allahın göndərdiyi) peyğəmbərlərə iman gətirmək;
5. Qədərə – xeyir və şərin Allahdan olmasına iman gətirmək;
6. Axirət gününə iman gətirmək. Qəbirdə sorğu-sual olunmağa, öldükdən sonra dirilməyə, məhşərə toplanmağa, haqq-hesaba çəkilməyə, tərəziyə, qıl körpüsünə, Cənnət və Cəhənnəmə iman gətirmək də buna aiddir.
7. Allahı sevmək;
8. Allah üçün sevmək və Allah üçün qəzəblənmək;
9. Muhəmməd Peyğəmbəri ﷺ sevmək və onun böyüklüyünü qəbul etmək. Peyğəmbərə ﷺ salavat gətirmək və onun yolunu tutub getmək də buna aiddir;
10. İxlas. Riyanı və nifaqı tərk etmək də buna aiddir;
11. Tövbə etmək;
12. (Allahdan) qorxmaq;
13. (Allahın mərhəmətinə) ümid bəsləmək;
14. Şükür etmək;
15. Vəfalı olmaq;
16. Səbir etmək;
17. Qəzavü-qədərə razı qalmaq;
18. (Allaha) təvəkkül etmək;
19. Rəhmli olmaq;
20. Təvazökar olmaq. Böyüyə hörmət etmək və kiçiyə mərhəmət göstərmək də buna aiddir.
21. Təkəbbürlü olmaqdan və özünü bəyənməkdən çəkinmək;
22. Həsəd və paxıllıqdan həzər etmək;
23. Kin saxlamamaq;
24. Qəzəblənməmək.

**II. Dilin əməlləri.** İmanın bu qismi yeddi növdür:

1. Tövhid kəlməsini tələffüz etmək;
2. Quran oxumaq;
3. (Faydalı) elm öyrənmək;
4. (Faydalı) elm öyrətmək;

5. Dua etmək;
6. Zikr etmək. Allahdan bağışlanma diləmək də buna aiddir;
7. Boş sözlər danışmaqdan çəkinmək.

**III. Bədənin əməlləri.** İmanın bu qismi otuz səkkiz növdür:

a) Bunlardan on beşi insanın şəxsən özünə aiddir:
1. Zahirən və batinən təmizlənmək. Murdar şeylərdən təmizlənmək də buna aiddir;
2. Ayıb yerləri örtmək;
3. Fərz və nafilə namazlarını qılmaq;
4. Zəkat vermək;
5. Qul azad etmək;
6. Comərd olmaq; (Allah yolunda) yemək vermək və qonağa hörmət etmək də buna aiddir;
7. Fərz və nafilə oruclarını tutmaq;
8. Həcc və ümrə ziyarətlərini yerinə yetirmək;
9. Kəbəni təvaf etmək;
10. Etikaf etmək (Ramazan ayının axırıncı on gününü məsciddə qalmaq);
11. Qədr gecəsini axtarmaq;
12. Dinini fitnələrdən qorumaq. Allaha şərik qoşulan diyardan hicrət etmək də buna aiddir.
13. Nəzir etdikdə, onu yerinə yetirmək;
14. Andları pozmamaq;
15. Kəffarələri (günahın bağışlanılması üçün şəriətin buyurduğu qaydada müəyyən edilmiş müəyyən cəriməni) ödəmək.

b) Bunlardan altısı isə insanın tabeçiliyində olanlara qarşı münasibətdə yerinə yetirməsi gərəkli olan əməllərdir:
16. Evlənmək vasitəsilə iffəti qorumaq;
17. Ailəni dolandırmaq;
18. Valideynlərin qayğısına qalmaq və onlara asi olmamaq;
19. Uşaqları tərbiyə etmək;
20. Qohumluq əlaqələrini möhkəmləndirmək;
21. Ağaya itaət etmək, habelə kölələrlə mülayim rəftar etmək;

c) Bunlardan on yeddisi isə topluma qarşı yerinə yetirilməsi gərəkli olan əməllərdir:

22. Ədalətlə hökm vermək;
23. İxtiyar sahiblərinə itaət etmək;
24. İnsanların arasını düzəltmək. Xəvariclərlə, habelə yolunu azmış digər firqələrlə mübarizə aparmaq da buna aiddir;
25. Xeyirxah işlərdə bir-birinə yardım etmək. Yaxşılığı əmr etmək və pis işlərdən çəkindirmək də buna aiddir;
26. Şəriətin qoyduğu cəzaları yerinə yetirmək;
27. Cihad etmək. (İslam ölkəsinin) sərhədlərini qorumaq da buna aiddir;
28. Əmanətə xəyanət etməmək. Əldə edilmiş qənimətlərin beşdə birini beytülmala qoymaq;
29. Borc vermək, habelə borc aldıqda onu qaytarmaq;
30. Qonşuya yaxşılıq etmək;
31. İnsanlarla gözəl rəftar etmək;

**[١٥٣] ٥٨**-(...) حَدَّثَنَا زُهَيْرُ بْنُ حَرْبٍ: حَدَّثَنَا جَرِيرٌ عَنْ سُهَيْلٍ، عَنْ عَبْدِ اللَّهِ بْنِ دِينَارٍ، عَنْ أَبِي صَالِحٍ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((الإِيمَانُ بِضْعٌ وَسَبْعُونَ، - أَوْ بِضْعٌ وَسِتُّونَ - شُعْبَةً فَأَفْضَلُهَا قَوْلُ لاَ إِلَهَ إِلاَّ اللَّهُ، وَأَدْنَاهَا إِمَاطَةُ الأَذَى عَنْ الطَّرِيقِ، وَالْحَيَاءُ شُعْبَةٌ مِنْ الإِيمَانِ)).

**[153]-58-(...)** ........ Əbu Hureyrə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "İman yetmiş və bir neçə (yaxud altmış və bir neçə) şöbədən ibarətdir. Bunun ən üstünü "lə ilahə illəllah" sözü, ən aşağı dərəcəsi isə əziyyət verən[1] şeyləri yoldan kənarlaşdırmaqdır. Həya da imanın şöbələrindəndir".

**[١٥٤] ٥٩**-(٣٦) حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ وَعَمْرٌو النَّاقِدُ وَزُهَيْرُ بْنُ حَرْبٍ قَالُوا: حَدَّثَنَا سُفْيَانُ بْنُ عُيَيْنَةَ عَنْ الزُّهْرِيِّ، عَنْ سَالِمٍ، عَنْ أَبِيهِ أَنَّهُ قَالَ: سَمِعَ النَّبِيُّ ﷺ رَجُلاً يَعِظُ أَخَاهُ فِي الْحَيَاءِ، فَقَالَ: ((الْحَيَاءُ مِنْ الإِيمَانِ)).

**[154]-59-(36)** ........ Salimin atası (Abdullah ibn Ömər ﷺ) demişdir: "Peyğəmbər ﷺ, qardaşına (həddən ziyadə) həyalı olmamağı[2] nəsihət edən bir adamın (yanından keçərkən ona) demişdir: "Həya imandandır".

**[١٥٥]** (...) حَدَّثَنَا عَبْدُ بْنُ حُمَيْدٍ: حَدَّثَنَا عَبْدُ الرَّزَّاقِ: أَخْبَرَنَا مَعْمَرٌ عَنْ الزُّهْرِيِّ بِهَذَا الإِسْنَادِ وَقَالَ: مَرَّ بِرَجُلٍ مِنْ الأَنْصَارِ يَعِظُ أَخَاهُ.

**[155] (...)** ........ Məmər (hədisi) Zuhridən bu isnadla rəvayət etmiş və: "(Peyğəmbər ﷺ), ənsardan olan qardaşına (həddən ziyadə həyalı olmamağı) nəsihət edən bir kişinin yanından keçərkən...."– demişdir.

---

32. Halal yolla var-dövlət qazanmaq və bunu lazımi yerlərə (faydalı işlərə) xərcləmək;
33. İsraf etməmək;
34. Verilən salamı almaq;
35. Asqırıb "əlhəmdulilləh" deyənə "yərhəmukəllah" demək;
36. İnsanlara əziyyət verməmək;
37. Boş söhbətlərdən və faydasız işlərdən qaçmaq;
38. Əziyyət verən bir şeyi yoldan kənar etmək.

Bunların cəmi altmış doqquz edir. Lakin yuxarıda iki-iki zikr edilmiş xislətləri tək-tək sadalamaqla onların sayını yetmiş doqquza çatdırmaq mümkündür. ("Fəth əl-Bari", 1/73-74)

[1] Söhbət gediş-gəlişə əngəl törədən daş, odun, tikan və başqa bu kimi şeylərdən gedir.

[2] Həmin vaxt o adam mömin qardaşına həddən ziyadə həyalı olmağın nə cür fəsadlar törədəcəyini başa salırdı.

**[١٥٦] ٦٠–(٣٧)** حَدَّثَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى وَمُحَمَّدُ بْنُ بَشَّارٍ – وَاللَّفْظُ لاِبْنِ الْمُثَنَّى – قَالاَ: حَدَّثَنَا مُحَمَّدُ بْنُ جَعْفَرٍ: حَدَّثَنَا شُعْبَةُ عَنْ قَتَادَةَ قَالَ: سَمِعْتُ أَبَا السَّوَّارِ يُحَدِّثُ، أَنَّهُ سَمِعَ عِمْرَانَ بْنَ حُصَيْنٍ يُحَدِّثُ عَنْ النَّبِيِّ ﷺ أَنَّهُ قَالَ: ((الْحَيَاءُ لاَ يَأْتِي إِلاَّ بِخَيْرٍ)) فَقَالَ بُشَيْرُ بْنُ كَعْبٍ: إِنَّهُ مَكْتُوبٌ فِي الْحِكْمَةِ أَنَّ مِنْهُ وَقَارًا وَمِنْهُ سَكِينَةً. فَقَالَ عِمْرَانُ: أُحَدِّثُكَ عَنْ رَسُولِ اللَّهِ ﷺ وَتُحَدِّثُنِي عَنْ صُحُفِكَ؟

**[156]-60-(37)** ........ Əbu Səvvar demişdir: "(Bir dəfə) İmran ibn Husayn Peyğəmbərin ﷺ: "Həya insana ancaq xeyir gətirər"– dediyini xəbər verdi. (Bunu eşidəndə) Buşeyr ibn Kəb dedi: "Hikmətdə isə onun bir qisminin vüqar, bir qisminin də sükunət olduğu yazılmışdır". İmran dedi: "Mən sənə Peyğəmbərdən ﷺ hədis danışıram, sən isə mənə öz səhifələrindən danışırsan?!"

**[١٥٧] ٦١–(...)** حَدَّثَنَا يَحْيَى بْنُ حَبِيبٍ الْحَارِثِيُّ: حَدَّثَنَا حَمَّادُ بْنُ زَيْدٍ عَنْ إِسْحَقَ وَهُوَ ابْنُ سُوَيْدٍ؛ أَنَّ أَبَا قَتَادَةَ حَدَّثَ قَالَ: كُنَّا عِنْدَ عِمْرَانَ بْنِ حُصَيْنٍ فِي رَهْطٍ مِنَّا، وَفِينَا بُشَيْرُ بْنُ كَعْبٍ، فَحَدَّثَنَا عِمْرَانُ يَوْمَئِذٍ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((الْحَيَاءُ خَيْرٌ كُلُّهُ)) – قَالَ أَوْ قَالَ –: ((الْحَيَاءُ كُلُّهُ خَيْرٌ)) فَقَالَ بُشَيْرُ بْنُ كَعْبٍ: إِنَّا لَنَجِدُ فِي بَعْضِ الْكُتُبِ أَوْ الْحِكْمَةِ أَنَّ مِنْهُ سَكِينَةً وَوَقَارًا لِلَّهِ، – قَالَ – وَمِنْهُ ضَعْفٌ قَالَ: فَغَضِبَ عِمْرَانُ حَتَّى احْمَرَّتَا عَيْنَاهُ، وَقَالَ: أَلاَ أَرَانِي أُحَدِّثُكَ عَنْ رَسُولِ اللَّهِ ﷺ وَتُعَارِضُ فِيهِ؟ قَالَ فَأَعَادَ عِمْرَانُ الْحَدِيثَ، – قَالَ – فَأَعَادَ بُشَيْرٌ، فَغَضِبَ عِمْرَانُ – قَالَ –: فَمَا زِلْنَا نَقُولُ فِيهِ إِنَّهُ مِنَّا يَا أَبَا نُجَيْدٍ، إِنَّهُ لاَ بَأْسَ بِهِ.

**[157]-61-(...)** ........ Əbu Qətadə demişdir: "Biz öz camaatımızdan olan bir dəstə adamla birlikdə İmran ibn Husaynın yanında idik. Buşeyr ibn Kəb də aramızda idi. O gün İmran bizə bir hədis danışdı və dedi: "Peyğəmbər ﷺ: "Həya bütövlükdə xeyirdir"– demişdir, yaxud: "Həyanın hamısı xeyirdir[1]"– demişdir. Buşeyr ibn Kəb (buna etirazını bildirib) dedi: "Biz bəzi kitablarda və ya hikmətdə bunun bir qisiminin sükunət, bir qisiminin də Allah üçün vüqar olduğunu görürük, bunda zəiflik vardır". (Bunu eşidəndə) İmran qəzəbləndi, hətta gözləri qıpqırmızı oldu və dedi: "Mən sənə Peyğəmbərdən ﷺ hədis danışıram, sən isə buna etiraz edirsən?!" Sonra İmran bu hədisi təkrar danışdı, Buşeyr isə yenə öz bildiyini dedi. İmran yenə qəzəbləndi.

---

[1] Bəziləri həyanın bütövlükdə xeyir olub yalnız xeyir gətirdiyini inkar edirlər. Səbəbi də budur ki, həyalı adam hərdən haqqı deməyə utanır – insanlara yaxşı işlər görməyi buyurmur və onları pis işlərdən çəkindirmir. Amr ibn əs-Səlah bunu belə izah etmişdir: "Bu qeyd edilən naqis cəhətlər, əsil həya sayıla bilməz, əksinə, bu acizlik, zəlillik və alçalmaqdır. Sadəcə, zahirən həyaya bənzədiyindən, bəziləri onu həya adlandırmışlar. Əsil həya isə adamı pis iş tutmaqdan və haqsızlıq etməkdən çəkindirir".

Biz isə Buşeyr haqqında: "O bizdəndir, ey Əbu Nəcid![1] O, elə də pis adam deyildir"[2]- deyirdik.

**[١٥٨]** (...) حَدَّثَنَا إِسْحَقُ بْنُ إِبْرَاهِيمَ: أَخْبَرَنَا النَّضْرُ: حَدَّثَنَا أَبُو نَعَامَةَ الْعَدَوِيُّ قَالَ: سَمِعْتُ حُجَيْرَ بْنَ الرَّبِيعِ الْعَدَوِيَّ يَقُولُ عَنْ عِمْرَانَ بْنِ حُصَيْنٍ عَنْ النَّبِيِّ ﷺ نَحْوَ حَدِيثِ حَمَّادِ بْنِ زَيْدٍ.

**[158] (...)** ........ Əbu Nəamə əl-Ədəvi demişdir: "Huceyr ibn Rəbi əl-Ədəvi İmran ibn Husayndan, o da Peyğəmbərdən ﷺ rəvayət etdiyi hədis, Həmmad ibn Zeydin rəvayət etdiyi hədisə bənzəyir".

## (١٣) – بَابُ جَامِعِ أَوْصَافِ الإِسْلاَمِ

## 13-cü fəsil. İslamın vəsflərini cəm edən (xislət)

**[١٥٩] ٦٢-(٣٨)** حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ وَأَبُو كُرَيْبٍ قَالاَ: حَدَّثَنَا ابْنُ نُمَيْرٍ؛ ح: و حَدَّثَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ وَإِسْحَقُ بْنُ إِبْرَاهِيمَ، جَمِيعًا عَنْ جَرِيرٍ؛ ح: و حَدَّثَنَا أَبُو كُرَيْبٍ: حَدَّثَنَا أَبُو أُسَامَةَ، كُلُّهُمْ عَنْ هِشَامِ بْنِ عُرْوَةَ، عَنْ أَبِيهِ، عَنْ سُفْيَانَ بْنِ عَبْدِ اللَّهِ الثَّقَفِيِّ قَالَ: قُلْتُ: يَا رَسُولَ اللَّهِ! قُلْ لِي فِي الإِسْلاَمِ قَوْلاً لاَ أَسْأَلُ عَنْهُ أَحَدًا بَعْدَكَ – وَفِي حَدِيثِ أَبِي أُسَامَةَ: غَيْرَكَ قَالَ: ((قُلْ آمَنْتُ بِاللَّهِ ثُمَّ اسْتَقِمْ)).

**[159]-62-(38)** ........ Süfyan ibn Abdullah əs-Səqəfi ﵁ demişdir: "(Bir dəfə) mən (Peyğəmbərə ﷺ) dedim: "Ya Rəsulullah! İslam haqqında mənə elə bir söz söylə ki, artıq səndən sonra heç kəsdən bu haqda soruşmayım. (Əbu Usamənin hədisində: "səndən başqa" rəvayət edilmişdir)". Peyğəmbər ﷺ buyurdu: "Allaha iman gətirdim" de, sonra da düz yol tut![3]"

---

[1] Əbu Nəcid, İmran ibn Huseynin ﵁ kunyəsidir.

[2] Yəni o, münafiq, zındıq, bidət əhli və başqa bu kimi azğınlıqda olan kimsələrdən deyildir.

[3] Burada "düz yol tut" deyildikdə Allahın haqq məbud olduğunu qəbul edib heç bir şeyi Ona şərik qoşmamaq, habelə Onun buyurduqlarını yerinə yetirib qadağan etdiyi şeylərdən çəkinmək və ölənə qədər bu əqidədə qalmaq qəsd edilir. Belələrinin mükafatı Cənnətdir. Uca Allah buyurur: "**Şübhəsiz: "Rəbbimiz Allahdır!"– deyib sonra** (əməllərində) **düz olan kəslərə mələklər nazil olub** ***deyirlər:*** **"Qorxmayın və kədərlənməyin! Sizə vəd olunan Cənnətlə sevinin!"** (Fussilət, 30); **"Şübhəsiz: "Rəbbimiz Allahdır!"– deyib sonra düz yol tutan kəslərə heç bir qorxu yoxdur və onlar kədərlənməyəcəklər"** ("əl-Əhqaf" surəsi, 13).

## (١٤) – بَابُ بَيَانِ تَفَاضُلِ الإِسْلاَمِ وَأَيِّ أُمُورِهِ أَفْضَلُ

## 14-cü fəsil. İslam dininin üstünlüyünün və (bu dində olan) hansı işlərin ən fəzilətli olmasının bəyan edilməsi

**[١٦٠] ٦٣-(٣٩)** حَدَّثَنَا قُتَيْبَةُ بْنُ سَعِيد: حَدَّثَنَا لَيْثٌ؛ ح: و حَدَّثَنَا مُحَمَّدُ بْنُ رُمْحِ بْنِ الْمُهَاجِرِ: أَخْبَرَنَا اللَّيْثُ عَنْ يَزِيدَ بْنِ أَبِي حَبِيب، عَنْ أَبِي الْخَيْرِ، عَنْ عَبْدِ اللَّهِ بْنِ عَمْرٍو أَنَّ رَجُلاً سَأَلَ رَسُولَ اللَّهِ ﷺ: أَيُّ الإِسْلاَمِ خَيْرٌ؟ قَالَ: ((تُطْعِمُ الطَّعَامَ وَتَقْرَأُ السَّلاَمَ عَلَى مَنْ عَرَفْتَ وَمَنْ لَمْ تَعْرِفْ)).

**[160]-63-(39)** ........ Abdullah ibn Amr ﵄ rəvayət edir ki, bir nəfər Peyğəmbərdən ﷺ soruşdu: "İslam (xislətlərindən) ən xeyirlisi hansıdır?" Peyğəmbər ﷺ dedi: "Sənin, (ehtiyacı olana) yemək yedirtməyin, tanıdığına və tanımadığına salam verməyindir".[1]

**[١٦١] ٦٤-(٤٠)** و حَدَّثَنِي أَبُو الطَّاهِرِ أَحْمَدُ بْنُ عَمْرِو بْنِ عَبْدِ اللَّهِ بْنِ عَمْرِو بْنِ سَرْحٍ الْمِصْرِيُّ، أَخْبَرَنَا ابْنُ وَهْبٍ عَنْ عَمْرِو بْنِ الْحَارِث، عَنْ يَزِيدَ بْنِ أَبِي حَبِيب، عَنْ أَبِي الْخَيْرِ، أَنَّهُ سَمِعَ عَبْدَ اللَّهِ بْنَ عَمْرِو بْنِ الْعَاصِ يَقُولُ: إِنَّ رَجُلاً سَأَلَ رَسُولَ اللَّهِ ﷺ: أَيُّ الْمُسْلِمِينَ خَيْرٌ؟ فَقَالَ: ((مَنْ سَلِمَ الْمُسْلِمُونَ مِنْ لِسَانِهِ وَيَدِهِ)).

**[161]-64-(40)** ........ Abdullah ibn Amr ﵄ rəvayət edir ki, bir nəfər Peyğəmbərdən ﷺ soruşdu: "Hansı müsəlman daha xeyirlidir?" Peyğəmbər ﷺ buyurdu: "Dilindən və əlindən müsəlmanlara zərər dəyməyən (müsəlman)".

**[١٦٢] ٦٥-(٤١)** حَدَّثَنَا حَسَنٌ الْحُلْوَانِيُّ وَعَبْدُ بْنُ حُمَيْد، جَمِيعًا عَنْ أَبِي عَاصِمٍ – قَالَ عَبْدٌ: أَنْبَأَنَا أَبُو عَاصِمٍ – عَنِ ابْنِ جُرَيْجٍ أَنَّهُ سَمِعَ أَبَا الزُّبَيْرِ يَقُولُ: سَمِعْتُ جَابِرًا يَقُولُ: سَمِعْتُ النَّبِيَّ ﷺ يَقُولُ: ((الْمُسْلِمُ مَنْ سَلِمَ الْمُسْلِمُونَ مِنْ لِسَانِهِ وَيَدِهِ)).

**[162]-65-(41)** ........ Cabir ﵁ demişdir: "Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: "Müsəlman o kəsdir ki,[2] onun dilindən və əlindən başqa müsəlmanlara zərər dəyməsin".

---

[1] Yəni qarşına çıxan hər kəsə salam verməlisən. Yalnız tanıdığın adama salam vermək İslam əxlaqına zidd olan bir xasiyyətdir və Qiyamətin əlamətlərindəndir. Peyğəmbər ﷺ demişdir: "Birisinin ancaq tanıdığına salam verməsi Qiyamətin əlamətlərindəndir" ("Müsnəd Əhməd", 1/387; "Silsilətu Əhadis əs-Səhihə", 648). Hədisdə tanıdığına və tanımadığına salam ver deyildikdə əlbəttə ki, müsəlman cəmiyyəti nəzərdə tutulur. Belə ki, kafirlərə ümumiyyətlə salam vermək qadağan edilmişdir. Peyğəmbər ﷺ belə buyurmuşdur: "Yəhudilərə (və xristianlara) birinci salam verməyin. Əgər onlar sizə salam versələr, siz: "Və aleykum (sizə də olsun)!"– deyin" ("Ədəb əl-Müfrəd", 1102).

[2] Burada müsəlman deyildikdə kamil əxlaqlı müsəlman nəzərdə tutulur. Yoxsa, əli ilə və ya dili ilə müsəlman qardaşına əziyyət verən bir müsəlman, bu əməlinə görə kafir sayıla bilməz.

**[١٦٣] ٦٦-(٤٢)** و حَدَّثَنِي سَعِيدُ بْنُ يَحْيَى بْنِ سَعِيدٍ الْأُمَوِيُّ قَالَ: حَدَّثَنِي أَبِي: حَدَّثَنِي أَبُو بُرْدَةَ بْنُ عَبْدِ اللَّهِ بْنِ أَبِي بُرْدَةَ بْنِ أَبِي مُوسَى عَنْ أَبِي بُرْدَةَ، عَنْ أَبِي مُوسَى، قَالَ: قُلْتُ: يَا رَسُولَ اللَّهِ! أَيُّ الإِسْلَامِ أَفْضَلُ؟ قَالَ: ((مَنْ سَلِمَ الْمُسْلِمُونَ مِنْ لِسَانِهِ وَيَدِهِ)).

**[163]-66-(42)** ........ Əbu Musa[1] ﷺ demişdir: "Mən (Peyğəmbərdən ﷺ) soruşdum: "Ya Rəsulullah! Hansı İslam daha fəzilətli sayılır?" Dedi: "Dilindən və əlindən müsəlmanlara zərər dəyməyən (müsəlman)".

**[١٦٤]** و حَدَّثَنِيهِ إِبْرَاهِيمُ بْنُ سَعِيدٍ الْجَوْهَرِيُّ: حَدَّثَنَا أَبُو أُسَامَةَ قَالَ: حَدَّثَنِي بُرَيْدُ بْنُ عَبْدِ اللَّهِ بِهَذَا الإِسْنَادِ قَالَ: سُئِلَ رَسُولُ اللَّهِ ﷺ: أَيُّ الْمُسْلِمِينَ أَفْضَلُ؟ فَذَكَرَ مِثْلَهُ.

**[164]** ........ Əbu Usamə demişdir: "Bureyd ibn Abdullah eyni isnadla: "Peyğəmbərdən ﷺ soruşdu: "Hansı müsəlman daha fəzilətli sayılır?"– deyərək bu hədisin bənzərini rəvayət etmişdir.

## (١٥) – بَابُ بَيَانِ خِصَالٍ مَنْ اتَّصَفَ بِهِنَّ وَجَدَ حَلَاوَةَ الإِيمَانِ

## 15-ci fəsil. İmanın şirinliyini[2] dadmaq üçün əldə edilməsi gərəkli olan xislətlərin bəyan olunması

**[١٦٥] ٦٧-(٤٣)** حَدَّثَنَا إِسْحَقُ بْنُ إِبْرَاهِيمَ وَمُحَمَّدُ بْنُ يَحْيَى بْنِ أَبِي عُمَرَ وَمُحَمَّدُ بْنُ بَشَّارٍ، جَمِيعًا عَنْ الثَّقَفِيِّ – قَالَ ابْنُ أَبِي عُمَرَ: حَدَّثَنَا عَبْدُ الْوَهَّابِ – عَنْ أَيُّوبَ، عَنْ أَبِي قِلَابَةَ، عَنْ أَنَسٍ عَنْ النَّبِيِّ ﷺ قَالَ:

---

[1] Əbu Musa əl-Əşari ﷺ Peyğəmbərin ﷺ səhabəsidir. Adı Abdullah ibn Qeysdir. Ömər ibn Xəttabın xilafəti dövründə Bəsrə və Kufə şəhərlərinin valisi olmuşdur. Əbu Musa hicrətin 44-cü ilində vəfat etmişdir.

[2] Burada "imanın şirinliyi" deyildikdə (şəriətin) buyurduqlarını yerinə yetirməkdən zövq almaq, habelə Allahın və Onun rəsulunun rizasını qazanmaq məqsədilə məşəqqətlərə dözmək və bunu dünyanın naz-nemətindən üstün tutmaq, qulun öz Rəbbinə itaət etməklə və Onun əmrinə müxalif olan şeyləri tərk etməklə Onu sevməsi, həmçinin də Onun Peyğəmbərini ﷺ sevməsi qəsd edilir. Qazı İyad ﷺ demişdir: "Bu hədis: "Allahın Rəbb, İslamın din və Muhəmmədin peyğəmbər olduğundan razı qalan kimsə imanın tamını dadmış olar!" hədisinə bənzəyir. Belə ki, Allahı və Onun elçisini ﷺ sevmək, habelə bir kimsəni Allah üçün sevmək və küfrə qayıtmağı xoşlamamaq yalnız o adama nəsib ola bilər ki, onun imanı yəqinliyini artırmış, özünü arxayın salmış, qəlbini genişləndirmiş, canına və qanına keçmiş olsun. Bax beləsi imanın şirinliyini dadmış olar..."

((ثَلاَثٌ مَنْ كُنَّ فِيهِ وَجَدَ بِهِنَّ حَلاَوَةَ الإِيمَانِ، مَنْ كَانَ اللَّهُ وَرَسُولُهُ أَحَبَّ إِلَيْهِ مِمَّا سِوَاهُمَا، وَأَنْ يُحِبَّ الْمَرْءَ لاَ يُحِبُّهُ إِلاَّ لِلَّهِ، وَأَنْ يَكْرَهَ أَنْ يَعُودَ فِي الْكُفْرِ بَعْدَ أَنْ أَنْقَذَهُ اللَّهُ مِنْهُ، كَمَا يَكْرَهُ أَنْ يُقْذَفَ فِي النَّارِ)).

**[165]-67-(43)** ........ Ənəs ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Üç xislət vardır ki, bunlar kimdə olsa, o kimsə bu xislətlər sayəsində imanın şirinliyini dadmış olar: Allahı və Onun elçisini başqalarından daha çox sevmək[1], sevdiyi kimsəni yalnız Allah üçün sevmək, Allah onu küfrdən qurtardıqdan sonra yenidən küfrə qayıtmağı, oda atılmağı xoşlamadığı kimi, xoşlamamaq".

**[١٦٦] ٦٨**–(...) حَدَّثَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى وَابْنُ بَشَّارٍ قَالاَ: حَدَّثَنَا مُحَمَّدُ بْنُ جَعْفَرٍ: حَدَّثَنَا شُعْبَةُ قَالَ: سَمِعْتُ قَتَادَةَ يُحَدِّثُ عَنْ أَنَسٍ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((ثَلاَثٌ مَنْ كُنَّ فِيهِ وَجَدَ طَعْمَ الإِيمَانِ، مَنْ كَانَ يُحِبُّ الْمَرْءَ لاَ يُحِبُّهُ إِلاَّ لِلَّهِ، وَمَنْ كَانَ اللَّهُ وَرَسُولُهُ أَحَبَّ إِلَيْهِ مِمَّا سِوَاهُمَا، وَمَنْ كَانَ أَنْ يُلْقَى فِي النَّارِ أَحَبَّ إِلَيْهِ مِنْ أَنْ يَرْجِعَ فِي الْكُفْرِ بَعْدَ أَنْ أَنْقَذَهُ اللَّهُ مِنْهُ)).

**[166]-68-(...)** ........ Ənəs ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Kimdə bu üç xislət olsa, imanın tamını dadmış olar: sevdiyini ancaq Allah üçün sevmək, Allahı və Onun elçisini başqalarından daha çox sevmək, Allah onu küfrdən qurtardıqdan sonra atəşə atılmağı təkrar küfrə qayıtmaqdan üstün saymaq".

**[١٦٧]** (...) حَدَّثَنِي إِسْحَقُ بْنُ مَنْصُورٍ: أَنْبَأَنَا النَّضْرُ بْنُ شُمَيْلٍ: أَنْبَأَنَا حَمَّادٌ عَنْ ثَابِتٍ، عَنْ أَنَسٍ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ بِنَحْوِ حَدِيثِهِمْ، غَيْرَ أَنَّهُ قَالَ: ((مِنْ أَنْ يَرْجِعَ يَهُودِيًّا أَوْ نَصْرَانِيًّا)).

**[167] (...)** ........ Sabit (bu hədisi) Ənəsdən, o da Peyğəmbərdən ﷺ yuxarıdakı hədisə yaxın mənada rəvayət etmişdir. Fəqət (bu rəvayətdə): "(Allah onu küfrdən qurtardıqdan sonra oda atılmağı) yəhudi, yaxud nəsrani olmaqdan (üstün saymaq)"– deyilir.

[1] Yəni Allah və Onun rəsulu ona dünyada mövcud olan hər şeydən – canından, övladından, valideynindən, zövcəsindən və qeyrilərindən daha sevimli olarsa ("əl-Qovl əl-Mufid", 2/53); Hədisdə Allah və Onun rəsulu deyilir, Allah, sonra Onun rəsulu deyilmir. Çünki Peyğəmbəri ﷺ sevmək Pak və Uca Allahı sevməyə bağlıdır. İnsanın Allaha olan sevgisi artdıqca, Peyğəmbərə ﷺ olan sevgisi də artmalıdır ("Şərh Riyad əs-Salihin", 1/432); Belə ki, Allaha olan sevgi yalnız Peyğəmbəri ﷺ sevməklə təsdiq edilə bilər. Uca Allah buyurur: **"De: "Əgər siz Allahı sevirsinizsə, mənim ardımca gəlin ki, Allah da sizi sevsin və günahlarınızı bağışlasın. Allah Bağışlayandır, Rəhmlidir"** ("Ali-İmran" surəsi, 31).

## (١٦) – بَابُ وُجُوبِ مَحَبَّةِ رَسُولِ اللَّهِ ﷺ أَكْثَرَ مِنْ الأَهْلِ وَالْوَلَدِ وَالْوَالِدِ وَالنَّاسِ أَجْمَعِينَ وَإِطْلاَقِ عَدَمِ الإِيمَانِ عَلَى مَنْ لَمْ يُحِبُّهُ هَذِهِ الْمَحَبَّةِ

## 16-cı fəsil. Allahın elçisini ﷺ zövcədən, övladdan, valideyndən və bütün insanlardan daha çox sevməyin vacibliyi və onu bu sevgi ilə sevməyən kəsə imansız olduğu isnad edilməsi

**[١٦٨] ٦٩-(٤٤)** و حَدَّثَنِي زُهَيْرُ بْنُ حَرْبٍ: حَدَّثَنَا إِسْمَعِيلُ ابْنُ عُلَيَّةَ؛ ح: و حَدَّثَنَا شَيْبَانُ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا عَبْدُ الْوَارِثِ، كِلاَهُمَا عَنْ عَبْدِ الْعَزِيزِ، عَنْ أَنَسٍ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((لاَ يُؤْمِنُ عَبْدٌ – وَفِي حَدِيثِ عَبْدِ الْوَارِثِ الرَّجُلُ – حَتَّى أَكُونَ أَحَبَّ إِلَيْهِ مِنْ أَهْلِهِ وَمَالِهِ وَالنَّاسِ أَجْمَعِينَ)).

**[168]-69-(44)** ........ Ənəs ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Heç bir bəndə (Abdul-Varisin rəvayətində: heç bir adam) məni ailəsindən, malından və bütün insanlardan çox sevməyincə iman gətirmiş olmaz[1]".

**[١٦٩] ٧٠-(...)** حَدَّثَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى وَابْنُ بَشَّارٍ، قَالاَ: حَدَّثَنَا مُحَمَّدُ بْنُ جَعْفَرٍ: حَدَّثَنَا شُعْبَةُ قَالَ: سَمِعْتُ قَتَادَةَ يُحَدِّثُ عَنْ أَنَسِ بْنِ مَالِكٍ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((لاَ يُؤْمِنُ أَحَدُكُمْ حَتَّى أَكُونَ أَحَبَّ إِلَيْهِ مِنْ وَلَدِهِ وَوَالِدِهِ وَالنَّاسِ أَجْمَعِينَ)).

**[169]-70-(...)** ........ Ənəs ibn Malik ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Sizdən biriniz məni övladından, valideynindən və bütün insanlardan çox sevməyincə iman gətirmiş olmaz".

---

[1] İmam Əbu Süleyman əl-Xəttabi ﷺ demişdir: "Hədisin mənası belədir: "Mənə itaət etməyincə və axırı ölüm olsa belə mənim rizamı öz istəyindən üstün tutmayınca məni sevdiyini təsdiqləyə bilməzsən". İbn Bəttal, Qazı İyad və başqaları – Allah onların hamısına rəhmət eləsin! – demişlər: "Məhəbbət üç qisimdir:

– ehtiram və izzətlə bağlı olan məhəbbət. Buna valideyni sevməyi misal çəkmək olar;

– şəfqət və mərhəmətlə bağlı olan məhəbbət. Buna da övladı sevməyi misal çəkmək olar;

– oxşamaq və nəvazişlə bağlı olan məhəbbət. Buna da digər insanları sevməyi misal çəkmək olar..."

Qazı İyad ﷺ demişdir: "Peyğəmbərin ﷺ sünnəsinin yayılmasına kömək etmək, onun gətirdiyi şəriəti qorumaq, onunla birlikdə olmağı arzulamaq, canını və malını ona fəda etmək, onu sevmək deməkdir... Bu söylədiklərimiz aydın olduqdan sonra açıq-aydın görünür ki, həqiqi iman yalnız bu dediklərimiz sayəsində tamamlana bilər... Buna etiqad etməyən adam isə mömin sayılmaz".

## (١٧) – بَابُ الدَّلِيلِ عَلَى أَنَّ مِنْ خِصَالِ الإِيمَانِ أَنْ يُحِبَّ لأَخِيهِ الْمُسْلِمِ مَا يُحِبُّ لِنَفْسِهِ مِنَ الْخَيْرِ

## 17-ci fəsil. Özü üçün istədiyi xeyirdən müsəlman qardaşı üçün istəməyin iman xislətlərindən olmasına dair dəlil

**[١٧٠] ٧١–(٤٥)** حَدَّثَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى وَابْنُ بَشَّارٍ قَالاَ: حَدَّثَنَا مُحَمَّدُ بْنُ جَعْفَرٍ، أَخْبَرَنَا شُعْبَةُ قَالَ: سَمِعْتُ قَتَادَةَ يُحَدِّثُ عَنْ أَنَسِ بْنِ مَالِكٍ عَنْ النَّبِيِّ ﷺ قَالَ: ((لاَ يُؤْمِنُ أَحَدُكُمْ حَتَّى يُحِبَّ لأَخِيهِ أَوْ قَالَ لِجَارِهِ مَا يُحِبُّ لِنَفْسِهِ)).

**[170]-71-(45)** ........ Ənəs ibn Malik ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Biriniz özü üçün istədiyini (müsəlman) qardaşı üçün (yaxud qonşusu üçün) istəmədikcə iman etmiş olmaz[1]".

**[١٧١] ٧٢–(...)** و حَدَّثَنِي زُهَيْرُ بْنُ حَرْبٍ: حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ عَنْ حُسَيْنٍ الْمُعَلِّمِ، عَنْ قَتَادَةَ، عَنْ أَنَسٍ عَنْ النَّبِيِّ ﷺ قَالَ: ((وَالَّذِي نَفْسِي بِيَدِهِ لاَ يُؤْمِنُ عَبْدٌ حَتَّى يُحِبَّ لِجَارِهِ أَوْ قَالَ لأَخِيهِ مَا يُحِبُّ لِنَفْسِهِ)).

**[171]-72-(...)** ........ Ənəs ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Canım Əlində olan *Allaha* and olsun ki, heç bir bəndə özü üçün istədiyini qonşusu üçün (yaxud qardaşı üçün) istəmədikcə iman etmiş olmaz".

## (١٨) – بَابُ بَيَانِ تَحْرِيمِ إِيذَاءِ الْجَارِ

## 18-ci fəsil. Qonşuya əziyyət verməyin haram olmasının bəyan edilməsi

**[١٧٢] ٧٣–(٤٦)** حَدَّثَنَا يَحْيَى بْنُ أَيُّوبَ وَقُتَيْبَةُ بْنُ سَعِيدٍ وَعَلِيُّ بْنُ حُجْرٍ، جَمِيعًا عَنْ إِسْمَعِيلَ بْنِ جَعْفَرٍ– قَالَ ابْنُ أَيُّوبَ: حَدَّثَنَا إِسْمَعِيلُ – قَالَ: أَخْبَرَنِي الْعَلاَءُ عَنْ أَبِيهِ، عَنْ أَبِي هُرَيْرَةَ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: ((لاَ يَدْخُلُ الْجَنَّةَ مَنْ لاَ يَأْمَنُ جَارُهُ بَوَائِقَهُ)).

---

[1] Alimlər demişlər: "Hədisdə söhbət kamil imandan gedir. Belə ki, bu əxlaqa sahib olmayan mömin kafir sayılmır. (Sadəcə olaraq imanı naqis olur). Və burada "qardaşı üçün istəmədikcə" deyildikdə xeyirli və mübah şeylər nəzərdə tutulur. Buna da Nəsainin rəvayət etdiyi hədisi dəlil göstərmək olar. Həmin hədisdə Peyğəmbər ﷺ belə buyurmuşdur: "Biriniz özü üçün istədiyi xeyri (müsəlman) qardaşı üçün istəmədikcə iman etmiş olmaz" ("Sunən ən-Nəsai", 6/534).

İbn Həcər "Fəth əl-Bari" əsərində Kərmaninin belə dediyini nəql etmişdir: "Həmçinin birinin özü üçün istəmədiyi şəri (müsəlman) qardaşı üçün istəməməsi də imandandır. Peyğəmbər ﷺ hədisdə bunu qeyd etməmişdir. Məlumdur ki, bir şeyi sevmək onun əksini sevməməyi tələb edir. Elə bu səbəbdən də Peyğəmbər ﷺ "istədiyi" sözü ilə kifayətlənmişdir" 1/20.

**[172]-73-(46)** ........ Əbu Hureyrə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Qonşusu, şərindən və zülmündən əmin olmayan kimsə Cənnətə girməz[1]”.

## (١٩) – بَابُ الْحَثِّ عَلَى إِكْرَامِ الْجَارِ وَالضَّيْفِ وَلُزُومِ الصَّمْتِ إِلاَّ عَنْ الْخَيْرِ وَكَوْنِ ذَلِكَ كُلِّهِ مِنْ الإِيمَانِ

## 19-cu fəsil. Qonşuya və qonağa qayğı göstərməyə həvəsləndirmək, xeyir söyləmək istisna olmaqla susmağın vacib olması və bütün bunların imandan olması

**[١٧٣] ٧٤-(٤٧)** حَدَّثَنِي حَرْمَلَةُ بْنُ يَحْيَى: أَنْبَأَنَا ابْنُ وَهْبٍ قَالَ: أَخْبَرَنِي يُونُسُ عَنْ ابْنِ شِهَابٍ، عَنْ أَبِي سَلَمَةَ بْنِ عَبْدِ الرَّحْمَنِ، عَنْ أَبِي هُرَيْرَةَ عَنْ رَسُولِ اللَّهِ ﷺ قَالَ: ((مَنْ كَانَ يُؤْمِنُ بِاللَّهِ وَالْيَوْمِ الآخِرِ فَلْيَقُلْ خَيْرًا أَوْ لِيَصْمُتْ، وَمَنْ كَانَ يُؤْمِنُ بِاللَّهِ وَالْيَوْمِ الآخِرِ فَلْيُكْرِمْ جَارَهُ، وَمَنْ كَانَ يُؤْمِنُ بِاللَّهِ وَالْيَوْمِ الآخِرِ فَلْيُكْرِمْ ضَيْفَهُ)).

**[173]-74-(47)** ........ Əbu Hureyrə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurmuşdur: “Kim Allaha və Axirət gününə inanırsa, ya xeyir danışsın, ya da sussun.[2] Kim Allaha və Axirət gününə inanırsa, qonşusuna qayğı göstərsin. Kim Allaha və Axirət gününə inanırsa, qonağına yaxşı baxsın[3]”.

---

[1] İmam Nəvəvi demişdir: “Hədisdə keçən “Cənnətə girməz” sözü iki cür izah edilə bilər:

– birincisi budur ki, bu, qonşuya əziyyət verməyin haram olduğunu bilə-bilə bu yaramaz əməli halal sayan kimsəyə aiddir. (Allahın və Onun peyğəmbərinin ﷺ haram buyurduğunu halal sayan) adam isə kafir sayılır və beləsi Cənnətə əsla girməyəcək.

– ikincisi də budur ki, o, Cənnətin qapıları açıldığı zaman oraya ilk əvvəl daxil olacaq kimsələrlə birgə daxil olmayacaq, əksinə, bir müddət məhşərdə saxlanılacaq. Bundan sonra o, ya cəzalandırılacaq, ya da Allah ona rəhm edəcək və beləliklə də o, Cənnətə daxil olacaq.

Haqq yolu tutub gedənlərin bu etiqadda olduğuna görə biz hədisi bu şəkildə izah etdik. Əvvəldə qeyd etmişdik ki, haqq əhlinin etiqadına görə günah işlər görmüş və tövhid üzərində dünyasını dəyişmiş hər kəs Uca Allahın istəyi altındadır. İstər onu bağışlar və Cənnətə daxil edər, istərsə də, əvvəlcə cəzalandırar, sonra Cənnətə daxil edər”.

[2] Ömər ibn Abdul-Aziz ﷺ demişdir: “Hər kim danışdığı sözün etdiyi əməllərə aid olduğunu hesab edərsə, ancaq özünə aid olan sözləri dilinə gətirər” (“Tarix Dəməşq”, 48/117).

[3] Qazı İyad ﷺ demişdir: “İslam ayinlərini yerinə yetirən hər kəsə qonşusuna və qonağına yaxşılıq etmək gərəkdir. Qonşunun haqlarını ödəmək və bu hüquqları qorumaq müsəlmanın borcudur. Bu xüsusda Uca Allah Qurani Kərimdə belə buyurur: **“Allaha ibadət edin və heç bir şeyi Ona şərik qoşmayın! Valideynlərə, qohum-əqrəbaya, yetimlərə, kasıblara, yaxın və**

**[١٧٤] ٧٥**-(...) حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا أَبُو الأَحْوَصِ عَنْ أَبِي حُصَيْنٍ، عَنْ أَبِي صَالِحٍ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((مَنْ كَانَ يُؤْمِنُ بِاللَّهِ وَالْيَوْمِ الآخِرِ فَلاَ يُؤْذِي جَارَهُ، وَمَنْ كَانَ يُؤْمِنُ بِاللَّهِ وَالْيَوْمِ الآخِرِ فَلْيُكْرِمْ ضَيْفَهُ، وَمَنْ كَانَ يُؤْمِنُ بِاللَّهِ وَالْيَوْمِ الآخِرِ فَلْيَقُلْ خَيْرًا أَوْ لِيَسْكُتْ)).

**[174]-75-(...)** ........ Əbu Hureyrə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Kim Allaha və Axirət gününə inanırsa, qonşusuna əziyyət verməsin. Kim Allaha və Axirət gününə inanırsa, qonağına yaxşı baxsın. Kim Allaha və Axirət gününə inanırsa, ya xeyir danışsın, ya da sussun".

**[١٧٥] ٧٦**-(...) و حَدَّثَنَا إِسْحَقُ بْنُ إِبْرَاهِيمَ: أَخْبَرَنَا عِيسَى بْنُ يُونُسَ عَنْ الأَعْمَشِ، عَنْ أَبِي صَالِحٍ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ، بِمِثْلِ حَدِيثِ أَبِي حَصِينٍ، غَيْرَ أَنَّهُ قَالَ: ((فَلْيُحْسِنْ إِلَى جَارِهِ)).

**[175]-76-(...)** ........ Aməş (bu hədisi) Əbu Salehdən, o da Əbu Hureyrədən, o da Peyğəmbərdən ﷺ, Əbu Həsinin hədisinə yaxın mənada rəvayət etmişdir. Fəqət (bu rəvayətdə): "Qonşusu ilə yaxşı rəftar etsin"– deyilir.

**[١٧٦] ٧٧**-(٤٨) حَدَّثَنَا زُهَيْرُ بْنُ حَرْبٍ وَمُحَمَّدُ بْنُ عَبْدِ اللَّهِ بْنِ نُمَيْرٍ، جَمِيعًا عَنْ ابْنِ عُيَيْنَةَ – قَالَ ابْنُ نُمَيْرٍ: حَدَّثَنَا سُفْيَانُ – عَنْ عَمْرٍو أَنَّهُ سَمِعَ نَافِعَ بْنَ جُبَيْرٍ يُخْبِرُ عَنْ أَبِي شُرَيْحٍ الْخُزَاعِيِّ، أَنَّ النَّبِيَّ ﷺ قَالَ: ((مَنْ كَانَ يُؤْمِنُ بِاللَّهِ وَالْيَوْمِ الآخِرِ فَلْيُحْسِنْ إِلَى جَارِهِ، وَمَنْ كَانَ يُؤْمِنُ بِاللَّهِ وَالْيَوْمِ الآخِرِ فَلْيُكْرِمْ ضَيْفَهُ، وَمَنْ كَانَ يُؤْمِنُ بِاللَّهِ وَالْيَوْمِ الآخِرِ فَلْيَقُلْ خَيْرًا أَوْ لِيَسْكُتْ)).

**[176]-77-(48)** ........ Əbu Şureyh əl-Xuzai[1] ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Kim Allaha və Axirət gününə inanırsa, qonşusu ilə yaxşı rəftar etsin. Kim Allaha və Axirət gününə inanırsa, qonağına yaxşı baxsın. Kim Allaha və Axirət gününə inanırsa, ya xeyir danışsın, ya da sussun".

---

**uzaq qonum-qonşuya, yol yoldaşına, müsafirə və sahib olduğunuz** ***kölə və kənizlərə*** **yaxşılıq edin! Həqiqətən, Allah lovğalıq edənləri və özünü öyənləri sevmir"** ("ən-Nisa" surəsi, 36). Peyğəmbər ﷺ də hədisdə belə buyurmuşdur: "Cəbrail qonşu haqqında mənə o qədər tövsiyə etdi ki, qonşuya da mirasdan pay düşəcəyini güman etdim" ("Səhih əl-Buxari", 6014).

Həmçinin qonaqpərvər olmaq İslam ədəb-ərkanına, peyğəmbərlərin və əməlisaleh insanların əxlaqına aid olan əməllərdəndir..."

[1] Əbu Şureyh əl-Xuzai ﷺ Peyğəmbərin ﷺ səhabəsidir. Adı: Xuveylid ibn Amrdır. Məkkənin fəthi günü İslamı qəbul etmişdir. Əbu Şureyh hicrətin 68-ci ilində vəfat etmişdir.

## (٢٠) – بَابُ بَيَانِ كَوْنِ النَّهْيِ عَنْ الْمُنْكَرِ مِنْ الإِيمَانِ وَأَنَّ الإِيمَانَ يَزِيدُ وَيَنْقُصُ وَأَنَّ الأَمْرَ بِالْمَعْرُوفِ وَالنَّهْيَ عَنْ الْمُنْكَرِ وَاجِبَانِ

## 20-ci fəsil. Pis işləri qadağan etməyin imandan olmasının, imanın artıb azalmasının, habelə yaxşı işləri əmr etməyin və pis işlərdən çəkindirməyin vacib olmasının bəyan edilməsi

**[١٧٧] ٧٨-(٤٩)** حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا وَكِيعٌ عَنْ سُفْيَانَ؛ ح: و حَدَّثَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى: حَدَّثَنَا مُحَمَّدُ بْنُ جَعْفَرٍ: حَدَّثَنَا شُعْبَةُ كِلاَهُمَا عَنْ قَيْسِ بْنِ مُسْلِمٍ، عَنْ طَارِقِ بْنِ شِهَابٍ، وَهَذَا حَدِيثُ أَبِي بَكْرٍ قَالَ: أَوَّلُ مَنْ بَدَأَ بِالْخُطْبَةِ يَوْمَ الْعِيدِ قَبْلَ الصَّلاَةِ مَرْوَانُ، فَقَامَ إِلَيْهِ رَجُلٌ فَقَالَ: الصَّلاَةُ قَبْلَ الْخُطْبَةِ، فَقَالَ: قَدْ تُرِكَ مَا هُنَالِكَ. فَقَالَ أَبُو سَعِيدٍ: أَمَّا هَذَا فَقَدْ قَضَى مَا عَلَيْهِ، سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ: ((مَنْ رَأَى مِنْكُمْ مُنْكَرًا فَلْيُغَيِّرْهُ بِيَدِهِ، فَإِنْ لَمْ يَسْتَطِعْ فَبِلِسَانِهِ، فَإِنْ لَمْ يَسْتَطِعْ فَبِقَلْبِهِ، وَذَلِكَ أَضْعَفُ الإِيمَانِ)).

**[177]-78-(49)** ....... Tariq ibn Şihab demişdir: "Bayram günü xütbəni namazdan əvvəl oxuyanların birincisi Mərvan olmuşdur.[1] (O belə etdikdə) bir nəfər ayağa qalxıb ona: "Namaz xütbədən öncə olmalıdır"– deyə (etirazını bildirdi). Mərvan isə belə cavab verdi: "Bu artıq tərk olunmuşdur". (Bunu eşidəndə) Əbu Səid dedi: "Bu (adam) öz öhdəsinə düşəni yerinə yetirdi. Mən Peyğəmbərin ﷺ belə buyurduğunu eşitmişəm: "Sizdən biriniz günah edildiyini görsə, bunu əli ilə düzəltsin,[2]

---

[1] Əlbəttə ki, bu hadisədə Mərvan ibn Həkəm xətaya yol vermişdir. Çünki həm Peyğəmbər ﷺ, həm Əbu Bəkr, həm Ömər, həm Osman, həm də Əli – Allah onların hamısından razı olsun! – bayram xütbəsini namazdan sonra oxuyardılar. Əbu Səid əl-Xudri demişdir: "Mən Mədinənin əmiri Mərvanla birlikdə Orucluq ya da Qurban bayramında namaz qılınan yerə gəlib çatdıqda mən Kəsir ibn Səltin düzəltdiyi minbəri gördüm və bir də baxdım ki, Mərvan namazı qılmamış minbərə qalxmaq istəyir. Mən onun ətəyindən dartdım, lakin o ətəyini dartıb (əlimdən aldı) və (minbərə) qalxıb namazdan əvvəl xütbə verdi. Mən ona dedim: "Vallahi, siz (sünnəni) dəyişdirdiniz!" O isə belə cavab verdi: "Ey Əbu Səid, sənin bildiyin keçmişdə qalmışdır." Mən dedim: "Vallahi, mənim bildiyim, bilmədiyimdən daha xeyirlidir" ("Səhih əl-Buxari", 956).

[2] İbn Qeyyim əl-Covzi münkəri inkar etmək (yəni pis işlərdən çəkindirmək) xüsusunda belə demişdir: "Münkəri inkar etməyin dörd yolu vardır:

– münkərin aradan qaldırılması və yerinə sünnənin bərpa edilməsi;

– münkər tamamilə aradan qaldırılmasa da, onun qismən də olsa azalması;

– münkərin yerini onun bənzərinin tutması;

– münkərin yerinə ondan da pis münkərin gəlməsi.

Bunlardan əvvəlki ikisini yerinə yetirmək vacib, üçüncüsü ictihadi məsələ, dördüncüsünü etmək isə haramdır".

bacarmasa, dili ilə (düzəltsin), bunu da bacarmasa, qəlbi ilə (buna nifrət etsin), bu da imanın ən zəifidir"[1].

**[١٧٨] ٧٩**–(...) حَدَّثَنَا أَبُو كُرَيْبٍ مُحَمَّدُ بْنُ الْعَلاَءِ: حَدَّثَنَا أَبُو مُعَاوِيَةَ: حَدَّثَنَا الأَعْمَشُ عَنْ إِسْمَعِيلَ بْنِ رَجَاءٍ، عَنْ أَبِيهِ، عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ – وَعَنْ قَيْسِ بْنِ مُسْلِمٍ، عَنْ طَارِقِ بْنِ شِهَابٍ، عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ – فِي قِصَّةِ مَرْوَانَ، وَحَدِيثِ أَبِي سَعِيدٍ عَنْ النَّبِيِّ ﷺ، بِمِثْلِ حَدِيثِ شُعْبَةَ وَسُفْيَانَ.

---

[1] İnsanlara yaxşı işləri əmr etmək və onları pis işlərdən çəkindirmək hamıya vacib deyildir. Və əgər bəzi adamlar (alimlər, ziyalılar, ixtiyar sahibləri və s.) bunu yerinə yetirsələr, yerdə qalanların üzərindən məsuliyyət götürülər. Yox əgər heç kəs buna qol qoymasa (Allahın qayda-qanunlarını yer üzündə tətbiq etməyə çalışmasa), əlində ixtiyar olan hər kəs günah qazanar və onlardan heç bir üzr qəbul edilməz. Demək, adam ərki çatdığı birisinin günah etdiyini gördüyü zaman bunu ona qadağan etməlidir. Məsələn, adam öz zövcəsinin, yaxud övladının, yaxud xidmətçisinin düz hərəkət eləmədiyini görsə, onu başa salmalı və bunun qarşısını almalıdır...

Alimlər demişlər ki: "Yaxşı işləri əmr edən və pis işlərdən çəkindirən adamın kamil insan olması, əmr etdiyi şeyə özünün də əməl etməsi və qadağan etdiyi şeydən özünün də çəkinməsi şərt deyil, əksinə, ixtiyar sahibi yaxşı işləri əmr etməli və pis işlərdən çəkindirməlidir.... Biləsiniz ki, yaxşı işləri əmr etmək və pis işlərdən çəkindirmək təkcə ixtiyar sahiblərinə aid deyildir, əksinə, bu, hər bir müsəlmanın öhdəsinə düşən bir işdir. Həmçinin qeyd etmək lazımdır ki, bu işi yalnız savadı olan şəxslər yerinə yetirməlidir. Namaz, oruc və başqa bu kimi vacibliyi hamıya bəlli olan, habelə zina etmək, içki içmək və başqa bu kimi haramlığı hamıya bəlli olan işlərdə xüsusi savadın olmasına lüzum yoxdur və hər bir müsəlman bu cür məsələlərdə alim sayılır. İncə və qəliz məsələlərə avam adamların münasibət bildirməsi və münkəri inkar etməsi isə yersizdir. Əksinə, bunu etmək alimlərin öhdəsinə düşür...

Günah işlər və yaramaz əməllər çoxaldığı zaman (ağıllı adamlar) zalımları pis əməllərdən çəkindirməsələr, Allahın göndərdiyi bəla hamını bürüyər. Uca Allah buyurur: **"Qoy Peyğəmbərin əmrinə qarşı çıxanlar başlarına bir bəla gəlməsindən, yaxud özlərinə ağrılı-acılı bir əzab üz verməsindən qorxsunlar"** "(ən-Nur" surəsi, 64). Axirəti və Allahın rizasına qazanmaq istəyən kimsə bu məsələlərə diqqət yetirməlidir... (Belə olduğu təqdirdə Allah da onun köməyində olar.) Uca Allah buyurur: **"Allah Ona yardım edənlərə, mütləq yardım edər"** ("əl-Həcc" surəsi, 40); həmçinin buyurur: **"Kim Allaha möhkəm bağlanarsa, həqiqətən də, doğru yola yönəlmiş olar"** ("Ali-İmran" surəsi, 101); həmçinin buyurur: **"Uğrumuzda cihad edənləri mütləq Öz yolumuza yönəldəcəyik"** ("əl-Ənkəbut" surəsi, 69); həmçinin buyurur: **"İnsanlar elə güman edirlər ki, təkcə: "İman gətirdik!"– demələri ilə onlardan əl çəkiləcək və onlar imtahan edilməyəcəklər? Biz onlardan öncəkiləri də sınaqdan keçirmişdik. Sözsüz ki, Allah doğru danışanları da, yalançıları da aşkara çıxardacaqdır"** ("əl-Ənkəbut" surəsi, 2-3)" (Nəvəvi, 1/213-214).

Bu xüsusda Peyğəmbər ﷺ demişdir: "Allahın qoyduğu hüdudları qoruyanların və onu aşanların halı, gəmiyə minmək üçün püşk atdıqdan sonra bir qismi gəminin göyərtəsinə, digərləri də gəminin aşağı mərtəbəsində yerləşmiş bir toplumun halına bənzəyir. (Onlar dənizdə olduqları zaman) aşağıdakılar su istədikdə gəminin göyərtəsinə qalxıb yuxarıdakıların arasından keçir (və onları narahat edirlər). Onda aşağıdakılar deyirlər: "Gəlin, gəmini deşib buradan su götürək və yuxarıdakılara əziyyət verməyək." Əgər yuxarıdakılar onların özbaşınalıq etməsinə göz yumsalar, (gəmi batacaq və) hamısı həlak olacaq; yox əgər bunun qarşısını alsalar, onda həm özləri, həm də aşağıdakılar xilas olacaqlar" ("Səhih əl-Buxari", 2493).

Hədisdə: "bu da imanın ən zəifidir" deyildikdə səmərəsi və savabı ən az olanı qəsd edilir.

**[178]-79-(...)** ........ Ravi ayrı-ayrı isnadlarla Əbu Səid əl-Xudridən Mərvanın hekayəsini, həmçinin Əbu Səidin Peyğəmbərdən ﷺ rəvayət etdiyi hədisi Şobənin və Süfyanın hədislərinə yaxın mənada rəvayət etmişdir.

**[١٧٩] ٨٠-(٥٠)** حَدَّثَنِي عَمْرٌو النَّاقِدُ وَأَبُو بَكْرِ بْنُ النَّضْرِ وَعَبْدُ بْنُ حُمَيْدٍ - وَاللَّفْظُ لِعَبْدٍ – قَالُوا: حَدَّثَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ بْنِ سَعْدٍ قَالَ: حَدَّثَنِي أَبِي عَنْ صَالِحِ بْنِ كَيْسَانَ، عَنْ الْحَارِثِ، عَنْ جَعْفَرِ بْنِ عَبْدِ اللَّهِ بْنِ الْحَكَمِ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ الْمِسْوَرِ، عَنْ أَبِي رَافِعٍ، عَنْ عَبْدِ اللَّهِ بْنِ مَسْعُودٍ، أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: ((مَا مِنْ نَبِيٍّ بَعَثَهُ اللَّهُ فِي أُمَّةٍ قَبْلِي، إِلاَّ كَانَ لَهُ مِنْ أُمَّتِهِ حَوَارِيُّونَ وَأَصْحَابٌ يَأْخُذُونَ بِسُنَّتِهِ وَيَقْتَدُونَ بِأَمْرِهِ، ثُمَّ إِنَّهَا تَخْلُفُ مِنْ بَعْدِهِمْ خُلُوفٌ يَقُولُونَ مَا لاَ يَفْعَلُونَ، وَيَفْعَلُونَ مَا لاَ يُؤْمَرُونَ، فَمَنْ جَاهَدَهُمْ بِيَدِهِ فَهُوَ مُؤْمِنٌ، وَمَنْ جَاهَدَهُمْ بِلِسَانِهِ فَهُوَ مُؤْمِنٌ، وَمَنْ جَاهَدَهُمْ بِقَلْبِهِ فَهُوَ مُؤْمِنٌ، وَلَيْسَ وَرَاءَ ذَلِكَ مِنْ الإِيمَانِ حَبَّةُ خَرْدَلٍ)).

قَالَ أَبُو رَافِعٍ: فَحَدَّثْتُ عَبْدَ اللَّهِ بْنَ عُمَرَ فَأَنْكَرَهُ عَلَيَّ، فَقَدِمَ ابْنُ مَسْعُودٍ، فَنَزَلَ بِقَنَاةَ، فَاسْتَتْبَعَنِي إِلَيْهِ عَبْدُ اللَّهِ بْنُ عُمَرَ يَعُودُهُ، فَانْطَلَقْتُ مَعَهُ، فَلَمَّا جَلَسْنَا سَأَلْتُ ابْنَ مَسْعُودٍ عَنْ هَذَا الْحَدِيثِ، فَحَدَّثَنِيهِ كَمَا حَدَّثْتُهُ ابْنَ عُمَرَ.

قَالَ صَالِحٌ وَقَدْ تُحُدِّثَ بِنَحْوِ ذَلِكَ عَنْ أَبِي رَافِعٍ.

**[179]-80-(50)** ........ Abdullah ibn Məsud ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Allahın məndən əvvəlki ümmətlərə göndərdiyi hər bir peyğəmbərin öz ümmətindən onun sünnəsinə[1] sarılan və əmrlərinə uyan ən yaxın sirdaşları və səhabələri olmuşdur. Onların ardından isə etməyəcəkləri şeyləri danışan və əmr olunmadıqları işləri görən xələflər gəlmişdir (və gələcək də). Kim bunlarla əli ilə mübarizə apararsa, (bilsin ki,) o, mömindir. Kim onlarla dili ilə mübarizə apararsa, o da mömindir. Kim onlara qəlbi ilə nifrət edərsə, o da mömindir. Ancaq bundan o yana imandan bir xardal dənəsi belə yoxdur[2]".

Əbu Rafi demişdir: "Mən bu hədisi Abdullah ibn Ömərə danışdım, lakin o, bunu mənə qadağan etdi. (Çox keçmədən) ibn Məsud (Mədinəyə) gəldi və Qənat vadisində dayandı. Abdullah ibn Ömər onu ziyarət etməyə getdikdə, məni də özü ilə aparmaq istədi, mən də onunla getdim. Biz (orada) oturduğu-

---

[1] Sünnə – yol deməkdir. Peyğəmbərin ﷺ sünnəsi deyildikdə onun buyurduqları, əmr və qadağaları, habelə onun etdiyi əməllər, davranışı, əxlaqı, zahiri görünüşü nəzərdə tutulur. Bundan başqa məcburi olmayan və yerinə yetirilməməsinə görə müsəlman üçün cəza nəzərdə tutulmayan göstəriş və tövsiyələrə də sünnə deyilir.

[2] Yəni bundan o yana imanın heç bir mərtəbəsi mövcud deyildir. Belə ki, münkəri qəlbi ilə inkar etməyən adam onu bəyənmiş kimsələrədən hesab edilir, onu bəyənmək isə küfr sayılır. ("Mişkat əl-Məsabih", 1/603).

muz zaman mən ibn Məsuddan bu hədis barədə soruşdum, o da hədisi mənə, mən onu İbn Ömərə danışdığım kimi danışdı".

(Ravi) Saleh ibn Qeys demişdir: "Əbu Rafidən bu cür rəvayət edilmişdir".

**[١٨٠]** (...) و حَدَّثَنِيهِ أَبُو بَكْرِ بْنُ إِسْحَقَ بْنِ مُحَمَّدٍ: أَخْبَرَنَا ابْنُ أَبِي مَرْيَمَ: حَدَّثَنَا عَبْدُ الْعَزِيزِ بْنُ مُحَمَّدٍ قَالَ: حَدَّثَنِي الْحَارِثُ بْنُ الْفُضَيْلِ الْخَطْمِيُّ عَنْ جَعْفَرِ بْنِ عَبْدِ اللَّهِ بْنِ الْحَكَمِ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ الْمِسْوَرِ بْنِ مَخْرَمَةَ، عَنْ أَبِي رَافِعٍ مَوْلَى النَّبِيِّ ﷺ، عَنْ عَبْدِ اللَّهِ بْنِ مَسْعُودٍ: أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: ((مَا كَانَ مِنْ نَبِيٍّ إِلاَّ وَ[قَدْ] كَانَ لَهُ حَوَارِيُّونَ يَهْتَدُونَ بِهَدْيِهِ وَيَسْتَنُّونَ بِسُنَّتِهِ)) مِثْلَ حَدِيثِ صَالِحٍ، وَلَمْ يَذْكُرْ قُدُومَ ابْنِ مَسْعُودٍ، وَاجْتِمَاعِ ابْنِ عُمَرَ مَعَهُ.

**[180] (...)** ........ Abdullah ibn Məsud ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Hər bir peyğəmbərin öz yolunu tutub gedən və sünnəsinə sarılan ən yaxın sirdaşları olmuşdur".

Bu hədis Saleh (ibn Keysanın) hədisi kimidir. Fəqət Əbu Rafi bu hədisdə ibn Məsudun gəldiyini və ibn Ömərin onunla görüşməsini söyləməmişdir.

## (٢١) – بَابُ تَفَاضُلِ أَهْلِ الإِيمَانِ فِيهِ وَرُجْحَانِ أَهْلِ الْيَمَنِ فِيهِ

## 21-ci fəsil. Möminlərin imanda bir-birindən üstün olması və Yəmən əhlinin daha imanlı olması

**[١٨١] ٨١–(٥١)** حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا أَبُو أُسَامَةَ؛ ح: و حَدَّثَنَا ابْنُ نُمَيْرٍ: حَدَّثَنَا أَبِي؛ ح: و حَدَّثَنَا أَبُو كُرَيْبٍ، حَدَّثَنَا ابْنُ إِدْرِيسَ، كُلُّهُمْ عَنْ إِسْمَعِيلَ بْنِ أَبِي خَالِدٍ؛ ح: و حَدَّثَنَا يَحْيَى بْنُ حَبِيبٍ الْحَارِثِيُّ – وَاللَّفْظُ لَهُ –: حَدَّثَنَا مُعْتَمِرٌ عَنْ إِسْمَعِيلَ قَالَ: سَمِعْتُ قَيْسًا يَرْوِي عَنْ أَبِي مَسْعُودٍ قَالَ: أَشَارَ النَّبِيُّ ﷺ بِيَدِهِ نَحْوَ الْيَمَنِ فَقَالَ: ((أَلاَ إِنَّ الإِيمَانَ هَهُنَا، وَإِنَّ الْقَسْوَةَ وَغِلَظَ الْقُلُوبِ فِي الْفَدَّادِينَ عِنْدَ أُصُولِ أَذْنَابِ الإِبِلِ، حَيْثُ يَطْلُعُ قَرْنَا الشَّيْطَانِ، فِي رَبِيعَةَ وَمُضَرَ)).

**[181]-81-(51)** ........ Əbu Məsud[1] ﷺ demişdir: "(Bir dəfə) Peyğəmbər ﷺ əli ilə Yəmənə tərəf işarə edib dedi: "Biləsiniz, həqiqətən, iman bax oradadır.[2] Daş-

[1] Əbu Məsud əl-Ənsari ﷺ Peyğəmbərin ﷺ səhabəsidir. Adı: Uqbə ibn Amrdır. Əbu Məsud hicrətin 40-cı ilində vəfat etmişdir.

[2] Burada yəmənlilərin iman əhli olduğu nəzərdə tutulur. Lakin qeyd etmək lazımdır ki, bu, yalnız yəmənlilərin iman əhli olduğuna dəlalət etmir. Belə ki, başqa bir hədisdə Peyğəmbər ﷺ: "İman Hicaz əhlinə aiddir"– demişdir. Sadəcə olaraq Yəmən əhli bir çoxlarına nisbətdə daha mülayim olduğundan, onları xüsusilə qeyd etmişdir.

ürəklilik və qabalıq isə kobud danışığı ilə seçilən, dəvələrin quyruğundan yapışmış[1] bədəvilərə aiddir. (Bu xasiyyətlər isə) şeytanın iki buynuzu çıxan[2] yerdə – Rəbiə və Mudər (qəbilələrində) özünü büruzə verir".

**[١٨٢] ٨٢-(٥٢)** حَدَّثَنَا أَبُو الرَّبِيعِ الزَّهْرَانِيُّ: أَنْبَأَنَا حَمَّادٌ: حَدَّثَنَا أَيُّوبُ: حَدَّثَنَا مُحَمَّدٌ عَنْ أَبِي هُرَيْرَةَ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((جَاءَ أَهْلُ الْيَمَنِ، هُمْ أَرَقُّ أَفْئِدَةً، الإِيمَانُ يَمَانٍ، وَالْفِقْهُ يَمَانٍ، وَالْحِكْمَةُ يَمَانِيَةٌ)).

**[182]-82-(52)** ........ Əbu Hureyrə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Yəmənlilər gəldilər. Onlar ən incə ürəkli (insanlardır). İman Yəmənə aiddir, fiqh[3] Yəmənə aiddir, hikmət Yəmənə aiddir "[4].

**[١٨٣] ٨٣-(...)** حَدَّثَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى: حَدَّثَنَا ابْنُ أَبِي عَدِيٍّ؛ ح: و حَدَّثَنِي عَمْرٌو النَّاقِدُ، حَدَّثَنَا إِسْحَقُ بْنُ يُوسُفَ الأَزْرَقُ، كِلاَهُمَا عَنْ ابْنِ عَوْنٍ، عَنْ مُحَمَّدٍ عَنْ أَبِي هُرَيْرَةَ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ بِمِثْلِهِ.

**[183]-83-(...)** ........ Əbu Hureyrə ﷺ: "Peyğəmbər ﷺ belə buyurmuşdur..." deyərək (yuxarıda keçən) hədisin bənzərini rəvayət etmişdir.

**[١٨٤] ٨٤-(...)** و حَدَّثَنِي عَمْرٌو النَّاقِدُ وَحَسَنٌ الْحُلْوَانِيُّ قَالاَ: حَدَّثَنَا يَعْقُوبُ وَهُوَ ابْنُ إِبْرَاهِيمَ بْنِ سَعْدٍ: حَدَّثَنَا أَبِي عَنْ صَالِحٍ، عَنْ الأَعْرَجِ قَالَ: قَالَ أَبُو هُرَيْرَةَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((أَتَاكُمْ أَهْلُ الْيَمَنِ هُمْ أَضْعَفُ قُلُوبًا وَأَرَقُّ أَفْئِدَةً الْفِقْهُ يَمَانٍ وَالْحِكْمَةُ يَمَانِيَةٌ)).

**[184]-84-(...)** ........ Əbu Hureyrə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Yəmənlilər sizin yanınıza gəlmişlər. Onlar ən yumşaq qəlbli və ən incə ürəkli (insanlardır). Fiqh Yəmənə aiddir, hikmət də Yəmənə aiddir".

---

[1] Burada Peyğəmbər ﷺ başları dəvələrinə qarışan, getdikcə kobudlaşan insanları qəsd edir.

[2] Xəttabi ﷺ demişdir: Burada "şeytanın iki buynuz"u yaramaz işlərə məsəl çəkilmişdir.

[3] Fiqh kəlməsi lüğəti mənada anlama, başa düşmə deməkdir. Uca Allah buyurur: **"Elə bir şey yoxdur ki, həmd ilə Ona tərif deməsin, lakin siz onların tərifini anlamırsınız"** ("əl-İsra" surəsi, 44); **"Onlar dedilər: "Ey Şueyb! Dediklərinin çoxunu anlamırıq"** ("Hud" surəsi, 91). İstilahi mənasına gəldikdə isə, bu, həm əqidə, həm də əməl baxımından Allahın hökmlərini bilməkdir. Qeyd etmək lazımdır ki, fiqh deyildikdə təkcə insanların əməlləri və buna aid əhkamlar nəzərdə tutulmur, üstəlik buna əqidə ilə bağlı əhkamlar da aid edilir. Hətta bəzi alimlər demişlər ki: "Əqidə elmi ən böyük fiqhdir!" Bu söz həqiqətdir. Çünki məbuda yalnız Onun vəhdaniyyətini tanımaqla düzgün ibadət etmək olar. Əks təqdirdə, insan tanımadığına necə ibadət edə bilər?! ("Zad əl-Mustəqnə", 1/16-17).

[4] Yəni onlar həm imanda, həm dini anlamaqda, həm də hikmətlə davranmaqda bir çoxlarından seçilirlər.

**[١٨٥] ٨٥**-(...) حَدَّثَنَا يَحْيَى بْنُ يَحْيَى قَالَ: قَرَأْتُ عَلَى مَالِكٍ عَنْ أَبِي الزِّنَادِ، عَنْ الأَعْرَجِ، عَنْ أَبِي هُرَيْرَةَ: أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: ((رَأْسُ الْكُفْرِ نَحْوَ الْمَشْرِقِ، وَالْفَخْرُ وَالْخُيَلاَءُ فِي أَهْلِ الْخَيْلِ وَالإِبِلِ - الْفَدَّادِينَ، أَهْلِ الْوَبَرِ - وَالسَّكِينَةُ فِي أَهْلِ الْغَنَمِ)).

**[185]-85-(...)** ........ Əbu Hureyrə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Küfrün başı şərq istiqamətindədir. Lovğalıq və təkəbbürlük (adətən) at ilxısına və dəvə sürüsünə sahib olan kimsələrdə, kobud danışığı ilə seçilən bədəvilərdə özünü büruzə verir. Qoyun sürüsünə sahib olan kimsələr isə dinc adamlar olurlar”.

**[١٨٦] ٨٦**-(...) و حَدَّثَنِي يَحْيَى بْنُ أَيُّوبَ وَقُتَيْبَةُ وَابْنُ حُجْرٍ عَنْ إِسْمَعِيلَ بْنِ جَعْفَرٍ - قَالَ ابْنُ أَيُّوبَ: حَدَّثَنَا إِسْمَعِيلُ - قَالَ: أَخْبَرَنِي الْعَلاَءُ، عَنْ أَبِيهِ، عَنْ أَبِي هُرَيْرَةَ، أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: ((الإِيمَانُ يَمَانٍ، وَالْكُفْرُ قِبَلَ الْمَشْرِقِ، وَالسَّكِينَةُ فِي أَهْلِ الْغَنَمِ، وَالْفَخْرُ وَالرِّيَاءُ فِي الْفَدَّادِينَ أَهْلِ الْخَيْلِ وَالْوَبَرِ)).

**[186]-86-(...)** Əbu Hureyrə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “İman Yəmənə mənsubdur. Küfr şərq tərəfdədir. Qoyun sürüsünə sahib olan kimsələr dinc adam olurlar. Lovğalıq və riyakarlıq isə at ilxısına və dəvə sürüsünə sahib olan kimsələrdə, kobud danışığı ilə seçilən bədəvilərdə özünü büruzə verir”.

**[١٨٧] ٨٧**-(...) و حَدَّثَنِي حَرْمَلَةُ بْنُ يَحْيَى، أَخْبَرَنَا ابْنُ وَهْبٍ قَالَ: أَخْبَرَنِي يُونُسُ عَنْ ابْنِ شِهَابٍ قَالَ: أَخْبَرَنِي أَبُو سَلَمَةَ بْنُ عَبْدِ الرَّحْمَنِ؛ أَنَّ أَبَا هُرَيْرَةَ قَالَ: سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ: ((الْفَخْرُ وَالْخُيَلاَءُ فِي الْفَدَّادِينَ أَهْلِ الْوَبَرِ، وَالسَّكِينَةُ فِي أَهْلِ الْغَنَمِ)).

**[187]-87-(...)** ........ Əbu Hureyrə ﷺ demişdir: “Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: “Lovğalıq və təkəbbürlük kobud danışığı ilə seçilən bədəvilərdə özünü büruzə verir. Qoyun sürüsünə sahib olan kimsələr isə dinc adam olurlar”.

**[١٨٨] ٨٨**-(...) و حَدَّثَنَا عَبْدُ اللَّهِ بْنُ عَبْدِ الرَّحْمَنِ الدَّارِمِيُّ: أَخْبَرَنَا أَبُو الْيَمَانِ: أَخْبَرَنَا شُعَيْبٌ عَنْ الزُّهْرِيِّ بِهَذَا الإِسْنَادِ مِثْلَهُ، وَزَادَ ((الإِيمَانُ يَمَانٍ، وَالْحِكْمَةُ يَمَانِيَةٌ)).

**[188]-88-(...)** ........ Şueyb bu hədisi Zuhridən eyni isnadla rəvayət etmiş və: “İman Yəmənə aiddir, hikmət də Yəmənə aiddir” sözlərini də əlavə etmişdir.

**[١٨٩]** **٨٩**–(...) حَدَّثَنَا عَبْدُ اللَّهِ بْنُ عَبْدِ الرَّحْمَنِ: أَخْبَرَنَا أَبُو الْيَمَانِ عَنْ شُعَيْبٍ، عَنْ الزُّهْرِيِّ، حَدَّثَنِي سَعِيدُ بْنُ الْمُسَيَّبِ، أَنَّ أَبَا هُرَيْرَةَ قَالَ: سَمِعْتُ النَّبِيَّ ﷺ يَقُولُ: ((جَاءَ أَهْلُ الْيَمَنِ، هُمْ أَرَقُّ أَفْئِدَةً وَأَضْعَفُ قُلُوبًا، الإِيمَانُ يَمَانٍ، وَالْحِكْمَةُ يَمَانِيَةٌ، السَّكِينَةُ فِي أَهْلِ الْغَنَمِ، وَالْفَخْرُ وَالْخُيَلاَءُ فِي الْفَدَّادِينَ أَهْلِ الْوَبَرِ قِبَلَ مَطْلِعِ الشَّمْسِ)).

**[189]-89-(...)** ........ Əbu Hureyrə ﷺ demişdir: “Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: “Yəmən əhli gəlmişdir. Onlar ən incə ürəkli və ən yumşaq qəlbli (insanlardır). İman Yəmənə mənsubdur, hikmət də Yəmənə mənsubdur. Qoyun sürüsünə sahib olan kimsələr dinc adam olurlar. Lovğalıq və təkəbbürlük isə dəvə sürüsünə sahib olan kimsələrdə, kobud danışığı ilə seçilən bədəvilərdə, şərq tərəfdə özünü büruzə verir”.

**[١٩٠]** **٩٠**–(...) حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ وَأَبُو كُرَيْبٍ قَالاَ: حَدَّثَنَا أَبُو مُعَاوِيَةَ عَنْ الأَعْمَشِ، عَنْ أَبِي صَالِحٍ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((أَتَاكُمْ أَهْلُ الْيَمَنِ، هُمْ أَلْيَنُ قُلُوبًا وَأَرَقُّ أَفْئِدَةً، الإِيمَانُ يَمَانٍ، وَالْحِكْمَةُ يَمَانِيَةٌ، رَأْسُ الْكُفْرِ قِبَلَ الْمَشْرِقِ)).

**[190]-90-(...)** ........ Əbu Hureyrə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Yəmən əhli sizin yanınıza gəlmişdir. Onlar ən yumşaq qəlbli və ən incə ürəkli (insanlardır). İman Yəmənə aiddir, hikmət də Yəmənə aiddir. Küfrün başı şərq istiqamətindədir”.

**[١٩١]** (...) و حَدَّثَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ وَزُهَيْرُ بْنُ حَرْبٍ قَالاَ: حَدَّثَنَا جَرِيرٌ عَنْ الأَعْمَشِ بِهَذَا الإِسْنَادِ وَلَمْ يَذْكُرْ: ((رَأْسُ الْكُفْرِ قِبَلَ الْمَشْرِقِ)).

**[191] (...)** ........ Cərir bu hədisi Aməşdən eyni isnadla rəvayət etmiş, ancaq “küfrün başı şərq istiqamətindədir” sözünü söyləməmişdir.

**[١٩٢]** (...) و حَدَّثَنِي مُحَمَّدُ بْنُ الْمُثَنَّى: حَدَّثَنَا ابْنُ أَبِي عَدِيٍّ؛ **ح**: و حَدَّثَنِي بِشْرُ بْنُ خَالِدٍ: حَدَّثَنَا مُحَمَّدٌ يَعْنِي ابْنَ جَعْفَرٍ قَالاَ: حَدَّثَنَا شُعْبَةُ عَنْ الأَعْمَشِ بِهَذَا الإِسْنَادِ مِثْلَ حَدِيثِ جَرِيرٍ. وَزَادَ: ((وَالْفَخْرُ وَالْخُيَلاَءُ فِي أَصْحَابِ الإِبِلِ، وَالسَّكِينَةُ وَالْوَقَارُ فِي أَصْحَابِ الشَّاءِ)).

**[192] (...)** ........ Şobə bu hədisi Aməşdən eyni isnadla Cəririn rəvayət etdiyi hədisə bənzər rəvayət etmiş və: “Lovğalıq və təkəbbürlük dəvə sürüsünə sahib olan kimsələrdə özünü büruzə verir. Qoyun sürüsünə sahib olan kimsələr isə vüqarlı və dinc adam olurlar” sözünü əlavə etmişdir.

**[١٩٣] ٩٢**-(**٥٣**) و حَدَّثَنَا إِسْحَقُ بْنُ إِبْرَاهِيمَ: أَخْبَرَنَا عَبْدُ اللَّهِ بْنُ الْحَارِثِ الْمَخْزُومِيُّ عَنْ ابْنِ جُرَيْجٍ قَالَ: أَخْبَرَنِي أَبُو الزُّبَيْرِ، أَنَّهُ سَمِعَ جَابِرَ بْنَ عَبْدِ اللَّهِ يَقُولُ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((غِلَظُ الْقُلُوبِ وَالْجَفَاءُ فِي الْمَشْرِقِ، وَالإِيمَانُ فِي أَهْلِ الْحِجَازِ)).

**[193]-92-(53)** ........ Cabir ibn Abdullah ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Daşqəlblilik və qabalıq şərq tərəfdədir. İman isə Hicaz əhlinə aiddir".

## (٢٢) – بَابُ بَيَانِ أَنَّهُ لاَ يَدْخُلُ الْجَنَّةَ إِلاَّ الْمُؤْمِنُونَ وَأَنَّ مَحَبَّةَ الْمُؤْمِنِينَ مِنْ الإِيمَانِ وَأَنَّ إِفْشَاءَ السَّلاَمِ سَبَبًا لِحُصُولِهَا

## 22-ci fəsil. Cənnətə yalnız möminlərin girəcəyinin, habelə möminləri sevməyin imandan olmasının və salamlaşmanın bu sevgiyə nail olmağa səbəb olduğunun bəyan edilməsi

**[١٩٤] ٩٣**-(**٥٤**) حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا أَبُو مُعَاوِيَةَ وَوَكِيعٌ عَنْ الأَعْمَشِ، عَنْ أَبِي صَالِحٍ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((لاَ تَدْخُلُونَ الْجَنَّةَ حَتَّى تُؤْمِنُوا، وَلاَ تُؤْمِنُوا حَتَّى تَحَابُّوا، أَوَلاَ أَدُلُّكُمْ عَلَى شَيْءٍ إِذَا فَعَلْتُمُوهُ تَحَابَبْتُمْ؟ أَفْشُوا السَّلاَمَ بَيْنَكُمْ)).

**[194]-93-(54)** ........ Əbu Hureyrə ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "İman gətirməyincə Cənnətə girə bilməzsiniz. Biri-birinizi sevməyincə (tamam-kamal) iman gətirmiş olmazsınız. Sizə elə bir şey öyrədimmi ki, onu etdikdə biri-birinizi sevəsiniz? Aranızda salamı yayın"[1].

**[١٩٥] ٩٤**-(...) و حَدَّثَنِي زُهَيْرُ بْنُ حَرْبٍ أَنْبَأَنَا جَرِيرٌ عَنْ الأَعْمَشِ بِهَذَا الإِسْنَادِ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((وَالَّذِي نَفْسِي بِيَدِهِ! لاَ تَدْخُلُونَ الْجَنَّةَ حَتَّى تُؤْمِنُوا)) بِمِثْلِ حَدِيثِ أَبِي مُعَاوِيَةَ وَوَكِيعٍ.

**[195]-94-(...)** ........ Cərir bu isnadla Aməşdən, (o da Əbu Salehdən,) o da Əbu Hureyrədən rəvayət etmişdir ki, Peyğəmbər ﷺ buyurmuşdur: "Canım Əlində olan *Allaha* and olsun ki, iman gətirməyincə Cənnətə girə bilməzsiniz..."– söyləyərək (yuxarıda keçən) Müaviyənin və Vəkiyin rəvayət etdiyi hədisin bənzərini rəvayət etmişdir.

---

[1] Ammar ibn Yasir ﵁ demişdir: "Üç xisləti özündə cəm edən kəs iman əldə etmiş olar: öz nəfsinə qarşı insaflı olmaq, salamı (hər tərəfə) yaymaq və ehtiyaclı olduğu halda belə, (malından Allah yolunda) xərcləmək" ("Səhih əl-Buxari", 1/32).

## (٢٣) – بَابُ بَيَانِ أَنَّ الدِّينَ النَّصِيحَةُ

## 23-cü fəsil. Dinin nəsihət olduğunun bəyan edilməsi

**[١٩٦] ٩٥-(٥٥)** حَدَّثَنَا مُحَمَّدُ بْنُ عَبَّادٍ الْمَكِّيُّ: حَدَّثَنَا سُفْيَانُ قَالَ: قُلْتُ لِسُهَيْلٍ: إِنَّ عَمْرًا حَدَّثَنَا عَنْ الْقَعْقَاعِ، عَنْ أَبِيكَ – قَالَ: وَرَجَوْتُ أَنْ يُسْقِطَ عَنِّي رَجُلاً – قَالَ – فَقَالَ: سَمِعْتُهُ مِنَ الَّذِي سَمِعَهُ مِنْهُ أَبِي، كَانَ صَدِيقًا لَهُ بِالشَّامِ. ثُمَّ حَدَّثَنَا سُفْيَانُ عَنْ سُهَيْلٍ، عَنْ عَطَاءِ بْنِ يَزِيدَ، عَنْ تَمِيمٍ الدَّارِيِّ أَنَّ النَّبِيَّ ﷺ قَالَ: ((الدِّينُ النَّصِيحَةُ)) قُلْنَا: لِمَنْ؟ قَالَ: ((لِلَّهِ وَلِكِتَابِهِ وَلِرَسُولِهِ وَلأَئِمَّةِ الْمُسْلِمِينَ وَعَامَّتِهِمْ)).

**[196]-95-(55)** ........ Təmim əd-Dari ﷺ demişdir: "(Bir dəfə) Peyğəmbər ﷺ: "Din nəsihətdir!"– deyə buyurdu. Biz soruşduq: "Kimin üçün?" Dedi: "Allah üçün, Onun Kitabı üçün, Onun rəsulu üçün, habelə müsəlmanların rəhbərləri və bütün müsəlmanlar üçün"[1].

---

[1] İbn Həcər demişdir: "Hədisdə "Allah üçün (nəsihət)" deyildikdə Onu layiqincə vəsf etmək, aşkarda da, gizlində də Ona boyun əymək, Onun razılığını qazanmaq üçün buyuruqlarını yerinə yetirmək, qəzəbindən qurtulmaq üçün qadağan etdiyi şeylərdən çəkinmək, asilik edənləri Onun yoluna qaytarmaq uğrunda mübarizə aparmaq nəzərdə tutulur. Sövri, Abdul-Aziz ibn Rufeydən, o da Əlinin sirdaşı olmuş Əbu Sumamədən rəvayət etmişdir ki, (bir dəfə) həvarilər (Məryəm oğlu) İsadan ﷺ: "Ey Allahın ruhu! Kimdir Allaha nəsihət edən?"– deyə soruşdular. İsa ﷺ (onlara) belə cavab verdi: "Allahın haqqını öz haqqından üstün tutan kimsə!"

"Allahın Kitabı üçün (nəsihət)" deyildikdə onu öyrənmək və (başqalarına) öyrətmək, oxuduqda təcvidlə oxumaq, yazdıqda düzgün şəkildə yazmaq, ayələrinin mənasını başa düşməyə səy göstərmək, ayələrdə keçən qayda-qanunları qorumaq, əhkamları yerinə yetirmək və onları təhrif edənlərin cavabını vermək qəsd edilir.

"Allahın Rəsulu üçün (nəsihət)" deyildikdə ona sayğı göstərmək, hər zaman ona (və onun dininin yayılmasına) kömək etmək, sünnəsini öyrənib (başqalarına) öyrətməklə onu yaşatmaq, sözdə və əməldə onun yolunu tutub getmək, onu və ardınca gedənləri sevmək nəzərdə tutulur.

"Müsəlmanların rəhbərləri üçün (nəsihət)" deyildikdə idarəçilikdə onlara dəstək vermək, bixəbər olduqları məsələlərdən onları agah etmək, səhvlərini gördükdə onlara yaltaqlanmamaq, əksinə, bu səhvi hikmətlə onlara başa salmaq, onların (şəriətə müvafiq olan) bir sözünü iki eləməmək, onları camaata sevdirmək və gözəl tərzdə onları zülm etməkdən çəkindirmək qəsd edilir. Qeyd etmək lazımdır ki, rəhbərlər deyildikdə bura alimlər də aid edilir və onlara nəsihət etmək deyildikdə elmlərinə ehtiram göstərmək, onların yaxşı əməlləri barədə danışmaq və barələrində yaxşı zənn etmək nəzərdə tutulur.

"Bütün müsəlmanlar üçün (nəsihət)" deyildikdə isə, onlara mərhəmət etmək, onlara yaxşılıq etməyə səy göstərmək, onlara fayda verəcək şeyləri onlara öyrətmək, onlara əziyyət verməmək, özünə istədiyini onlar üçün də istəmək və özünə rəva bilmədiyini onlara da rəva bilməmək qəsd edilir.

Hədisdən belə nəticə çıxır ki, (yaxşı) əməl din adlandırıla bilər. Çünki Peyğəmbər ﷺ öyüd-nəsihət verməyi din adlandırmışdır..." ("Fəth əl-Bari", 1/89).

**[١٩٧] ٩٦**–(...) حَدَّثَنِي مُحَمَّدُ بْنُ حَاتِمٍ: حَدَّثَنَا ابْنُ مَهْدِيٍّ: حَدَّثَنَا سُفْيَانُ عَنْ سُهَيْلِ بْنِ أَبِي صَالِحٍ، عَنْ عَطَاءِ بْنِ يَزِيدَ اللَّيْثِيِّ، عَنْ تَمِيمٍ الدَّارِيِّ عَنْ النَّبِيِّ ﷺ بِمِثْلِهِ.

**[197]-96-(...)** ........ Süfyan Suheyl ibn Əbu Salehdən, o da Əta ibn Yezid əl-Leysidən, o da Təmim əd-Daridən, o da Peyğəmbərdən ﷺ bu hədisin bənzərini rəvayət etmişdir.

**[١٩٨]** (...) و حَدَّثَنِي أُمَيَّةُ بْنُ بِسْطَامَ: حَدَّثَنَا يَزِيدُ يَعْنِي ابْنَ زُرَيْعٍ: حَدَّثَنَا رَوْحٌ وَهُوَ ابْنُ الْقَاسِمِ: حَدَّثَنَا سُهَيْلٌ عَنْ عَطَاءِ بْنِ يَزِيدَ سَمِعَهُ وَهُوَ يُحَدِّثُ أَبَا صَالِحٍ عَنْ تَمِيمٍ الدَّارِيِّ عَنْ رَسُولِ اللَّهِ ﷺ بِمِثْلِهِ.

**[198] (...)** ........ İbn Qasim (əvvəlki isnadla) Təmim əd-Daridən, o da Peyğəmbərdən ﷺ bu hədisin bənzərini rəvayət etmişdir.

**[١٩٩] ٩٧**–(٥٦) حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا عَبْدُ اللَّهِ بْنُ نُمَيْرٍ وَأَبُو أُسَامَةَ عَنْ إِسْمَعِيلَ بْنِ أَبِي خَالِدٍ، عَنْ قَيْسٍ، عَنْ جَرِيرٍ قَالَ: بَايَعْتُ رَسُولَ اللَّهِ ﷺ عَلَى إِقَامِ الصَّلَاةِ وَإِيتَاءِ الزَّكَاةِ وَالنُّصْحِ لِكُلِّ مُسْلِمٍ.

**[199]-97-(56)** ........ Cərir ؓ demişdir: "Mən namaz qılacağıma, zəkat verəcəyimə və hər bir müsəlmana nəsihət edəcəyimə dair Peyğəmbərə ﷺ beyət[1] etdim".

**[٢٠٠] ٩٨**–(...) حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ وَزُهَيْرُ بْنُ حَرْبٍ وَابْنُ نُمَيْرٍ قَالُوا: حَدَّثَنَا سُفْيَانُ عَنْ زِيَادِ بْنِ عِلَاقَةَ، سَمِعَ جَرِيرَ بْنَ عَبْدِ اللَّهِ يَقُول: بَايَعْتُ النَّبِيَّ ﷺ عَلَى النُّصْحِ لِكُلِّ مُسْلِمٍ.

**[200]-98-(...)** ........ Cərir ibn Abdullah ؓ demişdir: "Mən hər bir müsəlmana nəsihət edəcəyimə dair Peyğəmbərə ﷺ beyət etdim".

**[٢٠١] ٩٩**–(...) حَدَّثَنَا سُرَيْجُ بْنُ يُونُسَ وَيَعْقُوبُ الدَّوْرَقِيُّ قَالَا: حَدَّثَنَا هُشَيْمٌ عَنْ سَيَّارٍ، عَنْ الشَّعْبِيِّ، عَنْ جَرِيرٍ قَالَ: بَايَعْتُ النَّبِيَّ ﷺ عَلَى السَّمْعِ وَالطَّاعَةِ، فَلَقَّنَنِي ((فِيمَا اسْتَطَعْتَ)) وَالنُّصْحِ لِكُلِّ مُسْلِمٍ. قَالَ يَعْقُوبُ فِي رِوَايَتِهِ: قَالَ: حَدَّثَنَا سَيَّارٌ.

**[201]-99-(...)** ........ Cərir ؓ demişdir: "Mən (buyuruqları) dinləyib itaət edəcəyimə və hər bir müsəlmana nəsihət edəcəyimə dair Peyğəmbərə ﷺ beyət etdim. O da: "Bacardığın işlərdə" – deyə mənə nəsihət etdi.

Yəqub öz rəvayətində demişdir: "(Bu hədisi) bizə Səyyar rəvayət etmişdir".

[1] Peyğəmbərin ﷺ dəvətini qəbul edərək ona tabe və sadiq olma.

## (٢٤) – بَابُ بَيَانِ نُقْصَانِ الإِيمَانِ بِالْمَعَاصِي وَنَفْيِهِ عَنْ الْمُتَلَبِّسِ بِالْمَعْصِيَةِ عَلَى إِرَادَةِ نَفْيِ كَمَالِهِ

## 24-cü fəsil. Günah işlərlə imanın azalmasının və günaha batan kimsənin kamil iman sahibi olmayacağının bəyan edilməsi

**[٢٠٢] ١٠٠–(٥٧)** حَدَّثَنِي حَرْمَلَةُ بْنُ يَحْيَى بْنِ عَبْدِ اللَّهِ بْنِ عِمْرَانَ التُّجِيبِيُّ: أَنْبَأَنَا ابْنُ وَهْبٍ قَالَ: أَخْبَرَنِي يُونُسُ عَنْ ابْنِ شِهَابٍ قَالَ: سَمِعْتُ أَبَا سَلَمَةَ بْنَ عَبْدِ الرَّحْمَنِ وَسَعِيدَ بْنَ الْمُسَيَّبِ يَقُولَانِ: قَالَ أَبُو هُرَيْرَةَ: إِنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: ((لاَ يَزْنِي الزَّانِي حِينَ يَزْنِي وَهُوَ مُؤْمِنٌ، وَلاَ يَسْرِقُ السَّارِقُ حِينَ يَسْرِقُ وَهُوَ مُؤْمِنٌ، وَلاَ يَشْرَبُ الْخَمْرَ حِينَ يَشْرَبُهَا وَهُوَ مُؤْمِنٌ)).

قَالَ ابْنُ شِهَابٍ: فَأَخْبَرَنِي عَبْدُ الْمَلِكِ بْنُ أَبِي بَكْرِ بْنِ عَبْدِ الرَّحْمَنِ، أَنَّ أَبَا بَكْرٍ كَانَ يُحَدِّثُهُمْ هَؤُلاَءِ عَنْ أَبِي هُرَيْرَةَ، ثُمَّ يَقُولُ: وَكَانَ أَبُو هُرَيْرَةَ يُلْحِقُ مَعَهُنَّ: ((وَلاَ يَنْتَهِبُ نُهْبَةً ذَاتَ شَرَفٍ، يَرْفَعُ النَّاسُ إِلَيْهِ فِيهَا أَبْصَارَهُمْ، حِينَ يَنْتَهِبُهَا، وَهُوَ مُؤْمِنٌ)).

**[202]-100-(57)** ........ Əbu Hureyrə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Zina edən adam zina etdiyi vaxt mömin sayıla bilməz. Oğurluq edən adam oğurluq etdiyi vaxt mömin sayıla bilməz. Şərab içən adam şərab içdiyi vaxt mömin sayıla bilməz"[1].

İbn Şihab demişdir: "Abdul-Malik ibn Əbu Bəkr ibn Abdur-Rəhman mənə xəbər vermişdir ki, Əbu Bəkr ibn Abdur-Rəhman onlara Əbu Hureyrədən bu sözləri rəvayət etdikdən sonra deyərmiş: "Əbu Hureyrə bu sözlərə bunu da əlavə edərdi: "Camaatın gözü önündə (birisinin dəyərli) bir şeyini zor gücünə götürən zadəgan adam, onu götürdüyü vaxt mömin sayıla bilməz"[2].

---

[1] Burada söhbət möminin imanının kamilliyindən gedir. Belə ki, mömin bəndə hər dəfə günah işlətdikdə, imanı bir qədər azalır. Lakin qeyd etmək lazımdır ki, mömin böyük günah etdiyi zaman iman onu tərk edir, bu günahdan əl çəkdikdən sonra imanı yenidən özünə qayıdır. Bu xüsusda Peyğəmbər ﷺ belə buyurmuşdur: "Mömin zina etdiyi zaman iman ondan xaric olar və sanki bir bulud olar. Günahdan əl çəkdikdə isə yenidən özünə qayıdar" (Silsilətul-Əhadis əs-Səhihə, 509). Bu da dəlildir ki, iman mömini birdəfəlik tərk etmir. Yalnız açıq-aydın küfr edənlər – yəni bu günahları halal sayan kimsələr istisnadır. Belə ki, Allahın və Peyğəmbərinin ﷺ qadağan etidiyi bir şeyi halal sayan hər kəs kafir sayılır.

[2] Hədisin bu hissəsi Əbu Hureyrənin ﷺ əlavəsi kimi görünsə də, əslində bu, Peyğəmbərin ﷺ sözündən götürülmüşdür. Bu xüsusda Əbu Amr ibn əs-Səlah ﷺ demişdir: "Əbu Nueym öz "Mustəxrəc" əsərində Həmmam ibn Munəbbihdən bu hədisi rəvayət etmişdir. Həmin rəvayətdə deyilir: "Muhəmmədin canı Əlində olan *Allaha* and olsun ki, sizdən biriniz (başqasının malını) zor gücünə götürdüyü zaman..." Hədisdən açıq-aydın görünür ki, bu söz Peyğəmbərin ﷺ sözüdür. Digər bir hədisdə Peyğəmbər ﷺ buyurmuşdur: "(Başqasının malını) zor gücünə götürən adam bizdən deyildir" ("Müsnəd imam Əhməd", 2655; "Sunən ət-Tirmizi", 1601; "Səhih əl-Cami", 7168).

**[٢٠٣] ١٠١**–(...) و حَدَّثَنِي عَبْدُ الْمَلِكِ بْنُ شُعَيْبِ بْنِ اللَّيْثِ بْنِ سَعْدٍ قَالَ: حَدَّثَنِي أَبِي عَنْ جَدِّي قَالَ: حَدَّثَنِي عُقَيْلُ بْنُ خَالِدٍ قَالَ: قَالَ ابْنُ شِهَابٍ: أَخْبَرَنِي أَبُو بَكْرِ بْنُ عَبْدِ الرَّحْمَنِ بْنِ الْحَارِثِ بْنِ هِشَامٍ، عَنْ أَبِي هُرَيْرَةَ أَنَّهُ قَالَ: إِنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: ((لاَ يَزْنِي الزَّانِي)) وَاقْتَصَّ الْحَدِيثَ بِمِثْلِهِ، مَعَ ذِكْرِ النُّهْبَةِ، وَلَمْ يَذْكُرْ ذَاتَ شَرَفٍ.

قَالَ ابْنُ شِهَابٍ: حَدَّثَنِي سَعِيدُ بْنُ الْمُسَيَّبِ وَأَبُو سَلَمَةَ بْنُ عَبْدِ الرَّحْمَنِ عَنْ أَبِي هُرَيْرَةَ عَنْ رَسُولِ اللَّهِ ﷺ بِمِثْلِ حَدِيثِ أَبِي بَكْرٍ هَذَا إِلاَّ النُّهْبَةَ.

**[203]-101-(...)** ........ Əbu Sələmə ibn Abdur-Rəhman (bu hədisi) Əbu Hureyrədən, o da Peyğəmbərdən ﷺ: "Zina edən adam zina etdiyi vaxt..."– deyərək (yuxarıdakı) hədisi eyni ilə rəvayət etmiş, lakin: "zadəgan adam" sözünü zikr etməmişdir.

İbn Şihab demişdir: "Səid ibn Museyyib və Əbu Sələmə ibn Abdur-Rəhman mənə Əbu Hureyrədən, o da Peyğəmbərdən ﷺ nəql edərək bu hədisi Əbu Bəkr ibn Abdur-Rəhmanın rəvayət etdiyi kimi rəvayət etmişdir. Lakin (burada): "dəyərli bir şeyini" sözü qeyd olunmamışdır.

**[٢٠٤] ١٠٢**–(...) و حَدَّثَنِي مُحَمَّدُ بْنُ مِهْرَانَ الرَّازِيُّ قَالَ: أَخْبَرَنِي عِيسَى بْنُ يُونُسَ: حَدَّثَنَا الأَوْزَاعِيُّ عَنْ الزُّهْرِيِّ، عَنْ ابْنِ الْمُسَيَّبِ، وَأَبِي سَلَمَةَ وَأَبِي بَكْرِ بْنِ عَبْدِ الرَّحْمَنِ بْنِ الْحَارِثِ بْنِ هِشَامٍ، عَنْ أَبِي هُرَيْرَةَ عَنْ النَّبِيِّ ﷺ بِمِثْلِ حَدِيثِ عُقَيْلٍ عَنْ الزُّهْرِيِّ، عَنْ أَبِي بَكْرِ بْنِ عَبْدِ الرَّحْمَنِ، عَنْ أَبِي هُرَيْرَةَ وَذَكَرَ: ((النُّهْبَةَ)) وَلَمْ يَقُلْ: ((ذَاتَ شَرَفٍ)).

**[204]-102-(...)** ........ Əvzai bu hədisi Uqeylin əsaslandığı isnadla eyni ilə rəvayət etmiş və (bu rəvayətdə): "dəyərli bir şeyi" sözünü də qeyd etmişdir. Yalnız: "zadəgan adam" sözünü zikr etməmişdir.

**[٢٠٥–٢٠٧] ١٠٣**–(...) و حَدَّثَنِي حَسَنُ بْنُ عَلِيٍّ الْحُلْوَانِيُّ: حَدَّثَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ: حَدَّثَنَا عَبْدُ الْعَزِيزِ بْنُ الْمُطَّلِبِ، عَنْ صَفْوَانَ بْنِ سُلَيْمٍ، عَنْ عَطَاءِ بْنِ يَسَارٍ مَوْلَى مَيْمُونَةَ، وَحُمَيْدِ بْنِ عَبْدِ الرَّحْمَنِ، عَنْ أَبِي هُرَيْرَةَ عَنْ النَّبِيِّ ﷺ؛ و حَدَّثَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ: حَدَّثَنَا عَبْدُ الْعَزِيزِ يَعْنِي الدَّرَاوَرْدِيَّ، عَنْ الْعَلاَءِ بْنِ عَبْدِ الرَّحْمَنِ، عَنْ أَبِيهِ، عَنْ أَبِي هُرَيْرَةَ عَنْ النَّبِيِّ ﷺ. و حَدَّثَنَا مُحَمَّدُ بْنُ رَافِعٍ: حَدَّثَنَا عَبْدُ الرَّزَّاقِ: أَخْبَرَنَا مَعْمَرٌ عَنْ هَمَّامِ بْنِ مُنَبِّهٍ، عَنْ أَبِي هُرَيْرَةَ عَنْ النَّبِيِّ ﷺ، كُلُّ هَؤُلاَءِ بِمِثْلِ حَدِيثِ الزُّهْرِيِّ، غَيْرَ أَنَّ الْعَلاَءَ وَصَفْوَانَ بْنَ سُلَيْمٍ لَيْسَ فِي حَدِيثِهِمَا ((يَرْفَعُ النَّاسُ إِلَيْهِ فِيهَا أَبْصَارَهُمْ)) وَفِي حَدِيثِ هَمَّامٍ ((يَرْفَعُ إِلَيْهِ الْمُؤْمِنُونَ أَعْيُنَهُمْ فِيهَا، وَهُوَ – حِينَ يَنْتَهِبُهَا – مُؤْمِنٌ)). وَزَادَ: ((وَلاَ يَغُلُّ أَحَدُكُمْ حِينَ يَغُلُّ وَهُوَ مُؤْمِنٌ، فَإِيَّاكُمْ إِيَّاكُمْ)).

**[205-207]-103-(...)** ........ Səfvan ibn Suleym Meymunənin azad etdiyi köləsi Əta ibn Yəsardan və Humeyd ibn Abdur-Rəhmandan, habelə Alə ibn Abdur-Rəhman öz atasından, həmçinin Məmər Həmmam ibn Munəbbihdən, o da Əbu Hureyrədən, o da Peyğəmbərdən ﷺ (bu hədisi) rəvayət etmişlər. Ravilərin hamısı (bu hədisi) Zuhrinin hədisinə bənzər rəvayət etmişlər. Fəqət Alə ibn Abdur-Rəhmanın və Səfvan ibn Suleymin rəvayətlərində: “Camaatın gözü önündə”, habelə Həmmamın rəvayətində: “Möminlərin gözləri önündə (birisinin dəyərli bir şeyini zor gücünə götürən adam) onu götürdüyü vaxt mömin sayıla bilməz” sözləri zikr olunmamışdır. (Bu hədisdə): “Sizlərdən (əmanətə) xəyanət edən bir kimsə xəyanət etdiyi vaxt mömin sayıla bilməz. Odur ki, (bundan) uzaq durun, uzaq!” sözləri əlavə edilmişdir.

**[٢٠٨] ١٠٤**–(...) حَدَّثَنِي مُحَمَّدُ بْنُ الْمُثَنَّى: حَدَّثَنَا ابْنُ أَبِي عَدِيٍّ عَنْ شُعْبَةَ، عَنْ سُلَيْمَانَ، عَنْ ذَكْوَانَ، عَنْ أَبِي هُرَيْرَةَ: أَنَّ النَّبِيَّ ﷺ قَالَ: ((لاَ يَزْنِي الزَّانِي حِينَ يَزْنِي وَهُوَ مُؤْمِنٌ، وَلاَ يَسْرِقُ حِينَ يَسْرِقُ وَهُوَ مُؤْمِنٌ، وَلاَ يَشْرَبُ الْخَمْرَ حِينَ يَشْرَبُهَا وَهُوَ مُؤْمِنٌ، وَالتَّوْبَةُ مَعْرُوضَةٌ بَعْدُ)).

**[208]-104-(...)** ........ Əbu Hureyrə ؓ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Zina edən adam zina etdiyi vaxt mömin sayıla bilməz. (Oğurluq edən adam) oğurluq etdiyi vaxt mömin sayıla bilməz. (Şərab içən adam) şərab içdiyi vaxt mömin sayıla bilməz. Bundan sonrakı tövbə isə məqbul sayılır”[1].

---

[1] Yəni Allahın tövbə qapısı daim açıqdır. Uca Allah buyurur: **“Yaramaz işlər görüb sonra bunun ardından tövbə edib iman gətirənlərə gəlincə, şübhəsiz ki, Rəbbin bundan sonra Bağışlayandır, Rəhmlidir”** (“əl-Əraf” surəsi, 153). Yalnız iki vaxt istisnadır ki, bu vaxtlarda Allah tövbəni qəbul etmir:

a) Günəş məğribdən doğacağı zaman: Bu xüsusda Peyğəmbər ﷺ demişdir: “....günəş batdığı yerdən doğmayınca *qiyamət qopmayacaq*. Günəş *məğribdən* doğduğu zaman insanlar onu görəcək, yəni hamısı *bu həqiqətə* inanacaq, *lakin artıq iş işdən keçmiş olacaq*. Həmin vaxt: **“Rəbbinin bəzi əlamətləri gələcəyi gün əvvəlcə iman gətirməmiş və ya imanında bir xeyir qazanmamış kimsəyə iman gətirməsi fayda verməyəcəkdir”** (“Səhih əl-Buxari”, 7121).

b) Can boğaza yetişdiyi an: Bu xüsusda Peyğəmbər ﷺ buyurmuşdur: “Qüdrət və Qüvvət sahibi olan Allah, qulunun canı boğazına yetişənədək onun tövbəsini qəbul edər” (“Sunən ibn Macə”, 2697; “Səhih ət-Tərğib vət-Tərhib”, 3143).

İbn Useymin ؒ demişdir: “Tövbənin şərtləri belədir:

– tövbəni Allah üçün etməli;
– keçmiş günaha görə peşman olmalı;
– həmin günaha qayıtmamağa niyyət etməli;
– bir daha o günaha qayıtmamalı;
– tövbəni qəbul olduğu vaxt yerinə yetirməli” (“Şərh əl-Mumti”).

**[٢٠٩] ١٠٥**-(...) حَدَّثَنِي مُحَمَّدُ بْنُ رَافِعٍ: حَدَّثَنَا عَبْدُ الرَّزَّاقِ: أَخْبَرَنَا سُفْيَانُ عَنْ الأَعْمَشِ، عَنْ ذَكْوَانَ، عَنْ أَبِي هُرَيْرَةَ – رَفَعَهُ – قَالَ: ((لاَ يَزْنِي الزَّانِي)) ثُمَّ ذَكَرَ بِمِثْلِ حَدِيثِ شُعْبَةَ.

**[209]-105-(...)** ........ Zəkvan Əbu Hureyrədən, o da Peyğəmbərdən ﷺ: "Zina edən adam zina etdiyi vaxt..."– deyərək (bu hədisi) Şobənin rəvayət etdiyi kimi rəvayət etmişdir.

## (٢٥) – بَابُ بَيَانِ خِصَالِ الْمُنَافِقِ

## 25-ci fəsil. Münafiqə (xas) xislətlərin bəyan edilməsi

**[٢١٠] ١٠٦**-(٥٨) حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا عَبْدُ اللَّهِ بْنُ نُمَيْرٍ؛ ح: و حَدَّثَنَا ابْنُ نُمَيْرٍ حَدَّثَنَا أَبِي: حَدَّثَنَا الأَعْمَشُ؛ ح: و حَدَّثَنِي زُهَيْرُ بْنُ حَرْبٍ: حَدَّثَنَا وَكِيعٌ: حَدَّثَنَا سُفْيَانُ، عَنْ الأَعْمَشِ، عَنْ عَبْدِ اللَّهِ بْنِ مُرَّةَ، عَنْ مَسْرُوقٍ، عَنْ عَبْدِ اللَّهِ بْنِ عَمْرٍو قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((أَرْبَعٌ مَنْ كُنَّ فِيهِ كَانَ مُنَافِقًا خَالِصًا، وَمَنْ كَانَتْ فِيهِ خَلَّةٌ مِنْهُنَّ كَانَتْ فِيهِ خَلَّةٌ مِنْ نِفَاقٍ، حَتَّى يَدَعَهَا: إِذَا حَدَّثَ كَذَبَ، وَإِذَا عَاهَدَ غَدَرَ، وَإِذَا وَعَدَ أَخْلَفَ، وَإِذَا خَاصَمَ فَجَرَ)). غَيْرَ أَنَّ فِي حَدِيثِ سُفْيَانَ: ((وَإِنْ كَانَتْ فِيهِ خَصْلَةٌ مِنْهُنَّ كَانَتْ فِيهِ خَصْلَةٌ مِنْ النِّفَاقِ)).

**[210]-106-(58)** ........ Abdullah ibn Amr رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Dörd (xislət) vardır ki, bunlar kimdə olsa, əsl münafiq[1] sayılar və

---

[1] Bu hədis bəzilərini şübhəyə salmış və onlar elə güman etmişlər ki, hədisdə keçən əlamətlər mömini İslamdan çıxarır və onu kafir edir. Lakin bu heç də belə deyildir. Çünki İslam alimləri ittifaq etmişlər ki, qəlbi və dili ilə iman gətirmiş hər kəs bu əməllərdən hər hansı birini etsə, nə kafir sayılar, nə də Cəhənnəmin alt təbəqəsinə düşəcək münafiqlərdən hesab edilər. Baxın, Yusuf peyğəməbərin عليه السلام qardaşları bu xislətləri özlərində cəm etdilər, (həm yalan danışdılar, həm əmanətə xəyanət etdilər, həm də verdikləri vədə xilaf çıxdılar, lakin Allah onları münafiq saymadı). Həmçinin alimlərin tərcümeyi-halına nəzər salsaq, onlardan bəzisinin bu xislətlərin hamısını və ya bir qismini özündə cəm etdiyini görə bilərik. (Buna rəğmən heç kəs onları kafir saymamışdır.) Allaha həmd olsun ki, bu hədisdə heç bir şəkk-şübhə yoxdur. Hədisdə qəsd edilən budur ki, bu xislətlər münafiqlik əlamətlərindəndir və buna yiyələnmiş hər kəs münafiqə bənzəmiş olur. Əslində nifaq, içində olanın əksini üzə çıxartmaq deməkdir. Təbii ki, yalan danışan, əhdini pozan, vədinə xilaf çıxan, əmanətə xəyanət edən və haqsız olaraq mübahisə edən adam, öz içində olanın əksini üzə çıxardır və beləliklə də, zahirən (yəni əməllərində) münafiqlərə bənzəyir. Bu da heç də həmin adamın münafiq olması – özünü müsəlman kimi göstərib küfrünü gizlətməsi demək deyil. Peyğəmbər ﷺ belələrinin etiqadda münafiq olduqlarını və əbədi olaraq Cəhənnəmin dibində qalacaqlarını söyləməmişdir.

hər kimdə bunlardan biri olsa belə, onu tərk edincəyə qədər özündə münafiqlik xisləti qalmış sayılar: danışdığı zaman yalan danışar, ona əmanət verildiyi zaman xəyanət edər, əhd bağladığı zaman (əhdini) pozar, mübahisə etdiyi zaman haqsızlıq edər".

Süfyanın rəvayət etdiyi hədisdə isə belə deyilir: "Kimdə bunlardan biri olarsa, özündə münafiqlik xasiyyəti qalmış sayılar".

**[٢١١] ١٠٧-(٥٩)** حَدَّثَنَا يَحْيَى بْنُ أَيُّوبَ وَقُتَيْبَةُ بْنُ سَعِيدٍ – وَاللَّفْظُ لِيَحْيَى – قَالاَ: حَدَّثَنَا إِسْمَعِيلُ بْنُ جَعْفَرٍ قَالَ: أَخْبَرَنِي أَبُو سُهَيْلٍ نَافِعُ بْنُ مَالِكِ بْنِ أَبِي عَامِرٍ، عَنْ أَبِيهِ، عَنْ أَبِي هُرَيْرَةَ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: ((آيَةُ الْمُنَافِقِ ثَلاَثٌ: إِذَا حَدَّثَ كَذَبَ، وَإِذَا وَعَدَ أَخْلَفَ، وَإِذَا اؤْتُمِنَ خَانَ)).

**[211]-107-(59)** ........ Əbu Hureyrə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Münafiqin əlaməti üçdür: danışdığı zaman yalan danışar, vəd verdiyi zaman (vədinə) xilaf çıxar, ona əmanət verildiyi zaman xəyanət edər".

**[٢١٢] ١٠٨-(...)** حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ إِسْحَقَ: أَخْبَرَنَا ابْنُ أَبِي مَرْيَمَ: أَخْبَرَنَا مُحَمَّدُ بْنُ جَعْفَرٍ قَالَ: أَخْبَرَنِي الْعَلاَءُ بْنُ عَبْدِ الرَّحْمَنِ بْنِ يَعْقُوبَ – مَوْلَى الْحُرَقَةِ – عَنْ أَبِيهِ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((مِنْ عَلاَمَاتِ الْمُنَافِقِ ثَلاَثَةٌ: إِذَا حَدَّثَ كَذَبَ، وَإِذَا وَعَدَ أَخْلَفَ، وَإِذَا اؤْتُمِنَ خَانَ)).

**[212]-108-(...)** ........ Əbu Hureyrə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Üç şey münafiqin əlamətlərindəndir: danışdığı zaman yalan danışar, vəd verdiyi zaman (vədinə) xilaf çıxar, ona əmanət verildiyi zaman xəyanət edər".

**[٢١٣] ١٠٩-(...)** حَدَّثَنَا عُقْبَةُ بْنُ مُكْرَمٍ الْعَمِّيُّ: حَدَّثَنَا يَحْيَى بْنُ مُحَمَّدِ بْنِ قَيْسٍ أَبُو زُكَيْرٍ قَالَ: سَمِعْتُ الْعَلاَءَ بْنَ عَبْدِ الرَّحْمَنِ يُحَدِّثُ بِهَذَا الإِسْنَادِ وَقَالَ: ((آيَةُ الْمُنَافِقِ ثَلاَثٌ، وَإِنْ صَامَ وَصَلَّى وَزَعَمَ أَنَّهُ مُسْلِمٌ)).

**[213]-109-(...)** ........ Yəhya ibn Muhəmməd Alə ibn Abdur-Rəhmandan həmin isnadla (Peyğəmbərin ﷺ belə dediyini) rəvayət etmişdir: "Münafiqin əlaməti üçdür... oruc tutsa, namaz qılsa və müsəlman olduğunu iddia etsə belə".

**[٢١٤] ١١٠-(...)** و حَدَّثَنِي أَبُو نَصْرٍ التَّمَّارُ وَعَبْدُ الأَعْلَى بْنُ حَمَّادٍ قَالاَ: حَدَّثَنَا حَمَّادُ بْنُ سَلَمَةَ، عَنْ دَاوُدَ بْنِ أَبِي هِنْدٍ، عَنْ سَعِيدِ بْنِ الْمُسَيَّبِ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ بِمِثْلِ حَدِيثِ يَحْيَى بْنِ مُحَمَّدٍ عَنْ الْعَلاَءِ، ذَكَرَ فِيهِ: ((وَإِنْ صَامَ وَصَلَّى وَزَعَمَ أَنَّهُ مُسْلِمٌ)).

**[214]-110-(...)** ........ Səid ibn Museyyib (bu hədisi) Əbu Hureyrədən, o da Peyğəmbərdən ﷺ, Yəhya ibn Muhəmmədin Alə ibn Abdur-Rəhmandan (Peyğəmbərə ﷺ istinadən) rəvayət etdiyi hədisə yaxın mənada rəvayət etmiş və (bu hədisdə): "oruc tutsa, namaz qılsa və müsəlman olduğunu iddia etsə belə" sözlərini də zikr etmişdir.

## (٢٦) – بَابُ بَيَانِ حَالِ إِيمَانِ مَنْ قَالَ لأَخِيهِ الْمُسْلِمِ يَا كَافِرُ

## 26-cı fəsil. Müsəlman qardaşına: "Ey kafir!" deyən adamın imanının nə dərəcədə olduğunun bəyan edilməsi

**[٢١٥] ١١١–(٦٠)** حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا مُحَمَّدُ بْنُ بِشْرٍ وَعَبْدُ اللَّهِ بْنُ نُمَيْرٍ، قَالاَ: حَدَّثَنَا عُبَيْدُ اللَّهِ بْنُ عُمَرَ عَنْ نَافِعٍ، عَنِ ابْنِ عُمَرَ: أَنَّ النَّبِيَّ ﷺ قَالَ: ((إِذَا كَفَّرَ الرَّجُلُ أَخَاهُ فَقَدْ بَاءَ بِهَا أَحَدُهُمَا)).

**[215]-111-(60)** ........ İbn Ömər رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Adam (din) qardaşını kafir hesab etsə, ikisindən biri bu günahla geri dönər"[1].

---

[1] Alimlər bu hədisin mənasında ixtilaf etmişlər. Belə ki, haqq əhlinin etiqadına görə, adam öldürmək, zina etmək və başqa bu kimi böyük günahlar işlətmiş müsəlman kafir sayılmır. Qardaşına "kafir" deyən kimsə də habelə. Elə bu səbəbdən də, alimlər hədisin izahına dair müxtəlif rəylər söyləmişlər. Bunlar aşağıdakılardır:

Birincisi: Bu, din qardaşının kafir olduğuna etiqad edən kimsəyə aiddir. Beləsi kafir sayılır, yəni dediyi söz özünə aid edilir.

İkincisi: Din qardaşına ünvanladığı ittiham və bunun günahı onun özünə qayıdır. (Qeyd edək ki, bu ən doğru rəy sayılır.)

Üçüncüsü: Bu, möminləri kafir sayan xəvariclərə aiddir... Bu isə zəif rəydir. Belə ki, əksər alimlərin və tədqiqatçıların fikrincə xəvariclər də, digər bidətçilər kimi kafir sayılmırlar.

Dördüncüsü: Bu, söz sahibini aparıb küfrə çıxarır...

Beşincisi: Burada küfrün özü yox, ancaq hökmü söz sahibinə qayıdır. Yəni qardaşına kafir deyən şəxs sanki özünü təkfir etmiş olur... (Nəvəvi).

İbn Useymin demişdir: "Müsəlmanın kafir və ya fasiq olduğuna hökm verməzdən əvvəl iki məsələyə diqqət yetirmək vacibdir:

1. Həmin şəxsin etdiyi əməlin küfr və ya günah olduğuna dair Quranda və ya hədisdə dəlil-sübut tapılsın;

2. Müəyyən bir adamın kafir və ya fasiq olduğuna hökm vermək üçün buna dair qoyulmuş şərtlər bir araya gətirilsin.

Həmin şərtlərdən ən mühüm sayılanı isə, adamın bilərəkdən, haqqı inkar edərək günah işlətməsidir. Uca Allah buyurur: **"Hər kəs özünə doğru yol bəlli olduqdan sonra Peyğəmbərə qarşı çıxsa və möminlərin yolundan başqa bir yolla getsə, onu üz tutduğu yola yönəldər və Cəhənnəmdə yandırarıq. Ora nə pis dönüş yeridir"** ("ən-Nisa" surəsi, 115). Həmçinin buyurur:

**[٢١٦]** (...) و حَدَّثَنَا يَحْيَى بْنُ يَحْيَى التَّمِيمِيُّ وَيَحْيَى بْنُ أَيُّوبَ وَقُتَيْبَةُ بْنُ سَعِيدٍ وَعَلِيُّ بْنُ حُجْرٍ، جَمِيعًا عَنْ إِسْمَعِيلَ بْنِ جَعْفَرٍ – قَالَ يَحْيَى بْنُ يَحْيَى: أَخْبَرَنَا إِسْمَعِيلُ بْنُ جَعْفَرٍ – عَنْ عَبْدِ اللَّهِ بْنِ دِينَارٍ أَنَّهُ سَمِعَ ابْنَ عُمَرَ يَقُولُ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((أَيُّمَا امْرِئٍ قَالَ لأَخِيهِ: [يَا] كَافِرُ! فَقَدْ بَاءَ بِهَا أَحَدُهُمَا، إِنْ كَانَ كَمَا قَالَ، وَإِلاَّ رَجَعَتْ عَلَيْهِ)).

**[216] (...)** ........ İbn Ömər رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurmuşdur: "Hansı bir adam (din) qardaşına: "Ey kafir!" desə – əgər dediyi kimidirsə – ikisindən biri[1] bu günahla geri dönər. Yox, belə deyilsə, onda bu kəlmə onun özünə qayıdar".

## (٢٧) – بَابُ بَيَانِ حَالِ إِيمَانِ مَنْ رَغِبَ عَنْ أَبِيهِ وَهُوَ يَعْلَمُ

## 27-ci fəsil. Bilərəkdən öz atasından imtina edən kimsənin imanının nə dərəcədə olduğunun bəyan edilməsi

**[٢١٧]** ١١٢–(٦١) و حَدَّثَنِي زُهَيْرُ بْنُ حَرْبٍ: حَدَّثَنَا عَبْدُ الصَّمَدِ بْنُ عَبْدِ الْوَارِثِ: حَدَّثَنَا أَبِي: حَدَّثَنَا حُسَيْنٌ الْمُعَلِّمُ، عَنْ ابْنِ بُرَيْدَةَ، عَنْ يَحْيَى بْنِ يَعْمَرَ أَنَّ أَبَا الأَسْوَدِ حَدَّثَهُ عَنْ أَبِي ذَرٍّ، أَنَّهُ سَمِعَ رَسُولَ اللَّهِ

---

**"Allah bir qövmü doğru yola yönəltdikdən sonra uzaqlaşmaları zəruri olan şeylərdən onları xəbərdar etməyincə, onları həmin yoldan azdırmaz. Həqiqətən, Allah hər şeyi bilir. Həqiqətən, göylərin və yerin mülkü Allaha məxsusdur. O həm dirildir, həm də öldürür. Sizin Allahdan başqa nə bir himayədarınız, nə də bir köməkçiniz vardır"** ("ət-Tovbə" surəsi, 115-116). Elə buna görə də alimlər demişlər ki: "İslamı yenicə qəbul etmiş şəxs vacib əməllərdən birini inkar etsə belə, haqq ona aydın olmayınca, onu kafir saymaq olmaz.

Habelə, küfr və fasiqlik edən adam bunu öz iradəsi ilə deyil, məcburiyyət qarşısında edərsə, deyək ki, təzyiq altında qəlbi ilə etiqad etmədiyi bir şeyi dilinə gətirərsə, kafir sayılmaz. Bu xüsusda Uca Allah buyurur: **"Qəlbi imanla sabit qaldığı halda *haqqı danmağa* məcbur edilən kəslər istisna olmaqla, kim iman gətirdikdən sonra Allahı inkar etsə və qəlbini küfrə açsa, Allahın qəzəbinə düçar olar. Onlar üçün böyük bir əzab vardır"** ("ən-Nəhl" surəsi, 106). Və ya çox sevindiyindən, yaxud kədərləndiyindən, yaxud da qorxduğundan nə danışdığını bilmədən küfr etsə, yenə kafir sayılmaz. Buna imam Muslimin "Səhih" əsərində Ənəs ibn Malikdən رضي الله عنه rəvayət etdiyi hədisi dəlil göstərmək olar. Həmin hədisdə Peyğəmbər ﷺ belə buyurmuşdur: "Allahın, bəndəsi Ona tövbə edərkən onun tövbəsinə sevinməsi, sizlərdən (səhrada dəvəsini tapmış) kimsənin sevincindən daha artıqdır. O kimsə ki, dəvəsinə minib səhraya çıxdıqdan sonra dəvəsi ondan qaçmış, yeməyi və suyu da onun üstündə getmişdir. (Bundan sonra) həmin adam dəvəsindən əlini üzmüş və nəhayət, dəvəsini tapacağına ümidi qalmadığı halda gəlib bir ağacın kölgəsində uzanıb yatmışdır. O, bu vəziyyətdə ikən birdən dəvəsini öz yanında görmüş və dərhal onun ovsarından tutub sevincindən: "Allahım, Sən mənim qulumsan, mən də Sənin rəbbinəm!" – demişdir. Çox sevindiyindən belə bir xətaya yol vermişdir". ("Məcmu Fətavə və Rəsail", 3/255-257).

[1] Yəni qəsd edilən şəxs.

ﷺ يَقُولُ: ((لَيْسَ مِنْ رَجُلٍ ادَّعَى لِغَيْرِ أَبِيهِ وَهُوَ يَعْلَمُهُ، إِلاَّ كَفَرَ، وَمَنْ ادَّعَى مَا لَيْسَ لَهُ فَلَيْسَ مِنَّا، وَلْيَتَبَوَّأْ مَقْعَدَهُ مِنْ النَّارِ، وَمَنْ دَعَا رَجُلاً بِالْكُفْرِ، أَوْ قَالَ: عَدُوَّ اللَّهِ! وَلَيْسَ كَذَلِكَ، إِلاَّ حَارَ عَلَيْهِ)).

**[217]-112-(61)** ........ Əbu Zərr[1] ﷺ Peyğəmbərin ﷺ belə dediyini eşitmişdir: "Kim bilərəkdən doğma atasının deyil, başqa birisinin oğlu olduğunu iddia edərsə, küfr etmiş olar.[2] Kim sahibi olmadığı bir şeyin (özününkü olduğunu) iddia etsə, o bizdən deyildir[3] və qoy o (adam) oddan oturacağı yerə hazırlaşsın. Kim bir adamı: "Ey kafir!", yaxud "Ey Allahın düşməni" deyə çağırsa – əgər belə deyilsə – bunun günahı onun özünə qayıdar".

**[٢١٨] ١١٣-(٦٢)** حَدَّثَنِي هَارُونُ بْنُ سَعِيدٍ الأَيْلِيُّ: حَدَّثَنَا ابْنُ وَهْبٍ قَالَ: أَخْبَرَنِي عَمْرٌو عَنْ جَعْفَرِ بْنِ رَبِيعَةَ، عَنْ عِرَاكِ بْنِ مَالِكٍ، أَنَّهُ سَمِعَ أَبَا هُرَيْرَةَ يَقُولُ: إِنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: ((لاَ تَرْغَبُوا عَنْ آبَائِكُمْ، فَمَنْ رَغِبَ عَنْ أَبِيهِ فَهُوَ كُفْرٌ)).

**[218]-113-(62)** ........ Əbu Hureyrə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Atalarınızdan imtina etməyin! Kim atasından imtina edərsə, küfr etmiş olar".

**[٢١٩] ١١٤-(٦٣)** حَدَّثَنِي عَمْرٌو النَّاقِدُ: حَدَّثَنَا هُشَيْمُ بْنُ بَشِيرٍ: أَخْبَرَنَا خَالِدٌ عَنْ أَبِي عُثْمَانَ قَالَ: لَمَّا ادُّعِيَ زِيَادٌ، لَقِيتُ أَبَا بَكْرَةَ فَقُلْتُ لَهُ: مَا هَذَا الَّذِي صَنَعْتُمْ؟ إِنِّي سَمِعْتُ سَعْدَ بْنَ أَبِي وَقَّاصٍ يَقُولُ: سَمِعَ أُذُنَايَ مِنْ رَسُولِ اللَّهِ ﷺ وَهُوَ يَقُولُ: ((مَنْ ادَّعَى أَبًا فِي الإِسْلاَمِ غَيْرَ أَبِيهِ، يَعْلَمُ أَنَّهُ غَيْرُ أَبِيهِ، فَالْجَنَّةُ عَلَيْهِ حَرَامٌ)). فَقَالَ أَبُو بَكْرَةَ: وَأَنَا سَمِعْتُهُ مِنْ رَسُولِ اللَّهِ ﷺ.

**[219]-114-(63)** ........ Əbu Osman demişdir: "Ziyada yad bir nəsəb aid edildiyi[4] zaman mən Əbu Bəkrə[5] ilə görüşdüm və ona: "Sizin tutduğunuz bu

---

[1] Əbu Zərr əl-Ğifari ﷺ Peyğəmbərin ﷺ səhabəsidir. Adı: Cundəb ibn Cunadədir. O, hicrətin 31-ci ilində vəfat etmişdir.

[2] Əgər bu əməlin haram olduğunu bilə-bilə onu halal sayarsa, kafir sayılar. Yox əgər onun haram olduğunu qəbul edərək belə bir iddia edərsə, nankorluq etmiş olar.

[3] Yəni bizim yolumuzu tutub gedənlərdən deyil.

[4] Ziyad ibn Əbu Süfyan kimi özünü qələmə verən bu adama Ziyad ibn Əbiyhi (atasının oğlu) və ya Ziyad ibn Ummihi (anasının oğlu) deyilirdi. O, Əbu Bəkrənin doğma qardaşı idi və Ziyad ibn Ubeyd əs-Səqəfi kimi tanınırdı. Əvvəlcə Əli ibn Əbu Talibin ﷺ sirdaşı olmuş, sonra isə Müaviyə ibn Əbu Süfyana qoşulmuş və Əbu Süfyanın oğlu olduğunu iddia etmişdir. Elə buna görə də Əbu Osman, Ziyadın bu hərəkətini qınamış və Əbu Bəkrəyə öz etirazını bildirmişdir. Halbuki, Əbu Bəkrə Ziyadın bu yaramaz əməlini inkar etmiş, buna görə ondan üz döndərmiş və onu heç vaxt danışdırmayacağına and içmişdir. Ola bilsin ki, Əbu Osmanın bundan xəbəri yox imiş. Yaxud o: "Sizin tutduğunuz bu (əməl) nədir?!"– deyəndə: "Sənin qardaşının tutduğu bu yaramaz əməl necə də pisdir!" demək istəmişdir.

[5] Əbu Bəkrə ﷺ Peyğəmbərin ﷺ səhabəsidir. Adı: Nufey ibn Hərsdir. Bu səhabə hicrətin 51-ci, ya da 52-ci ilində vəfat etmişdir.

(əməl) nədir?! Mən Səd ibn Əbu Vəqqasın belə dediyini eşitmişəm: “Mən öz qulaqlarımla Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: “Kim müsəlman ola-ola, üstəlik atalığının öz atası olmadığını bilə-bilə qeyrisinin oğlu olduğunu iddia edərsə, Cənnət ona haram edilər”[1].

Əbu Bəkrə dedi: “Mən də bu hədisi Peyğəmbərdən ﷺ eşitmişəm.

**[٢٢٠] ١١٥**–(...) حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا يَحْيَى بْنُ زَكَرِيَّاءَ بْنِ أَبِي زَائِدَةَ وَأَبُو مُعَاوِيَةَ عَنْ عَاصِمٍ، عَنْ أَبِي عُثْمَانَ، عَنْ سَعْدٍ وَأَبِي بَكْرَةَ كِلَاهُمَا يَقُولُ: سَمِعَتْهُ أُذُنَايَ – وَوَعَاهُ قَلْبِي – مُحَمَّدًا ﷺ يَقُولُ: ((مَنْ ادَّعَى إِلَى غَيْرِ أَبِيهِ، وَهُوَ يَعْلَمُ أَنَّهُ غَيْرُ أَبِيهِ، فَالْجَنَّةُ عَلَيْهِ حَرَامٌ)).

**[220]-115-(...)** ........ Səd və Əbu Bəkrə – hər ikisi belə rəvayət etmişdir: “Mən Peyğəmbərin ﷺ belə dediyini (bu) iki qulağımla eşitmişəm və onu qəlbimə həkk etmişəm: “Kim bilərəkdən yad bir adamın öz atası olduğunu iddia edərsə, Cənnət ona haram edilər”.

## (٢٨) – بَابُ بَيَانِ قَوْلِ النَّبِيِّ ﷺ: ((سِبَابُ الْمُسْلِمِ فُسُوقٌ وَقِتَالُهُ كُفْرٌ))

## 28-ci fəsil. Peyğəmbərin ﷺ: “Müsəlmanı söymək günah, ona qarşı vuruşmaq isə küfrdür” sözünün bəyan edilməsi

**[٢٢١] ١١٦**–(٦٤) حَدَّثَنَا مُحَمَّدُ بْنُ بَكَّارِ بْنِ الرَّيَّانِ وَعَوْنُ بْنُ سَلَّامٍ قَالَا: حَدَّثَنَا مُحَمَّدُ بْنُ طَلْحَةَ؛ ح: و حَدَّثَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى: حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ بْنُ مَهْدِيٍّ: حَدَّثَنَا سُفْيَانُ؛ ح: و حَدَّثَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى: حَدَّثَنَا مُحَمَّدُ بْنُ جَعْفَرٍ: حَدَّثَنَا شُعْبَةُ كُلُّهُمْ عَنْ زُبَيْدٍ، عَنْ أَبِي وَائِلٍ، عَنْ عَبْدِ اللَّهِ بْنِ مَسْعُودٍ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((سِبَابُ الْمُسْلِمِ فُسُوقٌ وَقِتَالُهُ كُفْرٌ)) قَالَ زُبَيْدٌ: فَقُلْتُ لِأَبِي وَائِلٍ: أَنْتَ سَمِعْتَهُ مِنْ عَبْدِ اللَّهِ يَرْوِيهِ عَنْ رَسُولِ اللَّهِ ﷺ؟ قَالَ نَعَمْ.

وَلَيْسَ فِي حَدِيثِ شُعْبَةَ قَوْلُ زُبَيْدٍ لِأَبِي وَائِلٍ.

**[221]-116-(64)** ........ Abdullah ibn Məsud رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Müsəlmanı söymək fasiqlik, ona qarşı vuruşmaq isə küfrdür[2]”.

---

[1] İman kitabının 10-cu fəslinin, habelə 141-ci və 172-ci hədislərin qeydlərinə bax.

[2] Burada “fasiqlik” deyildikdə Allahın və Onun peyğəmbərinin ﷺ itaətindən çıxmaq nəzərdə tutulur. İslam alimlərinin yekdil fikrinə əsasən müsəlmanı haqsız yerə söymək haram, bunu edən adam isə fasiq sayılır. O ki qaldı nahaq yerə müsəlmanla vuruşmağa, haqqı rəhbər tutan alimlərə görə beləsi, kafir sayılmır. Yalnız müsəlmanın qanını halal sayanlar müstəsnadır. Beləri haramı halal saydığına görə kafir sayılırlar.

Zubeyd dedi: “Mən Əbu Vaildən: “Sən özün Abdullah ibn Məsudun bu hədisi Peyğəmbərdən ﷺ rəvayət etdiyini eşitmisənmi?”– deyə soruşdum”. O: “Bəli!”– deyə cavab verdi.

Şobənin hədisində Zubeydin Əbu Vailə dedikləri rəvayət edilməmişdir.

**[٢٢٢] ١١٧**–(...) حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ وَابْنُ الْمُثَنَّى، عَنْ مُحَمَّدِ بْنِ جَعْفَرٍ، عَنْ شُعْبَةَ، عَنْ مَنْصُورٍ؛ ح: و حَدَّثَنَا ابْنُ نُمَيْرٍ، حَدَّثَنَا عَفَّانُ حَدَّثَنَا شُعْبَةُ عَنْ الأَعْمَشِ، كِلاَهُمَا عَنْ أَبِي وَائِلٍ، عَنْ عَبْدِ اللَّهِ عَنْ النَّبِيِّ ﷺ بِمِثْلِهِ.

**[222]-117-(...)** ........ Mənsur və Aməş – hər ikisi (yuxarıdakı hədisi) Əbu Vaildən, o da Abdullahdan, o da Peyğəmbərdən ﷺ eyni ilə rəvayət etmişlər.

## (٢٩) – بَابُ بَيَانِ مَعْنَى قَوْلِ النَّبِيِّ ﷺ: ((لاَ تَرْجِعُوا بَعْدِي كُفَّارًا يَضْرِبُ بَعْضُكُمْ رِقَابَ بَعْضٍ))

## 29-cu fəsil. Peyğəmbərin ﷺ: “Məndən sonra bir-birinizin boynunu vuraraq kafir olmayın!” sözünün mənasının bəyan edilməsi

**[٢٢٣] ١١٨**–(٦٥) حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ وَمُحَمَّدُ بْنُ الْمُثَنَّى وَابْنُ بَشَّارٍ، جَمِيعًا عَنْ مُحَمَّدِ بْنِ جَعْفَرٍ، عَنْ شُعْبَةَ؛ ح: و حَدَّثَنَا عُبَيْدُ اللَّهِ بْنُ مُعَاذٍ، وَاللَّفْظُ لَهُ: حَدَّثَنَا أَبِي: حَدَّثَنَا شُعْبَةُ عَنْ عَلِيِّ بْنِ مُدْرِكٍ، سَمِعَ أَبَا زُرْعَةَ يُحَدِّثُ عَنْ جَدِّهِ جَرِيرٍ قَالَ: قَالَ لِي النَّبِيُّ ﷺ فِي حَجَّةِ الْوَدَاعِ: ((اسْتَنْصِتْ النَّاسَ)) ثُمَّ قَالَ: ((لاَ تَرْجِعُوا بَعْدِي كُفَّارًا يَضْرِبُ بَعْضُكُمْ رِقَابَ بَعْضٍ)).

**[223]-118-(65)** ........ Cərir رضي الله عنه demişdir: “Peyğəmbər ﷺ Vida həccində[1] mənə: “Camaata, susub (məni) dinləməyi əmr et”– dedi. (Hamı susduqdan) sonra o, belə buyurdu: “Məndən sonra bir-birinizin boynunu vuraraq kafir olmayın![2]”

---

[1] Peyğəmbər ﷺ həcc ziyarəti əsnasında vida xütbəsi verdiyinə görə bu həcc, Vida həcci adlandırılmışdır.

[2] Alimlər bu hədisin mənasını aşağıdakı kimi yozmuşlar:
– haqsız yerə bir-birinizi kafir saymayın;
– (Allahın sizə əta etdiyi) nemətlərə küfr etməyin;
– bir-birinizi kafir saymayın ki, bu sizi bir-birinizlə vuruşmağa vadar etməsin;
– kafirlərin işlərinə bənzər işlər görməyin;
– kafir olmayın, əksinə, müsəlmançılığınızda sabit qalın;
– bir-birinizin üstünə silah çəkməyin;
Qazı İyad رحمه الله bu yozumların dördüncüsünün daha doğru olduğunu söyləmişdir.

[٢٢٤] ١١٩-(٦٦) و حَدَّثَنَا عُبَيْدُ اللَّهِ بْنُ مُعَاذٍ: حَدَّثَنَا أَبِي: حَدَّثَنَا شُعْبَةُ عَنْ وَاقِدِ بْنِ مُحَمَّدٍ، عَنْ أَبِيهِ، عَنْ ابْنِ عُمَرَ عَنْ النَّبِيِّ ﷺ بِمِثْلِهِ.

**[224]-119-(66)** ........ Şobə (bu hədisi) Vaqid ibn Muhəmməddən, o da öz atasından, o da ibn Ömərdən, o da Peyğəmbərdən ﷺ eyni ilə rəvayət etmişdir.

[٢٢٥] ١٢٠-(...) و حَدَّثَنِي أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ وَأَبُو بَكْرِ بْنُ خَلَّادٍ الْبَاهِلِيُّ قَالاَ: حَدَّثَنَا مُحَمَّدُ بْنُ جَعْفَرٍ: حَدَّثَنَا شُعْبَةُ عَنْ وَاقِدِ بْنِ مُحَمَّدِ بْنِ زَيْدٍ؛ أَنَّهُ سَمِعَ أَبَاهُ يُحَدِّثُ عَنْ عَبْدِ اللَّهِ بْنِ عُمَرَ، عَنْ النَّبِيِّ ﷺ أَنَّهُ قَالَ فِي حَجَّةِ الْوَدَاعِ: ((وَيْحَكُمْ! - أَوْ قَالَ: وَيْلَكُمْ - لاَ تَرْجِعُوا بَعْدِي كُفَّارًا يَضْرِبُ بَعْضُكُمْ رِقَابَ بَعْضٍ)).

**[225]-120-(...)** ........ Abdullah ibn Ömər رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ Vida həccində demişdir: “Ay yazıqlar! (yaxud: Ay biçarələr!) Məndən sonra bir-birinizin boynunu vuraraq kafir olmayın!”

[٢٢٦] (...) حَدَّثَنِي حَرْمَلَةُ بْنُ يَحْيَى: أَخْبَرَنَا عَبْدُ اللَّهِ بْنُ وَهْبٍ قَالَ: حَدَّثَنِي عُمَرُ بْنُ مُحَمَّدٍ؛ أَنَّ أَبَاهُ حَدَّثَهُ عَنْ ابْنِ عُمَرَ عَنْ النَّبِيِّ ﷺ بِمِثْلِ حَدِيثِ شُعْبَةَ عَنْ وَاقِدٍ.

**[226] (...)** ........ Ömər ibn Muhəmməd öz atasından, o da ibn Ömərdən, o da Peyğəmbərdən ﷺ (bu hədisi) Şobənin Vaqiddən rəvayət etdiyi kimi rəvayət etmişdir.

## (٣٠) – بَابُ إِطْلَاقِ اسْمِ الْكُفْرِ عَلَى الطَّعْنِ فِي النَّسَبِ وَالنِّيَاحَةِ

## 30-cu fəsil. Əsil-nəsəbə tənə vurmağın və ölünün üstündə vay-şivən salaraq ağlamağın küfr adlandırılması

[٢٢٧] ١٢١-(٦٧) و حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا أَبُو مُعَاوِيَةَ؛ ح: و حَدَّثَنَا ابْنُ نُمَيْرٍ – وَاللَّفْظُ لَهُ – حَدَّثَنَا أَبِي وَمُحَمَّدُ بْنُ عُبَيْدٍ كُلُّهُمْ عَنْ الأَعْمَشِ، عَنْ أَبِي صَالِحٍ عَنْ أَبِي هُرَيْرَةَ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((اثْنَتَانِ فِي النَّاسِ هُمَا بِهِمْ كُفْرٌ: الطَّعْنُ فِي النَّسَبِ وَالنِّيَاحَةُ عَلَى الْمَيِّتِ)).

**[227]-121-(67)** ........ Əbu Hureyrə رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “İnsanlarda iki (xislət) vardır ki, bunların onlarda olması küfrdür[1]: (Bu,) əsil-nəsəbə tənə vurmaq və ölünün üstündə vay-şivən salıb ağlamaq”.

---

[1] Yəni bunlar kafirlərin adətlərindən və cahillərin əxlaqındandır. Hədisdən bu əməllərin haram buyurulduğu açıq-aydın görünür.

## (٣١) – بَابُ تَسْمِيَةِ الْعَبْدِ الآبِقِ كَافِرًا

## 31-ci fəsil. Qaçmış köləni kafir[1] adlandırmaq

**[٢٢٨] ١٢٢–(٦٨)** حَدَّثَنَا عَلِيُّ بْنُ حُجْرٍ السَّعْدِيُّ: حَدَّثَنَا إِسْمَعِيلُ يَعْنِي ابْنَ عُلَيَّةَ عَنْ مَنْصُورِ بْنِ عَبْدِ الرَّحْمَنِ، عَنْ الشَّعْبِيِّ، عَنْ جَرِيرٍ أَنَّهُ سَمِعَهُ يَقُولُ: ((أَيُّمَا عَبْدٍ أَبَقَ مِنْ مَوَالِيهِ فَقَدْ كَفَرَ، حَتَّى يَرْجِعَ إِلَيْهِمْ)).
قَالَ مَنْصُورٌ: قَدْ وَاللَّهِ، رُوِيَ عَنْ النَّبِيِّ ﷺ، وَلَكِنِّي أَكْرَهُ أَنْ يُرْوَى عَنِّي هَهُنَا بِالْبَصْرَةِ.

**[228]-122-(68)** ........ Şəbi Cəririn belə dediyini eşitmişdir: "Ağalarından qaçmış kölə onların yanına qayıdanadək küfr etmiş sayılar".

Mənsur demişdir: "Vallahi, bu hədis Peyğəmbərdən ﷺ rəvayət edilmişdir. Lakin mən burada – Bəsrədə – bu hədisin məndən rəvayət olunmasını istəmirəm.

**[٢٢٩] ١٢٣–(٦٩)** حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا حَفْصُ بْنُ غِيَاثٍ عَنْ دَاوُدَ، عَنْ الشَّعْبِيِّ، عَنْ جَرِيرٍ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((أَيُّمَا عَبْدٍ أَبَقَ فَقَدْ بَرِئَتْ مِنْهُ الذِّمَّةُ)).

**[229]-123-(69)** ........ Cərir ؓ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Hansı bir kölə (ağasından) qaçsa, (İslam) himayəsindən çıxmış olar"[2].

**[٢٣٠] ١٢٤–(٧٠)** حَدَّثَنَا يَحْيَى بْنُ يَحْيَى: أَخْبَرَنَا جَرِيرٌ، عَنْ مُغِيرَةَ، عَنْ الشَّعْبِيِّ قَالَ: كَانَ جَرِيرُ بْنُ عَبْدِ اللَّهِ يُحَدِّثُ عَنْ النَّبِيِّ ﷺ قَالَ: ((إِذَا أَبَقَ الْعَبْدُ لَمْ تُقْبَلْ لَهُ صَلاَةٌ)).

**[230]-124-(70)** ........ Cərir ibn Abdullah ؓ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Kölə (ağasından) qaçarsa, onun namazı qəbul olunmaz[3]".

---

[1] Burada "kafir" deyildikdə bu əməlin kafirlərin adətlərindən və cahillərin əxlaqından olması, yaxud o kölənin nankorluq etməsi, yaxud bu əməlin həmin köləni küfrə yönəltməsi, yaxud da ağadan qaçmağı halal sayan kölənin kafir sayılması qəsd edilir.

[2] Əbu Amr ibn əs-Səlah demişdir: "Burada "himayə" deyidikdə, həmin kölənin ağasının, habelə Allahın və Onun rəsulunun ﷺ himayəsi nəzərdə tutulur".

[3] İbn əs-Səlah demişdir: "Namazın qəbul olunmaması, heç də onun düzgün yerinə yetirilməmiş olduğuna dəlalət etmir. DeməK, ağasından qaçmış kölənin namazı səhihdir, lakin məqbul deyildir. Səhih olması ona görədir ki, namazın şərtlərini və ərkanlarını yerinə yetirmiş, məqbul sayılmaması da ona görədir ki, ağasından qaçmaqla günaha batmışdır. Bundan belə nəticə çıxır ki, namaza görə savab qazanılmasa da, həmin namazın qəzasını yerinə yetirməyə lüzum yoxdur.

## (٣٢) – بَابُ بَيَانِ كُفْرِ مَنْ قَالَ مُطِرْنَا بِالنَّوْءِ

## 32-ci fəsil. "Bizə filan ulduz sayəsində yağış yağdı" deyən kimsənin küfr etdiyinin bəyan olunması

**[٢٣١] ١٢٥**–(٧١) حَدَّثَنَا يَحْيَى بْنُ يَحْيَى قَالَ: قَرَأْتُ عَلَى مَالِك عَنْ صَالِحِ بْنِ كَيْسَانَ، عَنْ عُبَيْدِ اللَّه بْنِ عَبْد اللَّه بْنِ عُتْبَةَ، عَنْ زَيْد بْنِ خَالد الْجُهَنِيِّ قَالَ: صَلَّى بِنَا رَسُولُ اللَّه ﷺ صَلَاةَ الصُّبْحِ بِالْحُدَيْبِيَة فِي إِثْرِ السَّمَاءِ كَانَتْ مِنْ اللَّيْلِ، فَلَمَّا انْصَرَفَ أَقْبَلَ عَلَى النَّاسِ فَقَالَ: ((هَلْ تَدْرُونَ مَاذَا قَالَ رَبُّكُمْ؟)) قَالُوا: اللَّهُ وَرَسُولُهُ أَعْلَمُ. قَالَ: ((قَالَ: أَصْبَحَ مِنْ عِبَادِي مُؤْمِنٌ بِي وَكَافِرٌ، فَأَمَّا مَنْ قَالَ: مُطِرْنَا بِفَضْلِ اللَّه وَرَحْمَته، فَذَلِكَ مُؤْمِنٌ بِي كَافِرٌ بِالْكَوْكَبِ، وَأَمَّا مَنْ قَالَ: مُطِرْنَا بِنَوْءِ كَذَا وَكَذَا، فَذَلِكَ كَافِرٌ بِي مُؤْمِنٌ بِالْكَوْكَبِ)).

**[231]-125-(71)** ........ Zeyd ibn Xalid əl-Cuhəni ﵁ demişdir: "Peyğəmbər ﷺ Hudeybiyyədə[1] gecə ikən yağmış yağışdan sonra bizə sübh namazını qıldırdı və namazı bitirdikdən sonra üzünü camaata çevirib soruşdu: "Bilirsinizmi, Rəbbiniz nə buyurdu?" (Səhabələr:) "Allah və Onun elçisi daha yaxşı bilir"– deyə cavab verdilər. Peyğəmbər ﷺ dedi: "(Allah buyurdu): "Qullarımdan bir qismi mömin, digər qismi isə kafir oldu. "Bizə Allahın lütfü və mərhəməti sayəsində yağış göndərilmişdir"– deyənlərə gəlincə, onlar Mənə iman gətirmiş və ulduzlara küfr etmişlər. "Yağış bizə filan və filan ulduza görə nazil olmuşdur"– deyənlərə gəldikdə isə, onlar Mənə küfr etmiş və ulduzlara iman gətirmişlər"[2].

---

[1] Hudeybiyyə – Məkkənin 16 kilometrliyində, Ciddəyə gedən yolda yerləşən yer. Hicri tarixinin 6-cı ilində orada Muhəmməd Peyğəmbərlə ﷺ müsəlmanları şəhərə buraxmayan və onları ümrə ziyarəti etməyə qoymayan məkkəlilər arasında sülh müqaviləsi bağlanmışdır.

[2] Hər kim yağışın məhz ulduzun sayəsində yağmasına etiqad edərsə, Allaha küfr etmiş və İslam ümmətindən xaric olmuş olar. Beləsinin kafir olduğuna heç bir şəkk-şübhə ola bilməz. Və əgər "yağış bizə filan və filan ulduza görə nazil olmuşdur"– desə, həm də onun Allahın rəhməti və istəyi ilə nazil olduğuna etiqad edərsə, kafir sayılmaz. Beləsi nankor və cahil sayılar. Bu fikir bu hədisdən sonra gələn hədislərdə öz əksini tapmışdır (Nəvəvi).

İbn Abdul-Bərr demişdir: "Yağış bizə filan və filan ulduza görə nazil olmuşdur"– yəni filan ulduzun batması və ya filan ulduzun doğmazı sayəsində bizə yağış yağır" sözünü deyən adam Allahın yox, ulduzun yağış yaratdığına və onu yerə endirdiyinə, habelə buludları idarə etdiyinə etiqad edərsə, kafir sayılar və İslam ümmətindən çıxmış olar. Beləsi tövbə edib dinə-imana qayıtmalı, əks halda isə cəzalandırılmalıdır.

Yox əgər Allahın ulduzu sadəcə yağışın yağması üçün bir işarə, vaxt və səbəb yaratdığına etiqad edərsə, – necə ki, yağışın sayəsində yer cana gəlir və onun vasitəsilə orada növbənöv bitkilər yetişir, – kafir sayılmaz. Lakin belə cahilə yağışın məhz Allahın hikməti, rəhməti və qüdrəti ilə nazil olduğunu bildirmək lazımdır" ("əl-İstizkar", 2/436; "əd-Dibac alə Muslim", 1/89).

**[٢٣٢] ١٢٦-(٧٢)** حَدَّثَنِي حَرْمَلَةُ بْنُ يَحْيَى وَعَمْرُو بْنُ سَوَّادٍ الْعَامِرِيُّ وَمُحَمَّدُ بْنُ سَلَمَةَ الْمُرَادِيُّ – قَالَ الْمُرَادِيُّ: حَدَّثَنَا عَبْدُ اللَّهِ بْنُ وَهْبٍ عَنْ يُونُسَ، وَقَالَ الآخَرَانِ: أَخْبَرَنَا – ابْنُ وَهْبٍ قَالَ: أَخْبَرَنِي يُونُسُ عَنِ ابْنِ شِهَابٍ قَالَ: حَدَّثَنِي عُبَيْدُ اللَّهِ بْنُ عَبْدِ اللَّهِ بْنِ عُتْبَةَ أَنَّ أَبَا هُرَيْرَةَ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((أَلَمْ تَرَوْا إِلَى مَا قَالَ رَبُّكُمْ؟ قَالَ: مَا أَنْعَمْتُ عَلَى عِبَادِي مِنْ نِعْمَةٍ إِلاَّ أَصْبَحَ فَرِيقٌ [مِنْهُمْ] بِهَا كَافِرِينَ، يَقُولُونَ: الْكَوَاكِبُ وَبِالْكَوَاكِبِ)).

**[232]-126-(72)** ........ Əbu Hureyrə ﷺ rəvayət edir ki, (bir dəfə) Peyğəmbər ﷺ dedi: “Rəbbinizin nə buyurduğunu görmədinizmi? O buyurdu ki: “Qullarıma nə zaman bir nemət bəxş etdimsə, [onlardan] bir qismi: “(Bunu) ulduz elədi, (bu,) ulduz sayəsində oldu”– deyərək küfr etdi”.

**[٢٣٣]** (...) و حَدَّثَنِي مُحَمَّدُ بْنُ سَلَمَةَ الْمُرَادِيُّ: حَدَّثَنَا عَبْدُ اللَّهِ بْنُ وَهْبٍ عَنْ عَمْرِو بْنِ الْحَارِثِ؛ **ح:** و حَدَّثَنِي عَمْرُو بْنُ سَوَّادٍ: أَخْبَرَنَا عَبْدُ اللَّهِ بْنُ وَهْبٍ: أَخْبَرَنَا عَمْرُو بْنُ الْحَارِثِ أَنَّ أَبَا يُونُسَ مَوْلَى أَبِي هُرَيْرَةَ حَدَّثَهُ، عَنْ أَبِي هُرَيْرَةَ، عَنْ رَسُولِ اللَّهِ ﷺ قَالَ: ((مَا أَنْزَلَ اللَّهُ مِنَ السَّمَاءِ مِنْ بَرَكَةٍ إِلاَّ أَصْبَحَ فَرِيقٌ مِنَ النَّاسِ بِهَا كَافِرِينَ، يُنْزِلُ اللَّهُ الْغَيْثَ فَيَقُولُونَ: الْكَوْكَبُ كَذَا وَكَذَا)) وَفِي حَدِيثِ الْمُرَادِيِّ: ((بِكَوْكَبِ كَذَا وَكَذَا)).

**[233] (...)** ........ Əbu Hureyrə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Allah göydən nə zaman bərəkət endirmişdirsə, insanlardan bir qismi bu nemətə nankorluq etmişdir: Allah yağış endirir, insanlar isə: “Filan və filan ulduz (endirir)”– deyirlər”.

Muradinin rəvayətində isə: “Filan və filan ulduz sayəsində (yağış yağır)”– deyirlər”.

**[٢٣٤] ١٢٧-(٧٣)** و حَدَّثَنِي عَبَّاسُ بْنُ عَبْدِ الْعَظِيمِ الْعَنْبَرِيُّ: حَدَّثَنَا النَّضْرُ بْنُ مُحَمَّدٍ: حَدَّثَنَا عِكْرِمَةُ وَهُوَ ابْنُ عَمَّارٍ: حَدَّثَنَا أَبُو زُمَيْلٍ قَالَ: حَدَّثَنِي ابْنُ عَبَّاسٍ قَالَ: مُطِرَ النَّاسُ عَلَى عَهْدِ النَّبِيِّ ﷺ فَقَالَ النَّبِيُّ ﷺ: ((أَصْبَحَ مِنَ النَّاسِ شَاكِرٌ وَمِنْهُمْ كَافِرٌ، قَالُوا هَذِهِ رَحْمَةُ اللَّهِ، وَقَالَ بَعْضُهُمْ: لَقَدْ صَدَقَ نَوْءُ كَذَا وَكَذَا)) قَالَ: فَنَزَلَتْ هَذِهِ الآيَةُ: ﴿فَلَآ أُقْسِمُ بِمَوَٰقِعِ ٱلنُّجُومِ ﴿٧٥﴾﴾، حَتَّى بَلَغَ: ﴿وَتَجْعَلُونَ رِزْقَكُمْ أَنَّكُمْ تُكَذِّبُونَ ﴿٨٢﴾﴾

**[234]-127-(73)** ........ Abdullah ibn Abbas ﷺ demişdir: “Peyğəmbərin ﷺ zamanında insanlara yağış yağdı və Peyğəmbər ﷺ buyurdu: “Bu gün insanlardan kimisi şükr edən (bəndə), kimisi də kafir oldu! (Bəziləri): “Bu yağış Allahın rəhmətidir!”– dedilər. Bəziləri də: “Filan və filan ulduzun ehtimalı doğru çıxdı![1]”– dedilər. Beləliklə də bu ayələr nazil oldu: **“Ulduzların batdığı yerlərə**

[1] Bəziləri yağışın məhz Allahın izni ilə yağmasına iman gətirməklə şükür edənlər, bəziləri də onun məhz ulduzların izni ilə yağmasına inanmaqla kafir oldular!

**and olsun! Kaş bunun, doğrudan da, böyük bir and olduğunu biləydiniz. Həqiqətən, bu, ehtirama layiq Qurandır, qorunub saxlanılan Yazıdadır** (Lövhi-məhfuzdadır[1]). **Ona yalnız pak olanlar toxunur. O, aləmlərin Rəbbindən nazil edilmişdir. Siz bu kəlamı yalan sayırsınız?! Sizə verilən ruziyə şükür etməyi, onu yalan saymaqla yerinə yetirirsiniz?! Can boğaza yetişdiyi zaman – həmin an siz can verən adama baxırsınız. Biz ona sizdən daha yaxın oluruq, siz isə bunu görmürsünüz".**[2]

## (٣٣) – بَابُ الدَّلِيلِ عَلَى أَنَّ حُبَّ الأَنْصَارِ وَعَلِيٍّ ﷺ مِنْ الإِيمَانِ وَعَلاَمَاتِهِ وَبُغْضِهِمْ مِنْ عَلاَمَاتِ النِّفَاقِ

## 33-cü fəsil. Ənsarı[3] və Əlini[4] ﷺ sevməyin imandan və iman əlamətlərindən, onlara nifrət etməyin[5] isə münafiqlik əlamətlərindən olmasına dair dəlillər

**[٢٣٥] ١٢٨–(٧٤)** حَدَّثَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى: حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ بْنُ مَهْدِيٍّ عَنْ شُعْبَةَ، عَنْ عَبْدِ اللَّهِ بْنِ عَبْدِ اللَّهِ بْنِ جَبْرٍ قَالَ: سَمِعْتُ أَنَسًا قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((آيَةُ الْمُنَافِقِ بُغْضُ الأَنْصَارِ وَآيَةُ الْمُؤْمِنِ حُبُّ الأَنْصَارِ)).

---

[1] Ərəbcə, qorunan lövhə deməkdir. İslamda – olmuş və olacaq hər şeyin yazıldığı ilahi bir Kitab. Lövhi-məhfuz Allahın elmi və sifətləri ilə bağlıdır. Onun qorunan, hifz edilən kimi adlandırılmasının səbəbi, onda yazılmış ilahi məlumatlara hər hansı bir müdaxilənin mümkün olmaması, onların dəyişdirilməsinin imkansızlığı və mütləq mühafizə edilməsidir.

[2] "əl-Vaqiə" surəsi, 75-82.

[3] İslamı qəbul etmiş və Muhəmməd Peyğəmbərin ﷺ sədaqətli silahdaşları olmuş Mədinənin yerli sakinləri. Onlar Məkkədən və başqa şəhərlərdən gələn mühacirləri evlərinə qəbul edir və onları zəruri əşyalarla təmin edirdilər.

[4] Əli ibn Əbu Talib ﷺ: Peyğəmbərin ﷺ əmisi oğlu və kürəkəni, onun iki nəvəsi – Həsən və Huseynin atası idi. İslamı qəbul edən ilk yeniyetmə olmuşdur.

[5] Burada söhbət dünyəvi işlərdə olan nifrətdən deyil, məhz dinlə bağlı olan nifrətdən gedir. Dünyəvi işlərdə möminlərdən bir dəstənin başqa birisinə nifrət edib ona qarşı vuruşması onların münafiq olmasına dəlalət etmir. Uca Allah bu xüsusda buyurur: **"Əgər möminlərdən iki dəstə bir-biri ilə vuruşsa, onları barışdırın. Əgər onlardan biri digərinə qarşı təcavüz etsə, təcavüzkar dəstə ilə, o, Allahın əmrini *yerinə yetirməyə* qayıdanadək, vuruşun. Əgər o qayıtsa, hər iki dəstəni ədalətlə barışdırın və insaflı olun. Sözsüz ki, Allah insaflıları sevir. Möminlər, həqiqətən də qardaşdırlar. Elə isə qardaşlarınızı barışdırın və Allahdan qorxun ki, sizə rəhm edilsin"** ("əl-Hucurat" surəsi, 9-10). Peyğəmbər ﷺ minbərdə ikən nəvəsi Həsənə baxıb demişdir: "Mənim bu oğlum çox hörmətli şəxsiyyətdir. (Vaxt gələcək) o, müsəlmanlardan iki böyük dəstənin arasında sülh bağlayacaq" ("Sunən Əbu Davud", 664).

**[235]-128-(74)** ........ Ənəs ﷺ rəvayət edir ki, Rəsulullah ﷺ demişdir: “Münafiqin əlaməti ənsara nifrət etmək, mömininin əlaməti isə ənsarı sevməkdir”.

**[٢٣٦]** (...) حَدَّثَنَا يَحْيَى بْنُ حَبِيبٍ الْحَارِثِيُّ: حَدَّثَنَا خَالِدٌ يَعْنِي ابْنَ الْحَارِثِ: حَدَّثَنَا شُعْبَةُ عَنْ عَبْدِ اللَّهِ بْنِ عَبْدِ اللَّهِ، عَنْ أَنَسٍ عَنِ النَّبِيِّ ﷺ أَنَّهُ قَالَ: ((حُبُّ الأَنْصَارِ آيَةُ الإِيمَانِ وَبُغْضُهُمْ آيَةُ النِّفَاقِ)).

**[236] (...)** ........ Ənəs ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Ənsarı sevmək iman əlaməti, onlara nifrət etmək isə münafiqlik əlamətidir”.

**[٢٣٧] ١٢٩-(٧٥)** و حَدَّثَنِي زُهَيْرُ بْنُ حَرْبٍ قَالَ: حَدَّثَنِي مُعَاذُ بْنُ مُعَاذٍ؛ **ح**: و حَدَّثَنَا عُبَيْدُ اللَّهِ بْنُ مُعَاذٍ – وَاللَّفْظُ لَهُ – حَدَّثَنَا أَبِي: حَدَّثَنَا شُعْبَةُ عَنْ عَدِيِّ بْنِ ثَابِتٍ قَالَ: سَمِعْتُ الْبَرَاءَ يُحَدِّثُ عَنِ النَّبِيِّ ﷺ أَنَّهُ قَالَ فِي الأَنْصَارِ: ((لاَ يُحِبُّهُمْ إِلاَّ مُؤْمِنٌ وَلاَ يُبْغِضُهُمْ إِلاَّ مُنَافِقٌ، مَنْ أَحَبَّهُمْ أَحَبَّهُ اللَّهُ، وَمَنْ أَبْغَضَهُمْ أَبْغَضَهُ اللَّهُ)).
قَالَ شُعْبَةُ: قُلْتُ لِعَدِيٍّ: سَمِعْتَهُ مِنَ الْبَرَاءِ؟ قَالَ: إِيَّايَ حَدَّثَ!

**[237]-129-(75)** ........ Bəra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ ənsar haqqında belə demişdir: “Onları yalnız mömin sevər və onlara yalnız münafiq nifrət edər. Kim onları sevsə, Allah da onu sevər. Kim onlara nifrət etsə, Allah da ona nifrət edər”.

Şobə demişdir: “Mən Adiydən: “Sən bu hədisi Bəradan eşitmisənmi?”– deyə soruşdum. (Adiy): “O (bu hədisi) mənə rəvayət etmişdir”– deyə cavab verdi.

**[٢٣٨] ١٣٠-(٧٦)** حَدَّثَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ: حَدَّثَنَا يَعْقُوبُ يَعْنِي ابْنَ عَبْدِ الرَّحْمَنِ الْقَارِيَّ عَنْ سُهَيْلٍ، عَنْ أَبِيهِ، عَنْ أَبِي هُرَيْرَةَ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: ((لاَ يُبْغِضُ الأَنْصَارَ رَجُلٌ يُؤْمِنُ بِاللَّهِ وَالْيَوْمِ الآخِرِ)).

**[238]-130-(76)** ........ Əbu Hureyrə ﷺ rəvayət edir ki, Rəsulullah ﷺ belə demişdir: “Allaha və Axirət gününə iman gətirən adam ənsara nifrət etməz”.

**[٢٣٩]** (٧٧) و حَدَّثَنَا عُثْمَانُ بْنُ مُحَمَّدِ بْنِ أَبِي شَيْبَةَ: حَدَّثَنَا جَرِيرٌ؛ **ح**: و حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا أَبُو أُسَامَةَ، كِلاَهُمَا عَنِ الأَعْمَشِ، عَنْ أَبِي صَالِحٍ، عَنْ أَبِي سَعِيدٍ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((لاَ يُبْغِضُ الأَنْصَارَ رَجُلٌ يُؤْمِنُ بِاللَّهِ وَالْيَوْمِ الآخِرِ)).

**[239] (77)** ........ Əbu Səid ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Allaha və Axirət gününə iman gətirən adam ənsara nifrət etməz”.

**[٢٤٠] ١٣١**-(٧٨) حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا وَكِيعٌ وَأَبُو مُعَاوِيَةَ عَنْ الأَعْمَشِ؛ ح: و حَدَّثَنَا يَحْيَى بْنُ يَحْيَى – وَاللَّفْظُ لَهُ –: أَخْبَرَنَا أَبُو مُعَاوِيَةَ عَنْ الأَعْمَشِ، عَنْ عَدِيِّ بْنِ ثَابِت، عَنْ زِرٍّ قَالَ: قَالَ عَلِيٌّ: وَالَّذِي فَلَقَ الْحَبَّةَ وَبَرَأَ النَّسَمَةَ إِنَّهُ لَعَهْدُ النَّبِيِّ الأُمِّيِّ ﷺ إِلَيَّ: ((أَنْ لاَ يُحِبَّنِي إِلاَّ مُؤْمِنٌ، وَلاَ يُبْغِضَنِي إِلاَّ مُنَافِقٌ)).

**[240]-131-(78)** ........ Əli (ibn Əbu Talib) ﵁ demişdir: “Toxumu çatladıb cücərdən və insanı yaradan *Allaha* and olsun ki, yazıb-oxumağı bacarmayan Peyğəmbər ﷺ mənə söz vermişdir ki: “Məni yalnız mömin sevər və mənə yalnız münafiq nifrət edər”.

## (٣٤) – بَابُ بَيَانِ نُقْصَانِ الإِيمَانِ بِنَقْصِ الطَّاعَاتِ وَبَيَانِ إِطْلاَقِ لَفْظِ الْكُفْرِ عَلَى غَيْرِ الْكُفْرِ بِاللَّهِ كَكُفْرِ النِّعْمَةِ وَالْحُقُوقِ

## 34-cü fəsil. Buyuruqları yerinə yetirməkdə naqisliyə yol verməklə imanın azalmasının, habelə küfr sözünün Allaha qarşı edilən küfrdən başqa, nemətə və haqlara qarşı nankorluq mənasında işlədilməsinin bəyan olunması

**[٢٤١] ١٣٢**-(٧٩) حَدَّثَنَا مُحَمَّدُ بْنُ رُمْحِ بْنِ الْمُهَاجِرِ الْمِصْرِيُّ: أَخْبَرَنَا اللَّيْثُ عَنْ ابْنِ الْهَادِ، عَنْ عَبْدِ اللَّهِ بْنِ دِينَارٍ، عَنْ عَبْدِ اللَّهِ بْنِ عُمَرَ عَنْ رَسُولِ اللَّهِ ﷺ أَنَّهُ قَالَ: ((يَا مَعْشَرَ النِّسَاءِ! تَصَدَّقْنَ وَأَكْثِرْنَ الاسْتِغْفَارَ، فَإِنِّي رَأَيْتُكُنَّ أَكْثَرَ أَهْلِ النَّارِ)) فَقَالَتْ امْرَأَةٌ مِنْهُنَّ، جَزْلَةٌ: وَمَا لَنَا يَا رَسُولَ اللَّهِ أَكْثَرَ أَهْلِ النَّارِ؟ قَالَ: ((تُكْثِرْنَ اللَّعْنَ، وَتَكْفُرْنَ الْعَشِيرَ، وَمَا رَأَيْتُ مِنْ نَاقِصَاتِ عَقْلٍ وَدِينٍ أَغْلَبَ لِذِي لُبٍّ مِنْكُنَّ)) قَالَتْ: يَا رَسُولَ اللَّهِ! وَمَا نُقْصَانُ الْعَقْلِ وَالدِّينِ؟ قَالَ: ((أَمَّا نُقْصَانُ الْعَقْلِ فَشَهَادَةُ امْرَأَتَيْنِ تَعْدِلُ شَهَادَةَ رَجُلٍ، فَهَذَا نُقْصَانُ الْعَقْلِ، وَتَمْكُثُ اللَّيَالِي مَا تُصَلِّي، وَتُفْطِرُ فِي رَمَضَانَ، فَهَذَا نُقْصَانُ الدِّينِ)).

**[241]-132-(79)** ........ Abdullah ibn Ömər ﵄ rəvayət edir ki, (bayram günü) Peyğəmbər ﷺ (qadınların yanından keçərkən) belə buyurdu: “Ey qadınlar! Sədəqə verin və (Allahdan) çoxlu-çoxlu bağışlanma diləyin! Çünki mən Cəhənnəm əhlinin əksəriyyətinin siz (qadınlar) olduğunu gördüm”. Onlardan dərrakəsi olan bir qadın soruşdu ki: “Nəyə görə Cəhənnəm əhlinin əksəriyyəti biz olacağıq, ya Rəsulullah?” Peyğəmbər ﷺ buyurdu: “Çünki siz (insanları) tez-tez lənətləyir və ərinizə qarşı nankorluq edirsiniz. Mən ağıllı və ehtiyatlı bir adamın sizin qədər həm ağıl, həm də din baxımından naqis olduğunu görmə-

dim". Qadın: "Ya Rəsulullah! Ağlımızda və dinimizdə olan naqislik nədir?"– deyə soruşdu. Peyğəmbər ﷺ buyurdu: "Ağıl naqisliyinə gəlincə, iki qadının şahidliyi bir kişinin şahidliyinə bərabərdir.[1] Bu, (qadın) ağlının naqisliyidir. (Qadın heyz vaxtı) bir neçə gecə gözləyib namaz qılmır, habelə Ramazanda (pak oluncayadək) oruc tutmur. Bu da dininin naqisliyidir"[2].

**[٢٤٢]** و حَدَّثَنِيهِ أَبُو الطَّاهِرِ: أَخْبَرَنَا ابْنُ وَهْبٍ عَنْ بَكْرِ بْنِ مُضَرَ، عَنْ ابْنِ الْهَادِ بِهَذَا الإِسْنَادِ، مِثْلَهُ.

**[242]** ........ Əbu Tahir, ibn Vəhbdən, o da Bəkr ibn Mudərdən, o da ibn Haddan bu isnadla həmin hədisin bənzərini rəvayət etmişdir.

**[٢٤٣]** (٨٠) و حَدَّثَنَا الْحَسَنُ بْنُ عَلِيٍّ الْحُلْوَانِيُّ وَأَبُو بَكْرِ بْنُ إِسْحَقَ قَالاَ: حَدَّثَنَا ابْنُ أَبِي مَرْيَمَ: أَخْبَرَنَا مُحَمَّدُ بْنُ جَعْفَرٍ قَالَ: أَخْبَرَنِي زَيْدُ بْنُ أَسْلَمَ عَنْ عِيَاضِ بْنِ عَبْدِ اللَّهِ، عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ عَنْ النَّبِيِّ ﷺ؛ ح: و حَدَّثَنَا يَحْيَى بْنُ أَيُّوبَ وَقُتَيْبَةُ وَابْنُ حُجْرٍ قَالُوا: حَدَّثَنَا إِسْمَعِيلُ وَهُوَ ابْنُ جَعْفَرٍ عَنْ عَمْرِو بْنِ أَبِي عَمْرٍو، عَنْ الْمَقْبُرِيِّ، عَنْ أَبِي هُرَيْرَةَ عَنْ النَّبِيِّ ﷺ بِمِثْلِ مَعْنَى حَدِيثِ ابْنِ عُمَرَ عَنْ النَّبِيِّ ﷺ.

**[243] (80)** ........ Həm Əbu Səid əl-Xudri, həm də Əbu Hureyrə Peyğəmbərdən ﷺ, İbn Ömərin Peyğəmbərdən ﷺ rəvayət etdiyi hədisin bənzərini rəvayət etmişdir.

---

[1] Bu xüsusda Uca Allah buyurur: **"...Aranızdakı kişilərdən iki nəfəri şahid tutun. Əgər iki kişi olmazsa, razı olduğunuz şahidlərdən bir kişi və iki qadını *şahid tutun* ki, *qadınlardan* biri unutduqda, o birisi onun yadına salsın..."** ("əl-Bəqərə" surəsi, 282).

[2] Hədisdən belə nəticə çıxır ki, (insanları) sədəqə verməyə, yaxşı işlər görməyə, Allahdan bağışlanma diləməyə və başqa bu kimi xeyirxah işlər görməyə çağırmaq gərəkdir. Bu xüsusda Uca Allah buyurur: **"Həqiqətən, yaxşı işlər pis əməlləri silib aparır. Bu, yada salanlar üçün bir xatırlatmadır"** ("Hud" surəsi, 114). Həmçinin hədisdən açıq-aydın görünür ki, yaxşılığa qarşı nankorluq etmək böyük günahlardandır. Çünki Peyğəmbər ﷺ bu əməlin sahibini Cəhənnəmlə təhdid edir. Habelə, tez-tez lənət oxumağın da böyük günahlardan olması hədisdə öz əksini tapmışdır... Başqa bir hədisdə Peyğəmbər ﷺ demişdir: "Mömini lənətləmək onu öldürmək kimidir". Elə bu səbəbdən də alimlər kimliyi bəlli olmayan kimsəyə lənət oxumağı haram hesab etmişlər. Çünki lənət şər'i mənada Allahın rəhmətindən qovmaq deməkdir. Odur ki, alimlər müəyyən bir adamı – istər müsəlman, istərsə kafir olsun, hətta heyvanı belə – lənətləməyi qadağan etmişlər. Lakin vəsf ilə lənətləmək yekdilliklə caizdir. Deməli, hədislərə əsaslanaraq bədənə yazı və ya şəkil döyənlərə və döydürənlərə, qaş qopardanlara və qopartdıranlara, rəsm çəkənlərə, sələm yeyənlərə və yedirdənlərə, zalımlara, kafirlərə və fasiqlərə, heyvanın diri ikən hər hansı bir əzasını kəsənlərə, özlərini qadınlara oxşadan kişilərə və özlərini kişilərə oxşadan qadınlara, dinə yenilik gətirənlərə, lut qövmü kimi murdar işlər görən "kişilərə", cinayətkara dəstək verənlərə və hədislərədə varid olmuş başqa bu kimi vəsflərlə lənət oxumaq caizdir.

## (٣٥) – بَابُ بَيَانِ إِطْلَاقِ اسْمِ الْكُفْرِ عَلَى مَنْ تَرَكَ الصَّلَاةَ

## 35-ci fəsil. Namazı buraxanın küfrdə ittiham edilməsinin bəyan olunması

**[٢٤٤] ١٣٣**–(٨١) حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ وَأَبُو كُرَيْبٍ قَالاَ: حَدَّثَنَا أَبُو مُعَاوِيَةَ عَنْ الأَعْمَشِ، عَنْ أَبِي صَالِحٍ، عَنْ أَبِي هُرَيْرَةَ قَال: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((إِذَا قَرَأَ ابْنُ آدَمَ السَّجْدَةَ فَسَجَدَ، اعْتَزَلَ الشَّيْطَانُ يَبْكِي، يَقُولُ: يَا وَيْلَهُ – وَفِي رِوَايَةِ أَبِي كُرَيْبٍ يَا وَيْلِي! – أُمِرَ ابْنُ آدَمَ بِالسُّجُودِ فَسَجَدَ فَلَهُ الْجَنَّةُ، وَأُمِرْتُ بِالسُّجُودِ فَأَبَيْتُ فَلِي النَّارُ)).

**[244]-133-(81)** ........ Əbu Hureyrə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Adəm övladı səcdə ayəsini[1] oxuyub səcdəyə qapandıqda, şeytan kənara çəkilib ağlayır və deyir: "Vay mənim halıma! (Əbu Kureybin rəvayətində: Ay yazıq!) Adəm övladına səcdə etmək əmr olundu, səcdə edib Cənnəti qazandı. Mənə isə səcdə etmək əmr olundu, boyun qaçırıb Cəhənnəm odunu qazandım"[2].

**[٢٤٥]** (...) و حَدَّثَنِي زُهَيْرُ بْنُ حَرْبٍ: حَدَّثَنَا وَكِيعٌ: حَدَّثَنَا الأَعْمَشُ بِهَذَا الإِسْنَادِ مِثْلَهُ، غَيْرَ أَنَّهُ قَالَ: ((فَعَصَيْتُ فَلِي النَّارُ)).

**[245] (...)** ........ Aməş bu isnadla hədisin bənzərini rəvayət etmişdir. Lakin bu rəvayətdə (şeytan demişdir): "asilik edib Cəhənnəm odunu qazandım".

**[٢٤٦] ١٣٤**–(٨٢) حَدَّثَنَا يَحْيَى بْنُ يَحْيَى التَّمِيمِيُّ وَعُثْمَانُ بْنُ أَبِي شَيْبَةَ، كِلاَهُمَا عَنْ جَرِيرٍ – قَالَ يَحْيَى أَخْبَرَنَا جَرِيرٌ – عَنْ الأَعْمَشِ، عَنْ أَبِي سُفْيَانَ قَالَ: سَمِعْتُ جَابِرًا يَقُولُ: سَمِعْتُ النَّبِيَّ ﷺ يَقُولُ: ((إِنَّ بَيْنَ الرَّجُلِ وَبَيْنَ الشِّرْكِ وَالْكُفْرِ تَرْكَ الصَّلَاةِ)).

---

[1] Quranda on beş səcdə ayəsi mövcuddur ki, bunlar da aşağıdakılardır:

"əl-Əraf", 206; "ər-Rəd", 15; "ən-Nəhl", 50; "əl-İsra", 109; "Məryəm", 58; "əl-Həcc", 18; "əl-Həcc", 77; "əl-Furqan", 60; "ən-Nəml", 26; "əs-Səcdə", 15; "Sad", 24; "Fussilət", 38; "ən-Nəcm", 62; "əl-İnşiqaq", 21; "əl-Ələq", 19.

Bu səcdə ayələrini oxuduqdan sonra səcdə etdikdə aşağıdakı duanı oxumaq müstəhəbdir:

اللَّهُمَّ لَكَ سَجَدْتُ، وَبِكَ آمَنْتُ، وَلَكَ أَسْلَمْتُ، سَجَدَ وَجْهِيَ لِلَّذِي خَلَقَهُ، وَصَوَّرَهُ، وَشَقَّ سَمْعَهُ وَبَصَرَهُ، تَبَارَكَ اللهُ أَحْسَنُ الْخَالِقِينَ

Transkripsiyası: Allahummə ləkə səcədtu və bikə aməntu və ləkə əsləmtu, səcədə vəchiyə lilləzi xaləqahu, və savvərahu, və şəqqa səm'ahu və bəsarahu, təbarəkəllahu əhsənul-xaliqin.

Tərcüməsi: Allahım! Sənə səcdə etdim, Sənə iman gətirdim, Sənə təslim oldum! Üzüm onu yaradana, ona surət verənə, onda göz və qulaq açana səcdə etdi. Yaradanların ən gözəli olan Allah nə qədər xeyirxahdır!

[2] Uca Allah buyurur: **"Bir zaman Biz mələklərə: "Adəmə səcdə edin!"– dedikdə İblisdən başqa *hamısı* səcdə etdi. O, imtina edib təkəbbür göstərdi və kafir oldu"** ("əl-Bəqərə" surəsi, 34).

**[246]-134-(82)** ........ Cabir ﵁ demişdir: "Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: "Şübhəsiz ki, insanla şirk və küfr arasında namazı tərk etmək durur"[1].

**[٢٤٧]** (...) حَدَّثَنَا أَبُو غَسَّانَ الْمِسْمَعِيُّ: حَدَّثَنَا الضَّحَّاكُ بْنُ مَخْلَدٍ، عَنْ ابْنِ جُرَيْجٍ قَالَ: أَخْبَرَنِي أَبُو الزُّبَيْرِ، أَنَّهُ سَمِعَ جَابِرَ بْنَ عَبْدِ اللَّهِ يَقُولُ: سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ: ((بَيْنَ الرَّجُلِ وَبَيْنَ الشِّرْكِ وَالْكُفْرِ تَرْكُ الصَّلَاةِ)).

**[247] (...)** ........ Cabir ibn Abdullah ﵁ demişdir: "Mən Rəsulullahın ﷺ belə dediyini eşitmişəm: "Şübhəsiz ki, insanla şirk və küfr arasında namazı buraxmaq durur".

## (٣٦) – بَابُ بَيَانِ كَوْنِ الإِيمَانِ بِاللَّهِ تَعَالَى أَفْضَلُ الأَعْمَالِ

## 36-cı fəsil. Uca Allaha iman gətirməyin əməllərin ən fəzilətlisi olmasının bəyan edilməsi

**[٢٤٨] ١٣٥-(٨٣)** و حَدَّثَنَا مَنْصُورُ بْنُ أَبِي مُزَاحِمٍ: حَدَّثَنَا إِبْرَاهِيمُ بْنُ سَعْدٍ؛ ح: حَدَّثَنِي مُحَمَّدُ بْنُ جَعْفَرِ بْنِ زِيَادٍ: أَخْبَرَنَا إِبْرَاهِيمُ يَعْنِي ابْنَ سَعْدٍ عَنْ ابْنِ شِهَابٍ، عَنْ سَعِيدِ بْنِ الْمُسَيَّبِ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ: سُئِلَ رَسُولُ اللَّهِ ﷺ: أَيُّ الأَعْمَالِ أَفْضَلُ؟ قَالَ: ((إِيمَانٌ بِاللَّهِ)) قَالَ: ثُمَّ مَاذَا؟ قَالَ: ((الْجِهَادُ فِي سَبِيلِ اللَّهِ)) قَالَ: ثُمَّ مَاذَا؟ قَالَ: ((حَجٌّ مَبْرُورٌ)) وَفِي رِوَايَةِ مُحَمَّدِ بْنِ جَعْفَرٍ قَالَ: ((إِيمَانٌ بِاللَّهِ وَرَسُولِهِ)).

**[248]-135-(83)** ........ Əbu Hureyrə ﵁ rəvayət edir ki, Peyğəmbərdən ﷺ soruşdular: "Hansı əməl ən əfzəl (əməl) sayılır?" Dedi: "Allaha iman gətirmək".

---

[1] Namazın vacibliyini inkar edərək onu tərk edən kimsə müsəlmanların yekdil fikrinə əsasən kafir sayılır. Yalnız İslam dinindən yenicə xəbər tutmuş və müsəlmanlara qaynayıb-qarışmayan, beləliklə də, namazın vacib buyurulduğundan bixəbər olan kimsələr istisnadır.

Namaz qılmağın vacib olduğunu bildiyi halda səhlənkarlığı üzündən namazı tərk edən kimsəyə gəlincə, alimlər onun kafir olub-olmaması barədə ixtilaf etmişlər. İmam Malik və Şafii, habelə qədim və müasir alimlərdən bir çoxları, tənbəlliyi üzündən namazı tərk edən kimsəni kafir saymamış, əksinə, onun fasiq olduğunu demişlər. Onların rəyinə görə beləsindən tövbə etməsi tələb olunmalıdır. Və əgər tövbə edərsə əfv edilməli, əks halda isə dul zinakarın cəzalandırıldığı kimi cəzalandırılmalıdır.

İmam Əli ibn Əbu Talib ﵁ (və bir çox başqa səhabələr), Abdullah ibn Mübarək, Əhməd ibn Hənbəl, İshaq ibn Rahuyə və bəzi şafiilər isə tənbəlliyi üzündən namazı tərk edən kimsənin kafir olduğunu və İslam ümmətindən xaric olduğunu söyləmişlər.

Soruşdular: “Sonra hansıdır?” Dedi: “Allah yolunda cihad[1] etmək”. (Yenə) soruşdular: “Sonra hansıdır?” Dedi: “Qəbul olunmuş həcc”[2].

Muhəmməd ibn Cəfərin rəvayətində: “Allaha və Onun elçisinə iman gətirməkdir”– deyilir.

**[٢٤٩]** و حَدَّثَنِيهِ مُحَمَّدُ بْنُ رَافِعٍ وَعَبْدُ بْنُ حُمَيْدٍ عَنْ عَبْدِ الرَّزَّاقِ: أَخْبَرَنَا مَعْمَرٌ عَنْ الزُّهْرِيِّ، بِهَذَا الإِسْنَادِ مِثْلَهُ.

**[249]** ........ Məmər bu isnadla Zuhridən bu hədisin bənzərini rəvayət etmişdir.

**[٢٥٠] ١٣٦**–(٨٤) حَدَّثَنِي أَبُو الرَّبِيعِ الزَّهْرَانِيُّ: حَدَّثَنَا حَمَّادُ بْنُ زَيْدٍ: حَدَّثَنَا هِشَامُ بْنُ عُرْوَةَ؛ ح: و حَدَّثَنَا خَلَفُ بْنُ هِشَامٍ – وَاللَّفْظُ لَهُ – حَدَّثَنَا حَمَّادُ بْنُ زَيْد، عَنْ هِشَامِ بْنِ عُرْوَةَ، عَنْ أَبِيهِ، عَنْ أَبِي مُرَاوِحٍ اللَّيْثِيِّ، عَنْ أَبِي ذَرٍّ قَالَ: قُلْتُ: يَا رَسُولَ اللَّهِ! أَيُّ الأَعْمَالِ أَفْضَلُ؟ قَالَ: ((الإِيمَانُ بِاللَّهِ وَالْجِهَادُ فِي سَبِيلِهِ)) قَالَ: قُلْتُ: أَيُّ الرِّقَابِ أَفْضَلُ؟ قَالَ: ((أَنْفَسُهَا عِنْدَ أَهْلِهَا، وَأَكْثَرُهَا ثَمَنًا)) قَالَ: قُلْتُ: فَإِنْ لَمْ أَفْعَلْ؟ قَالَ: ((تُعِينُ صَانِعًا أَوْ تَصْنَعُ لأَخْرَقَ)) قَالَ: قُلْتُ: يَا رَسُولَ اللَّهِ! أَرَأَيْتَ إِنْ ضَعُفْتُ عَنْ بَعْضِ الْعَمَلِ؟ قَالَ: ((تَكُفُّ شَرَّكَ عَنْ النَّاسِ، فَإِنَّهَا صَدَقَةٌ مِنْكَ عَلَى نَفْسِكَ)).

**[250]-136-(84)** ........ Əbu Zərr ﵁ demişdir: “Mən (Peyğəmbərdən ﷺ) soruşdum: “Ya Rəsulullah! Əməllərin hansı biri daha fəzilətli sayılır?” Dedi: “Allaha iman gətirmək və Onun yolunda cihad etmək”. Soruşdum: “Hansı köləni azad etmək daha yaxşıdır?” Dedi: “Sahibi üçün ən dəyərli və ən bahalı olanı”. Dedim: “Əgər bunu edə bilməsəm, (onda necə olsun)?” Buyurdu ki: “(Yaxşı) bir iş görən adama kömək et və ya işi bacarmayan adamın işini gör”. Dedim: “İşdi,

---

[1] (a) Allah yolunda müqəddəs müharibə; (b) Uca Allahın adını şərəfləndirmək məqsədilə göstərilən istənilən səylər. Cihadın bir neçə forması var: müsəlman dövlətinin təhlükəsizliyinə qəsd edən və İslamın yayılmasına maneə yaradan kafirlərə qarşı hərbi yolla aparılan cihad.

Uca Allah buyurur: **“Ey iman gətirənlər! Sizlərdən hər kim dinindən dönsə, Allah** ***onun əvəzinə*** **Özünün sevdiyi və Onu sevən, möminlərə qarşı mülayim, kafirlərə qarşı isə sərt olan, Allah yolunda cihad edən və tənə edənin tənəsindən qorxmayan bir camaat gətirər. Bu, Allahın lütfüdür, onu istədiyinə verər. Allah** ***hər şeyi*** **Əhatəedəndir, Biləndir”** (“əl-Maidə” surəsi, 54).

Özlərini müsəlman kimi göstərən münafiqlərlə, bidət əhli və onlar kimiləri ilə elm vasitəsilə aparılan cihad. İnsanın şeytanla, həmçinin öz nəfsi ilə apardığı cihad da mövcuddur.

[2] Əbu Hureyrə ﵁ demişdir: “Mən Peyğəmbərin ﷺ belə buyurduğunu eşitmişəm: “Kim Allah xatirinə həcc ziyarətini yerinə yetirsə, *ziyarət əsnasında* qadını ilə yaxınlıq etməsə və *digər* günah işlərdən çəkinsə, dünyaya gəldiyi gündə olduğu kimi *pak halda evinə* qayıdar” (“Səhih əl-Buxari”, 1521).

bunu da etməyə qadir olmasam, (onda necə olsun)?" Buyurdu ki: "İnsanlara pislik etməkdən çəkin. (Belə etsən,) bu, sənin özünə verdiyin bir sədəqə olar".

**[٢٥١]** (...) و حَدَّثَنِي مُحَمَّدُ بْنُ رَافِعٍ وَعَبْدُ بْنُ حُمَيْدٍ – قَالَ عَبْدٌ: أَخْبَرَنَا، وَقَالَ ابْنُ رَافِعٍ: حَدَّثَنَا عَبْدُ الرَّزَّاقِ أَخْبَرَنَا مَعْمَرٌ عَنْ الزُّهْرِيِّ، عَنْ حَبِيبٍ مَوْلَى عُرْوَةَ بْنِ الزُّبَيْرِ، عَنْ عُرْوَةَ بْنِ الزُّبَيْرِ، عَنْ أَبِي مُرَاوِحٍ، عَنْ أَبِي ذَرٍّ عَنْ النَّبِيِّ ﷺ بِنَحْوِهِ، غَيْرَ أَنَّهُ قَالَ: ((فَتُعِينُ الصَّانِعَ أَوْ تَصْنَعُ لأَخْرَقَ)).

**[251] (...)** ........ Əbu Zərr ﵁ Peyğəmbərdən ﷺ bu hədisin bənzərini rəvayət etmişdir. Fəqət bu rəvayətdə: "Elə isə iş görən adama yardım et, yaxud işi bacarmayan adamın işini gör"– deyilir.

**[٢٥٢] ١٣٧–(٨٥)** حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا عَلِيُّ بْنُ مُسْهِرٍ، عَنْ الشَّيْبَانِيِّ، عَنْ الْوَلِيدِ بْنِ الْعَيْزَارِ، عَنْ سَعْدِ بْنِ إِيَاسٍ أَبِي عَمْرٍو الشَّيْبَانِيِّ، عَنْ عَبْدِ اللَّهِ بْنِ مَسْعُودٍ قَالَ: سَأَلْتُ رَسُولَ اللَّهِ ﷺ: أَيُّ الْعَمَلِ أَفْضَلُ؟ قَالَ: ((الصَّلاَةُ لِوَقْتِهَا)) قَالَ: قُلْتُ: ثُمَّ أَيٌّ؟ قَالَ: ((بِرُّ الْوَالِدَيْنِ)) قَالَ: قُلْتُ: ثُمَّ أَيٌّ؟ قَالَ: ((الْجِهَادُ فِي سَبِيلِ اللَّهِ)) فَمَا تَرَكْتُ أَسْتَزِيدُهُ إِلاَّ إِرْعَاءً عَلَيْهِ.

**[252]-137-(85)** ........ Abdullah ibn Məsud ﵁ demişdir: "Mən Peyğəmbərdən ﷺ soruşdum: "Hansı əməl daha fəzilətli sayılır?" O buyurdu: "Namazı vaxtlı-vaxtında qılmaq[1]". Mən soruşdum: "Sonra hansıdır?" O buyurdu: "Valideynlərin qayğısına qalmaq[2]". Mən soruşdum: "Bəs sonra hansıdır?" O buyurdu: "Allah yolunda cihad etmək".

Mən onu yormaq istəmədiyim üçün ona bundan artıq sual vermədim".

**[٢٥٣] ١٣٨–(...)** حَدَّثَنَا مُحَمَّدُ بْنُ أَبِي عُمَرَ الْمَكِّيُّ: حَدَّثَنَا مَرْوَانُ الْفَزَارِيُّ: حَدَّثَنَا أَبُو يَعْفُورٍ عَنْ الْوَلِيدِ بْنِ الْعَيْزَارِ، عَنْ أَبِي عَمْرٍو الشَّيْبَانِيِّ، عَنْ عَبْدِ اللَّهِ بْنِ مَسْعُودٍ قَالَ: قُلْتُ: يَا نَبِيَّ اللَّهِ! أَيُّ الأَعْمَالِ أَقْرَبُ إِلَى الْجَنَّةِ؟ قَالَ: ((الصَّلاَةُ عَلَى مَوَاقِيتِهَا)) قُلْتُ: وَمَاذَا يَا نَبِيَّ اللَّهِ؟ قَالَ: ((بِرُّ الْوَالِدَيْنِ)) قُلْتُ: وَمَاذَا يَا نَبِيَّ اللَّهِ؟ قَالَ: ((الْجِهَادُ فِي سَبِيلِ اللَّهِ)).

---

[1] Peyğəmbər ﷺ (səhabələrindən): "Bir deyin görüm, əgər sizdən birinizin qapısının önündən çay axsaydı, o da hər gün bu çayda beş dəfə yuyunsaydı, onun (bədənində olan) çirkabdan bir şey qalardımı?"– deyə soruşdu. Səhabələr: "Onun (bədənindəki) çirkabdan heç nə qalmazdı"– deyə cavab verdikdə Peyğəmbər ﷺ buyurdu: "Beş vaxt qılınan namazların məsəli də buna bənzəyir. Belə ki, Allah bununla günahları silir!" ("Səhih əl-Buxari", 528).

[2] Abdullah ibn Amr ﵄ demişdir: "*Bir dəfə* bir nəfər Peyğəmbərin ﷺ yanına gəlib cihada getmək üçün izin istədi. Peyğəmbər ﷺ soruşdu: "Valideynlərin sağdırmı?" O: "Bəli!"– deyə cavab verdi. Peyğəmbər ﷺ buyurdu: "Elə isə onların qayğısına qal" ("Səhih əl-Buxari", 3004).

**[253]-138-(...)** ........ Abdullah ibn Məsud ﷺ demişdir: “Mən soruşdum: “Ey Allahın peyğəmbəri! Əməllərin hansı biri Cənnətə daha yaxındır?” Dedi: “Namazları vaxtlı-vaxtında qılmaq”. Soruşdum: “Daha nə, ey Allahın peyğəmbəri?” Dedi: “Valideynlərin qayğısına qalmaq”. (Yenə) soruşdum: “Daha nə, ey Allahın peyğəmbəri?” Dedi: “Allah yolunda cihad etmək”.

**[٢٥٤] ١٣٩**-(...) و حَدَّثَنَا عُبَيْدُ اللَّهِ بْنُ مُعَاذٍ الْعَنْبَرِيُّ: حَدَّثَنَا أَبِي: حَدَّثَنَا شُعْبَةُ عَنْ الْوَلِيدِ بْنِ الْعَيْزَارِ أَنَّهُ سَمِعَ أَبَا عَمْرٍو الشَّيْبَانِيَّ قَالَ: حَدَّثَنِي صَاحِبُ هَذِهِ الدَّارِ – وَأَشَارَ إِلَى دَارِ عَبْدِ اللَّهِ – قَالَ: سَأَلْتُ رَسُولَ اللَّهِ ﷺ أَيُّ الأَعْمَالِ أَحَبُّ إِلَى اللَّهِ؟ قَالَ: ((الصَّلَاةُ عَلَى وَقْتِهَا)) قُلْتُ: ثُمَّ أَيٌّ؟ قَالَ: ((ثُمَّ بِرُّ الْوَالِدَيْنِ)) قُلْتُ: ثُمَّ أَيٌّ؟ قَالَ: ((ثُمَّ الْجِهَادُ فِي سَبِيلِ اللَّهِ)) قَالَ: حَدَّثَنِي بِهِنَّ، وَلَوْ اسْتَزَدْتُهُ لَزَادَنِي.

**[254]-139-(...)** ........ Əbu Amr əş-Şeybani əli ilə Abdullah ibn Məsudun evini göstərib demişdir: “Bu evin sahibi mənə belə rəvayət etmişdir: “Mən Peyğəmbərdən ﷺ soruşdum: “Allahın ən sevdiyi (əməl) hansı əməldir?” O buyurdu: “Namazı vaxtlı-vaxtında qılmaq”. Mən soruşdum: “Sonra hansıdır?” Dedi: “Sonra valideynlərin qayğısına qalmaq”. (Yenə) soruşdum: “Bəs sonra hansıdır?” Dedi: “Sonra Allah yolunda cihad etmək”.

(İbn Məsud ﷺ) demişdir: “O, mənə bunları söylədi. Əgər soruşsaydım, yenə əlavə edərdi”.

**[٢٥٥]** (...) حَدَّثَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ: حَدَّثَنَا مُحَمَّدُ بْنُ جَعْفَرٍ: حَدَّثَنَا شُعْبَةُ بِهَذَا الإِسْنَادِ مِثْلَهُ، وَزَادَ: وَأَشَارَ إِلَى دَارِ عَبْدِ اللَّهِ، وَمَا سَمَّاهُ لَنَا.

**[255] (...)** ........ Şobə bu isnadla (yuxarıdakı) hədisin bənzərini rəvayət etmiş və buna: “(əli ilə) Abdullahın evini göstərdi, lakin onun adını bizə söyləmədi” sözünü əlavə etmişdir.

**[٢٥٦] ١٤٠**-(...) حَدَّثَنَا عُثْمَانُ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا جَرِيرٌ عَنْ الْحَسَنِ بْنِ عُبَيْدِ اللَّهِ، عَنْ أَبِي عَمْرٍو الشَّيْبَانِيِّ، عَنْ عَبْدِ اللَّهِ عَنْ النَّبِيِّ ﷺ قَالَ: ((أَفْضَلُ الأَعْمَالِ – أَوْ الْعَمَلِ – الصَّلَاةُ لِوَقْتِهَا، وَبِرُّ الْوَالِدَيْنِ)).

**[256]-140-(...)** ........ Abdullah ibn Məsud ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurmuşdur: “Əməllərin ən əfzəli (yaxud ən əfzəl əməl) namazı vaxtlı-vaxtında qılmaq və valideynlərin qayğısına qalmaqdır”.

## (٣٧) – بَابُ كَوْنِ الشِّرْكِ أَقْبَحُ الذُّنُوبِ وَبَيَانِ أَعْظَمِهَا بَعْدَهُ

## **37-ci fəsil.** (Allaha) **şərik qoşmağın[1] ən qəbih günah olması və ondan sonra** (hansı) **günahın ən böyük olmasının bəyan edilməsi**

**[٢٥٧] ١٤١**–(٨٦) حَدَّثَنَا عُثْمَانُ بْنُ أَبِي شَيْبَةَ وَإِسْحَقُ بْنُ إِبْرَاهِيمَ – قَالَ إِسْحَقُ: أَخْبَرَنَا جَرِيرٌ، وَقَالَ عُثْمَانُ: حَدَّثَنَا جَرِيرٌ – عَنْ مَنْصُورٍ، عَنْ أَبِي وَائِلٍ، عَنْ عَمْرِو بْنِ شُرَحْبِيلَ، عَنْ عَبْدِ اللَّهِ قَالَ: سَأَلْتُ رَسُولَ اللَّهِ ﷺ أَيُّ الذَّنْبِ أَعْظَمُ عِنْدَ اللَّهِ؟ قَالَ: ((أَنْ تَجْعَلَ لِلَّهِ نِدًّا وَهُوَ خَلَقَكَ)) قَالَ: قُلْتُ لَهُ: إِنَّ ذَلِكَ لَعَظِيمٌ، قَالَ: قُلْتُ: ثُمَّ أَيٌّ؟ قَالَ: ((ثُمَّ أَنْ تَقْتُلَ وَلَدَكَ مَخَافَةَ أَنْ يَطْعَمَ مَعَكَ)) قَالَ: قُلْتُ: ثُمَّ أَيٌّ؟ قَالَ: ((ثُمَّ أَنْ تُزَانِيَ حَلِيلَةَ جَارِكَ)).

**[257]-141-(86)** ........ Abdullah (ibn Məsud) ﷺ demişdir: "(Bir dəfə) mən Peyğəmbərdən ﷺ soruşdum ki: "Hansı günah Allah yanında ən böyük (günah) sayılır?" Dedi: "Allah səni yaratdığı halda (başqa birisini) Ona tay tutmağın!"[2] Mən ona: "Doğrudan da, bu, böyük günahdır"– dedim, sonra (yenə) soruşdum: "Sonra hansıdır?" Dedi: "Övladının səninlə birgə yemək yeyəcəyindən qorxub onu öldürməyin!"[3] Mən soruşdum: "Sonra hansıdır?" Dedi: "Qonşunun zövcəsi ilə zina etməyin!"[4]

**[٢٥٨] ١٤٢**–(...) حَدَّثَنَا عُثْمَانُ بْنُ أَبِي شَيْبَةَ وَإِسْحَقُ بْنُ إِبْرَاهِيمَ، جَمِيعًا عَنْ جَرِيرٍ – قَالَ عُثْمَانُ: حَدَّثَنَا جَرِيرٌ – عَنْ الْأَعْمَشِ، عَنْ أَبِي وَائِلٍ، عَنْ عَمْرِو بْنِ شُرَحْبِيلَ قَالَ: قَالَ عَبْدُ اللَّهِ: قَالَ رَجُلٌ: يَا رَسُولَ اللَّهِ! أَيُّ الذَّنْبِ أَكْبَرُ عِنْدَ اللَّهِ؟ قَالَ: ((أَنْ تَدْعُوَ لِلَّهِ نِدًّا وَهُوَ خَلَقَكَ)) قَالَ: ثُمَّ أَيٌّ؟ قَالَ: ((أَنْ تَقْتُلَ وَلَدَكَ مَخَافَةَ أَنْ يَطْعَمَ مَعَكَ)) قَالَ: ثُمَّ أَيٌّ؟ قَالَ: ((أَنْ تُزَانِيَ حَلِيلَةَ جَارِكَ)) فَأَنْزَلَ اللَّهُ عَزَّ وَجَلَّ تَصْدِيقَهَا:

---

[1] Buna ərəbcə şirk deyilir; bilərəkdən Allaha şərik qoşan kimsə isə müşrik adlanır. Şirk: vəhdaniyyətdə Allaha şərik qoşmaq, (Allahdan qeyrisini) Ona tay tutmaq deməkdir. Və bu, günahların ən böyüyü hesab edilir. Uca Allah buyurur: **"Bir zaman Loğman öz oğluna nəsihət edərək demişdir: "Oğlum! *Allaha* şərik qoşma. Həqiqətən, Allaha şərik qoşmaq böyük zülmdür!"** ("Loğman" surəsi, 13). Onu da qeyd etmək lazımdır ki, digər günahlardan fərqli olaraq bu günahdan tövbə etmədən ölüb getmiş kimsəni Allah bağışlamayacaq. Bu xüsusda Quranda belə buyurulur: **"Həqiqətən, Allah Özünə şərik qoşulmasını bağışlamaz, bundan başqa *daha kiçik günahları* isə istədiyi kimsəyə bağışlayar. Allaha şərik qoşan kəs iftira atmaqla böyük bir günah etmiş olur"** ("ən-Nisa" surəsi, 13).

[2] Uca Allah buyurur: **"Sənə və səndən əvvəlkilərə belə vəhy olunmuşdur: "Əgər şərik qoşsan, əməlin puç olacaq və mütləq ziyana uğrayanlardan olacaqsan. Sən yalnız Allaha ibadət et və şükür edənlərdən ol!"** ("əz-Zumər" surəsi, 65-66).

[3] Uca Allah buyurur: **"Yoxsulluq qorxusundan uşaqlarınızı öldürməyin. Axı onların da, sizin də ruzinizi Biz veririk. Onları öldürmək, həqiqətən də, böyük günahdır"** ("əl-İsra" surəsi, 31).

[4] Hərçənd zina etmək murdar əməl sayılır, lakin qonşunun arvadı ilə zina etməyin murdarlığı bundan da betərdir.

﴿وَٱلَّذِينَ لَا يَدۡعُونَ مَعَ ٱللَّهِ إِلَٰهًا ءَاخَرَ وَلَا يَقۡتُلُونَ ٱلنَّفۡسَ ٱلَّتِي حَرَّمَ ٱللَّهُ إِلَّا بِٱلۡحَقِّ وَلَا يَزۡنُونَۚ وَمَن يَفۡعَلۡ ذَٰلِكَ يَلۡقَ أَثَامًا﴾

**[258]-142-(...)** ........ Abdullah (ibn Məsud) ﷺ demişdir: "Bir nəfər (Peyğəmbərdən ﷺ) soruşdu: "Ya Rəsulullah! Hansı günah Allah yanında ən böyük (günah) sayılır?" Dedi: "Allah səni yaratdığı halda (başqa birisini) Ona tay tutmağın!" Adam soruşdu: "Sonra hansıdır?" Peyğəmbər ﷺ dedi: "Övladının səninlə birgə yemək yeyəcəyindən qorxub onu öldürməyin!" O (yenə) soruşdu: "Sonra hansıdır?" Peyğəmbər ﷺ dedi: "Qonşunun zövcəsi ilə zina etməyin!" Qüdrətli və qüvvətli Allah da bunun təsdiqini nazil etdi: **"Onlar Allahla yanaşı başqa məbuda yalvarmaz, Allahın haram etdiyi cana haqsız yerə qıymaz və zina etməzlər. Bunu edən kimsə cəzalandırılar".**[1]

## (٣٨) – بَابُ بَيَانِ الْكَبَائِرِ وَأَكْبَرِهَا

## 38-ci fəsil. Böyük günahların[2] və bunların ən böyüyünün bəyan edilməsi

**[٢٥٩] ١٤٣–(٨٧)** حَدَّثَنِي عَمْرُو بْنُ مُحَمَّدِ بْنِ بُكَيْرِ بْنِ مُحَمَّدٍ النَّاقِدُ: حَدَّثَنَا إِسْمَعِيلُ ابْنُ عُلَيَّةَ عَنْ سَعِيدٍ الْجُرَيْرِيِّ: حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ بْنُ أَبِي بَكْرَةَ عَنْ أَبِيهِ قَالَ: كُنَّا عِنْدَ رَسُولِ اللَّهِ ﷺ فَقَالَ: ((أَلَا أُنَبِّئُكُمْ

---

[1] "əl-Furqan" surəsi, 68.

[2] İbn Abbas ﷺ demişdir: "Böyük günah deyildikdə o günahlar qəsd edilir ki, Allah onları edənlərin Cəhənnəmə düşəcəyini xəbər vermiş, yaxud onlara qəzəbi tutmuş, yaxud onları lənətləmiş, yaxud da onlara əzab vermişdir" ("Təfsir ət-Təbəri", 5/27; "Təfsir əl-Qurtubi", 5/159; "Nəvəvi", 2/271).

İbn Teymiyyə ﷺ İbn Abbasın ﷺ bu sözünü əsas götürərək böyük günaha belə tərif vermişdir: "(Bəndəni) Allahın lənətinə məruz qoyan, yaxud Onun qəzəbinə düçar edən, yaxud Cəhənnəm oduna sürükləyən, yaxud da dünyada ikən cəzaya məhkum edilməsinə səbəb olan hər bir günah" ("Məcmuə Fətavə", 11/650-651).

Qeyd etmək lazımdır ki, böyük günahlar yalnız tövbə etməklə bağışlanır. **"Allah ancaq o kəslərin tövbələrini qəbul edir ki, onlar avamlıqları üzündən pis iş gördükdən sonra tezliklə tövbə edirlər. Allah onların tövbələrini qəbul edər. Həqiqətən, Allah Biləndir, Müdrikdir"** (ən-Nisa, 17). Kiçik günahlara gəlincə, bunları namaz, oruc və başqa bu kimi saleh əməllər silib aparır. Uca Allah buyurur: **"Gündüzün iki başında –** *əvvəlində və axırında* **və gecənin bəzi saatlarında namaz qıl! Həqiqətən, yaxşı işlər pis əməlləri silib aparır. Bu, yada salanlar üçün bir xatırlatmadır"** ("Hud" surəsi, 114). **"Sizə qadağan olunmuş böyük günahlardan çəkinsəniz, Biz sizin təqsirlərinizdən keçər və sizi şərəfli bir keçidə –** *Cənnətə* **daxil edərik"** ("ən-Nisa", surəsi 31). **"Göylərdə və yerdə nə varsa, Allahındır.** *Bu, Allahın* **pislik edənlərə əməllərinin cəzasını verməsi, yaxşılıq edənləri isə ən gözəli ilə (Cənnətlə) mükafatlandırması üçündür. Onlar kiçik günahlar istisna olmaqla, böyük günahlardan və iyrənc əməllərdən çəkinirlər."** ("ən-Nəcm" surəsi, 31-32).

بِأَكْبَرِ الْكَبَائِرِ؟)) – ثَلاَثًا –: الإِشْرَاكُ بِاللَّهِ، وَعُقُوقُ الْوَالِدَيْنِ، وَشَهَادَةُ الزُّورِ، – أَوْ قَوْلُ الزُّورِ)) وَكَانَ رَسُولُ اللَّهِ ﷺ مُتَّكِئًا فَجَلَسَ، فَمَا زَالَ يُكَرِّرُهَا حَتَّى قُلْنَا: لَيْتَهُ سَكَتَ!

**[259]-143-(87)** ........ Əbu Bəkrə ﷺ demişdir: "(Bir dəfə) biz Peyğəmbərin ﷺ yanında ikən o, üç dəfə: "Sizə günahların ən böyüyü barədə xəbər verimmi?"– deyə buyurdu, (sonra da): "(Bu,) Allaha şərik qoşmaq, valideynlərin üzünə ağ olmaq və yalandan şahidlik etməkdir (yaxud yalan danışmaqdır[1])"– dedi. Həmin vaxt Peyğəmbər ﷺ söykənmişdi, sonra oturdu və bunu dalbadal o qədər təkrar etdi ki, biz (bir-birimizə): "Nə olaydı, susaydı!"– dedik"[2].

**[٢٦٠] ١٤٤**–(٨٨) و حَدَّثَنِي يَحْيَى بْنُ حَبِيبٍ الْحَارِثِيُّ: حَدَّثَنَا خَالِدٌ وَهُوَ ابْنُ الْحَارِثِ: حَدَّثَنَا شُعْبَةُ: أَخْبَرَنَا عُبَيْدُ اللَّهِ بْنُ أَبِي بَكْرٍ عَنْ أَنَسٍ عَنِ النَّبِيِّ ﷺ فِي الْكَبَائِرِ قَالَ: ((الشِّرْكُ بِاللَّهِ، وَعُقُوقُ الْوَالِدَيْنِ، وَقَتْلُ النَّفْسِ، وَقَوْلُ الزُّورِ)).

**[260]-144-(88)** ........ Ənəs ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ böyük günahlar barəsində belə buyurmuşdur: "(Bu,) Allaha şərik qoşmaq, valideynlərin üzünə ağ olmaq, (Allahın haram buyurduğu) cana qıymaq və yalan danışmaqdır".

**[٢٦١]** (...) و حَدَّثَنَا مُحَمَّدُ بْنُ الْوَلِيدِ بْنِ عَبْدِ الْحَمِيدِ: حَدَّثَنَا مُحَمَّدُ بْنُ جَعْفَرٍ: حَدَّثَنَا شُعْبَةُ قَالَ: حَدَّثَنِي عُبَيْدُ اللَّهِ بْنُ أَبِي بَكْرٍ قَالَ: سَمِعْتُ أَنَسَ بْنَ مَالِكٍ قَالَ: ذَكَرَ رَسُولُ اللَّهِ ﷺ الْكَبَائِرَ – أَوْ سُئِلَ عَنْ الْكَبَائِرِ – فَقَالَ: ((الشِّرْكُ بِاللَّهِ، وَقَتْلُ النَّفْسِ، وَعُقُوقُ الْوَالِدَيْنِ)) وَقَالَ: ((أَلاَ أُنَبِّئُكُمْ بِأَكْبَرِ الْكَبَائِرِ؟)) قَالَ: ((قَوْلُ الزُّورِ – أَوْ قَالَ شَهَادَةُ الزُّورِ)) قَالَ: شُعْبَةُ وَأَكْبَرُ ظَنِّي أَنَّهُ شَهَادَةُ الزُّورِ.

**[261] (...)** ........ Ənəs ibn Malik ﷺ demişdir: "(Bir dəfə) Peyğəmbər ﷺ böyük günahları yada saldı, (yaxud ondan böyük günahlar barəsində soruşdular) və o, belə buyurdu: "(Bu,) Allaha şərik qoşmaq, (Allahın haram buyurduğu) cana qəsd etmək və valideynlərin üzünə ağ olmaqdır". Sonra dedi: "Sizə günahların ən böyüyü barədə xəbər verimmi?! (Bu,) yalan danışmaqdır, yaxud yalandan şahidlik etməkdir".

Şobə dedi: "Çox güman ki, o: "yalandan şahidlik etməkdir"– demişdir.

**[٢٦٢] ١٤٥**–(٨٩) حَدَّثَنِي هَارُونُ بْنُ سَعِيدٍ الأَيْلِيُّ: حَدَّثَنَا ابْنُ وَهْبٍ قَالَ: حَدَّثَنِي سُلَيْمَانُ بْنُ بِلاَلٍ عَنْ ثَوْرِ بْنِ زَيْدٍ، عَنْ أَبِي الْغَيْثِ، عَنْ أَبِي هُرَيْرَةَ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: ((اجْتَنِبُوا السَّبْعَ الْمُوبِقَاتِ)) قِيلَ: يَا

---

[1] **"Kim xəta edər və ya günah qazanar, sonra da onu təqsiri olmayanın boynuna atarsa, özü-özünə böhtan atmış və açıq-aydın günaha batmış olar"** ("ən-Nisa" surəsi, 112).

[2] Onlar Peyğəmbərin ﷺ halına yandığından, o həyəcanlanmasın deyə belə dedilər.

رَسُولَ اللَّهِ! وَمَا هُنَّ؟ قَالَ: ((الشِّرْكُ بِاللَّهِ، وَالسِّحْرُ، وَقَتْلُ النَّفْسِ الَّتِي حَرَّمَ اللَّهُ إِلاَّ بِالْحَقِّ، وَأَكْلُ مَالِ الْيَتِيمِ، وَأَكْلُ الرِّبَا، وَالتَّوَلِّي يَوْمَ الزَّحْفِ، وَقَذْفُ الْمُحْصِنَاتِ الْغَافِلاَتِ الْمُؤْمِنَاتِ)).

**[262]-145-(89)** ........ Əbu Hureyrə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Həlakedici yeddi[1] günahdan çəkinin!" Soruşdular: "Ya Rəsulullah, nədir onlar?" Peyğəmbər ﷺ buyurdu: "Allaha şərik qoşmaq, sehirbazlıq, Allahın haram buyurduğu cana nahaq yerə qəsd etmək, yetimin malını yemək,[2] sələm yemək,[3] döyüş meydanından qaçmaq və (zinadan) xəbəri olmayan namuslu, ismətli mömin qadınları zinada ittiham etmək".

**[٢٦٣] ١٤٦-(٩٠)** حَدَّثَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ: حَدَّثَنَا اللَّيْثُ عَنْ ابْنِ الْهَادِ، عَنْ سَعْدِ بْنِ إِبْرَاهِيمَ، عَنْ حُمَيْدِ بْنِ عَبْدِ الرَّحْمَنِ، عَنْ عَبْدِ اللَّهِ بْنِ عَمْرِو بْنِ الْعَاصِ، أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: ((مِنْ الْكَبَائِرِ شَتْمُ الرَّجُلِ وَالِدَيْهِ)) قَالُوا: يَا رَسُولَ اللَّهِ! وَهَلْ يَشْتِمُ الرَّجُلُ وَالِدَيْهِ؟ قَالَ: ((نَعَمْ يَسُبُّ أَبَا الرَّجُلِ، فَيَسُبُّ أَبَاهُ، وَيَسُبُّ أُمَّهُ، فَيَسُبُّ أُمَّهُ)).

**[263]-146-(90)** ........ Abdullah ibn Amr ibn əl-As ﷺ demişdir: "(Bir dəfə) Peyğəmbər ﷺ belə buyurdu: "Bir adamın öz valideynlərini söyməsi böyük günahlardandır". (Səhabələr) dedilər: "Ya Rəsulullah! Heç adam da öz valideynini söyərmi?" Peyğəmbər ﷺ dedi: "Bəli, adam birisinin atasını söyür, o da (qayıdıb) onun atasını söyür, birisinin anasını söyür, o da (qayıdıb) onun anasını söyür".

---

[1] Diqqət edin! Yuxarıdakı hədislərdə Peyğəmbər ﷺ, Allaha tay tutmağın, övladı öldürməyin, qonşunun zövcəsi ilə zina etməyin, Allahın haram buyurduğu cana qıymağın, valideynlərin üzünə ağ olmağın, yalandan şahidlik etməyin, yalan danışmağın, habelə sonrakı hədislərdə valideyni söyməyin böyük günahlardan olmasını xəbər verir. Bu da, böyük günahların cəmi yeddi deyil, daha çox olduğuna dəlalət edir. Hətta İbn Abbasdan ﷺ nəql edilmiş rəvayətə əsasən böyük günahların sayı yetmişə yaxındır. İbn Cərir ət-Təbəri belə rəvayət etmişdir: "(Bir dəfə) İbn Abbasdan soruşdular: "Böyük günahlar yeddidirmi?" İbn Abbas belə cavab verdi: "Onların sayı yetmişə yaxındır" (Nəvəvi).

[2] Uca Allah buyurur: **"Yetimlərin mallarını haqsızlıqla yeyənlər, öz qarınlarına ancaq od doldururlar və onlar *Qiyamət günü* yandırıb-yaxan Oda girəcəklər"** ("ən-Nisa" surəsi, 10).

[3] Uca Allah buyurur: **"Sələm yeyənlər, *qəbirlərindən* şeytan toxunub dəli eləmiş kimsənin qalxdığı kimi qalxarlar. Bu onların: "Alış-veriş də sələmçilik kimidir!"– demələrinə görədir. Halbuki, Allah alış-verişi halal, sələmçiliyi isə haram etmişdir. Hər kim özünə Rəbbindən xəbərdarlıq gəldikdən sonra *sələmçiliyə* son qoyarsa, olub-keçənlər ona bağışlanar və onun işi Allaha qalar. *Sələmçiliyə* qayıdanlar isə Od sakinləridirlər. Onlar orada əbədi qalacaqlar"** ("əl-Bəqərə" surəsi, 275).

**[٢٦٤]** (...) و حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ وَمُحَمَّدُ بْنُ الْمُثَنَّى وَابْنُ بَشَّارٍ، جَمِيعًا عَنْ مُحَمَّدِ بْنِ جَعْفَرٍ، عَنْ شُعْبَةَ؛ ح: و حَدَّثَنِي مُحَمَّدُ بْنُ حَاتِمٍ: حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ: حَدَّثَنَا سُفْيَانُ، كِلَاهُمَا عَنْ سَعْدِ بْنِ إِبْرَاهِيمَ بِهَذَا الإِسْنَادِ، مِثْلَهُ.

**[264] (...)** ........ Şobə və Süfyan – hər ikisi bu hədisi Səd ibn İbrahimdən yuxarıdakı isnadla rəvayət etmişlər.

## (٣٩) – بَابُ تَحْرِيمِ الْكِبْرِ وَبَيَانِهِ

## 39-cu fəsil. Təkəbbürlüyün haram buyurulması və onun bəyan edilməsi

**[٢٦٥] ١٤٧**–(٩١) حَدَّثَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى وَمُحَمَّدُ بْنُ بَشَّارٍ وَإِبْرَاهِيمُ بْنُ دِينَارٍ، جَمِيعًا عَنْ يَحْيَى بْنِ حَمَّادٍ – قَالَ ابْنُ الْمُثَنَّى: حَدَّثَنِي يَحْيَى بْنُ حَمَّادٍ – أَخْبَرَنَا شُعْبَةُ عَنْ أَبَانَ بْنِ تَغْلِبَ، عَنْ فُضَيْلٍ الْفُقَيْمِيِّ، عَنْ إِبْرَاهِيمَ النَّخَعِيِّ، عَنْ عَلْقَمَةَ، عَنْ عَبْدِ اللَّهِ بْنِ مَسْعُودٍ عَنِ النَّبِيِّ ﷺ قَالَ: ((لَا يَدْخُلُ الْجَنَّةَ مَنْ كَانَ فِي قَلْبِهِ مِثْقَالُ ذَرَّةٍ مِنْ كِبْرٍ)) قَالَ رَجُلٌ: إِنَّ الرَّجُلَ يُحِبُّ أَنْ يَكُونَ ثَوْبُهُ حَسَنًا، وَنَعْلُهُ حَسَنَةً، قَالَ: ((إِنَّ اللَّهَ جَمِيلٌ يُحِبُّ الْجَمَالَ، الْكِبْرُ: بَطَرُ الْحَقِّ وَغَمْطُ النَّاسِ)).

**[265]-147-(91)** ........ Abdullah ibn Məsud ﵁ demişdir: "(Bir dəfə) Peyğəmbər ﷺ dedi: "Qəlbində zərrə qədər təkəbbür olan kimsə Cənnətə girməz[1]". (Bu vaxt) bir adam[2] dedi: "Adam libasının və ayaqqabısının gözəl olmasını xoşlayır". Peyğəmbər ﷺ buyurdu: "Allah gözəldir[3] və gözəlliyi sevər[4]. Təkəbbürlük isə haqqı danmaq və insanlara xor baxmaqdır".

---

[1] Yəni belələri birbaşa Cənnətə girməyəcək. Yalnız Allahın istədiyi kimsələrdən başqa. Belə ki, günah iş görmüş və tövhid üzərində dünyasını dəyişmiş hər kəs Allahın istəyi altındadır. İstər onu bağışlar və Cənnətə daxil edər, istərsə də, əvvəlcə ona Cəhənnəm əzabını daddırar, axırda isə onu mütləq Cənnətə daxil edər.

[2] Qazı İyad və İbn Abdul-Bərr həmin adamın Malik ibn Murara ər-Rəhavi olduğunu söyləmişlər.

[3] Bu, Allahın həm zatının, həm sifətlərinin, həm gördüyü hər bir işin, həm də isimlərinin gözəl olmasına dəlalət edir.

[4] Peyğəmbər ﷺ bu sözü ilə səhabələrinə gözəl geyinməyi və yaraşıqlı görünməyi məsləhət görür. Digər bir hədisdə rəvayət edilir ki, *bir dəfə* Ömər ibn Xattab ﵁ məscidin qapısının yanında *satılan* ipək paltarı görüb dedi: "Ey Allahın elçisi! Yaxşı olar ki, bu paltarı alasan və onu həm Cümə günləri, həm də yanına nümayəndələr gələndə geyəsən". Peyğəmbər ﷺ buyurdu: "Bu paltarı, axirətdə heç bir payı olmayan kimsə geyər!" Hədisdən açıq-aydın görünür ki, Pey-

**[٢٦٦] ١٤٨**–(...) حَدَّثَنَا مِنْجَابُ بْنُ الْحَارِثِ التَّمِيمِيُّ وَسُوَيْدُ بْنُ سَعِيدٍ كِلاَهُمَا عَنْ عَلِيِّ بْنِ مُسْهِرٍ – قَالَ مِنْجَابٌ: أَخْبَرَنَا ابْنُ مُسْهِرٍ – عَنْ الأَعْمَشِ، عَنْ إِبْرَاهِيمَ، عَنْ عَلْقَمَةَ، عَنْ عَبْدِ اللَّهِ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((لاَ يَدْخُلُ النَّارَ أَحَدٌ فِي قَلْبِهِ مِثْقَالُ حَبَّةِ خَرْدَلٍ مِنْ إِيمَانٍ، وَلاَ يَدْخُلُ الْجَنَّةَ أَحَدٌ فِي قَلْبِهِ مِثْقَالُ حَبَّةِ خَرْدَلٍ مِنْ كِبْرِيَاءَ)).

**[266]-148-(...)** ........ Abdullah ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Qəlbində xardal dənəsi ağırlığında imanı olan kimsə Cəhənnəmə girməz. Qəlbində xardal dənəsi ağırlığında təkəbbür olan kimsə Cənnətə girməz".

**[٢٦٧] ١٤٩**–(...) و حَدَّثَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ: حَدَّثَنَا أَبُو دَاوُدَ: حَدَّثَنَا شُعْبَةُ، عَنْ أَبَانَ بْنِ تَغْلِبَ، عَنْ فُضَيْلٍ، عَنْ إِبْرَاهِيمَ، عَنْ عَلْقَمَةَ، عَنْ عَبْدِ اللَّهِ عَنْ النَّبِيِّ ﷺ قَالَ: ((لاَ يَدْخُلُ الْجَنَّةَ مَنْ كَانَ فِي قَلْبِهِ مِثْقَالُ ذَرَّةٍ مِنْ كِبْرٍ)).

**[267]-149-(...)** ........ Abdullah ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Qəlbində zərrə qədər təkəbbür olan kimsə Cənnətə girməz".

## (٤٠) – بَابُ مَنْ مَاتَ لاَ يُشْرِكُ بِاللَّهِ شَيْئًا دَخَلَ الْجَنَّةَ وَمَنْ مَاتَ مُشْرِكًا دَخَلَ النَّارَ

## 40-cı fəsil. Kim Allaha şərik qoşmayıb ölərsə, Cənnətə girər. Kim də Allaha şərik qoşduğu halda ölərsə, Cəhənnəmə girər.

**[٢٦٨] ١٥٠**–(٩٢) حَدَّثَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللَّهِ بْنِ نُمَيْرٍ: حَدَّثَنَا أَبِي وَوَكِيعٌ، عَنْ الأَعْمَشِ، عَنْ شَقِيقٍ، عَنْ عَبْدِ اللَّهِ، – قَالَ وَكِيعٌ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: و قَالَ ابْنُ نُمَيْرٍ: سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ – يَقُولُ: مَنْ مَاتَ يُشْرِكُ بِاللَّهِ شَيْئًا دَخَلَ النَّارَ)) وَقُلْتُ أَنَا: وَمَنْ مَاتَ لاَ يُشْرِكُ بِاللَّهِ شَيْئًا دَخَلَ الْجَنَّةَ.

---

ğəmbər ﷺ həm Cümə günləri, həm də yanına nümayəndələr gələndə gözəl libas geyinərdi. İpəkdən imtina etməsinin səbəbi isə o paltarın bu ümmətin kişilərinə haram buyurulması idi. Həmçinin Allah Subhanəhu və Təalə da Quranda bizlərə məscidə getdikdə gözəl libas geyməyi buyurur: **"Ey Adəm oğulları! Məscidlərə *gedərkən* gözəl geyimlərinizi geyin. Yeyin-için, lakin israf etməyin. Şübhəsiz ki, *Allah* israf edənləri sevmir"** ("əl-Əraf" surəsi, 31). Bütün bunlar dəlildir ki, adamın libası, ayaqqabısı və ümumiyyətlə geyimə aid hər bir şeyi gözəl olmalıdır. Lakin bütün bunlar onu israf etməyə, təkəbbürlük göstərməyə və özünü dartmağa səbəb olmamalıdır. Əksinə, mömin təvazökar olmalıdır. Peyğəmbər ﷺ buyurmuşdur: "Kim Allah üçün təvazökarlıq edərsə, Allah onu ucaldar!" ("Silsilətul-Əhadis əs-Səhihə", 2328).

**[268]-150-(92)** ........ Abdullah ibn Məsud ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Kim Allaha şərik qoşub ölərsə, Cəhənnəmə girər”.

Mən dedim: “Kim Allaha şərik qoşmayıb ölərsə, Cənnətə daxil olar”.

**[٢٦٩] ١٥١-(٩٣)** و حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ وَأَبُو كُرَيْبٍ قَالا: حَدَّثَنَا أَبُو مُعَاوِيَةَ عَنْ الأَعْمَشِ، عَنْ أَبِي سُفْيَانَ، عَنْ جَابِرٍ قَالَ: أَتَى النَّبِيَّ ﷺ رَجُلٌ فَقَالَ: يَا رَسُولَ اللَّهِ! مَا الْمُوجِبَتَانِ؟ فَقَالَ: ((مَنْ مَاتَ لاَ يُشْرِكُ بِاللَّهِ شَيْئًا دَخَلَ الْجَنَّةَ، وَمَنْ مَاتَ يُشْرِكُ بِاللَّهِ شَيْئًا دَخَلَ النَّارَ)).

**[269]-151-(93)** ........ Cabir ﷺ demişdir: “Bir nəfər Peyğəmbərin ﷺ yanına gəlib dedi: “Ya Rəsulullah! (Cənnətə və Cəhənnəmə girməyi) vacib edən iki şey nədir?” Peyğəmbər ﷺ buyurdu: “Kim Allaha şərik qoşmayıb ölərsə, Cənnətə daxil olar. Kim də Allaha şərik qoşub ölərsə, Cəhənnəmə girər”.

**[٢٧٠] ١٥٢-(...)** و حَدَّثَنِي أَبُو أَيُّوبَ الْغَيْلاَنِيُّ سُلَيْمَانُ بْنُ عَبْدِ اللَّهِ، وَحَجَّاجُ بْنُ الشَّاعِرِ قَالاَ: حَدَّثَنَا عَبْدُ الْمَلِكِ بْنُ عَمْرٍو: حَدَّثَنَا قُرَّةُ عَنْ أَبِي الزُّبَيْرِ: حَدَّثَنَا جَابِرُ بْنُ عَبْدِ اللَّهِ قَالَ: سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ: ((مَنْ لَقِيَ اللَّهَ لاَ يُشْرِكُ بِهِ شَيْئًا دَخَلَ الْجَنَّةَ، وَمَنْ لَقِيَهُ يُشْرِكُ بِهِ دَخَلَ النَّارَ)) قَالَ أَبُو أَيُّوبَ: قَالَ أَبُو الزُّبَيْرِ، عَنْ جَابِرٍ.

**[270]-152-(...)** ........ Cabir ibn Abdullah ﷺ demişdir: “Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: “Kim Allaha şərik qoşmadığı halda Ona qovuşarsa, Cənnətə girər. Kim də Allaha şərik qoşduğu halda Ona qovuşarsa, Cəhənnəmə girər”.

Əbu Əyyub (bu hədisi) Əbu Zubeyrdən, o da Cabirdən rəvayət etmişdir.

**[٢٧١]** (...) و حَدَّثَنِي إِسْحَقُ بْنُ مَنْصُورٍ: أَخْبَرَنَا مُعَاذٌ - وَهُوَ ابْنُ هِشَامٍ - قَالَ: حَدَّثَنِي أَبِي، عَنْ أَبِي الزُّبَيْرِ، عَنْ جَابِرٍ أَنَّ نَبِيَّ اللَّهِ ﷺ قَالَ، بِمِثْلِهِ.

**[271] (...)** ........ İbn Hişam demişdir: “Atam, Əbu Zubeyrdən, o da Cabirdən, o da Peyğəmbərdən ﷺ bu hədisin bənzərini rəvayət etmişdir”.

**[٢٧٢] ١٥٣-(٩٤)** و حَدَّثَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى وَابْنُ بَشَّارٍ - قَالَ ابْنُ الْمُثَنَّى: حَدَّثَنَا - مُحَمَّدُ بْنُ جَعْفَرٍ: حَدَّثَنَا شُعْبَةُ عَنْ وَاصِلٍ الأَحْدَبِ، عَنْ الْمَعْرُورِ بْنِ سُوَيْدٍ قَالَ: سَمِعْتُ أَبَا ذَرٍّ يُحَدِّثُ عَنْ النَّبِيِّ ﷺ أَنَّهُ قَالَ: ((أَتَانِي جِبْرِيلُ عَلَيْهِ السَّلاَم، فَبَشَّرَنِي أَنَّهُ مَنْ مَاتَ مِنْ أُمَّتِكَ لاَ يُشْرِكُ بِاللَّهِ شَيْئًا دَخَلَ الْجَنَّةَ. قُلْتُ: وَإِنْ زَنَى وَإِنْ سَرَقَ؟ قَالَ: وَإِنْ زَنَى، وَإِنْ سَرَقَ)).

**[272]-153-(94)** ........ Əbu Zərr ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir. “Cəbrail ﷺ yanıma gəlib mənə müjdə verdi ki, ümmətimdən hər kim Allaha şərik qoşmadığı halda ölsə, o adam Cənnətə girər”. Mən soruşdum: “Zina etsə, oğurluq etsə belə?” Dedi: “(Bəli,) zina etsə, oğurluq etsə[1] belə?”.[2]

**[٢٧٣] ١٥٤**-(...) حَدَّثَنِي زُهَيْرُ بْنُ حَرْبٍ وَأَحْمَدُ بْنُ خِرَاشٍ قَالاَ: حَدَّثَنَا عَبْدُ الصَّمَدِ بْنُ عَبْدِ الْوَارِثِ، حَدَّثَنَا أَبِي قَالَ: حَدَّثَنِي حُسَيْنٌ الْمُعَلِّمُ، عَنِ ابْنِ بُرَيْدَةَ؛ أَنَّ يَحْيَى بْنَ يَعْمَرَ حَدَّثَهُ؛ أَنَّ أَبَا الأَسْوَدِ الدِّيلِيَّ حَدَّثَهُ؛ أَنَّ أَبَا ذَرٍّ حَدَّثَهُ قَالَ: أَتَيْتُ النَّبِيَّ ﷺ وَهُوَ نَائِمٌ، عَلَيْهِ ثَوْبٌ أَبْيَضُ، ثُمَّ أَتَيْتُهُ فَإِذَا هُوَ نَائِمٌ، ثُمَّ أَتَيْتُهُ وَقَدِ اسْتَيْقَظَ، فَجَلَسْتُ إِلَيْهِ فَقَالَ: ((مَا مِنْ عَبْدٍ قَالَ: لاَ إِلَهَ إِلاَّ اللَّهُ ثُمَّ مَاتَ عَلَى ذَلِكَ إِلاَّ دَخَلَ الْجَنَّةَ)) قُلْتُ: وَإِنْ زَنَى، وَإِنْ سَرَقَ؟ قَالَ: ((وَإِنْ زَنَى، وَإِنْ سَرَقَ)) قُلْتُ: وَإِنْ زَنَى، وَإِنْ سَرَقَ؟ قَالَ: ((وَإِنْ زَنَى، وَإِنْ سَرَقَ)) ثَلاَثًا، ثُمَّ قَالَ فِي الرَّابِعَةِ: ((عَلَى رَغْمِ أَنْفِ أَبِي ذَرٍّ)) قَالَ: فَخَرَجَ أَبُو ذَرٍّ وَهُوَ يَقُولُ: وَإِنْ رَغِمَ أَنْفُ أَبِي ذَرٍّ.

**[273]-154-(...)** ........ Əbu Zərr ﷺ demişdir: “(Bir dəfə) mən Peyğəmbərin ﷺ yanına gəldim. (Həmin vaxt) o, üstünə ağ örtük sərib yatmışdı. (Mən dönüb getdim və bir müddətdən) sonra yenə onun yanına gəldim. O, hələ də yatırdı. (Mən yenə dönüb getdim və bir müddətdən) sonra bir də onun yanına gəldim. Artıq o, oyanmışdı. Mən onun yanında oturdum və o, mənə belə buyurdu: “Lə ilahə illəllah” deyən və (qəlbən) bunu təsdiqləyərək ölən hər bir bəndə mütləq Cənnətə girəcəkdir”. Mən soruşdum: “Zina etsə, oğurluq etsə belə?” Dedi: “Zina etsə, oğurluq etsə belə”. Mən (yenə) soruşdum: “Zina etsə, oğurluq etsə belə?” Dedi: “Zina etsə, oğurluq etsə belə”. (Mən bu sualı) üç dəfə (təkrar etdim və hər dəfə eyni cavabı aldım.) Sonra dördüncü dəfə dedi: “Əbu Zərrin xoşuna gəlməsə belə”.

Əbu Əsvəd deyir ki: “Əbu Zərr Peyğəmbərin ﷺ yanından çıxarkən (öz-özünə) dedi: “Əbu Zərrin xoşuna gəlməsə belə”.

## (٤١) – بَابُ تَحْرِيمِ قَتْلِ الْكَافِرِ بَعْدَ قَوله: لاَ إِلَهَ إِلَّ اللَّهُ

## 41-ci fəsil. Kafir “lə ilahə illəllah” deyəndən sonra onu öldürməyin haram buyurulması

**[٢٧٤] ١٥٥**-(٩٥) حَدَّثَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ: حَدَّثَنَا لَيْثٌ؛ ح: و حَدَّثَنَا [مُحَمَّدُ] بْنُ رُمْحٍ – وَاللَّفْظُ – مُتَقَارِبٌ: أَخْبَرَنَا اللَّيْثُ عَنِ ابْنِ شِهَابٍ، عَنْ عَطَاءِ بْنِ يَزِيدَ اللَّيْثِيِّ، عَنْ عُبَيْدِ اللَّهِ بْنِ عَدِيِّ بْنِ الْخِيَارِ، عَنِ الْمِقْدَادِ

[1] İman kitabının 10-cu fəslinin, habelə 136-cı, 141-ci və 172-ci hədislərin qeydlərinə bax.
[2] 2304-cü hədisə bax.

بْنِ الأَسْوَدِ أَنَّهُ أَخْبَرَهُ أَنَّهُ قَالَ: يَا رَسُولَ اللَّه! أَرَأَيْتَ إِنْ لَقِيتُ رَجُلاً مِنْ الْكُفَّارِ، فَقَاتَلَنِي، فَضَرَبَ إِحْدَى يَدَيَّ بِالسَّيْفِ فَقَطَعَهَا، ثُمَّ لاَذَ مِنِّي بِشَجَرَةٍ فَقَالَ: أَسْلَمْتُ لِلَّهِ، أَفَأَقْتُلُهُ يَا رَسُولَ اللَّهِ بَعْدَ أَنْ قَالَهَا؟ قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((لاَ تَقْتُلْهُ)) قَالَ: فَقُلْتُ: يَا رَسُولَ اللَّه! إِنَّهُ قَدْ قَطَعَ يَدِي، ثُمَّ قَالَ ذَلِكَ بَعْدَ أَنْ قَطَعَهَا، أَفَأَقْتُلُهُ؟ قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((لاَ تَقْتُلْهُ، فَإِنْ قَتَلْتَهُ فَإِنَّهُ بِمَنْزِلَتِكَ قَبْلَ أَنْ تَقْتُلَهُ، وَإِنَّكَ بِمَنْزِلَتِهِ قَبْلَ أَنْ يَقُولَ كَلِمَتَهُ الَّتِي قَالَ)).

**[274]-155-(95)** ........ Miqdad ibn Əsvəd ﵁ belə rəvayət etmişdir: "(Bir dəfə) mən Peyğəmbərə ﷺ dedim: "Ya Rəsulullah! Söylə görüm, əgər mən (döyüşdə) kafirlərdən biri ilə üz-üzə gəlib onunla vuruşsam, o, qılıncla vurub mənim bir əlimi kəssə, sonra da canını məndən qurtarmaq üçün ağaca qalxıb: "Allaha təslim oluram!"– desə, bu sözü dedikdən sonra mən onu öldürə bilərəmmi, ya Rəsulullah?" Peyğəmbər ﷺ buyurdu: "Sən onu öldürməməlisən!" Mən dedim: "Ya Rəsulullah! O, mənim bir əlimi kəsmiş və bu sözü ancaq əlimi kəsdikdən sonra demişdir. Belə isə mən onu öldürə bilərəmmi?" Peyğəmbər ﷺ buyurdu: "Sən onu öldürməməlisən. Çünki əgər sən onu öldürsən, onun halı, sənin onu öldürməmişdən qabaqkı halın kimi olacaq. Sənin halın isə, onun bu sözü deməmişdən əvvəlki halı kimi olacaq"[1].

**[٢٧٥] ١٥٦**–(...) حَدَّثَنَا إِسْحَقُ بْنُ إِبْرَاهِيمَ وَعَبْدُ بْنُ حُمَيْدٍ قَالاَ: أَخْبَرَنَا عَبْدُ الرَّزَّاقِ قَالَ: أَخْبَرَنَا مَعْمَرٌ؛ ح: و حَدَّثَنَا إِسْحَقُ بْنُ مُوسَى الأَنْصَارِيُّ: حَدَّثَنَا الْوَلِيدُ بْنُ مُسْلِمٍ، عَنْ الأَوْزَاعِيِّ؛ ح: و حَدَّثَنَا مُحَمَّدُ بْنُ رَافِعٍ: حَدَّثَنَا عَبْدُ الرَّزَّاقِ: أَخْبَرَنَا ابْنُ جُرَيْجٍ، جَمِيعًا عَنْ الزُّهْرِيِّ بِهَذَا الإِسْنَادِ، أَمَّا الأَوْزَاعِيُّ وَابْنُ جُرَيْجٍ فَفِي حَدِيثِهِمَا قَالَ: أَسْلَمْتُ لِلَّهِ – كَمَا قَالَ اللَّيْثُ [فِي حَدِيثِهِ] – وَأَمَّا مَعْمَرٌ – فَفِي حَدِيثِهِ: فَلَمَّا أَهْوَيْتُ لأَقْتُلَهُ قَالَ: لاَ إِلَهَ إِلاَّ اللَّهُ.

**[275]-156-(...)** ........ Məmər, Əvzai və İbn Cureyc – hamısı (bu hədisi) Zuhridən bu isnadla rəvayət etmişlər. Əvzai və ibn Cureycə gəlincə, onların hədislərində Leysin hədisindəki kimi: "Allaha təslim oluram"– dedi..." rəvayət edilmişdir. Məmərin hədisində isə: "Mən onu öldürmək istədikdə o: "Lə ilahə illəllah"– dedi..." rəvayət edilmişdir.

**[٢٧٦] ١٥٧**–(...) و حَدَّثَنِي حَرْمَلَةُ بْنُ يَحْيَى: أَخْبَرَنَا ابْنُ وَهْبٍ قَالَ: أَخْبَرَنِي يُونُسُ عَنْ ابْنِ شِهَابٍ قَالَ: حَدَّثَنِي عَطَاءُ بْنُ يَزِيدَ اللَّيْثِيُّ ثُمَّ الْجُنْدَعِيُّ أَنَّ عُبَيْدَ اللَّهِ بْنَ عَدِيِّ بْنِ الْخِيَارِ أَخْبَرَهُ؛ أَنَّ الْمِقْدَادَ بْنَ عَمْرٍو

---

[1] Peyğəmbərin ﷺ: "...onun halı, sənin onu öldürməmişdən qabaqkı halın kimi olacaq" sözü o deməkdir ki, zahirən müsəlman olduqdan sonra onun qəsdinə durmaq qadağan olacaq, özü də şəriətə uyğun şəkildə mühakimə olunacaq. "Sənin halın onun bu sözü deməmişdən əvvəlki halı kimi olacaq" sözü isə o deməkdir ki, əgər sən onu öldürsən, onun varislərinin səndən qisas və ya qanbahası almağa haqqı olacaq ("Fəth əl-Bari", 19/301).

– بْنِ الأَسْوَد – الْكِنْدِيَّ، وَكَانَ حَلِيفًا لِبَنِي زُهْرَةَ، وَكَانَ مِمَّنْ شَهِدَ بَدْرًا مَعَ رَسُولِ اللَّهِ ﷺ، أَنَّهُ قَالَ: يَا رَسُولَ اللَّهِ! أَرَأَيْتَ إِنْ لَقِيتُ رَجُلاً مِنْ الْكُفَّارِ، ثُمَّ ذَكَرَ بِمِثْلِ حَدِيثِ اللَّيْثِ.

**[276]-157-(...)** ........ Bəni Zuhra qəbiləsinin müttəfiqi olmuş, Peyğəmbərlə ﷺ bərabər Bədr[1] döyüşündə iştirak etmiş Miqdad ibn Amr (ibn Əsvəd) əl-Kindi: "Ya Rəsulullah! Söylə görüm, əgər mən (döyüşdə) kafirlərdən biri ilə üz-üzə..."– deyərək Leysin rəvayət etdiyi hədisin eynisini rəvayət etmişdir.

**[٢٧٧] ١٥٨–(٩٦)** حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا أَبُو خَالِد الأَحْمَرُ؛ ح: و حَدَّثَنَا أَبُو كُرَيْبٍ وَإِسْحَقُ بْنُ إِبْرَاهِيمَ عَنْ أَبِي مُعَاوِيَةَ، كِلاَهُمَا عَنْ الأَعْمَشِ، عَنْ أَبِي ظَبْيَانَ، عَنْ أُسَامَةَ بْنِ زَيْد، وَهَذَا حَدِيثُ ابْنِ أَبِي شَيْبَةَ قَالَ: بَعَثَنَا رَسُولُ اللَّهِ ﷺ فِي سَرِيَّة، فَصَبَّحْنَا الْحُرَقَاتِ مِنْ جُهَيْنَةَ فَأَدْرَكْتُ رَجُلاً فَقَالَ: لاَ إِلَهَ إِلاَّ اللَّهُ، فَطَعَنْتُهُ فَوَقَعَ فِي نَفْسِي مِنْ ذَلِكَ، فَذَكَرْتُهُ لِلنَّبِيِّ ﷺ فَقَالَ: رَسُولُ اللَّهِ ﷺ: ((أَقَالَ: لاَ إِلَهَ إِلاَّ اللَّهُ وَقَتَلْتَهُ؟)) قَالَ: قُلْتُ: يَا رَسُولَ اللَّهِ! إِنَّمَا قَالَهَا خَوْفًا مِنْ السِّلاَحِ. قَالَ: ((أَفَلاَ شَقَقْتَ عَنْ قَلْبِهِ حَتَّى تَعْلَمَ أَقَالَهَا أَمْ لاَ))، فَمَا زَالَ يُكَرِّرُهَا عَلَيَّ حَتَّى تَمَنَّيْتُ أَنِّي أَسْلَمْتُ يَوْمَئِذ، قَالَ: فَقَالَ سَعْدٌ: وَأَنَا وَاللَّهِ! لاَ أَقْتُلُ مُسْلِمًا حَتَّى يَقْتُلَهُ ذُو الْبُطَيْنِ يَعْنِي أُسَامَةَ – قَالَ –: قَالَ رَجُلٌ: أَلَمْ يَقُلْ اللَّهُ: ﴿ وَقَٰتِلُوهُمْ حَتَّىٰ لَا تَكُونَ فِتْنَةٌ وَيَكُونَ ٱلدِّينُ كُلُّهُۥ لِلَّهِ ﴾ فَقَالَ سَعْدٌ: قَدْ قَاتَلْنَا حَتَّى لاَ تَكُونَ فِتْنَةٌ، وَأَنْتَ وَأَصْحَابُكَ تُرِيدُونَ أَنْ تُقَاتِلُوا حَتَّى تَكُونَ فِتْنَةٌ.

**[277]-158-(96)** ........ Usamə ibn Zeyd ﵁ demişdir: "(Bir dəfə) Peyğəmbər ﷺ bizi döyüşə göndərdi. (Nəhayət,) gəlib səhərə yaxın Cuheynədəki[2] Huraqata[3] hücum etdik. (Orada) mən (kafirlərdən) birisini yaxaladım. O: "Lə ilahə illəllah!"– dedi, lakin mən onu vurub öldürdüm. Sonra qəlbimə şübhə düşdü. Mən bu hadisəni Peyğəmbərə ﷺ danışdım. Peyğəmbər ﷺ dedi: "(Adam) "lə ilahə illəllah" dediyi halda sən onu öldürdün?!" Dedim: "Ya Rəsulullah! O, silahdan qorxub belə dedi". Peyğəmbər ﷺ buyurdu: "Məgər sən onun qəlbini açıb baxmışdın ki, onun bu sözü (qəlbən) dediyini biləsən?" Peyğəmbər ﷺ bu sözü mənə o qədər təkrar etdi ki, axırda mən (öz-özümə): "Kaş ki, mən İslamı bu gün qəbul etmiş olaydım"[4]– deyə təmənna etdim.

---

[1] Mədinədən 150 km cənubda yerləşən bir yerdir. İslam tarixində müsəlmanlarla kafirlər arasında ilk irimiqyaslı döyüş keçirilmiş yerdir.

[2] Cuheynə - Qudaə diyarındakı qəbilələrdən biri.

[3] Bu, Huraqa ləqəbi ilə tanınmış Cuheyş ibn Amir ibn Sələbə ibn Mudiə ibn Cuheynəyə mənsub edilir. Huraqa ərəbcə hərəqə (yandırmaq) felindən düzəlmiş isimdir. Cuheyş bir qövmü başdan-başa yandırdığına görə ona belə ləqəb verilmişdir. ("Fəth əl-Bari", 12/82).

[4] Yəni kaş bu günah, İslamı qəbul etməmişdən əvvəl etdiyim günahlardan sayılardı və İslamı qəbul etdikdə Allah mənim bu günahımdan keçərdi ("Dibac alə Muslim", 1/112).

Səd ibn (Əbu Vəqqas) ﷺ dedi: “Vallahi, (bu) yekəgödən – Usamə – (Allaha təslim olmuş) bir kimsəni öldürməyincə mən heç vaxt heç bir müsəlmanı öldürməyəcəyəm”. (Bunu eşidəndə xəvaric[1] fikirli olan) bir adam dedi: “Məgər Allah buyurmur: **“Fitnə aradan qalxana qədər və din tamamilə yalnız Allaha həsr edilənədək onlarla vuruşun!”**[2] Səd dedi: “Biz vuruşurduq ki, fitnə aradan qalxsın. Sən və sənin havadarların isə fitnənin yayılması üçün vuruşursunuz”[3].

**[٢٧٨] ١٥٩**–(...) حَدَّثَنَا يَعْقُوبُ الدَّوْرَقِيُّ: حَدَّثَنَا هُشَيْمٌ: أَخْبَرَنَا حُصَيْنٌ: حَدَّثَنَا أَبُو ظِبْيَانَ قَالَ: سَمِعْتُ أُسَامَةَ بْنَ زَيْدِ بْنِ حَارِثَةَ يُحَدِّثُ قَالَ: بَعَثَنَا رَسُولُ اللَّهِ ﷺ إِلَى الْحُرَقَةِ مِنْ جُهَيْنَةَ، فَصَبَّحْنَا الْقَوْمَ

---

[1] Xəvaric ərəbcə xərəcə ( خَرَجَ ) felindən əmələ gəlmiş xarici sözünün cəmidir. Xərəcə: xaric olmaq, xarici isə xaric olan deməkdir. Xarici deyildikdə müsəlman camaatından ayrılıb özünə dəstə yaradan və ya yaranmış belə bir dəstəyə qoşulan, dəlil-sübutsuz olaraq böyük günah sahibini kafir sayan və şəriətə zidd olan digər əxlaqları özündə cəm edən fasiqlər nəzərdə tutulur. Bu firqə – müsəlmanlar arasında meydana gəlmiş ilk firqədir. Onlar Allahın razı qaldığı, Cənnətlə müjdələnmiş, İslam üçün canından və malından keçmiş, ölənədək Peyğəmbərə ﷺ sadiq olmuş Osman ﷺ və Əli ﷺ kimi iki böyük səhabəni kafir sayıb şəhid etmişlər.

[2] “əl-Ənfal” surəsi, 39.

[3] Nasir ibn Süleyman demişdir: “İnsanlar fitnəyə düşüb əllərini qana buladıqdan sonra bu vəziyyətdən çıxmaq demək olar ki, mümkün olmur. Peyğəmbər ﷺ buyurmuşdur: “Mömini öldürməyin günahı Allah yanında bu dünyanın tamamilə məhv olmasından daha ağırdır” (“Sunən ən-Nəsai”, 3986; “Səhih ət-Tərğib vət-Tərhib”, 2440). İbn Ərəbi bu günahın nə dərəcədə böyük olduğunu izah edib demişdir: “Şəriət bizə nahaq yerə heyvan öldürməyi qadağan edir və bunu edən kimsənin əzaba düçar olacağını xəbər verir. Peyğəmbər ﷺ demişdir: “...Mən *Cəhənnəmdə* bir qadın gördüm və soruşdum ki: “Bu qadının günahı nədir?” *Mənə* dedilər: “Bu qadın *bir pişiyi* acından ölənədək *evdə* saxlamış, nə ona yemək vermiş, nə də onu sərbəst buraxmışdır ki, gedib özünə yem tapsın” (“Səhih əl-Buxari”, 745). Və əgər nahaq yerə heyvan öldürmək haramdırsa, bəs adam öldürmək necə?! Bəs müsəlmanı öldürmək necə?! Bəs Allahdan qorxan əməlisaleh mömini öldürmək necə?!”

Musanın ﷺ hekayəsinə diqqət yetirsəniz, görərsiniz ki, o, başçısı Firon olan dinsiz bir dövlətin sakinini – zalım, kafir misirlini öldürdükdən sonra: **“Ey Rəbbim! Mən özüm-özümə zülm etdim. Məni bağışla!”**– deyə Allahdan bağışlanma diləyir (“əl-Qəsəs” surəsi, 16), hətta: **“Bu, şeytan əməlindəndir. Həqiqətən, o, *haqq yoldan* azdıran açıq-aydın bir düşməndir!”**– deyir (“əl-Qəsəs” surəsi, 15). Diqqət edin, Musa ﷺ bu əməli cihad adlandırmır, əksinə, özünə zülm etdiyini bildirir. Peyğəmbər ﷺ xəbər vermişdir ki, Musa ﷺ belə bir iş tutduğuna görə Qiyamət günü ona: “Ey Musa! Sən, Allahın elçisisən, Allah Öz risaləti ilə, üstəlik səninlə bilavasitə danışmaqla səni digər insanlardan üstün etmişdir. *Elə isə* Rəbbinin yanında bizdən ötrü havadarlıq et! Məgər sən bizim nə vəziyyətdə olduğumuzu görmürsənmi?!”– deyə ondan mədəd diləyən insanlara: “Bu gün Rəbbim elə qəzəblənmişdir ki, O, bundan əvvəl heç vaxt belə qəzəblənməmiş və bundan sonra əsla belə qəzəblənməyəcəkdir. Mən adam öldürmüşəm. Halbuki, onu öldürmək mənə əmr edilməmişdi. Ah nəfsim, nəfsim, nəfsim! Gedin başqasının yanına. Gedin Məryəm oğlu İsanın yanına!”– deyə üzrxahlıq edəcək və şəfaət etməkdən boyun qaçıracaq. Halbuki, Musa o misirlini öldürmək niyyətində deyildi.

فَهَزَمْنَاهُمْ، قَالَ: وَلَحِقْتُ أَنَا وَرَجُلٌ مِنَ الأَنْصَارِ رَجُلاً مِنْهُمْ، فَلَمَّا غَشِينَاهُ قَالَ: لاَ إِلَهَ إِلاَّ اللَّهُ، فَكَفَّ عَنْهُ الأَنْصَارِيُّ وَطَعَنْتُهُ بِرُمْحِي حَتَّى قَتَلْتُهُ، قَالَ: فَلَمَّا قَدِمْنَا بَلَغَ ذَلِكَ النَّبِيَّ ﷺ فَقَالَ لِي: ((يَا أُسَامَةُ! أَقَتَلْتَهُ بَعْدَ مَا قَالَ: لاَ إِلَهَ إِلاَّ اللَّهُ؟)) قَالَ: قُلْتُ: يَا رَسُولَ اللَّهِ! إِنَّمَا كَانَ مُتَعَوِّذًا. قَالَ: فَقَالَ: ((أَقَتَلْتَهُ بَعْدَ مَا قَالَ: لاَ إِلَهَ إِلاَّ اللَّهُ؟)) قَالَ: فَمَا زَالَ يُكَرِّرُهَا عَلَيَّ حَتَّى تَمَنَّيْتُ أَنِّي لَمْ أَكُنْ أَسْلَمْتُ قَبْلَ ذَلِكَ الْيَوْمِ.

**[278]-159-(...)** ........ Usamə ibn Zeyd ﷺ demişdir: "(Bir dəfə) Peyğəmbər ﷺ bizi Cuheynədəki Huraqatın üstünə göndərdi. Biz səhərə yaxın düşmənə hücum etdik və onları məğlubiyyətə uğratdıq. (Orada) mən ənsardan olan bir (mücahidlə) kafirlərdən birini haqladıq. Biz onun başının üstünü aldıqda o: "Lə ilahə illəllah!"– dedi. (Bunu eşidəndə) ənsardan olan qardaşım ona dəymədi. Mən isə nizəmlə onu vurub öldürdüm. Biz Mədinəyə gəldikdə hadisəni Peyğəmbərə ﷺ danışdılar. Peyğəmbər ﷺ mənə dedi: "Ey Usamə! O: "Lə ilahə illəllah" deyəndən sonra sən onu öldürdün?!" Dedim: "Ya Rəsulullah! O, (canını) qurtarmaq üçün belə etdi". Peyğəmbər ﷺ dedi: "O: "Lə ilahə illəllah" deyəndən sonra sən onu öldürdün?!" Peyğəmbər ﷺ bu sözü mənə o qədər təkrar etdi ki, nəhayət, mən (öz-özümə): "Kaş mən bu gündən öncə İslamı qəbul etmiş olmayaydım"– deyə təmənna etdim.

**[٢٧٩] ١٦٠-(٩٧)** حَدَّثَنَا أَحْمَدُ بْنُ الْحَسَنِ بْنِ خِرَاشٍ: حَدَّثَنَا عَمْرُو بْنُ عَاصِمٍ: حَدَّثَنَا مُعْتَمِرٌ قَالَ: سَمِعْتُ أَبِي يُحَدِّثُ أَنَّ خَالِدًا الأَثْبَجَ ابْنَ أَخِي صَفْوَانَ بْنِ مُحْرِزٍ، حَدَّثَ عَنْ صَفْوَانَ بْنِ مُحْرِزٍ أَنَّهُ حَدَّثَ أَنَّ جُنْدَبَ بْنَ عَبْدِ اللَّهِ الْبَجَلِيَّ بَعَثَ إِلَى عَسْعَسِ بْنِ سَلاَمَةَ، زَمَنَ فِتْنَةِ ابْنِ الزُّبَيْرِ، فَقَالَ: اجْمَعْ لِي نَفَرًا مِنْ إِخْوَانِكَ حَتَّى أُحَدِّثَهُمْ، فَبَعَثَ رَسُولاً إِلَيْهِمْ، فَلَمَّا اجْتَمَعُوا جَاءَ جُنْدَبٌ وَعَلَيْهِ بُرْنُسٌ أَصْفَرُ فَقَالَ: تَحَدَّثُوا بِمَا كُنْتُمْ تَحَدَّثُونَ بِهِ، حَتَّى دَارَ الْحَدِيثُ، فَلَمَّا دَارَ الْحَدِيثُ إِلَيْهِ حَسَرَ الْبُرْنُسَ عَنْ رَأْسِهِ، فَقَالَ: إِنِّي أَتَيْتُكُمْ وَلاَ أُرِيدُ أَنْ أُخْبِرَكُمْ عَنْ نَبِيِّكُمْ ﷺ، إِنَّ رَسُولَ اللَّهِ ﷺ بَعَثَ بَعْثًا مِنَ الْمُسْلِمِينَ إِلَى قَوْمٍ مِنَ الْمُشْرِكِينَ، وَإِنَّهُمُ الْتَقَوْا فَكَانَ رَجُلٌ مِنَ الْمُشْرِكِينَ إِذَا شَاءَ أَنْ يَقْصِدَ إِلَى رَجُلٍ مِنَ الْمُسْلِمِينَ قَصَدَ لَهُ فَقَتَلَهُ، وَإِنَّ رَجُلاً مِنَ الْمُسْلِمِينَ قَصَدَ غَفْلَتَهُ قَالَ: وَكُنَّا نُحَدَّثُ أَنَّهُ أُسَامَةُ بْنُ زَيْدٍ، فَلَمَّا رَفَعَ عَلَيْهِ السَّيْفَ قَالَ: لاَ إِلَهَ إِلاَّ اللَّهُ، فَقَتَلَهُ، فَجَاءَ الْبَشِيرُ إِلَى النَّبِيِّ ﷺ، فَسَأَلَهُ فَأَخْبَرَهُ، حَتَّى أَخْبَرَهُ خَبَرَ الرَّجُلِ كَيْفَ صَنَعَ، فَدَعَاهُ فَسَأَلَهُ، فَقَالَ: ((لِمَ قَتَلْتَهُ؟)) قَالَ: يَا رَسُولَ اللَّهِ! أَوْجَعَ فِي الْمُسْلِمِينَ، وَقَتَلَ فُلاَنًا وَفُلاَنًا وَسَمَّى لَهُ نَفَرًا، وَإِنِّي حَمَلْتُ عَلَيْهِ، فَلَمَّا رَأَى السَّيْفَ قَالَ: لاَ إِلَهَ إِلاَّ اللَّهُ، قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((أَقَتَلْتَهُ؟)) قَالَ: نَعَمْ، قَالَ: ((فَكَيْفَ تَصْنَعُ بِلاَ إِلَهَ إِلاَّ اللَّهُ إِذَا جَاءَتْ يَوْمَ الْقِيَامَةِ؟)) قَالَ: يَا رَسُولَ اللَّهِ! اسْتَغْفِرْ لِي، قَالَ: ((وَكَيْفَ تَصْنَعُ بِلاَ إِلَهَ إِلاَّ اللَّهُ إِذَا جَاءَتْ يَوْمَ الْقِيَامَةِ؟)) فَقَالَ: فَجَعَلَ لاَ يَزِيدُهُ عَلَى أَنْ يَقُولَ: ((كَيْفَ تَصْنَعُ بِلاَ إِلَهَ إِلاَّ اللَّهُ إِذَا جَاءَتْ يَوْمَ الْقِيَامَةِ؟)).

**[279]-160-(97)** ........ Cundəb ibn Abdullah əl-Bəcəli, İbn Zubeyrin başına gələn fitnə[1] zamanı Əsəs ibn Sələməyə xəbər yolladı ki: “Dostlarından bir dəstə adam yığ, mən gəlib onlarla söhbət edəcəyəm[2]”. Əsəs onların yanına bir adam göndərdi. Onlar toplandığı zaman Cundəb əynində sarı rəngli burnus[3] onların yanına gəldi və: “Nə söyləyəcəksinizsə, söyləyin”– deyə buyurdu. Nəhayət, söhbət açıldı. Cundəbə söz verildiyi zaman o, burnusu başından açıb dedi: “Mən sizin yanınıza gəlmişəm ki, sizlərə Peyğəmbərinizdən ﷺ xəbər verim. (Bir zaman) Peyğəmbər ﷺ bir dəstə müsəlmanı müşrik olan bir tayfanın üstünə göndərdi. (Nəhayət,) onlar qarşı-qarşıya gəldilər. (Döyüş əsnasında) müşriklərdən biri müsəlmanlardan kimsəni öldürmək istədikdə, qəsdinə durub onu öldürürdü. Müsəlmanlardan da birisi gözləyib fürsət tapan kimi bu adamı öldürdü. O kimsənin Usamə ibn Zeyd olduğu bizə xəbər verilmişdi. Usamə qılıncını (kafirin) başı üzərinə qaldırdıqda o: “Lə ilahə illəllah” demiş, (amma buna baxmayaraq) Usamə onu öldürmüşdü.

(Müsəlmanlar düşməni darmadağın etdikdən sonra) müjdəçi Peyğəmbərin ﷺ yanına gəldi. Peyğəmbər ﷺ ondan (döyüş barəsində) soruşdu, o da (baş verənləri) ona xəbər verdi. Ayrıca Usamənin nə etdiyini də ona xəbər verdi. Onda Peyğəmbər ﷺ Usaməni çağırıb: “Onu niyə öldürdün?”– deyə soruşdu. Usamə dedi: “Ya Rəsulullah! O, müsəlmanlardan bir çoxunun canına qəsd etdi. Filankəsi və filankəsi öldürdü. (Usamə bir neçə adamın adını çəkdi). Mən də onun üstünə getdim. O, qılıncı görəndə: “Lə ilahə illəllah”– dedi. Peyğəmbər ﷺ soruşdu: “Sən də onu öldürdün?” Mən: “Bəli”– deyə cavab verdim. Peyğəmbər ﷺ buyurdu: “Qiyamət günü “lə ilahə illəllah” kəlməsi (şahid olaraq) gəldiyi zaman sən nə edəcəksən?” Usamə dedi: “Ya Rəsulullah, mənim üçün bağışlanma dilə”. Peyğəmbər ﷺ buyurdu: “Qiyamət günü “lə ilahə illəllah” kəlməsi (şahid olaraq) gəldiyi zaman sən nə edəcəksən?” Peyğəmbər ﷺ: “Qiyamət günü “lə ilahə illəllah” kəlməsi (şahid olaraq) gəldiyi zaman sən nə edəcəksən?” sözündən başqa bir söz söyləmədi.

---

[1] Burada “İbn Zubeyrin başına gələn fitnə deyildikdə”, zalım Həccacın onu və onun tərəfdarlarını vəhşicəsinə qətlə yetirməsi nəzərdə tutulur. Bu hadisə Mərvan ibn Həkəmin xilafəti dövründə baş vermişdir.

[2] Bu dəlildir ki, insanlar arasında sözükeçən ziyalılar, fitnə baş qaldırdığı zaman camaatı sakitlədirməli və dəlil-sübuta əsaslanaraq haqqı onlara bəyan etməlidir.

[3] Burnus – arxa tərəfdən yaxalığına başlıq bənd edilmiş üst geyimidir.

## (٤٢) – بَابُ قَوْلِ النَّبِيِّ ﷺ مَنْ حَمَلَ عَلَيْنَا السِّلاَحَ فَلَيْسَ مِنَّا

## 42-ci fəsil. Peyğəmbərin ﷺ: "Bizə silah qaldıran bizdən deyildir" sözü

**[٢٨٠] ١٦١–(٩٨)** حَدَّثَنِي زُهَيْرُ بْنُ حَرْبٍ وَمُحَمَّدُ بْنُ الْمُثَنَّى قَالاَ: حَدَّثَنَا يَحْيَى وَهُوَ الْقَطَّانُ؛ ح: و حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا أَبُو أُسَامَةَ وَابْنُ نُمَيْرٍ، كُلُّهُمْ عَنْ عُبَيْدِ اللَّهِ عَنْ نَافِعٍ، عَنْ ابْنِ عُمَرَ عَنْ النَّبِيِّ ﷺ؛ ح: و حَدَّثَنَا يَحْيَى بْنُ يَحْيَى وَاللَّفْظُ لَهُ قَالَ: قَرَأْتُ عَلَى مَالِكٍ عَنْ نَافِعٍ، عَنْ ابْنِ عُمَرَ، أَنَّ النَّبِيَّ ﷺ قَالَ: ((مَنْ حَمَلَ عَلَيْنَا السِّلاَحَ فَلَيْسَ مِنَّا)).

**[280]-161-(98)** ........ İbn Ömər رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ buyurmuşdur: "Bizim üstümüzə silah qaldıran bizdən deyildir"[1].

**[٢٨١] ١٦٢–(٩٩)** حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ وَابْنُ نُمَيْرٍ قَالاَ: حَدَّثَنَا مُصْعَبٌ وَهُوَ ابْنُ الْمِقْدَامِ: حَدَّثَنَا عِكْرِمَةُ بْنُ عَمَّارٍ عَنْ إِيَاسِ بْنِ سَلَمَةَ، عَنْ أَبِيهِ عَنْ النَّبِيِّ ﷺ قَالَ: ((مَنْ سَلَّ عَلَيْنَا السَّيْفَ فَلَيْسَ مِنَّا)).

**[281]-162-(99)** ........ Sələmə رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Bizə qarşı qılınc çəkən bizdən deyildir".

**[٢٨٢] ١٦٣–(١٠٠)** حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ وَعَبْدُ اللَّهِ بْنُ بَرَّادٍ الأَشْعَرِيُّ وَأَبُو كُرَيْبٍ، قَالُوا: حَدَّثَنَا أَبُو أُسَامَةَ عَنْ بُرَيْدٍ، عَنْ أَبِي بُرْدَةَ، عَنْ أَبِي مُوسَى عَنْ النَّبِيِّ ﷺ قَالَ: ((مَنْ حَمَلَ عَلَيْنَا السِّلاَحَ فَلَيْسَ مِنَّا)).

**[282]-163-(100)** ........ Əbu Musa رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Bizə qarşı silah qaldıran bizdən deyildir".

## (٤٣) – بَابُ قَوْلِ النَّبِيِّ ﷺ مَنْ غَشَّنَا فَلَيْسَ مِنَّا

## 43-cü fəsil. Peyğəmbərin ﷺ: "Bizə kələk gələn bizdən deyildir" sözü

**[٢٨٣] ١٦٤–(١٠١)** حَدَّثَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ: حَدَّثَنَا يَعْقُوبُ وَهُوَ ابْنُ عَبْدِ الرَّحْمَنِ الْقَارِيُّ؛ ح: و حَدَّثَنَا أَبُو الأَحْوَصِ مُحَمَّدُ بْنُ حَيَّانَ: حَدَّثَنَا ابْنُ أَبِي حَازِمٍ، كِلاَهُمَا عَنْ سُهَيْلِ بْنِ أَبِي صَالِحٍ، عَنْ أَبِيهِ، عَنْ أَبِي هُرَيْرَةَ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: ((مَنْ حَمَلَ عَلَيْنَا السِّلاَحَ فَلَيْسَ مِنَّا، وَمَنْ غَشَّنَا فَلَيْسَ مِنَّا)).

---

[1] Yəni bizim əxlaqımıza və sünnəmizə uyğun hərəkət edənlərdən deyil.

**[283]-164-(101)** ........ Əbu Hureyrə ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Bizim üstümüzə silah qaldıran bizdən deyildir. Bizə kələk gələn də bizdən deyildir”[1].

**[٢٨٤]** (١٠٢) و حَدَّثَنِي يَحْيَى بْنُ أَيُّوبَ وَقُتَيْبَةُ وَابْنُ حُجْرٍ، جَمِيعًا عَنْ إِسْمَعِيلَ بْنِ جَعْفَرٍ – قَالَ ابْنُ أَيُّوبَ: حَدَّثَنَا إِسْمَعِيلُ – قَالَ: أَخْبَرَنِي الْعَلَاءُ عَنْ أَبِيهِ، عَنْ أَبِي هُرَيْرَةَ، أَنَّ رَسُولَ اللَّهِ ﷺ مَرَّ عَلَى صُبْرَةِ طَعَامٍ، فَأَدْخَلَ يَدَهُ فِيهَا، فَنَالَتْ أَصَابِعُهُ بَلَلاً، فَقَالَ: ((مَا هَذَا يَا صَاحِبَ الطَّعَامِ؟)) قَالَ: أَصَابَتْهُ السَّمَاءُ يَا رَسُولَ اللَّهِ! قَالَ: ((أَفَلاَ جَعَلْتَهُ فَوْقَ الطَّعَامِ كَيْ يَرَاهُ النَّاسُ؟ مَنْ غَشَّ فَلَيْسَ مِنِّي)).

**[284] (102)** ........ Əbu Hureyrə ﵁ rəvayət edir ki, (bir dəfə) Peyğəmbər ﷺ bir ərzaq topası görüb əlini onun içinə saldı. Barmaqları yaş bir şeyə dəydikdə, o: “Bu nədir, ey mal yiyəsi?”– deyə soruşdu. Mal sahibi: “Ona yağış dəyib, ya Rəsulullah!”– deyə cavab verdi. Onda Peyğəmbər ﷺ dedi: “Niyə bəs sən onu üstə qoymursan ki, insanlar onu görə bilsin?! (Bil ki,) bizə kələk gələn bizdən deyildir”.

## (٤٤) – بَابُ تَحْرِيمِ ضَرْبِ الْخُدُودِ وَشَقِّ الْجُيُوبِ وَالدُّعَاءِ بِدَعْوَى الْجَاهِلِيَّةِ

## 44-cü fəsil. Üzə vurmağın, paltarın yaxasını cırmağın və cahiliyyət dövründə deyilən sözləri deməyin haram buyurulması

**[٢٨٥] ١٦٥**–(١٠٣) حَدَّثَنَا يَحْيَى بْنُ يَحْيَى: أَخْبَرَنَا أَبُو مُعَاوِيَةَ؛ ح: و حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا أَبُو مُعَاوِيَةَ وَوَكِيعٌ؛ ح: و حَدَّثَنَا ابْنُ نُمَيْرٍ: حَدَّثَنَا أَبِي جَمِيعًا عَنْ الأَعْمَشِ، عَنْ عَبْدِ اللَّهِ بْنِ مُرَّةَ، عَنْ مَسْرُوقٍ، عَنْ عَبْدِ اللَّهِ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((لَيْسَ مِنَّا مَنْ ضَرَبَ الْخُدُودَ، أَوْ شَقَّ الْجُيُوبَ، أَوْ دَعَا بِدَعْوَى الْجَاهِلِيَّةِ)).

هَذَا حَدِيثُ يَحْيَى، وَأَمَّا ابْنُ نُمَيْرٍ وَأَبُو بَكْرٍ فَقَالاَ: ((وَشَقَّ وَدَعَا)) بِغَيْرِ أَلِفٍ.

**[285]-165-(103)** ........ Abdullah (ibn Məsud) ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Üz-gözünə döyən, yaxud paltarının yaxasını cıran, yaxud cahiliyyət dövründə deyilən sözləri[2] deyən kimsə bizdən deyildir”[3].

---

[1] Bu hədis müsəlmanların bir-birilərilə vuruşmalarının, habelə bir-birilərinə kələk gəlmələrinin haram olduğuna dəlalət edir.

[2] Burada “cahiliyyət dövründə deyilən sözlər” deyildikdə vay-şivən qoparıb ölünün tayfasını, yaxud əsil-nəsəbini, yaxud məqamını, başqalarından üstün olduğunu xüsusilə qeyd edərək ağı demək, qəzavü-qədərə dil uzadaraq heyfsilənmək nəzərdə tutulur.

[3] Ölüyə ağladıqda həddi aşan hər kəs Peyğəmbərin ﷺ sünnəsinə zidd hərəkət etmiş hesab olunur.

Bu, Yəhyanın rəvayət etdiyi hədisdir. İbn Numeyrin və Əbu Bəkrin hədisində isə əlifsiz olaraq[1]: "cıran və deyən" rəvayət edilmişdir.

**[٢٨٦] ١٦٦**–(...) و حَدَّثَنَا عُثْمَانُ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا جَرِيرٌ؛ ح: و حَدَّثَنَا إِسْحَقُ بْنُ إِبْرَاهِيمَ وَعَلِيُّ بْنُ خَشْرَمٍ قَالاَ: حَدَّثَنَا عِيسَى بْنُ يُونُسَ، جَمِيعًا عَنْ الأَعْمَشِ بِهَذَا الإِسْنَادِ، وَقَالاَ: ((وَشَقَّ وَدَعَا)).

**[286]-166-(...)** ........ Cərir və İsa ibn Yunus – hər ikisi (bu hədisi) Aməşdən bu isnadla rəvayət etmiş və onlar da (əlifsiz olaraq): "cıran və deyən" ləfzi ilə rəvayət etmişlər.

**[٢٨٧] ١٦٧**–(**١٠٤**) حَدَّثَنَا الْحَكَمُ بْنُ مُوسَى الْقَنْطَرِيُّ: حَدَّثَنَا يَحْيَى بْنُ حَمْزَةَ عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ يَزِيدَ ابْنِ جَابِرٍ: أَنَّ الْقَاسِمَ بْنَ مُخَيْمِرَةَ حَدَّثَهُ قَالَ: حَدَّثَنِي أَبُو بُرْدَةَ بْنُ أَبِي مُوسَى قَالَ: وَجِعَ أَبُو مُوسَى وَجَعًا فَغُشِيَ عَلَيْهِ، وَرَأْسُهُ فِي حَجْرِ امْرَأَةٍ مِنْ أَهْلِهِ، فَصَاحَتْ امْرَأَةٌ مِنْ أَهْلِهِ فَلَمْ يَسْتَطِعْ أَنْ يَرُدَّ عَلَيْهَا شَيْئًا، فَلَمَّا أَفَاقَ قَالَ: أَنَا بَرِيءٌ مِمَّا بَرِئَ مِنْهُ رَسُولُ اللَّهِ ﷺ، فَإِنَّ رَسُولَ اللَّهِ ﷺ بَرِئَ مِنْ الصَّالِقَةِ وَالْحَالِقَةِ وَالشَّاقَّةِ.

**[287]-167-(104)** ........ Əbu Burdə ibn Əbu Musa demişdir: "(Bir dəfə) Əbu Musa ağır xəstələndi və başı ailəsindən bir qadının qucağında ikən bayıldı. Bu vaxt həmin qadın fəryad qoparıb ağlamağa başladı və Əbu Musa ona heç nə deyə bilmədi. Ayıldıqda isə belə dedi: "Peyğəmbərin ﷺ uzaq olduğu kimsədən mən də uzağam. Həqiqətən, Peyğəmbər ﷺ (müsibət üz verdikdə) vay-şivən salıb ağlayan, başını qırxdıran[2] və paltarını cıran qadından uzaqdır!"

**[٢٨٨]** (...) حَدَّثَنَا عَبْدُ بْنُ حُمَيْدٍ وَإِسْحَقُ بْنُ مَنْصُورٍ قَالاَ: أَخْبَرَنَا جَعْفَرُ بْنُ عَوْنٍ قَالَ: أَخْبَرَنَا أَبُو عُمَيْسٍ قَالَ: سَمِعْتُ أَبَا صَخْرَةَ يَذْكُرُ عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ يَزِيدَ وَأَبِي بُرْدَةَ بْنِ أَبِي مُوسَى، قَالاَ: أُغْمِيَ عَلَى أَبِي مُوسَى وَأَقْبَلَتْ امْرَأَتُهُ أُمُّ عَبْدِ اللَّهِ تَصِيحُ بِرَنَّةٍ قَالاَ: ثُمَّ أَفَاقَ، قَالَ: أَلَمْ تَعْلَمِي – وَكَانَ يُحَدِّثُهَا – أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: ((أَنَا بَرِيءٌ مِمَّنْ حَلَقَ وَسَلَقَ وَخَرَقَ)).

---

[1] Hədis ərəbcə (أو) "əv" yəni, yaxud bağlayıcısı əvəzinə əlifsiz olaraq (و), yəni "və" ilə rəvayət edilmişdir.

[2] Məhz müsibət üz verdikdə baş qırxmaq haram buyurulmuşdur. Çünki bu əməl, cahiliyyət dövründən qalmış mənfur adətlərdəndir. Ümumiyyətlə isə baş qırxdırmaq dörd cürdür:
– ya həcc və ümrə ziyarətləri əsnasında;
– ya başda sirkə, bit, birə və başqa bu kimi xəstəliklər olduqda;
– ya sərinləmək, rahat olmaq üçün;
– ya da hər hansı bir təriqətə bənzəmək, yad adətlərə uymaq üçün.
Bu sadaladıqlarımızın birincisi müstəhəb, ikincisi vacib, üçüncüsü mübah, dördüncüsü isə haramdır. Yuxarıdakı hədisdə qəsd edilən baş qırxmaq da, məhz haram növə aiddir.
Qeyd etmək lazımdır ki, qadınlara yalnız başlarında olan xəstəlik və ya bu kimi zəruri hallarda saçlarını qırxdırmaq caizdir.

**[288] (...)** ........ Abdur-Rəhman ibn Yezid və Əbu Burdə belə rəvayət etmişlər: “Əbu Musa (ağır xəstə ikən) bayıldı və zövcəsi Ummu Abdullah ona yaxınlaşıb hönkür-hönkür ağlamağa başladı. Əbu Musa ayıldıqdan sonra zövcəsinə dedi: “Məgər Peyğəmbərin ﷺ: “Mən saçını yolan, vay-şivən salıb ağlayan və paltarını cıran kimsədən uzağam!”– dediyini bilmirsənmi?!” (Belə ki, Əbu Musa bu hədisi zövcəsinə danışardı.)

**[٢٨٩]** (...) وَ حَدَّثَنِي عَبْدُ اللَّهِ بْنُ مُطِيعٍ: حَدَّثَنَا هُشَيْمٌ عَنْ حُصَيْنٍ، عَنْ عِيَاضٍ الأَشْعَرِيِّ، عَنْ امْرَأَةِ أَبِي مُوسَى، عَنْ أَبِي مُوسَى عَنْ النَّبِيِّ ﷺ؛ ح: و حَدَّثَنِيهِ حَجَّاجُ بْنُ الشَّاعِرِ، حَدَّثَنَا عَبْدُ الصَّمَدِ قَالَ: حَدَّثَنِي أَبِي: حَدَّثَنَا دَاوُدُ – يَعْنِي ابْنَ أَبِي هِنْدٍ –: حَدَّثَنَا عَاصِمٌ عَنْ صَفْوَانَ بْنِ مُحْرِزٍ، عَنْ أَبِي مُوسَى عَنْ النَّبِيِّ ﷺ؛ ح: و حَدَّثَنِي الْحَسَنُ بْنُ عَلِيٍّ الْحُلْوَانِيُّ: حَدَّثَنَا عَبْدُ الصَّمَدِ: أَخْبَرَنَا شُعْبَةُ عَنْ عَبْدِ الْمَلِكِ بْنِ عُمَيْرٍ، عَنْ رِبْعِيِّ بْنِ حِرَاشٍ، عَنْ أَبِي مُوسَى عَنْ النَّبِيِّ ﷺ بِهَذَا الْحَدِيثِ، غَيْرَ أَنَّ فِي حَدِيثِ عِيَاضٍ الأَشْعَرِيِّ قَالَ: ((لَيْسَ مِنَّا)) وَلَمْ يَقُلْ: ((بَرِيءٌ)).

**[289] (...)** ........ (Ravilər) ayrı-ayrı isnadlarla bu hədisi Əbu Musadan, o da Peyğəmbərdən ﷺ rəvayət etmişlər. Ancaq İyad əl-Əşarinin rəvayətində: “bizdən deyildir” buyurmuş, “uzağam” deməmişdir.

## (٤٥) – بَابُ بَيَانِ غِلَظِ تَحْرِيمِ النَّمِيمَةِ

## 45-ci fəsil. Söz gəzdirməyin[1] ağır günah olduğunun bəyan edilməsi

**[٢٩٠]** ١٦٨–(١٠٥) و حَدَّثَنِي شَيْبَانُ بْنُ فَرُّوخَ وَعَبْدُ اللَّهِ بْنُ مُحَمَّدِ بْنِ أَسْمَاءَ الضُّبَعِيُّ قَالاَ: حَدَّثَنَا مَهْدِيٌّ وَهُوَ ابْنُ مَيْمُونٍ: حَدَّثَنَا وَاصِلٌ الأَحْدَبُ عَنْ أَبِي وَائِلٍ، عَنْ حُذَيْفَةَ أَنَّهُ بَلَغَهُ أَنَّ رَجُلاً يَنُمُّ الْحَدِيثَ فَقَالَ حُذَيْفَةُ: سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ: ((لاَ يَدْخُلُ الْجَنَّةَ نَمَّامٌ)).

**[290]-168-(105)** ........ Əbu Vail demişdir: “Bir kimsənin söz gəzdirməsi xəbəri Huzeyfəyə gəlib çatmış və o demişdir: “Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: “Söz gəzdirən adam Cənnətə girməz”[2].

---

[1] Burada “söz gəzdirmək” deyildikdə camaat arasında fəsad yaymaq məqsədilə birinin sözünü başqa birisinə çatdırmaq qəsd edilir.

[2] İmam Əbu Hamid əl-Ğəzali ﵀ “İhya Ulum əd-Din” əsərində demişdir: “Bil ki, əksər hallarda söz gəzdirmək deyildikdə birisinin, qeybət qıran adamın sözünü, qeybətini qırdığı

**[٢٩١] ١٦٩**–(...) حَدَّثَنَا عَلِيُّ بْنُ حُجْرٍ السَّعْدِيُّ وَإِسْحَقُ بْنُ إِبْرَاهِيمَ – قَالَ إِسْحَقُ: أَخْبَرَنَا – جَرِيرٌ عَنْ مَنْصُورٍ، عَنْ إِبْرَاهِيمَ، عَنْ هَمَّامِ بْنِ الْحَارِثِ قَالَ: كَانَ رَجُلٌ يَنْقُلُ الْحَدِيثَ إِلَى الأَمِيرِ، فَكُنَّا جُلُوسًا فِي الْمَسْجِدِ فَقَالَ الْقَوْمُ: هَذَا مِمَّنْ يَنْقُلُ الْحَدِيثَ إِلَى الأَمِيرِ، قَالَ: فَجَاءَ حَتَّى جَلَسَ إِلَيْنَا، فَقَالَ حُذَيْفَةُ: سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ: ((لاَ يَدْخُلُ الْجَنَّةَ قَتَّاتٌ)).

**[291]-169-(...)** ........ Həmmam ibn Haris demişdir: "Bir nəfər əmirə söz aparırdı. (Bir gün) biz məsciddə ikən camaat (onun barəsində): "Bu adam əmirə söz aparanlardan biridir"– dedi. Elə bu vaxt həmin adam (məscidə) gəlib bizim yanımızda oturdu. (Onu görəndə) Huzeyfə dedi: "Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: "Dedi-qodu yayan adam Cənnətə girməz!"

**[٢٩٢] ١٧٠**–(...) حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا أَبُو مُعَاوِيَةَ وَوَكِيعٌ عَنْ الأَعْمَشِ؛ ح: و حَدَّثَنَا مِنْجَابُ بْنُ الْحَارِثِ التَّمِيمِيُّ: – وَاللَّفْظُ لَهُ – أَخْبَرَنَا ابْنُ مُسْهِرٍ، عَنْ الأَعْمَشِ، عَنْ إِبْرَاهِيمَ، عَنْ هَمَّامِ بْنِ

---

kimsəyə çatdırması nəzərdə tutulur. Məsələn, deyir: "Filankəs sənin barəndə filan sözü danışır". Lakin söz gəzdirməyin tərifini bununla xüsusiləşdirmək düzgün sayılmır. Əksinə, söz gəzdirmək deyildikdə ifşa edilməsi arzu olunmayan bir işin üstünü açmaq nəzərdə tutulur... Bu, istər qeybət edənin, istər barəsində qeybət edilənin, istərsə də üçüncü bir adamın xoşuna gəlməsə də, habelə istər kinayə ilə, istər eyhamla, istərsə də işarə ilə olsun, hər halda söz gəzdirmək sayılır. Əslində, söz gəzdirmək, sirri ifşa etmək deməkdir. Və əgər birisi başqa birisinin gizlətdiyi maldan xəbər tutub: "Filankəsin filan qədər malı var" desə, söz gəzdirmiş hesab edilər. Həmçinin qeyd etmək lazımdır ki, birisi başqa birisinə: "Filankəs sənin barəndə filan sözü danışır" desə, həmin adam belə etməlidir:

– onun sözünü təsdiqləməməlidir. Çünki söz gəzdirən adam fasiq adam sayılır;

– bu əməlin qəbih bir iş olduğunu ona başa salmalı, bunu ona qadağan etməli və ona öyüd-nəsihət verməlidir;

– ona Allah xatirinə nifrət etməlidir. Çünki o, Allahın nifrət etdiyi kimsələrdəndir. Allahın nifrət etdityinə nifrət etmək isə vacibdir;

– mömin qardaşı barəsində pis fikirləşməməlidir;

– bu sözü eşidəndən sonra casusluq etməməlidir;

– bu sözü başqalarına danışmamalıdır. Yoxsa, o da onun tayı olacaq.

(Əbu Hamidin sözü burada bitir.)

Hərçənd bu dediklərimiz söz gəzdirmək sayılır, lakin məsləhət olduqda islah etmək məqsədilə bunu etməkdə heç bir qəbahət yoxdur. Məsələn, birisi gəlib başqa birisinə xəbər verir ki, filankəs onu öldürmək istəyir, yaxud onun ailəsinə sataşmaq istəyir və ya malını qəsb etmək istəyir və s. Yaxud əmirə və ya qazıya xəbər verir ki, filankəs filan cinayəti edib. Beləliklə də, fəsadın qarşısını alır. Əmir və qazı isə öz növbəsində bu məsələni araşdırıb günahkarı cəzasına çatdırmalıdır. (Nəvəvi, 2/295-296).

الْحَارِثِ قَالَ: كُنَّا جُلُوسًا مَعَ حُذَيْفَةَ فِي الْمَسْجِدِ، فَجَاءَ رَجُلٌ حَتَّى جَلَسَ إِلَيْنَا، فَقِيلَ لِحُذَيْفَةَ: إِنَّ هَذَا يَرْفَعُ إِلَى السُّلْطَانِ أَشْيَاءَ، فَقَالَ حُذَيْفَةُ – إِرَادَةَ أَنْ يُسْمِعَهُ –: سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ: ((لاَ يَدْخُلُ الْجَنَّةَ قَتَّاتٌ)).

**[292]-170-(...)** ........ Həmmam ibn Haris demişdir: “Biz məsciddə Huzeyfənin yanında oturmuşduq. Bu vaxt bir nəfər gəlib bizim yanımızda oturdu. Huzeyfəyə: “Bu (adam) əmirə bəzi şeylər çatdırır”– deyildi. Huzeyfə ona eşitdirmək məqsədilə dedi: “Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: “Dedi-qodu yayan adam Cənnətə girməz!”

## (٤٦) – بَابُ بَيَانِ غلَظِ تَحْرِيمِ إِسْبَالِ الإِزَارِ وَالْمَنِّ بِالْعَطِيَّةِ وَتَنْفِيقِ السِّلْعَةِ بِالْحَلِفِ وَبَيَانِ الثَّلاَثَةِ الَّذِينَ لاَ يُكَلِّمُهُمُ اللَّهُ يَوْمَ الْقِيَامَةِ وَلاَ يَنْظُرُ إِلَيْهِمْ وَلاَ يُزَكِّيهِمْ وَلَهُمْ عَذَابٌ أَلِيمٌ

## 46-cı fəsil. Paltarın ətəyini topuqdan aşağı buraxmağın, verilən şeyi başa qaxmağın, satlıq malı and içib sırımağın, habelə Allahın Qiyamət günü danışdırmayacağı, üzlərinə baxmayacağı, təmizə çıxarmayacağı, üstəlik üzücü bir əzaba giriftar olan üç qisim insanın bəyan edilməsi

**[٢٩٣] ١٧١–(١٠٦)** حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ وَمُحَمَّدُ بْنُ الْمُثَنَّى وَابْنُ بَشَّارٍ قَالُوا: حَدَّثَنَا مُحَمَّدُ بْنُ جَعْفَرٍ عَنْ شُعْبَةَ، عَنْ عَلِيِّ بْنِ مُدْرِك، عَنْ أَبِي زُرْعَةَ، عَنْ خَرَشَةَ بْنِ الْحُرِّ، عَنْ أَبِي ذَرٍّ عَنِ النَّبِيِّ ﷺ قَالَ: ((ثَلاَثَةٌ لاَ يُكَلِّمُهُمُ اللَّهُ يَوْمَ الْقِيَامَةِ، وَلاَ يَنْظُرُ إِلَيْهِمْ، وَلاَ يُزَكِّيهِمْ، وَلَهُمْ عَذَابٌ أَلِيمٌ)) قَالَ: فَقَرَأَهَا رَسُولُ اللَّهِ ﷺ ثَلاَثَ مِرَارًا. قَالَ أَبُو ذَرٍّ: خَابُوا وَخَسِرُوا، مَنْ هُمْ يَا رَسُولَ اللَّهِ؟ قَالَ: ((الْمُسْبِلُ [إِزَارَهُ] وَالْمَنَّانُ وَالْمُنَفِّقُ سِلْعَتَهُ بِالْحَلِفِ الْكَاذِبِ)).

**[293]-171-(106)** ........ Əbu Zərr ؓ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Üç qisim insan vardır ki, Qiyamət günü Allah onları danışdırmayacaq, onların üzünə baxmayacaq və onları təmizə çıxarmayacaqdır. Üstəlik onları üzücü bir əzab gözləyir”.

Əbu Zərr dedi: “Peyğəmbər ﷺ (buna dəlalət edən) ayəni[1] üç dəfə oxudu. Mən dedim: “Onların ümidləri boşa çıxdı, özləri də ziyana uğradılar. Kimlərdir onlar, ya Rəsulullah?” Peyğəmbər ﷺ buyurdu: “(Libasının) ətəyini topuq-

[1] **“Həqiqətən, Allah ilə olan əhdlərini və andlarını ucuz qiymətə satan kəslər üçün Axirətdə heç bir pay yoxdur. Qiyamət günü Allah onları danışdırmayacaq, onların üzünə baxmayacaq və onları təmizə çıxarmayacaqdır. Onlar üçün ağrılı-acılı bir əzab vardır”** (“Ali-İmran” surəsi, 77).

dan aşağı uzadan,[1] verdiyini başa qaxan[2] və yalandan and içməklə[3] malını sırıyan (kimsələrdir)".

**[٢٩٤]** (...) و حَدَّثَنِي أَبُو بَكْرِ بْنُ خَلاَّدٍ الْبَاهِلِيُّ: حَدَّثَنَا يَحْيَى وَهُوَ الْقَطَّانُ: حَدَّثَنَا سُفْيَانُ: حَدَّثَنَا سُلَيْمَانُ الأَعْمَشُ عَنْ سُلَيْمَانَ بْنِ مُسْهِرٍ، عَنْ خَرَشَةَ بْنِ الْحُرِّ، عَنْ أَبِي ذَرٍّ عَنْ النَّبِيِّ ﷺ قَالَ: ((ثَلاَثَةٌ لاَ يُكَلِّمُهُمْ اللَّهُ يَوْمَ الْقِيَامَةِ: الْمَنَّانُ الَّذِي لاَ يُعْطِي شَيْئًا إِلاَّ مَنَّهُ، وَالْمُنَفِّقُ سِلْعَتَهُ بِالْحَلِفِ الْفَاجِرِ، وَالْمُسْبِلُ إِزَارَهُ)).

**[294] (...)** ........ Əbu Zərr ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Üç qisim insan vardır ki, Qiyamət günü Allah onları danışdırmayacaq:
– verdiyi hər bir şeyi başa qaxan;
– yalandan and içməklə malını sırıyan;
– libasının ətəyini (topuqdan aşağı) uzadan".

**[٢٩٥]** و حَدَّثَنِيه بِشْرُ بْنُ خَالِد: حَدَّثَنَا مُحَمَّدٌ يَعْنِي ابْنَ جَعْفَرٍ عَنْ شُعْبَةَ قَالَ: سَمِعْتُ سُلَيْمَانَ بِهَذَا الإِسْنَادِ، وَقَالَ: ((ثَلاَثَةٌ لاَ يُكَلِّمُهُمْ اللَّهُ، وَلاَ يَنْظُرُ إِلَيْهِمْ، وَلاَ يُزَكِّيهِمْ، وَلَهُمْ عَذَابٌ أَلِيمٌ)).

**[295]** ........ Şobə demişdir: "Mən bu hədisi Süleymandan bu isnadla eşitmişəm. O, belə rəvayət etmişdir: "Üç qisim insan vardır ki, Allah onları danışdır-

---

[1] Peyğəmbər ﷺ demişdir: "Paltarın topuqdan aşağı düşən hissəsinə *görə bu topuqlar* Cəhənnəm odunda yanacaqdır" ("Səhih əl-Buxari", 5787).

İbn Useymin ﷺ demişdir: "Bəziləri Əbu Bəkrin ﷺ hədisini dəlil göstərərək bu hökmü təkəbbürlüklə əlaqələndirirlər. Bunu iddia edənlərə belə cavab verilir:

Birincisi: həmin hədisdə Əbu Bəkr ﷺ: "İzarımın balağı aşağı düşdükcə mən onu yuxarı qaldırıram..."– deyir. Bu da onu göstərir ki, Əbu Bəkr ﷺ libasının ətəyini öz ixtiyarı ilə topuqdan aşağı salmırdı, əksinə o, öz-özünə aşağı düşürdü. Buna baxmayaraq Əbu Bəkr ﷺ onu yuxarı qaldırırdı. Lakin indiki vaxtda libaslarının ətəyini topuqdan aşağı salanlar bunu öz ixtiyarları ilə edir və: "biz bunu özümüzü dartmaq üçün etmirik" deyirlər. Onlara belə cavab vermək lazımdır: "Əgər təkəbbürlük etmək məqsədiniz olmadan libasınızın ətəyini topuqdan aşağı salsanız, onu aşağı saldığınıza görə Odda yanacaqsınız. Və əgər bununla yanaşı təkəbbürlük də göstərsəniz, onda daha böyük əzaba düçar olacaqsınız. Qiyamət günü Allah sizi danışdırmayacaq, üzünüzə baxmayacaq və sizi təmizə çıxarmayacaq. Üstəlik sizi üzücü bir əzab gözləyir.

İkincisi: Həmin hədisdə Peyğəmbər ﷺ Əbu Bəkrə: "Sən bunu təkəbbürlük üçün etmirsən"– deməklə onu təmizə çıxarmış və onun topuqlarının Cəhənnəm odunda yanmayacağına şahidlik etmişdir. Hazırki zamanda libasını topuqdan aşağı salan kimsələrdən hansı birini təmizə çıxarmaq və onun Cəhənnəmdə yanmayacağına əminliklə şahidlik etmək olar?! Lakin şeytan (qəlblərində əyrilik olan) bu kimsələrə, Quran və Sünnədən mənası özlərinə aydın olmayan ayə və hədislərin ardınca düşməyi təlqin etməklə pis əməllərini onlara yaxşı göstərmişdir. Allah isə istədiyi kimsəni doğru yola yönəldir" ("Məcmuə Fətavə", 12/254).

[2] **"Ey iman gətirənlər! Sədəqələrinizi, özünü camaata göstərmək məqsədilə xərcləyən, Allaha və Axirət gününə inanmayan şəxs kimi minnət qoymaqla və əziyyət verməklə puç etməyin..."** ("əl-Bəqərə" surəsi, 264).

[3] Məsələn, satıcı yalandan müştəriyə and içir ki, malı filan qiymətə almışdır, halbuki həqiqətdə o, bu mala daha az pul vermişdir.

mayacaq, onların üzünə baxmayacaq və onları təmizə çıxarmayacaqdır. Üstəlik onları üzücü bir əzab gözləyir".

**[٢٩٦] ١٧٢-(١٠٧)** و حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا وَكِيعٌ وَأَبُو مُعَاوِيَةَ عَنْ الأَعْمَشِ، عَنْ أَبِي حَازِمٍ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((ثَلاَثَةٌ لاَ يُكَلِّمُهُمُ اللَّهُ يَوْمَ الْقِيَامَةِ، وَلاَ يُزَكِّيهِمْ)) قَالَ أَبُو مُعَاوِيَةَ: ((وَلاَ يَنْظُرُ إِلَيْهِمْ، وَلَهُمْ عَذَابٌ أَلِيمٌ: شَيْخٌ زَانٍ، وَمَلِكٌ كَذَّابٌ، وَعَائِلٌ مُسْتَكْبِرٌ)).

**[296]-172-(107)** ........ Əbu Hureyrə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Üç qisim insan vardır ki, Qiyamət günü Allah onları danışdırmayacaq, onları təmizə çıxarmayacaq – (Əbu Müaviyənin rəvayətində:) və onların üzünə baxmayacaqdır. Üstəlik onları üzücü bir əzab gözləyir: (Bu,) zinakar qoca, yalançı hökmdar və təkəbbürlü kasıbdır"[1].

**[٢٩٧] ١٧٣-(١٠٨)** و حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ وَأَبُو كُرَيْبٍ قَالاَ: حَدَّثَنَا أَبُو مُعَاوِيَةَ عَنْ الأَعْمَشِ، عَنْ أَبِي صَالِحٍ، عَنْ أَبِي هُرَيْرَةَ – وَهَذَا حَدِيثُ أَبِي بَكْرٍ – قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((ثَلاَثٌ لاَ يُكَلِّمُهُمْ اللَّهُ يَوْمَ الْقِيَامَةِ، وَلاَ يَنْظُرُ إِلَيْهِمْ، وَلاَ يُزَكِّيهِمْ، وَلَهُمْ عَذَابٌ أَلِيمٌ: رَجُلٌ عَلَى فَضْلِ مَاءٍ بِالْفَلاَةِ يَمْنَعُهُ مِنْ ابْنِ السَّبِيلِ، وَرَجُلٌ بَايَعَ رَجُلاً بِسِلْعَةٍ بَعْدَ الْعَصْرِ فَحَلَفَ لَهُ بِاللَّهِ لأَخَذَهَا بِكَذَا وَكَذَا فَصَدَّقَهُ وَهُوَ عَلَى غَيْرِ ذَلِكَ، وَرَجُلٌ بَايَعَ إِمَامًا لاَ يُبَايِعُهُ إِلاَّ لِدُنْيَا، فَإِنْ أَعْطَاهُ مِنْهَا وَفَى، وَإِنْ لَمْ يُعْطِهِ مِنْهَا لَمْ يَفِ)).

**[297]-173-(108)** ........ Əbu Hureyrə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Üç qisim insan vardır ki, Qiyamət günü Allah onları danışdırmayacaq, onların üzünə baxmayacaq və onları təmizə çıxarmayacaqdır. Üstəlik onları üzücü bir əzab gözləyir:

– o adam ki, səhrada (çıxan) suyun başında durub (oradan keçən) müsafirlərə bu sudan (içməyə) mane olur;

– o adam ki, axşamçağı birisinə mal satır (və malını satarkən) ona: "Allaha and olsun ki, bu mala filan qədər pul vermişəm"– deyir, o da ona inanır, halbuki bu belə deyildir;

---

[1] Qazı İyad ﷺ demişdir: "Hədisdə təhdid olunan bu üç qisim insan ona görə xüsusiləşdirilmişdir ki, onlar zəruri olmayan və ehtiyac duyulmayan işlərə əl atmaqla özlərini günaha batırmışlar. Bu isə inadkarlıqdan, tamahkarlıqdan və nəfsin zəifliyindən irəli gələn, həm də Allaha asi olaraq görülən işlərə bənzəyir. Belə ki, öz halalı ilə yaxınlıq etməkdən bezmiş və şəhvəti azalmış, həyat təcrübəsi olan və uzun illər ərzində guya ağlı artmış yaşlı adamın zinaya meyilli olması, onun həm ağıldan kəm, həm bihəya, həm də şəhvətinin qulu olduğuna dəlalət edir. Yalançı hökmdara gəlincə, o, heç kəsdən qorxmadığı halda bunu edirsə, demək, bunu xalqın mənfəəti üçün yox, məhz öz xeyri üçün edir. Təkəbbürlü kasıbın əlində heç bir şeyi olmadığı halda özünü dartması isə onun ağılsız olduğunu göstərir" ("Şərh əs-Suyuyti alə Muslim", 1/122).

– o adam ki, əmirə yalnız dünya xatirinə beyət edir, (sonra) əmir dünya malından ona verdikdə əhdinə sadiq qalır, heç nə vermədikdə isə əhdinə vəfa etmir".

**[٢٩٨]** (...) و حَدَّثَنِي زُهَيْرُ بْنُ حَرْبٍ: حَدَّثَنَا جَرِيرٌ؛ ح: و حَدَّثَنَا سَعِيدُ بْنُ عَمْرٍو الأَشْعَثِيُّ: أَخْبَرَنَا عَبْثَرٌ كِلاَهُمَا عَنْ الأَعْمَشِ بِهَذَا الإِسْنَادِ مِثْلَهُ. غَيْرَ أَنَّ فِي حَدِيثِ جَرِيرٍ: ((وَرَجُلٌ سَاوَمَ رَجُلاً بِسِلْعَةٍ)).

**[298] (...)** ........ Cərir və Əbsər – hər ikisi (yuxarıdakı) isnadla bu hədisin bənzərini rəvayət etmişlər. Fəqət bu rəvayətdə deyilir: "o adam ki, birisinə mal satdıqda çənəbazara çıxar".

**[٢٩٩] ١٧٤**–(...) و حَدَّثَنِي عَمْرٌو النَّاقِدُ: حَدَّثَنَا سُفْيَانُ عَنْ عَمْرٍو، عَنْ أَبِي صَالِحٍ، عَنْ أَبِي هُرَيْرَةَ – قَالَ: أُرَاهُ مَرْفُوعًا – قَالَ: ((ثَلاَثَةٌ لاَ يُكَلِّمُهُمْ اللَّهُ، وَلاَ يَنْظُرُ إِلَيْهِمْ، وَلَهُمْ عَذَابٌ أَلِيمٌ: رَجُلٌ حَلَفَ عَلَى يَمِينٍ بَعْدَ صَلاَةِ الْعَصْرِ عَلَى مَالِ مُسْلِمٍ فَاقْتَطَعَهُ)) وَبَاقِي حَدِيثِهِ نَحْوُ حَدِيثِ الأَعْمَشِ.

**[299]-174-(...)** ........ Əbu Hureyrə ﷺ Peyğəmbərə ﷺ istinadən belə rəvayət etmişdir: "Üç qisim insan vardır ki, Allah onları danışdırmayacaq və onların üzünə baxmayacaqdır. Üstəlik onları üzücü bir əzab gözləyir:

– o adam ki, əsr namazından sonra[1] bir müsəlmanın malı üzərinə o qədər and içir ki, axırda onun malını mənimsəyir..."

Hədisin qalanı Aməşin rəvayət etdiyi hədis kimidir.[2]

## (٤٧) – بَابُ غِلَظِ تَحْرِيمِ قَتْلِ الإِنْسَانِ نَفْسَهُ وَأَنَّ مَنْ قَتَلَ نَفْسَهُ بِشَيْءٍ عُذِّبَ بِهِ فِي النَّارِ وَأَنَّهُ لاَ يَدْخُلُ الْجَنَّةَ إِلاَّ نَفْسٌ مُسْلِمَةٌ

## 47-ci fəsil. İnsanın öz canına qəsd etməsinin ağır günah olması; kim özünü nə ilə qətlə yetirmişsə, onunla da atəşdə ona əzab verilər; Cənnətə isə yalnız müsəlman olan kəs daxil olar

**[٣٠٠] ١٧٥**–(١٠٩) حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ وَأَبُو سَعِيدٍ الأَشَجُّ قَالاَ حَدَّثَنَا وَكِيعٌ عَنْ الأَعْمَشِ، عَنْ أَبِي صَالِحٍ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((مَنْ قَتَلَ نَفْسَهُ بِحَدِيدَةٍ فَحَدِيدَتُهُ فِي يَدِهِ يَتَوَجَّأُ بِهَا

---

[1] Əsr namazından sonrakı vaxtın (yəni axşamçağının) ayrıca qeyd olunması ona görədir ki, həmin vaxt, gecə və gündüz bir-birilərini növbə ilə əvəz edən, Allahın hüzuruna qalxıb-enən mələklər o adamın etdiyi günaha şahidlik edirlər.

[2] 297-ci hədisə bax.

فِي بَطْنِهِ فِي نَارِ جَهَنَّمَ خَالِدًا مُخَلَّدًا فِيهَا أَبَدًا، وَمَنْ شَرِبَ سَمًّا فَقَتَلَ نَفْسَهُ فَهُوَ يَتَحَسَّاهُ فِي نَارِ جَهَنَّمَ خَالِدًا مُخَلَّدًا فِيهَا أَبَدًا، وَمَنْ تَرَدَّى مِنْ جَبَلٍ فَقَتَلَ نَفْسَهُ فَهُوَ يَتَرَدَّى فِي نَارِ جَهَنَّمَ خَالِدًا مُخَلَّدًا فِيهَا أَبَدًا)).

**[300]-175-(109)** ........ Əbu Hureyrə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Kim dəmir parçası ilə öz canına qəsd edərsə, Cəhənnəm odunda bu dəmir parçasını daim qarnına soxar və od içində əbədi olaraq qalar. Kim zəhər içib özünü öldürərsə, Cəhənnəm odunda o zəhəri əlində tutub daima onu içər və orada əbədi olaraq qalar. Kim özünü dağdan atıb canına qəsd edərsə, Cəhənnəm odunda özünü daima yuxarıdan aşağı atar və odda əbədi olaraq qalar"[1].

**[٣٠١]** (...) و حَدَّثَنِي زُهَيْرُ بْنُ حَرْبٍ: حَدَّثَنَا جَرِيرٌ؛ ح: و حَدَّثَنَا سَعِيدُ بْنُ عَمْرٍو الأَشْعَثِيُّ، حَدَّثَنَا عَبْثَرٌ؛ ح: و حَدَّثَنِي يَحْيَى بْنُ حَبِيبٍ الْحَارِثِيُّ: حَدَّثَنَا خَالِدٌ - يَعْنِي ابْنَ الْحَارِثِ - حَدَّثَنَا شُعْبَةُ كُلُّهُمْ بِهَذَا الإِسْنَادِ مِثْلَهُ، وَفِي رِوَايَةِ شُعْبَةَ - عَنْ سُلَيْمَانَ قَالَ: سَمِعْتُ ذَكْوَانَ.

**[301] (...)** ........ Cərir, Əbsər və Şobə – hamısı bu isnadla həmin hədisin bənzərini rəvayət etmişlər. Şobənin Süleymandan rəvayət etdiyi hədisdə Süleyman demişdir: "Mən (bu hədisi) Zəkvandan eşitmişəm".

**[٣٠٢] ١٧٦**-(١١٠) حَدَّثَنَا يَحْيَى بْنُ يَحْيَى: أَخْبَرَنَا مُعَاوِيَةُ بْنُ سَلَّامِ بْنِ أَبِي سَلَّامٍ الدِّمَشْقِيُّ عَنْ يَحْيَى بْنِ أَبِي كَثِيرٍ، أَنَّ أَبَا قِلَابَةَ أَخْبَرَهُ أَنَّ ثَابِتَ بْنَ الضَّحَّاكِ أَخْبَرَهُ أَنَّهُ بَايَعَ رَسُولُ اللَّهِ ﷺ تَحْتَ الشَّجَرَةِ، وَأَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: ((مَنْ حَلَفَ عَلَى يَمِينٍ بِمِلَّةٍ غَيْرِ الإِسْلَامِ كَاذِبًا فَهُوَ كَمَا قَالَ، وَمَنْ قَتَلَ نَفْسَهُ بِشَيْءٍ عُذِّبَ بِهِ يَوْمَ الْقِيَامَةِ، وَلَيْسَ عَلَى رَجُلٍ نَذْرٌ فِي شَيْءٍ لاَ يَمْلِكُهُ)).

---

[1] Motəzilər və başqaları bu hədisi əsas götürərək böyük günah sahiblərinin əbədi olaraq Cəhənnəm odunda yanacaqlarını iddia etmişlər. Əhli-sünnə isə onlara ayrı-ayrı cavablar vermişdir. Bunlar aşağıdakılardır:

– tövhid əhlinin Cəhənnəm odunda əbədi qalmayacağına dair bir çox səhih rəvayətlər varid olmuşdur. Həmin rəvayətlərdə bildirilir ki, tövhid əhlindən olub böyük günah işlətmiş və etdiyi günaha görə tövbə etməyən hər kəs Allahın istəyi altındadır. Allah ona Cəhənnəm əzabını daddırsa da, həmin adam tövhid əhli olduğundan, axırda onu Cənnətə daxil edəcək (İman kitabının 10-cu fəslinin, habelə 136-cı, 141-ci və 172-ci hədislərin qeydlərinə bax);

– bu, intihar etməyi halal sayan kimsəyə aiddir. Allahın və Onun Peyğəmbərinin ﷺ haram buyurduğunu halal sayan adam isə kafir sayılır və beləsi öz canına qəsd etdiyinı görə yox, məhz kafir olduğuna görə əbədi olaraq Cəhənnəmdə qalacaq;

– bu təhdid sadəcə olaraq insanı öz canına qəsd etməkdən çəkindirmək üçündür;

– əslində, bu, canına qəsd etmiş kimsələrin cəzasıdır. Lakin Allah onlara mərhəmət edəcək və təkAllahlılığı qəbul etdiklərinə görə onları Cəhənnəmdən çıxaracaq.

– Hədisdə "əbədi olaraq qalar" deyildikdə "Allahın istədiyi vaxta qədər orada qalar" nəzərdə tutulur. ("Fəth əl-Bari", 4/438).

**[302]-176-(110)** ........ Sabit ibn Dəhhak ﵁ xəbər vermişdir ki, o, ağac altında[1] Peyğəmbərə ﷺ beyət etmiş səhabədir. Peyğəmbər ﷺ belə buyurmuşdur: "Kim yalandan İslamdan başqa bir dində olduğuna and içsə, dediyi kimi olar.[2] Kim özünü bir şeylə qətlə yetirsə, həmin şeylə Qiyamət günü ona əzab verilər. Və bir adamın əlində olmadığı bir şeyi nəzir etməsi məqsədəuyğun sayılmaz"[3].

**[٣٠٣]** (...) حَدَّثَنِي أَبُو غَسَّانَ الْمِسْمَعِيُّ: حَدَّثَنَا مُعَاذٌ وَهُوَ ابْنُ هِشَامٍ قَالَ: حَدَّثَنِي أَبِي عَنْ يَحْيَى بْنِ أَبِي كَثِيرٍ قَالَ: حَدَّثَنِي أَبُو قِلاَبَةَ، عَنْ ثَابِتِ بْنِ الضَّحَّاكِ عَنْ النَّبِيِّ ﷺ قَالَ: ((لَيْسَ عَلَى رَجُلٍ نَذْرٌ فِيمَا لاَ يَمْلِكُ، وَلَعْنُ الْمُؤْمِنِ كَقَتْلِه، وَمَنْ قَتَلَ نَفْسَهُ بِشَيْءٍ فِي الدُّنْيَا عُذِّبَ بِهِ يَوْمَ الْقِيَامَةِ، وَمَنْ ادَّعَى دَعْوَى كَاذِبَةً لِيَتَكَثَّرَ بِهَا لَمْ يَزِدْهُ اللَّهُ إِلاَّ قِلَّةً، وَمَنْ حَلَفَ عَلَى يَمِينِ صَبْرٍ فَاجِرَةٍ)).

**[303] (...)** ........ Sabit ibn Dəhhak ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Adamın əlində olmadığı bir şeyi nəzir etməsi məqsədəuyğun deyildir. Mömini lənətləmək onu öldürmək deməkdir.[4] Kim bu dünyada özünü bir şeylə qətlə yetirərsə, Qiyamət günü o şeylə ona əzab verilər. Kim (özündə olanı) çox göstərmək məqsədilə yalan iddia edərsə, Allah ona azlıqdan başqa bir şey

---

[1] Bu, "Ridvan" beyəti adlanır. Osman ibn Əffanın ﵁ qureyşlilər tərəfindən öldürülməsi haqqında yalan xəbər Muhəmməd Peyğəmbərin ﷺ səhabələrinə çatdıqda, onlar Hudeybiyyədə, bir ağac altında razılıq andı, yəni ölənə qədər Peyğəmbərə ﷺ sədaqətli qalacaqlarına and içmişdilər. Bu hadisə hicri təqviminin 6-cı ilində baş vermişdir.

[2] Hədisdə "başqa bir din" deyildikdə İslamdan başqa bütün (batil) dinlər – yəhidilərin, xristianların, məcusilərin, sabiilərin, bütpərəstlərin, şeytanlara tapınanların, mələklərə ibadət edənlərin və qeyrilərinin dinləri qəsd edilir. İbn Munzir ﵀ demişdir: "İslam alimləri, başqa bir dindən olduğunu iddia edən adamın kafir olub-olmadığı barədə ixtilaf etmişlər. İbn Abbas ﵄, Əbu Hureyrə ﵁, Əta, Qətadə və əksər fəqihlər bu cür and içən adamın kafir sayılmadığını, habelə buna görə onun kəffarə ödəməsinin vacib olmadığını söyləmişlər. Yalnız qəlbən buna etiqad edən kimsələrdən başqa (yəni etiqad edərək başqa dindən olduğuna and içən hər kəs kafir sayılır). Əl-Əvzai, əs-Sovri, hənəfilər, Əhməd və İshaq bu şəkildə and içən adamın kəffarə verməsini vacib hesab etmişlər. Lakin İbn Munzir birinci rəyin daha doğru olduğunu demiş və bunu Peyğəmbərin ﷺ bu hədisi ilə əsaslandırmışdır: "Hər kim and içərkən: "Lata and olsun, Uzzaya and olsun!"– desə, qoy: "Lə ilahə illəllah!"– desin ("Səhih əl-Buxari", 4860). Hədisdə Peyğəmbər ﷺ kəffarə barədə heç nə söyləməmişdir. Qazı İyad ﵀ demişdir: "Hər kim qəlbi imanla dolu olduğu halda, yalandan İslamdan başqa bir dində olduğuna and içərsə, kafir sayılmaz. Yox, əgər etiqad edərək bilərəkdən başqa dindən olduğunu söyləsə və həmin dinin haqq olduğunu iddia etsə, kafir hesab edilər" ("Neyl əl-Əvtar", 9/105).

[3] Yəni əgər adam başqasının malını nəzir etsə, məsələn: "Filankəsin dəvəsini nəzir deyirəm", yaxud "filankəsin köləsini azad etməyi nəzir deyirəm"– desə, bunu yerinə yetirmək ona vacib sayılmaz ("əl-Mufhim limə Əşkələ min Təlxis Kitab Muslim", 2/76).

[4] 241-ci hədisin qeydlərinə bax.

artırmaz.[1] (Kim hakimin hüzurunda) özünü vadar edib bilə-bilə yalandan and içsə, (ona da mal azlığından başqa bir şey artırılmaz)".

**[٣٠٤] ١٧٧**-(...) حَدَّثَنَا إِسْحَقُ بْنُ إِبْرَاهِيمَ وَإِسْحَقُ بْنُ مَنْصُورٍ وَعَبْدُ الْوَارِثِ بْنُ عَبْدِ الصَّمَدِ، كُلُّهُمْ عَنْ عَبْدِ الصَّمَدِ بْنِ عَبْدِ الْوَارِثِ عَنْ شُعْبَةَ، عَنْ أَيُّوبَ، عَنْ أَبِي قِلاَبَةَ، عَنْ ثَابِتِ بْنِ الضَّحَّاكِ الأَنْصَارِيِّ؛ ح: و حَدَّثَنَا مُحَمَّدُ بْنُ رَافِعٍ عَنْ عَبْدِ الرَّزَّاقِ، عَنْ الثَّوْرِيِّ، عَنْ خَالِدِ الْحَذَّاءِ، عَنْ أَبِي قِلاَبَةَ، عَنْ ثَابِتِ بْنِ الضَّحَّاكِ قَالَ: قَالَ النَّبِيُّ ﷺ: ((مَنْ حَلَفَ بِمِلَّةٍ سِوَى الإِسْلاَمِ كَاذِبًا مُتَعَمِّدًا فَهُوَ كَمَا قَالَ، وَمَنْ قَتَلَ نَفْسَهُ بِشَيْءٍ عَذَّبَهُ اللَّهُ بِهِ فِي نَارِ جَهَنَّمَ)) - هَذَا حَدِيثُ سُفْيَانَ، وَأَمَّا شُعْبَةُ فَحَدِيثُهُ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: ((مَنْ حَلَفَ بِمِلَّةٍ سِوَى الإِسْلاَمِ كَاذِبًا فَهُوَ كَمَا قَالَ، وَمَنْ ذَبَحَ نَفْسَهُ بِشَيْءٍ ذُبِحَ بِهِ يَوْمَ الْقِيَامَةِ)).

**[304]-177-(...)** ........ Sabit ibn Dəhhak ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Kim bilə-bilə yalandan İslamdan başqa bir dində olduğuna and içsə, dediyi kimi olar. Kim özünü bir şeylə qətlə yetirsə, Allah Cəhənnəm odunda həmin şeylə ona əzab verər".

Bu, Süfyanın hədisidir. Şobənin rəvayət etdiyi hədisdə isə Peyğəmbər ﷺ belə buyurmuşdur: "Kim yalandan İslamdan başqa bir dində olduğuna and içsə, dediyi kimi olar. Kim özünü bir şeylə boğazlasa, Qiyamət günü həmin şeylə boğazlanar".

**[٣٠٥] ١٧٨**-(١١١) و حَدَّثَنَا مُحَمَّدُ بْنُ رَافِعٍ وَعَبْدُ بْنُ حُمَيْدٍ، جَمِيعًا عَنْ عَبْدِ الرَّزَّاقِ - قَالَ ابْنُ رَافِعٍ: حَدَّثَنَا عَبْدُ الرَّزَّاقِ -: أَخْبَرَنَا مَعْمَرٌ عَنْ الزُّهْرِيِّ، عَنْ ابْنِ الْمُسَيَّبِ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ: شَهِدْنَا مَعَ رَسُولِ اللَّهِ ﷺ حُنَيْنًا، فَقَالَ لِرَجُلٍ مِمَّنْ يُدْعَى بِالإِسْلاَمِ: ((هَذَا مِنْ أَهْلِ النَّارِ)) فَلَمَّا حَضَرْنَا الْقِتَالَ قَاتَلَ الرَّجُلُ قِتَالاً شَدِيدًا فَأَصَابَتْهُ جِرَاحَةٌ، فَقِيلَ: يَا رَسُولَ اللَّهِ! الرَّجُلُ الَّذِي قُلْتَ لَهُ آنِفًا: ((إِنَّهُ مِنْ أَهْلِ النَّارِ)) فَإِنَّهُ قَاتَلَ الْيَوْمَ قِتَالاً شَدِيدًا، وَقَدْ مَاتَ، فَقَالَ النَّبِيُّ ﷺ: ((إِلَى النَّارِ)) فَكَادَ بَعْضُ الْمُسْلِمِينَ أَنْ يَرْتَابَ، فَبَيْنَمَا هُمْ عَلَى ذَلِكَ إِذْ قِيلَ، إِنَّهُ لَمْ يَمُتْ، وَلَكِنَّ بِهِ جِرَاحًا شَدِيدًا، فَلَمَّا كَانَ مِنْ اللَّيْلِ لَمْ يَصْبِرْ عَلَى الْجِرَاحِ فَقَتَلَ نَفْسَهُ، فَأُخْبِرَ النَّبِيُّ ﷺ بِذَلِكَ فَقَالَ: ((اللَّهُ أَكْبَرُ! أَشْهَدُ أَنِّي عَبْدُ اللَّهِ وَرَسُولُهُ)) ثُمَّ أَمَرَ بِلاَلاً فَنَادَى فِي النَّاسِ: ((أَنَّهُ لاَ يَدْخُلُ الْجَنَّةَ إِلاَّ نَفْسٌ مُسْلِمَةٌ، وَأَنَّ اللَّهَ يُؤَيِّدُ هَذَا الدِّينَ بِالرَّجُلِ الْفَاجِرِ)).

---

[1] Kim mal-dövlətini artırmaq üçün yalan danışarsa, Allah onun malına bərəkət verməz. Kim yalandan özünü alim kimi göstərərsə, Allah onun avamlığını üzə çıxarar və camaat ona hörmət qoymaz. Kim də yalandan dindar olduğunu iddia edərsə, Allah onu rüsvay edər, onun iç üzünü aşkara çıxarar və onu hörmətdən salar. Bu xüsusda Uca Allah belə buyurur: **"Törətdikləri əməllərdən fərəhlənən və etmədikləri işlərə görə tərif olunmağı xoşlayan kimsələrin əzabdan qurtulacaqlarını əsla güman etmə. Onlara acılı-ağrılı bir əzab hazırlanmışdır"** ("Ali-İmran" surəsi, 188).

**[305]-178-(111)** ........ Əbu Hureyrə ﷺ demişdir: "Biz Peyğəmbərlə ﷺ birlikdə Huneyn[1] döyüşündə iştirak etdik. Orada Peyğəmbər ﷺ müsəlman adlanan kimsələrdən biri haqqında: "Bu, Cəhənnəm əhlindəndir"– dedi. (Nəhayət,) döyüşə başladığımız zaman həmin adam var gücü ilə vuruşdu və (ağır) yaralandı. (Peyğəmbərə ﷺ dedilər): "Ya Rəsulullah! Bayaq haqqında: "O, Cəhənnəm əhlindəndir"– dediyin adam bu gün var gücü ilə vuruşdu və (aldığı yaralardan) dünyasını dəyişdi". Peyğəmbər ﷺ: "(Onun yolu) Cəhənnəmədir"– dedi. (Bu sözdən sonra) az qaldı ki, müsəlmanların bəzisi şübhəyə düşsün. Onlar şübhə içində ikən birdən (səhabələrdən biri): "O adam ölməyib, lakin ağır yaralıdır"– dedi. Nəhayət, gecə düşdükdə həmin adam ağrılara dözməyib öz canına qəsd etdi. Onun barəsində Peyğəmbərə ﷺ xəbər verildikdə o: "Allah Böyükdür! Şahidlik edirəm ki, mən, həqiqətən də, Allahın qulu və elçisiyəm!"– dedi. Sonra Bilala buyurdu, o da camaata bunu elan etdi: "Şübhəsiz ki, Cənnətə yalnız müsəlman girər. Və sözsüz ki, Allah bu dini günahkar bir adamın vasitəsilə olsa belə, qüvvətləndirər".

**[٣٠٦] ١٧٩–(١١٢)** حَدَّثَنَا قُتَيْبَةُ بْنُ سَعِيد: حَدَّثَنَا يَعْقُوبُ وَهُوَ ابْنُ عَبْدِ الرَّحْمَنِ الْقَارِيُّ – حَيٌّ مِنْ الْعَرَبِ – عَنْ أَبِي حَازِمٍ، عَنْ سَهْلِ بْنِ سَعْدِ السَّاعِدِيِّ: أَنَّ رَسُولَ اللَّهِ ﷺ الْتَقَى هُوَ وَالْمُشْرِكُونَ فَاقْتَتَلُوا، فَلَمَّا مَالَ رَسُولُ اللَّهِ ﷺ إِلَى عَسْكَرِهِ، وَمَالَ الآخَرُونَ إِلَى عَسْكَرِهِمْ، وَفِي أَصْحَابِ رَسُولِ اللَّهِ ﷺ رَجُلٌ لاَ يَدَعُ لَهُمْ شَاذَّةً إِلاَّ اتَّبَعَهَا يَضْرِبُهَا بِسَيْفِهِ، فَقَالُوا: مَا أَجْزَأَ مِنَّا الْيَوْمَ أَحَدٌ كَمَا أَجْزَأَ فُلاَنٌ، فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: ((أَمَا إِنَّهُ مِنْ أَهْلِ النَّارِ)) فَقَالَ رَجُلٌ مِنَ الْقَوْمِ: أَنَا صَاحِبُهُ أَبَدًا، قَالَ: فَخَرَجَ مَعَهُ، كُلَّمَا وَقَفَ وَقَفَ مَعَهُ، وَإِذَا أَسْرَعَ أَسْرَعَ مَعَهُ، قَالَ: فَجُرِحَ الرَّجُلُ جُرْحًا شَدِيدًا، فَاسْتَعْجَلَ الْمَوْتَ فَوَضَعَ [نَصْلَ] سَيْفِهِ بِالأَرْضِ، وَذُبَابَهُ بَيْنَ ثَدْيَيْهِ، ثُمَّ تَحَامَلَ [عَلَى سَيْفِهِ] فَقَتَلَ نَفْسَهُ، فَخَرَجَ الرَّجُلُ إِلَى رَسُولِ اللَّهِ ﷺ فَقَالَ: أَشْهَدُ أَنَّكَ رَسُولُ اللَّهِ، قَالَ: ((وَمَا ذَاكَ؟)) قَالَ الرَّجُلُ الَّذِي ذَكَرْتَ آنِفًا أَنَّهُ مِنْ أَهْلِ النَّارِ، فَأَعْظَمَ النَّاسُ ذَلِكَ، فَقُلْتُ: أَنَا لَكُمْ بِهِ، فَخَرَجْتُ فِي طَلَبِهِ حَتَّى جُرِحَ جُرْحًا شَدِيدًا، فَاسْتَعْجَلَ الْمَوْتَ، فَوَضَعَ نَصْلَ سَيْفِهِ بِالأَرْضِ وَذُبَابَهُ بَيْنَ ثَدْيَيْهِ، ثُمَّ تَحَامَلَ عَلَيْهِ فَقَتَلَ نَفْسَهُ، فَقَالَ رَسُولُ اللَّهِ ﷺ عِنْدَ ذَلِكَ: ((إِنَّ الرَّجُلَ لَيَعْمَلُ عَمَلَ [أَهْلِ] الْجَنَّةِ فِيمَا يَبْدُو لِلنَّاسِ، وَهُوَ مِنْ أَهْلِ النَّارِ، وَإِنَّ الرَّجُلَ لَيَعْمَلُ عَمَلَ [أَهْلِ] النَّارِ فِيمَا يَبْدُو لِلنَّاسِ، وَهُوَ مِنْ أَهْلِ الْجَنَّةِ)).

**[306]-179-(112)** ........ Səhl ibn Səd əs-Saidi ﷺ rəvayət edir ki, (yürüşlərin birində) Peyğəmbər ﷺ (və onun səhabələri) müşriklərlə üz-üzə gəlib döyüşməyə

---

[1] Məkkə ilə Taif arasında yerləşən vahə. Orada hicri tarixinin 8-ci ilində müsəlmanlarla müşriklər arasında irimiqyaslı döyüş olmuşdur.

başladılar. (Günün axırında) Peyğəmbər ﷺ öz düşərgəsinə, müşriklər də öz düşərgələrinə çəkildilər. Peyğəmbərin ﷺ səhabələri arasında elə birisi var idi ki, (döyüşdə) heç bir fürsəti əldən verməmiş, çatdığı hər kəsi qılıncdan keçirib qətlə yetirmişdi. (Bəziləri) dedilər: "Bu gün bizim heç birimiz filankəs kimi döyüşmədi". Peyğəmbər ﷺ buyurdu: "(Filankəsə) gəlincə, o, Cəhənnəm əhlindəndir!" Səhabələrdən biri: "Mən axıra kimi onu izləyəcəyəm"– dedi və onun dalınca düşdü. Adam hər dayandıqda, səhabə onunla bərabər dayanır, tez-tez getdikdə isə ona çatmağa tələsirdi. Sonra həmin adam ölümcül yaralandı və ölümünü tezləşdirib (canını əzab-əziyyətdən qurtarsın deyə) qılıncının qəbzəsini yerə dayadı, tiyəsini də sinəsinə dirədi, sonra da özünü qılıncının üstünə yıxaraq canına qəsd etdi. (Bu hadisədən sonra) səhabə Peyğəmbərin ﷺ yanına gəlib dedi: "Mən şahidlik edirəm ki, sən Allahın elçisisən!" Peyğəmbər ﷺ soruşdu: "Nə olub ki?" (Səhabə) dedi: "Bayaq sən bir adamın Cəhənnəm əhlindən olduğunu söylədin və bu, hamını heyrətə saldı. Onda mən (öz-özümə): "Mən onun barəsində sizə (bir xəbər) gətirərəm"– dedim və həmin adamı izləməyə başladım. Bu əsnada həmin adam ölümcül yaralandı və ölümünü tezləşdirib (canını əzab-əziyyətdən tez qurtarmaq üçün) qılıncının qəbzəsini yerə dayadı, tiyəsini də sinəsinə dirədi, sonra da özünü qılıncının üstünə yıxaraq canına qəsd etdi". Bunu eşidəndə Peyğəmbər ﷺ buyurdu: "Ola bilsin, bir adam insanlara Cənnət əhlinin əməlini edən bir kimsə kimi görünsün, lakin (axırda) Cəhənnəm əhlindən olsun. Həmçinin ola bilsin ki, bir kimsə insanlara Cəhənnəm əhlinin əməlini edən bir kimsə kimi görünsün, lakin (sonda) Cənnət əhlindən olsun".

**[٣٠٧] ١٨٠–(١١٣)** حَدَّثَنِي مُحَمَّدُ بْنُ رَافِعٍ: حَدَّثَنَا الزُّبَيْرِيُّ وَهُوَ مُحَمَّدُ بْنُ عَبْدِ اللَّهِ بْنِ الزُّبَيْرِ: حَدَّثَنَا شَيْبَانُ قَالَ: سَمِعْتُ الْحَسَنَ يَقُولُ: ((إِنَّ رَجُلاً مِمَّنْ كَانَ قَبْلَكُمْ خَرَجَتْ بِهِ قُرْحَةٌ، فَلَمَّا آذَتْهُ انْتَزَعَ سَهْمًا مِنْ كِنَانَتِهِ، فَنَكَأَهَا فَلَمْ يَرْقَأْ الدَّمُ حَتَّى مَاتَ، قَالَ رَبُّكُمْ: قَدْ حَرَّمْتُ عَلَيْهِ الْجَنَّةَ)) ثُمَّ مَدَّ يَدَهُ إِلَى الْمَسْجِدِ فَقَالَ: إِي وَاللَّهِ! لَقَدْ حَدَّثَنِي بِهَذَا الْحَدِيثِ جُنْدَبٌ – عَنْ رَسُولِ اللَّهِ ﷺ – فِي هَذَا الْمَسْجِدِ.

**[307]-180-(113)** ........ Həsən (əl-Bəsri) demişdir: "Sizdən əvvəl yaşamış insanlardan birinin bədəninə çiban çıxmışdı. Yara ona əziyyət verdikdə o, ox qabından bir ox çıxardıb çibanı deşdi. Onun qanı dayanmadan axmağa başladı və nəhayət, adam öldü. Onda Rəbbiniz buyurdu: "Mən Cənnəti ona haram

etdim[1]". Sonra Həsən əlini məscidə tərəf uzadıb dedi: "Vallahi ki, Cundəb Peyğəmbərdən ﷺ (eşitdiyi) bu hədisi mənə bu məsciddə danışmışdır".

**[٣٠٨] ١٨١**–(...) و حَدَّثَنَا مُحَمَّدُ بْنُ أَبِي بَكْرٍ الْمُقَدَّمِيُّ: حَدَّثَنَا وَهْبُ بْنُ جَرِيرٍ: حَدَّثَنَا أَبِي قَالَ: سَمِعْتُ الْحَسَنَ يَقُولُ: حَدَّثَنَا جُنْدَبُ بْنُ عَبْدِ اللَّهِ الْبَجَلِيُّ فِي هَذَا الْمَسْجِدِ، فَمَا نَسِينَا، وَمَا نَخْشَى أَنْ يَكُونَ [جُنْدَبٌ]كَذَبَ عَلَى رَسُولِ اللَّهِ ﷺ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((خَرَجَ بِرَجُلٍ فِيمَنْ كَانَ قَبْلَكُمْ خُرَاجٌ فَذَكَرَ نَحْوَهُ)).

**[308]-181-(...)** ........ Həsən (əl-Bəsri) demişdir: "Cundəb ibn Abdullah əl-Bəcəli bizə bu məsciddə bir hədis danışdı. Biz (bu hədisi) unutmamışıq, üstəlik onun Peyğəmbərdən ﷺ yalan danışa biləcəyindən də ehtiyat etmirik. Peyğəmbər ﷺ demişdir: "Sizdən əvvəl yaşamış insanlardan birinin bədəninə çiban çıxmışdı..." Sonra Həsən bu hədisi eyni ilə rəvayət etdi.

## (٤٨) – بَابُ غِلَظِ تَحْرِيمِ الْغُلُولِ وَأَنَّهُ لاَ يَدْخُلُ الْجَنَّةَ إِلاَّ الْمُؤْمِنُونَ

## 48-ci fəsil. Əmanətə xəyanət etməyin[2] ağır günah olması; Və bir də Cənnətə yalnız möminlər daxil olar

**[٣٠٩] ١٨٢**–(١١٤) حَدَّثَنِي زُهَيْرُ بْنُ حَرْبٍ: حَدَّثَنَا هَاشِمُ بْنُ الْقَاسِمِ: حَدَّثَنَا عِكْرِمَةُ بْنُ عَمَّارٍ قَالَ: حَدَّثَنِي سِمَاكٌ الْحَنَفِيُّ أَبُو زُمَيْلٍ قَالَ: حَدَّثَنِي عَبْدُ اللَّهِ بْنُ عَبَّاسٍ قَالَ: حَدَّثَنِي عُمَرُ بْنُ الْخَطَّابِ قَالَ: لَمَّا كَانَ يَوْمُ خَيْبَرَ أَقْبَلَ نَفَرٌ مِنْ صَحَابَةِ النَّبِيِّ ﷺ فَقَالُوا: فُلاَنٌ شَهِيدٌ وَ فُلاَنٌ شَهِيدٌ، حَتَّى مَرُّوا عَلَى رَجُلٍ فَقَالُوا: فُلاَنٌ شَهِيدٌ، فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: ((كَلاَّ، إِنِّي رَأَيْتُهُ فِي النَّارِ فِي بُرْدَةٍ غَلَّهَا، أَوْ عَبَاءَةٍ)) ثُمَّ قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((يَا ابْنَ الْخَطَّابِ! اذْهَبْ فَنَادِ فِي النَّاسِ أَنَّهُ لاَ يَدْخُلُ الْجَنَّةَ إِلاَّ الْمُؤْمِنُونَ)) قَالَ فَخَرَجْتُ فَنَادَيْتُ: أَلاَ إِنَّهُ لاَ يَدْخُلُ الْجَنَّةَ إِلاَّ الْمُؤْمِنُونَ.

---

[1] Qazı İyad رحمه الله demişdir: "Ola bilsin ki, həmin şəxs, cana qəsd etməyi halal saydığından Cənnət ona haram edilmiş, yaxud ona əməlisaleh insanlarla birgə ilk əvvəl Cənnətə daxil olmaq haram buyurulmuş, yaxud bu sözlə onun uzun müddət haqq-hesaba çəkiləcəyi və ya bir müddət Ərafda saxlanılacağı nəzərdə tutulmuşdur".

İbn Abbas رضي الله عنهما demişdir: "Əraf əhli" deyildikdə günah işlər görmüş və bağışlanmaları Allahın istəyinə bağlı olan kimsələr qəsd edilir. Onlar səddin üzərində dayanıb əvvəl Cənnət əhlinə baxacaq və onlarla bərabər ora daxil olmağı təmənna edəcək, sonra da Cəhənnəm əhlinə baxıb ondan Allaha sığınacaqlar.

[2] Burada "əmanətə xəyanət etmək" deyildikdə izinsiz olaraq qənimətdən bir şey götürmək nəzərdə tutulur.

**[309]-182-(114)** ........ Abdullah ibn Abbas ﵄ demişdir: "Ömər ibn Xəttab mənə belə rəvayət etmişdir: "Xeybər döyüşündə səhabələrdən bəziləri gəlib: "Filankəs şəhiddir, filankəs şəhiddir..."– dedilər. Nəhayət, (döyüşdə ölmüş) bir kişinin yanına gəlib: "Filankəs şəhiddir"– deyəndə Peyğəmbər ﷺ buyurdu: "Xeyr! Mən onun qənimətdən (izinsiz olaraq) götürdüyü bürüncəyə (yaxud əbaya) görə odda (yandığını) gördüm". Sonra Peyğəmbər ﷺ: "Ey Xəttabın oğlu! Qalx camaata elan et ki, Cənnətə yalnız möminlər girəcəklər!"– deyə buyurdu.

Mən də qalxıb (camaata) elan edib dedim: "Cənnətə yalnız möminlər girəcək!"

**[٣١٠] ١٨٣**–(١١٥) حَدَّثَنِي أَبُو الطَّاهِرِ قَالَ: أَخْبَرَنِي ابْنُ وَهْبٍ عَنْ مَالِكِ بْنِ أَنَسٍ، عَنْ ثَوْرِ بْنِ زَيْدٍ الدُّؤَلِيِّ، عَنْ سَالِمٍ أَبِي الْغَيْثِ مَوْلَى ابْنِ مُطِيعٍ، عَنْ أَبِي هُرَيْرَةَ؛ ح: و حَدَّثَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ وَهَذَا حَدِيثُهُ: حَدَّثَنَا عَبْدُ الْعَزِيزِ يَعْنِي ابْنَ مُحَمَّدٍ، عَنْ ثَوْرٍ، عَنْ أَبِي الْغَيْثِ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ: خَرَجْنَا مَعَ النَّبِيِّ ﷺ إِلَى خَيْبَرَ، فَفَتَحَ اللَّهُ عَلَيْنَا، فَلَمْ نَغْنَمْ ذَهَبًا وَلاَ وَرِقًا، غَنِمْنَا الْمَتَاعَ وَالطَّعَامَ وَالثِّيَابَ، ثُمَّ انْطَلَقْنَا إِلَى الْوَادِي، وَمَعَ رَسُولِ اللَّهِ ﷺ عَبْدٌ لَهُ، وَهَبَهُ لَهُ رَجُلٌ مِنْ جُذَامَ، يُدْعَى رِفَاعَةَ بْنَ زَيْدٍ مِنْ بَنِي الضُّبَيْبِ، فَلَمَّا نَزَلْنَا الْوَادِي قَامَ عَبْدُ رَسُولِ اللَّهِ ﷺ يَحُلُّ رَحْلَهُ فَرُمِيَ بِسَهْمٍ، فَكَانَ فِيهِ حَتْفُهُ، فَقُلْنَا هَنِيئًا لَهُ الشَّهَادَةُ يَا رَسُولَ اللَّهِ! قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((كَلاَّ، وَالَّذِي نَفْسُ مُحَمَّدٍ بِيَدِهِ! إِنَّ الشَّمْلَةَ لَتَلْتَهِبُ عَلَيْهِ نَارًا أَخَذَهَا مِنْ الْغَنَائِمِ يَوْمَ خَيْبَرَ لَمْ تُصِبْهَا الْمَقَاسِمُ)) قَالَ: فَفَزِعَ النَّاسُ، فَجَاءَ رَجُلٌ بِشِرَاكٍ أَوْ شِرَاكَيْنِ، فَقَالَ: يَا رَسُولَ اللَّهِ! أَصَبْتُ يَوْمَ خَيْبَرَ، فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: ((شِرَاكٌ مِنْ نَارٍ أَوْ شِرَاكَانِ مِنْ نَارٍ)).

**[310]-183-(115)** ........ Əbu Hureyrə ﵁ demişdir: "Biz Peyğəmbərlə ﷺ birlikdə Xeybərə yürüş etdik və Allah bizə zəfər bəxş etdi. Biz (bu qəzavatda) qənimət olaraq qızıl-gümüş deyil, sadəcə əşya, ərzaq və geyim ələ keçirdik. Sonra biz Vadil-Qura[1] deyilən yerə getdik. Peyğəmbərin ﷺ Dubeyb oğullarından olan Rifaə ibn Zeyd adlı köləsi də onun yanınca gedirdi. Bu köləni ona Cuzam qəbiləsindən bir nəfər hədiyyə etmişdi. Biz vadiyə endiyimiz zaman Peyğəmbərin ﷺ köləsi onun dəvəsinin yəhərinin (qayışlarını) açmağa başladı. Elə bu vaxt (xeybərlilərin) atdığı ox gəlib köləyə dəydi və o, elə oradaca canını tapşırdı. Biz dedik: "(Allah bu) şəhidliyi ona mübarək eləsin, ya Rəsulullah!" Peyğəmbər ﷺ buyurdu: "Xeyr! Muhəmmədin canı Əlində olan (Allaha) and olsun ki, Xeybər döyüşündə (ələ keçirilmiş) və hələ bölüşdürülməmiş qənimətlərdən götürdüyü bürüncək onun üstündə od tutub yanır".

---

[1] Vadil-Qura – Mədinə ilə Şam sərhədləri arasında yerləşən qədim bir kənddir.

(Bunu eşidəndə) camaat qorxuya düşdü. Bu vaxt bir nəfər bir və ya iki ədəd ayaqqabı qaytanı gətirdi və: "Ya Rəsulullah! Bunu Xeybər günü götürmüşəm"– dedi. Peyğəmbər ﷺ buyurdu: "(Bunlar,) oddan olan bir ayaqqabı qaytanı, yaxud oddan olan iki ayaqqabı qaytanıdır"[1].

## (٤٩) – بَابُ الدَّلِيلِ عَلَى أَنَّ قَاتِلَ نَفْسَهُ لاَ يَكْفُرُ

## 49-cu fəsil. Özünü öldürən kimsənin kafir sayılmamasına dair dəlil

**[٣١١] ١٨٤–(١١٦)** حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ وَإِسْحَقُ بْنُ إِبْرَاهِيمَ، جَمِيعًا عَنْ سُلَيْمَانَ – قَالَ أَبُو بَكْرٍ: حَدَّثَنَا سُلَيْمَانُ بْنُ حَرْبٍ –: حَدَّثَنَا حَمَّادُ بْنُ زَيْدٍ، عَنْ حَجَّاجٍ الصَّوَّافِ، عَنْ أَبِي الزُّبَيْرِ، عَنْ جَابِرٍ: أَنَّ الطُّفَيْلَ بْنَ عَمْرٍو الدَّوْسِيَّ أَتَى النَّبِيَّ ﷺ فَقَالَ: يَا رَسُولَ اللَّهِ! هَلْ لَكَ فِي حِصْنٍ حَصِينٍ وَمَنْعَةٍ؟ – قَالَ: حِصْنٌ كَانَ لِدَوْسٍ فِي الْجَاهِلِيَّةِ – فَأَبَى ذَلِكَ النَّبِيُّ ﷺ، لِلَّذِي ذَخَرَ اللَّهُ لِلأَنْصَارِ، فَلَمَّا هَاجَرَ النَّبِيُّ ﷺ إِلَى الْمَدِينَةِ، هَاجَرَ إِلَيْهِ الطُّفَيْلُ بْنُ عَمْرٍو، وَهَاجَرَ مَعَهُ رَجُلٌ مِنْ قَوْمِهِ، فَاجْتَوَوْا الْمَدِينَةَ، فَمَرِضَ، فَجَزِعَ، فَأَخَذَ مَشَاقِصَ لَهُ، فَقَطَعَ بِهَا بَرَاجِمَهُ، فَشَخَبَتْ يَدَاهُ حَتَّى مَاتَ، فَرَآهُ الطُّفَيْلُ بْنُ عَمْرٍو فِي مَنَامِهِ، فَرَآهُ وَهَيْئَتُهُ حَسَنَةٌ، وَرَآهُ مُغَطِّيًا يَدَيْهِ، فَقَالَ لَهُ: مَا صَنَعَ بِكَ رَبُّكَ؟ فَقَالَ: غَفَرَ لِي بِهِجْرَتِي إِلَى نَبِيِّهِ ﷺ، فَقَالَ لَهُ: مَا لِي أَرَاكَ مُغَطِّيًا يَدَيْكَ؟ قَالَ: قِيلَ لِي: لَنْ نُصْلِحَ مِنْكَ مَا أَفْسَدْتَ، فَقَصَّهَا الطُّفَيْلُ عَلَى رَسُولِ اللَّهِ ﷺ فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: ((اللَّهُمَّ وَلِيَدَيْهِ فَاغْفِرْ)).

---

[1] Bu iki hədisdən aşağıdakı nəticələr çıxır:

– əmanətə xəyanət etmək haram sayılır;

– götürülən şeyin böyük və ya kiçik olması heç nəyi dəyişdirmir, hətta götürülmüş ayaqqabı qaytanı belə, əmanətə xəyanət sayılır;

– belə bir xəyanət, Allah yolunda vuruşub ölən şəxsin şəhid adlandırılmasına əngəl törədir;

– müsəlmanların yekdil fikrinə görə kafir olduğu halda, ölən şəxs əsla Cənnətə girməyəcək;

– Peyğəmbərin ﷺ: "Muhəmmədin canı Əlində olan (Allaha) and olsun...." sözünə əsasən demək olar ki, zərurət olmadığı halda, Allaha and içmək caizdir;

– hər kim izinsiz olaraq qənimətdən bir şey götürmüşdürsə, onu geri qaytarmalıdır. Və o bunu geri qaytardığı zaman həmin adamın əşyası yandırılmamalıdır. Çünki Peyğəmbər ﷺ bürüncək və qaytan götürmüş kimsələrin əşyalarını yandırmamışdır. Əgər bunu etmək vacib olsaydı, Peyğəmbər ﷺ bunu edərdi.

O ki qaldı Peyğəmbərin adından rəvayət edilmiş: "Qənimətdən izinsiz bir şey götürən kimsənin malını yandırın, özünün də boynunu vurun!" hədisinə, bu, zəif hədisdir. İbn Abdul-Bərr və qeyriləri öz kitablarında bu hədisin zəif olduğunu açıqlamışlar.

**[311]-184-(116)** ........ Cabir ﷺ demişdir: “(Bir dəfə) Tufeyl ibn Amr əd-Dövsi Peyğəmbərin ﷺ yanına gəlib dedi: “Ya Rəsulullah! Səni qoruyacaq bir qalanın və səni düşmənlərindən mühafizə edəcək bir camaatın yanında olmaq istəyirsənmi?” (Cabir dedi: “Cahiliyyət dövründə Dövs qəbiləsinin bir qalası var idi”.)

Allah (hicrəti[1]) Mədinə əhalisinə seçmişdi deyə, Peyğəmbər ﷺ Tufeylin təklifini qəbul etmədi. Peyğəmbər ﷺ Mədinəyə hicrət etdikdən sonra Tufeyl ibn Amr öz tayfasından olan bir kişi ilə birlikdə Mədinəyə hicrət etdi. Lakin onlar sıxıntı və xəstəlik üzündən Mədinədə qalmaq istəmədilər. Tufeyl ilə gələn adam xəstələndi və iztirab keçirməyə başladı. Elə bu səbəbdən də o, öz oxunu götürüb onun tiyəsi ilə barmaq buğumlarını[2] kəsdi və onun kəsilmiş əllərində qan fışqırmağa başladı. Nəhayət, o, (çoxlu qan itirib) öldü. (Bir müddətdən sonra) Tufeyl ibn Amr yuxuda həmin adamı gördü. Tufeyl onu gözəl görkəmdə, əllərinin isə sarıqlı olduğunu görüb ondan: “Rəbbin sənə nə etdi?”– deyə soruşdu. O dedi: “Peyğəmbərin ﷺ yanına hicrət etdiyimə görə (Rəbbim) məni bağışladı”. Tufeyl soruşdu: “Bəs niyə əllərin sarıqlıdır?” O dedi: “Mənə buyuruldu ki: “Sənin öz vücudundan korladığın bir əzanı biz düzəltməyəcəyik”. Tufeyl yuxusunu Peyğəmbərə ﷺ danışdı və Peyğəmbər ﷺ (həmin adam üçün): “Allahım, onun əllərini də bağışla!”– deyə dua etdi[3]”.

## (٥٠) – بَابُ فِي الرِّيحِ الَّتِي تَكُونُ قُرْبَ الْقِيَامَةِ تَقْبِضُ مَنْ فِي قَلْبِهِ شَيْءٌ مِنْ الإِيمَانِ

## 50-ci fəsil. Qiyamətə yaxın meydana gələcək və qəlbində azacıq imanı olan kimsələrin canını alacaq külək haqqında

**[٣١٢] ١٨٥–(١١٧)** حَدَّثَنَا أَحْمَدُ بْنُ عَبْدَةَ الضَّبِّيُّ: حَدَّثَنَا عَبْدُ الْعَزِيزِ بْنُ مُحَمَّدٍ وَأَبُو عَلْقَمَةَ الْفَرْوِيُّ قَالاَ: حَدَّثَنَا صَفْوَانُ بْنُ سُلَيْمٍ، عَنْ عَبْدِ اللَّهِ بْنِ سَلْمَانَ، عَنْ أَبِيهِ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ: قَالَ رَسُولُ اللَّهِ

[1] Hicrət sözü aşağıdakı mənaları verir:
(a) müsəlmanın dinini qorumaq məqsədilə İslama düşmənçilik edən ölkədən təhlükəsiz yerə köçməsi; (b) Muhəmməd Peyğəmbərin ﷺ səhabələrinin əvvəlcə Həbəşistana (indiki Efiopiyaya), sonra da Mədinəyə köçməsi; (c) Muhəmməd Peyğəmbərin ﷺ Məkkədən Mədinəyə köçməsi; (ç) başlanğıcı xristian təqviminin 622-ci ilinə uyğun gələn və Peyğəmbərin ﷺ Mədinəyə hicrət etdiyi ildən başlayan müsəlman təqvimi.

[2] Buğum – sümüklərin uclarının bir-birinə birləşdiyi yer.

[3] Bu hədis dəlildir ki, hər kim öz canına qəsd etsə və ya böyük bir günah işlədib tövbə etmədən ölsə, nə kafir sayılar, nə də Cəhənnəmlik olduğu iddia edilər. Əksinə, beləsi Allahın istəyi altındadır. İstər, onu bağışlar, istərsə də ona əzab verər.

ﷺ: ((إِنَّ اللَّهَ يَبْعَثُ رِيحًا مِنَ الْيَمَنِ، أَلْيَنَ مِنَ الْحَرِيرِ، فَلاَ تَدَعُ أَحَدًا فِي قَلْبِهِ – قَالَ أَبُو عَلْقَمَةَ: مِثْقَالُ حَبَّةٍ، وَ قَالَ عَبْدُ الْعَزِيزِ: مِثْقَالُ ذَرَّةٍ – مِنْ إِيمَانٍ إِلاَّ قَبَضَتْهُ)).

**[312]-185-(117)** ........ Əbu Hureyrə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Heç şübhəsiz ki, Allah Yəməndən[1] ipəkdən daha xəfif bir külək göndərəcək və bu külək qəlbində dən boyda, yaxud zərrə qədər[2] imanı olan hər kəsin canını (rahatlıqla) alacaq[3]".

## (٥١) – بَابُ الْحَثِّ عَلَى الْمُبَادَرَةِ بِالأَعْمَالِ قَبْلَ تَظَاهُرِ الْفِتَنِ

## 51-ci fəsil. Qiyamətin əlamətləri aşkara çıxmazdan əvvəl (insanları yaxşı) işlər görməyə təşviq etmək

**[٣١٣] ١٨٦**–(١١٨) حَدَّثَنِي يَحْيَى بْنُ أَيُّوبَ وَقُتَيْبَةُ وَابْنُ حُجْرٍ، جَمِيعًا عَنْ إِسْمَعِيلَ بْنِ جَعْفَرٍ – قَالَ ابْنُ أَيُّوبَ: حَدَّثَنَا إِسْمَعِيلُ – قَالَ: أَخْبَرَنِي الْعَلاَءُ عَنْ أَبِيهِ، عَنْ أَبِي هُرَيْرَةَ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: ((بَادِرُوا بِالأَعْمَالِ فِتَنًا كَقِطَعِ اللَّيْلِ الْمُظْلِمِ، يُصْبِحُ الرَّجُلُ مُؤْمِنًا وَيُمْسِي كَافِرًا، أَوْ يُمْسِي مُؤْمِنًا وَيُصْبِحُ كَافِرًا، يَبِيعُ دِينَهُ بِعَرَضٍ مِنَ الدُّنْيَا)).

**[313]-186-(118)** ........ Əbu Hureyrə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "(Ey müsəlmanlar!) Qaranlıq gecənin zülməti kimi (qorxunc) fitnələr-

---

[1] İmam Muslimin "Səhih" əsərinin axırlarında, Dəccal barədə varid olmuş hədislərin birində deyilir ki: "...sonra Allah Şam tərəfdən sərin bir meh göndərəcək və yer üzündə, qəlbində xardal dənəsi ağırlığında xeyir və ya iman olan elə bir kimsə qalmayacaq ki, bu meh onun canını (rahatlıqla) almasın..." Bir rəvayətdə Yəmən, digərində isə Şam deyilməsini belə izah etmək olar:

– ehtimal ki, bu, həm Şam, həm də Yəmən tərəfdən gələn meh olacaq;

– və ola da bilər ki, birindən başlayıb digərindən keçərək hər iki istiqamətdən gəlmiş sayılsın. Allah daha yaxşı bilir!

[2] "Dən boyda" kəlməsi Əbu Əlqəmənin, "zərrə qədər" ifadəsi isə Abdul-Azizin rəvayətində nəql olunmuşdur. Bu da dəlildir ki, iman artır və azalır.

[3] Bu xüsusda bir çox rəvayətlər varid olmuşdur ki, bunların zahiri bir-birinə ziddir. Lakin bunları açıqladıqdan sonra oxucuya aydın olur ki, Peyğəmbərin ﷺ hədislərində əsla ziddiyyət ola bilməz. Məsələn, bəzi hədislərdə: "Nə qədər ki, yer üzündə "Allah! Allah!" (sözü) deyilir, Qiyamət qopmayacaq", yaxud: "Allah! Allah!" deyən kimsənin üzərində Qiyamət qopmaz" və ya "Qiyamət yalnız ən pis adamların üzərində qopacaq" deyilir, digərində isə: "Qiyamətədək mənim ümmətimdən haqq üzərində zəfər çalacaq insanlar olacaq" deyilir. İlk baxışdan bu hədislər ziddiyyətli görünsə də, əslində bunlarda heç bir ziddiyyət yoxdur. Belə ki, Qiyamət yaxınlaşdıqda, Allahın göndərdiyi o sərin meh, haqq üzərində olan möminlərin canını rahatlıqla alacaq. Bundan sonra isə Qiyamət ən pis adamların üzərində qopacaq.

dən[1] əvvəl (yaxşı) işlər görməkdə bir-birinizlə yarışın! (Bu fitnələr zamanı) insan mömin olaraq səhərə çıxar, kafir olaraq isə axşamı qarşılayar,[2] yaxud mömin olaraq axşamı qarşılayar, kafir olaraq isə səhərə çıxar. Beləsi dünya mənfəəti müqabilində dinini satar".

## (٥٢) – بَابُ مَخَافَةِ الْمُؤْمِنِ أَنْ يَحْبَطَ عَمَلُهُ

## 52-ci fəsil. Möminin əməllərinin puç olmasından qorxması

**[٣١٤] ١٨٧–(١١٩)** حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا الْحَسَنُ بْنُ مُوسَى: حَدَّثَنَا حَمَّادُ بْنُ سَلَمَةَ، عَنْ ثَابِتٍ الْبُنَانِيِّ، عَنْ أَنَسِ بْنِ مَالِكٍ أَنَّهُ قَالَ: لَمَّا نَزَلَتْ هَذِهِ الآيَةُ:

﴿ يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُواْ لَا تَرۡفَعُوٓاْ أَصۡوَٰتَكُمۡ فَوۡقَ صَوۡتِ ٱلنَّبِيِّ ﴾إِلَى آخِرِ الآيَةِ.

جَلَسَ ثَابِتُ [بْنُ قَيْسٍ] فِي بَيْتِهِ وَقَالَ: أَنَا مِنْ أَهْلِ النَّارِ، وَاحْتَبَسَ [ثَابِتُ بْنُ قَيْسٍ] عَنِ النَّبِيِّ ﷺ، فَسَأَلَ النَّبِيُّ ﷺ سَعْدَ بْنَ مُعَاذٍ فَقَالَ: ((يَا أَبَا عَمْرٍو! مَا شَأْنُ ثَابِتٍ؟ اشْتَكَى؟)) قَالَ سَعْدٌ: إِنَّهُ لَجَارِي وَمَا عَلِمْتُ لَهُ بِشَكْوَى، قَالَ فَأَتَاهُ سَعْدٌ فَذَكَرَ لَهُ قَوْلَ رَسُولِ اللَّهِ ﷺ فَقَالَ ثَابِتٌ: أُنْزِلَتْ هَذِهِ الآيَةُ وَلَقَدْ عَلِمْتُمْ أَنِّي مِنْ أَرْفَعِكُمْ صَوْتًا عَلَى رَسُولِ اللَّهِ ﷺ، فَأَنَا مِنْ أَهْلِ النَّارِ، فَذَكَرَ ذَلِكَ سَعْدٌ لِلنَّبِيِّ ﷺ، فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: ((بَلْ هُوَ مِنْ أَهْلِ الْجَنَّةِ)).

**[314]-187-(119)** ........ Ənəs ibn Malik ﷺ rəvayət edir ki, (Allahın): **"Ey iman gətirənlər! Səsinizi Peyğəmbərin səsindən yüksəyə qaldırmayın və bir-birinizə müraciət etdiyiniz kimi, ona da uca səslə müraciət etməyin. Yoxsa özünüz də hiss etmədən əməlləriniz hədər gedər"**[3] ayəsi nazil olduqdan sonra Sabit (ibn Qeys) evindən bayıra çıxmadı və: "Mən Cəhənnəm əhlindənəm"– deyərək Peyğəmbərin ﷺ gözünə görünməkdən çəkindi. Peyğəmbər ﷺ Səd ibn Muazdan: "Ey Əbu Amr! Sabitə nə olub, xəstələnibmi?"– deyə onu xəbər aldı.

---

[1] Burada "fitnə" deyildikdə Qiyamətin əlamətləri nəzərdə tutulur. Əbu Hureyrə ﷺ rəvayət etmişdir ki, *bir dəfə* Peyğəmbər ﷺ: "*Qiyamətə yaxın* elm aradan qaldırılacaq, cəhalət və fitnələr üzə çıxacaq və hərc çoxalacaq"– dedi. Ondan: "Hərc nədir, ya Rəsulullah?"– deyə soruşdular. O, əlini çəpəki vəziyyətdə yuxarıdan aşağı endirib: "Bax belə"– deyə buyurdu, sanki *çoxlu* qətl *hadisələri* törədiləcəyini qəsd edirdi" ("Səhih əl-Buxari", 85); başqa bir hədisdə isə belə buyurmuşdur: "Elmin azalması, cahilliyin meydana çıxması, zinakarlığın yayılması və əlli qadına bir kişi düşəcək qədər qadınların çoxalıb kişilərin isə azalması Qiyamət saatının əlamətlərindəndir" ("Səhih əl-Buxari", 81).

[2] Yəni həmin vaxt bu fitnələrə uyan mömin hər an imanından dönüb kafir ola bilər.

[3] "əl-Hucurat" surəsi, 2.

Səd dedi: “O mənim qonşumdur. Onun xəstələnməyindən xəbərim yoxdur”. Sonra Səd Sabitin yanına gəlib Peyğəmbərin ﷺ sözünü ona xəbər verdi. Sabit dedi: “Bu ayə nazil oldu! Özünüz də yaxşı bilirsiniz ki, aranızda səsini Peyğəmbərin ﷺ səsindən yüksəyə qaldıran mənəm.[1] Deməк, mən Cəhənnəm əhlindənəm”. Səd onun dediklərini Peyğəmbərə ﷺ xəbər verdikdə Peyğəmbər ﷺ buyurdu: “Əksinə, o, Cənnət əhlindəndir!”[2]

**[٣١٥] ١٨٨**–(...) و حَدَّثَنَا قَطَنُ بْنُ نُسَيْرٍ: حَدَّثَنَا جَعْفَرُ بْنُ سُلَيْمَانَ: حَدَّثَنَا ثَابِتٌ عَنْ أَنَسِ بْنِ مَالِكٍ قَالَ: كَانَ ثَابِتُ بْنُ قَيْسِ بْنِ شَمَّاسٍ خَطِيبَ الأَنْصَارِ، فَلَمَّا نَزَلَتْ هَذِهِ الآيَةُ، بِنَحْوِ حَدِيثِ حَمَّادٍ، وَلَيْسَ فِي حَدِيثِهِ ذِكْرُ سَعْدِ بْنِ مُعَاذٍ.

**[315]-188-(...)** ........ Ənəs ibn Malik ﷺ: “Sabit ibn Qeys ibn Şəmmas ənsarın xətibi idi. Bu ayə nazil olduqda...” deyərək Həmmadın rəvayət etdiyi hədisə bənzər bir hədis rəvayət etmişdir. Lakin onun bu hədisində Səd ibn Muaz barədə heç nə deyilməmişdir.

**[٣١٦]** و حَدَّثَنِيهِ أَحْمَدُ بْنُ سَعِيدِ بْنِ صَخْرٍ الدَّارِمِيُّ: حَدَّثَنَا حَبَّانُ: حَدَّثَنَا سُلَيْمَانُ بْنُ الْمُغِيرَةِ، عَنْ ثَابِتٍ، عَنْ أَنَسٍ قَالَ: لَمَّا نَزَلَتْ: ﴿ يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُواْ لَا تَرْفَعُوٓاْ أَصْوَٰتَكُمْ فَوْقَ صَوْتِ ٱلنَّبِيِّ ﴾ وَلَمْ يَذْكُرْ سَعْدَ بْنَ مُعَاذٍ فِي الْحَدِيثِ.

**[316]** ........ Ənəs ibn Malik ﷺ: **“Ey iman gətirənlər! Səsinizi Peyğəmbərin səsindən yüksəyə qaldırmayın...”**[3] ayəsi nazil olduqda**...**” deyərək (bu hədisi) rəvayət etmiş, lakin bu hədisdə Səd ibn Muazı zikr etməmişdir.

---

[1] Sabit ibn Qeys ﷺ ənsarın xətibi idi. O, hərdən Peyğəmbərin ﷺ göstərişi ilə onun yanına gələnlərə xütbə verər və təbii ki, səsini qaldırardı.

[2] Sabit ibn Qeys ﷺ peyğəmbərlik iddiasında olan Museyləmənin ordusuna qarşı gedən döyüşdə şəhid olmuşdur. Rəvayət edilir ki, Ənəs ﷺ Yəmamə günü Sabit ibn Qeysin ﷺ yanına gəlikdə, Sabit ayaqlarına *dizdən baldıra qədər* hənut sürtürdü. Ənəs dedi: “Əmi, səni *döyüşdən* saxlayan nədir?” O: “Gəlirəm, qardaş oğlu!”– dedi və *ayaqlarına* ətir sürtməyə davam etdi. Sonra o gəlib *döyüşçülərin arasında* oturdu. *Döyüşdə* bəziləri düşmənin qabağından qaçarkən Sabit dedi: “Çəkilin gözümüzün qabağından! Qoyun biz onlarla vuruşaq! Biz Peyğəmbərlə ﷺ birlikdə vuruşarkən belə hərəkət etməzdik. Siz düşmənlərinizi çox pis öyrətmisiniz! (Yəni siz onlarda elə təsəvvür yaratmısınız və artıq onlar elə düşünməyə başlamışlar ki, onlar müsəlmanları qorxudub döyüş meydanından qaçmağa məcbur edə bilərlər)” (“Səhih əl-Buxari”, 2845).

Ənəs ﷺ demişdir: “Sabit bizim aramızda gəzib-dolaşırdı və biz onun Cənnət əhlindən olduğunu bilirdik. Yəmamə günü Sabit ibn Qeys ibn Şəmmas bədəninə hənut sürtdü, əyninə kəfən geydi, sonra da: “Siz düşmənlərinizi çox pis öyrətmisiniz!”– deyib (döyüşə atıldı) və düşmənlə döyüşüb şəhid oldu” (“Musnəd Əhməd”, 12422).

[3] “əl-Hucurat” surəsi, 2.

**[٣١٧]** (...) و حَدَّثَنَا هُرَيْمُ بْنُ عَبْدِ الأَعْلَى الأَسَدِيُّ: حَدَّثَنَا الْمُعْتَمِرُ بْنُ سُلَيْمَانَ قَالَ: سَمِعْتُ أَبِي يَذْكُرُ عَنْ ثَابِتٍ، عَنْ أَنَسٍ قَالَ: لَمَّا نَزَلَتْ هَذِهِ الآيَةُ – وَاقْتَصَّ الْحَدِيثَ – وَلَمْ يَذْكُرْ سَعْدَ بْنَ مُعَاذٍ وَزَادَ: فَكُنَّا نَرَاهُ يَمْشِي بَيْنَ أَظْهُرِنَا رَجُلٌ مِنْ أَهْلِ الْجَنَّةِ.

**[317] (...)** ........ Ənəs ﷺ: “Bu ayə nazil olduqda...” deyərək (hədisi) rəvayət etmiş, fəqət Səd ibn Muaz haqda heç nə deməmişdir. Üstəlik bunu əlavə etmişdir: “Biz, Cənnət əhlindən olan bir kişinin aramızda gəzib-dolaşdığını görürdük”.

## (٥٣) – بَابُ هَلْ يُؤَاخَذُ بِأَعْمَالِ الْجَاهِلِيَّةِ

## 53-cü fəsil. Cahiliyyət dövründə görülmüş işlərə görə cəzalandırılıb-cəzalandırılmayacağı haqqında

**[٣١٨] ١٨٩**–(١٢٠) حَدَّثَنَا عُثْمَانُ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا جَرِيرٌ عَنْ مَنْصُورٍ، عَنْ أَبِي وَائِلٍ، عَنْ عَبْدِ اللَّهِ قَالَ: قَالَ أُنَاسٌ لِرَسُولِ اللَّهِ ﷺ: يَا رَسُولَ اللَّهِ! أَنُؤَاخَذُ بِمَا عَمِلْنَا فِي الْجَاهِلِيَّةِ؟ قَالَ: ((أَمَّا مَنْ أَحْسَنَ مِنْكُمْ فِي الإِسْلاَمِ فَلاَ يُؤَاخَذُ بِهَا وَمَنْ أَسَاءَ أُخِذَ بِعَمَلِهِ فِي الْجَاهِلِيَّةِ وَالإِسْلاَمِ)).

**[318]-189-(120)** ........ Abdullah (ibn Məsud) ﷺ demişdir: “(Bir dəfə) bir dəstə adam Peyğəmbərdən ﷺ soruşdu: “Ya Rəsulullah, biz cahiliyyət dövründə etdiyimiz əməllərə görə cəzalandırılacağıqmı?” Peyğəmbər ﷺ buyurdu: “Sizlərdən müsəlman olduqdan sonra yaxşı iş[1] görən hər kəs cahiliyyət dövründə etdiyi əməllərə görə qınanmaz. (Müsəlman olduğu halda) günah işlərdən[2] əl çəkməyən kimsə isə, həm cahiliyyət dövründə, həm də müsəlman ola-ola etdiyi günahlarına görə cəzalandırılar”.

**[٣١٩] ١٩٠**–(...) حَدَّثَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللَّهِ بْنِ نُمَيْرٍ: حَدَّثَنَا أَبِي وَوَكِيعٌ؛ ح: و حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ – وَاللَّفْظُ لَهُ – حَدَّثَنَا وَكِيعٌ عَنْ الأَعْمَشِ، عَنْ أَبِي وَائِلٍ، عَنْ عَبْدِ اللَّهِ قَالَ: قُلْنَا: يَا رَسُولَ اللَّهِ! أَنُؤَاخَذُ بِمَا عَمِلْنَا فِي الْجَاهِلِيَّةِ؟ قَالَ: ((مَنْ أَحْسَنَ فِي الإِسْلاَمِ لَمْ يُؤَاخَذْ بِمَا عَمِلَ فِي الْجَاهِلِيَّةِ، وَمَنْ أَسَاءَ فِي الإِسْلاَمِ أُخِذَ بِالأَوَّلِ)).

---

[1] “Yaxşı iş” deyildikdə həm zahirdə, həm də batində İslamı qəbul etmək, əsil müsəlman olmaq qəsd edilir. Beləsinin İslamdan əvvəl etdiyi günahlar bağışlanır.

[2] “Pis işlər” deyildikdə İslamı ancaq dildə qəbul edib qəlbinə iman girməmiş kimsələr nəzərdə tutulur. Belələri həm cahiliyyət dövründə, həm də İslama gəldikdən sonra etdikləri pis əməllərə görə cəzalandırılacaqlar. Belə ki, onlar zahirən müsəlman olduqlarını iddia etsələr də, öz küfrlərinə davam etmiş və həqiqi möminlərdən olmamışlar.

**[319]-190-(...)** ........ Abdullah (ibn Məsud) ﷺ demişdir: "Biz (Peyğəmbərdən ﷺ) soruşduq: "Ya Rəsulullah, biz cahiliyyət dövründə etdiyimiz əməllərə görə cəzalandırılacağıqmı?" Peyğəmbər ﷺ buyurdu: "Müsəlman olduqdan sonra yaxşı iş görən hər kəs cahiliyyət dövründə etdiyi əməllərə görə qınanmaz. Müsəlman olduğu halda günah işlərdən əl çəkməyən kimsəyə gəlincə, o, keçmiş günahlarına görə cəzalandırılar".

**[٣٢٠] ١٩١**-(...) حَدَّثَنَا مِنْجَابُ بْنُ الْحَارِثِ التَّمِيمِيُّ: أَخْبَرَنَا [عَلِيُّ] بْنُ مُسْهِرٍ عَنْ الأَعْمَشِ بِهَذَا الإِسْنَادِ، مِثْلَهُ.

**[320]-191-(...)** ........ Mincab ibn Haris ət-Təmimi demişdir: "Əli ibn Mushir Aməşdən bu isnadla hədisin bənzərini bizə rəvayət etmişdir".

## (٥٤) – بَابُ كَوْنِ الإِسْلاَمِ يَهْدِمُ مَا قَبْلَهُ وَكَذَا الْهِجْرَةِ وَالْحَجِّ

## 54-cü fəsil. İslam dinini qəbul etmək əvvəlki günahların hamısını yox edər, hicrət etmək və həcc ziyarətinə getmək də habelə

**[٣٢١] ١٩٢**-(١٢١) حَدَّثَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى الْعَنَزِيُّ وَأَبُو مَعْنٍ الرَّقَاشِيُّ وَإِسْحَقُ بْنُ مَنْصُورٍ، كُلُّهُمْ عَنْ أَبِي عَاصِمٍ – وَاللَّفْظُ لاِبْنِ الْمُثَنَّى – حَدَّثَنَا الضَّحَّاكُ يَعْنِي أَبَا عَاصِمٍ قَالَ: أَخْبَرَنَا حَيْوَةُ بْنُ شُرَيْحٍ قَالَ: حَدَّثَنِي يَزِيدُ بْنُ أَبِي حَبِيبٍ عَنْ ابْنِ شِمَاسَةَ الْمَهْرِيِّ قَالَ: حَضَرْنَا عَمْرَو بْنَ الْعَاصِ وَهُوَ فِي سِيَاقَةِ الْمَوْتِ فَبَكَى طَوِيلاً وَحَوَّلَ وَجْهَهُ إِلَى الْجِدَارِ، فَجَعَلَ ابْنُهُ يَقُولُ: يَا أَبَتَاهُ! أَمَا بَشَّرَكَ رَسُولُ اللَّهِ ﷺ بِكَذَا؟ أَمَا بَشَّرَكَ رَسُولُ اللَّهِ ﷺ بِكَذَا؟ قَالَ فَأَقْبَلَ بِوَجْهِهِ فَقَالَ: إِنَّ أَفْضَلَ مَا نُعِدُّ شَهَادَةُ أَنْ لاَ إِلَهَ إِلاَّ اللَّهُ وَأَنَّ مُحَمَّدًا رَسُولُ اللَّهِ، إِنِّي كُنْتُ عَلَى أَطْبَاقٍ ثَلاَثٍ، لَقَدْ رَأَيْتُنِي وَمَا أَحَدٌ أَشَدَّ بُغْضًا لِرَسُولِ اللَّهِ ﷺ مِنِّي، وَلاَ أَحَبَّ إِلَيَّ أَنْ أَكُونَ قَدْ اسْتَمْكَنْتُ مِنْهُ، فَقَتَلْتُهُ فَلَوْ مُتُّ عَلَى تِلْكَ الْحَالِ لَكُنْتُ مِنْ أَهْلِ النَّارِ، فَلَمَّا جَعَلَ اللَّهُ الإِسْلاَمَ فِي قَلْبِي أَتَيْتُ النَّبِيَّ ﷺ فَقُلْتُ: ابْسُطْ يَمِينَكَ فَلأُبَايِعْكَ، فَبَسَطَ يَمِينَهُ، قَالَ فَقَبَضْتُ يَدِي، قَالَ: ((مَا لَكَ يَا عَمْرُو؟)) قَالَ: قُلْتُ: أَرَدْتُ أَنْ أَشْتَرِطَ، قَالَ: ((تَشْتَرِطُ بِمَاذَا؟)) قُلْتُ: أَنْ يُغْفَرَ لِي، قَالَ: ((أَمَا عَلِمْتَ أَنَّ الإِسْلاَمَ يَهْدِمُ مَا كَانَ قَبْلَهُ؟ وَأَنَّ الْهِجْرَةَ تَهْدِمُ مَا كَانَ قَبْلَهَا؟ وَأَنَّ الْحَجَّ يَهْدِمُ مَا كَانَ قَبْلَهُ؟)) وَمَا كَانَ أَحَدٌ أَحَبَّ إِلَيَّ مِنْ رَسُولِ اللَّهِ ﷺ وَلاَ أَجَلَّ فِي عَيْنِي مِنْهُ، وَمَا كُنْتُ أُطِيقُ أَنْ أَمْلأَ عَيْنَيَّ مِنْهُ إِجْلاَلاً لَهُ، وَلَوْ سُئِلْتُ أَنْ أَصِفَهُ مَا أَطَقْتُ، لأَنِّي لَمْ أَكُنْ أَمْلأُ عَيْنَيَّ مِنْهُ، وَلَوْ مُتُّ عَلَى تِلْكَ الْحَالِ لَرَجَوْتُ أَنْ أَكُونَ مِنْ أَهْلِ الْجَنَّةِ، ثُمَّ وَلِينَا أَشْيَاءَ مَا أَدْرِي مَا حَالِي فِيهَا، فَإِذَا أَنَا مُتُّ فَلاَ تَصْحَبْنِي نَائِحَةٌ وَلاَ نَارٌ، فَإِذَا دَفَنْتُمُونِي فَشُنُّوا عَلَيَّ التُّرَابَ شَنًّا، ثُمَّ أَقِيمُوا حَوْلَ قَبْرِي قَدْرَ مَا تُنْحَرُ جَزُورٌ وَيُقْسَمُ لَحْمُهَا حَتَّى أَسْتَأْنِسَ بِكُمْ، وَأَنْظُرَ مَاذَا أُرَاجِعُ بِهِ رُسُلَ رَبِّي)).

**[321]-192-(121)** ........ İbn Şüməmə əl-Məhri demişdir: “Amr ibn əl-As ölüm ayağında ikən biz ona baş çəkdik. O, bir xeyli ağladıqdan sonra üzünü divara tərəf çevirdi. Onda oğlu Abdullah dedi: “Atacan! Peyğəmbər ﷺ səni filan şeylə müjdələməyibmi?! Peyğəmbər ﷺ səni filan şeylə müjdələməyibmi?!” Amr üzünü (bizə) tərəf çevirib dedi: “Mənim tədarük gördüyüm ən əfzəl şey Allahdan başqa məbud olmadığına və Muhəmmədin Onun elçisi olduğuna şəhadət gətirməyimdir. Mən artıq üç mərhələdən keçmişəm. Vaxt var idi Allahın elçisinə ﷺ mənim qədər nifrət edən bir kimsə yox idi. Həmçinin onu yaxalayıb öldürməyim qədər məni sevindirəcək bir şey də yox idi. Əgər bu halda ölsəydim, Cəhənnəm əhlindən olardım.

Allah İslamı qəlbimə yerləşdirdiyi zaman mən Peyğəmbərin ﷺ yanına gəlib dedim: “Uzat sağ əlini, sənə beyət edim!” O, sağ əlini (mənə tərəf) uzatdı, lakin mən əlimi geri çəkdim. Peyğəmbər ﷺ: “Sənə nə olub, ey Amr?”– deyə soruşdu. Dedim: “Şərt kəsmək istəyirəm”. Soruşdu: “Nə şərtdir elə?” Dedim: “Bağışlanmağımı (istəyirəm)”. O buyurdu: “Məgər bilmirsən ki, İslam özündən əvvəlki günahları yox edir?![1] (Bilmirsən) ki, hicrət özündən əvvəlki günahları yox edir?! Bilmirsən ki, həcc ziyarəti özündən əvvəlki günahları yox edir?!” Bundan sonra mənim üçün Peyğəmbərdən ﷺ daha əziz və gözümdə ondan daha hörmətli bir kimsə qalmamışdı. Peyğəmbərə ﷺ bəslədiyim hörmətdən yana, ona baxmaqla gözlərimi doyura bilmirdim. Əgər məndən onu vəsf etmək tələb olunsaydı, mən onu vəsf edə bilməzdim. Çünki mən ona baxmaqla gözlərimi doyura bilmirdim. Əgər bu halda ölsəydim, Cənnət əhlindən olacağıma (qətiyyətlə) ümid edərdim.

Bundan sonra biz elə işlər gördük ki, mən bunlara görə aqibətimin necə olacağını bilmirəm.

Mən öldükdən sonra (heç kəs) vay-şivən salıb ağlamasın, habelə cənazəmi odla müşayiət etməsin.[2] Məni dəfn etdikdən sonra üzərimə torpaq səpin.[3] Daha sonra qəbrimin yan-yörəsində bir dəvənin kəsilib, ətinin paylanılacağı vaxt

---

[1] Uca Allah buyurur: **“Kafir olanlara de ki, əgər *küfrə* son qoysalar, olub-keçənlər onlara bağışlanar. Yox, əgər *küfrə* qayıtsalar, əvvəlkilərin başına gələn aqibəti gözləsinlər”** (“əl-Ənfal” surəsi, 38).

[2] Ölü üçün vay-şivən salıb ağlamaq və cənazəni odla müşayiət etmək cahiliyyət dövrünün əməllərindən olduğundan Amr ﵁ bunu, onun cənazəsində iştirak edəcək adamlara qadağan edir.

[3] Bu, qəbirə torpaq tökməyin müstəhəb olmasına dəlalət edir.

qədər dayanın ki, sizin sayənizdə öz yerimə isinişim[1] və Rəbbimin elçilərini[2] necə qarşılayacağıma bir çarə qılım"[1].

---

[1] Yəni sizin mənim üçün etdiyiniz dualar, dilədiyiniz məğfirət və sabitlik sayəsində sabitqədəm olum, mənə verilən suallara cavab verə bilim.

[2] Burada "elçilər" deyildikdə insanı qəbirdə sorğu-sual edən Nəkir və Munkir adlı mələklər nəzərdə tutulur. Bəra ibn Azib ﷺ rəvayət edir ki, biz Peyğəmbərlə ﷺ birlikdə ənsardan olan bir kişinin cənazəsini dəfn edərkən Allahın elçisi ﷺ qəbirin yanında oturdu, biz də dinməz-söyləməz onun ətrafında oturduq. O, əlindəki çubuğu yerə vururdu. Sonra başını qaldırıb buyurdu: "Qəbir əzabından Allaha sığının!" O bunu üç dəfə təkrar etdikdən sonra dedi: "Mömin bəndə dünyadan köçüb Axirətə qovuşduqda, göydən onun yanına üzləri günəş kimi parlaq mələklər enir. Onlar özləri ilə Cənnətdən kəfən və ətir gətirir, *onun* gözünün gördüyü son məsafədə oturub gözləyirlər. Sonra ölüm mələyi gəlib onun başının üstündə oturub deyir: "Ey gözəl ruh! Allahın mərhəmətinə və xeyir-duasına qovuşmaq üçün çıx *oradan*!" Nəhayət, mömin bəndənin ruhu bədənindən, su damcısı qabın ağzından axıb töküldüyü kimi çıxır. Ölüm mələyi ruhu götürdükdən sonra onu bir göz qırpımında, *oturub gözləyən* mələklərə təhvil verir, onlar da onu kəfənə büküb ətirləyirlər. Bundan sonra ondan, yer üzündə mövcud olan ən gözəl ətirin qoxusuna bənzər gözəl bir qoxu gəlir. Sonra mələklər onu götürüb göyə qaldırırlar. Göyə qalxarkən mələklərdən ibarət hansı toplumun yanından keçirlərsə, onlar: "Görəsən bu gözəl ruh kimin ruhudur?"– deyə soruşurlar. Onlar: "Bu, filankəsin oğlu filankəsdir"– deyə bu bəndəni, *camaatın* onu həyatda ikən çağırdığı ən gözəl adla çağırırlar. Nəhayət, onlar birinci göyə gəlib yetişdikdə, göy qapılarının açılmasını xahiş edir və onun qapıları taybatay açılır. Hər bir göyün mələkləri o ruhu növbəti göyə qədər beləcə yola salır. Nəhayət, yeddinci göyə gəlib çatdıqda, Qüdrətli və Əzəmətli Allah buyurur: **"Mənim qulum barədə olan qeydləri İlliyyuna yazın, sonra da onu qaytarın yerə. Çünki Mən söz vermişəm ki, onları torpaqdan yaratdım, öləndən sonra ora qaytaracaq və *Qiyamət günü* bir daha oradan *dirildib* çıxardacağam"**. Mələklər onu bədəninə qaytardıqdan sonra iki mələk gəlib onu otuzdurur və: "Rəbbin kimdir?"– deyə soruşur. O: "Rəbbim Allahdır!"– deyə cavab verir. Onlar: "Dinin nədir?"– deyə soruşurlar. O: "Dinim İslamdır!"– deyə cavab verir. Onlar: "Sizə göndərilmiş o kişi kim idi?"– deyə soruşurlar. O: "Bu, Allahın elçisi ﷺ idi!"– deyə cavab verir. Onlar: "Həyatda ikən sən nə öyrəndin?"– deyə soruşurlar. O: "Mən Allahın Kitabını oxuyub ona iman gətirdim və ona sadiq oldum"– deyə cavab verir. Bu vaxt göydən belə bir səda gəlir: **"Mənim qulum doğru danışır. Cənnət nemətlərini onun önünə sərin və onun üçün Cənnətdən bir qapı açın!"** Beləliklə, Cənnətin gözəl iyi və havası ona gəlir, qəbri də gözlərinin gördüyü son məsafəyə qədər genişlənir. Sonra gözəl görkəmli, əynində yaraşıqlı paltarı olan və üst-başından ətir iyi gələn bir kişi onun yanına gəlib deyir: "Səni sevindirəcək bir xəbərə sevin! Bu, sənə vəd olunan gündür!" Mömin: "Sən kimsən? Sənin üzündən xeyirxahlıq yağır!"– deyə soruşur. O da: "Mən sənin yaxşı əməlinəm!"– deyə cavab verir. Onda mömin dua edib deyir: "Allahım! Qoy Qiyamət günü tez gəlsin ki, mən öz ailəmə qayıdıb var-dövlətimə sahib olum".

Kafir bəndə dünyadan köçüb Axirətə qovuşduqda isə göydən onun yanına ağırzəhmli və qara simalı mələklər enir. Onlar özləri ilə Cəhənnəmdən giş (cod parça) gətirir və gözünün gördüyü son məsafədə oturub gözləyirlər. Sonra ölüm mələyi gəlib onun başının üstündə oturub deyir: "Ey yaramaz ruh! Allahın qəzəbi və qeyzinə düçar olmaq üçün çıx *oradan*!" Nəhayət onun ruhu bədənindən, tikanlı məftil yaş yunun arasından keçdiyi kimi çıxır. Ölüm mələyi ruhu götürdükdən sonra onu bir göz qırpımında, *oturub gözləyən* mələklərə təhvil verir, onlar da onu gişə bükürlər. Bundan sonra ondan, yer üzündə mövcud olan ən pis iyə bənzər bir iy gəlir. Sonra mələklər onu götürüb göyə qaldırırlar. Göyə qalxarkən mələklərdən ibarət hansı toplumun yanından keçirlərsə, onlar: "Görəsən bu iyrənc ruh kimin ruhudur?"– deyə soruşurlar. Onlar: "Bu, filankəsin oğlu filankəsdir"– deyə bu bəndəni, *camaatın* onu həyatda

**[٣٢٢] ١٩٣-(١٢٢)** حَدَّثَنِي مُحَمَّدُ بْنُ حَاتِمِ بْنِ مَيْمُونٍ، وَإِبْرَاهِيمُ بْنُ دِينَارٍ – وَاللَّفْظُ لِإِبْرَاهِيمَ – قَالَ: حَدَّثَنَا حَجَّاجٌ وَهُوَ ابْنُ مُحَمَّدٍ – عَنِ ابْنِ جُرَيْجٍ قَالَ: أَخْبَرَنِي يَعْلَى بْنُ مُسْلِمٍ أَنَّهُ سَمِعَ سَعِيدَ بْنَ جُبَيْرٍ يُحَدِّثُ عَنِ ابْنِ عَبَّاسٍ، أَنَّ نَاسًا مِنْ أَهْلِ الشِّرْكِ قَتَلُوا فَأَكْثَرُوا، وَزَنَوْا فَأَكْثَرُوا، ثُمَّ أَتَوْا مُحَمَّدًا ﷺ فَقَالُوا: إِنَّ الَّذِي تَقُولُ وَتَدْعُو لَحَسَنٌ، وَلَوْ تُخْبِرُنَا أَنَّ لِمَا عَمِلْنَا كَفَّارَةً، فَنَزَلَ:

﴿وَٱلَّذِينَ لَا يَدۡعُونَ مَعَ ٱللَّهِ إِلَٰهًا ءَاخَرَ وَلَا يَقۡتُلُونَ ٱلنَّفۡسَ ٱلَّتِي حَرَّمَ ٱللَّهُ إِلَّا بِٱلۡحَقِّ وَلَا يَزۡنُونَۚ وَمَن يَفۡعَلۡ ذَٰلِكَ يَلۡقَ أَثَامًا﴾ وَنَزَلَ: ﴿۞ قُلۡ يَٰعِبَادِيَ ٱلَّذِينَ أَسۡرَفُواْ عَلَىٰٓ أَنفُسِهِمۡ لَا تَقۡنَطُواْ مِن رَّحۡمَةِ ٱللَّهِۚ﴾

**[322]-193-(122)** ........ İbn Abbas ﵄ demişdir: “Müşriklərdən bəziləri (neçə-neçə) adam öldürmüş və (bu günahı) təkrar-təkrar etmişdilər, həmçinin zina etmiş və dəfələrlə (bu günaha) batmışdılar. Bundan sonra onlar Muhəmmədin ﷺ yanına gəlib dedilər: “Sənin dediyin və dəvət etdiyin (İslam dini), həqiqətən də, gözəldir. Nə olaydı, sən bizə vaxtı ilə bizim elədiyimiz günahların kəffarə[2] olduğunu xəbər verəydin. Onda bu ayələr nazil oldu:

---

ikən çağırdığı ən pis adla çağırırlar. Nəhayət, onlar birinci göyə gəlib yetişdikdə göy qapılarının açılmasını xahiş edir, lakin onun qapıları açılmır.

Sonra Peyğəmbər ﷺ bu ayəni oxudu: **“Şübhəsiz ki, ayələrimizi yalan sayanlara və onlara təkəbbürlüklə yanaşanlara göyün qapıları açılmayacaq və dəvə iynənin gözündən keçməyincə, onlar Cənnətə girməyəcəklər”** (“əl-Əraf” surəsi, 40).

Sonra o *rəvayətinə davam edib* dedi: “*Allah buyurur:* “Mənim qulum barədə olan qeydləri yerin alt təbəqəsində yerləşən Siccinə yazın. Çünki Mən söz vermişəm ki, onları torpaqdan yaradıb, öləndən sonra ora qaytaracaq və *Qiyamət günü* bir daha oradan *dirildib* çıxardacağam”. Mələklər onun ruhunu göydən aşağı atırlar”.

Sonra Peyğəmbər ﷺ bu ayəni oxudu: **“Kim Allaha şərik qoşsa, sanki o, göydən yerə düşər, quşlar onu alıb aparar, yaxud külək onu sovurub uzaq bir yerə atar”** (“əl-Həcc” surəsi, 31).

Sonra o *rəvayətinə davam edib* dedi: “Onun ruhu bədəninə qayıtdıqdan sonra iki mələk gəlib onu otuzdurur və: “Rəbbin kimdir?”– deyə soruşur. O mızıldanıb deyir: “M-mm... Bilmirəm!” Onlar: “Sizə göndərilmiş o kişi kim idi?”– deyə soruşurlar. O yenə mızıldanıb deyir: “M-mm... Bilmirəm!” Bu vaxt göydən belə bir səda gəlir: **“O yalan danışır. Onun yolunu alovlandırın və onun üçün Cəhənnəmdən bir qapı açın”.** Beləliklə, Cəhənnəm atəşi və alovlu külək ona dəyir, qəbri də o qədər sıxılır ki, qabırğaları bir-birinə keçir. Sonra eybəcər sifətli, əynində nimdaş paltarı olan və üst-başından pis qoxu gələn bir kişi onun yanına gəlib deyir: “Mən səni kədərli bir xəbərlə müjdələyirəm. Bu, sənə vəd olunan gündür!” Kafir: “Sən kimsən? Sənin üzündən şər yağır!”– deyə soruşur. O da: “Mən sənin yaramaz əməllərinəm!”– deyə cavab verir. Onda kafir yalvarıb deyir: “Allahım! Qoyma Qiyamət qopsun” (“Sunən Əbu Davud”, 4755).

[1] Hədisdən belə nəticə çıxır ki, İslam dinini qəbul etmək, küfr olan bir diyardan möminlərin olduğu yerə köçmək və həcc ziyarətini yerinə yetirmək – bunların hər biri əvvəlki günahları silib aparır. Həmçinin hədisdən görünür ki, ölüm ayağında olan kimsəyə müjdə vermək və onun etdiyi yaxşılıqları xatırlatmaq onun halını yüngülləşdirər və ona Allah barədə yaxşı zənn etməyə səbəb olar. Hədis həmçinin insanın öləndən sonra qəbirdə imtahan ediləcəyinə və sorğu-suala çəkiləcəyinə, habelə dəfndən sonra qəbrinin yanında durub onun üçün dua etməyə dəlalət edir.

[2] Günahların bağışlanılması üçün şəriətin buyurduğu qaydada verilən cəza, yaxud deyilən söz və ya verilən sədəqə.

**“Onlar Allahla yanaşı başqa məbuda yalvarmaz, Allahın haram etdiyi cana haqsız yerə qıymaz və zina etməzlər. Bunu edən kimsə cəzalandırılar.”[1]**

**“*Qullarıma mənim bu sözümü* de: “Ey Mənim özlərinə qarşı həddi aşmış qullarım! Allahın rəhmindən ümidinizi üzməyin...”[2]**

## (٥٥) – بَابُ بَيَانِ حُكْمِ عَمَلِ الْكَافِرِ إِذَا أَسْلَمَ بَعْدَهُ

## 55-ci fəsil. Kafirin İslamı qəbul etməzdən əvvəl (etdiyi yaxşı) **əməllərinin hökmünün bəyan edilməsi**

**[٣٢٣] ١٩٤**–(١٢٣) حَدَّثَنِي حَرْمَلَةُ بْنُ يَحْيَى: أَخْبَرَنَا ابْنُ وَهْبٍ: أَخْبَرَنِي يُونُسُ عَنْ ابْنِ شِهَابٍ: أَخْبَرَنِي عُرْوَةُ بْنُ الزُّبَيْرِ أَنَّ حَكِيمَ بْنَ حِزَامٍ أَخْبَرَهُ أَنَّهُ قَالَ لِرَسُولِ اللَّهِ ﷺ: أَرَأَيْتَ أُمُورًا كُنْتُ أَتَحَنَّثُ بِهَا فِي الْجَاهِلِيَّةِ، هَلْ لِي فِيهَا مِنْ شَيْءٍ؟ فَقَالَ لَهُ رَسُولُ اللَّهِ ﷺ: ((أَسْلَمْتَ عَلَى مَا أَسْلَفْتَ مِنْ خَيْرٍ)) وَالتَّحَنُّثُ التَّعَبُّدُ.

**[323]-194-(123)** ........ Həkim ibn Hizam ﷺ demişdir: “(Bir dəfə) mən Peyğəmbərdən ﷺ soruşdum ki: “Cahiliyyət dövründə ibadət məqsədilə gördüyüm yaxşı işlər barədə nə deyə bilərsən?” Peyğəmbər ﷺ buyurdu: “Sən olubkeçmiş yaxşılıqlarla bərabər müsəlman oldun!”[3]

(Hədisdə keçən) “təhənnüs” kəlməsi ibadət etmək deməkdir.

**[٣٢٤] ١٩٥**–(...) و حَدَّثَنَا حَسَنٌ الْحُلْوَانِيُّ وَعَبْدُ بْنُ حُمَيْدٍ – و قَالَ الْحُلْوَانِيُّ: حَدَّثَنَا، وَقَالَ عَبْدٌ: حَدَّثَنِي – يَعْقُوبُ وَهُوَ ابْنُ إِبْرَاهِيمَ بْنِ سَعْدٍ: حَدَّثَنَا أَبِي عَنْ صَالِحٍ، عَنْ ابْنِ شِهَابٍ قَالَ: أَخْبَرَنِي عُرْوَةُ بْنُ الزُّبَيْرِ، أَنَّ حَكِيمَ بْنَ حِزَامٍ أَخْبَرَهُ، أَنَّهُ قَالَ لِرَسُولِ اللَّهِ ﷺ: أَيْ رَسُولَ اللَّهِ! أَرَأَيْتَ أُمُورًا كُنْتُ أَتَحَنَّثُ بِهَا فِي الْجَاهِلِيَّةِ: مِنْ صَدَقَةٍ أَوْ عَتَاقَةٍ أَوْ صِلَةِ رَحِمٍ، أَفِيهَا أَجْرٌ؟ فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: ((أَسْلَمْتَ عَلَى مَا أَسْلَفْتَ مِنْ خَيْرٍ)).

---

[1] “əl-Furqan” surəsi, 68.

[2] “əz-Zumər” surəsi, 53.

[3] İbn Bəttal və başqa tədqiqatçılar bu hədisi olduğu kimi qəbul etmiş və onu başqa mənaya yozmamışlar. Yəni əgər kafir adam İslam dinini qəbul edər və müsəlman olduğu halda dünyasını dəyişərsə, İslamdan əvvəl etdiyi xeyirxahlıqlara görə savab qazanar. Buna da Əbu Səid əl-Xudrinin ﷺ rəvayət etdiyi hədisi dəlil gətirmişlər. Həmin hədisdə Peyğəmbər ﷺ belə buyurmuşdur: “(Kafir) adam İslamı qəbul etdiyi zaman Allah ona müsəlman olmamışdan əvvəl etdiyi hər yaxşılığa görə savab yazar və etdiyi bütün günahları silər. Bundan sonra isə hər bir əməlin əvəzi verilər: hər yaxşılığa görə ona savabın on mislindən yeddi yüz qatınadək savab yazılar. Hər günaha görə isə ona bunun cəmi bir misli yazılar. Yalnız Allahın bağışladığı günahlardan başqa” (“Sunən ən-Nəsai”, 4998; “Silsilətul-Əhadis əs-Səhihə”, 247; “Səhih əl-Cami”, 336).

**[324]-195-(...)** ........ Həkim ibn Hizam ﵁ demişdir: "Mən Peyğəmbərə ﷺ dedim: "Ya Rəsulullah! De görüm, cahiliyyət dövründə sədəqə vermək, qul azad etmək və qohumluq əlaqələrini möhkəmləndirmək kimi ibadət məqsədilə gördüyüm yaxşı işlərə görə mənə savab yazılırmı?" Peyğəmbər ﷺ buyurdu: "Sən olub-keçmiş yaxşılıqlarla bərabər müsəlman oldun!"

**[٣٢٥]** (...) حَدَّثَنَا إِسْحَقُ بْنُ إِبْرَاهِيمَ وَعَبْدُ بْنُ حُمَيْدٍ قَالاَ: أَخْبَرَنَا عَبْدُ الرَّزَّاقِ: أَخْبَرَنَا مَعْمَرٌ عَنْ الزُّهْرِيِّ، بِهَذَا الإِسْنَادِ؛ ح: و حَدَّثَنَا إِسْحَقُ بْنُ إِبْرَاهِيمَ: أَخْبَرَنَا أَبُو مُعَاوِيَةَ: حَدَّثَنَا هِشَامُ بْنُ عُرْوَةَ، عَنْ أَبِيهِ، عَنْ حَكِيمِ بْنِ حِزَامٍ قَالَ: قُلْتُ: يَا رَسُولَ اللَّهِ! أَشْيَاءَ كُنْتُ أَفْعَلُهَا فِي الْجَاهِلِيَّةِ – قَالَ هِشَامٌ: يَعْنِي أَتَبَرَّرُ بِهَا – فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: ((أَسْلَمْتَ عَلَى مَا أَسْلَفْتَ لَكَ مِنْ الْخَيْرِ)) قُلْتُ: فَوَاللَّهِ! لاَ أَدَعُ شَيْئًا صَنَعْتُهُ فِي الْجَاهِلِيَّةِ إِلاَّ فَعَلْتُ فِي الإِسْلاَمِ مِثْلَهُ.

**[325] (...)** ........ Həkim ibn Hizam ﵁ demişdir: "Mən Peyğəmbərə ﷺ dedim: "Ya Rəsulullah! Mənim cahiliyyət dövründə etdiyim xeyirxahlıqlar barədə nə deyə bilərsən?" Peyğəmbər ﷺ buyurdu: "Sən olub-keçmiş yaxşılıqlarla bərabər müsəlman oldun!"

Mən dedim: "Allaha and olsun ki, cahiliyyət dövründə nə (yaxşılıq) etmişəmsə, bunu İslamda da edəcəyəm".

**[٣٢٦] ١٩٦**–(...) حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا عَبْدُ اللَّهِ بْنُ نُمَيْرٍ عَنْ هِشَامِ بْنِ عُرْوَةَ، عَنْ أَبِيهِ أَنَّ حَكِيمَ بْنَ حِزَامٍ أَعْتَقَ فِي الْجَاهِلِيَّةِ مِائَةَ رَقَبَةٍ وَحَمَلَ عَلَى مِائَةِ بَعِيرٍ، ثُمَّ أَعْتَقَ فِي الإِسْلاَمِ مِائَةَ رَقَبَةٍ، وَحَمَلَ عَلَى مِائَةِ بَعِيرٍ، ثُمَّ أَتَى النَّبِيَّ ﷺ فَذَكَرَ نَحْوَ حَدِيثِهِمْ.

**[326]-196-(...)** ........ Urva: "Həkim ibn Hizam cahiliyyət dövründə yüz kölə azad etmiş və yüz dəvə yükü qədər sədəqə vermişdi. İslam dinini qəbul etdikdən sonra da, yüz kölə azad etdi və yüz dəvə yükü qədər sədəqə verdi, sonra da Peyğəmbərin yanına gəlib..." deyərək yuxarıdakı hədislərə yaxın mənada rəvayət etmişdir.

## (٥٦) – بَابُ صِدْقِ الإِيمَانِ وَإِخْلاَصِهِ

## 56-cı fəsil. İmanda sədaqət və səmimiyyət

**[٣٢٧] ١٩٧**–(١٢٤) حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا عَبْدُ اللَّهِ بْنُ إِدْرِيسَ وَأَبُو مُعَاوِيَةَ وَوَكِيعٌ عَنْ الأَعْمَشِ، عَنْ إِبْرَاهِيمَ، عَنْ عَلْقَمَةَ، عَنْ عَبْدِ اللَّهِ قَالَ: لَمَّا نَزَلَتْ: ﴿ٱلَّذِينَ ءَامَنُواْ وَلَمْ يَلْبِسُوٓاْ إِيمَـٰنَهُم بِظُلْمٍ﴾

شَقَّ ذَلِكَ عَلَى أَصْحَابِ رَسُولِ اللَّهِ ﷺ وَقَالُوا: أَيُّنَا لاَ يَظْلِمُ نَفْسَهُ؟ فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: ((لَيْسَ هُوَ كَمَا تَظُنُّونَ، إِنَّمَا هُوَ كَمَا قَالَ لُقْمَانُ لاِبْنِهِ: ﴿ يَٰبُنَيَّ لَا تُشْرِكْ بِٱللَّهِ إِنَّ ٱلشِّرْكَ لَظُلْمٌ عَظِيمٌ ﴾.

**[327]-197-(124)** ........ Abdullah (ibn Məsud) ﵁ rəvayət edir ki: **"İman gətirib imanlarına zülm qatmayanlar əmin-amanlıqdadırlar..."**[1] ayəsi nazil olduqda bu ayə Peyğəmbərin ﷺ səhabələrinə ağır gəldi və onlar dedilər: "(Ya Rəsulullah!) Bizim hansı birimiz (özünə) zülm etmir ki?"[2] Peyğəmbər ﷺ buyurdu: "Bu (ayədəki zülm) sizin zənn etdiyiniz kimi deyil. Bu, Loğmanın öz oğluna dediyi kimidir: **"Oğlum! *Allaha* şərik qoşma. Həqiqətən də, Allaha şərik qoşmaq böyük zülmdür!"**[3]

**[٣٢٨] ١٩٨**–(...) حَدَّثَنَا إِسْحَقُ بْنُ إِبْرَاهِيمَ وَعَلِيُّ بْنُ خَشْرَمٍ قَالاَ: أَخْبَرَنَا عِيسَى وَهُوَ ابْنُ يُونُسَ؛ ح: و حَدَّثَنَا مِنْجَابُ بْنُ الْحَارِثِ التَّمِيمِيُّ: أَخْبَرَنَا ابْنُ مُسْهِرٍ؛ ح: و حَدَّثَنَا أَبُو كُرَيْبٍ: أَخْبَرَنَا ابْنُ إِدْرِيسَ، كُلُّهُمْ عَنْ الأَعْمَشِ بِهَذَا الإِسْنَادِ قَالَ أَبُو كُرَيْبٍ: قَالَ ابْنُ إِدْرِيسَ: حَدَّثَنِيهِ أَوَّلاً أَبِي عَنْ أَبَانَ بْنِ تَغْلِبَ، عَنْ الأَعْمَشِ، ثُمَّ سَمِعْتُهُ مِنْهُ.

**[328]-198-(...)** ........ İsa ibn Yunus, İbn Mushir və İbn İdris – hamısı (bu hədisi) Aməşdən bu isnadla rəvayət etmişdir.

Əbu Kureyb rəvayət etmişdir ki, İbn İdris demişdir: "Bu hədisi mənə əvvəlcə atam, Əban ibn Təğlibdən, o da Aməşdən rəvayət etmiş, sonra isə mən onu Əbanın özündən eşitmişəm".

## (٥٧) – بَابُ بَيَانِ أَنَّهُ سُبْحَانَهُ وَتَعَالَى لَمْ يُكَلِّفْ إِلاَّ مَا يُطَاقُ

## 57-ci fəsil. Pak və Uca Allahın (bəndələrini) yalnız qüvvələri çatdığı qədər mükəlləf[4] etməsinin bəyan olunması

**[٣٢٩] ١٩٩**–(١٢٥) حَدَّثَنِي مُحَمَّدُ بْنُ مِنْهَالٍ الضَّرِيرُ وَأُمَيَّةُ بْنُ بِسْطَامَ الْعَيْشِيُّ، وَاللَّفْظُ لأُمَيَّةَ قَالاَ: حَدَّثَنَا يَزِيدُ بْنُ زُرَيْعٍ: حَدَّثَنَا رَوْحٌ وَهُوَ ابْنُ الْقَاسِمِ عَنْ الْعَلاَءِ، عَنْ أَبِيهِ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ: لَمَّا نَزَلَتْ عَلَى

---

[1] "əl-Ən'am" surəsi, 82.

[2] Xəttabi demişdir: "Səhabələr zülm sözünü zahiri mənada başa düşdüyü üçün, insanların haqqına girməyi və günah iş görməyi zülm hesab etdiklərinə görə, bu onlara ağır gəldi. Əslində isə zülm, bir şeyi öz yerinə qoymamaq deməkdir. Odur ki, ibadəti Allahdan qeyrisinə yönəldən şəxs zalımların zalımı sayılır".

[3] "Loğman" surəsi, 13.

[4] Allahın Öz bəndələri üzərinə qoyduğu vəzifə, borc.

رَسُولِ اللَّهِ ﷺ: ﴿ لِّلَّهِ مَا فِي ٱلسَّمَٰوَٰتِ وَمَا فِي ٱلْأَرْضِۗ وَإِن تُبْدُواْ مَا فِيٓ أَنفُسِكُمْ أَوْ تُخْفُوهُ يُحَاسِبْكُم بِهِ ٱللَّهُۖ فَيَغْفِرُ لِمَن يَشَآءُ وَيُعَذِّبُ مَن يَشَآءُۗ وَٱللَّهُ عَلَىٰ كُلِّ شَيْءٖ قَدِيرٌ ﴾

قَالَ فَاشْتَدَّ ذَلِكَ عَلَى أَصْحَابِ رَسُولِ اللَّهِ ﷺ فَأَتَوْا رَسُولَ اللَّهِ ﷺ ثُمَّ بَرَكُوا عَلَى الرُّكَبِ فَقَالُوا: أَيْ رَسُولَ اللَّهِ! كُلِّفْنَا مِنْ الأَعْمَالِ مَا نُطِيقُ: الصَّلاَةَ وَالصِّيَامَ وَالْجِهَادَ وَالصَّدَقَةَ وَقَدْ أُنْزِلَتْ عَلَيْكَ هَذِهِ الآيَةُ وَلاَ نُطِيقُهَا. قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((أَتُرِيدُونَ أَنْ تَقُولُوا كَمَا قَالَ أَهْلُ الْكِتَابَيْنِ مِنْ قَبْلِكُمْ: سَمِعْنَا وَعَصَيْنَا؟ بَلْ قُولُوا: سَمِعْنَا وَأَطَعْنَا غُفْرَانَكَ رَبَّنَا وَإِلَيْكَ الْمَصِيرُ)) قَالُوا: سَمِعْنَا وَأَطَعْنَا غُفْرَانَكَ رَبَّنَا وَإِلَيْكَ الْمَصِيرُ، فَلَمَّا اقْتَرَأَهَا الْقَوْمُ ذَلَّتْ بِهَا أَلْسِنَتُهُمْ. فَأَنْزَلَ اللَّهُ فِي إِثْرِهَا:

﴿ ءَامَنَ ٱلرَّسُولُ بِمَآ أُنزِلَ إِلَيْهِ مِن رَّبِّهِۦ وَٱلْمُؤْمِنُونَۚ كُلٌّ ءَامَنَ بِٱللَّهِ وَمَلَٰٓئِكَتِهِۦ وَكُتُبِهِۦ وَرُسُلِهِۦ لَا نُفَرِّقُ بَيْنَ أَحَدٖ مِّن رُّسُلِهِۦۚ وَقَالُواْ سَمِعْنَا وَأَطَعْنَاۖ غُفْرَانَكَ رَبَّنَا وَإِلَيْكَ ٱلْمَصِيرُ ﴾

فَلَمَّا فَعَلُوا ذَلِكَ نَسَخَهَا اللَّهُ تَعَالَى، فَأَنْزَلَ اللَّهُ عَزَّ وَجَلَّ:

﴿ لَا يُكَلِّفُ ٱللَّهُ نَفْسًا إِلَّا وُسْعَهَاۚ لَهَا مَا كَسَبَتْ وَعَلَيْهَا مَا ٱكْتَسَبَتْۗ رَبَّنَا لَا تُؤَاخِذْنَآ إِن نَّسِينَآ أَوْ أَخْطَأْنَاۚ ﴾ قَالَ: نَعَمْ

﴿ رَبَّنَا وَلَا تَحْمِلْ عَلَيْنَآ إِصْرًا كَمَا حَمَلْتَهُۥ عَلَى ٱلَّذِينَ مِن قَبْلِنَاۚ ﴾ قَالَ: نَعَمْ

﴿ رَبَّنَا وَلَا تُحَمِّلْنَا مَا لَا طَاقَةَ لَنَا بِهِۦۖ ﴾ قَالَ: نَعَمْ

﴿ وَٱعْفُ عَنَّا وَٱغْفِرْ لَنَا وَٱرْحَمْنَآۚ أَنتَ مَوْلَىٰنَا فَٱنصُرْنَا عَلَى ٱلْقَوْمِ ٱلْكَٰفِرِينَ ﴾ قَالَ نَعَمْ.

**[329]-199-(125)** ........ Əbu Hureyrə ﵁ demişdir: "(Uca Allahın): **"Göylərdə və yerdə nə varsa, Allahındır. Siz içərinizdə olanı üzə çıxarsanız da, gizlətsəniz də Allah buna görə sizi hesaba çəkəcək. O, istədiyini bağışlayar, istədiyinə də əzab verər. Allah hər şeyə qadirdir"**[1] ayəsi Peyğəmbərə ﷺ nazil olduqdan sonra onu eşidən səhabələr böyük bir sıxıntı keçirərək Peyğəmbərin ﷺ yanına gəlib diz üstə oturdular və dedilər: "Ya Rəsulullah! Biz bacardığımızı – namaz qılmaq, oruc tutmaq, cihad etmək və sədəqə vermək kimi əməlləri yerinə yetirməyə mükəlləf edildik, lakin sənə nazil olan bu ayəyə əməl etməyə gücümüz çatmır.[2] Peyğəmbər ﷺ (onlara) dedi: "Sizdən əvvəlki iki kitab əhli kimi: "Eşitdik və asi olduq!"– sözünümü demək istəyirsiniz? Xeyr, deyin: "Eşitdik və itaət etdik! Ey Rəbbimiz! Səndən bağışlanma diləyirik, dönüş də yalnız Sənə-

[1] "əl-Bəqərə" surəsi, 284.

[2] Yəni heç birimiz nəfsi istəklərin və şeytani vəsvəsələrin qabağını biryolluq ala bilməz. Qoy hər kəs Allahın və Onun peyğəmbərinin ﷺ buyuruqlarını bacardığı qədər yerinə yetirsin. Çünki Allah hər kəsi, yalnız onun qüvvəsi çatdığı qədər mükəlləf edir.

dir!" Onlar: "Eşitdik və itaət etdik! Ey Rəbbimiz! Səndən bağışlanma diləyirik, dönüş də yalnız Sənədir!"– dedilər. Camaat bunu oxuduqca dilləri bu sözlərə alışdı. Arxasınca da Allah bu ayəni nazil etdi: **"Peyğəmbər öz Rəbbindən ona nazil edilənə iman gətirdi, möminlər də *iman gətirdilər*. Hamısı Allaha, Onun mələklərinə, kitablarına və elçilərinə iman gətirdilər. *Onlar dedilər*: "Biz Onun elçiləri arasında fərq qoymuruq!" Onlar dedilər: "Eşitdik və itaət etdik! Ey Rəbbimiz! Səndən bağışlanma diləyirik, dönüş də yalnız Sənədir!"[1]** Onlar bunu yerinə yetirdikləri zaman Uca Allah onu açıqlayaraq bu ayəni nazil etdi: **"Allah hər kəsi yalnız onun qüvvəsi çatdığı qədər mükəlləf edər. Hər kəsin qazandığı *xeyir yalnız* onun özünə, qazandığı *şər də yalnız* öz əleyhinədir. "Ey Rəbbimiz, unutsaq və ya xəta etsək, bizi cəzalandırma!" Ey Rəbbimiz, bizdən əvvəlkilərə yüklədiyin kimi, bizə də ağır yük yükləmə! Ey Rəbbimiz, gücümüz çatmayan şeyi daşımağa bizi vadar etmə! Bizi əfv et, bizi bağışla və bizə rəhm et! Sən bizim Himayədarımızsan! Kafirləri məğlub etməkdə bizə yardım et!"[2]** (Möminlər bu ayəni oxuyub hər dəfə: "Ey Rəbbimiz!..."– deyə Allaha xitab etdikdə) Allah: "Bəli!"– deyə buyurdu.

**[٣٣٠] ٢٠٠–(١٢٦)** حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ وَأَبُو كُرَيْبٍ وَإِسْحَقُ بْنُ إِبْرَاهِيمَ – وَاللَّفْظُ لأَبِي بَكْرٍ – قَالَ إِسْحَقُ: أَخْبَرَنَا، وَقَالَ: الآخرَانِ حَدَّثَنَا – وَكِيعٌ عَنْ سُفْيَانَ، عَنْ آدَمَ بْنِ سُلَيْمَانَ مَوْلَى خَالِدٍ قَالَ: سَمِعْتُ سَعِيدَ بْنَ جُبَيْرٍ يُحَدِّثُ عَنْ ابْنِ عَبَّاسٍ قَالَ: لَمَّا نَزَلَتْ هَذِهِ الآيَةُ:

﴿وَإِن تُبْدُوا۟ مَا فِىٓ أَنفُسِكُمْ أَوْ تُخْفُوهُ يُحَاسِبْكُم بِهِ ٱللَّهُ﴾

قَالَ دَخَلَ قُلُوبَهُمْ مِنْهَا شَيْءٌ لَمْ يَدْخُلْ قُلُوبَهُمْ مِنْ شَيْءٍ، فَقَالَ النَّبِيُّ ﷺ: ((قُولُوا: سَمِعْنَا وَأَطَعْنَا وَسَلَّمْنَا)) قَالَ: فَأَلْقَى اللَّهُ الإِيمَانَ فِي قُلُوبِهِمْ، فَأَنْزَلَ اللَّهُ تَعَالَى:

﴿لَا يُكَلِّفُ ٱللَّهُ نَفْسًا إِلَّا وُسْعَهَا ۚ لَهَا مَا كَسَبَتْ وَعَلَيْهَا مَا ٱكْتَسَبَتْ ۗ رَبَّنَا لَا تُؤَاخِذْنَآ إِن نَّسِينَآ أَوْ أَخْطَأْنَا ۚ﴾

قَالَ: قَدْ فَعَلْتُ ﴿رَبَّنَا وَلَا تَحْمِلْ عَلَيْنَآ إِصْرًا كَمَا حَمَلْتَهُۥ عَلَى ٱلَّذِينَ مِن قَبْلِنَا ۚ﴾

قَالَ: قَدْ فَعَلْتُ ﴿وَٱغْفِرْ لَنَا وَٱرْحَمْنَآ ۚ أَنتَ مَوْلَىٰنَا﴾ قَالَ قَدْ فَعَلْتُ.

**[330]-200-(126)** ........ İbn Abbas (r.a.) demişdir: "(Allahın): **"Siz içərinizdə olanı üzə çıxarsanız da, gizlətsəniz də Allah buna görə sizi hesaba çəkə-**

---

[1] "əl-Bəqərə" surəsi, 285.
[2] "əl-Bəqərə" surəsi, 286.

**cək"**[1] ayəsi nazil olduqda, (hələ) səhabələrin qəlblərinə girməyən bir şey bu səbəbdən onların qəlbinə girdi.[2] Onda Peyğəmbər ﷺ buyurdu: "Deyin: "Eşitdik, itaət etdik və qəbul etdik!" (Beləliklə də) Allah imanı onların qəlbinə yerləşdirdi, sonra da bu ayəni nazil etdi: **"Allah hər kəsi yalnız onun qüvvəsi çatdığı qədər mükəlləf edər. Hər kəsin qazandığı** *xeyir yalnız* **onun özünə, qazandığı** *şər də yalnız* **öz əleyhinədir. "Ey Rəbbimiz, unutsaq və ya xəta etsək, bizi cəzalandırma!"**[3]

Allah: "İstədiyinizi yerinə yetirdim"– dedi.

**"Ey Rəbbimiz, bizdən əvvəlkilərə yüklədiyin kimi, bizə də ağır yük yükləmə!"**[4]

Allah: "İstədiyinizi yerinə yetirdim"– dedi.

**"...bizi bağışla və bizə rəhm et! Sən bizim Himayədarımızsan!"**[5]

Allah: "İstədiyinizi yerinə yetirdim"– dedi.

## (٥٨) – بَابُ تَجَاوُزِ اللَّهِ عَنْ حَدِيثِ النَّفْسِ وَالْخَوَاطِرِ بِالْقَلْبِ إِذَا لَمْ تَسْتَقِرَّ

## 58-ci fəsil. Nəfsin təhrik etdiyi (yaramaz) şeyləri və qəlbdən keçən (pis) fikirləri həyata keçirməyincə Allahın (bunları) əfv etməsi

**[٣٣١] ٢٠١–(١٢٧)** حَدَّثَنَا سَعِيدُ بْنُ مَنْصُورٍ وَقُتَيْبَةُ بْنُ سَعِيدٍ وَمُحَمَّدُ بْنُ عُبَيْدٍ الْغُبَرِيُّ – وَاللَّفْظُ لِسَعِيدٍ – قَالُوا: حَدَّثَنَا أَبُو عَوَانَةَ عَنْ قَتَادَةَ، عَنْ زُرَارَةَ بْنِ أَوْفَى، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((إِنَّ اللَّهَ تَجَاوَزَ لِأُمَّتِي مَا حَدَّثَتْ بِهِ أَنْفُسَهَا مَا لَمْ يَتَكَلَّمُوا أَوْ يَعْمَلُوا بِهِ)).

**[331]-201-(127)** ........ Əbu Hureyrə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Allah mənim ümmətimin qəlbindən keçən,[6] lakin dilinə gətirmədiyi, yaxud həyata keçirmədiyi günahlarını bağışlayır".

---

[1] "əl-Bəqərə" surəsi, 284.

[2] Bu ayədən sonra səhabələrin qəlbləri təşvişə düşdü və onlar elə güman etdilər ki, qəlblərindən keçən hər bir şeyə görə haqq-hesaba çəkiləcəklər.

[3] "əl-Bəqərə" surəsi, 286.

[4] Əvvəlki ayə.

[5] Əvvəlki ayə.

[6] Burada insanın xəyalından keçən şeylər nəzərdə tutulur. Növbəti fəsillərdə varid olmuş 334-cü, 335-ci, 336-cı, 337-ci, 338-ci, 340-cı və 342-ci hədislər bu fikri təsdiqləyir.

**[٣٣٢] ٢٠٢**-(...) حَدَّثَنَا عَمْرٌو النَّاقِدُ وَزُهَيْرُ بْنُ حَرْبٍ قَالاَ: حَدَّثَنَا إِسْمَعِيلُ بْنُ إِبْرَاهِيمَ؛ **ح:** و حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا عَلِيُّ بْنُ مُسْهِرٍ وَعَبْدَةُ بْنُ سُلَيْمَانَ؛ **ح:** و حَدَّثَنَا ابْنُ الْمُثَنَّى وَابْنُ بَشَّارٍ قَالاَ: حَدَّثَنَا ابْنُ أَبِي عَدِيٍّ، كُلُّهُمْ عَنْ سَعِيدِ بْنِ أَبِي عَرُوبَةَ، عَنْ قَتَادَةَ، عَنْ زُرَارَةَ عَنْ أَبِي هُرَيْرَةَ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((إِنَّ اللَّهَ عَزَّ وَجَلَّ تَجَاوَزَ لأُمَّتِي عَمَّا حَدَّثَتْ بِهِ أَنْفُسَهَا مَا لَمْ تَعْمَلْ أَوْ تَكَلَّمْ بِهِ)).

**[332]-202-(...)** ........ Əbu Hureyrə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "İzzətli və Qüdrətli Allah mənim ümmətimin qəlbindən keçən, lakin həyata keçirmədiyi və ya dilinə gətirmədiyi günahlarını bağışlayır".

**[٣٣٣]** و حَدَّثَنِي زُهَيْرُ بْنُ حَرْبٍ: حَدَّثَنَا وَكِيعٌ: حَدَّثَنَا مِسْعَرٌ وَهِشَامٌ؛ **ح:** و حَدَّثَنِي إِسْحَقُ بْنُ مَنْصُورٍ: أَخْبَرَنَا الْحُسَيْنُ بْنُ عَلِيٍّ عَنْ زَائِدَةَ، عَنْ شَيْبَانَ، جَمِيعًا عَنْ قَتَادَةَ بِهَذَا الإِسْنَادِ مِثْلَهُ.

**[333]** ........ Misar, Hişam və Şeyban – hamısı bu isnadla (yuxarıdakı) hədisin bənzərini rəvayət etmişlər.

## (٥٩) – بَابُ إِذَا هَمَّ الْعَبْدُ بِحَسَنَةٍ كُتِبَتْ وَإِذَا هَمَّ بِسَيِّئَةٍ لَمْ تُكْتَبْ

## 59-cu fəsil. İnsan yaxşı iş görməyə niyyət etdikdə (ona savab) yazılır, günah iş tutmağa niyyət etdikdə isə (ona günah) yazılmır

**[٣٣٤] ٢٠٣**-(١٢٨) حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ وَزُهَيْرُ بْنُ حَرْبٍ وَإِسْحَقُ بْنُ إِبْرَاهِيمَ – وَاللَّفْظُ لأَبِي بَكْرٍ – قَالَ إِسْحَقُ: أَخْبَرَنَا سُفْيَانُ: وَقَالَ الآخَرَانِ: حَدَّثَنَا ابْنُ عُيَيْنَةَ، عَنْ أَبِي الزِّنَادِ، عَنْ الأَعْرَجِ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((قَالَ اللَّهُ عَزَّ وَجَلَّ: إِذَا هَمَّ عَبْدِي بِسَيِّئَةٍ فَلاَ تَكْتُبُوهَا عَلَيْهِ، فَإِنْ عَمِلَهَا فَاكْتُبُوهَا سَيِّئَةً، وَإِذَا هَمَّ بِحَسَنَةٍ فَلَمْ يَعْمَلْهَا فَاكْتُبُوهَا حَسَنَةً، فَإِنْ عَمِلَهَا فَاكْتُبُوهَا عَشْرًا)).

**[334]-203-(128)** ........ Əbu Hureyrə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "İzzətli və Qüdrətli Allah (mələklərinə belə) buyurmuşdur: "Qulum bir günah iş görməyə niyyət etdiyi zaman bunu (dərhal) onun əleyhinə yazmayın.[1]

---

[1] Burada "niyyət etmək" deyildikdə günah iş görməyə meyil etmək qəsd edilir. Lakin onu da qeyd etmək lazımdır ki, hər hansı bir günahı etməyə səy göstərən adam istəyinə çatsa da, çatmasa da, niyyətinə görə ona günah yazılır. Buna Peyğəmbərin ﷺ bu hədisini dəlil göstərmək olar: "İki müsəlman qılınclarını çəkib üz-üzə gələrsə, öldürən də, öldürülən də Cəhənnəmə girər". (Səhabə soruşdu): "Ya Rəsulullah! Öldürən aydındır. Bəs öldürülən niyə?" Peyğəmbər ﷺ buyurdu: "Çünki o, qardaşını öldürməyə həris idi" ("Səhih əl-Buxari", 31). Belə ki, əgər Allahın əzəldən yazdığı qədər onun qarşısını almasaydı, o, müsəlman qardaşını öldürəcəkdi.

Əgər o, bu günahı edərsə, ona (cəmi) bir günah yazın. Əgər qulum bir yaxşılıq etməyə niyyət etsə, sonra bunu yerinə yetirməzsə, (ona) bir savab yazın. Hərgah bu yaxşılığı etsə, onda (ona) on savab yazın".

**[٣٣٥] ٢٠٤**–(...) حَدَّثَنَا يَحْيَى بْنُ أَيُّوبَ وَقُتَيْبَةُ وَابْنُ حُجْرٍ قَالُوا: حَدَّثَنَا إِسْمَعِيلُ وَهُوَ ابْنُ جَعْفَرٍ، عَنْ الْعَلَاءِ، عَنْ أَبِيهِ، عَنْ أَبِي هُرَيْرَةَ عَنْ رَسُولِ اللَّهِ ﷺ قَالَ: ((قَالَ اللَّهُ عَزَّ وَجَلَّ: إِذَا هَمَّ عَبْدِي بِحَسَنَةٍ وَلَمْ يَعْمَلْهَا كَتَبْتُهَا لَهُ حَسَنَةً، فَإِنْ عَمِلَهَا كَتَبْتُهَا عَشْرَ حَسَنَاتٍ إِلَى سَبْعِ مِائَةِ ضِعْفٍ، وَإِذَا هَمَّ بِسَيِّئَةٍ وَلَمْ يَعْمَلْهَا لَمْ أَكْتُبْهَا عَلَيْهِ، فَإِنْ عَمِلَهَا كَتَبْتُهَا سَيِّئَةً وَاحِدَةً)).

**[335]-204-(...)** ........ Əbu Hureyrə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "İzzətli və Qüdrətli Allah belə buyurmuşdur: "Qulum bir yaxşılıq etməyə niyyət etsə, sonra buna əməl etməzsə, Mən ona bir savab yazaram. Əgər buna əməl edərsə, Mən ona on savabdan yeddi yüz qatınadək savab yazaram. Bir günah iş görməyə niyyət etsə, sonra bundan vaz keçərsə, Mən bunu onun əleyhinə yazmaram. Əgər o bu günahı etsə, Mən ona cəmi bir günah yazaram".

**[٣٣٦] ٢٠٥**–(١٢٩) و حَدَّثَنَا مُحَمَّدُ بْنُ رَافِعٍ: حَدَّثَنَا عَبْدُ الرَّزَّاقِ: أَخْبَرَنَا مَعْمَرٌ عَنْ هَمَّامِ بْنِ مُنَبِّهٍ قَالَ: هَذَا مَا حَدَّثَنَا أَبُو هُرَيْرَةَ عَنْ مُحَمَّدٍ رَسُولِ اللَّهِ ﷺ [فَذَكَرَ أَحَادِيثَ مِنْهَا] قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((قَالَ اللَّهُ تَعَالَى: إِذَا تَحَدَّثَ عَبْدِي بِأَنْ يَعْمَلَ حَسَنَةً فَأَنَا أَكْتُبُهَا لَهُ حَسَنَةً مَا لَمْ يَعْمَلْ، فَإِذَا عَمِلَهَا فَأَنَا أَكْتُبُهَا بِعَشْرِ أَمْثَالِهَا، وَإِذَا تَحَدَّثَ بِأَنْ يَعْمَلَ سَيِّئَةً فَأَنَا أَغْفِرُهَا لَهُ مَا لَمْ يَعْمَلْهَا، فَإِذَا عَمِلَهَا فَأَنَا أَكْتُبُهَا لَهُ بِمِثْلِهَا)).

وَقَالَ رَسُولُ اللَّهِ ﷺ: ((قَالَتْ الْمَلَائِكَةُ: رَبِّ! ذَاكَ عَبْدُكَ يُرِيدُ أَنْ يَعْمَلَ سَيِّئَةً وَهُوَ أَبْصَرُ بِهِ، فَقَالَ: ارْقُبُوهُ، فَإِنْ عَمِلَهَا فَاكْتُبُوهَا لَهُ بِمِثْلِهَا، وَإِنْ تَرَكَهَا فَاكْتُبُوهَا لَهُ حَسَنَةً، إِنَّمَا تَرَكَهَا مِنْ جَرَّايَ)).

وَقَالَ رَسُولُ اللَّهِ ﷺ: ((إِذَا أَحْسَنَ أَحَدُكُمْ إِسْلَامَهُ فَكُلُّ حَسَنَةٍ يَعْمَلُهَا تُكْتَبُ بِعَشْرِ أَمْثَالِهَا إِلَى سَبْعِ مِائَةِ ضِعْفٍ، وَكُلُّ سَيِّئَةٍ يَعْمَلُهَا تُكْتَبُ بِمِثْلِهَا حَتَّى يَلْقَى اللَّهَ)).

**[336]-205-(129)** ........ Həmmam: "Bu, Əbu Hureyrənin bizə Allahın elçisi Muhəmməddən ﷺ rəvayət etdikləridir" demiş (və bir çox hədislər zikr etmişdir. Onlardan biri də budur): "Peyğəmbər ﷺ demişdir: "Uca Allah buyurdu: "Əgər qulum bir yaxşılıq etmək qərarına gəlsə və bunu yerinə yetirməsə, Mən ona bir savab yazaram. Hərgah yerinə yetirərsə, Mən (ona) bunun on mislində savab yazaram. Əgər o, bir günah işlətmək qərarına gələr, sonra da bundan vaz keçərsə, Mən onun (bu pis) niyyətini bağışlayaram. Hərgah bunu həyata keçirərsə, etdiyinin misli qədər ona günah yazaram".

Peyğəmbər ﷺ buyurdu: “Mələklər dedilər: “Ey Rəbbimiz! ”Sənin bu qulun günah iş görmək istəyir”. Allah onu hamıdan yaxşı gördüyü halda (mələklərə): “Ona nəzarət edin! İşdi, bunu gerçəyə çevirərsə, ona bunun misli qədər günah yazın. Yox əgər bundan vaz keçərsə, ona bir savab yazın. Çünki o, bunu Mənim xatirimə tərk etmişdir”.

Peyğəmbər ﷺ buyurdu: “Sizdən (hansı) biriniz layiqli müsəlman olarsa, etdiyi hər yaxşılığa görə ona bunun on mislindən yeddi yüz qatınadək savab yazılar. Etdiyi hər bir pis əməlinə görə isə cəmi bir günah yazılar. Bu, ta Allaha qovuşanadək beləcə davam edər”.

**[٣٣٧] ٢٠٦–(١٣٠)** و حَدَّثَنَا أَبُو كُرَيْبٍ: حَدَّثَنَا أَبُو خَالِدٍ الأَحْمَرُ عَنْ هِشَامٍ، عَنْ ابْنِ سِيرِينَ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((مَنْ هَمَّ بِحَسَنَةٍ فَلَمْ يَعْمَلْهَا كُتِبَتْ لَهُ حَسَنَةً، وَمَنْ هَمَّ بِحَسَنَةٍ فَعَمِلَهَا كُتِبَتْ لَهُ عَشْرًا إِلَى سَبْعِ مِائَةِ ضِعْفٍ، وَمَنْ هَمَّ بِسَيِّئَةٍ فَلَمْ يَعْمَلْهَا، لَمْ تُكْتَبْ، وَإِنْ عَمِلَهَا كُتِبَتْ)).

**[337]-206-(130)** ........ Əbu Hureyrə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Kim bir savab iş görməyə niyyət etsə, sonra buna əməl etməzsə, ona bir savab yazılar. Hərgah savab iş görməyə niyyət edər və bunu yerinə yetirərsə, ona on savabdan yeddi yüz qatınadək savab yazılar. Kim bir günah iş görməyə niyyət etsə, sonra niyyətindən vaz keçərsə, ona günah yazılmaz, (yox) əgər bunu edərsə, ona (cəmi bir günah) yazılar”.

**[٣٣٨] ٢٠٧–(١٣١)** حَدَّثَنَا شَيْبَانُ بْنُ فَرُّوخَ: حَدَّثَنَا عَبْدُ الْوَارِثِ، عَنْ الْجَعْدِ أَبِي عُثْمَانَ: حَدَّثَنَا أَبُو رَجَاءٍ الْعُطَارِدِيُّ، عَنْ ابْنِ عَبَّاسٍ عَنْ رَسُولِ اللَّهِ ﷺ – فِيمَا يَرْوِي عَنْ رَبِّهِ تَبَارَكَ وَتَعَالَى –، قَالَ: ((إِنَّ اللَّهَ كَتَبَ الْحَسَنَاتِ وَالسَّيِّئَاتِ، ثُمَّ بَيَّنَ ذَلِكَ فَمَنْ هَمَّ بِحَسَنَةٍ فَلَمْ يَعْمَلْهَا كَتَبَهَا اللَّهُ عِنْدَهُ حَسَنَةً كَامِلَةً وَإِنْ هَمَّ بِهَا فَعَمِلَهَا كَتَبَهَا اللَّهُ عَزَّ وَجَلَّ عِنْدَهُ عَشْرَ حَسَنَاتٍ إِلَى سَبْعِ مِائَةِ ضِعْفٍ إِلَى أَضْعَافٍ كَثِيرَةٍ، وَإِنْ هَمَّ بِسَيِّئَةٍ فَلَمْ يَعْمَلْهَا كَتَبَهَا اللَّهُ عِنْدَهُ حَسَنَةً كَامِلَةً، وَإِنْ هَمَّ بِهَا فَعَمِلَهَا، كَتَبَهَا اللَّهُ سَيِّئَةً وَاحِدَةً)).

**[338]-207-(131)** ........ İbn Abbas رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ Uca və Ulu Rəbbindən belə rəvayət etmişdir: “Allah savab və günah işləri yazmış, sonra da bunları bəyan etmişdir. Kim bir savab iş görməyə niyyət etsə, sonra buna əməl etməzsə, Allah onun üçün Öz yanında tam bir savab yazar. Əgər o savab iş görməyə niyyət edər və bunu yerinə yetirərsə, İzzətli və Qüdrətli Allah onun üçün Öz yanında on mislindən yeddi yüzədək, hətta bundan qat-qat artıq savab yazar. Kim bir günah iş görməyə niyyət etsə, sonra buna əməl etməzsə,

Allah onun üçün Öz yanında tam bir savab yazar. Əgər o günah iş görməyə niyyət edər və bunu yerinə yetirərsə, Allah ona cəmi bir günah yazar".

**[٣٣٩] ٢٠٨**–(...) و حَدَّثَنَا يَحْيَى بْنُ يَحْيَى: حَدَّثَنَا جَعْفَرُ بْنُ سُلَيْمَانَ عَنْ الْجَعْدِ أَبِي عُثْمَانَ فِي هَذَا الإِسْنَادِ بِمَعْنَى حَدِيثِ عَبْدِ الْوَارِثِ، وَزَادَ: ((وَمَحَاهَا اللَّهُ، وَلاَ يَهْلِكُ عَلَى اللَّهِ إِلاَّ هَالِكٌ)).

**[339]-208-(...)** ........ Yəhya ibn Yəhya demişdir: "Cəfər ibn Süleyman Cəd ibn Əbu Süfyandan bu isnadla Abdul-Varisin rəvayət etdiyi hədisin eynisini rəvayət etmiş və bunu əlavə etmişdir: "Allah həmin günahı silər. (Allahın bu geniş lütfünə rəğmən) ancaq özünü bu mərhəmətdən məhrum edən kimsə[1] həlak olar".

## (٦٠) – بَابُ بَيَانِ الْوَسْوَسَةِ فِي الإِيمَانِ وَمَا يَقُولُهُ مَنْ وَجَدَهَا

## 60-cı fəsil. İmanda vəsvəsənin və bu vəsvəsələri özündə hiss edən kimsənin nə deyəcəyinin bəyan edilməsi

**[٣٤٠] ٢٠٩**–(١٣٢) حَدَّثَنِي زُهَيْرُ بْنُ حَرْبٍ: حَدَّثَنَا جَرِيرٌ عَنْ سُهَيْلٍ، عَنْ أَبِيهِ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ: جَاءَ نَاسٌ مِنْ أَصْحَابِ النَّبِيِّ ﷺ فَسَأَلُوهُ: إِنَّا نَجِدُ فِي أَنْفُسِنَا مَا يَتَعَاظَمُ أَحَدُنَا أَنْ يَتَكَلَّمَ بِهِ، قَالَ: ((أَوَقَدْ وَجَدْتُمُوهُ؟)) قَالُوا: نَعَمْ. قَالَ: ((ذَاكَ صَرِيحُ الإِيمَانِ)).

**[340]-209-(132)** ........ Əbu Hureyrə ﷺ demişdir: "(Bir dəfə) bir dəstə adam Peyğəmbərin ﷺ yanına gəlib ondan soruşdu: "Qəlbimizdən elə (pis) fikirlər keçir ki, (hər) birimiz onu dilinə gətirməyi böyük günah hesab edir"[2]. Peyğəmbər ﷺ soruşdu: "Doğrudanmı siz bunu günah sayırsınız?" Onlar: "Bəli!"– deyə cavab verdikdə Peyğəmbər ﷺ buyurdu: "Bu, imanın saflığıdır"[3].

**[٣٤١] ٢١٠**–(...) و حَدَّثَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ: حَدَّثَنَا ابْنُ أَبِي عَدِيٍّ، عَنْ شُعْبَةَ؛ ح: و حَدَّثَنِي مُحَمَّدُ بْنُ عَمْرِو بْنِ جَبَلَةَ بْنِ أَبِي رَوَّادٍ وَأَبُو بَكْرِ بْنُ إِسْحَقَ قَالاَ: حَدَّثَنَا أَبُو الْجَوَّابِ عَنْ عَمَّارِ بْنِ رُزَيْقٍ، كِلاَهُمَا عَنْ الأَعْمَشِ، عَنْ أَبِي صَالِحٍ، عَنْ أَبِي هُرَيْرَةَ عَنْ النَّبِيِّ ﷺ بِهَذَا الْحَدِيثِ.

---

[1] Söhbət günah işlər görməyə can atan və yaxşılıq etməkdən boyun qaçıran kimsələrdən gedir.

[2] Növbəti hədislərdə şeytanın insanların qəlbinə nə cür vəsvəsə etdiyi bəyan edilir.

[3] Mömünin qəlbindən keçən vəsvəsəni dilinə gətirməyi böyük günah hesab etməsi, onun safqəlbli mömin olmağına dəlalət edir.

**[341]-210-(...)** ........ Şobə və Əmmar ibn Ruzeyq – hər ikisi Aməşdən, o da Əbu Salehdən, o da Əbu Hureyrədən, o da Peyğəmbərdən ﷺ bu hədisi rəvayət etmişdir.

**[٣٤٢] ٢١١-(١٣٣)** حَدَّثَنَا يُوسُفُ بْنُ يَعْقُوبَ الصَّفَّارُ: حَدَّثَنِي عَلِيُّ بْنُ عَثَّامٍ عَنْ سُعَيْرِ بْنِ الْخِمْسِ، عَنْ مُغِيرَةَ، عَنْ إِبْرَاهِيمَ، عَنْ عَلْقَمَةَ، عَنْ عَبْدِ اللَّهِ قَالَ: سُئِلَ النَّبِيُّ ﷺ عَنْ الْوَسْوَسَةِ، قَالَ: ((تِلْكَ مَحْضُ الإِيمَانِ)).

**[342]-211-(133)** ........ Abdullah (ibn Məsud) ﷺ demişdir: "Peyğəmbərdən ﷺ vəsvəsə barədə soruşdular. Peyğəmbər ﷺ: "Bu, imanın saflığıdır"– buyurdu".

**[٣٤٣] ٢١٢-(١٣٤)** حَدَّثَنَا هَارُونُ بْنُ مَعْرُوفٍ وَمُحَمَّدُ بْنُ عَبَّادٍ – وَاللَّفْظُ لِهَارُونَ – قَالاَ: حَدَّثَنَا سُفْيَانُ عَنْ هِشَامٍ، عَنْ أَبِيهِ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((لاَ يَزَالُ النَّاسُ يَتَسَاءَلُونَ حَتَّى يُقَالَ: هَذَا، خَلَقَ اللَّهُ الْخَلْقَ، فَمَنْ خَلَقَ اللَّهَ؟ فَمَنْ وَجَدَ مِنْ ذَلِكَ شَيْئًا فَلْيَقُلْ: آمَنْتُ بِاللَّهِ)).

**[343]-212-(134)** ........ Əbu Hureyrə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "İnsanlar bir-birilərinə o qədər sual verəcəklər ki, axırda deyəcəklər: "Baxın, Allah məxluqatı yaratmışdır. Bəs Allahı kim yaratmışdır? Kim (qəlbində) belə (vəsvəsələrdən) bir şey hiss etsə,[1] qoy desin: "Mən Allaha iman gətirmişəm!"

**[٣٤٤] ٢١٣-(...)** و حَدَّثَنَا مَحْمُودُ بْنُ غَيْلاَنَ: حَدَّثَنَا أَبُو النَّضْرِ: حَدَّثَنَا أَبُو سَعِيدٍ الْمُؤَدِّبُ، عَنْ هِشَامِ بْنِ عُرْوَةَ بِهَذَا الإِسْنَادِ، أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: ((يَأْتِي الشَّيْطَانُ أَحَدَكُمْ فَيَقُولُ: مَنْ خَلَقَ السَّمَاءَ؟ مَنْ خَلَقَ الأَرْضَ؟ فَيَقُولُ: اللَّهُ)) ثُمَّ ذَكَرَ بِمِثْلِهِ، وَزَادَ: ((وَرُسُلِهِ)).

**[344]-213-(...)** ........ Əbu Səid əl-Müvəddib hədisi bu isnadla Hişam ibn Urvadan rəvayət etmişdir ki, Peyğəmbər ﷺ demişdir: "Şeytan birinizin yanına gəlib: "Göyü kim yaradıb? Yeri kim yaradıb?"– deyə soruşar, o da ona: "Allah"– deyə cavab verər..."

---

[1] Qeyd etmək lazımdır ki, qəlbdən keçən pis-pis fikirlər iki qisimdir:

Birincisi: ötəri fikirlərdir ki, bunu hiss etdikdə: "Aməntu billah! (Mən Allaha iman gətirmişəm!)", yaxud: "Aməntu billahi və rusulih! (Mən Allaha və Onun elçilərinə iman gətirmişəm!)", yaxud: "Əuzu billahi minəş-şeytanir-rəcim! (*Allahın rəhmətindən* qovulmuş şeytandan Allaha sığınıram)" demək kifayət edir.

İkincisi isə artıq şübhəyə çevrilmiş fikirlərdir ki, bunu dəf etmək üçün dəlil-sübuta əsaslanaraq həmin fikri təkzib etmək və şübhəni aradan qaldırmaq gərəkdir.

Ravi bu hədisi (əvvəlki hədis kimi) rəvayət etmiş və bunu əlavə etmişdir: "və Onun elçilərinə"[1].

**[٣٤٥] ٢١٤**–(...) حَدَّثَنِي زُهَيْرُ بْنُ حَرْبٍ وَعَبْدُ بْنُ حُمَيْدٍ، جَمِيعًا عَنْ يَعْقُوبَ – قَالَ زُهَيْرٌ: حَدَّثَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ –: حَدَّثَنَا ابْنُ أَخِي ابْنِ شِهَابٍ عَنْ عَمِّهِ قَالَ: أَخْبَرَنِي عُرْوَةُ بْنُ الزُّبَيْرِ، أَنَّ أَبَا هُرَيْرَةَ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((يَأْتِي الشَّيْطَانُ أَحَدَكُمْ فَيَقُولَ: مَنْ خَلَقَ كَذَا وَكَذَا؟ حَتَّى يَقُولَ لَهُ: مَنْ خَلَقَ رَبَّكَ؟ فَإِذَا بَلَغَ ذَلِكَ، فَلْيَسْتَعِذْ بِاللَّهِ وَلْيَنْتَهِ)).

**[345]-214-(...)** ........ Əbu Hureyrə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Şeytan birinizin yanına gəlib: "Filan və filan şeyi kim yaradıb?"– deyə suallar verir. Axırda ondan: "Rəbbini kim yaradıb?"– deyə soruşur. Elə ki, iş bu yerə gəlib çatdı, qoy həmin adam Allaha sığınsın[2] və (bu haqda düşünməyə) son qoysun".

**[٣٤٦]** (...) حَدَّثَنِي عَبْدُ الْمَلِكِ بْنُ شُعَيْبِ بْنِ اللَّيْثِ قَالَ: حَدَّثَنِي أَبِي عَنْ جَدِّي قَالَ: حَدَّثَنِي عُقَيْلُ بْنُ خَالِد، قَالَ: قَالَ ابْنُ شِهَابٍ: أَخْبَرَنِي عُرْوَةُ بْنُ الزُّبَيْرِ أَنَّ أَبَا هُرَيْرَةَ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((يَأْتِي الْعَبْدَ الشَّيْطَانُ فَيَقُولُ: مَنْ خَلَقَ كَذَا وَكَذَا؟ حَتَّى يَقُولَ لَهُ: مَنْ خَلَقَ رَبَّكَ؟ فَإِذَا بَلَغَ ذَلِكَ، فَلْيَسْتَعِذْ بِاللَّهِ وَلْيَنْتَهِ)) مِثْلَ حَدِيثِ ابْنِ أَخِي ابْنِ شِهَابٍ.

**[346] (...)** ........ Əbu Hureyrə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Şeytan insanın yanına gəlib: "Filan və filan şeyi yaradan kimdir?"– deyə suallar verir. Nəhayət, (ondan): "Rəbbini kim yaradıb?"– deyə soruşur. Elə ki iş bu yerə gəlib çatdı, qoy həmin adam Allaha sığınsın və (buna) son qoysun".

(Bu hədis də) ibn Şihabın qardaşının rəvayət etdiyi hədis kimidir.

**[٣٤٧] ٢١٥**–(١٣٥) حَدَّثَنِي عَبْدُ الْوَارِثِ بْنُ عَبْدِ الصَّمَدِ قَالَ: حَدَّثَنِي أَبِي عَنْ جَدِّي، عَنْ أَيُّوبَ، عَنْ مُحَمَّدِ بْنِ سِيرِينَ، عَنْ أَبِي هُرَيْرَةَ عَنِ النَّبِيِّ ﷺ قَالَ: ((لاَ يَزَالُ النَّاسُ يَسْأَلُونَكُمْ عَنِ الْعِلْمِ، حَتَّى يَقُولُوا: هَذَا، اللَّهُ خَلَقَنَا، فَمَنْ خَلَقَ اللَّهَ؟)).

قَالَ: وَهُوَ آخِذٌ بِيَدِ رَجُلٍ فَقَالَ: صَدَقَ اللَّهُ وَرَسُولُهُ، قَدْ سَأَلَنِي اثْنَانِ وَهَذَا الثَّالِثُ – أَوْ قَالَ –: سَأَلَنِي وَاحِدٌ وَهَذَا الثَّانِي.

[1] Yəni "Qoy desin: "Mən Allaha və Onun elçilərinə iman gətirmişəm!"
[2] Yəni "Əuzu billahi minəş-şeytanir-rəcim" desin.

**[347]-215-(135)** ........ Əbu Hureyrə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "İnsanlar sizə elm haqqında o qədər sual verəcəklər ki, axırda deyəcəklər: "Baxın, Allah bizi yaradıb. Bəs Allahı kim yaradıb?"

Əbu Hureyrə birinin əlindən tutduğu halda dedi: "Allah və Onun elçisi doğru söyləmişdir. Artıq iki nəfər məndən (bu haqda) soruşub, bu da üçüncüsü. (Yaxud bir nəfər soruşub, bu da ikincisi).

**[٣٤٨]** و حَدَّثَنِيهِ زُهَيْرُ بْنُ حَرْبٍ وَيَعْقُوبُ الدَّوْرَقِيُّ قَالاَ: حَدَّثَنَا إِسْمَعِيلُ وَهُوَ ابْنُ عُلَيَّةَ، عَنْ أَيُّوبَ، عَنْ مُحَمَّدٍ قَالَ: قَالَ أَبُو هُرَيْرَةَ: ((لاَ يَزَالُ النَّاسُ)) بِمِثْلِ حَدِيثِ عَبْدِ الْوَارِثِ، غَيْرَ أَنَّهُ لَمْ يَذْكُرْ النَّبِيَّ ﷺ فِي الإِسْنَادِ، وَلَكِنْ قَدْ قَالَ فِي آخِرِ الْحَدِيثِ: صَدَقَ اللَّهُ وَرَسُولُهُ.

**[348]** ........ (Bu isnaddakı ravilər) Əbu Hureyrədən: "İnsanlar soruşacaqlar..."– deyərək Abdul-Varisin hədisinin bənzərini rəvayət etmiş, amma bu isnadda Peyğəmbəri ﷺ zikr etməmişlər. Fəqət hədisin axırında demişlər: "Allah və Onun elçisi doğru söyləmişdir".

**[٣٤٩]** (...) و حَدَّثَنِي عَبْدُ اللَّهِ بْنُ الرُّومِيِّ: حَدَّثَنَا النَّضْرُ بْنُ مُحَمَّدٍ: حَدَّثَنَا عِكْرِمَةُ وَهُوَ ابْنُ عَمَّارٍ: حَدَّثَنَا يَحْيَى: حَدَّثَنَا أَبُو سَلَمَةَ عَنْ أَبِي هُرَيْرَةَ قَالَ: قَالَ لِي رَسُولُ اللَّهِ ﷺ: ((لاَ يَزَالُونَ يَسْأَلُونَكَ يَا أَبَا هُرَيْرَةَ! حَتَّى يَقُولُوا: هَذَا اللَّهُ، فَمَنْ خَلَقَ اللَّهَ؟)) قَالَ فَبَيْنَا أَنَا فِي الْمَسْجِدِ إِذْ جَاءَنِي نَاسٌ مِنْ الأَعْرَابِ فَقَالُوا: يَا أَبَا هُرَيْرَةَ! هَذَا اللَّهُ، فَمَنْ خَلَقَ اللَّهَ؟ قَالَ: فَأَخَذَ حَصًى بِكَفِّهِ فَرَمَاهُمْ ثُمَّ. قَالَ: قُومُوا قُومُوا، صَدَقَ خَلِيلِي ﷺ.

**[349] (...)** ........ Əbu Hureyrə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ mənə belə demişdir: "Ey Əbu Hureyrə! (Vaxt gələcək) insanlar sənə (o qədər) sual verəcəklər ki, nəhayət, deyəcəklər: "Bu, (hər şeyi yaradan) Allahdır. Bəs Allahı kim yaradıb?"

(Əbu Hureyrə rəvayətinə davam edib) dedi: "Bir dəfə mən məsciddə ikən bədəvilərdən bir dəstə adam mənim yanıma gəlib dedi: "Ey Əbu Hureyrə! Bu, (hər şeyi yaradan) Allahdır. Bəs Allahı kim yaradıb?"

Əbu Hureyrə (yerdən) xırda daşlar götürüb onları daşladı, sonra dedi: "Qalxın, qalxın! Sevimli dostum ﷺ doğru söyləmişdir".

**[٣٥٠] ٢١٦**–(...) حَدَّثَنِي مُحَمَّدُ بْنُ حَاتِمٍ: حَدَّثَنَا كَثِيرُ بْنُ هِشَامٍ: حَدَّثَنَا جَعْفَرُ بْنُ بُرْقَانَ: حَدَّثَنَا يَزِيدُ بْنُ الأَصَمِّ قَالَ: سَمِعْتُ أَبَا هُرَيْرَةَ يَقُولُ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((لَيَسْأَلَنَّكُمْ النَّاسُ عَنْ كُلِّ شَيْءٍ، حَتَّى يَقُولُوا: اللَّهُ خَلَقَ كُلَّ شَيْءٍ، فَمَنْ خَلَقَهُ؟)).

**[350]-216-(...)** ........ Əbu Hureyrə ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "İnsanlar sizdən hər bir şey haqqında soruşacaqlar. Axırda da belə deyəcəklər: "Allah hər şeyi yaratmışdır. Bəs Allahı kim yaradıb?"

**[٣٥١] ٢١٧-(١٣٦)** حَدَّثَنَا عَبْدُ اللَّهِ بْنُ عَامِرِ بْنِ زُرَارَةَ الْحَضْرَمِيُّ: حَدَّثَنَا مُحَمَّدُ بْنُ فُضَيْلٍ عَنْ مُخْتَارِ بْنِ فُلْفُلٍ، عَنْ أَنَسِ بْنِ مَالِكٍ عَنْ رَسُولِ اللَّهِ ﷺ قَالَ: ((قَالَ اللَّهُ عَزَّ وَجَلَّ: إِنَّ أُمَّتَكَ لاَ يَزَالُونَ يَقُولُونَ: مَا كَذَا؟ مَا كَذَا؟ حَتَّى يَقُولُوا: هَذَا، اللَّهُ خَلَقَ الْخَلْقَ، فَمَنْ خَلَقَ اللَّهَ تَعَالَى؟)).

**[351]-217-(136)** ........ Ənəs ibn Malik ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "İzzətli və Qüdrətli Allah (mənə belə) buyurdu: "Sənin ümmətin: "Bu nədir? O nədir?" deyə o qədər suallar verəcəklər ki, axırda deyəcəklər: "Baxın, məxluqatı Allah yaratmışdır. Bəs Uca Allahı kim yaradıb?"

**[٣٥٢]** حَدَّثَنَاه إِسْحَقُ بْنُ إِبْرَاهِيمَ: أَخْبَرَنَا جَرِيرٌ؛ ح: و حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا حُسَيْنُ بْنُ عَلِيٍّ، عَنْ زَائِدَةَ، كِلاَهُمَا عَنْ الْمُخْتَارِ، عَنْ أَنَسٍ عَنْ النَّبِيِّ ﷺ بِهَذَا الْحَدِيثِ، غَيْرَ أَنَّ إِسْحَقَ لَمْ يَذْكُرْ ((قَالَ اللَّهُ عَزَّ وَ جَلَّ إِنَّ أُمَّتَكَ:)).

**[352]** ........ Cərir və Zaidə – hər ikisi bu hədisi Muxtardan, o da Ənəsdən, o da Peyğəmbərdən ﷺ rəvayət etmişdir. Fəqət (ravilərdən biri) – İshaq, Peyğəmbərin ﷺ: "İzzətli və Qüdrətli Allah buyurdu: "Sənin ümmətin..." sözünü zikr etməmişdir.

## (٦١) – بَابُ وَعِيدِ مَنْ اقْتَطَعَ حَقَّ مُسْلِمٍ بِيَمِينٍ فَاجِرَةٍ بِالنَّارِ

## 61-ci fəsil. Yalandan and içərək bir müsəlmanın haqqına girən kimsənin Cəhənnəm odu ilə təhdid edilməsi

**[٣٥٣] ٢١٨-(١٣٧)** حَدَّثَنَا يَحْيَى بْنُ أَيُّوبَ وَقُتَيْبَةُ بْنُ سَعِيدٍ وَعَلِيُّ بْنُ حُجْرٍ، جَمِيعًا عَنْ إِسْمَعِيلَ بْنِ جَعْفَرٍ – قَالَ ابْنُ أَيُّوبَ: حَدَّثَنَا إِسْمَعِيلُ بْنُ جَعْفَرٍ – قَالَ: أَخْبَرَنَا الْعَلاَءُ، وَهُوَ ابْنُ عَبْدِ الرَّحْمَنِ مَوْلَى الْحُرَقَةِ، عَنْ مَعْبَدِ بْنِ كَعْبٍ السَّلَمِيِّ، عَنْ أَخِيهِ عَبْدِ اللَّهِ بْنِ كَعْبٍ عَنْ أَبِي أُمَامَةَ، أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: ((مَنْ اقْتَطَعَ حَقَّ امْرِئٍ مُسْلِمٍ بِيَمِينِهِ، فَقَدْ أَوْجَبَ اللَّهُ لَهُ النَّارَ، وَحَرَّمَ عَلَيْهِ الْجَنَّةَ)) فَقَالَ لَهُ رَجُلٌ: وَإِنْ كَانَ شَيْئًا يَسِيرًا يَا رَسُولَ اللَّهِ؟ قَالَ: ((وَإِنْ قَضِيبًا مِنْ أَرَاكٍ)).

**[353]-218-(137)** ........ Əbu Ümamə[1] ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Hər kim yalandan and içərək bir müsəlmanın haqqına girsə,[2] Allah Cəhənnəm odunu ona vacib buyurar və Cənnəti ona haram edər". (Bu vaxt) bir nəfər ondan soruşdu: "Bu haqq az bir şey olsa da belə, ya Rəsulullah?" Peyğəmbər ﷺ buyurdu: "Ərak ağacından[3] bir çubuq olsa da belə".

**[٣٥٤] ٢١٩**–(...) و حَدَّثَنَاه أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ وَإِسْحَقُ بْنُ إِبْرَاهِيمَ وَهَارُونُ بْنُ عَبْدِ اللَّهِ، جَمِيعًا عَنْ أَبِي أُسَامَةَ، عَنْ الْوَلِيدِ بْنِ كَثِيرٍ، عَنْ مُحَمَّدِ بْنِ كَعْبٍ أَنَّهُ سَمِعَ أَخَاهُ عَبْدَ اللَّهِ بْنَ كَعْبٍ يُحَدِّثُ أَنَّ أَبَا أُمَامَةَ الْحَارِثِيَّ حَدَّثَهُ أَنَّهُ سَمِعَ رَسُولَ اللَّهِ ﷺ، بِمِثْلِهِ.

**[354]-219-(...)** ........ Əbu Bəkr ibn Əbu Şeybə, İshaq ibn İbrahim və Harun ibn Abdullah – hamısı bu hədisi bizə Əbu Usamədən, o da Vəlid ibn Kəsirdən, o da Muhəmməd ibn Kəbdən rəvayət etmişdir ki, (Muhəmmədin) qardaşı Abdullah ibn Kəb bu hədisi Əbu Ümamədən, o da Peyğəmbərdən ﷺ eşitmişdir.

**[٣٥٥] ٢٢٠**–(١٣٨) و حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا وَكِيعٌ؛ ح: و حَدَّثَنَا ابْنُ نُمَيْرٍ: حَدَّثَنَا أَبُو مُعَاوِيَةَ وَوَكِيعٌ؛ ح: و حَدَّثَنَا إِسْحَقُ بْنُ إِبْرَاهِيمَ الْحَنْظَلِيُّ – وَاللَّفْظُ لَهُ – أَخْبَرَنَا وَكِيعٌ: حَدَّثَنَا الأَعْمَشُ عَنْ أَبِي وَائِلٍ، عَنْ عَبْدِ اللَّهِ عَنْ رَسُولِ اللَّهِ ﷺ قَالَ: ((مَنْ حَلَفَ عَلَى يَمِينِ صَبْرٍ يَقْتَطِعُ بِهَا مَالَ امْرِئٍ مُسْلِمٍ هُوَ فِيهَا فَاجِرٌ، لَقِيَ اللَّهَ وَهُوَ عَلَيْهِ غَضْبَانُ)).

قَالَ: فَدَخَلَ الأَشْعَثُ بْنُ قَيْسٍ فَقَالَ: مَا يُحَدِّثُكُمْ أَبُو عَبْدِ الرَّحْمَنِ؟ قَالُوا: كَذَا وَكَذَا، قَالَ: صَدَقَ أَبُو عَبْدِ الرَّحْمَنِ، فِيَّ نَزَلَتْ، كَانَ بَيْنِي وَبَيْنَ رَجُلٍ أَرْضٌ بِالْيَمَنِ، فَخَاصَمْتُهُ إِلَى النَّبِيِّ ﷺ فَقَالَ: ((هَلْ لَكَ بَيِّنَةٌ؟)) فَقُلْتُ: لاَ، قَالَ: ((فَيَمِينُهُ)) قُلْتُ: إِذَنْ يَحْلِفُ، فَقَالَ رَسُولُ اللَّهِ ﷺ عِنْدَ ذَلِكَ: ((مَنْ حَلَفَ عَلَى يَمِينِ صَبْرٍ، يَقْتَطِعُ بِهَا مَالَ امْرِئٍ مُسْلِمٍ هُوَ فِيهَا فَاجِرٌ، لَقِيَ اللَّهَ وَهُوَ عَلَيْهِ غَضْبَانُ)) فَنَزَلَتْ:

﴿ إِنَّ ٱلَّذِينَ يَشْتَرُونَ بِعَهْدِ ٱللَّهِ وَأَيْمَٰنِهِمْ ثَمَنًا قَلِيلًا ﴾ إِلَى آخِرِ الآيَةِ.

**[355]-220-(138)** ........ Abdullah (ibn Məsud) ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Hər kim nəfsinə uyub bilə-bilə yalandan and içərək bir müsəlmanın malını mənimsəyərsə, Allahın qəzəbinə gəlmiş halda Onun hüzuruna yetişər".

---

[1] Əbu Ümamə əl-Bahili ﷺ Peyğəmbərin ﷺ səhabəsidir. Adı: Sudey ibn Əclandır. Hicrətin 86-cı ilində 91 yaşında vəfat etmişdir.

[2] Qazı İyad ﷺ demişdir: "Hədisdə Peyğəmbərin ﷺ müsəlmanı xüsusilə qeyd etməsi, onlara xitab olunduğuna, habelə onların şəriət qayda-qanunlarına riayət etmələrinə görədir. Yoxsa, bu o demək deyil ki, bu hökm qeyri-müsəlmanlara aid deyil. Əksinə, bu xüsusda müsəlmanlara aid olan hökm onlara da aiddir".

[3] Dişləri təmizləmək üçün istifadə olunan təbii fırça – misvak, ərak ağacından hazırlanır.

(Bu dəmdə) Əşəs ibn Qeys içəri girdi və: "Əbu Abdur-Rəhman sizə nə danışır?"– deyə soruşdu. Onlar: "Belə, belə (söylədi)"– dedilər. Əşəs dedi: "Əbu Abdur-Rəhman doğru söylədi. Mənim başıma gəlmiş hadisədə ayə nazil olmuşdur. (Bir vaxt) mənimlə bir adamın[1] arasında Yəməndəki bir ərazi üstündə mübahisə düşmüşdü. Mən bunun hökmünü Peyğəmbərdən ﷺ soruşduqda, o buyurdu: "Sənin dəlilin varmı?" Mən: "Xeyr!"– deyə cavab verdim. Peyğəmbər ﷺ buyurdu: "Elə isə o, and içməlidir".[2] Mən dedim: "Belə olduğu təqdirdə, o and içəcək". Peyğəmbər ﷺ buyurdu: "Hər kim nəfsinə uyub bilərəkdən yalandan and içərək bir müsəlmanın malını mənimsəyərsə, Allahın qəzəbinə gəlmiş halda Onun hüzuruna yetişər". (Elə həmin vaxt) bu ayə nazil oldu: **"Həqiqətən də, Allah ilə olan əhdlərini və andlarını ucuz qiymətə satan kəslər üçün axirətdə heç bir pay yoxdur. Allah onları danışdırmayacaq, Qiyamət günü onların üzünə baxmayacaq və onları təmizə çıxarmayacaqdır. Onlar üçün ağrılı-acılı bir əzab vardır".**[3]

**[٣٥٦] ٢٢١**–(...) حَدَّثَنَا إِسْحَقُ بْنُ إِبْرَاهِيمَ: أَخْبَرَنَا جَرِيرٌ عَنْ مَنْصُورٍ، عَنْ أَبِي وَائِلٍ، عَنْ عَبْدِ اللَّهِ قَالَ: مَنْ حَلَفَ عَلَى يَمِينٍ يَسْتَحِقُّ بِهَا مَالاً هُوَ فِيهَا فَاجِرٌ لَقِيَ اللَّهَ وَهُوَ عَلَيْهِ غَضْبَانُ، ثُمَّ ذَكَرَ نَحْوَ حَدِيثِ الأَعْمَشِ، غَيْرَ أَنَّهُ قَالَ: كَانَتْ بَيْنِي وَبَيْنَ رَجُلٍ خُصُومَةٌ فِي بِئْرٍ، فَاخْتَصَمْنَا إِلَى رَسُولِ اللَّهِ ﷺ فَقَالَ: ((شَاهِدَاكَ أَوْ يَمِينُهُ)).

[1] İmam Buxarinin rəvayətində (2417): "(Bir vaxt) mənimlə bir yəhudinin arasında..."– deyilir. Bu da dəlildir ki, and içən adam kafir olsa belə, onun andı qəbul edilir. Bu isə Allaha and içməyin nə qədər möhtəşəm olduğuna dəlalət edir. Aşağıdakı ayə və hədislərə diqqət yetirin:

Uca Allah buyurur: **"Şeytan, onların bir-birindən gizli qalan ayıb yerlərini özlərinə göstərmək üçün onlara pıçıldayıb dedi: "Rəbbiniz sizə bu ağacı yalnız ona görə qadağan etmişdir ki, siz mələk və ya *Cənnətdə* əbədi qalanlardan olmayasınız". *Üstəlik* onlara: "Şübhəsiz ki, mən sizin nəsihətçilərinizdənəm"– deyə and içdi. Beləliklə, *şeytan* onları tovlayıb Cənnətdən aşağı endirdi"** ("əl-Əraf" surəsi, 20-22).

Kəb ibn Malik ﷺ demişdir: "Təbuk döyüşündən yayınan səksəndən artıq kişi gəlib Peyğəmbərə ﷺ müxtəlif bəhanələr gətirməklə və and içməklə üzrxahlıq etməyə başladılar. Allahın elçisi onların aşkarda dediklərini qəbul etdi, onlardan bir daha vəd aldı, onlar üçün bağışlanma dilədi, qəlblərində gizlətdiklərini isə Allaha həvalə etdi..." ("Səhih əl-Buxari", 4418). Diqqət edin! And içən adamların münafiq olmalarına rəğmən Peyğəmbər ﷺ onların andını qəbul etmişdir.

Peyğəmbər ﷺ demişdir: "(Bir dəfə) Məryəm oğlu İsa bir nəfərin oğurluq etdiyini görüb ona dedi: "Sən oğurluq edirsən?!" Adam: "Xeyr! Özündən başqa (haqq) məbud olmayan Allaha and olsun ki, (mən oğurluq etmirəm)"– deyə cavab verdi. Onda İsa dedi: "Allaha iman gətirirəm və gözlərimi yalançı sayıram". ("Səhih əl-Buxari", 3444).

[2] Başqa bir hədisdə Peyğəmbər ﷺ demişdir: "Əgər insanlara iddia etdikləri şeylər verilsəydi, (bir qisim) insanlar digərlərinin qanını və malını iddia edərdi. Lakin ittiham olunan and içməlidir" ("Səhih Muslim", 4567). Nəvəvi demişdir: "Bu hədis Beyhəqinin "Sunən" əsərində İbn Abbasdan mötəbər isnadla belə rəvayət edilmişdir: "...Lakin iddia edən dəlil-sübut gətirməli, inkar edən isə and içməlidir" ("Mişkat əl-Məsabih", 3758).

[3] "Ali-İmran" surəsi, 77.

**[356]-221-(...)** ........ Abdullah (ibn Məsud) ﷺ demişdir: "Kim yalandan and içərək bir müsəlmanın malına sahib çıxarsa, Allahın qəzəbinə gəlmiş halda Allaha qovuşar..." (Ravi bu hədisi) Aməşin hədisinə bənzər rəvayət etmişdir. Lakin bu rəvayətdə deyilir: "Mənimlə bir adamın arasında bir quyu üstündə mübahisə düşdü. Biz (mübahisəmizin) hökmünü Rəsulullahdan ﷺ soruşduqda, o buyurdu: "Sən iki şahid gətirməlisən, ya da o, and içməlidir".

**[٣٥٧] ٢٢٢**-(...) و حَدَّثَنَا ابْنُ أَبِي عُمَرَ الْمَكِّيُّ: حَدَّثَنَا سُفْيَانُ عَنْ جَامِعِ بْنِ أَبِي رَاشِد، وَعَبْدِ الْمَلِك بْنِ أَعْيَنَ سَمِعَا شَقِيقَ بْنَ سَلَمَةَ يَقُولُ: سَمِعْتُ ابْنَ مَسْعُود يَقُولُ: سَمِعْتُ رَسُولَ اللَّه ﷺ يَقُولُ: ((مَنْ حَلَفَ عَلَى مَالِ امْرِئٍ مُسْلِمٍ بِغَيْرِ حَقِّه، لَقِيَ اللَّهَ وَهُوَ عَلَيْهِ غَضْبَانُ)) قَالَ عَبْدُ اللَّه: ثُمَّ قَرَأَ عَلَيْنَا رَسُولُ اللَّه ﷺ مِصْدَاقَهُ مِنْ كِتَابِ اللَّهِ: ﴿إِنَّ ٱلَّذِينَ يَشْتَرُونَ بِعَهْدِ ٱللَّهِ وَأَيْمَـٰنِهِمْ ثَمَنًا قَلِيلًا﴾ إِلَى آخِرِ الآيَة.

**[357]-222-(...)** ........ Abdullah ibn Məsud ﷺ demişdir: "Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: "Kim haqsız olaraq müsəlman bir kimsənin malına yiyələnmək üçün yalandan and içsə, Allahın qəzəbinə gəlmiş halda Allaha qovuşar".

Abdullah (davam edib) dedi: "Sonra Peyğəmbər ﷺ Allahın Kitabında bunun təsdiqi olan ayəni bizə oxudu: **"Həqiqətən də, Allah ilə olan əhdlərini və andlarını ucuz qiymətə satan kəslər üçün axirətdə heç bir pay yoxdur. Allah onları danışdırmayacaq, Qiyamət günü onların üzünə baxmayacaq və onları təmizə çıxarmayacaqdır. Onlar üçün ağrılı-acılı bir əzab vardır".**[1]

**[٣٥٨] ٢٢٣**-(١٣٩) حَدَّثَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ وَأَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ وَهَنَّادُ بْنُ السَّرِيِّ وَأَبُو عَاصِمٍ الْحَنَفِيُّ - وَاللَّفْظُ لِقُتَيْبَةَ - قَالُوا: حَدَّثَنَا أَبُو الأَحْوَصِ عَنْ سِمَاك، عَنْ عَلْقَمَةَ بْنِ وَائِل، عَنْ أَبِيه قَالَ: جَاءَ رَجُلٌ مِنْ حَضْرَمَوْتَ وَرَجُلٌ مِنْ كِنْدَةَ إِلَى النَّبِيِّ ﷺ، فَقَالَ الْحَضْرَمِيُّ: يَا رَسُولَ اللَّه! إِنَّ هَذَا قَدْ غَلَبَنِي عَلَى أَرْضٍ لِي كَانَتْ لأَبِي، فَقَالَ الْكِنْدِيُّ هِيَ أَرْضِي فِي يَدِي أَزْرَعُهَا لَيْسَ لَهُ فِيهَا حَقٌّ. فَقَالَ رَسُولُ اللَّه ﷺ لِلْحَضْرَمِيِّ: ((أَلَكَ بَيِّنَةٌ؟)) قَالَ: لاَ، قَالَ: ((فَلَكَ يَمِينُهُ)) قَالَ: يَا رَسُولَ اللَّه! إِنَّ الرَّجُلَ فَاجِرٌ لاَ يُبَالِي عَلَى مَا حَلَفَ عَلَيْهِ وَلَيْسَ يَتَوَرَّعُ مِنْ شَيْءٍ. فَقَالَ: ((لَيْسَ لَكَ مِنْهُ إِلاَّ ذَلِكَ)) فَانْطَلَقَ لِيَحْلِفَ، فَقَالَ رَسُولُ اللَّه ﷺ لَمَّا أَدْبَرَ: ((أَمَا لَئِنْ حَلَفَ عَلَى مَاله لِيَأْكُلَهُ ظُلْمًا، لَيَلْقَيَنَّ اللَّهَ وَهُوَ عَنْهُ مُعْرِضٌ)).

**[358]-223-(139)** ........ Vail ﷺ rəvayət etmişdir ki: "(Bir dəfə) bir nəfər Hədrəmövtdən,[2] bir nəfər də Kindədən[3] Peyğəmbərin ﷺ yanına gəldi. Hədrəmli: "Ya

---

[1] Əvvəlki ayə.

[2] Hədrəmövt – Yəmən əyalətlərindən və ya Yəməndəki qəbilələrdən birinin adıdır ("Lisan əl-Arab", 4/196).

[3] Kində – Yəməndəki qəbilələrdən birinin adıdır ("Tohfətu əl-Əhvəzi", 4/475).

Rəsulullah! Bu adam vaxtı ilə atama məxsus olan bir ərazini zəbt etmişdir"– dedi. Kindəli isə: "Bu mənim əlimdə olan, əkib-becərdiyim bir ərazidir. Bu adamın onda heç bir haqqı yoxdur"– dedi. Peyğəmbər ﷺ hədrəmlidən soruşdu: "Dəlil-sübutun varmı?" O: "Xeyr!"– deyə cavab verdi. Peyğəmbər ﷺ buyurdu: "Elə isə onun and içməsi sənə yetər". Hədrəmli dedi: "Ya Rəsulullah! Bu adam fasiqdir, nəyə and içdiyinə əhəmiyyət verməz, nəyinsə günah olduğundan çəkinməz". Peyğəmbər ﷺ buyurdu: "Sənə bu anddan başqa heç nə çatmayacaq". Bundan sonra həmin adam and içməyə getdi. Peyğəmbər ﷺ geri döndüyü zaman belə buyurdu: "Biləsiniz, əgər o, bunun malını haqsızcasına yemək üçün and içərsə, o, Allah ondan üz döndərdiyi halda Onun hüzuruna gələr".

**[٣٥٩] ٢٢٤**–(...) و حَدَّثَنِي زُهَيْرُ بْنُ حَرْبٍ وَإِسْحَقُ بْنُ إِبْرَاهِيمَ جَمِيعًا عَنْ أَبِي الْوَلِيدِ – قَالَ زُهَيْرٌ حَدَّثَنَا هِشَامُ بْنُ عَبْدِ الْمَلِكِ – حَدَّثَنَا أَبُو عَوَانَةَ – عَنْ عَبْدِ الْمَلِكِ بْنِ عُمَيْرٍ، عَنْ عَلْقَمَةَ بْنِ وَائِلٍ، عَنْ وَائِلِ بْنِ حُجْرٍ قَالَ: كُنْتُ عِنْدَ رَسُولِ اللَّهِ ﷺ، فَأَتَاهُ رَجُلَانِ يَخْتَصِمَانِ فِي أَرْضٍ، فَقَالَ أَحَدُهُمَا: إِنَّ هَذَا انْتَزَى عَلَى أَرْضِي – يَا رَسُولَ اللَّهِ! – فِي الْجَاهِلِيَّةِ. وَهُوَ امْرُؤُ الْقَيْسِ بْنُ عَابِسٍ الْكِنْدِيُّ، وَخَصْمُهُ رَبِيعَةُ بْنُ عِبْدَانَ. قَالَ: ((بَيِّنَتُكَ)) قَالَ: لَيْسَ لِي بَيِّنَةٌ. قَالَ: ((يَمِينُهُ)) قَالَ: إِذَنْ يَذْهَبُ بِهَا. قَالَ: ((لَيْسَ لَكَ إِلاَّ ذَاكَ)) – قَالَ: فَلَمَّا قَامَ لِيَحْلِفَ، قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((مَنْ اقْتَطَعَ أَرْضًا ظَالِمًا، لَقِيَ اللَّهَ وَهُوَ عَلَيْهِ غَضْبَانُ)) قَالَ إِسْحَقُ فِي رِوَايَتِهِ: رَبِيعَةُ بْنُ عَيْدَانَ.

**[359]-224-(...)** ........ Vail ibn Hucr ﷺ belə rəvayət etmişdir: "Mən Peyğəmbərin ﷺ yanında idim. Bu vaxt torpaq üstə mübahisələri düşmüş iki nəfər onun yanına gəldi. Onlardan biri dedi: "Bu adam cahiliyyət dövründə mənim ərazimi zorla ələ keçirmişdir".

(Bunu deyən adam Qeys ibn Abis əl-Kindi, qarşı tərəf isə Rəbiə ibn İbdan idi).

Peyğəmbər ﷺ: "Dəlilini (göstər)!"– deyə buyurdu. (Qeys): "Mənim heç bir dəlilim yoxdur"– dedi. Peyğəmbər ﷺ buyurdu: "Onun and içməsi (kifayətdir)". (Qeys) dedi: "Belə olduğu təqdirdə, o mənim ərazimi mənimsəyəcək". Peyğəmbər ﷺ buyurdu: "Sənə bundan başqa heç nə çatmayacaq". Həmin adam and içmək üçün ayağa qalxdıqda Peyğəmbər ﷺ buyurdu: "Hər kim bir ərazini haqsızcasına ələ keçirərsə, Allahın qəzəbinə gəlmiş halda Allaha qovuşar".

İshaq öz rəvayətində: "...(qarşı tərəf isə) Rəbiə ibn İydan (idi)"– demişdir.

## (٦٢) – بَابُ الدَّلِيلِ عَلَى أَنَّ مَنْ قَصَدَ أَخْذَ مَالِ غَيْرِهِ بِغَيْرِ حَقٍّ كَانَ الْقَاصِدُ مُهْدَرَ الدَّمِ فِي حَقِّهِ وَإِنْ قُتِلَ كَانَ فِي النَّارِ وَأَنَّ مَنْ قُتِلَ دُونَ مَالِهِ فَهُوَ شَهِيدٌ

## 62-ci fəsil. Başqasının malını haqsızcasına mənimsəməyə can atan pisniyyətli adamın qanının halal olmasına, üstəlik əgər o, öldürülərsə Cəhənnəmlik olduğuna və öz malı uğrunda öldürülən kimsənin şəhid olduğuna dair dəlil

**[٣٦٠] ٢٢٥**–(١٤٠) حَدَّثَنِي أَبُو كُرَيْبٍ مُحَمَّدُ بْنُ الْعَلَاءِ: حَدَّثَنَا خَالِدٌ يَعْنِي ابْنَ مَخْلَدٍ: حَدَّثَنَا مُحَمَّدُ بْنُ جَعْفَرٍ عَنِ الْعَلَاءِ بْنِ عَبْدِ الرَّحْمَنِ، عَنْ أَبِيهِ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ: جَاءَ رَجُلٌ إِلَى رَسُولِ اللَّهِ ﷺ فَقَالَ: يَا رَسُولَ اللَّهِ! أَرَأَيْتَ إِنْ جَاءَ رَجُلٌ يُرِيدُ أَخْذَ مَالِي؟ قَالَ: ((فَلَا تُعْطِهِ مَالَكَ)) قَالَ: أَرَأَيْتَ إِنْ قَاتَلَنِي؟ قَالَ: ((قَاتِلْهُ)) قَالَ: أَرَأَيْتَ إِنْ قَتَلَنِي؟ قَالَ: ((فَأَنْتَ شَهِيدٌ)) قَالَ: أَرَأَيْتَ إِنْ قَتَلْتُهُ؟ قَالَ: ((هُوَ فِي النَّارِ)).

**[360]-225-(140)** ........ Əbu Hureyrə ﷺ rəvayət edir ki, (bir dəfə) bir nəfər Peyğəmbərin ﷺ yanına gəlib dedi: "Ya Rəsulullah! De görək, əgər bir adam gəlib mənim malımı əlimdən almaq istəsə, (mən nə edim)?" Peyğəmbər ﷺ: "Malını ona vermə"– deyə buyurdu. Adam soruşdu: "Yaxşı, bəs mənimlə vuruşsa, necə olsun?" Peyğəmbər ﷺ: "Sən də onunla vuruş!"– dedi. Adam soruşdu: "Bəs məni öldürsə, necə?" Peyğəmbər ﷺ: "Sən şəhid olarsan![1]"– dedi. Adam soruşdu: "Bəs mən onu öldürsəm necə?" Peyğəmbər ﷺ: "O, Cəhənnəmlikdir!"– dedi.

**[٣٦١] ٢٢٦**–(١٤١) حَدَّثَنِي الْحَسَنُ بْنُ عَلِيٍّ الْحُلْوَانِيُّ وَإِسْحَقُ بْنُ مَنْصُورٍ وَمُحَمَّدُ بْنُ رَافِعٍ، وَأَلْفَاظُهُمْ مُتَقَارِبَةٌ. قَالَ إِسْحَقُ: أَخْبَرَنَا، وَقَالَ الآخَرَانِ: حَدَّثَنَا عَبْدُ الرَّزَّاقِ: أَخْبَرَنَا ابْنُ جُرَيْجٍ قَالَ: أَخْبَرَنِي

---

[1] Şəhidlər üç qismə bölünürlər:

Birinci qisim: Allah yolunda vuruşub ölən kimsələrdir. Bunlar həm Axirət mükafatını qazanmaq baxımından, həm də dünyəvi əhkamlara görə şəhid sayılırlar. Yəni şəhid olduqlarına görə onları nə qüsl etmək, nə də onlara cənazə namazı qılmaq lazım gəlir.

İkinci qisim: Taun xəstəliyindən ölən, dənizdə batan, uçqun altında qalıb həlak olan, malını qorumaq üçün vuruşub ölən, habelə səhih hədislərdə şəhid adlandırılmış, yalnız Axirət mükafatını qazanmaq baxımından şəhid sayılan kimsələrdir. Dünyəvi əhkamlara görə isə digər müsəlmanlar kimi onları qüsl etmək və onlara cənazə namazı qılmaq vacibdir. Onu da qeyd etmək lazımdır ki, onların Axirət mükafatı birincilərin mükafatı kimi olmaya bilər.

Üçüncü qisim: qənimətlərdən izinsiz olaraq bir şey götürən, habelə səhih hədislərdə şəhid adlandırılması qadağan edilmiş kimsələrdir. Bunlar isə ancaq dünyəvi əhkamlara görə şəhid sayılırlar. Yəni zahirən şəhid olduqlarına görə onları nə qüsl etmək, nə də onlara cənazə namazı qılmaq lazım gəlir. Axirətdə isə onların mükafat olmayacaqdır.

سُلَيْمَانُ الأَحْوَلُ، أَنَّ ثَابِتًا مَوْلَى عُمَرَ بْنِ عَبْدِ الرَّحْمَنِ أَخْبَرَهُ، أَنَّهُ لَمَّا كَانَ بَيْنَ عَبْدِ اللَّهِ بْنِ عَمْرٍو وَبَيْنَ عَنْبَسَةَ بْنِ أَبِي سُفْيَانَ مَا كَانَ، تَيَسَّرُوا لِلْقِتَالِ، فَرَكِبَ خَالِدُ بْنُ الْعَاصِ إِلَى عَبْدِ اللَّهِ بْنِ عَمْرٍو فَوَعَظَهُ خَالِدٌ، فَقَالَ عَبْدُ اللَّهِ بْنُ عَمْرٍو: أَمَا عَلِمْتَ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: ((مَنْ قُتِلَ دُونَ مَالِهِ فَهُوَ شَهِيدٌ)).

**[361]-226-(141)** ........ Ömər ibn Abdur-Rəhmanın azad etdiyi köləsi – Sabit demişdir: “Abdullah ibn Amr ilə Ənbəsə ibn Əbu Süfyan arasında (narazılıq) olduğu zaman döyüşməyə hazırlaşdılar. Həmin vaxt Xalid ibn əl-As[1] Abdullah ibn Amrın yanına gəlib ona öyüd-nəsihət etdi. Abdullah ibn Amr dedi: “Məgər sən Peyğəmbərin ﷺ: “Hər kim öz malı uğrunda öldürülsə, o, şəhiddir”– dediyini bilmirsənmi?”

**[٣٦٢]** و حَدَّثَنِيهِ مُحَمَّدُ بْنُ حَاتِمٍ: حَدَّثَنَا مُحَمَّدُ بْنُ بَكْرٍ؛ **ح**: و حَدَّثَنَا أَحْمَدُ بْنُ عُثْمَانَ النَّوْفَلِيُّ: حَدَّثَنَا أَبُو عَاصِمٍ، كِلاَهُمَا عَنْ ابْنِ جُرَيْجٍ بِهَذَا الإِسْنَادِ مِثْلَهُ.

**[362]** ........ Muhəmməd ibn Bəkr və Əbu Asim – hər ikisi İbn Cureycdən bu isnadla (yuxarıdakı) hədisin bənzərini rəvayət etmişlər.

## (٦٣) – بَابُ اسْتِحْقَاقِ الْوَالِي الْغَاشِّ لِرَعِيَّتِهِ النَّارَ

## 63-cü fəsil. Rəiyyətini aldadan rəhbərin Cəhənnəmə layiq görülməsi

**[٣٦٣] ٢٢٧**–(**١٤٢**) حَدَّثَنَا شَيْبَانُ بْنُ فَرُّوخَ: حَدَّثَنَا أَبُو الأَشْهَبِ عَنْ الْحَسَنِ قَالَ: عَادَ عُبَيْدُ اللَّهِ بْنُ زِيَادٍ، مَعْقِلَ بْنَ يَسَارٍ الْمُزَنِيَّ فِي مَرَضِهِ الَّذِي مَاتَ فِيهِ، قَالَ مَعْقِلٌ: إِنِّي مُحَدِّثُكَ حَدِيثًا سَمِعْتُهُ مِنْ رَسُولِ اللَّهِ ﷺ، لَوْ عَلِمْتُ أَنَّ لِي حَيَاةً مَا حَدَّثْتُكَ، إِنِّي سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ: ((مَا مِنْ عَبْدٍ يَسْتَرْعِيهِ اللَّهُ رَعِيَّةً، يَمُوتُ يَوْمَ يَمُوتُ وَهُوَ غَاشٌّ لِرَعِيَّتِهِ، إِلاَّ حَرَّمَ اللَّهُ عَلَيْهِ الْجَنَّةَ)).

**[363]-227-(142)** ........ Həsən (əl-Bəsri) demişdir: “Məqil ibn Yəsar əl-Muzəni ölümü ilə nəticələnən xəstəliyə tutulduğu zaman Ubeydullah ibn Ziyad onu ziyarət etmiş və Məqil (ona) demişdir: “Mən sənə Peyğəmbərdən ﷺ eşitdiyim bir hədisi danışacağam. Əgər (bundan sonra) yaşayacağımı bilsəydim, bu hədisi sənə danışmazdım. Mən Peyğəmbərin ﷺ belə buyurduğunu eşit-

[1] Xalid ibn əl-As Abdullah ibn Amrın əmisidir.

mişəm: “Allah Öz qullarından birinə rəiyyətin qeydinə qalmağı həvalə edər[1] və o da ölərkən xalqını aldatmış olduğu halda ölərsə, Allah mütləq Cənnəti ona haram buyurar”.

**[٣٦٤] ٢٢٨**-(...) حَدَّثَنَا يَحْيَى بْنُ يَحْيَى: أَخْبَرَنَا يَزِيدُ بْنُ زُرَيْعٍ عَنْ يُونُسَ، عَنْ الْحَسَنِ قَالَ: دَخَلَ عُبَيْدُ اللَّهِ بْنُ زِيَادٍ عَلَى مَعْقِلِ بْنِ يَسَارٍ وَهُوَ وَجِعٌ، فَسَأَلَهُ فَقَالَ: إِنِّي مُحَدِّثُكَ حَدِيثًا لَمْ أَكُنْ حَدَّثْتُكَهُ، إِنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: ((لاَ يَسْتَرْعِي اللَّهُ عَبْدًا رَعِيَّةً، يَمُوتُ حِينَ يَمُوتُ وَهُوَ غَاشٌّ لَهَا، إِلاَّ حَرَّمَ اللَّهُ عَلَيْهِ الْجَنَّةَ)) قَالَ: أَلاَّ كُنْتَ حَدَّثْتَنِي هَذَا قَبْلَ الْيَوْمِ؟ قَالَ: مَا حَدَّثْتُكَ، أَوْ لَمْ أَكُنْ لأُحَدِّثَكَ.

**[364]-228-(...)** ........ Həsən demişdir: “Ubeydullah ibn Ziyad xəstə yatan Məqil ibn Yəsarın yanına gəlib onun halını soruşdu. Məqil dedi: “Mən sənə indiyədək (sizə) danışmadığım bir hədisi danışacağam. Peyğəmbər ﷺ demişdir: “Allah Öz qullarından birinə rəiyyətin qeydinə qalmağı həvalə edər və o da öldüyü gün onları aldatmış olduğu halda ölərsə, Allah mütləq Cənnəti ona haram buyurar”.

Ubeydullah dedi: “Niyə bunu mənə indiyədək danışmamısan?” Məqil dedi: “Sənə danışmamışam, (yaxud sənə danışmayacaqdım)”.

**[٣٦٥] ٢٢٩**-(...) و حَدَّثَنِي الْقَاسِمُ بْنُ زَكَرِيَّاءَ: حَدَّثَنَا حُسَيْنٌ يَعْنِي الْجُعْفِيَّ، عَنْ زَائِدَةَ، عَنْ هِشَامٍ قَالَ: قَالَ الْحَسَنُ كُنَّا عِنْدَ مَعْقِلِ بْنِ يَسَارٍ نَعُودُهُ، فَجَاءَ عُبَيْدُ اللَّهِ بْنُ زِيَادٍ فَقَالَ لَهُ مَعْقِلٌ: إِنِّي سَأُحَدِّثُكَ حَدِيثًا سَمِعْتُهُ مِنْ رَسُولِ اللَّهِ ﷺ، ثُمَّ ذَكَرَ بِمَعْنَى حَدِيثِهِمَا.

**[365]-229-(...)** ........ Həsən demişdir: “Biz Məqil ibn Yəsara baş çəkməyə getmişdik. Həmin vaxt Ubeydullah ibn Ziyad da (ona baş çəkməyə) gəldi. Məqil ona dedi: “Mən sənə Peyğəmbərdən ﷺ eşitdiyim bir hədisi danışacağam...”

Sonra bundan öncəki hədislərə yaxın mənada bir hədis rəvayət etdi.

**[٣٦٦]** (...) و حَدَّثَنَا أَبُو غَسَّانَ الْمِسْمَعِيُّ وَمُحَمَّدُ بْنُ الْمُثَنَّى وَإِسْحَقُ بْنُ إِبْرَاهِيمَ، قَالَ إِسْحَقُ: أَخْبَرَنَا، وَقَالَ الآخَرَانِ: حَدَّثَنَا مُعَاذُ بْنُ هِشَامٍ قَالَ: حَدَّثَنِي أَبِي عَنْ قَتَادَةَ، عَنْ أَبِي الْمَلِيحِ، أَنَّ عُبَيْدَ اللَّهِ بْنَ زِيَادٍ عَادَ مَعْقِلَ بْنَ يَسَارٍ فِي مَرَضِهِ، فَقَالَ لَهُ مَعْقِلٌ: إِنِّي مُحَدِّثُكَ بِحَدِيثٍ لَوْلاَ أَنِّي فِي الْمَوْتِ لَمْ أُحَدِّثْكَ بِهِ، سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ: ((مَا مِنْ أَمِيرٍ يَلِي أَمْرَ الْمُسْلِمِينَ ثُمَّ لاَ يَجْهَدُ لَهُمْ وَيَنْصَحُ إِلاَّ لَمْ يَدْخُلْ مَعَهُمْ الْجَنَّةَ)).

---

[1] Yəni hər bir rəhbərin borcudur ki, rəiyyəti ilə mülayim rəftar eləsin, onların haqqını ödəsin, onlara yaxşılıq etsin, onların qayğısına qalsın və onlara qarşı haqsızlığa yol verməsin. Çünki o, buna görə Allahın hüzurunda haqq-hesaba çıkiləcəkdir.

**[366] (...)** ........ Əbu Məlih belə rəvayət etmişdir: “Məqil ibn Yəsar xəstə yatarkən Ubeydullah ibn Ziyad ona baş çəkdi. Onda Məqil ona dedi: “Mən sənə bir hədis danışacağam. Əgər ölüm ayağında olmasaydım, bu hədisi sənə danışmazdım. Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: “Müsəlmanların işlərinə rəhbərlik edən, lakin onlar üçün çalışmayan və onlara yaxşılıq etməyən (hər) bir rəhbər Cənnətə girəcək müsəlmanlarla bərabər oraya girməz”.

## (٦٤) – بَابُ رَفْعِ الأَمَانَةِ وَالإِيمَانِ مِنْ بَعْضِ الْقُلُوبِ وَعَرْضِ الْفِتَنِ عَلَى الْقُلُوبِ

## 64-cü fəsil. Bəzi qəlblərdən əmanətin və imanın götürülməsi və qəlblərin fitnələrə məruz qalması

**[٣٦٧] ٢٣٠–(١٤٣)** حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا أَبُو مُعَاوِيَةَ وَوَكِيعٌ؛ ح: و حَدَّثَنَا أَبُو كُرَيْبٍ: حَدَّثَنَا أَبُو مُعَاوِيَةَ عَنْ الأَعْمَشِ، عَنْ زَيْدِ بْنِ وَهْبٍ، عَنْ حُذَيْفَةَ قَالَ: حَدَّثَنَا رَسُولُ اللَّهِ ﷺ حَدِيثَيْنِ قَدْ رَأَيْتُ أَحَدَهُمَا، وَأَنَا أَنْتَظِرُ الآخَرَ، حَدَّثَنَا: ((أَنَّ الأَمَانَةَ نَزَلَتْ فِي جَذْرِ قُلُوبِ الرِّجَالِ، ثُمَّ نَزَلَ الْقُرْآنُ، فَعَلِمُوا مِنْ الْقُرْآنِ وَعَلِمُوا مِنْ السُّنَّةِ)). ثُمَّ حَدَّثَنَا عَنْ رَفْعِ الأَمَانَةِ قَالَ: ((يَنَامُ الرَّجُلُ النَّوْمَةَ فَتُقْبَضُ الأَمَانَةُ مِنْ قَلْبِهِ، فَيَظَلُّ أَثَرُهَا مِثْلَ الْوَكْتِ ،ثُمَّ يَنَامُ النَّوْمَةَ فَتُقْبَضُ الأَمَانَةُ مِنْ قَلْبِهِ، فَيَظَلُّ أَثَرُهَا مِثْلَ الْمَجْلِ، كَجَمْرٍ دَحْرَجْتَهُ عَلَى رِجْلِكَ فَنَفِطَ فَتَرَاهُ مُنْتَبِرًا وَلَيْسَ فِيهِ شَيْءٌ ثُمَّ أَخَذَ حَصًى فَدَحْرَجَهُ عَلَى رِجْلِهِ فَيُصْبِحُ النَّاسُ يَتَبَايَعُونَ، لاَ يَكَادُ أَحَدٌ يُؤَدِّي الأَمَانَةَ حَتَّى يُقَالَ: إِنَّ فِي بَنِي فُلاَنٍ رَجُلاً أَمِينًا، حَتَّى يُقَالَ لِلرَّجُلِ: مَا أَجْلَدَهُ! مَا أَظْرَفَهُ! مَا أَعْقَلَهُ! وَمَا فِي قَلْبِهِ مِثْقَالُ حَبَّةٍ مِنْ خَرْدَلٍ مِنْ إِيمَانٍ)).

وَلَقَدْ أَتَى عَلَيَّ زَمَانٌ وَمَا أُبَالِي أَيَّكُمْ بَايَعْتُ، لَئِنْ كَانَ مُسْلِمًا لَيَرُدَّنَّهُ عَلَيَّ دِينُهُ، وَلَئِنْ كَانَ نَصْرَانِيًّا أَوْ يَهُودِيًّا لَيَرُدَّنَّهُ عَلَيَّ سَاعِيهِ، وَأَمَّا الْيَوْمَ فَمَا كُنْتُ لأُبَايِعَ مِنْكُمْ إِلاَّ فُلاَنًا وَفُلاَنًا.

**[367]-230-(143)** ........ Huzeyfə ﷺ demişdir: “Peyğəmbər ﷺ bizə (əmanət haqqında) iki hədis danışmışdır. Mən onlardan birini artıq görmüşəm, o birisini isə gözləyirəm.

Peyğəmbər ﷺ bizə xəbər vermişdir ki, əmanət[1] (əməlisaleh) insanların qəlbinin dərinliyinə endirilmiş, sonra Quran nazil olmuş və onlar Quranı, bunun ardından da sünnəni öyrənmişlər.

---

[1] İmam Əbul-Huseyn əl-Vahidi ﷺ Uca Allahın: **“Biz əmanəti göylərə, yerə və dağlara təklif etdik. Onlar onu daşımaqdan *qorxub* imtina etdilər. Lakin insan onu boynuna götürdü. Doğrudan da, o, zalım və cahildir”** (“əl-Əhzab” surəsi, 72) ayəsini izah edib demişdir: “İbn Abbas demişdir: “(Burada əmanət deyildikdə) Uca Allahın Öz qullarına vacib buyurduğu əməllər nəzərdə tutulur”. Həsən əl-Bəsri demişdir: “Bu, dindir. Din isə, bütövlükdə əmanət sayılır”. Əbul-Aliyə demişdir: “(Bu,) insanlara əmr olunmuş və qadağan edilmiş əməllərdir”. Muqatil demişdir: “Əmanət – itaət deməkdir”.

Bundan başqa, Peyğəmbər ﷺ əmanətin götürüləcəyi barədə bizə bildirib demişdir: “Adam yatacaq və (yuxuda ikən) əmanət onun qəlbindən götürüləcək, (yerində isə) rəngsiz nöqtə boyda izi qalacaq. Sonra yenə yatacaq və (o yuxuda ikən) əmanətin (qalan hissəsi də) onun qəlbindən götürüləcək, (yerində isə) suluğa bənzər izi qalacaq. Elə bil ki, (əlindəki) közü ayağının üstünə salmısan və onun düşdüyü yer suluqlayıb. Sən onun qabardığını görürsən, halbuki onun içi bomboşdur. Sonra o, kiçik daşlardan götürüb ayağının üstünə yumbalatdı. O zaman insanlar bir-biriləri ilə alış-veriş edəcək, amma heç kəs əmanəti qaytarmaq barəsində heç düşünməyəcək də. İş o yerə gəlib çatacaq ki, camaat deyəcək: “Filan qəbilə sakinləri arasında etibarlı bir adam vardır”. Hətta birisinin barəsində: “O necə dayanıqlı, necə bacarıqlı, necə dərrakəli adamdır!”– deyiləcək, halbuki onun qəlbində xardal dənəsi ağırlığında iman olmayacaqdır.”

(Huzeyfə) dedi: “Mən elə bir zamanda yaşamışam ki, həmin vaxt kiminlə alış-veriş edəcəyim məni narahat etməzdi. Belə ki, (iş gördüyüm adam) müsəlman olardısa, (əmanəti) mənə onun dini qaytarardı,[1] xristian və ya yəhudi olardısa, əmanəti mənə onun rəhbəri qaytarardı. Bu gün isə mən ancaq filankəs və filankəslə iş görürəm”.

**[٣٦٨]** و حَدَّثَنَا ابْنُ نُمَيْرٍ: حَدَّثَنَا أَبِي وَوَكِيعٌ؛ **ح:** و حَدَّثَنَا إِسْحَقُ بْنُ إِبْرَاهِيمَ: حَدَّثَنَا عِيسَى بْنُ يُونُسَ، جَمِيعًا عَنْ الأَعْمَشِ، بِهَذَا الإِسْنَادِ مِثْلَهُ.

**[368]** ........ Numeyr, Vəkiy və İsa ibn Yunus – hamısı bu hədisi Aməşdən bu isnadla rəvayət etmişlər.

## (٦٥) – بَابُ بَيَانِ أَنَّ الإِسْلاَمَ بَدَأَ غَرِيبًا وَسَيَعُودُ غَرِيبًا وَأَنَّهُ يَأْرِزُ بَيْنَ الْمَسْجِدَيْنِ

## 65-ci fəsil. İslamın qərib olaraq başladığının, təkrar qərib olaraq qayıdacağının və iki məscidin arasına toplanacağının[2] bəyan edilməsi

**[٣٦٩] ٢٣١–(١٤٤)** حَدَّثَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللَّهِ بْنِ نُمَيْرٍ: حَدَّثَنَا أَبُو خَالِد يَعْنِي سُلَيْمَانَ بْنَ حَيَّانَ، عَنْ سَعْدِ بْنِ طَارِقٍ، عَنْ رِبْعِيٍّ، عَنْ حُذَيْفَةَ قَالَ: كُنَّا عِنْدَ عُمَرَ، فَقَالَ: أَيُّكُمْ سَمِعَ رَسُولَ اللَّهِ ﷺ يَذْكُرُ الْفِتَنَ؟

---

[1] Yəni şəriət qayda-qanunlarına əsasən əmanət yiyəsinə qaytarılardı.

[2] Burada iki məscid deyildikdə Məkkə və Mədinə məscidləri nəzərdə tutulur. Və necə ki, İslamın əvvəlində səhabələr Mədinəyə toplanmışdılar, Qiyamətə yaxın da möminlər Mədinəyə toplanacaqlar.

فَقَالَ قَوْمٌ: نَحْنُ سَمِعْنَاهُ، فَقَالَ: لَعَلَّكُمْ تَعْنُونَ فِتْنَةَ الرَّجُلِ فِي أَهْلِهِ وَجَارِهِ؟ قَالُوا: أَجَلْ. قَالَ تِلْكَ تُكَفِّرُهَا الصَّلاَةُ وَالصِّيَامُ وَالصَّدَقَةُ. وَلَكِنْ أَيُّكُمْ سَمِعَ النَّبِيَّ ﷺ يَذْكُرُ الْفِتَنَ الَّتِي تَمُوجُ مَوْجَ الْبَحْرِ؟ قَالَ حُذَيْفَةُ: فَأَسْكَتَ الْقَوْمُ، فَقُلْتُ: أَنَا، قَالَ: أَنْتَ، لِلَّهِ أَبُوكَ!

قَالَ حُذَيْفَةُ: سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ: ((تُعْرَضُ الْفِتَنُ عَلَى الْقُلُوبِ كَالْحَصِيرِ عُودًا عُودًا، فَأَيُّ قَلْبٍ أُشْرِبَهَا نُكِتَ فِيهِ نُكْتَةٌ سَوْدَاءُ، وَأَيُّ قَلْبٍ أَنْكَرَهَا نُكِتَ فِيهِ نُكْتَةٌ بَيْضَاءُ، حَتَّى تَصِيرَ عَلَى قَلْبَيْنِ، عَلَى أَبْيَضَ مِثْلِ الصَّفَا، فَلاَ تَضُرُّهُ فِتْنَةٌ مَا دَامَتْ السَّمَاوَاتُ وَالأَرْضُ، وَالآخَرُ أَسْوَدُ مُرْبَادًّا كَالْكُوزِ مُجَخِّيًا لاَ يَعْرِفُ مَعْرُوفًا وَلاَ يُنْكِرُ مُنْكَرًا إِلاَّ مَا أُشْرِبَ مِنْ هَوَاهُ)).

قَالَ حُذَيْفَةُ: وَحَدَّثْتُهُ، أَنَّ بَيْنَكَ وَبَيْنَهَا بَابًا مُغْلَقًا يُوشِكُ أَنْ يُكْسَرَ، قَالَ عُمَرُ: أَكَسْرًا لاَ أَبَا لَكَ! فَلَوْ أَنَّهُ فُتِحَ لَعَلَّهُ كَانَ يُعَادُ قُلْتُ: لاَ بَلْ يُكْسَرُ، وَحَدَّثْتُهُ: أَنَّ ذَلِكَ الْبَابَ رَجُلٌ يُقْتَلُ أَوْ يَمُوتُ، حَدِيثًا لَيْسَ بِالأَغَالِيطِ.

قَالَ أَبُو خَالِدٍ: فَقُلْتُ لِسَعْدٍ: يَا أَبَا مَالِكٍ! مَا أَسْوَدُ مُرْبَادًّا؟ قَالَ: شِدَّةُ الْبَيَاضِ فِي سَوَادٍ. قَالَ: قُلْتُ: فَمَا الْكُوزُ مُجَخِّيًا؟ قَالَ: مَنْكُوسًا.

**[369]-231-(144)** ........ Huzeyfə ﷺ demişdir: "(Bir dəfə) biz Ömərin yanında ikən o soruşdu: "Hansınız Peyğəmbərin ﷺ fitnələr[1] barədə dediyi sözləri eşitmişdir?" Camaat: "Biz onu eşitmişik"– dedi. Ömər buyurdu: "Yəqin ki, siz kişinin əhli-əyalı[2] və qonşusu üzündən düşdüyü fitnəni nəzərdə tutursunuz". Onlar: "Bəli!"– deyə cavab verdilər. Ömər dedi: "(Sizin qəsd etdiyiniz) o fitnəni namaz, oruc və sədəqə (kimi ibadətlər) silib aparır.[3] (Mən bunu qəsd etmirəm). Hansınız Peyğəmbərin ﷺ, təlatümə gəlmiş dəniz kimi (araya) çaxnaşma salacaq bir fitnə barədə xəbər verdiyini eşitmişdir?"

Huzeyfə dedi: "Camaat susdu". Mən isə dedim: "Mən (eşitmişəm)". Ömər buyurdu: "Afərin sənə!"

Huzeyfə dedi: "Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: "Həsir tədriclə (adamın böyründə) iz buraxdığı kimi, fitnələr də qəlblərdə iz buraxır. Hansı qəlbə bu fitnələr (birdəfəlik) daxil edilərsə, o qəlbə qara ləkə düşər. Hansı qəlb də bunları rədd edərsə, onda ağ ləkə əmələ gələr. Hətta iki qəlb kimi olar; (biri) ağappaq hamar qayaya[4] bənzər. Göylər və yer durduqca, belə qəl-

[1] Fitnə – qarışıqlıq, ara qarışdırma, camaatı bir-birilə vuruşdurmaq, aralarını pozmaq üçün gizlicə hazırlanan qəsd, xəyanətdir.

[2] Burada "fitnə" deyildikdə imtahan qəsd edilir. Allah buyurur: **"Bilin ki, var-dövlətiniz də, övladlarınız da ancaq bir imtahandır. Böyük mükafat isə Allah yanındadır"** ("əl-Ənfal" surəsi, 28).

[3] Uca Allah buyurur: **"Həqiqətən, yaxşı işlər pis əməlləri silib aparır"** ("Hud" surəsi, 114).

[4] Belə ki, heç bir fitnə onun üstündə qərar tuta bilməz.

bə heç bir fitnə zərər verə bilməz. Digəri isə qırmızımtıl qara rəngli, mücəxxi kuzəyə[1] bənzər. Bu qəlb özünə sevdirilmiş arzulardan başqa heç bir yaxşılığa əhəmiyyət verməz və heç bir günahı inkar etməz”.

Huzeyfə dedi: “Mən Ömərə söylədim: “Səninlə o fitnə arasında bağlı bir qapı vardır. Onun sındırılmasına çox az qalıb”. Ömər dedi: “Cəsarətli ol! (De görək,) o qapı sındırılacaqmı? Əgər o açılarsa, onun geri qaytarılmasına ümid edilər”. Mən: “Xeyr, o sındırılacaq”– deyə cavab verdim və ona (içində) yalan olmayan bir hədis rəvayət edib dedim ki: “Bu qapı, öldürüləcək, yaxud öləcək bir adamdır”.

Əbu Xalid demişdir: “Mən Səddən soruşdum: “Ey Əbu Malik! Əsvədə murbaddən nədir?” Dedi: “Qaranın içində dümağ (parıltıdır)”. Soruşdum: “Bəs mücəxxi kuzə nədir?” Dedi: “tərsinə qoyulmuş kuzədir”.[2]

**[٣٧٠]** (...) و حَدَّثَنِي ابْنُ أَبِي عُمَرَ: حَدَّثَنَا مَرْوَانُ الْفَزَارِيُّ: حَدَّثَنَا أَبُو مَالِكٍ الأَشْجَعِيُّ، عَنْ رِبْعِيٍّ قَالَ: لَمَّا قَدِمَ حُذَيْفَةُ مِنْ عِنْدِ عُمَرَ، جَلَسَ فَحَدَّثَنَا فَقَالَ: إِنَّ أَمِيرَ الْمُؤْمِنِينَ أَمْسِ لَمَّا جَلَسْتُ إِلَيْهِ سَأَلَ أَصْحَابَهُ، أَيُّكُمْ يَحْفَظُ قَوْلَ رَسُولِ اللَّهِ ﷺ فِي الْفِتَنِ؟ وَسَاقَ الْحَدِيثَ بِمِثْلِ حَدِيثِ أَبِي خَالِدٍ، وَلَمْ يَذْكُرْ تَفْسِيرَ أَبِي مَالِكٍ لِقَوْلِهِ: ((مُرْبَادًّا مُجَخِّيًا))

**[370] (...)** ........ Rib'iy demişdir: “Huzeyfə Ömərin yanından qayıtdıqda, (gəlib aramızda) oturdu və bizə belə rəvayət etdi: “Dünən möminlərin əmiri – mən onun yanında ikən – yanındakılardan: “Rəsulullahın ﷺ fitnələr barədə dediyi sözlər hansınızın yadındadır?”– deyə soruşdu...”

(Sonra ravi) bu hədisi Əbu Xalidin hədisi kimi nəql etmişdir. Fəqət Əbu Malikin: “murbaddən və mücəxxi” kəlmələrini təfsir etməsi zikr edilməmişdir.

**[٣٧١]** (...) و حَدَّثَنِي مُحَمَّدُ بْنُ الْمُثَنَّى وَعَمْرُو بْنُ عَلِيٍّ وَعُقْبَةُ بْنُ مُكْرَمٍ الْعَمِّيُّ قَالُوا: حَدَّثَنَا مُحَمَّدُ بْنُ أَبِي عَدِيٍّ عَنْ سُلَيْمَانَ التَّيْمِيِّ، عَنْ نُعَيْمِ بْنِ أَبِي هِنْدٍ، عَنْ رِبْعِيِّ بْنِ حِرَاشٍ، عَنْ حُذَيْفَةَ، أَنَّ عُمَرَ قَالَ: مَنْ يُحَدِّثُنَا، أَوْ قَالَ: أَيُّكُمْ يُحَدِّثُنَا – وَفِيهِمْ حُذَيْفَةُ – مَا قَالَ رَسُولُ اللَّهِ ﷺ فِي الْفِتْنَةِ؟ قَالَ حُذَيْفَةُ: أَنَا. وَسَاقَ الْحَدِيثَ كَنَحْوِ حَدِيثِ أَبِي مَالِكٍ عَنْ رِبْعِيٍّ. وَقَالَ فِي الْحَدِيثِ: قَالَ حُذَيْفَةُ: حَدَّثْتُهُ حَدِيثًا لَيْسَ بِالأَغَالِيطِ – وَقَالَ يَعْنِي أَنَّهُ عَنْ رَسُولِ اللَّهِ ﷺ.

---

[1] Darboğazlı, aşağısı enli, qulplu saxsı su qabı, balaca səhəng, bardaq.
[2] 7258-ci hədisə bax.

**[371] (...)** ........ Rib'iy ibn Hiraş rəvayət edir ki, Huzeyfə demişdir: "(Bir dəfə) Ömər aralarında Huzeyfənin də olduğu bir camaatdan: "Rəsulullahın ﷺ fitnə haqqında söylədiklərini bizə kim danışar, yaxud hansınız danışar?"– deyə soruşdu. Huzeyfə: "Mən!"– deyə cavab verdi.

(Sonra ravi) hədisi Əbu Malikin Rib'iydən rəvayət etdiyi kimi rəvayət etmişdir. Bu hədisdə o, Huzeyfənin: "Mən ona (içində) yalan olmayan bir hədisi – yəni Peyğəmbərdən ﷺ eşitdiyim bir hədisi danışdım"– dediyini də rəvayət etmişdir.

**[٣٧٢] ٢٣٢**–(١٤٥) حَدَّثَنَا مُحَمَّدُ بْنُ عَبَّادٍ وَابْنُ أَبِي عُمَرَ، جَمِيعًا عَنْ مَرْوَانَ الْفَزَارِيِّ – قَالَ: ابْنُ عَبَّادٍ: حَدَّثَنَا مَرْوَانُ عَنْ يَزِيدَ يَعْنِي ابْنَ كَيْسَانَ عَنْ أَبِي حَازِمٍ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: بَدَأَ الإِسْلاَمُ غَرِيبًا وَسَيَعُودُ كَمَا بَدَأَ غَرِيبًا، فَطُوبَى لِلْغُرَبَاءِ)).

**[372]-232-(145)** ........ Əbu Hureyrə ؓ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "İslam (dini) qərib olaraq başlamış və yenə başlanğıcda olduğu kimi qəribliyə qayıdacaqdır. (O dövrdə yaşayacaq) qəriblərin xoş halına!"[1]

**[٣٧٣]** (١٤٦) و حَدَّثَنِي مُحَمَّدُ بْنُ رَافِعٍ وَالْفَضْلُ بْنُ سَهْلٍ الأَعْرَجُ قَالا: حَدَّثَنَا شَبَابَةُ بْنُ سَوَّارٍ: حَدَّثَنَا عَاصِمٌ وَهُوَ ابْنُ مُحَمَّدٍ الْعُمَرِيُّ، عَنْ أَبِيهِ، عَنْ ابْنِ عُمَرَ عَنْ النَّبِيِّ ﷺ قَالَ: ((إِنَّ الإِسْلاَمَ بَدَأَ غَرِيبًا وَسَيَعُودُ غَرِيبًا كَمَا بَدَأَ، وَهُوَ يَأْرِزُ بَيْنَ الْمَسْجِدَيْنِ كَمَا تَأْرِزُ الْحَيَّةُ فِي جُحْرِهَا)).

**[373] (146)** ........ İbn Ömər ؓ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurmuşdur: "Həqiqətən də, İslam qərib olaraq başlamışdır və başladığı kimi, qəribliyə dönəcəkdir. O, ilanın öz yuvasına yığışdığı kimi iki məscid arasına yığışar".

**[٣٧٤] ٢٣٣**–(١٤٧) حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا عَبْدُ اللَّهِ بْنُ نُمَيْرٍ وَأَبُو أُسَامَةَ عَنْ عُبَيْدِ اللَّهِ بْنِ عُمَرَ؛ ح: و حَدَّثَنَا ابْنُ نُمَيْرٍ: حَدَّثَنَا أَبِي: حَدَّثَنَا عُبَيْدُ اللَّهِ عَنْ خُبَيْبِ بْنِ عَبْدِ الرَّحْمَنِ، عَنْ حَفْصِ بْنِ عَاصِمٍ، عَنْ أَبِي هُرَيْرَةَ، أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: ((إِنَّ الإِيمَانَ لَيَأْرِزُ إِلَى الْمَدِينَةِ كَمَا تَأْرِزُ الْحَيَّةُ إِلَى جُحْرِهَا)).

---

[1] Hədisdə keçən "xoş halına" ifadəsi eynilə Qurandakı ayəyə bənzəyir. Həmin ayədə Uca Allah buyurur: **"İman gətirib saleh əməllər edənlər üçün xoş güzəran və gözəl qayıdış yeri hazırlanmışdır"** ("ər-Rəd" surəsi, 29). Təfsirçilər bu ayəni belə izah etmişlər: İbn Abbas ؓ demişdir: "Bu, sevinc və gözaydınlığıdır". İkrimə demişdir: "Onlara bəxş edilmiş nemətlər necə də gözəldir". Dəhhak demişdir: "Onlar qibtə olunası insanlardır". Qətadə demişdir: "Xoş onların gözəl aqibətinə". Həmçinin demişdir: "Onlar xeyirə nail olmuşlar". İbrahim demişdir: "Onlara xeyir və kəramət nəsib edilmişdir". İbn İclan demişdir: "(Ayədə "tubə" deyildikdə) – davamiyyətli xeyir (nəzərdə tutulur)". Bəzi təfsirçilər də (ayədə keçən "tubə" kəlməsinin): "Cənnət" və ya "Cənnətdəki ağac" olduğunu söyləmişlər. Qeyd etmək lazımdır ki, hədisdə keçən "tubə" sözü, bu mənalardan hər birini ifadə edə bilər. Daha doğrusunu isə Allah bilir.

**[374]-233-(147)** ........ Əbu Hureyrə ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "İlan öz yuvasına yığışdığı kimi, iman (əhli) də Mədinəyə yığışar".

## (٦٦) – بَابُ ذَهَابِ الإِيمَانِ آخِرِ الزَّمَانِ

## 66-cı fəsil. Qiyamətə yaxın imanın aradan qaldırılması

**[٣٧٥] ٢٣٤–(١٤٨)** حَدَّثَنِي زُهَيْرُ بْنُ حَرْبٍ: حَدَّثَنَا عَفَّانُ: حَدَّثَنَا حَمَّادٌ: أَخْبَرَنَا ثَابِتٌ عَنْ أَنَسٍ، أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: ((لاَ تَقُومُ السَّاعَةُ حَتَّى لاَ يُقَالَ فِي الأَرْضِ اللَّهُ اللَّهُ)).

**[375]-234-(148)** ........ Ənəs ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Nə qədər ki, yer üzündə "Allah! Allah!" (sözü) deyilir, Qiyamət qopmayacaq".[1]

**[٣٧٦]** حَدَّثَنَا عَبْدُ بْنُ حُمَيْدٍ: أَخْبَرَنَا عَبْدُ الرَّزَّاقِ: أَخْبَرَنَا مَعْمَرٌ عَنْ ثَابِتٍ، عَنْ أَنَسٍ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((لاَ تَقُومُ السَّاعَةُ عَلَى أَحَدٍ يَقُولُ اللَّهُ اللَّهُ)).

**[376]** ........ Ənəs ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Allah! Allah!" deyən heç bir kimsə üzərində Qiyamət qopmaz".

## (٦٧) – بَابُ جَوَازِ الاِسْتِسْرَارِ بِالإِيمَانِ لِلْخَائِفِ

## 67-ci fəsil. (Zalımın zülmündən) qorxan adamın imanı gizlətməsinin caiz olması

**[٣٧٧] ٢٣٥–(١٤٩)** حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ وَمُحَمَّدُ بْنُ عَبْدِ اللَّهِ بْنِ نُمَيْرٍ وَأَبُو كُرَيْبٍ – وَاللَّفْظُ لأَبِي كُرَيْبٍ – قَالُوا: حَدَّثَنَا أَبُو مُعَاوِيَةَ عَنِ الأَعْمَشِ عَنْ شَقِيقٍ، عَنْ حُذَيْفَةَ قَالَ: كُنَّا مَعَ رَسُولِ اللَّهِ ﷺ فَقَالَ: ((أَحْصُوا لِي كَمْ يَلْفِظُ الإِسْلاَمَ)) قَالَ: فَقُلْنَا: يَا رَسُولَ اللَّهِ! أَتَخَافُ عَلَيْنَا وَنَحْنُ مَا بَيْنَ السِّتِّمِائَةِ إِلَى السَّبْعِمِائَةِ؟ قَالَ: ((إِنَّكُمْ لاَ تَدْرُونَ، لَعَلَّكُمْ أَنْ تُبْتَلَوْا)) قَالَ: فَابْتُلِينَا، حَتَّى جَعَلَ الرَّجُلُ مِنَّا لاَ يُصَلِّي إِلاَّ سِرًّا.

**[377]-235-(149)** ........ Huzeyfə ﵁ demişdir: "(Bir dəfə) biz Peyğəmbərin ﷺ yanında ikən, o, belə buyurdu: "İslam kəlməsini[2] tələffüz edən kimsələrin sayının nə qədər olduğunu mənim üçün sayın"[3]. Biz dedik: "Ya Rəsulullah! Bi-

[1] 312-ci hədisin qeydlərinə bax.

[2] Burada tövhid kəlməsi – lə ilahə illəllah, Muhəmmədun rəsulullah – qəsd edilir.

[3] İmam Buxarinin rəvayətdində deyilir: "Peyğəmbər ﷺ (bizə): "İslam kəlməsini tələffüz edən kimsələrin sayının nə qədər olduğunu mənim üçün yazın"– deyə buyurdu, biz də onun üçün min beş yüz adamın adını yazdıq..." ("Səhih əl-Buxari", 3060). Bu iki hədisi cəm edib demək olar ki, Muslimin rəvayətində "altı yüzlə yeddi yüz arasında" deyildikdə ancaq Mədinədəki müsəlmanlar, bu rəvayətdə "min beş yüz adam" deyildikdə isə onlarla yanaşı, başqa yerlərdə yaşayan müsəlmanlar da nəzərdə tutulur.

zim sayımız altı yüzlə yeddi yüz arasında olduğu halda, sən bizə (bir müsibət üz verəcəyindənmi) qorxursan?" Peyğəmbər ﷺ belə buyurdu: "Siz bilmirsiniz! Ola bilsin ki, başınıza müsibət gəlsin".

Huzeyfə dedi: "Həqiqətən də, (sonralar) bizə müsibət üz verdi. İş o yerə gəlib çatmışdı ki, bəzilərimiz namazını ancaq gizlində qılırdı".

## (٦٨) – بَابُ تَأَلُّف قَلْبِ مَنْ يَخَافُ عَلَى إِيمَانه لضَعْفه وَالنَّهْيِ عَنْ الْقَطْعِ بِالإِيمَانِ مِنْ غَيْرِ دَلِيلٍ قَاطِعٍ

## 68-ci fəsil. İman zəifliyi üzündən imanına görə ehtiyat edilən kimsənin qəlbinin (İslama) isinişdirilməsi və qəti bir dəlil olmadan (kimsənin) qətiyyətlə mömin olduğunu (deməyin) qadağan edilməsi

**[٣٧٨] ٢٣٦–(١٥٠)** حَدَّثَنَا ابْنُ أَبِي عُمَرَ: حَدَّثَنَا سُفْيَانُ عَنْ الزُّهْرِيِّ، عَنْ عَامِرِ بْنِ سَعْد، عَنْ أَبِيه قَالَ: قَسَمَ رَسُولُ اللَّه ﷺ قَسْمًا، فَقُلْتُ: يَا رَسُولَ اللَّه! أَعْطِ فُلاَنًا فَإِنَّهُ مُؤْمِنٌ، فَقَالَ النَّبِيُّ ﷺ: ((أَوْ مُسْلِمٌ)) أَقُولُهَا ثَلاَثًا، وَيُرَدِّدُهَا عَلَيَّ ثَلاَثًا ((أَوْ مُسْلِمٌ)) ثُمَّ قَالَ: ((إِنِّي لأُعْطِي الرَّجُلَ وَغَيْرُهُ أَحَبُّ إِلَيَّ مِنْهُ، مَخَافَةَ أَنْ يَكُبَّهُ اللَّهُ فِي النَّارِ)).

**[378]-236-(150)** ........ Səd ibn Əbu Vəqqas ﷺ demişdir: "(Bir dəfə) Peyğəmbər ﷺ bəzi şeyləri (camaat arasında) paylaşdırdı. Onda mən dedim: "Ya Rəsulullah! Filankəsə də ver, axı o, mömindir". Peyğəmbər ﷺ buyurdu: "Bəlkə müsəlmandır (deyəsən)".[1] Mən sözümü üç dəfə təkrar etdim. Peyğəmbər ﷺ də: "Bəlkə müsəlmandır" sözünü üç dəfə təkrar etdi, sonra da belə buyurdu: "Mən (bəzi hallarda) bir adama Allah onu üzüqoylu Oda atmasın deyə hədiyyə verirəm,[2] halbuki başqasını ondan da çox istəyirəm".[3]

**[٣٧٩] ٢٣٧**–(...) حَدَّثَنِي زُهَيْرُ بْنُ حَرْب: حَدَّثَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ: حَدَّثَنَا ابْنُ أَخِي ابْنِ شِهَاب عَنْ عَمِّهِ قَالَ: أَخْبَرَنِي عَامِرُ بْنُ سَعْدِ بْنِ أَبِي وَقَّاصٍ عَنْ أَبِيهِ سَعْدٍ، أَنَّ رَسُولَ اللَّهِ ﷺ أَعْطَى رَهْطًا – وَسَعْدٌ

---

[1] Bu, dəlildir ki, həqiqi imanla İslam arasında fərq vardır. Həm də iman batini əməllərə, İslam isə zahiri əmllərə aiddir. Uca Allah buyurur: **"Bədəvilər: "Biz iman gətirdik!"– dedilər. De: "Siz *qəlbən* iman gətirmədiniz! Ancaq: "Biz müsəlman olduq!"– deyin. İman sizin qəlblərinizə hələ daxil olmamışdır"** ("əl-Hucurat" surəsi, 14). Bu hədis həmçinin kəlmeyi-şəhadəti dili ilə tələffüz edən, lakin qəlbi ilə buna etiqad etməyən kimsənin mömin olduğunu iddia edən murcilərin və kərramilərin əleyhinə dəlildir. Onmların iddiası isə münafiqliyə bərabər batil bir əqidədir.

[2] Uca Allah buyurur: **"*Sədəqə* Allah yolunda cihad edən və yer üzündə hərəkət edə bilməyən yoxsullar üçündür. *Bu adamlar* həya edib dilənmədiklərinə görə tanımayan adam onları varlı hesab edir. Sən onları üzlərindən tanıyırsan. Onlar insanlardan israrla *bir şey* istəməzlər. Şübhəsiz ki, Allah malınızdan nə sərf etdiyinizi bilir"** ("əl-Bəqərə" surəsi, 273).

[3] 2433-cü hədisə bax.

جَالِسٌ فِيهِمْ – قَالَ سَعْدٌ: فَتَرَكَ رَسُولُ اللَّه ﷺ مِنْهُمْ مَنْ لَمْ يُعْطِه، وَهُوَ أَعْجَبُهُمْ إِلَيَّ، فَقُلْتُ: يَا رَسُولَ اللَّه! مَا لَكَ عَنْ فُلَانٍ؟ فَوَاللَّه! إِنِّي لأَرَاهُ مُؤْمِنًا، فَقَالَ رَسُولُ اللَّه ﷺ: ((أَوْ مُسْلِمًا)) قَالَ: فَسَكَتُّ قَلِيلاً، ثُمَّ غَلَبَنِي مَا أَعْلَمُ مِنْهُ، فَقُلْتُ: يَا رَسُولَ اللَّه! مَا لَكَ عَنْ فُلَانٍ؟ فَوَاللَّه! إِنِّي لأَرَاهُ مُؤْمِنًا، فَقَالَ رَسُولُ اللَّه ﷺ: ((أَوْ مُسْلِمًا)) قَالَ: فَسَكَتُّ قَلِيلاً، ثُمَّ غَلَبَنِي مَا عَلِمْتُ مِنْهُ، فَقُلْتُ: يَا رَسُولَ اللَّه! مَا لَكَ عَنْ فُلَانٍ؟ فَوَاللَّه! إِنِّي لأَرَاهُ مُؤْمِنًا، فَقَالَ رَسُولُ اللَّه ﷺ: ((أَوْ مُسْلِمًا، إِنِّي لأُعْطِي الرَّجُلَ وَغَيْرُهُ أَحَبُّ إِلَيَّ مِنْهُ، خَشْيَةَ أَنْ يُكَبَّ فِي النَّارِ عَلَى وَجْهِه)).

**[379]-237-(...)** ........ Səd ibn Əbu Vəqqas ﷺ demişdir: “(Bir dəfə) Peyğəmbər ﷺ bir dəstə adama hədiyyə verərkən mən də (onların yanında) oturmuşdum. Peyğəmbər ﷺ onlardan ən çox xoşuma gələn bir adama heç nə vermədi. Mən dedim: “Ya Rəsulullah! Niyə filankəsi kənarda qoydun? Vallahi ki, mən onu mömin hesab edirəm”. Peyğəmbər ﷺ: “Bəlkə müsəlmandır!”– dedi. Mən bir az susdum. Lakin onun haqqında bildiklərim mənə üstün gəldi və yenə sözümü təkrar edib: “Ya Rəsulullah! Niyə filankəsi kənarda qoydun? Vallahi ki, mən onu mömin hesab edirəm”– dedim. Peyğəmbər ﷺ: “Bəlkə müsəlmandır!”– dedi. Mən bir müddət susdum. Amma onun haqqında bildiklərim yenə mənə üstün gəldi və bir daha sözümü təkrar edib: “Ya Rəsulullah! Niyə filankəsi kənarda qoydun? Vallahi ki, mən onu mömin hesab edirəm”– dedim. Peyğəmbər ﷺ buyurdu: “Bəlkə müsəlmandır! (Ey Səd!) Bəzən mən bir adama, üzüqoylu Oda atılmasın deyə hədiyyə verirəm, halbuki başqasını ondan da çox istəyirəm”.

**[٣٨٠]** (...) حَدَّثَنَا الْحَسَنُ بْنُ عَلِيٍّ الْحُلْوَانِيُّ وَعَبْدُ بْنُ حُمَيْدٍ قَالاَ: حَدَّثَنَا يَعْقُوبُ وَهُوَ ابْنُ إِبْرَاهِيمَ بْنِ سَعْدٍ –: حَدَّثَنَا أَبِي عَنْ صَالِحٍ، عَنْ ابْنِ شِهَابٍ قَالَ: حَدَّثَنِي عَامِرُ بْنُ سَعْدٍ، عَنْ أَبِيهِ سَعْدٍ أَنَّهُ قَالَ: أَعْطَى رَسُولُ اللَّه ﷺ رَهْطًا وَأَنَا جَالِسٌ فِيهِمْ، بِمِثْلِ حَدِيثِ ابْنِ أَخِي ابْنِ شِهَابٍ عَنْ عَمِّه، وَزَادَ: فَقُمْتُ إِلَى رَسُولِ اللَّه فَسَارَرْتُهُ، فَقُلْتُ: مَا لَكَ عَنْ فُلَانٍ؟

**[380] (...)** ........ Səd ﷺ: “(Bir dəfə) Peyğəmbər ﷺ bir dəstə adama pay verdi. (Həmin vaxt) mən də onların arasında idim...”– demiş və İbn Şihabın qardaşı oğlunun öz əmisindən rəvayət etdiyi hədisin bənzərini rəvayət etmişdir. Bu hədisdə: “Mən qalxıb Peyğəmbərə ﷺ yaxınlaşdım və xəlvətcə ona: “Niyə filankəsi kənarda qoydun?”– dedim” sözləri əlavə edilmişdir.

**[٣٨١]** (...) و حَدَّثَنَا الْحَسَنُ الْحُلْوَانِيُّ: حَدَّثَنَا يَعْقُوبُ: حَدَّثَنَا أَبِي عَنْ صَالِحٍ، عَنْ إِسْمَعِيلَ بْنِ مُحَمَّدٍ قَالَ: سَمِعْتُ مُحَمَّدَ بْنَ سَعْدٍ يُحَدِّثُ هَذَا، فَقَالَ فِي حَدِيثِه: فَضَرَبَ رَسُولُ اللَّه ﷺ بِيَدِه بَيْنَ عُنُقِي وَكَتِفِي، ثُمَّ قَالَ: ((أَقِتَالاً أَيْ سَعْدُ؟ إِنِّي لأُعْطِي الرَّجُلَ)).

**[381] (...)** ........ İsmail ibn Muhəmməd demişdir: "Mən Muhəmməd ibn Sədin bu hədisi rəvayət etdiyini eşitdim. Bu rəvayətində o, belə demişdir: "Peyğəmbər ﷺ əli ilə mənim boynumun bel sütununa birləşən tərəfinə vurdu, sonra da buyurdu: "(Mənimlə) döyüşməkmi (istəyirsən), ey Səd?! Mən bir adama (pay) verirəm..."

## (٦٩) – بَابُ زِيَادَةِ طُمَأْنِينَةِ الْقَلْبِ بِتَظَاهُرِ الأَدِلَّةِ

## 69-cu fəsil. Dəlillərin bir-birini qüvvətləndirməsi səbəbilə qəlbin yəqinliyini artırmaq

**[٣٨٢] ٢٣٨–(١٥١)** و حَدَّثَنِي حَرْمَلَةُ بْنُ يَحْيَى: أَخْبَرَنَا ابْنُ وَهْبٍ: أَخْبَرَنِي يُونُسُ عَنِ ابْنِ شِهَابٍ، عَنْ أَبِي سَلَمَةَ بْنِ عَبْدِ الرَّحْمَنِ، وَسَعِيدِ بْنِ الْمُسَيَّبِ، عَنْ أَبِي هُرَيْرَةَ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: ((نَحْنُ أَحَقُّ بِالشَّكِّ مِنْ إِبْرَاهِيمَ ﷺ إِذْ قَالَ: ﴿رَبِّ أَرِنِي كَيْفَ تُحْيِ ٱلْمَوْتَىٰ قَالَ أَوَلَمْ تُؤْمِن قَالَ بَلَىٰ وَلَٰكِن لِّيَطْمَئِنَّ قَلْبِي﴾ قَالَ: ((وَيَرْحَمُ اللَّهُ لُوطًا، لَقَدْ كَانَ يَأْوِي إِلَى رُكْنٍ شَدِيدٍ، وَلَوْ لَبِثْتُ فِي السِّجْنِ طُولَ لَبْثِ يُوسُفَ لأَجَبْتُ الدَّاعِيَ)).

**[382]-238-(151)** ........ Əbu Hureyrə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Biz şübhə etməyə İbrahimdən daha çox haqlıyıq.[1] Bir zaman İbrahim: **"Ey Rəbbim, ölüləri necə diriltdiyini mənə göstər!"– dedi.** ***Rəbbi ona*****: "Məgər sən inanmırsan?"– dedi.** ***İbrahim*** **dedi: "Əlbəttə** ***inanıram!*** **Amma** ***istəyirəm ki,*** **qəlbim rahat olsun..."**[2] Allah Luta rəhmət eləsin! Həqiqətən, o, möhkəm bir dayağa söykənirdi[3]. Əgər mən Yusuf qədər zindanda qalsay-

---

[1] İbrahimin ﷺ Allahın ölüləri diriltməsinə şəkk etməsi mümkün deyil. Ayədən də açıq-aydın görünür ki, İbrahim ﷺ bunu imanını artırmaq üçün belə etmişdir. Belə isə bu sözün mənası budur ki: "Əgər İbrahim şəkk etmiş olsaydı, biz daha çox şəkk etməyə layiq olardıq. Lakin siz bilirsiniz ki, mən şəkk etmirəm, habelə İbrahim də şəkk etməmişdir".

[2] "əl-Bəqərə" surəsi, 260.

[3] Quranda deyilir: ***"Lut*** **dedi: "Kaş ki, sizə çatan bir qüvvəm olaydı, yaxud möhkəm bir dayağa söykənəydim!"** ("Hud" surəsi, 80). Lut peyğəmbər ﷺ qonaqların yanında üzrxahlıq edir və bildirmək istəyir ki, əgər onun qüdrəti çatsaydı, qövmünün onlara etmək istədiyi pisliyi dəf edərdi. Mələklər isə ona belə deyirlər: **"Ey Lut! Biz sənin Rəbbinin elçiləriyik. Onlar əsla sənə zərər yetirə bilməzlər. Gecənin bir vaxtında arvadından başqa** ***bütün*** **ailənlə yola düş. Qoy içinizdən heç kəs dönüb arxaya baxmasın. Çünki onların başına gələcək müsibət onun da başına gələcəkdir. Onların** ***həlak olmaq*** **vaxtı səhərdir. Məgər səhər yaxın deyilmi?" Əmrimiz gəldikdə oranın altını üstünə çevirdik və odda bişmiş gil daşları ardıcıl olaraq onların üstünə yağdırdıq"** ("Hud" surəsi, 81-82).

dım, (sonra da padşahın elçisi gəlib məni çağırsaydı,) mən onun çağırışını dərhal qəbul edərdim”.[1]

**[٣٨٣]** (...) و حَدَّثَنِي بِهِ إِنْ شَاءَ اللَّهُ عَبْدُ اللَّهِ بْنُ مُحَمَّدِ بْنِ أَسْمَاءَ الضُّبَعِيُّ: حَدَّثَنَا جُوَيْرِيَةُ عَنْ مَالِكٍ، عَنْ الزُّهْرِيِّ، أَنَّ سَعِيدَ بْنَ الْمُسَيَّبِ وَأَبَا عُبَيْدٍ أَخْبَرَاهُ، عَنْ أَبِي هُرَيْرَةَ عَنْ رَسُولِ اللَّهِ ﷺ بِمِثْلِ حَدِيثِ يُونُسَ عَنْ الزُّهْرِيِّ، وَفِي حَدِيثِ مَالِكٍ: ﴿وَلَٰكِن لِّيَطْمَئِنَّ قَلْبِي﴾ قَالَ: ثُمَّ قَرَأَ هَذِهِ الآيَةَ حَتَّى جَازَهَا.

**[383] (...)** ........ Malik Zuhridən, o da Səid ibn Museyyib və Əbu Ubeydədən, onlar da Əbu Hureyrədən, o da Peyğəmbərdən ﷺ Yunusun Zuhridən rəvayət etdiyi hədisin bənzərini rəvayət etmişlər. Malikin hədisində: “Sonra Peyğəmbər ﷺ: **“Amma *istəyirəm ki,* qəlbim rahat olsun...”**[2] ayəsini sonuna qədər oxudu.[3]

**[٣٨٤]** حَدَّثَنَاه عَبْدُ بْنُ حُمَيْدٍ قَالَ: حَدَّثَنِي يَعْقُوبُ يَعْنِي ابْنَ إِبْرَاهِيمَ بْنِ سَعْدٍ: حَدَّثَنَا أَبُو أُوَيْسٍ عَنْ الزُّهْرِيِّ كَرِوَايَةِ مَالِكٍ بِإِسْنَادِهِ. وَقَالَ: ثُمَّ قَرَأَ هَذِهِ الآيَةَ حَتَّى أَنْجَزَهَا.

**[384]** ........ Əbu Uveys, Zuhridən Malikin istinad edərək rəvayət etdiyi hədisin bənzərini rəvayət etmiş, sonra da bu ayəni sonuna qədər oxumuşdur.

## (٧٠) – بَابُ وُجُوبِ الإِيمَانِ بِرِسَالَةِ نَبِيِّنَا مُحَمَّدٍ ﷺ إِلَى جَمِيعِ النَّاسِ وَنَسْخِ الْمِلَلِ بِمِلَّتِهِ

## 70-ci fəsil. Peyğəmbərimiz Muhəmmədin ﷺ bütün bəşəriyyətə elçi göndərilməsinə və bütün dinlərin onun dini ilə ləğv edilməsinə iman gətirməyin vacib olması

**[٣٨٥] ٢٣٩–(١٥٢)** حَدَّثَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ: حَدَّثَنَا لَيْثٌ عَنْ سَعِيدِ بْنِ أَبِي سَعِيدٍ الْمَقْبُرِيِّ، عَنْ أَبِيهِ، عَنْ أَبِي هُرَيْرَةَ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: ((مَا مِنْ الأَنْبِيَاءِ مِنْ نَبِيٍّ إِلاَّ قَدْ أُعْطِيَ مِنْ الآيَاتِ مَا مِثْلُهُ آمَنَ عَلَيْهِ الْبَشَرُ، وَإِنَّمَا كَانَ الَّذِي أُوتِيتُ وَحْيًا أَوْحَى اللَّهُ إِلَيَّ، فَأَرْجُو أَنْ أَكُونَ أَكْثَرَهُمْ تَابِعًا يَوْمَ الْقِيَامَةِ)).

---

[1] Bu sözlə Peyğəmbər ﷺ Yusufu عليه السلام tərif etmiş və onun nə dərəcədə səbirli və təmkinli olduğunu bildirmişdir. Belə ki, Yusuf عليه السلام uzun illər zindanda qaldıqdan sonra padşahın əmri ilə onun xitmətçisi gəlib Yusufu عليه السلام zindandan çıxartmaq istədikdə, o, bundan imtina edir və özünün günahsız olduğu sübuta yetirilməyincə zindandan çıxmayacağını söyləyir. (6142-ci hədisə bax.)

[2] “əl-Bəqərə” surəsi, 260.

[3] Ayənin tamamı belədir: **“*Allah* buyurdu: “Quşlardan dördünü tut və onları özünə tərəf çəkib tikə-tikə et. Sonra hər dağın başına onlardan bir parça qoy, sonra da onları çağır, tez sənin yanına gələcəklər. Bil ki, Allah Qüdrətlidir, Müdrikdir!”**

**[385]-239-(152)** ........ Əbu Hureyrə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Peyğəmbərlərdən elə bir peyğəmbər olmamışdır ki, ona bəşəriyyətin inandığı möcüzələrdən (bir və ya daha çox möcüzə) verilmiş olmasın. (Möcüzə olaraq) mənə verilmiş şey isə Allahın mənə vəhy[1] etdiyi (Qurandır).[2]

---

[1] Vəhy: gizli danışıq, işarə etmə, əmr etmə, ilham vermə, pıçıldama, məktub yazma, elçi göndərmə, tələsdirmə, səs çıxarma. Uca Allahın bilavasitə və ya Özünəməxsus başqa üsullarla Öz əmrlərini peyğəmbərlərinə bildirməsi mənasında işlədilən bir Quran istilahıdır.

[2] Əvvəlki peyğəmbərlərin möcüzələrini yalnız onlarla bir əsrdə yaşamış insanlar görmüş və onlardan sonra gələnlərə həmin möcüzələrin baş verdiyini inandırmaq çətin olmuşdur. Muhəmməd Peyğəmbərin ﷺ möcüzəsi isə Qiyamətədək qalacaq Qurandır. Quranın nə dərəcədə üstün və fəzilətli bir Kitab olduğu isə aşağıdakı ayə və hədislərdə öz əksini tapmışdır:

**“Bu, qətiyyən şübhə doğurmayan, müttəqilərə doğru yol göstərən bir Kitabdır”** (“əl-Bəqərə” surəsi, 2).

**“Həqiqətən, bu *Quran, haqqı batildən* ayırd edən bir kəlamdır”** (“ət-Tariq” surəsi,13).

**“Bu, Bizim nazil etdiyimiz mübarək bir Kitabdır”** (“əl-Ənam” surəsi, 155).

**“Şübhəsiz ki, Zikri Biz nazil etdik, əlbəttə, Biz də onu qoruyacağıq”** (“əl-Hicr” surəsi, 9).

**“Biz Kitabı sənə hər şey üçün bir izah, müsəlmanlara da doğru yol göstəricisi, mərhəmət və müjdə olaraq nazil etdik”** (“ən-Nəhl” surəsi, 89).

“Quran oxuyan və ona əməl edən mömin turunca (şirin limona) bənzəyir, onun dadı da xoşdur, iyi də. Quran oxumayan, amma ona əməl edən mömin xurmaya bənzəyir, onun dadı gözəldir, amma iyisi yoxdur. Quran oxuyan münafiqin məsəli reyhan bitkisinə bənzəyir, onun iyi gözəl olsa da, dadı acıdır. Quran oxumayan münafiqin məsəli acı qovuna bənzəyir, onun iyi xoşagəlməzdir, dadı da acıdır” (“Səhih əl-Buxari”, 5059).

“Yalnız iki şəxsə həsəd aparmaq olar: O şəxsə ki, Allah ona Quranı öyrətmiş, o da onu gecə-gündüz oxuyur. Qonşusu bunu eşidib deyər: “Kaş ona verilənin bənzəri mənə də veriləydi, onun etdiyi əməli mən də edərdim.” Bir də o şəxsə ki, Allah ona var-dövlət bəxş etmiş, o da onu Allah yolunda lazımi yerlərə xərcləyir. Onu görən adam deyər: “Kaş ona verilənin bənzəri mənə də veriləydi, onun etdiyi əməli mən də edərdim” (“Səhih əl-Buxari”, 5026).

“Sizin ən xeyirliniz Quranı öyrənən və onu başqalarına öyrədən kimsələrdir” (“Səhih əl-Buxari”, 5027).

“Quran oxuyun! Çünki Quran, onu oxuyanlar üçün Qiyamət günü şəfaətçi olacaq (onu oxuyub əməl edənlərin tərəfini saxlayacaq)” (“Səhih Muslim”, 252).

“Kim Allahın Kitabından bir hərf oxusa, buna görə savab qazanar və bu savab on savaba bərabər olar. Mən demirəm ki, əlif, ləm, mim bir hərfdir. Lakin əlif bir hərf, ləm bir hərf, mim də bir hərfdir” (“Sunən ət-Tirmizi”, 2910).

“Allah bu Kitabın vasitəsilə bir qrup insanları ucaldır, digərilərini isə alçaldır” (“Səhih Muslim”, 1934). Bu Kitab möminlərin imanını artırır, kafirlərin və münafiqlərin isə murdarlığı üstünə murdarlıq artırır. Uca Allah buyurur: **“Bir surə nazil edildiyi zaman *münafiqlərdən istehza ilə*: “Bu, hansınızın imanını artırdı?”– deyənlər də var. İman gətirənlərə gəldikdə isə, *o surə* onların imanını artırır və onlar bir-birilərini müjdələyirlər. Qəlbində xəstəlik olanlara gəlincə, *o surə* onların murdarlığı üstünə bir murdarlıq da artırır və onlar kafir olaraq ölürlər”** (“ət-Tovbə” surəsi, 124-125).

“Quran oxuyan və onu əzbərdən bilən adam möhtərəm və müti mələklərlə eyni dərəcədədir. Çətinlik çəkə-çəkə daim Quran oxuyan adam isə iki savab qazanır” (“Səhih əl-Buxari”, 4937).

Odur ki, Qiyamət günü mənim ardıcıllarımın onların hamısından çox olacağına ümid edirəm"[1].

**[٣٨٦] ٢٤٠-(١٥٣)** حَدَّثَنِي يُونُسُ بْنُ عَبْدِ الأَعْلَى: أَخْبَرَنَا ابْنُ وَهْبٍ قَالَ: وَأَخْبَرَنِي عَمْرٌو، أَنَّ أَبَا يُونُسَ حَدَّثَهُ عَنْ أَبِي هُرَيْرَةَ عَنْ رَسُولِ اللَّهِ ﷺ أَنَّهُ قَالَ: ((وَالَّذِي نَفْسُ مُحَمَّدٍ بِيَدِهِ! لاَ يَسْمَعُ بِي أَحَدٌ مِنْ هَذِهِ الأُمَّةِ يَهُودِيٌّ وَلاَ نَصْرَانِيٌّ، ثُمَّ يَمُوتُ وَلَمْ يُؤْمِنْ بِالَّذِي أُرْسِلْتُ بِهِ، إِلاَّ كَانَ مِنْ أَصْحَابِ النَّارِ)).

**[386]-240-(153)** ........ Əbu Hureyrə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Muhəmmədin canı Əlində olan (Allaha) and olsun ki, bu ümmətdən hər (hansı) bir yəhudi və ya xristian mənim barəmdə eşidib, sonra da mənimlə göndəriləna iman gətirmədiyi halda ölərsə, mütləq Cəhənnəm əhlindən olar"[2].

**[٣٨٧] ٢٤١-(١٥٤)** حَدَّثَنَا يَحْيَى بْنُ يَحْيَى: أَخْبَرَنَا هُشَيْمٌ عَنْ صَالِحِ بْنِ صَالِحٍ الْهَمْدَانِيِّ، عَنْ الشَّعْبِيِّ، قَالَ: رَأَيْتُ رَجُلاً مِنْ أَهْلِ خُرَاسَانَ سَأَلَ الشَّعْبِيَّ فَقَالَ: يَا أَبَا عَمْرٍو! إِنَّ مَنْ قِبَلَنَا مِنْ أَهْلِ خُرَاسَانَ يَقُولُونَ – فِي الرَّجُلِ – إِذَا أَعْتَقَ أَمَتَهُ ثُمَّ تَزَوَّجَهَا: فَهُوَ كَالرَّاكِبِ بَدَنَتَهُ، فَقَالَ الشَّعْبِيُّ: حَدَّثَنِي أَبُو بُرْدَةَ بْنُ أَبِي مُوسَى عَنْ أَبِيهِ، أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: ((ثَلاَثَةٌ يُؤْتَوْنَ أَجْرَهُمْ مَرَّتَيْنِ: رَجُلٌ مِنْ أَهْلِ الْكِتَابِ آمَنَ بِنَبِيِّهِ وَأَدْرَكَ النَّبِيَّ ﷺ فَآمَنَ بِهِ وَاتَّبَعَهُ وَصَدَّقَهُ فَلَهُ أَجْرَانِ، وَعَبْدٌ مَمْلُوكٌ أَدَّى حَقَّ اللَّهِ تَعَالَى وَحَقَّ سَيِّدِهِ فَلَهُ أَجْرَانِ، وَرَجُلٌ كَانَتْ لَهُ أَمَةٌ فَغَذَّاهَا فَأَحْسَنَ غِذَاءَهَا، ثُمَّ أَدَّبَهَا فَأَحْسَنَ أَدَبَهَا، ثُمَّ أَعْتَقَهَا وَتَزَوَّجَهَا، فَلَهُ أَجْرَانِ)).

ثُمَّ قَالَ الشَّعْبِيُّ لِلْخُرَاسَانِيِّ: خُذْ هَذَا الْحَدِيثَ بِغَيْرِ شَيْءٍ، فَقَدْ كَانَ الرَّجُلُ يَرْحَلُ فِيمَا دُونَ هَذَا إِلَى الْمَدِينَةِ.

**[387]-241-(154)** ........ Saleh ibn Saleh əl-Həmdani demişdir: "Mən Xorasan əhlindən bir nəfər gördüm, (bu adam) Şəbiyə dedi: "Ey Əbu Amr! Bizim tərəf-

---

[1] 529-cu hədisə bax.

[2] Bu hədis, Muhəmməd Peyğəmbərin ﷺ göndərilməsi ilə əvvəlki şəriətlərin hamısının nəsx olunduğuna dəlalət edir. Belə ki, Allah Subhanəhu və Təalə Öz qullarından ancaq İslam dinini qəbul edir. Uca Allah buyurur: **"Həqiqətən, Allah yanında *qəbul olunan* din, İslamdır!"** ("Ali-İmran" surəsi, 19); **"Hər kim İslamdan başqa bir dinin dalınca gedərsə, o *din* heç vaxt ondan qəbul olunmaz və o kimsə Axirətdə ziyana uğrayanlardan olar"** ("Ali-İmran" surəsi, 85).

Hədisdən o da aydın olur ki, bu dindən xəbəri olmayan, özünə İslam dəvəti çatmamış hər kəs üzrlü sayılır. Peyğəmbər ﷺ demişdir: "Qiyamət günü dörd sinif insan imtahan olunacaq: heç bir şey eşitməyən kar, dəli, ağlını itirmiş qoca və bir də özünə dəvət gəlib çatmamış ölən kimsə. Kar deyəcək: "Ey Rəbbim! İslam gəldikdə mən heç nə eşitmirdim". Dəli deyəcək: "Ey Rəbbim! İslam gəldikdə, balaca uşaqlar mənə peyin atırdılar". Ağlını itirmiş qoca deyəcək: "Ey Rəbbim! İslam gəldikdə, mənim ağlım kəsmirdi". Özünə dəvət gəlib çatmamış ölən kimsə deyəcək: "Ey Rəbbim! Sənin elçilərindən heç biri mənim yanıma gəlməmişdir". Allah onlardan Ona itaət edəcəkləri barədə əhd aldıqdan sonra onlara xəbər göndərəcək ki, Oda girsinlər. Muhəmmədin canı Əlində olana (Allaha) and olsun ki, əgər onlar Oda girsələr, bu onlar üçün sərin və zərərsiz olar" ("Müsnəd İmam Əhməd", 4/24; "Silsilətul Əhadis əs-Səhihə", 1434).

lərdə xorasanlılardan bəziləri, öz kənizini azad edib sonra onunla evlənən kimsə haqqında: "O, qurbanlıq dəvəsinə minmiş kimidir"– deyirlər. Şəbi dedi: "Əbu Burdə ibn Əbu Musa öz atasından mənə rəvayət etmişdir ki, Peyğəmbər ﷺ belə buyurmuşdur: "Savabları özlərinə ikiqat verilən üç qisim insan vardır:

– Kitab əhlindən olan bir kimsə (əvvəlcə) öz peyğəmbərinə iman gətirər, sonra da Muhəmmədə ﷺ yetişər və ona iman gətirər, onun ardınca gedər və onun (gətirdiyini) təsdiqləyərsə, ikiqat savab qazanar;[1]

– Kölə edilmiş bir qul həm Uca Allahın haqqını, həm də ağasının haqqını ödəyərsə, ikiqat savab qazanar;

– Cariyəyə[2] sahib olan bir adam onun qayğısına qalar və bunu gözəl tərzdə yerinə yetirər, habelə ona tərbiyə verər və bunu gözəl tərzdə yerinə yetirər, sonra da onu azad edib onunla evlənərsə, ikiqat savab qazanar".

Sonra Şəbi xorasanlıya dedi: "Heç bir şey (vermədən) hədisi götür. Vaxtı ilə adam belə bir hədisi öyrənmək üçün ta Mədinəyə qədər gedərdi".[3]

**[٣٨٨]** و حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا عَبْدَةُ بْنُ سُلَيْمَانَ؛ ح: و حَدَّثَنَا ابْنُ أَبِي عُمَرَ: حَدَّثَنَا سُفْيَانُ؛ ح: و حَدَّثَنَا عُبَيْدُ اللَّهِ بْنُ مُعَاذٍ: حَدَّثَنَا أَبِي: حَدَّثَنَا شُعْبَةُ، كُلُّهُمْ عَنْ صَالِحِ بْنِ صَالِحٍ بِهَذَا الإِسْنَادِ نَحْوَهُ.

**[388]** ........ Abdə ibn Suleyman, Süfyan və Şobə – onların hamısı Saleh ibn Salehdən bu isnadla həmin hədisin bənzərini rəvayət etmişlər.

## (٧١) – بَابُ نُزُولِ عِيسَى ابْنِ مَرْيَمَ حَاكِمًا بِشَرِيعَةِ نَبِيِّنَا مُحَمَّدٍ ﷺ

## 71-ci fəsil. Məryəm oğlu İsanın Peyğəmbərimiz Muhəmmədin ﷺ şəriəti ilə hökm edən bir kimsə olaraq nazil olması[4]

**[٣٨٩] ٢٤٢**–(١٥٥) حَدَّثَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ: حَدَّثَنَا لَيْثٌ؛ ح: و حَدَّثَنَا مُحَمَّدُ بْنُ رُمْحٍ: أَخْبَرَنَا اللَّيْثُ عَنِ ابْنِ شِهَابٍ، عَنِ ابْنِ الْمُسَيَّبِ، أَنَّهُ سَمِعَ أَبَا هُرَيْرَةَ يَقُولُ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((وَالَّذِي نَفْسِي بِيَدِهِ!

---

[1] Uca Allah buyurur: **"*Qurandan* əvvəl özlərinə Kitab verdiyimiz kəslər ona iman gətirirlər. Onlara *Quran* oxunduğu zaman: "Biz ona iman gətirdik. O, həqiqətən də, Rəbbimizdən olan haqdır. Biz ondan əvvəl də müsəlman idik!"– deyirlər. Səbir etdiklərinə görə onlara mükafatları ikiqat veriləcəkdir"** ("əl-Qəsəs" surəsi, 52-54).

[2] 93-cü hədisin qeydlərinə bax.

[3] Bu hədis dəlalət edir ki, sələflər – Allah onlara rəhmət eləsin! – bir hədis və ya bir məsələ dalınca uzaq ölkələrə gedərdilər. (3499-cu hədisə bax.)

[4] Bu xüsusda Uca Allah buyurur: "**Həqiqətən, *İsanın yer üzünə enməsi Qiyamət* saatının *yaxınlaşmasının* əlamətidir**" ("əz-Zuxruf" surəsi, 61).

لَيُوشكَنَّ أَنْ يَنْزِلَ فِيكُمْ ابْنُ مَرْيَمَ ﷺ حَكَمًا مُقْسِطًا، فَيَكْسِرَ الصَّلِيبَ، وَيَقْتُلَ الْخِنْزِيرَ، وَيَضَعَ الْجِزْيَةَ، وَيَفِيضُ الْمَالُ حَتَّى لاَ يَقْبَلَهُ أَحَدٌ)).

**[389]-242-(155)** ........ Əbu Hureyrə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Canım Əlində olan *Allaha* and olsun ki, tezliklə Məryəm oğlu (İsa) aranızda ədalətlə hökm vermək üçün[1] sizin yanınıza enib xaçları sındıracaq, donuzları öldürəcək və cizyəni[2] aradan qaldıracaq.[3] (Həmin vaxt) mal-dövlət o qədər artacaq ki, heç kəs sədəqə götürmək istəməyəcək".

**[٣٩٠]** و حَدَّثَنَاه عَبْدُ الْأَعْلَى بْنُ حَمَّادٍ وَأَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ وَزُهَيْرُ بْنُ حَرْبٍ قَالُوا: حَدَّثَنَا سُفْيَانُ بْنُ عُيَيْنَةَ؛ ح: و حَدَّثَنِيهِ حَرْمَلَةُ بْنُ يَحْيَى :أَخْبَرَنَا ابْنُ وَهْبٍ قَالَ: حَدَّثَنِي يُونُسُ؛ ح: و حَدَّثَنَا حَسَنٌ الْحُلْوَانِيُّ وَعَبْدُ بْنُ حُمَيْدٍ، عَنْ يَعْقُوبَ بْنِ إِبْرَاهِيمَ بْنِ سَعْدٍ: حَدَّثَنَا أَبِي عَنْ صَالِحٍ، كُلُّهُمْ عَنْ الزُّهْرِيِّ بِهَذَا الإِسْنَادِ، وَفِي رِوَايَةِ ابْنِ عُيَيْنَةَ: ((إِمَامًا مُقْسِطًا وَحَكَمًا عَدْلاً)). وَفِي رِوَايَةِ يُونُسَ: ((حَكَمًا عَادِلاً)) وَلَمْ يَذْكُرْ ((إِمَامًا مُقْسِطًا))، وَفِي حَدِيثِ صَالِحٍ ((حَكَمًا مُقْسِطًا)). كَمَا قَالَ اللَّيْثُ، وَفِي حَدِيثِهِ مِنْ الزِّيَادَةِ ((وَحَتَّى تَكُونَ السَّجْدَةُ الْوَاحِدَةُ خَيْرًا مِنْ الدُّنْيَا وَمَا فِيهَا)).

ثُمَّ يَقُولُ أَبُو هُرَيْرَةَ: اقْرَءُوا إِنْ شِئْتُمْ: ﴿ وَإِن مِّنْ أَهْلِ ٱلْكِتَـٰبِ إِلَّا لَيُؤْمِنَنَّ بِهِۦ قَبْلَ مَوْتِهِۦ ﴾ الآيَةَ.

**[390]** ........ İbn Uyeynə, Yunus və Saleh – onların hamısı Zuhridən bu isnadla həmin hədisi rəvayət etmişlər. İbn Uyeynənin rəvayətində: "adil bir imam və ədalətli bir hakim olaraq"– demiş, Yunusun rəvayətində isə "ədalətli bir hakim olaraq"– demiş və "adil bir imam" sözünü zikr etməmişdir. Salehin hədisində isə Leysin rəvayətindəki kimi: "adil bir hakim olaraq"– demişdir. Salehin hədisində ziyadə olaraq: "və hətta tək bir səcdə, dünya və onun içindəkilərdən daha xeyirli olacaq[4]"– demişdir.

Sonra Əbu Hureyrə dedi: "İstəyirsinizsə, (bu ayəni) oxuyun: **"Kitab əhlindən elə kimsə yoxdur ki, *öz ölümündən, yaxud İsanın* ölümündən əvvəl ona iman gətirməsin. Qiyamət günü isə *İsa* onların əleyhinə şahid olacaqdır"** ("ən-Nisa" surəsi, 159).[5]

---

[1] Bu dəlildir ki, İsa əleyhissəlam yeni bir şəriət gətirməyəcək, əksinə, bu ümmətə başçılıq edəcək ədalətli bir hakim olaraq göndəriləcək.

[2] Müsəlman dövlətinin himayəsi altında yaşayan qeyri-müsəlmanlardan alınan mal və ya can vergisi.

[3] Burada "cizyəni aradan qaldıracaq" deyildikdə cizyəni qəbul etməyəcəyi qəsd edilir. Yəni kafirlərə İslam dinini qəbul etmək, əks halda isə vuruşmaq təklif ediləcək.

[4] İnsanlar Qiyamətin yaxınlaşdığını bildiyindən və dünya malına rəğbət bəsləmədiyindən davamlı ibadət edəcəklər.

[5] 7342-ci hədisə bax.

**[٣٩١] ٢٤٣**–(...) حَدَّثَنَا قُتَيْبَةُ بْنُ سَعِيد: حَدَّثَنَا لَيْثٌ عَنْ سَعِيد بْنِ أَبِي سَعِيد، عَنْ عَطَاءِ بْنِ مِينَاءَ عَنْ أَبِي هُرَيْرَةَ، أَنَّهُ قَالَ قَالَ رَسُولُ اللَّه ﷺ: ((وَاللَّه! لَيَنْزِلَنَّ ابْنُ مَرْيَمَ حَكَمًا عَادِلاً، فَلَيَكْسِرَنَّ الصَّلِيبَ، وَلَيَقْتُلَنَّ الْخِنْزِيرَ، وَلَيَضَعَنَّ الْجِزْيَةَ، وَلَتُتْرَكَنَّ الْقِلاَصُ فَلاَ يُسْعَى عَلَيْهَا، وَلَتَذْهَبَنَّ الشَّحْنَاءُ وَالتَّبَاغُضُ وَالتَّحَاسُدُ وَلَيَدْعُوَنَّ إِلَى الْمَالِ فَلاَ يَقْبَلُهُ أَحَدٌ)).

**[391]-243-(...)** ........ Əbu Hureyrə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Allaha and olsun ki, Məryəm oğlu (İsa) adil bir hakim olaraq enəcək, sonra da xaçları sındıracaq, donuzları öldürəcək və cizyəni aradan qaldıracaq. Həmin vaxt cavan dişi dəvələr tərk olunacaq və onlara rəğbət bəslənilməyəcək.[1] Düşmənçilik, bir-birinə nifrət bəsləmək və bir-birinə həsəd etmək aradan qaldırılacaq. (Varlılar insanları) sədəqə götürməyə çağıracaqlar, lakin heç kəs onu qəbul etməyəcək".

**[٣٩٢] ٢٤٤**–(...) حَدَّثَنِي حَرْمَلَةُ بْنُ يَحْيَى: أَخْبَرَنَا ابْنُ وَهْب: أَخْبَرَنِي يُونُسُ عَنِ ابْنِ شِهَاب قَالَ: أَخْبَرَنِي نَافِعٌ مَوْلَى أَبِي قَتَادَةَ الأَنْصَارِيِّ، أَنَّ أَبَا هُرَيْرَةَ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((كَيْفَ أَنْتُمْ إِذَا نَزَلَ ابْنُ مَرْيَمَ فِيكُمْ، وَإِمَامُكُمْ مِنْكُمْ؟)).

**[392]-244-(...)** ........ Əbu Hureyrə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Məryəm oğlu (İsa) yanınıza nazil olacağı, üstəlik də sizə imamlıq edən adamın öz içinizdən birisi olacağı zaman sizin halınız necə olacaq?!"[2]

**[٣٩٣] ٢٤٥**–(...) و حَدَّثَنِي مُحَمَّدُ بْنُ حَاتِمِ بْنِ مَيْمُون: حَدَّثَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ: حَدَّثَنَا ابْنُ أَخِي ابْنِ شِهَاب عَنْ عَمِّهِ قَالَ: أَخْبَرَنِي نَافِعٌ مَوْلَى أَبِي قَتَادَةَ الأَنْصَارِيِّ أَنَّهُ سَمِعَ أَبَا هُرَيْرَةَ يَقُولُ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((كَيْفَ أَنْتُمْ إِذَا نَزَلَ ابْنُ مَرْيَمَ فِيكُمْ وَأَمَّكُمْ؟)).

**[393]-245-(...)** ........ Əbu Hureyrə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Məryəm oğlu (İsa) yanınıza enəcəyi və sizə imamlıq edəcəyi zaman sizin halınız necə olacaq?!"

**[٣٩٤] ٢٤٦**–(...) و حَدَّثَنَا زُهَيْرُ بْنُ حَرْب: حَدَّثَنِي الْوَلِيدُ بْنُ مُسْلِم: حَدَّثَنَا ابْنُ أَبِي ذِئْب، عَنِ ابْنِ شِهَاب، عَنْ نَافِعٍ مَوْلَى أَبِي قَتَادَةَ، عَنْ أَبِي هُرَيْرَةَ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: ((كَيْفَ أَنْتُمْ إِذَا نَزَلَ فِيكُمُ ابْنُ مَرْيَمَ

---

[1] Yəni o zaman mal-dövlət olduqca çox olduğundan, insanların bu dəvələrə ehtiyacı olmayacaq və heç kəs bunlardan zəkat üçün ayrılmış olanları götürməyəcək.

[2] Yəni təsəvvür edin ki, bu hadisə baş verdikdə müsəlmanlar necə sevinəcək və bununla necə fəxr edəcəklər.

فَأَمَّكُمْ مِنكُمْ؟)) فَقُلْتُ لابْنِ أَبِي ذِئْبٍ: إِنَّ الأَوْزَاعِيَّ حَدَّثَنَا عَنْ الزُّهْرِيِّ، عَنْ نَافِعٍ، عَنْ أَبِي هُرَيْرَةَ ((وَإِمَامُكُمْ مِنْكُمْ)) قَالَ ابْنُ أَبِي ذِئْبٍ، تَدْرِي مَا أَمَّكُمْ مِنْكُمْ؟ قُلْتُ: تُخْبِرُنِي قَالَ: فَأَمَّكُمْ بِكِتَابِ رَبِّكُمْ تَبَارَكَ وَتَعَالَى وَسُنَّةِ نَبِيِّكُمْ ﷺ.

**[394]-246-(...)** ........ Əbu Hureyrə ؓ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Məryəm oğlu (İsa) yanınıza enəcəyi və sizə sizdən imam təyin edəcəyi zaman sizin halınız necə olacaq?!"

Vəlid dedi: "Mən İbn Əbu Zibə dedim: "Əvzai bizə Zuhridən, o da Nafidən, o da Əbu Hureyrədən: "İmamınız özünüzdən olacaq"– deyə rəvayət etmişdir. İbn Əbu Zib dedi: "Heç bilirsən: "Sizə sizdən imam təyin edəcək" nə deməkdir?" Dedim: "Mənə xəbər versən, (bilərəm)". Dedi: "Sizə Uca və Ulu Allahın Kitabı və Peyğəmbərinizin ﷺ Sünnəsi ilə rəhbərlik edəcək".

**[٣٩٥] ٢٤٧–(١٥٦)** حَدَّثَنَا الْوَلِيدُ بْنُ شُجَاعٍ وَهَارُونُ بْنُ عَبْدِ اللَّهِ وَحَجَّاجُ بْنُ الشَّاعِرِ قَالُوا: حَدَّثَنَا حَجَّاجٌ وَهُوَ ابْنُ مُحَمَّدٍ عَنْ ابْنِ جُرَيْجٍ قَالَ: أَخْبَرَنِي أَبُو الزُّبَيْرِ أَنَّهُ سَمِعَ جَابِرَ بْنَ عَبْدِ اللَّهِ يَقُولُ: سَمِعْتُ النَّبِيَّ ﷺ يَقُولُ: ((لاَ تَزَالُ طَائِفَةٌ مِنْ أُمَّتِي يُقَاتِلُونَ عَلَى الْحَقِّ ظَاهِرِينَ إِلَى يَوْمِ الْقِيَامَةِ، قَالَ: فَيَنْزِلُ عِيسَى ابْنُ مَرْيَمَ ﷺ فَيَقُولُ أَمِيرُهُمْ: تَعَالَ صَلِّ لَنَا، فَيَقُولُ: لاَ، إِنَّ بَعْضَكُمْ عَلَى بَعْضٍ أُمَرَاءُ، تَكْرِمَةَ اللَّهِ هَذِهِ الأُمَّةَ)).

**[395]-247-(156)** ........ Cabir ibn Abdullah ؓ demişdir: "Mən Peyğəmbərin ﷺ belə dediyini eşitdim: "Ümmətimdən bir qrup insan Qiyamət gününədək haqq üzərində vuruşaraq qələbə çalmaqda davam edəcəkdir. Nəhayət, Məryəm oğlu İsa ﷺ enəcək və müsəlmanların əmiri[1] (ona): "Gəl, bizə namaz qıldır"– deyəcək. İsa isə belə buyuracaq: "Xeyr! Allahın bu ümmətə olan lütfü sayəsində sizin bir qisminiz digərilərinizin üzərində əmirdirlər".

## (٧٢) – بَابُ بَيَانِ الزَّمَنِ الَّذِي لاَ يُقْبَلُ فِيهِ الإِيمَانُ

## 72-ci fəsil. İmanın qəbul edilməyəcəyi vaxtın bəyan olunması

**[٣٩٦] ٢٤٨–(١٥٧)** حَدَّثَنَا يَحْيَى بْنُ أَيُّوبَ وَقُتَيْبَةُ بْنُ سَعِيدٍ وَعَلِيُّ بْنُ حُجْرٍ قَالُوا: حَدَّثَنَا إِسْمَعِيلُ يَعْنُونَ ابْنَ جَعْفَرٍ، عَنْ الْعَلاَءِ وَهُوَ ابْنُ عَبْدِ الرَّحْمَنِ عَنْ أَبِيهِ، عَنْ أَبِي هُرَيْرَةَ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: ((لاَ تَقُومُ السَّاعَةُ حَتَّى تَطْلُعَ الشَّمْسُ مِنْ مَغْرِبِهَا، فَإِذَا طَلَعَتْ مِنْ مَغْرِبِهَا آمَنَ النَّاسُ كُلُّهُمْ أَجْمَعُونَ، فَيَوْمَئِذٍ:

[1] Burada Fatimənin ؓ nəslindən olacaq, Mehdi ləqəbi ilə tanınmış Muhəmməd ibn Abdullah nəzərdə tutulur.

﴿لَا يَنفَعُ نَفْسًا إِيمَٰنُهَا لَمْ تَكُنْ ءَامَنَتْ مِن قَبْلُ أَوْ كَسَبَتْ فِيٓ إِيمَٰنِهَا خَيْرًا﴾.

**[396]-248-(157)** ........ Əbu Hureyrə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Günəş batdığı yerdən doğmayınca Qiyamət qopmayacaq. Günəş məğribdən doğduğu zaman insanların hamısı birlikdə iman gətirəcək, (lakin artıq iş işdən keçmiş olacaq[1]) və həmin gün: **"əvvəlcə iman gətirməmiş və ya imanında bir xeyir qazanmamış kimsəyə iman gətirməsi fayda verməyəcəkdir"** ("əl-Ənam" surəsi, 158).[2]

**[٣٩٧]** حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ وَابْنُ نُمَيْرٍ وَأَبُو كُرَيْبٍ قَالُوا: حَدَّثَنَا ابْنُ فُضَيْلٍ؛ ح: و حَدَّثَنِي زُهَيْرُ بْنُ حَرْبٍ: حَدَّثَنَا جَرِيرٌ، كِلاَهُمَا عَنْ عُمَارَةَ بْنِ الْقَعْقَاعِ، عَنْ أَبِي زُرْعَةَ عَنْ أَبِي هُرَيْرَةَ عَنِ النَّبِيِّ ﷺ؛ ح: و حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا حُسَيْنُ بْنُ عَلِيٍّ، عَنْ زَائِدَةَ، عَنْ عَبْدِ اللَّهِ بْنِ ذَكْوَانَ، عَنْ عَبْدِ الرَّحْمَنِ الأَعْرَجِ، عَنْ أَبِي هُرَيْرَةَ عَنِ النَّبِيِّ ﷺ؛ ح: و حَدَّثَنَا مُحَمَّدُ بْنُ رَافِعٍ: حَدَّثَنَا عَبْدُ الرَّزَّاقِ: حَدَّثَنَا مَعْمَرٌ عَنْ هَمَّامِ بْنِ مُنَبِّهٍ، عَنْ أَبِي هُرَيْرَةَ عَنِ النَّبِيِّ ﷺ بِمِثْلِ حَدِيثِ الْعَلاَءِ عَنْ أَبِيهِ عَنْ أَبِي هُرَيْرَةَ عَنِ النَّبِيِّ ﷺ.

**[397]** ........ İbn Fudeyl və Cərir – hər ikisi Umarə ibn Qa'qadan, o da Əbu Zurədən, o da Əbu Hureyrədən, o da Peyğəmbərdən ﷺ, həmçinin Huseyn ibn Əli Zaidədən, o da Abdullah ibn Zəkvandan, o da Abdur-Rəhman əl-Ərəcdən, o da Əbu Hureyrədən, o da Peyğəmbərdən ﷺ, habelə Məmər, Həmmam ibn Munəbbihdən, o da Əbu Hureyrədən, o da Peyğəmbərdən ﷺ, Alənin atasından, o da Əbu Hureyrədən, o da Peyğəmbərdən ﷺ rəvayət etdiyi hədisin bənzərini rəvayət etmişlər.

**[٣٩٨] ٢٤٩**-(١٥٨) و حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ وَزُهَيْرُ بْنُ حَرْبٍ قَالاَ: حَدَّثَنَا وَكِيعٌ؛ ح: و حَدَّثَنِيهِ زُهَيْرُ بْنُ حَرْبٍ: حَدَّثَنَا إِسْحَقُ بْنُ يُوسُفَ الأَزْرَقُ، جَمِيعًا عَنْ فُضَيْلِ بْنِ غَزْوَانَ؛ ح: و حَدَّثَنَا أَبُو كُرَيْبٍ مُحَمَّدُ بْنُ الْعَلاَءِ وَاللَّفْظُ لَهُ: حَدَّثَنَا ابْنُ فُضَيْلٍ عَنْ أَبِيهِ، عَنْ أَبِي حَازِمٍ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ ((ثَلاَثٌ إِذَا خَرَجْنَ لاَ يَنْفَعُ نَفْسًا إِيمَانُهَا لَمْ تَكُنْ آمَنَتْ مِنْ قَبْلُ أَوْ كَسَبَتْ فِي إِيمَانِهَا خَيْرًا طُلُوعُ الشَّمْسِ مِنْ مَغْرِبِهَا، وَالدَّجَّالُ، وَدَابَّةُ الأَرْضِ)).

**[398]-249-(158)** ........ Əbu Hureyrə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Üç (əlamət) vardır ki, onlar zühur etdiyi gün əvvəlcə iman gətirməmiş

[1] 2339, 6792, 7256 və 7301 saylı hədislərə bax.

[2] Artıq tövbə qəbul edilməyəcək.

və ya imanında bir xeyir qazanmamış kimsəyə iman gətirməsi fayda verməyəcəkdir; (bu,) günəşin məğribdən doğması, Dəccal[1] və yer heyvanıdır[2]".

**[٣٩٩] ٢٥٠-(١٥٩)** حَدَّثَنَا يَحْيَى بْنُ أَيُّوبَ وَإِسْحَقُ بْنُ إِبْرَاهِيمَ، جَمِيعًا عَنْ ابْنِ عُلَيَّةَ - قَالَ ابْنُ أَيُّوبَ: حَدَّثَنَا ابْنُ عُلَيَّةَ -: حَدَّثَنَا يُونُسُ، عَنْ إِبْرَاهِيمَ بْنِ يَزِيدَ التَّيْمِيِّ - سَمِعَهُ فِيمَا أَعْلَمُ - عَنْ أَبِيهِ، عَنْ أَبِي ذَرٍّ أَنَّ النَّبِيَّ ﷺ قَالَ يَوْمًا: ((أَتَدْرُونَ أَيْنَ تَذْهَبُ هَذِهِ الشَّمْسُ؟)) قَالُوا: اللَّهُ وَرَسُولُهُ أَعْلَمُ. قَالَ: ((إِنَّ هَذِهِ تَجْرِي حَتَّى تَنْتَهِيَ إِلَى مُسْتَقَرِّهَا تَحْتَ الْعَرْشِ، فَتَخِرُّ سَاجِدَةً فَلاَ تَزَالُ كَذَلِكَ حَتَّى يُقَالَ لَهَا: ارْتَفِعِي، ارْجِعِي مِنْ حَيْثُ جِئْتِ فَتَرْجِعُ، فَتُصْبِحُ طَالِعَةً مِنْ مَطْلِعِهَا، ثُمَّ تَجْرِي حَتَّى تَنْتَهِيَ إِلَى مُسْتَقَرِّهَا تَحْتَ الْعَرْشِ، فَتَخِرُّ سَاجِدَةً، وَلاَ تَزَالُ كَذَلِكَ حَتَّى يُقَالَ لَهَا: ارْتَفِعِي، ارْجِعِي مِنْ حَيْثُ جِئْتِ، فَتَرْجِعُ فَتُصْبِحُ طَالِعَةً مِنْ مَطْلِعِهَا،

---

[1] **Dəccalın əlamətləri:**

Peyğəmbər ﷺ (səhabələrinə belə) demişdir: "Mən Dəccal barəsində sizə elə bir söz deyəcəyəm ki, (onu) heç bir peyğəmbər öz ümmətinə deməmişdir. Bilin ki, o, təkgözdür. Allah isə təkgöz deyildir" ("Səhih əl-Buxari", 3057).

Həmçinin demişdir: "Məsih Dəccal alçaqboylu, əyriayaq, buruqsaç, təkgöz – gözü də sürtülmüş, nə domba, nə də batıq olan bir kişidir. Əgər çaşbaş qalsanız (onun kim olduğunu ayırd edə bilməsəniz,) bilin ki, Rəbbiniz təkgöz deyildir" ("Sunən Əbu Davud", 3763; "Səhih əl-Cami əs-Səğir", 2455).

Həmşinin, demişdir: "...Sonra dönüb qarşımda qırmızıdərili, cüssəli, buruqsaç və sağ gözü kor olan birisini gördüm. Onun gözü sanki domba üzüm dənəsi idi. Mən soruşdum: "Bu kimdir?" Dedilər: "Bu, Dəccaldır!.." ("Səhih əl-Buxari", 3441).

Həmçinin demişdir: "Dəccalın iki gözü arasında "kəf, fa, ra" yəni kafir (sözü) yazılıb. Oxumağı bacaran və bacarmayan hər bir müsəlman onu oxuyacaq" ("Səhih Muslim", 2933 və 7549).

Həmçinin demişdir: "Məsih Dəccal hər yeri gəzib-dolaşacaq. Yalnız dörd məsciddən başqa: Məscidul-Həram, Mədinə-Məscidi, ət-Tur və Məscidul-Əqsa" ("Musnəd Əhməd", 5/434).

Həmçinin demişdir: "Dəccal zühur edəcəyi zaman onun yanında su və od olacaq. İnsanlar nəyi od zənn edəcəklərsə, əslində, bu, sərin su olacaq. Nəyi sərin su zənn edəcəklərsə, o, yandırıb-yaxan bir od olacaq. Sizlərdən kim o vaxta qədər yaşasa, od zənn etdiyi şeyin içinə girsin. Həqiqətdə, o, şirin və sərin bir su olacaq" ("Səhih əl-Buxari", 3450).

**Dəccaldan qorunmağın yolları:**

Peyğəmbər ﷺ dua edib deyərdi: "Allahummə inni əuzu bikə min əzabil-qabri və min əzabin-nari və min fitnətil-məhyə vəl-məmati və min fitnətil-məsihid-dəccal. (Allahım! Qəbir əzabından, Cəhənnəm əzabından, həyatın və ölümün fitnəsindən və məsihid-dəccalın fitnəsindən Sənə sığınıram!)" ("Səhih əl-Buxari", 1377).

Peyğəmbər ﷺ demişdir: "Kim "əl-Kəhf" surəsinin əvvəlindəki on ayəni əzbərləsə, bu onu Dəccalın fitnəsindən qoruyar" ("Səhih Muslim", 1919); digər rəvayətdə isə belə demişdir: "Kim "əl-Kəhf" surəsinin axırındakı on ayəni oxuyarsa, bu onu Dəccalın fitnəsindən qoruyar" ("Səhih Muslim", 1920).

[2] Uca Allah buyurur: **"Qiyamət onların başlarının üstünü aldığı zaman, onlar üçün yerdən elə bir heyvan çıxardarıq ki, onlarla danışıb insanların ayələrimizə yəqinliklə inanmadıqlarını söyləyər"** ("ən-Nəml" surəsi, 82).

ثُمَّ تَجْرِي لاَ يَسْتَنْكِرُ النَّاسَ مِنْهَا شَيْئًا حَتَّى تَنْتَهِيَ إِلَى مُسْتَقَرِّهَا ذَاكَ تَحْتَ الْعَرْشِ فَيُقَالُ لَهَا: ارْتَفِعِي، أَصْبِحِي طَالِعَةً مِنْ مَغْرِبِكِ، فَتُصْبِحُ طَالِعَةً مِنْ مَغْرِبِهَا)) فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: ((أَتَدْرُونَ مَتَى ذَاكُمْ؟ ذَاكَ حِينَ ﴿لَا يَنفَعُ نَفْسًا إِيمَٰنُهَا لَمْ تَكُنْ ءَامَنَتْ مِن قَبْلُ أَوْ كَسَبَتْ فِىٓ إِيمَٰنِهَا خَيْرًا﴾.

**[399]-250-(159)** ........ Əbu Zərr ﷺ demişdir: "Bir gün Peyğəmbər ﷺ (səhabələrindən) soruşdu: "Bu günəşin hara getdiyini bilirsinizmi?" Onlar: "Allah və Onun elçisi daha yaxşı bilir!"– deyə cavab verdilər. Peyğəmbər ﷺ buyurdu: "Bu (günəş) Ərşin altındakı qaldığı yerə çatıncaya qədər gedib (orada) səcdəyə qapanır və (uzun müddət) bu vəziyyətdə qalır. Nəhayət, ona: "Qalx, gəldiyin yerə qayıt!"– deyilir, o da qayıdıb doğduğu yerdən təkrar doğur. Sonra (yenidən) Ərşin altındakı qaldığı yerə çatıncaya qədər gedib (orada) səcdəyə qapanır və (uzun müddət) bu vəziyyətdə qalır. Nəhayət, ona: "Qalx, gəldiyin yerə qayıt!"– deyilir, o da qayıdıb doğduğu yerdən təkrar doğur. Beləcə günəş insanlar ondan heç bir şeyi gizlətməyəcəkləri (aşkarda əxlaqsız işlər görəcəkləri) vaxtadək hərəkətinə davam edər. Nəhayət, o, Ərşin altındakı qaldığı yerə gələcək və ona: "Qalx, batdığın yerdən doğ!"– deyiləcək, o da batdığı yerdən doğacaq". Sonra Peyğəmbər ﷺ soruşdu: "Bunun nə vaxt baş verəcəyini bilirsinizmi?" Bu: **"Əvvəlcə iman gətirməmiş və ya imanında bir xeyir qazanmamış kimsəyə iman gətirməsi fayda verməyəcəkdir"**[1] (deyə xəbər verilən) bir vaxtda (baş verəcək)".

**[٤٠٠]** و حَدَّثَنِي عَبْدُ الْحَمِيدِ بْنُ بَيَانٍ الْوَاسِطِيُّ: أَخْبَرَنَا خَالِدٌ يَعْنِي ابْنَ عَبْدِ اللَّهِ عَنْ يُونُسَ، عَنْ إِبْرَاهِيمَ التَّيْمِيِّ، عَنْ أَبِيهِ، عَنْ أَبِي ذَرٍّ أَنَّ النَّبِيَّ ﷺ قَالَ يَوْمًا: ((أَتَدْرُونَ أَيْنَ تَذْهَبُ هَذِهِ الشَّمْسُ؟)) بِمِثْلِ مَعْنَى حَدِيثِ ابْنِ عُلَيَّةَ.

**[400]** ........ İbrahim ət-Teymi atasından, o da Əbu Zərdən rəvayət etmişdir ki: "Bir gün Peyğəmbər ﷺ (səhabələrindən): "Bu günəşin hara getdiyini bilirsinizmi?"– deyə soruşdu..."

Bu da İbn Uleyyənin hədisinə bənzər rəvayət edilmişdir.

**[٤٠١]** (...) و حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ وَأَبُو كُرَيْبٍ – وَاللَّفْظُ لأَبِي كُرَيْبٍ – قَالاَ: حَدَّثَنَا أَبُو مُعَاوِيَةَ: حَدَّثَنَا الأَعْمَشُ عَنْ إِبْرَاهِيمَ التَّيْمِيِّ، عَنْ أَبِيهِ، عَنْ أَبِي ذَرٍّ قَالَ: دَخَلْتُ الْمَسْجِدَ وَرَسُولُ اللَّهِ ﷺ جَالِسٌ،

[1] "əl-Ənam" surəsi, 158.

فَلَمَّا غَابَتْ الشَّمْسُ قَالَ: ((يَا أَبَا ذَرٍّ! هَلْ تَدْرِي أَيْنَ تَذْهَبُ هَذِهِ؟)) قَالَ، قُلْتُ: اللَّهُ وَرَسُولُهُ أَعْلَمُ. قَالَ: ((فَإِنَّهَا تَذْهَبُ فَتَسْتَأْذِنُ فِي السُّجُودِ، فَيُؤْذَنُ لَهَا، وَكَأَنَّهَا قَدْ قِيلَ لَهَا: ارْجِعِي مِنْ حَيْثُ جِئْتِ، فَتَطْلُعُ مِنْ مَغْرِبِهَا)).

قَالَ ثُمَّ قَرَأَ فِي قِرَاءَةِ عَبْدِ اللَّهِ: وَذَلِكَ مُسْتَقَرٌّ لَهَا.

**[401] (...)** ........ Əbu Zərr ﷺ belə rəvayət etmişdir: "Mən məscidə daxil oldum. Peyğəmbər ﷺ də (bir tərəfdə) oturmuşdu. Günəş batdıqda o soruşdu: "Ey Əbu Zərr! Bu günəşin hara getdiyini bilirsənmi?" Dedim: "Allah və Onun elçisi daha yaxşı bilir!" Peyğəmbər ﷺ buyurdu: "O, gedib səcdə etmək üçün izin istəyir və ona izin verilir. (Amma elə bir zaman gələcək ki,) ona: "Gəldiyin yerdən qayıt!" deyiləcək və o, (gedib) məğribdən doğacaq".

Sonra o: "Abdullah (ibn Məsudun) qiraəti ilə: "Bu onun qaldığı yerdir" ("Ya sin" surəsinin 38-ci ayəsini) oxudu.

**[٤٠٢] ٢٥١**–(...) حَدَّثَنَا أَبُو سَعِيدٍ الأَشَجُّ وَإِسْحَقُ بْنُ إِبْرَاهِيمَ قَالَ إِسْحَقُ: أَخْبَرَنَا، وَقَالَ الأَشَجُّ: حَدَّثَنَا وَكِيعٌ: حَدَّثَنَا الأَعْمَشُ عَنْ إِبْرَاهِيمَ التَّيْمِيِّ، عَنْ أَبِيهِ، عَنْ أَبِي ذَرٍّ قَالَ: سَأَلْتُ رَسُولَ اللَّهِ ﷺ عَنْ قَوْلِ اللَّهِ تَعَالَى: ﴿ وَٱلشَّمْسُ تَجْرِي لِمُسْتَقَرٍّ لَّهَا ﴾ قَالَ: ((مُسْتَقَرُّهَا تَحْتَ الْعَرْشِ)).

**[402]-251-(...)** ........ Əbu Zərr ﷺ demişdir: "Mən Peyğəmbərdən ﷺ Uca Allahın: **"Günəş də özünün qaldığı yerə axıb gedir"**[1] ayəsi barədə soruşdum. Dedi: "Onun qaldığı yer Ərşin altındadır".

## (٧٣) – بَابُ بَدْءِ الْوَحْيِ إِلَى رَسُولِ اللَّهِ ﷺ

## 73-cü fəsil. Peyğəmbərə ﷺ gələn vəhyin başlanğıcı

**[٤٠٣] ٢٥٢**–(١٦٠) حَدَّثَنِي أَبُو الطَّاهِرِ أَحْمَدُ بْنُ عَمْرِو بْنِ عَبْدِ اللَّهِ بْنِ عَمْرِو بْنِ سَرْحٍ: أَخْبَرَنَا ابْنُ وَهْبٍ قَالَ: أَخْبَرَنِي يُونُسُ عَنْ ابْنِ شِهَابٍ قَالَ: حَدَّثَنِي عُرْوَةُ بْنُ الزُّبَيْرِ أَنَّ عَائِشَةَ زَوْجَ النَّبِيِّ ﷺ أَخْبَرَتْهُ: أَنَّهَا قَالَتْ: كَانَ أَوَّلُ مَا بُدِئَ بِهِ رَسُولُ اللَّهِ ﷺ مِنْ الْوَحْيِ الرُّؤْيَا الصَّادِقَةَ فِي النَّوْمِ، فَكَانَ لاَ يَرَى رُؤْيَا إِلاَّ جَاءَتْ مِثْلَ فَلَقِ الصُّبْحِ، ثُمَّ حُبِّبَ إِلَيْهِ الْخَلاَءُ، فَكَانَ يَخْلُو بِغَارِ حِرَاءٍ يَتَحَنَّثُ فِيهِ، – وَهُوَ التَّعَبُّدُ – اللَّيَالِيَ أُوْلاَتِ الْعَدَدِ قَبْلَ أَنْ يَرْجِعَ إِلَى أَهْلِهِ، وَيَتَزَوَّدُ لِذَلِكَ، ثُمَّ يَرْجِعُ إِلَى خَدِيجَةَ فَيَتَزَوَّدُ لِمِثْلِهَا حَتَّى فَجِئَهُ الْحَقُّ وَهُوَ فِي غَارِ حِرَاءٍ، فَجَاءَهُ الْمَلَكُ فَقَالَ: اقْرَأْ قَالَ: ((مَا أَنَا بِقَارِئٍ)) قَالَ: ((فَأَخَذَنِي فَغَطَّنِي حَتَّى بَلَغَ مِنِّي الْجَهْدَ، ثُمَّ

[1] "Ya sin" surəsi, 38.

أَرْسَلَنِي فَقَالَ: اقْرَأْ – قَالَ – قُلْتُ: مَا أَنَا بِقَارِئٍ، قَالَ: فَأَخَذَنِي فَغَطَّنِي الثَّانِيَةَ حَتَّى بَلَغَ مِنِّي الْجَهْدَ ثُمَّ أَرْسَلَنِي فَقَالَ: أَقْرَأْ، فَقُلْتُ: مَا أَنَا بِقَارِئٍ فَأَخَذَنِي فَغَطَّنِي الثَّالِثَةَ حَتَّى بَلَغَ مِنِّي الْجَهْدَ ثُمَّ أَرْسَلَنِي فَقَالَ:

﴿ٱقْرَأْ بِٱسْمِ رَبِّكَ ٱلَّذِى خَلَقَ ﴿١﴾ خَلَقَ ٱلْإِنسَٰنَ مِنْ عَلَقٍ ﴿٢﴾ ٱقْرَأْ وَرَبُّكَ ٱلْأَكْرَمُ ﴿٣﴾ ٱلَّذِى عَلَّمَ بِٱلْقَلَمِ ﴿٤﴾ عَلَّمَ ٱلْإِنسَٰنَ مَا لَمْ يَعْلَمْ ﴿٥﴾﴾

فَرَجَعَ بِهَا رَسُولُ اللَّهِ ﷺ تَرْجُفُ بَوَادِرُهُ حَتَّى دَخَلَ عَلَى خَدِيجَةَ فَقَالَ: ((زَمِّلُونِي زَمِّلُونِي)) فَزَمَّلُوهُ حَتَّى ذَهَبَ عَنْهُ الرَّوْعُ، ثُمَّ قَالَ لِخَدِيجَةَ: ((أَيْ خَدِيجَةُ! مَا لِي)) وَأَخْبَرَهَا الْخَبَرَ، قَالَ: ((لَقَدْ خَشِيتُ عَلَى نَفْسِي)) قَالَتْ لَهُ خَدِيجَةُ: كَلاَّ، أَبْشِرْ فَوَاللَّهِ! لاَ يُخْزِيكَ اللَّهُ أَبَدًا، وَاللَّهِ! إِنَّكَ لَتَصِلُ الرَّحِمَ، وَتَصْدُقُ الْحَدِيثَ، وَتَحْمِلُ الْكَلَّ، وَتَكْسِبُ الْمَعْدُومَ، وَتَقْرِي الضَّيْفَ، وَتُعِينُ عَلَى نَوَائِبِ الْحَقِّ، فَانْطَلَقَتْ بِهِ خَدِيجَةُ حَتَّى أَتَتْ بِهِ وَرَقَةَ بْنَ نَوْفَلِ بْنِ أَسَدِ بْنِ عَبْدِ الْعُزَّى وَهُوَ ابْنُ عَمِّ خَدِيجَةَ، أَخِي أَبِيهَا، وَكَانَ امْرَأً تَنَصَّرَ فِي الْجَاهِلِيَّةِ وَكَانَ يَكْتُبُ الْكِتَابَ الْعَرَبِيَّ وَيَكْتُبُ مِنْ الإِنْجِيلِ بِالْعَرَبِيَّةِ مَا شَاءَ اللَّهُ أَنْ يَكْتُبَ، وَكَانَ شَيْخًا كَبِيرًا قَدْ عَمِيَ، فَقَالَتْ لَهُ خَدِيجَةُ: أَيْ عَمِّ! اسْمَعْ مِنْ ابْنِ أَخِيكَ، قَالَ وَرَقَةُ بْنُ نَوْفَلٍ: يَا ابْنَ أَخِي! مَاذَا تَرَى؟ فَأَخْبَرَهُ رَسُولُ اللَّهِ ﷺ خَبَرَ مَا رَأَى، فَقَالَ لَهُ وَرَقَةُ: هَذَا النَّامُوسُ الَّذِي أُنْزِلَ عَلَى مُوسَى ﷺ، يَا لَيْتَنِي فِيهَا جَذَعًا! يَا لَيْتَنِي أَكُونُ حَيًّا حِينَ يُخْرِجُكَ قَوْمُكَ! قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((أَوَ مُخْرِجِيَّ هُمْ)) قَالَ وَرَقَةُ: نَعَمْ، لَمْ يَأْتِ رَجُلٌ قَطُّ بِمَا جِئْتَ بِهِ إِلاَّ عُودِيَ، وَإِنْ يُدْرِكْنِي يَوْمُكَ أَنْصُرْكَ نَصْرًا مُؤَزَّرًا.

**[403]-252-(160)** ........ Peyğəmbərin ﷺ zövcəsi Aişə رضي الله عنها demişdir: "Allahın elçisinə ﷺ ilk vəhyin gəlməsi doğru yuxu vasitəsilə başlamışdır.[1] Onun gördüyü elə bir yuxu yox idi ki, sübh çağının aydınlığı kimi gerçəkləşməsin. Sonra onun qəlbinə tənhalığa çəkilmək[2] meyli salındı. Peyğəmbər ﷺ Hira dağındakı[3] mağarada xəlvətə çəkilib, ailəsinin yanına qayıdanadək müəyyən gecələri orada ibadət edərdi. (O özü ilə azuqə götürüb xəlvətə çəkilərdi). Sonra Xədicənin yanına qayıdıb yenə bir o qədər də (xəlvətdə) qalmaq üçün azuqə götürərdi. Nəhayət, Peyğəmbər ﷺ Hira dağındakı mağarada olarkən qəfildən ona haqq nazil oldu.[4] Mələk onun yanına gəlib: "Oxu!"– dedi. O isə: "Mən oxumağı bacarmıram!"– deyə cavab verdi.

---

[1] Qazı İyad رحمه الله və qeyriləri demişlər: "İlk vəhyin Peyğəmbərə ﷺ bu şəkildə gəlməsi ona görə idi ki, Peyğəmbər ﷺ mələyi gördüyü və ona qəfil peyğəmbərlik verildiyi zaman qorxuya düşməsin. Belə ki, Allahın köməyi olmadan heç bir bəşər buna tab gətirə bilməz. Digər hədislərdə xəbər verildiyi kimi, Peyğəmbərin ﷺ nur görməsi, səs eşitməsi, habelə daşın və ağacın ona salam verməsi də onun peyğəmbərlik əlamətlərindən idi".

[2] Əbu Suleyman əl-Xəttabi رحمه الله demişdir: "Peyğəmbərə ﷺ tənhalığa çəkilmək ona görə sevdirildi ki, bu halda adamın qəlbi kənar duyğulardan xali olur, adam daha çox düşünməyə başlayır və beləliklə də, dünyəvi qayğılardan uzaqlaşmaqla qəlbində qorxu əmələ gəlir".

[3] Bu dağ Məkkədən üç mil (5760 m) aralıda yerləşir.

[4] Yəni vəhy nazil oldu.

(Peyğəmbər ﷺ) dedi: "O zaman mələk məni tutub taqətim kəsilənədək sıxdı, sonra da buraxıb: "Oxu!"– dedi. Mən də: "Oxumağı bacarmıram!"– dedim. O, ikinci dəfə məni tutub nəfəsim kəsilənədək sıxdı, sonra da buraxıb: "Oxu!"– dedi. Mən isə: "Oxumağı bacarmıram!"– dedim. O, üçüncü dəfə məni tutub nəfəsim kəsilənədək sıxdı, sonra da buraxıb dedi: **"Yaradan Rəbbinin adı ilə oxu! O, insanı qan laxtasından yaratdı. Oxu! Sənin Rəbbin *müqayisəsiz* səxavətə malikdir. O, qələmlə *yazmağı* öyrətdi. İnsana bilmədiklərini öyrətdi".**[1]

(Bu hadisədən sonra) Peyğəmbər ﷺ qorxudan ürəyi əsə-əsə həmin ayələrlə geri döndü. O, Xədicə bint Xuveylidin (evinə) daxil olub: "Üstümü örtün, üstümü örtün!"– dedi. Onun üstünü örtdülər. Nəhayət, qorxu ondan keçib getdi və Peyğəmbər ﷺ başına gələn hadisəni Xədicəyə xəbər verib dedi: "Ey Xədicə, mənə nə olub? Düzü, mən başıma bir iş gələcəyindən qorxdum". Xədicə dedi: "Yox, sevin! Allaha and olsun ki, Allah səni heç vaxt rüsvay etməz. Vallahi, sən qohumluq əlaqələrini möhkəmləndirir, düz danışır, zəiflərin yükünü daşıyır, yoxsula pay verir, qonağa yaxşı baxır və haqq yolunda (insanlara) yardım edirsən[2]".

Xədicə Peyğəmbəri ﷺ əmisi oğlunun, yəni atasının qardaşı oğlu Vərəqə ibn Nofəl ibn Əsəd ibn Abdul-Uzzanın[3] yanına gətirdi. O, cahiliyyət dövründə nəsrani[4] olmuş bir adam idi və ərəbcə yazmağı bacarır, İncildən Allahın dilədiyi qədər (bəzi şeyləri) ərəbcə yazardı. O artıq gözləri kor olmuş qoca bir kişi idi. Xədicə dedi: "Əmican![5] Qulaq as, gör qardaşın oğlu nə deyir!" Vərəqə ibn Nofəl (ondan): "Ey qardaşım oğlu! Sən nə görürsən?"– deyə soruşdu. Peyğəmbər ﷺ də gördüyü şeyləri ona xəbər verdi. Vərəqə ona dedi: "O gördüyün Musaya göndərilmiş sirr sahibidir[6]. Kaş dəvət edəcəyin vaxt mən gənc olay-

---

[1] "əl-Ələq" surəsi, 1-5.

[2] Xədicənin رضي الله عنها bu sözü dəlildir ki, gözəl əxlaqlı olmaq və xeyirxah əməllər etmək, şərdən qorunmaq üçün səbəbdir. Həmçinin hədisdən görünür ki, məsləhət olduqda, hərdən insanın üzünə tərifləmək olar.

[3] Abdul-Uzza – Uzzanın qulu deməkdir. Uzza isə bütpərəst ərəblərin ilahiləşdirdikləri və Məkkə ilə Taif arasında, Nəhl adlanan yerdə yerləşdirilən ən məşhur bütlərindən biridir. İnsana bu kimi adlar qoymaq isə haramdır.

[4] Xristian, xaçpərəst.

[5] Digər rəvayətdə Xədicə Vərəqəyə demişdir: "Ey əmim oğlu! Qulaq as, gör qardaşın oğlu nə deyir!" Əslində Vərəqə ibn Nofəl ibn Əsəd, Xədicə bint Xuveylid ibn Əsədin əmisi oğludur. Bu rəvayətdə isə Xədicə ona hörmət əlaməti olaraq "əmi" deyə müraciət etmişdir.

[6] Burada sirr sahibi deyildikdə Cəbrail عليه السلام nəzərdə tutulur. Hərəvi demişdir: "Cəbrailin "sirr sahibi" adlandırılması ona görədir ki, Uca Allah vəhyin nazil edilməsini ona həvalə etmişdir".

dım! Kaş qövmün səni (yurdundan) qovacağı zaman sağ olaydım!" Peyğəmbər ﷺ soruşdu: "Məgər onlar məni qovacaqlar?" Vərəqə dedi: "Bəli! Sənin gətirdiyinin bənzərini gətirən (Allahın dinini təbliğ edən) elə bir kişi olmayıb ki, onunla düşmənçilik etməsinlər. İşdir, həmin (dəvət edəcəyin) günə qədər yaşasam, var gücümlə sənə yardım edərəm".

**[٤٠٤] ٢٥٣**–(...) و حَدَّثَنِي مُحَمَّدُ بْنُ رَافِعٍ: حَدَّثَنَا عَبْدُ الرَّزَّاقِ: أَخْبَرَنَا مَعْمَرٌ قَالَ: قَالَ الزُّهْرِيُّ: وَأَخْبَرَنِي عُرْوَةُ عَنْ عَائِشَةَ أَنَّهَا قَالَتْ: أَوَّلُ مَا بُدِئَ بِهِ رَسُولُ اللَّهِ ﷺ مِنْ الْوَحْيِ: وَسَاقَ الْحَدِيثَ بِمِثْلِ حَدِيثِ يُونُسَ، غَيْرَ أَنَّهُ قَالَ: فَوَاللَّهِ! لاَ يُحْزِنُكَ اللَّهُ أَبَدًا. وَقَالَ: قَالَتْ خَدِيجَةُ: أَيْ ابْنَ عَمِّ! اسْمَعْ مِنِ ابْنِ أَخِيكَ.

**[404]-253-(...)** ........ (Ravi) Aişədən: "Allahın elçisinə ﷺ ilk vəhyin gəlməsi..." deyə rəvayət edərək, bu hədisi Yunusun hədisi kimi rəvayət etmişdir. Fəqət bu rəvayətdə Xədicə (Peyğəmbərə ﷺ) demişdir: "Allaha and olsun ki, Allah səni heç vaxt kədərləndirməz". (Həmçinin bu rəvayətdə) Xədicə (Vərəqəyə) demişdir: "Ey əmim oğlu! Qulaq as, gör qardaşın oğlu nə deyir!"

**[٤٠٥] ٢٥٤**–(...) و حَدَّثَنِي عَبْدُ الْمَلِكِ بْنُ شُعَيْبِ بْنِ اللَّيْثِ: حَدَّثَنِي أَبِي عَنْ جَدِّي: حَدَّثَنِي عُقَيْلُ بْنُ خَالِد، قَالَ ابْنُ شِهَابٍ: سَمِعْتُ عُرْوَةَ بْنَ الزُّبَيْرِ يَقُولُ: قَالَتْ عَائِشَةُ زَوْجُ النَّبِيِّ ﷺ: فَرَجَعَ إِلَى خَدِيجَةَ يَرْجُفُ فُؤَادُهُ. وَاقْتَصَّ الْحَدِيثَ بِمِثْلِ حَدِيثِ يُونُسَ وَمَعْمَرٍ، وَلَمْ يَذْكُرْ أَوَّلَ حَدِيثِهِمَا مِنْ قَوْلِهِ: أَوَّلُ مَا بُدِئَ بِهِ رَسُولُ اللَّهِ ﷺ مِنْ الْوَحْيِ: الرُّؤْيَا الصَّادِقَةُ وَتَابَعَ يُونُسَ عَلَى قَوْلِهِ: فَوَاللَّهِ! لاَ يَخْزِيكَ اللَّهُ أَبَدًا، وَذَكَرَ قَوْلَ خَدِيجَةَ: أَيْ ابْنَ عَمِّ! اسْمَعْ مِنِ ابْنِ أَخِيكَ.

**[405]-254-(...)** ........ Peyğəmbərin ﷺ zövcəsi Aişə رضي الله عنها demişdir: "(Bu hadisədən sonra) Rəsulullah ﷺ qorxudan ürəyi əsə-əsə Xədicənin yanına döndü..." (Ravi bu hədisi) Yunusun və Məmərin hədisi kimi rəvayət etmiş, lakin hədislərinin əvvəlində: "Allahın elçisinə ﷺ ilk vəhyin gəlməsi doğru yuxu vasitəsilə başlamışdır" sözünü zikr etməmişdir. Bundan başqa o, Yunusun rəvayətindəki kimi: "Allaha and olsun ki, Allah səni heç vaxt rüsvay etməz" rəvayət etmiş, üstəlik Xədicənin: "Ey əmim oğlu! Qulaq as, gör qardaşın oğlu nə deyir!" sözünü də zikr etmişdir.

**[٤٠٦] ٢٥٥**–(١٦١) و حَدَّثَنِي أَبُو الطَّاهِرِ: أَخْبَرَنَا ابْنُ وَهْبٍ قَالَ: حَدَّثَنِي يُونُسُ قَالَ: قَالَ ابْنُ شِهَابٍ: أَخْبَرَنِي أَبُو سَلَمَةَ بْنُ عَبْدِ الرَّحْمَنِ أَنَّ جَابِرَ بْنَ عَبْدِ اللَّهِ الأَنْصَارِيَّ – وَكَانَ مِنْ أَصْحَابِ رَسُولِ اللَّهِ ﷺ – كَانَ يُحَدِّثُ، قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ وَهُوَ يُحَدِّثُ عَنْ فَتْرَةِ الْوَحْيِ – قَالَ فِي حَدِيثِهِ –: ((فَبَيْنَا أَنَا

أَمْشِي سَمِعْتُ صَوْتًا مِنْ السَّمَاءِ، فَرَفَعْتُ رَأْسِي، فَإِذَا الْمَلَكُ الَّذِي جَاءَنِي بِحِرَاءٍ جَالِسًا عَلَى كُرْسِيٍّ بَيْنَ السَّمَاءِ وَالْأَرْضِ)) قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((فَجُئِثْتُ مِنْهُ فَرَقًا فَرَجَعْتُ، فَقُلْتُ: زَمِّلُونِي زَمِّلُونِي، فَدَثَّرُونِي، فَأَنْزَلَ اللَّهُ تَبَارَكَ وَتَعَالَى: ﴿يَٰٓأَيُّهَا ٱلْمُدَّثِّرُ ۝١ قُمْ فَأَنذِرْ ۝٢ وَرَبَّكَ فَكَبِّرْ ۝٣ وَثِيَابَكَ فَطَهِّرْ ۝٤ وَٱلرُّجْزَ فَٱهْجُرْ ۝٥﴾ وَهِيَ الأَوْثَانُ قَالَ ثُمَّ تَتَابَعَ الْوَحْيُ.

**[406]-255-(161)** ........ Peyğəmbərin ﷺ səhabələrindən olmuş[1] Cabir ibn Abdullah əl-Ənsari رضي الله عنهما öz rəvayətində demişdir: "Peyğəmbər ﷺ vəhyin (müvəqqəti olaraq) kəsilməsindən danışarkən bunu söyləmişdir: "Bir dəfə mən yol gedərkən göydən səs eşitdim və başımı yuxarı qaldırdım. Bir də gördüm ki, Hira dağında yanıma gələn mələk göylə yer arasında olan kürsünün üzərində əyləşmişdir. Mən ondan bərk qorxdum.[2] (Evə) qayıdıb "Üstümü örtün, üstümü örtün!"– dedim. Uca və Ulu Allah da: **"Ey *əbasına bürünüb* örtünmüş *peyğəmbər*! Qalx və *insanları* xəbərdar et! Təkcə Rəbbini uca tut! Geyimini təmiz saxla! Pis şeyləri tərk et!"**[3]– ayələrini nazil etdi".

---

[1] Qəribədir ki, hədisi Cabirdən رضي الله عنه rəvayət edən Əbu Sələmə ibn Abdur-Rəhman, Cabirin məşhur səhabələrdən olduğuna, hətta Rəsulullahdan ﷺ ən çox hədis rəvayət edən yeddi nəfərdən biri hesab edildiyinə rəğmən bu rəvayətdə: "Peyğəmbərin ﷺ səhabələrindən olmuş Cabir ibn Abdullah əl-Ənsari... " deyərək onun səhabə olduğunu xüsusilə vurğulayır. Bu ona görədir ki, o dövrdə bəzi ravilər Cabirin səhabə yox, tabiin olduğunu güman edirdilər. Və elə bu səbəbdən də Əbu Sələmə bu şübhəni aradan qaldırmaq və onun səhabə olduğunu xatırlatmaq istəmişdir.

[2] Bu, təbii qorxudur və bunu Allahdan başqasından qorxmaq kimi yozmaq yanlışdır. Quranda buna bənzər neçə-neçə ayələr vardır. Məsələn:

**"Elçilərimiz İbrahimə *İshaqın doğulacağı barədə* müjdə gətirdilər və: "Salam!"– dedilər. O da: "Salam!"– dedi və dərhal *gedib* qızardılmış bir buzov gətirdi. *İbrahim mələklərin* yeməyə əl vurmadıqlarını gördükdə, onlar onun xoşuna gəlmədi və onların yanında canına qorxu düşdü. Onlar dedilər: "Qorxma! Həqiqətən, biz Lut qövmünə göndərilmişik".** ("Hud" surəsi, 69-70).

Allah Musaya belə buyurur: **"Mən səni Özümə *peyğəmbər* seçdim! Sən və qardaşın möcüzələrimlə gedin və Məni zikr etməkdə zəiflik göstərməyin. Fironun yanına gedin. Çünki o, həddini aşmışdır. Onunla yumşaq danışın. Bəlkə, öyüd-nəsihət qəbul etsin, yaxud qorxsun!" Onlar dedilər: "Ey Rəbbimiz! Biz, onun bizə şiddətli cəza verməsindən və ya həddini aşmasından qorxuruq". *Allah* buyurdu: "Qorxmayın, çünki Mən sizinləyəm, eşidirəm və görürəm!"** ("Ta ha" surəsi, 41-46).

**"Ey Musa! Qüdrətli, Müdrik Allah Mənəm! Əsanı *yerə* at!" *Musa* onun ilan kimi qıvrıldığını gördükdə, dönüb qaçdı və geriyə də dönmədi. *Allah dedi:* "Ey Musa! Qorxma! Elçilər Mənim hüzurumda qorxmazlar"** ("ən-Nəml" surəsi, 9-10).

**"*Davudun yanında* çəkişənlərin xəbəri sənə gəlib çatdımı? O zaman onlar divarı aşıb məbədə girdilər. Onlar Davudun yanına daxil olduqda, *Davud* onlardan qorxdu. Onlar dedilər: "Qorxma! Biz iki iddiaçıyıq. Birimiz digərinin haqqını tapdalamışdır. Aramızda ədalətlə hökm ver, haqsızlıq etmə və bizə düz yolu göstər!"** ("Sad" surəsi, 21-22).

[3] "əl-Muddəssir" surəsi, 1-5.

(Ayədə keçən) pis şeylər bütlərdir.

Peyğəmbər ﷺ dedi: "Sonra vəhy çoxaldı və bir-birinin ardınca nazil olmağa başladı".

**[٤٠٧] ٢٥٦**–(...) و حَدَّثَنِي عَبْدُ الْمَلِكِ بْنُ شُعَيْبِ بْنِ اللَّيْثِ قَالَ: حَدَّثَنِي أَبِي عَنْ جَدِّي قَالَ: حَدَّثَنِي عُقَيْلُ بْنُ خَالِد عَنْ ابْنِ شِهَاب قَالَ: سَمِعْتُ أَبَا سَلَمَةَ بْنَ عَبْد الرَّحْمَنِ يَقُولُ: أَخْبَرَنِي جَابِرُ بْنُ عَبْد اللَّه أَنَّهُ سَمِعَ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ: ((ثُمَّ فَتَرَ الْوَحْيُ عَنِّي فَتْرَةً، فَبَيْنَا أَنَا أَمْشِي)) ثُمَّ ذَكَرَ مِثْلَ حَدِيث يُونُسَ غَيْرَ أَنَّهُ قَالَ: ((فَجُئِثْتُ مِنْهُ فَرَقًا حَتَّى هَوَيْتُ إِلَى الأَرْضِ)) – قَالَ، و قَالَ أَبُو سَلَمَةَ: وَالرُّجْزُ الأَوْثَانُ – قَالَ: ثُمَّ حَمِيَ الْوَحْيُ – بَعْدُ – وَتَتَابَعَ.

**[407]-256-(...)** ........ (Ravi): "Cabir ibn Abdullah رضي الله عنهما Peyğəmbərin ﷺ belə dediyini eşitmişdir: "Sonra vəhy müvəqqəti olaraq kəsildi. Bir dəfə mən yol gedərkən..." deyərək (bu hədisi) Yunusun rəvayət etdiyi hədis kimi rəvayət etmişdir. Fəqət bu rəvayətdə Peyğəmbərin ﷺ: "Mən ondan bərk qorxdum, hətta (qorxumdan) yerə yıxıldım" dediyini, Əbu Sələmənin də: "Pis şeylər bütlərdir" dediyini və bir də Peyğəmbərin ﷺ: "Sonra vəhy şiddətləndi və ardı-arası kəsilmədən nazil olmağa başladı" dediyini zikr etmişdir.

**[٤٠٨]** و حَدَّثَنِي مُحَمَّدُ بْنُ رَافِعٍ: حَدَّثَنَا عَبْدُ الرَّزَّاقِ: أَخْبَرَنَا مَعْمَرٌ عَنْ الزُّهْرِيِّ بِهَذَا الإِسْنَاد نَحْوَ حَدِيثِ يُونُسَ، وَقَالَ: فَأَنْزَلَ اللَّهُ تَبَارَكَ وَتَعَالَى: ﴿يَٰٓأَيُّهَا ٱلْمُدَّثِّرُ﴾ إِلَى قَوْلِهِ ﴿وَٱلرُّجْزَ فَٱهْجُرْ﴾ قَبْلَ أَنْ تُفْرَضَ الصَّلَاةُ – وَهِيَ الأَوْثَانُ وَقَالَ: ((فَجُئِثْتُ مِنْهُ)) كَمَا قَالَ عُقَيْلٌ.

**[408]** ........ Məmər Zuhridən bu isnadla Yunusun rəvayət etdiyi hədisin bənzərini rəvayət etmiş və demişdir: "Allah Təbarəkə və Təalə – hələ namaz fərz buyurulmamışdan əvvəl: **"Ey *əbasına bürünüb* örtünmüş *peyğəmbər*! Qalx və *insanları* xəbərdar et! Təkcə Rəbbini uca tut! Geyimini təmiz saxla! Pis şeyləri tərk et!"**[1] ayələrini nazil etdi". (Ayədə keçən) pis şeylər, bütlər deməkdir.

Məmər də Uqeylin rəvayət etdiyi kimi (Peyğəmbərin ﷺ): "Mən ondan bərk qorxdum" dediyini rəvayət etmişdir.

**[٤٠٩] ٢٥٧**–(...) و حَدَّثَنَا زُهَيْرُ بْنُ حَرْب: حَدَّثَنَا الْوَلِيدُ بْنُ مُسْلِمٍ: حَدَّثَنَا الأَوْزَاعِيُّ قَالَ: سَمِعْتُ يَحْيَى يَقُولُ: سَأَلْتُ أَبَا سَلَمَةَ: أَيُّ الْقُرْآنِ أُنْزِلَ قَبْلُ؟ قَالَ: ﴿يَا أَيُّهَا الْمُدَّثِّرُ﴾ فَقُلْتُ: أَوْ ﴿اقْرَأْ﴾ فَقَالَ: سَأَلْتُ

[1] Əvvəlki ayələr.

جَابِرَ بْنَ عَبْدِ اللَّهِ: أَيُّ الْقُرْآنِ أُنْزِلَ قَبْلُ؟ قَالَ: ﴿يَا أَيُّهَا الْمُدَّثِّرُ﴾ فَقُلْتُ: أَوْ ﴿اقْرَأْ﴾ قَالَ: جَابِرٌ: أُحَدِّثُكُمْ مَا حَدَّثَنَا رَسُولُ اللَّهِ ﷺ. قَالَ: ((جَاوَرْتُ بِحِرَاءٍ شَهْرًا، فَلَمَّا قَضَيْتُ جِوَارِي نَزَلْتُ فَاسْتَبْطَنْتُ بَطْنَ الْوَادِي فَنُودِيتُ، فَنَظَرْتُ أَمَامِي وَخَلْفِي وَعَنْ يَمِينِي وَعَنْ شِمَالِي، فَلَمْ أَرَ أَحَدًا ثُمَّ نُودِيتُ، فَنَظَرْتُ فَلَمْ أَرَ أَحَدًا، ثُمَّ نُودِيتُ فَرَفَعْتُ رَأْسِي، فَإِذَا هُوَ عَلَى الْعَرْشِ فِي الْهَوَاءِ – يَعْنِي جِبْرِيلَ عليه السلام – فَأَخَذَتْنِي رَجْفَةٌ شَدِيدَةٌ، فَأَتَيْتُ خَدِيجَةَ فَقُلْتُ: دَثِّرُونِي، فَدَثَّرُونِي، فَصَبُّوا عَلَيَّ مَاءً، فَأَنْزَلَ اللَّهُ عَزَّ وَجَلَّ:

﴿يَٰٓأَيُّهَا ٱلْمُدَّثِّرُ ﴿١﴾ قُمْ فَأَنذِرْ ﴿٢﴾ وَرَبَّكَ فَكَبِّرْ ﴿٣﴾ وَثِيَابَكَ فَطَهِّرْ ﴿٤﴾﴾

**[409]-257-(...)** ........ Yəhya demişdir: "Mən Əbu Sələmədən[1] soruşdum: "Quranın hansı (ayəsi) daha əvvəl nazil olmuşdur?[2]" Dedi: **"Ey *libasına bürünüb* örtünmüş *peyğəmbər*!"** Dedim: "Yoxsa: **"Yaradan Rəbbinin adı ilə oxu!.."** (və sonrakı dörd ayə daha öncə nazil olmuşdur?" Dedi: "Mən Cabir ibn Abdullahdan soruşdum: "Quranın hansı (ayəsi) daha əvvəl nazil olmuşdur?" Dedi: **"Ey *libasına bürünüb* örtünmüş *peyğəmbər*!"** Dedim: "Yoxsa: **"Yaradan Rəbbinin adı ilə oxu!"** Dedi: "Mən sizə Peyğəmbərin ﷺ bizə danışdığı hədisi danışacağam. O demişdir: "Mən düz bir ay Hira dağında qaldım. Qaldığım müddət başa çatdıqdan sonra aşağı endim. Mən vadinin içində ikən mənə səda gəldi. Dərhal önümə, arxama, sağıma və soluma baxdım, lakin heç kəsi görmədim. Sonra yenə məni çağırdılar. Bu dəfə də baxdım, amma heç kəsi görə bilmədim. Sonra yenə məni səslədilər. Bu səfər başımı yuxarı qaldırdım. Bir də baxdım ki, o,

---

[1] Əbu Sələmə ibn Abdul-Əsəd ؓ Peyğəmbərin ﷺ həm səhabəsi, həm bibisi Burra bint Abdul-Muttəlibin oğlu, həm də süd qardaşıdır. Əbu Sələmə İslamı ilk əvvəl qəbul edənlərdən, öncə Həbəşistana, sonra da Mədinəyə hicrət edənlərdəndir. Hicrətin 3-cü ilində vəfat etmişdir.

[2] Hərçənd bu hədisdən "əl-Muddəssir" surəsinin ilk beş ayəsinin daha əvvəl nazil olduğu görünür, lakin həqiqət budur ki, ilk əvvəl nazil olmuş ayələr, "əl-Ələq" surəsinin ilk beş ayəsidir. Bu fikir aşağıdakı rəvayətdə öz əksini tapmışdır:

Cabir ibn Abdullah əl-Ənsari ؓ vəhyin (müvəqqəti olaraq) kəsilməsindən danışarkən rəvayətində bunu da söyləmişdir: "Peyğəmbər ﷺ demişdir: "*Bir dəfə* mən yol gedərkən göydən səs eşitdim və başımı yuxarı qaldırdım. Bir də gördüm ki, Hira dağında yanıma gələn mələk göylə yer arasında olan kürsünün üzərində əyləşmişdir. Mən ondan qorxdum. *Evə* qayıdıb "Üstümü örtün, üstümü örtün!"– dedim. Uca Allah da: **"Ey *əbasına* bürünüb örtünmüş *peyğəmbər*! Qalx və *insanları* xəbərdar et! Təkcə Rəbbini uca tut! Geyimini təmiz saxla! Pis şeyləri tərk et!"**– ayələrini nazil etdi. Sonra vəhy çoxaldı və bir-birinin ardınca nazil olmağa başladı. ("Səhih əl-Buxari", 4) Əbu Sələmənin: "Cabir ibn Abdullah əl-Ənsari vəhyin (müvəqqəti olaraq) kəsilməsindən danışarkən..." sözü, habelə Cabirin: "...Hira dağında yanıma gələn mələk..." sözü dəlildir ki, bu hadisədən öncə Cəbrail artıq Peyğəmbərin ﷺ yanına gəlmiş və ona Rəbbinin ayələrini gətirmişdi. İmam Muslimin bu fəslin əvvəlində varid etdiyi hədis buna dəlildir.

(yəni Cəbrail aleyhissəlam) havada taxtın üstündə əyləşib. Bu səbəbdən canıma vəlvələ düşdü. Mən Xədicənin yanına gəlib: "Məni bürüyün!"– dedim. Məni bürüdülər, üstümə də su əndərdilər. Onda İzzətli və Qüdrətli Allah bu ayələri nazil etdi: **"Ey** ***libasına bürünüb*** **örtünmüş** ***peyğəmbər*****! Qalx və** ***insanları*** **xəbərdar et! Təkcə Rəbbini uca tut! Geyimini təmiz saxla!"**[1]

**[٤١٠] ٢٥٨**–(...) حَدَّثَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى: حَدَّثَنَا عُثْمَانُ بْنُ عُمَرَ: أَخْبَرَنَا عَلِيُّ بْنُ الْمُبَارَكِ عَنْ يَحْيَى بْنِ أَبِي كَثِيرٍ بِهَذَا الإِسْنَادِ، وَقَالَ: ((فَإِذَا هُوَ جَالِسٌ عَلَى عَرْشٍ بَيْنَ السَّمَاءِ وَالأَرْضِ)).

**[410]-258-(...)** ........ Əli ibn Mübarək (həmin hədisi) Yəhya ibn Əbu Kəsirdən bu isnadla rəvayət etmiş və demişdir: "Bir də baxdım ki, o, göylə yer arasında olan taxtın üzərində əyləşmişdir".

## (٧٤) – بَابُ الإِسْرَاءِ بِرَسُولِ اللَّهِ ﷺ إِلَى السَّمَاوَاتِ وَفَرْضِ الصَّلَوَاتِ

## 74-cü fəsil. Rəsulullahın gecə vaxtı göylərə yüksəlməsi və namazların fərz buyurulması

**[٤١١] ٢٥٩**–(١٦٢) حَدَّثَنَا شَيْبَانُ بْنُ فَرُّوخَ: حَدَّثَنَا حَمَّادُ بْنُ سَلَمَةَ: حَدَّثَنَا ثَابِتٌ الْبُنَانِيُّ عَنْ أَنَسِ بْنِ مَالِكٍ، أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: ((أُتِيتُ بِالْبُرَاقِ – وَهُوَ دَابَّةٌ أَبْيَضُ طَوِيلٌ فَوْقَ الْحِمَارِ وَدُونَ الْبَغْلِ، يَضَعُ حَافِرَهُ عِنْدَ مُنْتَهَى طَرْفِهِ – قَالَ: – فَرَكِبْتُهُ حَتَّى أَتَيْتُ بَيْتَ الْمَقْدِسِ – قَالَ – فَرَبَطْتُهُ بِالْحَلْقَةِ الَّتِي يَرْبِطُ بِهِ الأَنْبِيَاءُ – قَالَ ثُمَّ دَخَلْتُ الْمَسْجِدَ فَصَلَّيْتُ فِيهِ رَكْعَتَيْنِ ثُمَّ خَرَجْتُ، فَجَاءَنِي جِبْرِيلُ عَلَيْهِ السَّلاَم بِإِنَاءٍ مِنْ خَمْرٍ، وَإِنَاءٍ مِنْ لَبَنٍ، فَاخْتَرْتُ اللَّبَنَ، فَقَالَ جِبْرِيلُ عَلَيْهِ السَّلاَم: اخْتَرْتَ الْفِطْرَةَ ثُمَّ عَرَجَ بِنَا إِلَى السَّمَاءِ، فَاسْتَفْتَحَ جِبْرِيلُ فَقِيلَ: مَنْ أَنْتَ؟ قَالَ: جِبْرِيلُ. قِيلَ: وَمَنْ مَعَكَ؟ قَالَ: مُحَمَّدٌ. قِيلَ: وَقَدْ بُعِثَ إِلَيْهِ؟ قَالَ: قَدْ بُعِثَ إِلَيْهِ. فَفُتِحَ لَنَا، فَإِذَا أَنَا بِآدَمَ ﷺ فَرَحَّبَ بِي وَدَعَا لِي بِخَيْرٍ، ثُمَّ عَرَجَ بِنَا إِلَى السَّمَاءِ الثَّانِيَةِ، فَاسْتَفْتَحَ جِبْرِيلُ عَلَيْهِ السَّلاَم، فَقِيلَ: مَنْ أَنْتَ؟ قَالَ: جِبْرِيلُ. قِيلَ: وَمَنْ مَعَكَ؟ قَالَ: مُحَمَّدٌ. قِيلَ: وَقَدْ بُعِثَ إِلَيْهِ؟ قَالَ: قَدْ بُعِثَ إِلَيْهِ. فَفُتِحَ لَنَا، فَإِذَا أَنَا بِابْنَيْ الْخَالَةِ: عِيسَى ابْنِ مَرْيَمَ وَيَحْيَى بْنِ زَكَرِيَّاءَ – صَلَوَاتُ اللَّهِ عَلَيْهِمَا – فَرَحَّبَا وَدَعَوَا لِي بِخَيْرٍ، ثُمَّ عَرَجَ بِي إِلَى السَّمَاءِ الثَّالِثَةِ، فَاسْتَفْتَحَ جِبْرِيلُ، فَقِيلَ: مَنْ أَنْتَ؟ قَالَ: جِبْرِيلُ. قِيلَ: وَمَنْ مَعَكَ؟ قَالَ: مُحَمَّدٌ ﷺ. قِيلَ: وَقَدْ بُعِثَ إِلَيْهِ؟ قَالَ: قَدْ بُعِثَ إِلَيْهِ. فَفُتِحَ لَنَا، فَإِذَا أَنَا بِيُوسُفَ ﷺ، إِذَا هُوَ قَدْ أُعْطِيَ شَطْرَ الْحُسْنِ، فَرَحَّبَ وَدَعَا لِي بِخَيْرٍ، ثُمَّ عَرَجَ بِنَا إِلَى السَّمَاءِ الرَّابِعَةِ، فَاسْتَفْتَحَ جِبْرِيلُ – عَلَيْهِ

[1] "əl-Muddəssir" surəsi, 1-4.

السَّلاَم – قِيلَ: مَنْ هَذَا؟ قَالَ: جِبْرِيلُ. قِيلَ: وَمَنْ مَعَكَ؟ قَالَ: مُحَمَّدٌ. قِيلَ: وَقَدْ بُعِثَ إِلَيْهِ؟ قَالَ: قَدْ بُعِثَ إِلَيْهِ. فَفُتِحَ لَنَا فَإِذَا أَنَا بِإِدْرِيسَ ﷺ، فَرَحَّبَ وَدَعَا لِي بِخَيْرٍ. قَالَ اللَّهُ عَزَّ وَجَلَّ: ﴿وَرَفَعْنَاهُ مَكَانًا عَلِيًّا﴾

ثُمَّ عَرَجَ بِنَا إِلَى السَّمَاءِ الْخَامِسَةِ، فَاسْتَفْتَحَ جِبْرِيلُ، قِيلَ: مَنْ هَذَا؟ قَالَ: جِبْرِيلُ. قِيلَ: وَمَنْ مَعَكَ؟ قَالَ: مُحَمَّدٌ. قِيلَ: وَقَدْ بُعِثَ إِلَيْهِ؟ قَالَ: قَدْ بُعِثَ إِلَيْهِ. فَفُتِحَ لَنَا، فَإِذَا أَنَا بِهَارُونَ ﷺ، فَرَحَّبَ وَدَعَا لِي بِخَيْرٍ، ثُمَّ عَرَجَ بِنَا إِلَى السَّمَاءِ السَّادِسَةِ. فَاسْتَفْتَحَ جِبْرِيلُ – عَلَيْهِ السَّلاَم – قِيلَ: مَنْ هَذَا؟ قَالَ: جِبْرِيلُ. قِيلَ: وَمَنْ مَعَكَ؟ قَالَ: مُحَمَّدٌ. قِيلَ: وَقَدْ بُعِثَ إِلَيْهِ؟ قَالَ: قَدْ بُعِثَ إِلَيْهِ. فَفُتِحَ لَنَا، فَإِذَا أَنَا بِمُوسَى ﷺ، فَرَحَّبَ وَدَعَا لِي بِخَيْرٍ، ثُمَّ عَرَجَ إِلَى السَّمَاءِ السَّابِعَةِ. فَاسْتَفْتَحَ جِبْرِيلُ، فَقِيلَ: مَنْ هَذَا؟ قَالَ: جِبْرِيلُ. قِيلَ: وَمَنْ مَعَكَ؟ قَالَ مُحَمَّدٌ [ﷺ] قِيلَ: وَقَدْ بُعِثَ إِلَيْهِ؟ قَالَ: قَدْ بُعِثَ إِلَيْهِ. فَفُتِحَ لَنَا، فَإِذَا أَنَا بِإِبْرَاهِيمَ ﷺ، مُسْنِدًا ظَهْرَهُ إِلَى الْبَيْتِ الْمَعْمُورِ، وَإِذَا هُوَ يَدْخُلُهُ كُلَّ يَوْمٍ سَبْعُونَ أَلْفَ مَلَكٍ لاَ يَعُودُونَ إِلَيْهِ، ثُمَّ ذَهَبَ بِي إِلَى السِّدْرَةِ الْمُنْتَهَى وَإِذَا وَرَقُهَا كَآذَانِ الْفِيَلَةِ، وَإِذَا ثَمَرُهَا كَالْقِلاَلِ – قَالَ – فَلَمَّا غَشِيَهَا مِنْ أَمْرِ اللَّهِ مَا غَشِيَ تَغَيَّرَتْ، فَمَا أَحَدٌ مِنْ خَلْقِ اللَّهِ يَسْتَطِيعُ أَنْ يَنْعَتَهَا مِنْ حُسْنِهَا، فَأَوْحَى اللَّهُ إِلَيَّ مَا أَوْحَى، فَفَرَضَ عَلَيَّ خَمْسِينَ صَلاَةً فِي كُلِّ يَوْمٍ وَلَيْلَةٍ، فَنَزَلْتُ إِلَى مُوسَى – عَلَيْهِ السَّلاَمُ – فَقَالَ: مَا فَرَضَ رَبُّكَ عَلَى أُمَّتِكَ؟ قُلْتُ: خَمْسِينَ صَلاَةً. قَالَ: ارْجِعْ إِلَى رَبِّكَ فَاسْأَلْهُ التَّخْفِيفَ، فَإِنَّ أُمَّتَكَ لاَ يُطِيقُونَ ذَلِكَ، فَإِنِّي قَدْ بَلَوْتُ بَنِي إِسْرَائِيلَ وَخَبَرْتُهُمْ – قَالَ – فَرَجَعْتُ إِلَى رَبِّي فَقُلْتُ: يَا رَبِّ خَفِّفْ عَلَى أُمَّتِي – فَحَطَّ عَنِّي خَمْسًا، فَرَجَعْتُ إِلَى مُوسَى فَقُلْتُ: حَطَّ عَنِّي خَمْسًا، قَالَ: إِنَّ أُمَّتَكَ لاَ يُطِيقُونَ ذَلِكَ فَارْجِعْ إِلَى رَبِّكَ فَاسْأَلْهُ التَّخْفِيفَ – قَالَ – فَلَمْ أَزَلْ أَرْجِعُ بَيْنَ رَبِّي تَبَارَكَ وَتَعَالَى وَبَيْنَ مُوسَى عَلَيْهِ السَّلاَم حَتَّى قَالَ: يَا مُحَمَّدُ! إِنَّهُنَّ خَمْسُ صَلَوَاتٍ كُلَّ يَوْمٍ وَلَيْلَةٍ، لِكُلِّ صَلاَةٍ عَشْرٌ، فَذَلِكَ خَمْسُونَ صَلاَةً، وَمَنْ هَمَّ بِحَسَنَةٍ فَلَمْ يَعْمَلْهَا كُتِبَتْ لَهُ حَسَنَةً، فَإِنْ عَمِلَهَا كُتِبَتْ لَهُ عَشْرًا، وَمَنْ هَمَّ بِسَيِّئَةٍ فَلَمْ يَعْمَلْهَا لَمْ تُكْتَبْ شَيْئًا، فَإِنْ عَمِلَهَا كُتِبَتْ سَيِّئَةً وَاحِدَةً، قَالَ: فَنَزَلْتُ حَتَّى انْتَهَيْتُ إِلَى مُوسَى فَأَخْبَرْتُهُ، فَقَالَ: ارْجِعْ إِلَى رَبِّكَ فَاسْأَلْهُ التَّخْفِيفَ، فَقَالَ رَسُولُ اللَّهِ ﷺ فَقُلْتُ: قَدْ رَجَعْتُ إِلَى رَبِّي حَتَّى اسْتَحْيَيْتُ مِنْهُ)).

**[411]-259-(162)** ........ Ənəs ibn Malik ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Mənə Buraq[1] gətirdilər. (Bu, uzunqulaqdan hündür və qatırdan alçaq olan ağ rəngli hündür bir heyvandır. O, addımını gözünün gördüyü son nöqtəyə qoyurdu. Peyğəmbər ﷺ davam edib dedi:) "Mən ona minib (getdim) və nəhayət, Beytul-Məqdisə[2] yetişdim. (Orada) Mən Buraqı (məndən əvvəlki)

---

[1] Buraq, Peyğəmbərin ﷺ İsra gecəsi Rəbbinin hüzuruna gedərkən mindiyi heyvandır.

[2] Beytul-Məqdis – Qüdsdə (Yerusəlimdə) yerləşən və zəvvarların ziyarət etməsinə icazə verilən müqəddəs ziyarətgahdır. Bu məsciddə namaz qılarkən qazanılan savab, Məkkədəki müqəddəs məscid və Mədinədəki Muhəmməd Peyğəmbərin ﷺ məscidi istisna olmaqla, başqa məscidlərdə beş yüz dəfə namaz qılanın savabına bərabərdir. Bu müqəddəs ziyarətgaha İyliya, Beytul-Müqəddəs və Məscidul-Əqsa da deyilir.

peyğəmbərlərin bağladığı bir halqaya[1] bağladım. Sonra məscidə daxil oldum və orada iki rükət[2] namaz qıldım. Sonra (bayıra) çıxdım. (Bu vaxt) Cəbrail ﷺ mənə bir qab şərab, bir qab da süd gətirdi. Mən südü seçdim. Cəbrail ﷺ dedi: "Sən fitrəti seçdin.[3] Sonra o (heyvan) bizi göyə qaldırdı. (Nəhayət, dünya səmasına gəlib çatdıqda) Cəbrail qapının açılmasını xahiş etdi. (Gözətçilər): "Kimdir o?"– deyə soruşdular. O: "Cəbraildir!"– dedi. Onlar: "Yanındakı kimdir?"– deyə soruşdular. O: "Muhəmməddir!"– dedi. Onlar soruşdular: "Onu çağırıblarmı?" Cəbrail: "(Bəli,) çağırıblar"– dedi. (Bundan sonra) qapılar bizim üzümüzə açıldı. Mən (içəri daxil olduqda) Adəmlə qarşılaşdım. O, mənə xoşgəldin elədi və mənim üçün xeyir-dua dilədi. Sonra (heyvan) bizi ikinci səmaya qaldırdı. Cəbrail ﷺ qapının açılmasını xahiş etdi. (Gözətçilər): "Sən kimsən?"– deyə soruşdular. O: "Cəbraildir!"– dedi. Onlar: "Yanındakı kimdir?"– deyə soruşdular. O: "Muhəmməddir!"– dedi. Onlar soruşdular: "Onu çağırıblarmı?" Cəbrail: "(Bəli,) çağırıblar"– dedi. (Bundan sonra) qapılar bizim üzümüzə açıldı. Mən (içəridə) xalauşaqlarını – Məryəm oğlu İsanı və Zəkəriyya oğlu Yəhyanı – (hər ikisinə Allahın salavatı olsun!) – gördüm. Onlar da mənə xoşgəldin elədilər və mənim üçün xeyir-dua dilədilər. Sonra (heyvan) məni üçüncü səmaya qaldırdı. Cəbrail qapının açılmasını xahiş etdi. (Gözətçilər): "Sən kimsən?"– deyə soruşdular. O: "Cəbraildir!"– dedi. Onlar: "Yanındakı kimdir?"– deyə soruşdular. O: "Muhəmməddir!"– dedi. Onlar soruşdular: "Onu çağırıblarmı?" Cəbrail: "(Bəli,) çağırıblar"– dedi. (Bundan sonra) qapılar bizim üzümüzə açıldı. Mən (içəri keçdikdə) Yusufu ﷺ gördüm. Ona gözəlliyin yarısı verilmişdi. O, mənə xoşgəldin elədi və mənim üçün xeyir-dua dilədi. Sonra (heyvan) bizi dördüncü səmaya qaldırdı. Cəbrail ﷺ qapının açılmasını xahiş etdi. (Gözətçilər): "Kimdir o?"– deyə soruşdular. O: "Cəbraildir!"– dedi. Onlar: "Yanındakı kimdir?"– deyə soruşdular. O: "Muhəmməddir!"– dedi. Onlar soruşdular: "Onu çağırıblarmı?" Cəbrail: "(Bəli,) çağırıblar"– dedi. (Bundan sonra) qapılar bizim üzümüzə açıldı. Mən (içəri keçdikdə) İdrisi ﷺ gördüm. O, mənə xoşgəldin elədi və mənim üçün xeyir-dua dilədi. İzzətli və Qüdrətli Allah (onun haqqında) belə buyurur: **"Biz onu yüksək bir məqama qaldırdıq".[4]**

[1] Burada "halqa" deyildikdə Beytul-Məqdis məscidinin qapısının tutqacı nəzərdə tutulur.

[2] Namazın *qiyam,* rüku və iki səcdəni özündə birləşdirən tam bir hissəsidir.

[3] Qazı İyad demişdir: "Burada fitrət deyildikdə yəqin ki, İslam dini, düzgün əqidə, tövhidə meyillilik nəzərdə tutulur". "İkmalul-Mulim Şərh Səhih Muslim", 1/328.

[4] "Məryəm" surəsi, 57.

Sonra (heyvan) bizi beşinci səmaya qaldırdı. Cəbrail qapının açılmasını xahiş etdi. (Gözətçilər): "Kimdir o?"– deyə soruşdular. O: "Cəbraildir!"– dedi. Onlar: "Yanındakı kimdir?"– deyə soruşdular. O: "Muhəmməddir!"– dedi. Onlar soruşdular: "Onu çağırıblarmı?" Cəbrail: "(Bəli,) çağırıblar"– dedi. (Bundan sonra) qapılar bizim üzümüzə açıldı. Mən (içəri daxil olduqda) Harunu ﷺ gördüm. O, mənə xoşgəldin elədi və mənim üçün xeyir-dua dilədi. Sonra (heyvan) bizi altıncı səmaya qaldırdı. Cəbrail عليه السلام qapının açılmasını xahiş etdi. (Gözətçilər): "Kimdir o?"– deyə soruşdular. O: "Cəbraildir!"– dedi. Onlar: "Yanındakı kimdir?"– deyə soruşdular. O: "Muhəmməddir!"– dedi. Onlar soruşdular: "Onu çağırıblarmı?" Cəbrail: "(Bəli,) çağırıblar"– dedi. (Bundan sonra) qapılar bizim üzümüzə açıldı. Mən (içəri girdikdə) Musanı ﷺ gördüm. O, mənə xoşgəldin elədi və mənim üçün xeyir-dua dilədi. Sonra (heyvan) bizi yeddinci səmaya qaldırdı. Cəbrail qapının açılmasını xahiş etdi. (Gözətçilər): "Kimdir o?"– deyə soruşdular. O: "Cəbraildir!"– dedi. Onlar: "Yanındakı kimdir?"– deyə soruşdular. O: "Muhəmməddir!"– dedi. Onlar soruşdular: "Onu çağırıblarmı?" Cəbrail: "(Bəli,) çağırıblar"– dedi. (Bundan sonra) qapılar bizim üzümüzə açıldı. Mən (içəri keçdikdə) İbrahimi ﷺ gördüm. O, arxasını Beytul-Məmura[1] söykəmişdi. Hər gün bu evə yetmiş min mələk girir və bir daha ora qayıtmırlar.[2]

Sonra (Cəbrail) məni son həddəki Sidr ağacının[3] yanına apardı. Onun yarpaqları fil qulaqları boyda idi, meyvələri də (Həcər məmləkətində düzəldilən) saxsı səhənglərə bənzəyirdi. Allahın əmri Sidr ağacını bürüdükdə, o, bambaşqa görkəm aldı. Belə ki, Allahın yaratdıqlarından heç kəs onun gözəlliyini vəsf edə bilməz.

Sonra Allah mənə vəhy edəcəyini vəhy etdi. Və mənə gecə və gündüz əlli (vaxt) namaz qılmağı vacib buyurdu. (Bundan sonra) mən Musanın عليه السلام yanına endim. Musa məndən soruşdu: "Rəbbin sənin ümmətinə nəyi vacib buyurdu?" Dedim: "Əlli (vaxt) namaz qılmağı vacib buyurdu". Dedi: "Rəbbinin yanına qayıt və Ondan ümmətin üçün (bu hökmü) yüngülləşdirməyi xahiş et.

---

[1] Bu ev yeddinci səmada, bilavasitə Kəbənin üstündə yerləşən məbəddir.

[2] əl-Ayni demişdir: "Hər gün oraya yetmiş min mələk daxil olub təvaf edir və namaz qılırlar, sonra bir daha ora qayıtmırlar". "Umdətul-Qari", 6/127.

[3] Sidrətul-Muntəha: Bu, yeddinci göydə bitən ağacdır. O, bu adını ona görə alıb ki, yerdən gedən və Allahdan nazil olan hər nə varsa, ona qədər gedib çatır.

Çünki ümmətin buna tab gətirə bilməyəcək. Mən İsrail oğullarını sınadım, (bu xüsusda) onları yoxladım, (lakin heç nə alınmadı)".

Mən Rəbbimin yanına qayıdıb: "Ey Rəbbim! Ümmətim üçün (bu hökmü) yüngülləşdir"– dedim, O da mənə (bundan) beşini keçdi. Sonra mən Musanın yanına qayıdıb: "(Rəbbim) mənə beşini keçdi"– dedim. Musa buyurdu: "Sənin ümmətin buna tab gətirə bilməyəcək. Rəbbinin yanına qayıt və Ondan (bu hökmü) yüngülləşdirməyi xahiş et". Beləcə Rəbbim Təbarəkə və Təalə ilə Musa aleyhissəlam arasında gedib-gəlməyə davam etdim. Axırda (Rəbbim) buyurdu: "Ey Muhəmməd! Bunlar hər gecə və gündüz (qılınan) beş namazdır. Hər bir namaz üçün on (savab) vardır. Bunlar da (savab baxımından) əlli namaza bərabərdir. Kim bir yaxşı iş görməyə niyyət etsə, sonra buna əməl etməzsə, ona bir savab yazılar. Və əgər yaxşı iş görməyə niyyət edər və bunu yerinə yetirərsə, ona on savab yazılar. Kim də bir günah iş görməyə niyyət etsə, sonra onu etməzsə, ona heç nə yazılmaz, (yox) əgər bunu edərsə, ona (cəmi) bir günah yazılar".

Sonra mən aşağı endim və Musanın yanına gəlib bunu ona xəbər verdim. Musa dedi: "Rəbbinin yanına qayıt və Ondan (bu hökmü) yüngülləşdirməyi xahiş et".

Rəsulullah ﷺ buyurdu: "Mən dedim: "Rəbbimin yanına (çox) qayıtdım. Belə ki, artıq Ondan utanıram".

**[٤١٢] ٢٦٠**-(...) حَدَّثَنِي عَبْدُ اللَّهِ بْنُ هَاشِمٍ الْعَبْدِيُّ: حَدَّثَنَا بَهْزُ [بْنُ أَسَدٍ]: حَدَّثَنَا سُلَيْمَانُ بْنُ الْمُغِيرَةِ: حَدَّثَنَا ثَابِتٌ عَنْ أَنَسِ بْنِ مَالِكٍ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((أُتِيتُ فَانْطَلَقُوا بِي إِلَى زَمْزَمَ، فَشُرِحَ عَنْ صَدْرِي، ثُمَّ غُسِلَ بِمَاءِ زَمْزَمَ ثُمَّ أُنْزِلْتُ)).

**[412]-260-(...)** ........ Ənəs ibn Malik ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "(Mələklər) yanıma gəlib məni Zəmzəm olan yerə apardılar, köksümü yardılar, sonra onu Zəmzəm suyu ilə yudular. Sonra da məni (götürdükləri yerə) qoydular".

**[٤١٣] ٢٦١**-(...) حَدَّثَنَا شَيْبَانُ بْنُ فَرُّوخَ: حَدَّثَنَا حَمَّادُ بْنُ سَلَمَةَ: حَدَّثَنَا ثَابِتٌ الْبُنَانِيُّ عَنْ أَنَسِ بْنِ مَالِكٍ، أَنَّ رَسُولَ اللَّهِ ﷺ أَتَاهُ جِبْرِيلُ ﷺ وَهُوَ يَلْعَبُ مَعَ الْغِلْمَانِ، فَأَخَذَهُ فَصَرَعَهُ فَشَقَّ عَنْ قَلْبِهِ، فَاسْتَخْرَجَ الْقَلْبَ، فَاسْتَخْرَجَ مِنْهُ عَلَقَةً، فَقَالَ: هَذَا حَظُّ الشَّيْطَانِ مِنْكَ، ثُمَّ غَسَلَهُ فِي طَسْتٍ مِنْ ذَهَبٍ بِمَاءِ زَمْزَمَ، ثُمَّ

لأَمَهُ ثُمَّ أَعَادَهُ فِي مَكَانِه، وَجَاءَ الْغِلْمَانُ يَسْعَوْنَ إِلَى أُمِّهِ – يَعْنِي ظِئْرَهُ – فَقَالُوا: إِنَّ مُحَمَّدًا قَدْ قُتِلَ، فَاسْتَقْبَلُوهُ وَهُوَ مُنْتَقِعُ اللَّوْنِ، قَالَ أَنَسٌ: وَقَدْ كُنْتُ أَرَى أَثَرَ ذَلِكَ الْمِخْيَطِ فِي صَدْرِهِ.

**[413]-261-(...)** ........ Ənəs ibn Malik ﷺ demişdir: "Peyğəmbər ﷺ (kiçik yaşlarında) uşaqlarla oynayarkən Cəbrail ﷺ onun yanına gəldi, onu tutub yerə yıxdı və köksünü yarıb qəlbini çıxartdı. Sonra onun içindən qan laxtası çıxartdı və (Peyğəmbərə ﷺ): "Bu, şeytanın səndə olan nəsibidir"– dedi. Onun qəlbini qızıl ləyənin içində Zəmzəm suyu ilə yuduqdan sonra onu bağladı. Sonra da onu yerinə qaytardı. (Bunu görən) uşaqlar tələsik onun süd anasının[1] yanına gəlib: "Muhəmməd öldürüldü!"– dedilər. (Dərhal) hamısı onun yanına gəldi. Onun rəngi qaçmışdı".

Ənəs dedi: "Mən tikişlərin yerini onun köksündə görürdüm".

**[٤١٤] ٢٦٢**–(...) حَدَّثَنَا هَارُونُ بْنُ سَعِيدٍ الأَيْلِيُّ: حَدَّثَنَا ابْنُ وَهْبٍ: أَخْبَرَنِي سُلَيْمَانُ وَهُوَ ابْنُ بِلاَلٍ: حَدَّثَنِي شَرِيكُ بْنُ عَبْدِ اللَّهِ بْنِ أَبِي نَمِرٍ: قَالَ سَمِعْتُ أَنَسَ بْنَ مَالِكٍ، يُحَدِّثُنَا عَنْ لَيْلَةَ أُسْرِيَ بِرَسُولِ اللَّهِ ﷺ مِنْ مَسْجِدِ الْكَعْبَةِ، أَنَّهُ جَاءَهُ ثَلاَثَةُ نَفَرٍ قَبْلَ أَنْ يُوحَى إِلَيْهِ، وَهُوَ نَائِمٌ فِي الْمَسْجِدِ الْحَرَامِ. وَسَاقَ الْحَدِيثَ بِقِصَّتِهِ نَحْوَ حَدِيثِ ثَابِتٍ الْبُنَانِيِّ، وَقَدَّمَ فِيهِ شَيْئًا وَأَخَّرَ، وَزَادَ وَنَقَصَ.

**[414]-262-(...)** ........ Şərik ibn Abdullah ibn Əbu Nəmir Ənəs ibn Malikdən Rəsulullahın ﷺ gecə vaxtı Kəbədən (Allahın hüzuruna) getdiyini belə rəvayət etmişdir: "Peyğəmbərə ﷺ hələ vəhy nazil olmamışdan əvvəl[2] o, Məscidul-Həramda[3] yatmış ikən[4] üç nəfər[5] onun yanına gəldi..."

---

[1] Peyğəmbərimizin ﷺ süd anası Həlimə bint Əbu Zueyb olmuşdur.

[2] Bu rəvayətdə Şərik ibn Abdullahın: "hələ vəhy nazil olmamışdan əvvəl" sözü yanlış sözdür. Bunun yanlış olduğunu Xəttabi, ibn Həzm, Qazı İyad, Nəvəvi və başqa alimlər söyləmişlər. Belə ki, Peyğəmbər ﷺ vəhy nazil olmamışdan əvvəl yox, sonra merac səfərinə çıxmışdır. İmam Muslimin: "Ravi bu hədisi Sabit əl-Bunaninin hədisi kimi rəvayət etmiş, lakin (hədisdə) önə keçirdiyi və arxaya buraxdığı, əlavə etdiyi və əskiltdiyi bəzi şeylər vardır" sözü də Şərikin rəvayətində nöqsan olduğunu göstərir.

[3] Məkkədə yerləşən və zəvvarların ziyarət etməsinə icazə verilən ilk müqəddəs ziyarətgahdır. Bu məsciddə namaz qılarkən qazanılan savab, başqa məscidlərdə yüz min dəfə namaz qılanın savabına bərabərdir. Allahın müqəddəs Evi – Kəbə, məhz bu məsciddə yerləşir.

[4] Rəvayətlərin birində deyilir ki: "Peyğəmbər ﷺ onları qəlbi ilə görürdü. Peyğəmbərin ﷺ gözləri yatsa da, qəlbi yatmazdı. Peyğəmbərlərin hamısı belə olmuşlar, gözləri yatsa da, qəlbləri yatmazdı..." ("Səhih əl-Buxari", 3570).

[5] Bunların üçü də mələklər idi.

Ravi bu hədisi Sabit əl-Bunaninin hədisi kimi rəvayət etmiş, lakin (hədisdə) önə keçirdiyi və arxaya buraxdığı, əlavə etdiyi və əskiltdiyi bəzi şeylər vardır.

**[٤١٥] ٢٦٣**-(١٦٣) و حَدَّثَنِي حَرْمَلَةُ بْنُ يَحْيَى التُّجِيبِيُّ: أَخْبَرَنَا ابْنُ وَهْبٍ قَالَ: أَخْبَرَنِي يُونُسُ عَنْ ابْنِ شِهَابٍ، عَنْ أَنَسِ بْنِ مَالِكٍ قَالَ: كَانَ أَبُو ذَرٍّ يُحَدِّثُ، أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: ((فُرِجَ سَقْفُ بَيْتِي وَأَنَا بِمَكَّةَ فَنَزَلَ جِبْرِيلُ - عَلَيْهِ السَّلاَمُ - فَفَرَجَ صَدْرِي، ثُمَّ غَسَلَهُ مِنْ مَاءِ زَمْزَمَ، ثُمَّ جَاءَ بِطَسْتٍ مِنْ ذَهَبٍ مُمْتَلِئٍ حِكْمَةً وَإِيمَانًا، فَأَفْرَغَهَا فِي صَدْرِي، ثُمَّ أَطْبَقَهُ ثُمَّ أَخَذَ بِيَدِي فَعَرَجَ بِي إِلَى السَّمَاءِ، فَلَمَّا جِئْنَا السَّمَاءَ الدُّنْيَا، قَالَ جِبْرِيلُ [عَلَيْهِ السَّلاَم] لِخَازِنِ السَّمَاءِ الدُّنْيَا، افْتَحْ. قَالَ: مَنْ هَذَا؟ قَالَ: هَذَا جِبْرِيلُ. قَالَ: هَلْ مَعَكَ أَحَدٌ؟ قَالَ: نَعَمْ، مَعِيَ مُحَمَّدٌ ﷺ. قَالَ: فَأُرْسِلَ إِلَيْهِ؟ قَالَ: نَعَمْ، فَفَتَحَ قَالَ: فَلَمَّا عَلَوْنَا السَّمَاءَ الدُّنْيَا فَإِذَا رَجُلٌ عَنْ يَمِينِهِ أَسْوِدَةٌ وَعَنْ يَسَارِهِ أَسْوِدَةٌ -قَالَ - فَإِذَا نَظَرَ قِبَلَ يَمِينِهِ ضَحِكَ، وَإِذَا نَظَرَ قِبَلَ شِمَالِهِ بَكَى، قَالَ فَقَالَ: مَرْحَبًا بِالنَّبِيِّ الصَّالِحِ، وَالاِبْنِ الصَّالِحِ. قَالَ قُلْتُ: يَا جِبْرِيلُ! مَنْ هَذَا؟ قَالَ: هَذَا آدَمُ ﷺ، وَهَذِهِ الأَسْوِدَةُ عَنْ يَمِينِهِ، وَعَنْ شِمَالِهِ نَسَمُ بَنِيهِ. فَأَهْلُ الْيَمِينِ أَهْلُ الْجَنَّةِ، وَالأَسْوِدَةُ الَّتِي عَنْ شِمَالِهِ أَهْلُ النَّارِ، فَإِذَا نَظَرَ قِبَلَ يَمِينِهِ ضَحِكَ، وَإِذَا نَظَرَ قِبَلَ شِمَالِهِ بَكَى - قَالَ - ثُمَّ عَرَجَ بِي جِبْرِيلُ حَتَّى أَتَى السَّمَاءَ الثَّانِيَةَ، فَقَالَ لِخَازِنِهَا: افْتَحْ. قَالَ: فَقَالَ لَهُ خَازِنُهَا مِثْلَ مَا قَالَ خَازِنُ السَّمَاءِ الدُّنْيَا، فَفَتَحَ.

فَقَالَ أَنَسُ بْنُ مَالِكٍ: فَذَكَرَ أَنَّهُ وَجَدَ فِي السَّمَاوَاتِ آدَمَ وَإِدْرِيسَ وَعِيسَى وَمُوسَى وَإِبْرَاهِيمَ - عَلَيْهِمُ السَّلاَمُ - وَلَمْ يُثْبِتْ كَيْفَ مَنَازِلُهُمْ، غَيْرَ أَنَّهُ ذَكَرَ أَنَّهُ قَدْ وَجَدَ آدَمَ - عَلَيْهِ السَّلاَم - فِي السَّمَاءِ الدُّنْيَا، وَإِبْرَاهِيمَ فِي السَّمَاءِ السَّادِسَةِ قَالَ: فَلَمَّا مَرَّ جِبْرِيلُ وَرَسُولُ اللَّهِ ﷺ بِإِدْرِيسَ قَالَ: مَرْحَبًا بِالنَّبِيِّ الصَّالِحِ، وَالأَخِ الصَّالِحِ. قَالَ ثُمَّ مَرَّ فَقُلْتُ: مَنْ هَذَا؟ فَقَالَ: هَذَا إِدْرِيسُ. قَالَ: ثُمَّ مَرَرْتُ بِمُوسَى - عَلَيْهِ السَّلاَم - فَقَالَ: مَرْحَبًا بِالنَّبِيِّ الصَّالِحِ، وَالأَخِ الصَّالِحِ. قَالَ قُلْتُ: مَنْ هَذَا؟ قَالَ: هَذَا مُوسَى. قَالَ: ثُمَّ مَرَرْتُ بِعِيسَى، فَقَالَ: مَرْحَبًا بِالنَّبِيِّ الصَّالِحِ، وَالأَخِ الصَّالِحِ. قُلْتُ: مَنْ هَذَا؟ قَالَ هَذَا عِيسَى ابْنُ مَرْيَمَ - قَالَ - ثُمَّ مَرَرْتُ بِإِبْرَاهِيمَ عَلَيْهِ السَّلاَم - فَقَالَ: مَرْحَبًا بِالنَّبِيِّ الصَّالِحِ، وَالاِبْنِ الصَّالِحِ - قَالَ - قُلْتُ: مَنْ هَذَا؟ قَالَ: هَذَا إِبْرَاهِيمُ)).

قَالَ ابْنُ شِهَابٍ: وَأَخْبَرَنِي ابْنُ حَزْمٍ، أَنَّ ابْنَ عَبَّاسٍ وَأَبَا حَبَّةَ الأَنْصَارِيَّ [كَانَا] يَقُولاَنِ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((ثُمَّ عَرَجَ بِي حَتَّى ظَهَرْتُ لِمُسْتَوًى أَسْمَعُ فِيهِ صَرِيفَ الأَقْلاَمِ)).

قَالَ ابْنُ حَزْمٍ وَأَنَسُ بْنُ مَالِكٍ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((فَفَرَضَ اللَّهُ عَلَى أُمَّتِي خَمْسِينَ صَلاَةً. قَالَ: فَرَجَعْتُ بِذَلِكَ حَتَّى أَمُرَّ بِمُوسَى فَقَالَ مُوسَى عَلَيْهِ السَّلاَم: مَاذَا فَرَضَ رَبُّكَ عَلَى أُمَّتِكَ؟ قَالَ قُلْتُ: فَرَضَ عَلَيْهِمْ خَمْسِينَ صَلاَةً. قَالَ لِي مُوسَى: فَرَاجِعْ رَبَّكَ، فَإِنَّ أُمَّتَكَ لاَ تُطِيقُ ذَلِكَ، قَالَ: فَرَاجَعْتُ رَبِّي فَوَضَعَ [عَنِّي] شَطْرَهَا، قَالَ: فَرَجَعْتُ إِلَى مُوسَى عَلَيْهِ السَّلاَم فَأَخْبَرْتُهُ، قَالَ: رَاجِعْ رَبَّكَ، فَإِنَّ أُمَّتَكَ لاَ تُطِيقُ ذَلِكَ، قَالَ: فَرَاجَعْتُ رَبِّي، فَقَالَ: هِيَ خَمْسٌ وَهِيَ خَمْسُونَ، لاَ يُبَدَّلُ الْقَوْلُ لَدَيَّ. قَالَ: فَرَجَعْتُ إِلَى مُوسَى، فَقَالَ: رَاجِعْ

رَبَّكَ. فَقُلْتُ: قَدْ اسْتَحْيَيْتُ مِنْ رَبِّي، قَالَ: ثُمَّ انْطَلَقَ بِي جِبْرِيلُ حَتَّى نَأْتِيَ سِدْرَةَ الْمُنْتَهَى، فَغَشِيَهَا أَلْوَانٌ لاَ أَدْرِي مَا هِيَ قَالَ: ثُمَّ أُدْخِلْتُ الْجَنَّةَ فَإِذَا فِيهَا جَنَابِذُ اللُّؤْلُؤِ، وَإِذَا تُرَابُهَا الْمِسْكُ)).

**[415]-263-(163)** ........ Ənəs ibn Malik ﷺ Əbu Zərdən rəvayət etmişdir ki, Peyğəmbər ﷺ belə demişdir: "Mən Məkkədə[1] ikən evimin tavanı aralandı və Cəbrail (ﷺ yanıma) endi. O, köksümü yardı, sonra onun içini Zəm-zəm suyu ilə yudu. Sonra da içi hikmət və imanla dolu olan qızıl ləyən gətirib içindəkiləri köksümə boşaltdı və köksümü bağladı. Sonra əlimdən tutub məni göyə qaldırdı. Mən yerə ən yaxın olan səmaya gəlib çatdıqda Cəbrail (aleyhissəlam) dünya səmasının gözətçisinə: "Aç"– dedi. (Gözətçi): "Kimdir o?"– deyə soruşdu. O: "Cəbraildir!"– dedi. (Gözətçi): "Yanında kimsə varmı?"– deyə soruşdu. Cəbrail: "Bəli, Muhəmməd ﷺ yanımdadır!"– dedi. (Gözətçi) soruşdu: "Ona (gəlsin deyə) xəbər göndərildimi?" Cəbrail: "Bəli!"– dedi. Gözətçi (qapıları) açdı. Biz yaxın göyün üstünə qalxdıq və orada (oturmuş) bir adam gördük ki, onun sağ və sol tərəfində qaraltılar var idi. Bu adam sağa baxanda gülür, sola baxanda isə ağlayırdı. O, (məni görüb) dedi: "Əməlisaleh peyğəmbər və əməlisaleh oğul xoş gəlibdir!" Mən: "Ey Cəbrail! Bu kimdir?"– deyə soruşdum. Dedi: "Bu Adəmdir, sağında və solunda olan qaraltılar isə zürriyyətinin ruhlarıdır. Sağında olanlar Cənnət əhli, solundakı qaraltılar isə Cəhənnəm əhlidir. (Buna görə də) o, sağına baxanda gülür, soluna baxanda ağlayır". Sonra Cəbrail məni (göyə) qaldırdı. Nəhayət, ikinci göyə gəlib çatdıqda onun gözətçisinə: "Aç"– dedi. Bu gözətçi də ona dünya səmasının gözətçisinin dediyini deyəndən sonra (qapını) açdı.

Ənəs ibn Malik ﷺ demişdir: "Əbu Zərr Peyğəmbərin ﷺ səmalarda Adəmi, İdrisi, İsanı, Musanı və İbrahimi – onların hamısına Allahın salavatı olsun! – gördüyünü söyləsə də, onların məqamları barədə dəqiq bir söz demədi. Yalnız Adəmi ﷺ dünya səmasında, İbrahimi də altıncı səmada gördüyünü söylədi.

Ənəs ﷺ demişdir: "Cəbrail Peyğəmbərlə ﷺ birlikdə İdrisin yanından keçdikdə (İdris): "Əməlisaleh peyğəmbər və əməlisaleh qardaş xoş gəlibdir!"– dedi".

(Sonra Peyğəmbər ﷺ dedi:) "Mən: "Bu kimdir?"– deyə soruşdum. Cəbrail: "Bu, İdrisdir"– dedi. Sonra mən Musanın ﷺ yanından keçdim. O da: "Əməli-

[1] Səudiyyə Ərəbistanında şəhərdir. Müsəlmanların ən mühüm müqəddəs yeri olan Kəbə bu şəhərdə yerləşir. Onun əsası İsmail peyğəmbərin ﷺ dövründə qoyulmuşdur. Muhəmməd Peyğəmbər ﷺ də orada anadan olmuş və İslamı yaymağa başlamışdır.

saleh peyğəmbər və əməlisaleh qardaş xoş gəlibdir!"– dedi. Mən: "Bu kimdir?"– deyə soruşdum. Cəbrail: "Bu, Musadır"– dedi. Sonra mən İsanın yanından keçdim. O da: "Əməlisaleh peyğəmbər və əməlisaleh qardaş xoş gəlibdir!"– dedi. Mən: "Bu kimdir?"– deyə soruşdum. Cəbrail: "Bu, Məryəm oğlu İsadır"– dedi. Sonra mən İbrahimin ﷺ yanından keçdim. İbrahim: "Əməlisaleh peyğəmbər və əməlisaleh övlad xoş gəlibdir!"– dedi. Mən: "Bu kimdir?"– deyə soruşdum. Cəbrail: "Bu, İbrahimdir"– dedi".

İbn Şihab dedi: "İbn Həzm mənə xəbər vermişdir ki, İbn Abbas və Əbu Həbbə əl-Ənsari[1] belə rəvayət etmişlər: "Peyğəmbər ﷺ demişdir: "Sonra Cəbrail məni elə bir yüksəkliyə qaldırdı ki, nəhayət, mən qələmlərin xışıltısını[2] eşitdim".

İbn Həzm (istinad edərək) və Ənəs ibn Malik rəvayət etmişlər ki, Peyğəmbər ﷺ demişdir: "Allah mənim ümmətimə əlli *vaxt* namaz qılmağı vacib buyurdu. Mən bu (məsuliyyətli işi öhdəmə götürüb) geri döndüm. Nəhayət, Musanın yanına gəlib çatdıqda Musa ﷺ (məndən): "Allah sənin ümmətinə nəyi əmr etdi?"– deyə soruşdu. Dedim: "Əlli *vaxt* namaz qılmağı vacib buyurdu". Musa dedi: "Rəbbinin yanına qayıt (və Ondan bu hökmü yüngülləşdirməyi) xahiş et. Çünki sənin ümmətin bunun öhdəsindən gələ bilməyəcək". Mən Rəbbimə müraciət etdim və O da bunun sayını bir qədər azaltdı. Sonra Musanın ﷺ yanına qayıdıb bunu ona xəbər verdim. Musa yenə dedi: "Rəbbinə müraciət et. Çünki sənin ümmətin bunun öhdəsindən gələ bilməyəcək". Mən yenə Rəbbimə müraciət etdim. (Allah Təbarəkə və Təalə) buyurdu: "Onlar (sayca) beşdir, (savab baxımından isə) əllidir, çünki Mənim sözüm dəyişməzdir". Sonra mən Musanın yanına qayıtdım. O yenə dedi: "Rəbbinə müraciət et!" Mən: "Artıq Rəbbimdən utanıram"– dedim. Sonra Cəbrail məni son həddəki Sidr ağacının[3] yanına apardı. Bu ağacı elə (əcaib-qəraib) rənglər bürümüşdü ki, mən onların nə olduğunu bilmirəm. Sonra məni Cənnətə daxil etdilər. Orada incilərdən qübbələr var idi. Torpağı da müşk (qoxulu) idi".

**[٤١٦] ٢٦٤–(١٦٤)** حَدَّثَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى: حَدَّثَنَا ابْنُ أَبِي عَدِيٍّ عَنْ سَعِيدٍ، عَنْ قَتَادَةَ، عَنْ أَنَسِ بْنِ مَالِكٍ –لَعَلَّهُ قَالَ – عَنْ مَالِكِ بْنِ صَعْصَعَةَ – رَجُلٍ مِنْ قَوْمِهِ – قَالَ: قَالَ نَبِيُّ اللَّهِ ﷺ: ((بَيْنَا أَنَا عِنْدَ الْبَيْتِ

---

1 Əbu Həbbə əl-Ənsari رضي الله عنه Peyğəmbərin ﷺ səhabəsidir. Adı: Sabit ibn Noməndir. O, Uhud döyüşündə şəhid olmuşdur.

2 Burada xışıltı deyildikdə Allahın buyuruqlarını yazan mələklərin qələmlərinin xışıltısı nəzərdə tutulur.

3 411-ci hədisin qeydlərinə bax.

بَيْنَ النَّائِمِ وَالْيَقْظَانِ، إِذْ سَمِعْتُ قَائِلاً يَقُولُ: أَحَدُ الثَّلاَثَةِ بَيْنَ الرَّجُلَيْنِ، فَأُتِيتُ فَانْطُلِقَ بِي، فَأُتِيتُ بِطَسْتٍ مِنْ ذَهَبٍ فِيهَا مِنْ مَاءِ زَمْزَمَ، فَشُرِحَ صَدْرِي إِلَى كَذَا وَكَذَا – قَالَ قَتَادَةُ: فَقُلْتُ لِلَّذِي مَعِي: مَا يَعْنِي؟ قَالَ: إِلَى أَسْفَلِ بَطْنِهِ – فَاسْتُخْرِجَ قَلْبِي، فَغُسِلَ بِمَاءِ زَمْزَمَ، ثُمَّ أُعِيدَ مَكَانَهُ، ثُمَّ حُشِيَ إِيمَانًا وَحِكْمَةً، ثُمَّ أُتِيتُ بِدَابَّةٍ أَبْيَضَ يُقَالُ لَهُ الْبُرَاقُ – فَوْقَ الْحِمَارِ وَدُونَ الْبَغْلِ، يَقَعُ خَطْوُهُ عِنْدَ أَقْصَى طَرْفِهِ – فَحُمِلْتُ عَلَيْهِ، ثُمَّ انْطَلَقْنَا حَتَّى أَتَيْنَا السَّمَاءَ الدُّنْيَا، فَاسْتَفْتَحَ جِبْرِيلُ – عَلَيْهِ السَّلاَمُ – فَقِيلَ: مَنْ هَذَا؟ قَالَ: جِبْرِيلُ. قِيلَ: وَمَنْ مَعَكَ؟ قَالَ: مُحَمَّدٌ ﷺ. قِيلَ: وَقَدْ بُعِثَ إِلَيْهِ؟ قَالَ: نَعَمْ. قَالَ فَفَتَحَ لَنَا. وَقَالَ: مَرْحَبًا [بِهِ]، وَلَنِعْمَ الْمَجِيءُ جَاءَ. قَالَ: فَأَتَيْنَا عَلَى آدَمَ – عَلَيْهِ السَّلاَمُ –، وَسَاقَ الْحَدِيثَ بِقِصَّتِهِ، وَذَكَرَ أَنَّهُ لَقِيَ فِي السَّمَاءِ الثَّانِيَةِ عِيسَى وَيَحْيَى – عَلَيْهِمَا السَّلاَمُ – وَفِي الثَّالِثَةِ يُوسُفَ، وَفِي الرَّابِعَةِ إِدْرِيسَ. وَفِي الْخَامِسَةِ هَارُونَ – عَلَيْهِمَا السَّلاَمُ – قَالَ: ثُمَّ انْطَلَقْنَا حَتَّى انْتَهَيْنَا إِلَى السَّمَاءِ السَّادِسَةِ، فَأَتَيْتُ عَلَى مُوسَى عَلَيْهِ السَّلاَمُ فَسَلَّمْتُ عَلَيْهِ فَقَالَ: مَرْحَبًا بِالأَخِ الصَّالِحِ وَالنَّبِيِّ الصَّالِحِ، فَلَمَّا جَاوَزْتُهُ بَكَى، فَنُودِيَ مَا يُبْكِيكَ؟ قَالَ: رَبِّ هَذَا غُلاَمٌ بَعَثْتَهُ بَعْدِي، يَدْخُلُ مِنْ أُمَّتِهِ الْجَنَّةَ أَكْثَرُ مِمَّا يَدْخُلُ مِنْ أُمَّتِي، قَالَ: ثُمَّ انْطَلَقْنَا حَتَّى انْتَهَيْنَا إِلَى السَّمَاءِ السَّابِعَةِ، فَأَتَيْتُ عَلَى إِبْرَاهِيمَ عَلَيْهِ السَّلاَمُ)). وَقَالَ فِي الْحَدِيثِ: وَحَدَّثَ نَبِيُّ اللَّهِ ﷺ أَنَّهُ رَأَى أَرْبَعَةَ أَنْهَارٍ يَخْرُجُ مِنْ أَصْلِهَا نَهْرَانِ ظَاهِرَانِ، وَنَهْرَانِ بَاطِنَانِ ((فَقُلْتُ: يَا جِبْرِيلُ! مَا هَذِهِ الأَنْهَارُ؟ قَالَ: أَمَّا النَّهْرَانِ الْبَاطِنَانِ فَنَهْرَانِ فِي الْجَنَّةِ، وَأَمَّا الظَّاهِرَانِ فَالنِّيلُ وَالْفُرَاتُ، ثُمَّ رُفِعَ لِي الْبَيْتُ الْمَعْمُورُ. فَقُلْتُ: يَا جِبْرِيلُ! مَا هَذَا؟ قَالَ هَذَا الْبَيْتُ الْمَعْمُورُ، يَدْخُلُهُ كُلَّ يَوْمٍ سَبْعُونَ أَلْفَ مَلَكٍ، إِذَا خَرَجُوا مِنْهُ لَمْ يَعُودُوا فِيهِ آخِرُ مَا عَلَيْهِمْ، ثُمَّ أُتِيتُ بِإِنَاءَيْنِ أَحَدُهُمَا خَمْرٌ وَالآخَرُ لَبَنٌ، فَعُرِضَا عَلَيَّ، فَاخْتَرْتُ اللَّبَنَ. فَقِيلَ: أَصَبْتَ، أَصَابَ اللَّهُ بِكَ، أُمَّتُكَ عَلَى الْفِطْرَةِ، ثُمَّ فُرِضَتْ عَلَيَّ كُلَّ يَوْمٍ خَمْسُونَ صَلاَةً)). ثُمَّ ذَكَرَ قِصَّتَهَا إِلَى آخِرِ الْحَدِيثِ.

**[416]-264-(164)** ........ Malik ibn Sə'səa ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Bir dəfə mən Kəbənin yanında (Hətimdə[1]) yarıoyaq-yarıyuxulu ikən bir nəfərin: "Üç kişidən biri, iki kişinin arasında (olanı götürün)"[2]– dediyini

[1] Bu, Kəbəyə bitişik yarımdairə şəklində hörülmüş, hündür olmayan divarla Kəbənin arasındakı yerdir. Bu yer Hicr və ya Hətim adlanır.

Diqqət edin! İmam Buxari "Səhih" əsərində "Yaradılışın başlanğıcı kitabında" nəql etdiyi hədisdə: "Mən Kəbənin yanında ikən...", Zuhrinin Ənəsdən, onun da Əbu Zərdən rəvayət etdiyi hədisdə: "Mən Məkkədə ikən evimin tavanı açıldı..." deyilir, habelə Vaqidinin gətirdiyi rəvayətlərdə Peyğəmbərin ﷺ Əbu Talibin evindən, Təbəraninin rəvayətində isə onun Ummu Haninin evindən meraca getdiyi xəbər verilir. Bu rəvayətləri cəm edib demək olar ki: "Həmin vaxt Peyğəmbər ﷺ Ummu Haninin evində imiş. Ummu Haninin evi isə Əbu Talibin həyətində yerləşirmiş. Sonra evin tavanı açılmış və Cəbrail ﷺ gəlib Peyğəmbəri ﷺ Kəbənin yanına aparmışdır. O, Kəbənin yanında uzanıb yarıoyaq-yarıyuxulu ikən mələk onu məscidin qapısının yanına gətirmiş və Buraqa mindirmişdir. " ("Fəth əl-Bari", 11/216).

[2] Burada "Üç kişi" deyildikdə Peyğəmbər ﷺ, Həmzə ﷺ və Cəfər ﷺ nəzərdə tutulur. Həmin vaxt Peyğəmbər ﷺ onların arasında uzanmışdı.

eşitdim. Elə bu vaxt onlar mənim yanıma gəldilər və məni götürüb apardılar. (Orada) yanıma içində Zəmzəm suyu olan qızıldan bir ləyən gətirdilər. Sonra köksümü buradan bura kimi yardılar. (Qətadə dedi: Yanımdakı adama: "O, nəyi qəsd edirdi?"– dedim. Dedi: "qarnının alt nahiyəsini".) Sonra qəlbimi çıxardıb Zəmzəm suyu ilə yudular və onu yerinə qoydular. Sonra qəlbimə iman və hikmət dolduruldu. Sonra mənim yanıma qatırdan alçaq və uzunqulaqdan hündür olan, ağ rəngli bir heyvan gətirdilər. Onun adı Buraq idi. O, addımını gözünün gördüyü son nöqtəyə qoyurdu. Məni ona mindirdilər. Sonra biz yolumuza davam etdik. Nəhayət, dünya səmasına gəlib çatdıqda Cəbrail عليه السلام qapının açılmasını xahiş etdi. (Gözətçi): "Kimdir o?"– deyə soruşdu. O: "Cəbraildir!"– dedi. (Gözətçi): "Yanındakı kimdir?"– deyə soruşdu. O: "Muhəmməddir!"– dedi. (Gözətçi): "Onu çağırıblarmı?"– deyə soruşdu. Cəbrail: "Bəli!"– dedi. (Gözətçi) qapını bizim üzümüzə açdı və dedi: "Xoş gəlib, səfa gətirib! O, nə gözəl ziyarətçidir!" Biz (içəri keçib) Adəmin عليه السلام yanına gəldik..."

Ravi bu hədisi nəql etmiş və demişdir: "O, ikinci səmada İsa və Yəhyaya – (onlara Allahın salamı olsun!) – üçüncü səmada Yusufa, dördüncü səmada İdrisə və beşinci səmada Haruna – (onlara Allahın salamı olsun!) – rast gəldi".

Peyğəmbər ﷺ davam edib dedi: "Sonra biz yolumuza davam etdik və nəhayət, gəlib altıncı səmaya çatdıq. Mən Musanın عليه السلام yanına gəldim və ona salam verdim. O (mənim salamımı aldıqdan sonra) dedi: "Xoş gəlmisən, ey əməlisaleh qardaş və əməlisaleh peyğəmbər!" Mən onun yanından keçib getdikdə, o ağladı. Ondan: "Niyə ağlayırsan?"– deyə soruşdular. Dedi: "Ey Rəbbim! Məndən sonra göndərdiyin bu cavan oğlanın ümmətindən Cənnətə daxil olanların sayı, mənim ümmətimdən ora daxil olanların sayından qat-qat artıq olacaq". Sonra biz yolumuza davam etdik və nəhayət, gəlib yeddinci səmaya çatdıq. Orada mən İbrahimin عليه السلام yanına gəldim".

Bu hədisdə ravi belə demişdir: "Peyğəmbər xəbər vermişdir ki, orada o, (son həddəki) Sidr ağacının dibindən çıxan dörd çay görmüşdür. Bu çaylardan ikisi üstdən, ikisi də altdan axırdı. Mən soruşdum: "Bu nə çaylardır, ey Cəbrail?" Dedi. "Altdakı çaylar Cənnətdən axır.[1] Üstdəki çaylar isə Nil və Furat çaylarıdır". Sonra mənə Beytul-Məmuru göstərdilər. Soruşdum: "Bu nədir, ey Cəbrail?" Dedi: "Bu Beytul-Məmurdur. Hər gün onun içinə yetmiş min mələk

---

[1] Bu, Seyhan və Ceyhan çaylarıdır.

girir. Oradan çıxdıqdan sonra bir daha ora qayıtmırlar. Sonra mənə iki qab gətirdilər, birində şərab, digərində isə süd var idi. Onları mənə uzatdılar və mən südü seçdim. Onda mənə: "Sən (fitrətinə) uyğun seçim etdin. Allah sənə (xeyir) nəsib etdi. Ümmətin də fitrət üzərində olacaq"– deyildi. Bundan sonra mənə gündəlik olaraq əlli (vaxt) namaz qılmaq vacib buyuruldu".

Sonra ravi hədisi axıra kimi rəvayət etdi.

**[٤١٧] ٢٦٥**–(...) حَدَّثَنِي مُحَمَّدُ بْنُ الْمُثَنَّى: حَدَّثَنَا مُعَاذُ بْنُ هِشَامٍ: قَالَ حَدَّثَنِي أَبِي عَنْ قَتَادَةَ: حَدَّثَنَا أَنَسُ بْنُ مَالِكٍ عَنْ مَالِكِ بْنِ صَعْصَعَةَ؛ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: فَذَكَرَ نَحْوَهُ، وَزَادَ فِيهِ: ((فَأُتِيتُ بِطَسْتٍ مِنْ ذَهَبٍ مُمْتَلِئٍ حِكْمَةً وَإِيمَانًا، فَشُقَّ مِنَ النَّحْرِ إِلَى مَرَاقِّ الْبَطْنِ، فَغُسِلَ بِمَاءِ زَمْزَمَ ثُمَّ مُلِئَ حِكْمَةً وَإِيمَانًا)).

**[417]-265-(...)** ........ Ənəs ibn Malik rəvayət etmişdir ki, Malik ibn Sə'səa: "Peyğəmbər ﷺ buyurmuşdur:..." deyərək hədisi eyni ilə rəvayət etmişdir. (Hədisdə) bunu da əlavə etmişdir: "Mənə içi hikmət və imanla dolu olan qızıl ləyən gətirdilər. Sonra mənim (bədənimi) boğazımdan qarnımın alt nahiyəsinə qədər yardılar. Sonra onu Zəmzəm suyu ilə yudular. Sonra da qəlbim hikmət və imanla dolduruldu".

**[٤١٨] ٢٦٦**–(١٦٥) حَدَّثَنِي مُحَمَّدُ بْنُ الْمُثَنَّى وَابْنُ بَشَّارٍ – قَالَ ابْنُ الْمُثَنَّى: حَدَّثَنَا – مُحَمَّدُ بْنُ جَعْفَرٍ: حَدَّثَنَا شُعْبَةُ عَنْ قَتَادَةَ قَالَ: سَمِعْتُ أَبَا الْعَالِيَةِ يَقُولُ: حَدَّثَنِي ابْنُ عَمِّ نَبِيِّكُمْ ﷺ يَعْنِي ابْنَ عَبَّاسٍ قَالَ: ذَكَرَ رَسُولُ اللَّهِ ﷺ حِينَ أُسْرِيَ بِهِ فَقَالَ: ((مُوسَى آدَمُ طُوَالٌ كَأَنَّهُ مِنْ رِجَالِ شَنُوءَةَ)) وَقَالَ: ((عِيسَى جَعْدٌ مَرْبُوعٌ)) وَذَكَرَ مَالِكًا خَازِنَ جَهَنَّمَ وَذَكَرَ الدَّجَّالَ.

**[418]-266-(165)** ........ Qətadə demişdir: "Mən Əbul-Aliyənin belə dediyini eşitdim: "Peyğəmbərinizin ﷺ əmisi oğlu (yəni ibn Abbas) demişdir: "Peyğəmbər ﷺ İsra gecəsi[1] barəsində danışarkən demişdir: "Musa qarabuğdayı, hündürboylu bir adam idi, lap Şənuə qəbiləsinin kişiləri kimi". Həmçinin demişdir: "İsa dolubədənli, ortaboylu bir adam idi". Peyğəmbər ﷺ Cəhənnəmin gözətçisi Maliki, həmçinin Dəccalı da zikr etdi.

**[٤١٩] ٢٦٧**–(...) و حَدَّثَنَا عَبْدُ بْنُ حُمَيْدٍ: أَخْبَرَنَا يُونُسُ بْنُ مُحَمَّدٍ: حَدَّثَنَا شَيْبَانُ بْنُ عَبْدِ الرَّحْمَنِ عَنْ قَتَادَةَ، عَنْ أَبِي الْعَالِيَةِ: حَدَّثَنَا ابْنُ عَمِّ نَبِيِّكُمْ ﷺ – ابْنُ عَبَّاسٍ – قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((مَرَرْتُ لَيْلَةَ

[1] İsra gecəsi – gecə səfəri deməkdir. Burada gecə səfəri deyildikdə Peyğəmbərin ﷺ Məkkədən Qüdsə getməsi, sonra oradan Allahın hüzuruna qalxması nəzərdə tutulur. Bu hadisə "əl-İsra" surəsinin 1-ci ayəsində və "ən-Nəcm" surəsinin 12-17-ci ayələrində öz əksini tapmışdır.

أُسْرِيَ بِي عَلَى مُوسَى بْنِ عِمْرَانَ عَلَيْهِ السَّلاَم رَجُلٌ آدَمُ طُوَالٌ جَعْدٌ كَأَنَّهُ مِنْ رِجَالِ شَنُوءَةَ، وَرَأَيْتُ عِيسَى ابْنَ مَرْيَمَ مَرْبُوعَ الْخَلْقِ، إِلَى الْحُمْرَةِ وَالْبَيَاضِ، سَبِطَ الرَّأْسِ)). وَأُرِيَ مَالِكًا خَازِنَ النَّارِ، وَالدَّجَّالَ، فِي آيَاتٍ أَرَاهُنَّ اللَّهُ إِيَّاهُ: ﴿فَلَا تَكُن فِي مِرْيَةٍ مِّن لِّقَآئِهِۦ﴾

قَالَ: كَانَ قَتَادَةُ يُفَسِّرُهَا أَنَّ نَبِيَّ اللَّهِ قَدْ لَقِيَ مُوسَى عَلَيْهِ السَّلاَمَ.

**[419]-267-(...)** ........ Əbul-Aliyə demişdir: "Peyğəmbərinizin ﷺ əmisi oğlu – İbn Abbas – rəvayət etmişdir ki, Peyğəmbər ﷺ belə buyurmuşdur: "Mən göylərə qalxdığım gecə İmran oğlu Musanın ﵇ yanına gəldim. Qarabuğdayı, hündürboylu və dolubədənli bir adam idi, lap Şənuə qəbiləsinin kişiləri kimi. Məryəm oğlu İsanı da gördüm. Ortaboylu, alyanaq, ağbəniz və nazik saçlı bir adam idi".

Rəsulullaha ﷺ Cəhənnəmin gözətçisi Malik, bir də Dəccal göstərildi. Bir çox əlamətlər içində Allah bunları da ona göstərmişdir".

**"Elə isə Sən onunla görüşəcəyinə şübhə etmə".[1]**

Qətadə bu ayəni təfsir edib demişdir: "Peyğəmbər ﷺ, həqiqətən də, Musa aleyhissəlamla görüşmüşdür".

**[٤٢٠] ٢٦٨-(١٦٦)** حَدَّثَنَا أَحْمَدُ بْنُ حَنْبَلٍ وَسُرَيْجُ بْنُ يُونُسَ قَالاَ: حَدَّثَنَا هُشَيْمٌ: أَخْبَرَنَا دَاوُدُ بْنُ أَبِي هِنْدٍ عَنْ أَبِي الْعَالِيَةِ، عَنِ ابْنِ عَبَّاسٍ أَنَّ رَسُولَ اللَّهِ ﷺ مَرَّ بِوَادِي الأَزْرَقِ فَقَالَ: ((أَيُّ وَادٍ هَذَا؟)) فَقَالُوا: هَذَا وَادِي الأَزْرَقِ – قَالَ –: ((كَأَنِّي أَنْظُرُ إِلَى مُوسَى عَلَيْهِ السَّلاَم هَابِطًا مِنَ الثَّنِيَّةِ، وَلَهُ جُؤَارٌ إِلَى اللَّهِ بِالتَّلْبِيَةِ)) ثُمَّ أَتَى عَلَى ثَنِيَّةِ هَرْشَى فَقَالَ: ((أَيُّ ثَنِيَّةٍ هَذِهِ؟)) قَالُوا: ثَنِيَّةُ هَرْشَى. قَالَ: ((كَأَنِّي أَنْظُرُ إِلَى يُونُسَ بْنِ مَتَّى عَلَيْهِ السَّلاَم عَلَى نَاقَةٍ حَمْرَاءَ جَعْدَةٍ عَلَيْهِ جُبَّةٌ مِنْ صُوفٍ، خِطَامُ نَاقَتِهِ خُلْبَةٌ، وَهُوَ يُلَبِّي)).

قَالَ ابْنُ حَنْبَلٍ فِي حَدِيثِهِ، قَالَ هُشَيْمٌ: يَعْنِي لِيفًا.

**[420]-268-(166)** ........ İbn Abbas ﵄ demişdir: "(Bir dəfə) Peyğəmbər ﷺ Əzrəq vadisinə[2] gəldi və: "Bu, hansı vadidir?"– deyə soruşdu. (Ona): "Bu, Əzrəq vadisidir"– dedilər. Peyğəmbər ﷺ buyurdu: "Mən sanki Musanın ﵇, gur səsi ilə Allaha təlbiyə[3] deyərək təpədən aşağı endiyini görürəm". Sonra Peyğəmbər ﷺ

[1] "əs-Səcdə" surəsi, 23.

[2] Məkkədən bir mil (1920 m) aralıda, Əməc kəndinin arxasında yerləşən bir vadidir.

[3] Əslində, təlbiyə həcc mərasimində uca səslə təkrar-təkrar deyilən duadır.

Ərəbcəsi:

(( لَبَّيْكَ اللَّهُمَّ لَبَّيْكَ، لَبَّيْكَ لاَ شَرِيكَ لَكَ لَبَّيْكَ، إِنَّ الْحَمْدَ، وَالنِّعْمَةَ، لَكَ وَ الْمُلْكَ، لاَ شَرِيكَ لَكَ ))

Transkripsiyası: [Ləbbeykəllahummə ləbbeyk, ləbbeykə lə şəriykə ləkə ləbbeyk, innəlhəmdə vən-ni'mətə, ləkə vəl-mulkə, lə şəriykə lək].

Tərcüməsi: "Hüzurundayam, Allahım, hüzurundayam! Hüzurundayam, Sənin şərikin yoxdur, hüzurundayam! Həmd Sənədir, nemət və mülk Sənə məxsusdur, Sənin şərikin yoxdur!"

Hərşa[1] keçidinə gəldi və: “Bu, hansı keçiddir?”– deyə soruşdu. (Ona): “Bu, Hərşa keçididir”– dedilər. Peyğəmbər ﷺ buyurdu: “Mən sanki Yunus ibn Məttanı ﵇, ətli-canlı, qırmızı bir dişi dəvənin üstündə, əynində yundan bir cübbə olduğu halda görürəm. Dəvəsinin ovsarı xulbədəndir. Özü də təlbiyə deyir”.

İbn Hənbəl öz rəvayətində demişdir: “Huşeym demişdir: “Peyğəmbər ﷺ xulbə dedikdə lifi[2] nəzərdə tutmuşdur”.

**[٤٢١] ٢٦٩**–(...) و حَدَّثَنِي مُحَمَّدُ بْنُ الْمُثَنَّى: حَدَّثَنَا ابْنُ أَبِي عَدِيٍّ عَنْ دَاوُدَ، عَنْ أَبِي الْعَالِيَةِ، عَنْ ابْنِ عَبَّاسٍ قَالَ: سِرْنَا مَعَ رَسُولِ اللَّهِ ﷺ بَيْنَ مَكَّةَ وَالْمَدِينَةِ، فَمَرَرْنَا بِوَادٍ فَقَالَ: ((أَيُّ وَادٍ هَذَا؟)) فَقَالُوا: وَادِي الأَزْرَقِ فَقَالَ: ((كَأَنِّي أَنْظُرُ إِلَى مُوسَى عَلَيْهِ السَّلَام – فَذَكَرَ مِنْ لَوْنِهِ وَشَعَرِهِ شَيْئًا لَمْ يَحْفَظْهُ دَاوُدُ – وَاضِعًا إِصْبَعَيْهِ فِي أُذُنَيْهِ، لَهُ جُؤَارٌ إِلَى اللَّهِ بِالتَّلْبِيَةِ، مَارًّا بِهَذَا الْوَادِي)) قَالَ: ثُمَّ سِرْنَا حَتَّى أَتَيْنَا عَلَى ثَنِيَّةٍ، فَقَالَ: ((أَيُّ ثَنِيَّةٍ هَذِهِ؟)) قَالُوا: هَرْشَى أَوْ لِفْتٌ. فَقَالَ: ((كَأَنِّي أَنْظُرُ إِلَى يُونُسَ عَلَى نَاقَةٍ حَمْرَاءَ، عَلَيْهِ جُبَّةُ صُوفٍ، خِطَامُ نَاقَتِهِ لِيفٌ خُلْبَةٌ، مَارًّا بِهَذَا الْوَادِي مُلَبِّيًا)).

**[421]-269-(...)** ........ İbn Abbas ﵄ demişdir: “Biz Peyğəmbərlə ﷺ bərabər Məkkədən Mədinəyə yola düşdük və gəlib bir vadiyə çatdıq. Peyğəmbər ﷺ: “Bu, hansı vadidir?”– deyə soruşdu. (Səhabələr ona): “Bu, Əzrəq vadisidir”– dedilər. Peyğəmbər ﷺ buyurdu: “Mən sanki Musanın ﵇, iki barmağını qulaqlarına qoymuş, özü də gur səsi ilə Allaha təlbiyə deyərək bu vadidən keçdiyini görürəm”.

(Burada Peyğəmbər ﷺ onun rəngindən və saçlarından bəzi şeylər zikr etmiş, lakin ravilərdən biri – Davud bunu yadda saxlamamışdır.)

(İbn Abbas dedi:) “Sonra biz yolumuza davam etdik. Nəhayət, gəlib bir dağ keçidinə çatdıq. Peyğəmbər ﷺ: “Bu, hansı keçiddir?”– deyə soruşdu. (Ona): “Bu, Hərşa, yaxud Lift keçididir”– dedilər. Peyğəmbər ﷺ buyurdu: “Mən sanki Yunusu qırmızı dişi dəvənin üstündə, əynində yundan bir cübbə olduğu halda görürəm. Dəvəsinin ovsarı lifdən, xulbədəndir. Özü də təlbiyə deyərək vadidən keçir”.

**[٤٢٢] ٢٧٠**–(...) حَدَّثَنِي مُحَمَّدُ بْنُ الْمُثَنَّى: حَدَّثَنَا ابْنُ أَبِي عَدِيٍّ عَنْ ابْنِ عَوْنٍ، عَنْ مُجَاهِدٍ قَالَ: كُنَّا عِنْدَ ابْنِ عَبَّاسٍ فَذَكَرُوا الدَّجَّالَ، فَقَالَ: إِنَّهُ مَكْتُوبٌ بَيْنَ عَيْنَيْهِ كَافِرٌ، قَالَ، فَقَالَ ابْنُ عَبَّاسٍ: لَمْ أَسْمَعْهُ قَالَ

---

[1] Bu, Şama və Mədinəyə gedən yolun üstündə, Cöhfənin yaxınlığında yerləşən bir dağdır.
[2] Xurma ağacının, pambığın, baramanın və s. incə saçaqları, ipliyi.

ذَاكَ، وَلَكِنَّهُ قَالَ: ((أَمَّا إِبْرَاهِيمُ، فَانْظُرُوا إِلَى صَاحِبِكُمْ، وَأَمَّا مُوسَى، فَرَجُلٌ آدَمُ جَعْدٌ عَلَى جَمَلٍ أَحْمَرَ مَخْطُومٍ بِخُلْبَةٍ، كَأَنِّي أَنْظُرُ إِلَيْهِ إِذَا انْحَدَرَ فِي الْوَادِي يُلَبِّي)).

**[422]-270-(...)** ........ Mücahid demişdir: "(Bir dəfə) biz İbn Abbasın yanında ikən oradakılar Dəccaldan danışdılar. (Onlardan) birisi: "Onun iki gözü arasında "kafir" yazılmışdır"– dedi. İbn Abbas dedi: "Mən Peyğəmbərin ﷺ belə dediyini eşitməmişəm. Fəqət o belə buyurmuşdur: "İbrahimə gəlincə, (əgər onu görmək istəyirsinizsə,) dostunuza[1] baxın. Musaya gəldikdə isə, o, qarabuğdayı, dolubədənli bir adam idi, xurma lifindən hörülmüş iplə ovsarlanmış qırmızı dəvənin üstündə oturmuşdu və mən sanki onun təlbiyə deyərək vadiyə endiyini görürəm".

**[٤٢٣] ٢٧١–(١٦٧)** حَدَّثَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ: حَدَّثَنَا لَيْثٌ؛ ح: و حَدَّثَنَا مُحَمَّدُ بْنُ رُمْحٍ: أَخْبَرَنَا اللَّيْثُ عَنْ أَبِي الزُّبَيْرِ، عَنْ جَابِرٍ، أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: ((عُرِضَ عَلَيَّ الأَنْبِيَاءُ، فَإِذَا مُوسَى ضَرْبٌ مِنَ الرِّجَالِ، كَأَنَّهُ مِنْ رِجَالِ شَنُوءَةَ، وَرَأَيْتُ عِيسَى ابْنَ مَرْيَمَ [عَلَيْهِ السَّلَام] فَإِذَا أَقْرَبُ مَنْ رَأَيْتُ بِهِ شَبَهًا عُرْوَةُ بْنُ مَسْعُودٍ، وَرَأَيْتُ إِبْرَاهِيمَ [صَلَوَاتُ اللَّهِ عَلَيْهِ]، فَإِذَا أَقْرَبُ مَنْ رَأَيْتُ بِهِ شَبَهًا صَاحِبُكُمْ – يَعْنِي نَفْسَهُ – وَرَأَيْتُ جِبْرِيلَ – عَلَيْهِ السَّلَام – فَإِذَا أَقْرَبُ مَنْ رَأَيْتُ بِهِ شَبَهًا دَحْيَةُ)).

وَفِي رِوَايَةِ ابْنِ رُمْحٍ: ((دَحْيَةُ بْنُ خَلِيفَةَ)).

**[423]-271-(167)** ........ Cabir ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Peyğəmbərlər mənə göstərildi. Baxdım ki, Musa Şənuə qəbiləsinin kişiləri kimi dolubədənlidir. Məryəm oğlu İsanı ﷺ da gördüm. Baxdım ki, o, hamıdan çox Urva ibn Məsuda oxşayır. İbrahimi ﷺ də gördüm. Ona ən çox oxşayan isə dostunuzdur. (Burada Peyğəmbər ﷺ özünü nəzərdə tuturdu.) Cəbraili ﷺ də gördüm. Ona ən çox oxşayan isə Dihyədir[2]".

İbn Rumhun rəvayətində: "Dihyə ibn Xəlifə"– deyilir.

**[٤٢٤] ٢٧٢–(١٦٨)** و حَدَّثَنِي مُحَمَّدُ بْنُ رَافِعٍ وَعَبْدُ بْنُ حُمَيْدٍ – وَتَقَارَبَا فِي اللَّفْظِ، قَالَ ابْنُ رَافِعٍ: حَدَّثَنَا، وَقَالَ: عَبْدٌ: أَخْبَرَنَا عَبْدُ الرَّزَّاقِ: أَخْبَرَنَا مَعْمَرٌ عَنِ الزُّهْرِيِّ قَالَ: أَخْبَرَنِي سَعِيدُ بْنُ الْمُسَيَّبِ عَنْ أَبِي هُرَيْرَةَ قَالَ: قَالَ النَّبِيُّ ﷺ: ((حِينَ أُسْرِيَ بِي لَقِيتُ مُوسَى عَلَيْهِ السَّلَام – فَنَعَتَهُ النَّبِيُّ ﷺ – فَإِذَا رَجُلٌ – حَسِبْتُهُ قَالَ – مُضْطَرِبٌ، رَجِلُ الرَّأْسِ، كَأَنَّهُ مِنْ رِجَالِ شَنُوءَةَ – قَالَ – وَلَقِيتُ عِيسَى فَنَعَتَهُ النَّبِيُّ ﷺ فَإِذَا

---

[1] Burada Peyğəmbər ﷺ özünü nəzərdə tutur.

[2] Dihyə ibn Xəlifə əl-Kəlbi ﷺ Peyğəmbərin ﷺ səhabələrindəndir.

رَبْعَةٌ أَحْمَرُ كَأَنَّمَا خَرَجَ مِنْ دِيمَاسٍ)) – يَعْنِي حَمَّامًا – قَالَ: ((وَرَأَيْتُ إِبْرَاهِيمَ عَلَيْهِ السَّلَامُ، وَأَنَا أَشْبَهُ وَلَده به – قَالَ –: فَأُتِيتُ بِإِنَاءَيْنِ فِي أَحَدِهِمَا لَبَنٌ وَفِي الآخَرِ خَمْرٌ، فَقِيلَ لِي: خُذْ أَيَّهُمَا شِئْتَ، فَأَخَذْتُ اللَّبَنَ فَشَرِبْتُهُ، فَقَالَ: هُدِيتَ الْفِطْرَةَ – أَوْ أَصَبْتَ الْفِطْرَةَ – أَمَّا إِنَّكَ لَوْ أَخَذْتَ الْخَمْرَ غَوَتْ أُمَّتُكَ)).

**[424]-272-(168)** ........ Əbu Hureyrə ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Mən İsra gecəsində Musaya ﵇ rast gəldim. (Peyğəmbər ﷺ onu belə vəsf etdi;) Baxdım ki, Musa Şənuə qəbiləsinin kişiləri kimi qarabuğdayı, hündürboylu, dolubədənli, düzsaçlı bir adamdır. İsaya da rast gəldim. (Peyğəmbər ﷺ onu vəsf edib dedi;) İsa ortaboylu, sanki hamamdan çıxmış adam kimi qırmızıyanaq idi. İbrahimə ﵇ də rast gəldim. Övladları içində ona ən çox oxşayanı mənəm. Sonra mənə iki qab gətirdilər; birində süd, digərində isə şərab var idi. Sonra da mənə dedilər: "Hansını istəyirsənsə, götür". Mən südü götürüb içdim. Onda mənə: "Sən fitrətə hidayət olundun, (yaxud fitrətinə uyğun seçim etdin). Əgər şərabı seçsəydin, ümmətin azğınlığa düşərdi".[1]

## (٧٥) – بَابُ ذِكْرِ الْمَسِيحِ ابْنِ مَرْيَمَ وَالْمَسِيحِ الدَّجَّالِ

## 75-ci fəsil. Məryəm oğlu Məsihin[2] və yalançı Məsihin[3] zikr olunması

**[٤٢٥] ٢٧٣**–(١٦٩) حَدَّثَنَا يَحْيَى بْنُ يَحْيَى قَالَ: قَرَأْتُ عَلَى مَالِكٍ عَنْ نَافِعٍ، عَنْ عَبْدِ اللَّهِ بْنِ عُمَرَ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: ((أَرَانِي لَيْلَةً عِنْدَ الْكَعْبَةِ، فَرَأَيْتُ رَجُلاً آدَمَ كَأَحْسَنِ مَا أَنْتَ رَاءٍ مِنْ أُدْمِ الرِّجَالِ لَهُ لِمَّةٌ

---

[1] 5240-cı hədisə bax.

[2] Məsih sözü ərəbcə «məsəhə» (مَسَحَ) felindən əmələ gəlmiş feli sifətdir. Bu da məsh etmək deməkdir. İsa aleyhissəlamın nə üçün Məsih adlandırılması barədə İbn Abbas belə demişdir: "Çünki məsh etdiyi (yəni əlini bədəninə sürtdüyü) elə bir xəstə olmamışdır ki, sağalmasın". Uca Allah onun barəsində belə buyurur: **"Allah deyəcəkdir: "Ey Məryəm oğlu İsa! Sənə və anana olan nemətimi xatırla! O zaman səni müqəddəs ruhla qüvvətləndirmişdim. Sən həm beşikdə ikən, həm də yetkin çağında insanlarla danışırdın. Sənə yazmağı, hikməti, Tövratı və İncili öyrətmişdim. Sən Mənim iznimlə palçıqdan quşa bənzər bir şey düzəldib ona üfürürdün, o da Mənim iznimlə quş olurdu. Sən Mənim iznimlə anadangəlmə koru və cüzam xəstəliyinə tutulanı sağaldır və Mənim iznimlə ölüləri dirildirdin..."** ("əl-Maidə" surəsi, 110).

[3] Hərçənd lüğəti mənada Məsih sözü məsh etmək mənasını ifadə edir, lakin İsa aleyhissəlamdan fərqli olaraq Dəccalın Məsih adlandırılmasının başqa səbəbləri vardır. Alimlər onun gözlərindən birinin sürtülmüş olduğuna, yaxud bir gözünün kor olduğuna, yaxud da dünyanın hər yerini gəzib-dolaşdığına görə Məsih adlandırıldığını söyləmişlər.

كَأَحْسَنِ مَا أَنْتَ رَاءٍ مِنَ اللِّمَمِ، قَدْ رَجَّلَهَا فَهِيَ تَقْطُرُ مَاءً، مُتَّكِئًا عَلَى رَجُلَيْنِ – أَوْ عَلَى عَوَاتِقِ رَجُلَيْنِ – يَطُوفُ بِالْبَيْتِ، فَسَأَلْتُ مَنْ هَذَا؟ فَقِيلَ: هَذَا الْمَسِيحُ ابْنُ مَرْيَمَ، ثُمَّ إِذَا أَنَا بِرَجُلٍ جَعْدٍ قَطَطٍ، أَعْوَرِ الْعَيْنِ الْيُمْنَى، كَأَنَّهَا عِنَبَةٌ طَافِيَةٌ، فَسَأَلْتُ مَنْ هَذَا؟ فَقِيلَ: هَذَا الْمَسِيحُ الدَّجَّالُ)).

**[425]-273-(169)** ........ Abdullah ibn Ömər ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Mən keçən gecə Kəbənin yanında qarayanız bir adam gördüm. (Bu adam) qarayanız adamların ən gözəli idi. Onun uzun saçları var idi. (Bu,) gördüyüm saçların ən gözəli idi. O, saçlarını daramışdı. Onun saçlarından su damırdı. O, əllərini iki nəfərin üstünə, (yaxud iki kişinin çiyninə) qoymuş halda Kəbəni təvaf[1] edirdi. Mən soruşdum: "Bu kimdir?" Dedilər: "Bu, Məryəm oğlu Məsihdir!" Sonra qəfildən buruqsaç və sağ gözü kor – sanki domba üzüm dənəsi kimi olan birisinə rast gəldim. (Oradakılardan): "Bu kimdir?"– deyə soruşdum. Dedilər: "Bu, Məsih Dəccaldır!"[2]

**[٤٢٦] ٢٧٤**–(...) حَدَّثَنَا مُحَمَّدُ بْنُ إِسْحَقَ الْمُسَيَّبِيُّ: حَدَّثَنَا أَنَسٌ يَعْنِي ابْنَ عِيَاضٍ، عَنْ مُوسَى وَهُوَ ابْنُ عُقْبَةَ، عَنْ نَافِعٍ قَالَ: قَالَ عَبْدُ اللَّهِ بْنُ عُمَرَ: ذَكَرَ رَسُولُ اللَّهِ ﷺ يَوْمًا بَيْنَ ظَهْرَانَيِ النَّاسِ الْمَسِيحَ الدَّجَّالَ فَقَالَ: ((إِنَّ اللَّهَ تَبَارَكَ وَتَعَالَى لَيْسَ بِأَعْوَرَ، أَلاَ إِنَّ الْمَسِيحَ الدَّجَّالَ أَعْوَرُ عَيْنِ الْيُمْنَى، كَأَنَّ عَيْنَهُ عِنَبَةٌ طَافِيَةٌ)). قَالَ: وَقَالَ رَسُولُ اللَّهِ ﷺ: ((أَرَانِي اللَّيْلَةَ فِي الْمَنَامِ عِنْدَ الْكَعْبَةِ، فَإِذَا رَجُلٌ آدَمُ كَأَحْسَنِ مَا تَرَى مِنْ أُدْمِ الرِّجَالِ، تَضْرِبُ لِمَّتُهُ بَيْنَ مَنْكِبَيْهِ، رَجِلُ الشَّعْرِ، يَقْطُرُ رَأْسُهُ مَاءً، وَاضِعًا يَدَيْهِ عَلَى مَنْكِبَيْ رَجُلَيْنِ، وَهُوَ بَيْنَهُمَا يَطُوفُ بِالْبَيْتِ، فَقُلْتُ: مَنْ هَذَا؟ فَقَالُوا: الْمَسِيحُ ابْنُ مَرْيَمَ، وَرَأَيْتُ وَرَاءَهُ رَجُلاً جَعْدًا قَطَطًا أَعْوَرَ عَيْنِ الْيُمْنَى، كَأَشْبَهِ مَنْ رَأَيْتُ مِنَ النَّاسِ بِابْنِ قَطَنٍ، وَاضِعًا يَدَيْهِ عَلَى مَنْكِبَيْ رَجُلَيْنِ، يَطُوفُ بِالْبَيْتِ، فَقُلْتُ: مَنْ هَذَا؟ قَالُوا: هَذَا الْمَسِيحُ الدَّجَّالُ)).

**[426]-274-(...)** ........ Abdullah ibn Ömər ﷺ demişdir: "Bir gün Peyğəmbər ﷺ camaat arasında Məsih Dəccalı yad edib dedi: "Uca və Ulu Allah kor deyildir. Məsih Dəccalın isə sağ gözü kordur. Onun gözü sanki salxımından kənara çıxmış iri üzüm dənəsi kimi dombadır".

---

[1] Kəbənin ətrafına dolanmaq. Bu ayin Qara daşdan başlanır və orada da qurtarır, yeddi dairədən ibarət olur.

[2] Qazı İyad ﷺ demişdir: "Peyğəmbər ﷺ Dəccalın Kəbənin ətrafında təvaf etdiyini yuxuda görmüşdür. Bu, sonrakı hədislərdə Peyğəmbərin ﷺ: "Mən yuxuda ikən Kəbəni təvaf etdiyimi gördüm" sözündə öz təsdiqini tapmışdır. Həqiqətdə isə Məsih Dəccal Məkkə və Mədinəyə daxil ola bilməyəcək" (7356-cı və 7361-ci hədislərə bax.)

(Peyğəmbər ﷺ) buyurdu: “Mən keçən gecə Kəbənin yanında yatarkən yuxuda qarayanız bir adam gördüm. (Bu adam) qarayanız adamların ən gözəli idi. Saçları kürəyinin arasına düşürdü, həm də daranmış idi, başından da su damırdı. Özü də iki kişinin arasında, əllərini onların çiyninə qoymuş halda Kəbəni təvaf edirdi. Soruşdum: “Bu kimdir?” Dedilər: “Bu, Məryəm oğlu Məsihdir!” Sonra mən onun arxasında saçları həddən ziyadə buruq, sağ gözü kor olan, daha çox İbn Qətənə[1] bənzəyən, əllərini də iki kişinin çiyninə qoymuş halda Kəbəni təvaf edən birisini gördüm. Soruşdum: “Bu kimdir?” Dedilər: “Bu, Məsih Dəccaldır!”

**[٤٢٧] ٢٧٥**–(...) حَدَّثَنَا ابْنُ نُمَيْرٍ: حَدَّثَنَا أَبِي: حَدَّثَنَا حَنْظَلَةُ عَنْ سَالِمٍ، عَنْ ابْنِ عُمَرَ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: ((رَأَيْتُ عِنْدَ الْكَعْبَةِ رَجُلاً آدَمَ، سَبِطَ الرَّأْسِ، وَاضِعًا يَدَيْهِ عَلَى رَجُلَيْنِ، يَسْكُبُ رَأْسُهُ – أَوْ يَقْطُرُ رَأْسُهُ – فَسَأَلْتُ: مَنْ هَذَا؟ فَقَالُوا: عِيسَى ابْنُ مَرْيَمَ أَوْ الْمَسِيحُ ابْنُ مَرْيَمَ – لاَ نَدْرِي أَيَّ ذَلِكَ قَالَ – قَالَ: وَرَأَيْتُ وَرَاءَهُ رَجُلاً أَحْمَرَ، جَعْدَ الرَّأْسِ، أَعْوَرَ الْعَيْنِ الْيُمْنَى، أَشْبَهُ مَنْ رَأَيْتُ بِهِ ابْنُ قَطَنٍ، فَسَأَلْتُ: مَنْ هَذَا؟ فَقَالُوا: الْمَسِيحُ الدَّجَّالُ)).

**[427]-275-(...)** ........ İbn Ömər رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Mən Kəbənin yanında qarayanız, saçları düz olan, əllərini iki nəfərin çiyninə qoymuş, başından da su tökülən (yaxud başından su daman) bir adam gördüm. Soruşdum: “Bu kimdir?” Dedilər: “Bu, Məryəm oğlu İsadır, yaxud Məryəm oğlu Məsihdir!”

(Ravi demişdir: “Bunlardan hansını söylədiyini bilmirəm”– dedi”.)

(Peyğəmbər ﷺ davam edib) dedi: Sonra mən onun arxasında qırmızıdərili, buruqsaç, sağ gözü kor olan və daha çox İbn Qətənə bənzəyən birisini gördüm. Soruşdum: “Bu kimdir?” Dedilər: “Məsih Dəccaldır!”

**[٤٢٨] ٢٧٦**–(١٧٠) حَدَّثَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ: حَدَّثَنَا لَيْثٌ عَنْ عُقَيْلٍ، عَنْ الزُّهْرِيِّ، عَنْ أَبِي سَلَمَةَ بْنِ عَبْدِ الرَّحْمَنِ، عَنْ جَابِرِ بْنِ عَبْدِ اللَّهِ، أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: ((لَمَّا كَذَّبَتْنِي قُرَيْشٌ، قُمْتُ فِي الْحِجْرِ فَجَلاَ اللَّهُ لِي بَيْتَ الْمَقْدِسِ، فَطَفِقْتُ أُخْبِرُهُمْ عَنْ آيَاتِهِ وَأَنَا أَنْظُرُ إِلَيْهِ)).

**[428]-276-(170)** ........ Cabir ibn Abdullah رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Qureyşlilər (gecə səfərim haqqında dediklərimi) təkzib etdikdə mən

[1] İbn Qətən Xuzaə qəbiləsindən olmuş və hələ İslam gəlməmişdən əvvəl vəfat etmişdir.

(gedib) Hicrdə[1] durdum. (Bu vaxt) Allah Beytul-Məqdisi mənə göstərdi. Mən də Beytul-Məqdisə baxaraq onun əlamətlərini qureyşlilərə bildirdim".

**[٤٢٩] ٢٧٧-(١٧١)** حَدَّثَنِي حَرْمَلَةُ بْنُ يَحْيَى: حَدَّثَنَا ابْنُ وَهْبٍ قَالَ: أَخْبَرَنِي يُونُسُ بْنُ يَزِيدَ، عَنْ ابْنِ شِهَابٍ، عَنْ سَالِمِ بْنِ عَبْدِ اللَّهِ بْنِ عُمَرَ بْنِ الْخَطَّابِ، عَنْ أَبِيهِ قَالَ: سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ: ((بَيْنَمَا أَنَا نَائِمٌ رَأَيْتُنِي أَطُوفُ بِالْكَعْبَةِ، فَإِذَا رَجُلٌ آدَمُ سَبِطُ الشَّعْرِ، بَيْنَ رَجُلَيْنِ، يَنْطِفُ رَأْسُهُ مَاءً – أَوْ يُهَرَاقُ رَأْسُهُ مَاءً – قُلْتُ: مَنْ هَذَا؟ قَالُوا: هَذَا ابْنُ مَرْيَمَ، ثُمَّ ذَهَبْتُ أَلْتَفِتُ فَإِذَا رَجُلٌ أَحْمَرُ، جَسِيمٌ، جَعْدُ الرَّأْسِ، أَعْوَرُ الْعَيْنِ، كَأَنَّ عَيْنَهُ عِنَبَةٌ طَافِيَةٌ، قُلْتُ: مَنْ هَذَا؟ قَالُوا: الدَّجَّالُ، أَقْرَبُ النَّاسِ بِهِ شَبَهًا ابْنُ قَطَنٍ)).

**[429]-277-(171)** ........ İbn Ömər ﵄ demişdir: "Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: "Mən yuxuda ikən Kəbəni təvaf etdiyimi gördüm. Birdən qarayanız, saçları düz olan bir adama rast gəldim. (Bu adam) iki kişinin arasında gedirdi, başından da su damırdı, (yaxud başından su axırdı). Soruşdum: "Bu kimdir?" Dedilər: "Bu, Məryəmin oğludur!" Sonra dönüb qarşımda qırmızıdərili, cüssəli, buruqsaç, sağ gözü kor – sanki salxımından kənara çıxmış iri üzüm dənəsi kimi (dombagöz) birisini gördüm. Soruşdum: "Bu kimdir?" Dedilər: "Dəccaldır!" İnsanlar arasında ona ən çox bənzəyəni isə ibn Qətəndir".

**[٤٣٠] ٢٧٨-(١٧٢)** حَدَّثَنِي زُهَيْرُ بْنُ حَرْبٍ: حَدَّثَنَا حُجَيْنُ بْنُ الْمُثَنَّى: حَدَّثَنَا عَبْدُ الْعَزِيزِ وَهُوَ ابْنُ أَبِي سَلَمَةَ، عَنْ عَبْدِ اللَّهِ بْنِ الْفَضْلِ، عَنْ أَبِي سَلَمَةَ بْنِ عَبْدِ الرَّحْمَنِ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((لَقَدْ رَأَيْتُنِي فِي الْحِجْرِ وَقُرَيْشٌ تَسْأَلُنِي عَنْ مَسْرَايَ، فَسَأَلَتْنِي عَنْ أَشْيَاءَ مِنْ بَيْتِ الْمَقْدِسِ لَمْ أُثْبِتْهَا، فَكُرِبْتُ كُرْبَةً مَا كُرِبْتُ مِثْلَهُ قَطُّ – قَالَ –: فَرَفَعَهُ اللَّهُ لِي أَنْظُرُ إِلَيْهِ، مَا يَسْأَلُونِي عَنْ شَيْءٍ إِلاَّ أَنْبَأْتُهُمْ بِهِ، وَقَدْ رَأَيْتُنِي فِي جَمَاعَةٍ مِنْ الأَنْبِيَاءِ، فَإِذَا مُوسَى – عَلَيْهِ السَّلاَمُ – قَائِمٌ يُصَلِّي، فَإِذَا رَجُلٌ ضَرْبٌ جَعْدٌ كَأَنَّهُ مِنْ رِجَالِ شَنُوءَةَ، وَإِذَا عِيسَى ابْنُ مَرْيَمَ – عَلَيْهِ السَّلاَمُ – قَائِمٌ يُصَلِّي، أَقْرَبُ النَّاسِ بِهِ شَبَهًا عُرْوَةُ بْنُ مَسْعُودٍ الثَّقَفِيُّ، وَإِذَا إِبْرَاهِيمُ عَلَيْهِ السَّلاَمُ قَائِمٌ يُصَلِّي، أَشْبَهُ النَّاسِ بِهِ صَاحِبُكُمْ – يَعْنِي نَفْسَهُ – فَحَانَتْ الصَّلاَةُ فَأَمَمْتُهُمْ، فَلَمَّا فَرَغْتُ مِنْ الصَّلاَةِ قَالَ قَائِلٌ: يَا مُحَمَّدُ! هَذَا مَالِكٌ صَاحِبُ النَّارِ فَسَلِّمْ عَلَيْهِ، فَالْتَفَتُّ إِلَيْهِ فَبَدَأَنِي بِالسَّلاَمِ)).

**[430]-278-(172)** ........ Əbu Hureyrə ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Mən Hicrdə ikən qureyşlilər məndən gecə səyahətim barəsində soruşdular. Onlar məndən Beytul-Məqdisə dair elə şeylər soruşdular ki, mən bunları yadımda saxlamamışdım. Və o qədər sıxıldım ki, heç vaxt bu qədər sıxılmamışdım. Elə bu vaxt Allah Beytul-Məqdisi mənə göstərdi və mən ona baxıb qureyşlilərin verdiyi hər bir sualı cavablandırdım. Mən orada özümü pey-

[1] 416-cı hədisin qeydlərinə bax.

ğəmbərlərdən ibarət bir toplum içində gördüm. Baxdım ki, Musa ﷺ ayaqüstə durub namaz qılır. O, saçları düz, Şənuə qəbiləsinin kişilərinə bənzər bir kişi idi. Həmçinin Məryəm oğlu İsanın ﷺ ayaqüstə durub namaz qıldığını gördüm. İnsanlardan ona ən çox oxşayanı Urva ibn Məsud əs-Səqəfidir. İbrahimin ﷺ də ayaqüstə durub namaz qıldığını gördüm. İnsanlardan ona ən çox bənzəyəni isə dostunuzdur. (Burada Peyğəmbər ﷺ özünü nəzərdə tuturdu.) Sonra namazın vaxtı yetişdi və mən onlara namaz qıldırdım. Namazımı bitirdikdə bir nəfər (məni səsləyib) dedi: "Ey Muhəmməd! Bu, Cəhənnəm odunun sahibi[1] – Malikdir. Ona salam ver!" Mən ona tərəf dönüb (salam vermək istədikdə, o məni qabaqladı), birinci o mənə salam verdi".

## (٧٦) – بَابُ فِي ذِكْرِ سِدْرَةِ الْمُنْتَهَى

## 76-cı fəsil. Sidrətul-Muntəhanın[2] zikr olunması

**[٤٣١] ٢٧٩–(١٧٣)** و حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا أَبُو أُسَامَةَ: حَدَّثَنَا مَالِكُ بْنُ مِغْوَلٍ؛ ح: و حَدَّثَنَا ابْنُ نُمَيْرٍ وَزُهَيْرُ بْنُ حَرْبٍ، جَمِيعًا عَنْ عَبْدِ اللَّهِ بْنِ نُمَيْرٍ – وَأَلْفَاظُهُمْ مُتَقَارِبَةٌ – قَالَ ابْنُ نُمَيْرٍ: حَدَّثَنَا أَبِي: حَدَّثَنَا مَالِكُ بْنُ مِغْوَلٍ، عَنْ الزُّبَيْرِ بْنِ عَدِيٍّ، عَنْ طَلْحَةَ عَنْ مُرَّةَ، عَنْ عَبْدِ اللَّهِ قَالَ: لَمَّا أُسْرِيَ بِرَسُولِ اللَّهِ ﷺ انْتُهِيَ بِهِ إِلَى سِدْرَةِ الْمُنْتَهَى، وَهِيَ فِي السَّمَاءِ السَّادِسَةِ، إِلَيْهَا يَنْتَهِي مَا يُعْرَجُ بِهِ مِنْ الأَرْضِ، فَيُقْبَضُ مِنْهَا، وَإِلَيْهَا يَنْتَهِي مَا يُهْبَطُ بِهِ مِنْ فَوْقِهَا، فَيُقْبَضُ مِنْهَا – قَالَ: ﴿إِذْ يَغْشَى ٱلسِّدْرَةَ مَا يَغْشَىٰ﴾

قَالَ: فَرَاشٌ مِنْ ذَهَبٍ. قَالَ: فَأُعْطِيَ رَسُولُ اللَّهِ ﷺ ثَلاثًا: أُعْطِيَ الصَّلَوَاتِ الْخَمْسَ، وَأُعْطِيَ خَوَاتِيمَ سُورَةِ الْبَقَرَةِ، وَغُفِرَ – لِمَنْ لَمْ يُشْرِكْ بِاللَّهِ مِنْ أُمَّتِهِ شَيْئًا – الْمُقْحِمَاتُ.

**[431]-279-(173)** ........ Abdullah (ibn Məsud) ﷺ demişdir: "Peyğəmbər ﷺ İsra gecəsində (göyə) qaldırıldığı zaman son həddəki Sidr ağacının yanına qədər aparıldı. Bu (ağac) altıncı səmadadır. Yerdən yüksəldilən hər nə varsa, ancaq oraya qədər gedib çata bilir və (hər şey) oradan götürülür. Üst tərəfindən endirilən hər nə varsa, orada dayanır və oradan götürülür".

(Allah) buyurur: **"O zaman Sidr ağacını bürüyən bürümüşdü".**[3] (Yəni) qızıldan pərvanələr (və başqa bu kimi göz oxşayan şeylər).

---

[1] Burada "sahibi" deyildikdə gözətçisi qəsd edilir. Uca Allah buyurur: "***Günahkarlar Cəhənnəm gözətçisini*** **çağırıb deyəcəklər: "Ey Malik! Qoy Rəbbin canımızı alıb qurtarsın!" O isə cavabında belə deyəcək: "Siz *burada* əbədi qalacaqsınız!"** ("əz-Zuxruf" surəsi, 77).

[2] 411-ci hədisin qeydlərinə bax.

[3] "ən-Nəcm" surəsi, 16.

(Abdullah davam edib) dedi: “Orada Peyğəmbərə ﷺ üç şey verilmişdi: ona beş namaz bəxş edilmiş,[1] əl-Bəqərə surəsinin son ayələri verilmiş[2] və bir də ümmətindən Allaha heç bir şeyi şərik qoşmadan ölən kimsələr üçün sahibini həlak edəcək böyük günahların bağışlanması vəd edilmişdir[3]”.

## (٧٧) – بَابُ مَعْنَى قَوْلِ اللَّهِ عَزَّ وَجَلَّ: ﴿ وَلَقَدْ رَءَاهُ نَزْلَةً أُخْرَىٰ ﴾ وَهَلْ رَأَى النَّبِيُّ ﷺ رَبَّهُ لَيْلَةَ الإِسْرَاءِ

## 77-ci fəsil. İzzətli və Qüdrətli Allahın: “Onu bir daha *öz surətində* enərkən gördü”[4] sözünün mənası və bir də:“Peyğəmbər ﷺ İsra gecəsində Rəbbini görübmü?” (sualının cavabı)

**[٤٣٢]** ٢٨٠–(١٧٤) و حَدَّثَنِي أَبُو الرَّبِيعِ الزَّهْرَانِيُّ: حَدَّثَنَا عَبَّادٌ وَهُوَ ابْنُ الْعَوَّامِ: حَدَّثَنَا الشَّيْبَانِيُّ قَالَ: سَأَلْتُ زِرَّ بْنَ حُبَيْشٍ عَنْ قَوْلِ اللَّهِ عَزَّ وَجَلَّ: ﴿فَكَانَ قَابَ قَوْسَيْنِ أَوْ أَدْنَىٰ ﴾

---

[1] Yəni beş vaxt namaz qılmaq vacib buyurulmuşdur.

[2] Uca Allah buyurur: **“Peyğəmbər öz Rəbbindən ona nazil edilənə iman gətirdi, möminlər də *iman gətirdilər*. Hamısı Allaha, Onun mələklərinə, kitablarına və elçilərinə iman gətirdilər. *Onlar dedilər*: “Biz Onun elçiləri arasında fərq qoymuruq!” Onlar dedilər: “Eşitdik və itaət etdik! Ey Rəbbimiz! Səndən bağışlanma diləyirik, dönüş də yalnız Sənədir!” Allah hər kəsi yalnız onun qüvvəsi çatdığı qədər mükəlləf edər. Hər kəsin qazandığı *xeyir yalnız* onun özünə, qazandığı *şər də yalnız* öz əleyhinədir. “Ey Rəbbimiz, unutsaq və ya xəta etsək bizi cəzalandırma! Ey Rəbbimiz, bizdən əvvəlkilərə yüklədiyin kimi, bizə də ağır yük yükləmə! Ey Rəbbimiz, gücümüz çatmayan şeyi daşımağa bizi vadar etmə! Bizi əfv et, bizi bağışla və bizə rəhm et! Sən bizim Himayədarımızsan! Kafirləri məğlub etməkdə bizə yardım et!”** (“əl-Bəqərə” surəsi, 285-286).

Burada “əl-Bəqərə surəsinin son ayələri verilmiş” deyildikdə ayələrdəki duaların qəbul olunması nəzərdə tutulur. 329 və 330 saylı hədislərə bax. Qeyd etmək lazımdır ki, bu iki ayə Peyğəmbər ﷺ meracda ikən yox, yerdə ikən nazil olmuşdur. İbn Abbas رضي الله عنهما demişdir: “Bir dəfə biz Peyğəmbərin ﷺ yanında oturmuşduq. Cəbrail عليه السلام də onun yanında idi. Birdən Peyğəmbər ﷺ başının üstündə xışıltı səsi eşitdi. Cəbrail عليه السلام göyə baxıb dedi: “Bu, göyün qapıları idi, açıldı! Bu günədək o, heç vaxt açılmamışdı”. Oradan yerə bir mələk endi. Bu mələk indiyədək heç vaxt yerə enməmişdi. Mələk Peyğəmbərə ﷺ salam verdikdən sonra dedi: “Sənə verilən və səndən əvvəl heç bir peyğəmbərə verilməmiş bu iki nura sevin! Bu, “əl-Fatihə” surəsi, bir də “əl-Bəqərə” surəsinin son ayələridir” (“Səhih Muslim”, 1913).

[3] Burada “böyük günahların bağışlanması vəd edilmişdir” deyildikdə tövhid-əhlindən olan böyük günah sahibinin əbədi olaraq Cəhənnəm odunda qalmayacağı, nə vaxtsa oradan çıxıb Cənnətə daxil olacağı nəzərdə tutulur. Belə ki, günahkarlar Qiyamət günü Allahın istəyi altında olacaqlar. İstər, onları bağışlar, istərsə də, onlara əzab verər.

[4] “ən-Nəcm” surəsi, 13.

قَالَ: أَخْبَرَنِي ابْنُ مَسْعُودٍ: أَنَّ النَّبِيَّ ﷺ رَأَى جِبْرِيلَ لَهُ سِتُّ مِائَةِ جَنَاحٍ.

**[432]-280-(174)** ........ Şeybani demişdir: "Mən Zir ibn Hubeyşdən, İzzətli və Qüdrətli Allahın: **"O, iki yay uzunluğunda, hətta ondan da yaxın məsafədə idi"[1]** sözünün (təfsirini) soruşdum. Dedi: "Abdullah ibn Məsud mənə Peyğəmbərin ﷺ Cəbraili (öz surətində) gördüyünü, onun altı yüz qanadı[2] olduğunu xəbər vermişdir".

**[٤٣٣] ٢٨١**-(...) حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا حَفْصُ بْنُ غِيَاثٍ عَنْ الشَّيْبَانِيِّ، عَنْ زِرٍّ، عَنْ عَبْدِ اللَّهِ قَالَ: ﴿مَا كَذَبَ ٱلْفُؤَادُ مَا رَأَىٰٓ﴾ قَالَ: رَأَى جِبْرِيلَ عَلَيْهِ السَّلَام لَهُ سِتُّ مِائَةِ جَنَاحٍ.

**[433]-281-(...)** ........ Abdullah (ibn Məsud ﷺ Allahın): ***"Peyğəmbərin* qəlbi, gördüyünü yalan saymadı"[3]** (ayəsinin izahında) demişdir: "Peyğəmbər ﷺ Cəbraili ﷺ gördü, onun altı yüz qanadı var idi".

**[٤٣٤] ٢٨٢**-(...) حَدَّثَنَا عُبَيْدُ اللَّهِ بْنُ مُعَاذٍ الْعَنْبَرِيُّ: حَدَّثَنَا أَبِي: حَدَّثَنَا شُعْبَةُ عَنْ سُلَيْمَانَ الشَّيْبَانِيِّ، سَمِعَ زِرَّ بْنَ حُبَيْشٍ، عَنْ عَبْدِ اللَّهِ قَالَ: ﴿لَقَدْ رَأَىٰ مِنْ ءَايَٰتِ رَبِّهِ ٱلْكُبْرَىٰٓ﴾
قَالَ رَأَى جِبْرِيلَ فِي صُورَتِهِ لَهُ سِتُّ مِائَةِ جَنَاحٍ.

**[434]-282-(...)** ........ Abdullah (ibn Məsud ﷺ Allahın): **"O, öz Rəbbinin ən böyük dəlillərindən *bəzisini* gördü"[4]** (ayəsinin təfsirində) demişdir: "Peyğəmbər ﷺ Cəbraili öz surətində gördü, onun altı yüz qanadı var idi".

**[٤٣٥] ٢٨٣**-(١٧٥) حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا عَلِيُّ بْنُ مُسْهِرٍ عَنْ عَبْدِ الْمَلِكِ، عَنْ عَطَاءٍ، عَنْ أَبِي هُرَيْرَةَ: ﴿وَلَقَدْ رَءَاهُ نَزْلَةً أُخْرَىٰ﴾ قَالَ رَأَى جِبْرِيلَ عَلَيْهِ السَّلَامَ.

**[435]-283-(175)** ........ Əbu Hureyrə ﷺ (Allahın): **"Onu bir daha *öz surətində* enərkən gördü"[5]** (ayəsinin təfsirində) demişdir: "(Peyğəmbər ﷺ) Cəbraili ﷺ görmüşdür".

---

[1] "ən-Nəcm" surəsi, 9.

[2] Mələklər öz xilqətlərinə görə bir-birilərindən fərqlənirlər. Bəzilərinin iki, bəzilərinin üç, bəzilərinin dörd, bəzilərinin də daha çox qanadları olur. Uca Allah buyurur: **"Göyləri və yeri Yaradan, mələkləri iki, üç və dörd qanadlı elçilər edən Allaha həmd olsun!"** ("Fatir" surəsi, 1).

[3] "ən-Nəcm" surəsi, 11.

[4] "ən-Nəcm" surəsi, 18.

[5] "ən-Nəcm" surəsi, 13.

**[٤٣٦] ٢٨٤-(١٧٦)** حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا حَفْصٌ عَنْ عَبْدِ الْمَلِكِ، عَنْ عَطَاءٍ، عَنْ ابْنِ عَبَّاسٍ قَالَ: رَآهُ بِقَلْبِهِ.

**[436]-284-(176)** ........ İbn Abbas ﵄ demişdir: "Peyğəmbər ﷺ Onu qəlbi ilə görmüşdür".

**[٤٣٧] ٢٨٥-(...)** حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ وَأَبُو سَعِيدٍ الأَشَجُّ، جَمِيعًا عَنْ وَكِيعٍ - قَالَ الأَشَجُّ: حَدَّثَنَا وَكِيعٌ -: حَدَّثَنَا الأَعْمَشُ عَنْ زِيَادِ بْنِ الْحُصَيْنِ أَبِي جَهْمَةَ، عَنْ أَبِي الْعَالِيَةِ، عَنْ ابْنِ عَبَّاسٍ قَالَ: ﴿مَا كَذَبَ ٱلْفُؤَادُ مَا رَأَىٰٓ﴾ ﴿وَلَقَدْ رَءَاهُ نَزْلَةً أُخْرَىٰ﴾ قَالَ رَآهُ بِفُؤَادِهِ مَرَّتَيْنِ.

**[437]-285-(...)** ........ İbn Abbas ﵄ (Allahın): ***"Peyğəmbərin* qəlbi gördüyünü yalan saymadı", "Onu bir daha *öz surətində* enərkən gördü"**[1] (ayələrinin təfsirində) demişdir: "Peyğəmbər ﷺ Onu qəlbi ilə iki dəfə görmüşdür".

**[٤٣٨] ٢٨٦-(...)** حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا حَفْصُ بْنُ غِيَاثٍ عَنْ الأَعْمَشِ: حَدَّثَنَا أَبُو جَهْمَةَ بِهَذَا الإِسْنَادِ.

**[438]-286-(...)** ........ (Bu hədisi) bizə Əbu Bəkr ibn Əbu Şeybə Həfs ibn Ğiyasdan, o da Aməşdən, o da Əbu Cəhmədən bu isnadla rəvayət etmişdir.

**[٤٣٩] ٢٨٧-(١٧٧)** حَدَّثَنِي زُهَيْرُ بْنُ حَرْبٍ: حَدَّثَنَا إِسْمَعِيلُ بْنُ إِبْرَاهِيمَ عَنْ دَاوُدَ، عَنْ الشَّعْبِيِّ، عَنْ مَسْرُوقٍ قَالَ: كُنْتُ مُتَّكِئًا عِنْدَ عَائِشَةَ فَقَالَتْ: يَا أَبَا عَائِشَةَ! ثَلاَثٌ مَنْ تَكَلَّمَ بِوَاحِدَةٍ مِنْهُنَّ فَقَدْ أَعْظَمَ عَلَى اللَّهِ الْفِرْيَةَ، قُلْتُ: مَا هُنَّ؟ قَالَتْ: مَنْ زَعَمَ أَنَّ مُحَمَّدًا ﷺ رَأَى رَبَّهُ فَقَدْ أَعْظَمَ عَلَى اللَّهِ الْفِرْيَةَ، قَالَ: وَكُنْتُ مُتَّكِئًا فَجَلَسْتُ، فَقُلْتُ: يَا أُمَّ الْمُؤْمِنِينَ! أَنْظِرِينِي وَلاَ تَعْجَلِينِي، أَلَمْ يَقُلْ اللَّهُ عَزَّ وَجَلَّ: ﴿وَلَقَدْ رَآهُ بِالأُفُقِ الْمُبِينِ﴾ ﴿وَلَقَدْ رَآهُ نَزْلَةً أُخْرَى﴾ فَقَالَتْ: أَنَا أَوَّلُ هَذِهِ الأُمَّةِ سَأَلَ عَنْ ذَلِكَ رَسُولَ اللَّهِ ﷺ، فَقَالَ: ((إِنَّمَا هُوَ جِبْرِيلُ لَمْ أَرَهُ عَلَى صُورَتِهِ الَّتِي خُلِقَ عَلَيْهَا غَيْرَ هَاتَيْنِ الْمَرَّتَيْنِ، رَأَيْتُهُ مُنْهَبِطًا مِنْ السَّمَاءِ، سَادًّا عِظَمُ خَلْقِهِ مَا بَيْنَ السَّمَاءِ إِلَى الأَرْضِ)) فَقَالَتْ: أَوَ لَمْ تَسْمَعْ أَنَّ اللَّهَ يَقُولُ: ﴿لاَ تُدْرِكُهُ الأَبْصَارُ وَهُوَ يُدْرِكُ الأَبْصَارَ وَهُوَ اللَّطِيفُ الْخَبِيرُ﴾ أَوَ لَمْ تَسْمَعْ أَنَّ اللَّهَ يَقُولُ: ﴿وَمَا كَانَ لِبَشَرٍ أَنْ يُكَلِّمَهُ اللَّهُ إِلاَّ وَحْيًا أَوْ مِنْ وَرَاءِ حِجَابٍ أَوْ يُرْسِلَ رَسُولاً فَيُوحِيَ بِإِذْنِهِ مَا يَشَاءُ إِنَّهُ عَلِيٌّ حَكِيمٌ﴾ قَالَتْ: وَمَنْ زَعَمَ أَنَّ رَسُولَ اللَّهِ ﷺ كَتَمَ شَيْئًا مِنْ كِتَابِ اللَّهِ فَقَدْ أَعْظَمَ عَلَى اللَّهِ الْفِرْيَةَ، وَاللَّهُ يَقُولُ: ﴿يَا أَيُّهَا الرَّسُولُ بَلِّغْ مَا أُنْزِلَ إِلَيْكَ مِنْ رَبِّكَ وَإِنْ لَمْ تَفْعَلْ فَمَا بَلَّغْتَ رِسَالَتَهُ﴾ قَالَتْ: وَمَنْ زَعَمَ أَنَّهُ يُخْبِرُ بِمَا يَكُونُ فِي غَدٍ فَقَدْ أَعْظَمَ عَلَى اللَّهِ الْفِرْيَةَ، وَاللَّهُ يَقُولُ: ﴿قُلْ لاَ يَعْلَمُ مَنْ فِي السَّمَوَاتِ وَالأَرْضِ الْغَيْبَ إِلاَّ اللَّهُ﴾.

---

[1] "ən-Nəcm" surəsi, 11 və 13.

**[439]-287-(177)** ........ Məsruq belə rəvayət etmişdir: "Mən Aişənin yanında söykənmiş vəziyyətdə ikən o (mənə): "Ey Əbu Aişə! Üç şey vardır ki, hər kim bunlardan birini dilinə gətirsə, Allaha böyük iftira yaxmış olar"– dedi. Mən: "Nədir onlar?"– deyə soruşdum. Dedi: "Hər kim Muhəmmədin ﷺ öz Rəbbini gördüyünü iddia etsə, Allaha böyük iftira yaxmış olar". Mən söykəndiyim yerdən qalxıb oturdum və dedim: "Ey möminlərin anası![1] Birhovur dayan, tələsmə! Məgər İzzətli və Qüdrətli Allah: **"O, onu aydın üfüqdə görmüşdür"[2] "O, onu bir daha enərkən gördü"[3]**– deyə buyurmayıbmı?" Aişə dedi: "Mən bu ümmətin Peyğəmbərdən ﷺ bu haqda soruşan kimsələrin birincisiyəm. O (mənim sualıma) belə cavab vermişdir: "O, Cəbraildir. Mən bu iki kərədən başqa heç vaxt onu xəlq edildiyi surətində görməmişəm. Onu səmadan enərkən gördüm. Xilqətinin böyüklüyü göylə yerin arasını tutmuşdu".

Aişə dedi: "Məgər sən Allahın: **"Gözlər Onu dərk etmir. O isə gözləri dərk edir. O, Lətifdir, *hər şeydən* Xəbərdardır",[4]**– deyə buyurduğunu, habelə Onun: **"Allah insanla ancaq vəhylə və ya pərdə arxasından danışır, yaxud bir elçi göndərir və o da *Allahın* izini ilə Onun istədiyini vəhy edir. Həqiqətən, O, Ucadır, Müdrikdir"[5]**– deyə buyurduğunu eşitməmisən?"

Aişə dedi: "Hər kim Rəsulullahın ﷺ Allahın Kitabından bir şey gizlətdiyini iddia etsə, Allaha böyük iftira yaxmış olar. Allah buyurur: **"Ey rəsul! Rəbbindən sənə nazil ediləni təbliğ et! *Belə* etməsən, Onun risalətini** *(sənə tapşırdığı elçilik vəzifəsini)* **yerinə yetirmiş olmazsan..."[6]**.

Aişə dedi: "Hər kim sabah nə baş verəcəyini xəbər verməyə qadir olduğunu iddia etsə, Allaha böyük iftira yaxmış olar. Allah buyurur: **"De: "Allahdan başqa göylərdə və yerdə olanların heç biri qeybi bilməz..."[7]**

**[٤٤٠] ٢٨٨**–(...) و حَدَّثَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى: حَدَّثَنَا عَبْدُ الْوَهَّابِ: حَدَّثَنَا دَاوُدُ بِهَذَا الإِسْنَادِ، نَحْوَ حَدِيثِ ابْنِ عُلَيَّةَ، وَزَادَ قَالَتْ: وَلَوْ كَانَ مُحَمَّدٌ ﷺ كَاتِمًا شَيْئًا مِمَّا أُنْزِلَ عَلَيْهِ لَكَتَمَ هَذِهِ الآيَةَ:

---

[1] Uca Allah buyurur: **"Peyğəmbər möminlərə onların özlərindən daha yaxındır. Zövcələri isə möminlərin analarıdır..."** ("əl-Əhzab" surəsi, 6).

[2] "ət-Təkvir" surəsi, 23.

[3] "ən-Nəcm" surəsi, 13.

[4] "əl-Ənam" surəsi, 103.

[5] "əş-Şura" surəsi, 51.

[6] "əl-Maidə" surəsi, 67.

[7] "ən-Nəml" surəsi, 65.

﴿ وَإِذْ تَقُولُ لِلَّذِيٓ أَنْعَمَ ٱللَّهُ عَلَيْهِ وَأَنْعَمْتَ عَلَيْهِ أَمْسِكْ عَلَيْكَ زَوْجَكَ وَٱتَّقِ ٱللَّهَ وَتُخْفِي فِي نَفْسِكَ مَا ٱللَّهُ مُبْدِيهِ وَتَخْشَى ٱلنَّاسَ وَٱللَّهُ أَحَقُّ أَن تَخْشَىٰهُ ﴾

**[440]-288-(...)** ........ Davud (hədisi) bu isnadla İbn Uleyyənin hədisinə bənzər rəvayət etmiş və (rəvayətinə bunu) əlavə etmişdir: Aişə dedi: "Əgər Muhəmməd ﷺ ona nazil olmuş (Kitabdan) nə isə gizlətsəydi, bu ayəni gizlədərdi: **"Bir zaman Allahın nemət verdiyi və sənin özünün nemət verdiyin *Zeydə*: "Zövcəni öz yanında saxla, Allahdan qorx!"– deyirdin. Allahın aşkar edəcəyi şeyi ürəyində gizli saxlayır və insanlardan çəkinirdin. Halbuki, əslində, qorxmalı olduğun məhz Allahdır..."**[1]

**[٤٤١] ٢٨٩**–(...) حَدَّثَنَا ابْنُ نُمَيْرٍ: حَدَّثَنَا أَبِي: حَدَّثَنَا إِسْمَعِيلُ، عَنْ الشَّعْبِيِّ، عَنْ مَسْرُوقٍ قَالَ: سَأَلْتُ عَائِشَةَ: هَلْ رَأَى مُحَمَّدٌ ﷺ رَبَّهُ؟ فَقَالَتْ: سُبْحَانَ اللَّهِ! لَقَدْ قَفَّ شَعَرِي لِمَا قُلْتَ، وَسَاقَ الْحَدِيثَ بِقِصَّتِهِ، وَحَدِيثُ دَاوُدَ أَتَمُّ وَأَطْوَلُ.

**[441]-289-(...)** ........ Məsruq demişdir: "Mən Aişədən: "Muhəmməd ﷺ Rəbbini görübmü?"– deyə soruşdum". (Aişə): "Subhanəllah! Bu dediyin sözdən tüklərim biz-biz oldu..."– dedi və hədisi axıra kimi tamamladı. Lakin Davudun rəvayət etdiyi hədis daha tamam və daha uzundur.

**[٤٤٢] ٢٩٠**–(...) و حَدَّثَنَا ابْنُ نُمَيْرٍ: حَدَّثَنَا أَبُو أُسَامَةَ: حَدَّثَنَا زَكَرِيَّاءُ، عَنْ ابْنِ أَشْوَعَ، عَنْ عَامِرٍ، عَنْ مَسْرُوقٍ قَالَ: قُلْتُ لِعَائِشَةَ: فَأَيْنَ قَوْله تَعَالَى: ﴿ ثُمَّ دَنَا فَتَدَلَّىٰ فَكَانَ قَابَ قَوْسَيْنِ أَوْ أَدْنَىٰ فَأَوْحَىٰٓ إِلَىٰ عَبْدِهِۦ مَآ أَوْحَىٰ ﴾ قَالَتْ: إِنَّمَا ذَاكَ جِبْرِيلُ ﷺ كَانَ يَأْتِيهِ فِي صُورَةِ الرِّجَالِ، وَإِنَّهُ أَتَاهُ فِي هَذِهِ الْمَرَّةِ فِي صُورَتِهِ الَّتِي هِيَ صُورَتُهُ، فَسَدَّ أُفُقَ السَّمَاءِ.

**[442]-290-(...)** ........ Məsruq demişdir: "Mən Aişədən: "Uca Allahın: **"Sonra *Muhəmmədə* yaxınlaşıb aşağı endi. O, iki yay uzunluğunda, hətta ondan da yaxın məsafədə idi. Sonra *Allah* Öz quluna vəhy edəcəyini vəhy etdi"**[2] sözləri nəyə işarədir?"– deyə soruşdum. Dedi: "Bu, Cəbraildir ﷺ. Cəbrail onun yanına kişi qiyafəsində gələrdi. Bu dəfə isə onun yanına əsl surətində – öz surətində gəlmiş və göy üzünü tutmuşdu".

---

[1] "əl-Əhzab" surəsi, 37.
[2] "ən-Nəcm" surəsi, 8-10.

## (٧٨) – بَابُ فِي قَوْلِهِ عَلَيْهِ السَّلَامِ: ((نُورٌ أَنَّى أَرَاهُ))، وَفِي قَوْلِهِ: ((رَأَيْتُ نُورًا))

## 78-ci fəsil. Peyğəmbərin ﷺ: "O, bir nurdur, onu necə görə bilərəm?!" və "bir nur gördüm" sözləri haqqında

**[٤٤٣] ٢٩١**–(١٧٨) حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا وَكِيعٌ عَنْ يَزِيدَ بْنِ إِبْرَاهِيمَ، عَنْ قَتَادَةَ، عَنْ عَبْدِ اللَّهِ بْنِ شَقِيقٍ، عَنْ أَبِي ذَرٍّ قَالَ: سَأَلْتُ رَسُولَ اللَّهِ ﷺ: هَلْ رَأَيْتَ رَبَّكَ؟ قَالَ: ((نُورٌ أَنَّى أَرَاهُ)).

**[443]-291-(178)** ........ Əbu Zərr ؓ demişdir: "Mən Peyğəmbərdən ﷺ soruşdum: "Rəbbini görmüsənmi?" Dedi: "O, bir nurdur, onu necə görə bilərəm?!"

**[٤٤٤] ٢٩٢**–(...) حَدَّثَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ: حَدَّثَنَا مُعَاذُ بْنُ هِشَامٍ: حَدَّثَنَا أَبِي؛ ح: و حَدَّثَنِي حَجَّاجُ بْنُ الشَّاعِرِ: حَدَّثَنَا عَفَّانُ بْنُ مُسْلِمٍ: حَدَّثَنَا هَمَّامٌ كِلاَهُمَا عَنْ قَتَادَةَ، عَنْ عَبْدِ اللَّهِ بْنِ شَقِيقٍ قَالَ: قُلْتُ لأَبِي ذَرٍّ: لَوْ رَأَيْتُ رَسُولَ اللَّهِ ﷺ لَسَأَلْتُهُ، فَقَالَ: عَنْ أَيِّ شَيْءٍ كُنْتَ تَسْأَلُهُ؟ قَالَ: كُنْتُ أَسْأَلُهُ: هَلْ رَأَيْتَ رَبَّكَ؟ قَالَ أَبُو ذَرٍّ قَدْ سَأَلْتُ فَقَالَ: ((رَأَيْتُ نُورًا)).

**[444]-292-(...)** ........ Abdullah ibn Şəqiq belə rəvayət etmişdir: "Mən Əbu Zərrə dedim: "Əgər Rəsulullahı ﷺ görsəydim, ondan soruşardım". Dedi: "Nə haqda soruşardın?" Soruşardım ki: "Rəbbini gördünmü?" (Əbu Zərr) dedi: "Mən (bu haqda ondan) soruşdum, o da: "Bir nur gördüm"– deyə cavab verdi".

## (٧٩) – بَابُ فِي قَوْلِهِ عَلَيْهِ السَّلَامِ: ((إِنَّ اللَّهَ لاَ يَنَامُ))، وَفِي قَوْلِهِ: ((حِجَابُهُ النُّورُ لَوْ كَشَفَهُ لأَحْرَقَ سُبُحَاتُ وَجْهِهِ مَا انْتَهَى إِلَيْهِ بَصَرُهُ مِنْ خَلْقِهِ))

## 79-cu fəsil. Peyğəmbərin ﷺ: "Allah yatmır" və "Onun hicabı nurdur. Əgər onu açsaydı, Üzünün subuhatı[1] Gözünün əhatə etdiyi bütün məxluqatını yandırıb-yaxardı" sözləri haqqında

**[٤٤٥] ٢٩٣**–(١٧٩) حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ وَأَبُو كُرَيْبٍ قَالاَ: حَدَّثَنَا أَبُو مُعَاوِيَةَ: حَدَّثَنَا الأَعْمَشُ، عَنْ عَمْرِو بْنِ مُرَّةَ، عَنْ أَبِي عُبَيْدَةَ، عَنْ أَبِي مُوسَى قَالَ: قَامَ فِينَا رَسُولُ اللَّهِ ﷺ بِخَمْسِ كَلِمَاتٍ

---

[1] Lüğəti mənada subuhat – nur, əzəmət, gözəllik və gülcamal mənalarını ifadə edir. ("Lisan əl-Arab", 2/470; "ən-Nihayə", 2/833; "əs-Sihah", 2/395). Subuhat sözünün mənası bəlli olsa da, Allahın Üzünün subuhatının necəliyi Onun Özündən başqa, heç kəsə məlum deyildir. Uca Allah buyurur: **"Onun heç bir bənzəri yoxdur. O, Eşidəndir, Görəndir"** ("əş-Şura" surəsi, 11).

فَقَالَ: ((إِنَّ اللَّهَ عَزَّ وَجَلَّ لاَ يَنَامُ وَلاَ يَنْبَغِي لَهُ أَنْ يَنَامَ، يَخْفِضُ الْقِسْطَ وَيَرْفَعُهُ، يُرْفَعُ إِلَيْهِ عَمَلُ اللَّيْلِ قَبْلَ عَمَلِ النَّهَارِ، وَعَمَلُ النَّهَارِ قَبْلَ عَمَلِ اللَّيْلِ، حِجَابُهُ النُّورُ – وَفِي رِوَايَةِ أَبِي بَكْرٍ النَّارُ – لَوْ كَشَفَهُ لأَحْرَقَتْ سُبُحَاتُ وَجْهِهِ مَا انْتَهَى إِلَيْهِ بَصَرُهُ مِنْ خَلْقِهِ)).

وَفِي رِوَايَةِ أَبِي بَكْرٍ: عَنْ الأَعْمَشِ، وَلَمْ يَقُلْ حَدَّثَنَا.

**[445]-293-(179)** ........ Əbu Musa ﷺ demişdir: “(Bir dəfə) Peyğəmbər ﷺ bizim aramızda ayağa qalxdı və bu beş kəlməni söylədi: “Allah yatmır, yatmaq Ona yaraşmaz.[1] O, ədalət (tərəzisini) alçaldır və yüksəldir.[2] Gündüzün əməlindən öncə gecənin əməli, gecənin əməlindən öncə gündüzün əməli Onun yanına yüksəlir.[3] Onun hicabı nurdur. (Əbu Bəkrin rəvayətində: “oddur” deyilir). Əgər onu açsaydı, Üzünün subuhatı Gözünün əhatə etdiyi bütün məxluqatını yandırıb-yaxardı”.

Əbu Bəkr, Aməşdən nəql etdiyi hədisində: “bizə rəvayət etmişdir”– deməmişdir.

**[٤٤٦] ٢٩٤**–(...) حَدَّثَنَا إِسْحَقُ بْنُ إِبْرَاهِيمَ: أَخْبَرَنَا جَرِيرٌ عَنْ الأَعْمَشِ بِهَذَا الإِسْنَادِ، قَالَ: قَامَ فِينَا رَسُولُ اللَّهِ ﷺ بِأَرْبَعِ كَلِمَاتٍ، ثُمَّ ذَكَرَ بِمِثْلِ حَدِيثِ أَبِي مُعَاوِيَةَ، وَلَمْ يَذْكُرْ ((مِنْ خَلْقِهِ)) وَقَالَ حِجَابُهُ النُّورُ.

**[446]-294-(...)** ........ Cərir (hədisi) Aməşdən bu isnadla belə rəvayət etmişdir: “Peyğəmbər ﷺ bizim aramızda ayağa qalxıb bu dörd kəlməni söylədi...” Beləcə, (ravi bu hədisi) Əbu Müaviyənin hədisinə bənzər rəvayət etmişdir. (Bu rəvayətdə) o: “məxluqatını” sözünü zikr etməmiş, fəqət: “Onun hicabı nurdur”– demişdir.

**[٤٤٧] ٢٩٥**–(...) حَدَّثَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى وَابْنُ بَشَّارٍ قَالاَ: حَدَّثَنَا مُحَمَّدُ بْنُ جَعْفَرٍ قَالَ: حَدَّثَنِي شُعْبَةُ عَنْ عَمْرِو بْنِ مُرَّةَ، عَنْ أَبِي عُبَيْدَةَ، عَنْ أَبِي مُوسَى قَالَ: قَامَ فِينَا رَسُولُ اللَّهِ ﷺ بِأَرْبَعٍ: ((إِنَّ اللَّهَ لاَ يَنَامُ، وَلاَ يَنْبَغِي لَهُ أَنْ يَنَامَ، يَرْفَعُ الْقِسْطَ وَيَخْفِضُهُ، وَيُرْفَعُ إِلَيْهِ عَمَلُ النَّهَارِ بِاللَّيْلِ، وَعَمَلُ اللَّيْلِ بِالنَّهَارِ)).

---

[1] **“Allah, Ondan başqa** ***ibadətə layiq olan*** **məbud yoxdur,** ***əbədi*** **Yaşayandır,** ***bütün yaratdıqlarının*** **Qəyyumudur. Onu nə mürgü, nə də yuxu tutar...”** (“əl-Bəqərə” surəsi, 255).

[2] **“Biz Qiyamət günü ədalət tərəziləri ilə haqq-hesab çəkəcəyik. Heç kimə hər hansı bir şeydə ədalətsizlik edilməyəcəkdir.** ***Görülmüş iş*** **bir xardal dənəsi mislində olsa belə, onu gətirib** ***tərəziyə*** **qoyacağıq. Biz haqqı araşdırmağa bəs edərik”** (“əl-Ənbiya” surəsi, 47).

[3] **“Gözəl söz Ona tərəf yüksəlir və onu ucaldan yaxşı əməldir”** (“Fatir” surəsi, 10); **“Mələklər və Ruh** ***Cəbrail*** **Ona doğru, sayı əlli min ilə bərabər bir gün ərzində qalxırlar”** (“əl-Məaric” surəsi, 4).

**[447]-295-(...)** ........ Əbu Musa ﷺ demişdir: "Peyğəmbər ﷺ bizim aramızda ayağa qalxıb bu dörd (kəlməni) söylədi: "Allah yatmır, yatmaq Ona yaraşmaz. O, ədalət (tərəzisini) həm alçaldır, həm də yüksəldir. Gündüzün əməli gecə vaxtı, gecənin əməli isə gündüz vaxtı Onun yanına yüksəlir".

## (٨٠) – بَابُ إِثْبَاتِ رُؤْيَةِ الْمُؤْمِنِينَ فِي الآخِرَةِ رَبَّهُمْ سُبْحَانَهُ وَتَعَالَى

## 80-ci fəsil. Möminlərin axirətdə özlərinin Rəbbi subhanəhu və təaləni görmələrinin isbatı

**[٤٤٨] ٢٩٦**-(١٨٠) حَدَّثَنَا نَصْرُ بْنُ عَلِيٍّ الْجَهْضَمِيُّ وَأَبُو غَسَّانَ الْمِسْمَعِيُّ وَإِسْحَقُ بْنُ إِبْرَاهِيمَ، جَمِيعًا عَنْ عَبْدِ الْعَزِيزِ بْنِ عَبْدِ الصَّمَدِ – وَاللَّفْظُ لأَبِي غَسَّانَ – قَالَ: حَدَّثَنَا أَبُو عَبْدِ الصَّمَدِ: حَدَّثَنَا أَبُو عِمْرَانَ الْجَوْنِيُّ، عَنْ أَبِي بَكْرِ بْنِ عَبْدِ اللَّهِ بْنِ قَيْسٍ، عَنْ أَبِيهِ، عَنِ النَّبِيِّ ﷺ قَالَ: ((جَنَّتَانِ مِنْ فِضَّةٍ آنِيَتُهُمَا وَمَا فِيهِمَا، وَجَنَّتَانِ مِنْ ذَهَبٍ آنِيَتُهُمَا وَمَا فِيهِمَا، وَمَا بَيْنَ الْقَوْمِ وَبَيْنَ أَنْ يَنْظُرُوا إِلَى رَبِّهِمْ إِلاَّ رِدَاءُ الْكِبْرِيَاءِ عَلَى وَجْهِهِ فِي جَنَّةِ عَدْنٍ)).

**[448]-296-(180)** ........ Abdullah ibn Qeys ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "İki cənnət vardır ki, bunların qabları və içindəki əşyaları gümüşdəndir. (Başqa) iki cənnət də vardır ki, bunların qabları və içindəki əşyaları qızıldandır. Ədn cənnətinin sakinləri ilə onların Rəbbi arasında Onun Üzündəki Kibriya örtüyündən[1] başqa bir şey olmayacaqdır".

**[٤٤٩] ٢٩٧**-(١٨١) حَدَّثَنَا عُبَيْدُ اللَّهِ بْنُ مَيْسَرَةَ قَالَ: حَدَّثَنِي عَبْدُ الرَّحْمَنِ بْنُ مَهْدِيٍّ: حَدَّثَنَا حَمَّادُ بْنُ سَلَمَةَ عَنْ ثَابِتٍ الْبُنَانِيِّ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ أَبِي لَيْلَى، عَنْ صُهَيْبٍ، عَنِ النَّبِيِّ ﷺ قَالَ: ((إِذَا دَخَلَ أَهْلُ الْجَنَّةِ الْجَنَّةَ، قَالَ يَقُولُ اللَّهُ تَبَارَكَ وَتَعَالَى: تُرِيدُونَ شَيْئًا أَزِيدُكُمْ؟ فَيَقُولُونَ: أَلَمْ تُبَيِّضْ وُجُوهَنَا؟ أَلَمْ تُدْخِلْنَا الْجَنَّةَ وَتُنَجِّنَا مِنَ النَّارِ؟ قَالَ: فَيَكْشِفُ الْحِجَابَ، فَمَا أُعْطُوا شَيْئًا أَحَبَّ إِلَيْهِمْ مِنَ النَّظَرِ إِلَى رَبِّهِمْ [عَزَّ وَجَلَّ])).

**[449]-297-(181)** ........ Suheyb ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Cənnət əhli Cənnətə daxil olduğu zaman Allah Təbarəkə və Təalə belə buyuracaq: "İstəyirsinizmi sizə nə isə artırım?" Onlar deyəcəklər: "Sən bizim üzümüzü ağ etmədinmi?! Bizi atəşdən qurtarıb Cənnətə daxil etmədinmi?!" Bu-

---

[1] Bundan sonrakı hədisdə keçən **"Bunun ardından Allah hicabı qaldıracaq"** sözü, habelə 450, 451, 454 və 455 saylı hədislər bu hədisi açıqlayır və möminlərin Qiyamət günü Allahı görəcəklərini sübuta yetirir.

nun ardından Allah hicabı qaldıracaq.[1] Artıq onlara özlərinin İzzətli və Qüdrətli Rəbbinə baxmaqdan daha əziz bir şey verilməmişdir".

**[٤٥٠] ٢٩٨**-(...) حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا يَزِيدُ بْنُ هَارُونَ، عَنْ حَمَّادِ بْنِ سَلَمَةَ بِهَذَا الإِسْنَادِ، وَزَادَ: ثُمَّ تَلاَ هَذِهِ الآيَةَ: ﴿لِّلَّذِينَ أَحْسَنُوا۟ ٱلْحُسْنَىٰ وَزِيَادَةٌ﴾.

**[450]-298-(...)** ........ Bizə Əbu Bəkr ibn Əbu Şeybə belə rəvayət etmişdir. (Bu hədisi) Yezid ibn Harun, Həmmad ibn Sələmədən bu isnadla bizə rəvayət etmiş və bunu əlavə etmişdir: "Sonra bu ayəni oxudu: **"Yaxşı iş görənlər üçün ən yaxşısı və bundan da üstünü vardır[2]"[3]**

## (٨١) – بَابُ مَعْرِفَةِ طَرِيقِ الرُّؤْيَةِ

## 81-ci fəsil. (Allahı) görməyin yolunu öyrənmək

**[٤٥١] ٢٩٩**-(١٨٢) حَدَّثَنِي زُهَيْرُ بْنُ حَرْبٍ: حَدَّثَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ: حَدَّثَنَا أَبِي عَنْ ابْنِ شِهَابٍ، عَنْ عَطَاءِ بْنِ يَزِيدَ اللَّيْثِيِّ أَنَّ أَبَا هُرَيْرَةَ أَخْبَرَهُ: أَنَّ نَاسًا قَالُوا لِرَسُولِ اللَّهِ ﷺ: يَا رَسُولَ اللَّهِ! هَلْ نَرَى رَبَّنَا يَوْمَ الْقِيَامَةِ؟ فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: هَلْ تُضَارُّونَ فِي [رُؤْيَةِ] الْقَمَرِ لَيْلَةَ الْبَدْرِ؟ قَالُوا: لاَ، يَا رَسُولَ اللَّهِ! قَالَ: ((هَلْ تُضَارُّونَ فِي الشَّمْسِ لَيْسَ دُونَهَا سَحَابٌ؟)) قَالُوا: لاَ، [يَا رَسُولَ اللَّهِ!] قَالَ: ((فَإِنَّكُمْ تَرَوْنَهُ كَذَلِكَ، يَجْمَعُ اللَّهُ النَّاسَ يَوْمَ الْقِيَامَةِ، فَيَقُولُ: مَنْ كَانَ يَعْبُدُ شَيْئًا فَلْيَتَّبِعْهُ، فَيَتَّبِعُ مَنْ كَانَ يَعْبُدُ الشَّمْسَ الشَّمْسَ، وَيَتَّبِعُ مَنْ كَانَ يَعْبُدُ الْقَمَرَ الْقَمَرَ، وَيَتَّبِعُ مَنْ كَانَ يَعْبُدُ الطَّوَاغِيتَ الطَّوَاغِيتَ، وَتَبْقَى هَذِهِ الأُمَّةُ فِيهَا مُنَافِقُوهَا، فَيَأْتِيهِمْ اللَّهُ [تَبَارَكَ وَتَعَالَى]، فِي صُورَةٍ غَيْرِ صُورَتِهِ الَّتِي يَعْرِفُونَ، فَيَقُولُ: أَنَا رَبُّكُمْ، فَيَقُولُونَ: نَعُوذُ بِاللَّهِ مِنْكَ، هَذَا مَكَانُنَا حَتَّى يَأْتِيَنَا رَبُّنَا، فَإِذَا جَاءَ رَبُّنَا عَرَفْنَاهُ، فَيَأْتِيهِمْ اللَّهُ [تَعَالَى] فِي صُورَتِهِ الَّتِي يَعْرِفُونَ، فَيَقُولُ: أَنَا رَبُّكُمْ، فَيَقُولُونَ: أَنْتَ رَبُّنَا، فَيَتَّبِعُونَهُ، وَيُضْرَبُ الصِّرَاطُ بَيْنَ ظَهْرَيْ جَهَنَّمَ، فَأَكُونُ أَنَا وَأُمَّتِي أَوَّلَ مَنْ يُجِيزُ، وَلاَ يَتَكَلَّمُ

---

[1] Bu, yalnız möminlərə məxsusdur. Kafirlər isə Allahı görə bilməyəcəklər. Uca Allah bu xüsusda buyurur: **"Xeyr, həmin gün onlarla Rəbbi arasına pərdə çəkiləcək! Sonra onlar Cəhənnəmə girəcəklər və *onlara* deyiləcək: "Budur sizin yalan hesab etdiyiniz *Cəhənnəm*!"** ("əl-Mutaffifin" surəsi, 15);

[2] Ayədəki "**ən yaxşısı**" sözü – Cənnət, "**və bundan da üstünü vardır**" sözü – Allahın Üzünə baxmaq kimi təfsir edilmişdir. Yəni əməlisaleh möminlərə Cənnət və bundan əlavə Allahı görmək nəsib olacaq. ("Təfsir ət-Təbəri", 15/62; "Təfsir əl-Qurtubi", 8/330; "Təfsir İbn Kəsir", 2/504-505; "Təfsir əl-Bəğəvi", 4/130; "əd-Dur əl-Mənsur", 4/356; "Fəth əl-Qədir", 2/636; "Təfsir əs-Sədi", 1/362; "Ədva əl-Bəyan", 1/489; "Əysər ət-Təfasir", 2/466).

[3] "Yunus" surəsi, 26.

يَوْمَئِذٍ إلاَّ الرُّسُلُ، وَدَعْوَى الرُّسُلِ يَوْمَئِذ: اللَّهُمَّ! سَلِّمْ، سَلِّمْ، وَفِي جَهَنَّمَ كَلاَلِيبُ مِثْلُ شَوْكِ السَّعْدَان، هَلْ رَأَيْتُمْ السَّعْدَانَ؟)) قَالُوا: نَعَمْ، يَا رَسُولَ اللَّه! قَالَ: ((فَإِنَّهَا مِثْلُ شَوْكِ السَّعْدَان، غَيْرَ أَنَّهُ لاَ يَعْلَمُ مَا قَدْرُ عِظَمِهَا إلاَّ اللَّهُ، تَخْطَفُ النَّاسَ بِأَعْمَالِهِمْ، فَمِنْهُمْ الْمُوبَقُ – يَعْنِي بِعَمَلِه – وَمِنْهُمْ الْمُجَازَى حَتَّى يُنَجَّى، حَتَّى إِذَا فَرَغَ اللَّهُ مِنْ الْقَضَاءِ بَيْنَ الْعِبَاد، وَأَرَادَ أَنْ يُخْرِجَ بِرَحْمَتِه مَنْ أَرَادَ مِنْ أَهْلِ النَّار، أَمَرَ الْمَلاَئِكَةَ أَنْ يُخْرِجُوا مِنْ النَّارِ مَنْ كَانَ لاَ يُشْرِكُ بِاللَّه شَيْئًا – مِمَّنْ أَرَادَ اللَّهُ تَعَالَى أَنْ يَرْحَمَهُ – مِمَّنْ يَقُولُ: لاَ إِلَهَ إِلاَّ اللَّهُ، فَيَعْرِفُونَهُمْ فِي النَّار، يَعْرِفُونَهُمْ بِأَثَرِ السُّجُود – تَأْكُلُ النَّارُ مِنْ ابْنِ آدَمَ إِلاَّ أَثَرَ السُّجُود – حَرَّمَ اللَّهُ عَلَى النَّارِ أَنْ تَأْكُلَ أَثَرَ السُّجُود، فَيُخْرَجُونَ مِنْ النَّارِ وَقَدْ امْتَحَشُوا، فَيُصَبُّ عَلَيْهِمْ مَاءُ الْحَيَاة، فَيَنْبُتُونَ مِنْهُ كَمَا تَنْبُتُ الْحِبَّةُ فِي حَمِيلِ السَّيْل، ثُمَّ يَفْرُغُ اللَّهُ تَعَالَى مِنْ الْقَضَاءِ بَيْنَ الْعِبَاد، وَيَبْقَى رَجُلٌ مُقْبِلٌ بِوَجْهِه عَلَى النَّار، وَهُوَ آخِرُ أَهْلِ الْجَنَّة دُخُولاً الْجَنَّةَ، فَيَقُولُ: أَيْ رَبِّ! اصْرِفْ وَجْهِي عَنْ النَّار، فَإِنَّهُ قَدْ قَشَبَنِي رِيحُهَا وَأَحْرَقَنِي ذَكَاؤُهَا، فَيَدْعُو اللَّهَ مَا شَاءَ اللَّهُ أَنْ يَدْعُوَهُ، ثُمَّ يَقُولُ اللَّهُ تَبَارَكَ وَتَعَالَى: هَلْ عَسَيْتَ إِنْ فَعَلْتُ ذَلِكَ بِكَ أَنْ تَسْأَلَ غَيْرَهُ! فَيَقُولُ: لاَ أَسْأَلُكَ غَيْرَهُ، وَيُعْطِي رَبَّهُ مِنْ عُهُود وَمَوَاثِيقَ مَا شَاءَ اللَّهُ، فَيَصْرِفُ اللَّهُ وَجْهَهُ عَنْ النَّار، فَإِذَا أَقْبَلَ عَلَى الْجَنَّة وَرَآهَا سَكَتَ مَا شَاءَ اللَّهُ أَنْ يَسْكُتَ، ثُمَّ يَقُولُ: أَيْ رَبِّ! قَدِّمْنِي إِلَى بَابِ الْجَنَّة. فَيَقُولُ اللَّهُ لَهُ: أَلَيْسَ قَدْ أَعْطَيْتَ عُهُودَكَ وَمَوَاثِيقَكَ لاَ تَسْأَلُنِي غَيْرَ الَّذِي أَعْطَيْتُك، وَيْلَكَ يَا ابْنَ آدَمَ مَا أَغْدَرَكَ! فَيَقُولُ: أَيْ رَبِّ! – وَيَدْعُو اللَّهَ – حَتَّى يَقُولَ لَهُ: فَهَلْ عَسَيْتَ إِنْ أَعْطَيْتُكَ ذَلِكَ أَنْ تَسْأَلَ غَيْرَهُ! فَيَقُولُ: لاَ، وَعِزَّتِكَ فَيُعْطِي رَبَّهُ مَا شَاءَ اللَّهُ مِنْ عُهُود وَمَوَاثِيقَ، فَيُقَدِّمُهُ إِلَى بَابِ الْجَنَّة، فَإِذَا قَامَ عَلَى بَابِ الْجَنَّة انْفَهَقَتْ لَهُ الْجَنَّةُ، فَرَأَى مَا فِيهَا مِنْ الْخَيْرِ وَالسُّرُور، فَيَسْكُتُ مَا شَاءَ اللَّهُ أَنْ يَسْكُتَ، ثُمَّ يَقُولُ: أَيْ رَبِّ! أَدْخِلْنِي الْجَنَّةَ، فَيَقُولُ اللَّهُ تَبَارَكَ وَتَعَالَى لَهُ: أَلَيْسَ قَدْ أَعْطَيْتَ عُهُودَكَ وَمَوَاثِيقَكَ أَنْ لاَ تَسْأَلَ غَيْرَ مَا أُعْطِيتَ، وَيْلَكَ يَا ابْنَ آدَمَ مَا أَغْدَرَكَ! فَيَقُولُ: أَيْ رَبِّ! لاَ أَكُونُ أَشْقَى خَلْقِكَ، فَلاَ يَزَالُ يَدْعُو اللَّهَ حَتَّى يَضْحَكَ اللَّهُ تَبَارَكَ وَتَعَالَى مِنْهُ، فَإِذَا ضَحِكَ اللَّهُ مِنْهُ قَالَ: ادْخُلْ الْجَنَّةَ، فَإِذَا دَخَلَهَا قَالَ اللَّهُ لَهُ: تَمَنَّهْ، فَيَسْأَلُ رَبَّهُ وَيَتَمَنَّى، حَتَّى إِنَّ اللَّهَ لَيُذَكِّرُهُ مِنْ كَذَا وَكَذَا، حَتَّى إِذَا انْقَطَعَتْ بِهِ الأَمَانِيُّ، قَالَ اللَّهُ تَعَالَى: ذَلِكَ لَكَ وَمِثْلُهُ مَعَهُ)).

قَالَ عَطَاءُ بْنُ يَزِيدَ:وَأَبُو سَعِيدٍ الْخُدْرِيُّ مَعَ أَبِي هُرَيْرَةَ لاَ يَرُدُّ عَلَيْهِ مِنْ حَدِيثِه شَيْئًا. حَتَّى إِذَا حَدَّثَ أَبُو هُرَيْرَةَ: أَنَّ اللَّهَ قَالَ لِذَلِكَ الرَّجُلِ: ((ذَلِكَ لَكَ وَمِثْلُهُ مَعَهُ))، قَالَ أَبُو سَعِيد: وَعَشَرَةُ أَمْثَالِه مَعَهُ يَا أَبَا هُرَيْرَةَ! قَالَ أَبُو هُرَيْرَةَ: مَا حَفِظْتُ إِلاَّ قَوْلَهُ: ((ذَلِكَ لَكَ وَمِثْلُهُ مَعَهُ)). قَالَ أَبُو سَعِيدٍ: أَشْهَدُ أَنِّي حَفِظْتُ مِنْ رَسُولِ اللَّهِ ﷺ قَوْلَهُ: ((ذَلِكَ لَكَ وَعَشَرَةُ أَمْثَالِه)).

قَالَ أَبُو هُرَيْرَةَ:وَذَلِكَ الرَّجُلُ آخِرُ أَهْلِ الْجَنَّة دُخُولاً الْجَنَّةَ.

**[451]-299-(182)** ........ Əbu Hureyrə ﷺ rəvayət edir ki, (bir dəfə) camaat Peyğəmbərdən ﷺ soruşdu: "Ya Rəsulullah! Biz Qiyamət günü Rəbbimizi görəcə-

yikmi?" Peyğəmbər ﷺ dedi: "Məgər siz buludla örtülməmiş on dörd gecəlik ayı (görmək üçün basabas salıb) bir-birinizə əziyyət verirsiniz?!" Onlar: "Xeyr, ya Rəsulullah!"– deyə cavab verdilər. (Peyğəmbər ﷺ yenə) buyurdu: "Məgər siz buludla örtülməmiş günəşi (görmək üçün) bir-birinizə əziyyət verirsiniz?!" Onlar: "Xeyr, (ya Rəsulullah)!"– deyə cavab verdilər. (Peyğəmbər ﷺ) buyurdu: "Rəbbinizi də beləcə[1] görəcəksiniz.[2] Qiyamət günü Allah insanları (məhşərə) toplayacaq və belə buyuracaq: "Kim nəyə ibadət edirdisə, qoy onun ardınca getsin!" Beləliklə, günəşə ibadət edənlər günəşin, aya ibadət edənlər ayın, tağutlara[3] ibadət edənlər də tağutların ardınca (gedib Cəhənnəmə) düşəcək. Axırda bu ümmət,[4] içində olan münafiqlərilə birlikdə qalacaqdır. Sonra Allah (Təbarəkə və Təalə) onların yanına əvvəlcə tanıdıqlarından başqa surətdə gələcək və: "Mən sizin Rəbbinizəm!"– deyə buyuracaq. Onlar (Allahı tanımadıqlarına görə) deyəcəklər: "Səndən Allaha sığınırıq! Rəbbimiz gələnədək bura bizim yerimizdir, (bu yerdən ayrılmayacağıq). Rəbbimiz gələndə biz Onu tanıyacağıq". Bu səfər Allah Təalə onların yanına tanıdıqları surətdə gəlib: "Mən sizin Rəbbinizəm!"– deyə buyuracaq. Onlar da: "Sən bizim Rəbbimizsən!"– deyəcək və Ona tabe olacaqlar. (Bundan sonra) Cəhənnəmin üzərində körpü[5] qurulacaq və ümməti ilə birlikdə bu körpüdən keçən elçilərin birincisi mən olacağam. O gün elçilərdən başqa heç kəs danışa bilməyəcək.[6] Elçilərin o günkü duaları isə: "Allahım, xilas et, xilas et!" olacaq. Cəhənnəmdə sadan[7] tikanlarına bənzər qarmaqlar vardır. Siz sadan tikanlarını

---

[1] Yəni heç bir çətinlik çəkmədən, məşəqqətə uğramadan.

[2] Quran ayələrinə və səhih hədislərə, üstəlik səhabələrin və onların yolunu tutub gedən haqq-əhlinin yekdil fikrinə əsasən möninlər Qiyamət günü Allahı görəcəklər. Lakin Mötəzililər və Xəvariclər başda olmaqla bidət əhlinin əksəriyyəti bunun mümkünlüyünü inkar etmişlər.

[3] Tağut sözü aşağıdakı mənalarda işlənir:
(a) Uca Allahla yanaşı ilahiləşdirilən və ibadət olunan hər hansı bir məxluq;
(b) Allahın haram buyurduqlarına məhəl qoymayan günahkar;
(c) şeytan və iblis;
(ç) cadugərlər və baxıcılar;
(d) insanları aldadan və Allahın şəriətinə zidd olan qanunlar qəbul edən kafirlər;
(e) büt yerləşdirilən məbəd.

[4] Burada ümmət deyildikdə həm Muhəmməd səllallahu aleyhi və səlləmin, həm də ondan əvvəlki peyğəmbərlərin ümmətlərindən təkAllahlılığı qəbul etmiş tövhid-əhli nəzərdə tutulur.

[5] Tərcümədə buna Sirat, qıl körpüsü deyilir.

[6] Uca Allah buyurur: **"Ruh *Cəbrailin* və mələklərin səf-səf duracağı gün, Mərhəmətli *Allahın* izin verdiyi kimsələrdən və doğru *söz* deyənlərdən başqa, heç kəs danışmayacaq"** ("ən-Nəbə" surəsi, 38).

[7] Dadı şirin tikanlı bitki.

görmüsünüzmü?" (Səhabələr): "Bəli, ya Rəsulullah!"– dedilər. (Peyğəmbər ﷺ) buyurdu: "Bu qarmaqlar sadan tikanlarına bənzəyirlər, lakin Allahdan başqa heç kəs onların nə qədər böyük olduğunu bilmir. Onlar insanları (pis) əməllərinə görə tutacaqlar. Onlardan kimisi əməlinə görə məhv olacaq, kimisi də didik-didik ediləcək, lakin axırda xilas olacaq. Nəhayət, Allah Öz qulları arasında mühakiməsini bitirdiyi və Cəhənnəmə vasil olanlardan dilədiyinə mərhəmət göstərmək istədiyi zaman mələklərə, "lə ilahə illəllah" deyənlərdən – Uca Allahın mərhəmət etmək istədiyi kimsələrdən – Allaha heç bir şeyi şərik qoşmamış kəsləri (oradan) çıxarmağı əmr edəcək. Mələklər onları atəşin içində (üzlərindəki) səcdə nişanəsindən tanıyacaqlar. Od, Adəm övladının vücudunu – səcdə yerləri[1] istisna olmaqla – başdan-ayağa yandırıb-yaxacaq. (Çünki) Allah Cəhənnəm oduna səcdə izlərini yandırıb-yaxmağı haram etmişdir. Beləliklə, onlar sümüklərinə qədər yanmış halda Cəhənnəm odundan çıxarılacaqlar. Bundan sonra onların üstünə dirilik suyu töküləcək və onlar selin gətirdiyi toxumun cücərib yetişdiyi kimi diriləcəklər. Nəhayət, Uca Allah Öz qulları arasında mühakiməsini bitirdikdə üzü Cəhənnəmə tərəf olan bir nəfər qalacaq. Bu adam Cənnətə girən kimsələrin axırıncısı olacaq. O deyəcək: "Ey Rəbbim! Üzümü oddan döndər, çünki onun tüstüsü məni zəhərləmişdir, alovu da məni yandırıb-yaxmışdır!" Bu zat Allahın istədiyi qədər Allaha dua edəcək. Sonra Allah Təbarəkə və Təalə buyuracaq: "Bu istədiyini yerinə yetirsəm, başqa bir şey istəyəcəksənmi?" (Bu adam): "Səndən, bundan başqa heç nə istəməyəcəyəm"– deyəcək və Allaha istədiyi qədər and içib söz verəcək. Allah da onun üzünü oddan döndərəcək. Allah onun üzünü Cənnətə tərəf çevirdikdə o, (Cənnətin) gözəlliyini görüb Allahın istədiyi qədər susduqdan sonra: "Ey Rəbbim, məni Cənnətin qapısına yaxınlaşdır"– deyəcək. Allah ona belə buyuracaq: "Sənə verdiyimdən başqa Məndən heç nə istəməyəcəyinə dair and içib söz verməmişdinmi? Yazıq sənə, ey Adəm övladı! Sən necə də bivəfasan!" (O adam): "Ey Rəbbim!"– deyəcək və Allaha davamlı dua edəcək. Nəhayət, Allah ona buyuracaq: "Bu istədiyini sənə versəm, başqa bir şey istəyəcəksənmi?" O: "Sənin izzətinə and olsun ki, yox!"– deyəcək və Allaha istədiyi qədər and içib söz verəcək. Allah da onu Cənnətin qapısına yaxınlaşdıracaq. O, Cənnətin qapısına çatdığı, Cənnət (qapısı) onun üzünə açıldığı,

[1] Burada səcdə yerləri deyildikdə cəcdə əzaları – alın və burun, əllər, dizlər və qədəmlər qəsd edilir.

içindəki xeyir-bərəkəti və sevinci gördüyü zaman Allahın istədiyi qədər susacaq, sonra deyəcək: “Ey Rəbbim, məni Cənnətə daxil et!” Allah Təbarəkə və Təalə ona belə buyuracaq: “Sənə verdiyimdən başqa Məndən heç nə istəməyəcəyinə dair and içib söz verməmişdinmi? Vay sənin halına, ey Adəm oğlu, sən nə qədər vədinə xilaf çıxırsan!” (O): “Ey Rəbbim, qoy Sənin yaratdıqlarının ən bədbəxti mən olmayım!”– deyəcək və davamlı olaraq Rəbbinə dua edəcək. Axırda Allah Təbarəkə və Təalə ona güləcək. Allah ona güldüyü zaman: “Cənnətə gir!”– buyuracaq. O (adam) Cənnətə girdikdə, Allah ona: “(Nə diləyirsən,) dilə!”– buyuracaq. O da Rəbbindən (o qədər) diləyəcək və təmənna edəcək (ki, axırda heç bir diləyi qalmayacaq). Nəhayət, Allah: “Filan şeyi və filan şeyi də (dilə!” buyuraraq onun istəklərini) ona xatırladacaq. Artıq onun heç bir istəyi qalmadıqda Uca Allah buyuracaq: “Bu istədiklərin və bir o qədəri də sənindir”.

Əta ibn Yezid demişdir: “Əbu Hureyrə (bu hədisi rəvayət edərkən) Əbu Səid əl-Xudri onun yanında idi və Əbu Hureyrənin dediklərindən heç bir şeyi rədd etmirdi. Nəhayət, Əbu Hureyrə deyəndə ki: “Allah o adama: “Bu istədiklərin və bir o qədəri də sənindir”– deyə buyuracaq, Əbu Səid: “Bu istədiklərin və onun on misli”, ey Əbu Hureyrə!”– dedi. Əbu Hureyrə (ona belə) cavab verdi: “Mən Peyğəmbərin ﷺ: “Bu istədiklərin və bir o qədəri də sənindir”– dediyini yadda saxlamışam. Əbu Səid əl-Xudri dedi: “Mən şahidlik edirəm ki, onun: “Bu istədiklərin və onun on misli sənindir”– dediyini yadda saxlamışam.

Əbu Hureyrə dedi: “Bu adam Cənnətə girən kimsələrin axırıncısı olacaq”.

**[٤٥٢] ٣٠٠**–(...) حَدَّثَنَا عَبْدُ اللَّهِ بْنُ عَبْدِ الرَّحْمَنِ الدَّارِمِيُّ: أَخْبَرَنَا أَبُو الْيَمَانِ: أَخْبَرَنَا شُعَيْبٌ عَنْ الزُّهْرِيِّ قَالَ: أَخْبَرَنِي سَعِيدُ بْنُ الْمُسَيَّبِ وَعَطَاءُ بْنُ يَزِيدَ اللَّيْثِيُّ؛ أَنَّ أَبَا هُرَيْرَةَ أَخْبَرَهُمَا؛ أَنَّ النَّاسَ قَالُوا لِلنَّبِيِّ ﷺ: يَا رَسُولَ اللَّهِ! هَلْ نَرَى رَبَّنَا يَوْمَ الْقِيَامَةِ؟ وَسَاقَ الْحَدِيثَ بِمِثْلِ مَعْنَى حَدِيثِ إِبْرَاهِيمَ بْنِ سَعْدٍ.

**[452]-300-(...)** ........ Əbu Hureyrə ؓ: “Camaat Peyğəmbərdən ﷺ: “Ya Rəsulullah! Biz Qiyamət günü Rəbbimizi görəcəyikmi?”– deyə soruşdular...” dedi və hədisi İbrahim ibn Sədin hədisinə yaxın mənada rəvayət etdi.

**[٤٥٣] ٣٠١**–(...) و حَدَّثَنَا مُحَمَّدُ بْنُ رَافِعٍ: حَدَّثَنَا عَبْدُ الرَّزَّاقِ: أَخْبَرَنَا مَعْمَرٌ، عَنْ هَمَّامِ بْنِ مُنَبِّهٍ قَالَ: هَذَا مَا حَدَّثَنَا أَبُو هُرَيْرَةَ عَنْ رَسُولِ اللَّهِ ﷺ فَذَكَرَ أَحَادِيثَ، مِنْهَا: وَقَالَ رَسُولُ اللَّهِ ﷺ: ((إِنَّ أَدْنَى مَقْعَدِ

أَحَدِكُمْ مِنْ الْجَنَّةِ أَنْ يَقُولَ لَهُ: تَمَنَّ، فَيَتَمَنَّى وَيَتَمَنَّى، فَيَقُولُ لَهُ: هَلْ تَمَنَّيْتَ؟ فَيَقُولُ: نَعَمْ، فَيَقُولُ لَهُ: فَإِنَّ لَكَ مَا تَمَنَّيْتَ وَمِثْلَهُ مَعَهُ)).

**[453]-301-(...)** ........ Həmmam ibn Munəbbih: "Bu, Əbu Hureyrənin Peyğəmbərdən ﷺ bizə rəvayət etdikləridir"– demiş və bir çox hədislər zikr etmişdir. Onlardan biri budur: "Peyğəmbər ﷺ demişdir: "Hər hansı birinizin Cənnətdəki ən aşağı məqamı ona: "(Nə diləyirsən,) dilə!"– deyilməsidir. O da (istədiyini) diləyəcək. Sonra ona: "Dilədinmi?"– deyiləcək. O: "Bəli!"– deyə cavab verdikdə ona: "İstədiklərin və bir o qədəri də sənindir"– deyiləcək.

**[٤٥٤] ٣٠٢**–(١٨٣) و حَدَّثَنِي سُوَيْدُ بْنُ سَعِيدٍ قَالَ: حَدَّثَنِي حَفْصُ بْنُ مَيْسَرَةَ، عَنْ زَيْدِ بْنِ أَسْلَمَ، عَنْ عَطَاءِ بْنِ يَسَارٍ، عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ: أَنَّ نَاسًا فِي زَمَنِ رَسُولِ اللَّهِ ﷺ قَالُوا: يَا رَسُولَ اللَّهِ! هَلْ نَرَى رَبَّنَا يَوْمَ الْقِيَامَةِ؟ قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((نَعَمْ)). قَالَ: ((هَلْ تُضَارُّونَ فِي رُؤْيَةِ الشَّمْسِ بِالظَّهِيرَةِ صَحْوًا لَيْسَ مَعَهَا سَحَابٌ؟ وَهَلْ تُضَارُّونَ فِي رُؤْيَةِ الْقَمَرِ لَيْلَةَ الْبَدْرِ صَحْوًا لَيْسَ فِيهَا سَحَابٌ؟)) قَالُوا: لاَ، يَا رَسُولَ اللَّهِ! قَالَ: ((مَا تُضَارُّونَ فِي رُؤْيَةِ اللَّهِ تَبَارَكَ وَتَعَالَى يَوْمَ الْقِيَامَةِ إِلاَّ كَمَا تُضَارُّونَ فِي رُؤْيَةِ أَحَدِهِمَا، إِذَا كَانَ يَوْمُ الْقِيَامَةِ أَذَّنَ مُؤَذِّنٌ: لِيَتَّبِعْ كُلُّ أُمَّةٍ مَا كَانَتْ تَعْبُدُ: فَلاَ يَبْقَى أَحَدٌ كَانَ يَعْبُدُ غَيْرَ اللَّهِ سُبْحَانَهُ مِنْ الأَصْنَامِ وَالأَنْصَابِ، إِلاَّ يَتَسَاقَطُونَ فِي النَّارِ، حَتَّى إِذَا لَمْ يَبْقَ إِلاَّ مَنْ كَانَ يَعْبُدُ اللَّهَ مِنْ بَرٍّ وَفَاجِرٍ وَغُبَّرِ أَهْلِ الْكِتَابِ، فَيُدْعَى الْيَهُودُ، فَيُقَالُ لَهُمْ: مَا كُنْتُمْ تَعْبُدُونَ؟ قَالُوا: كُنَّا نَعْبُدُ عُزَيْرَ ابْنَ اللَّهِ، فَيُقَالُ: كَذَبْتُمْ، مَا اتَّخَذَ اللَّهُ مِنْ صَاحِبَةٍ وَلاَ وَلَدٍ، فَمَاذَا تَبْغُونَ؟ قَالُوا: عَطِشْنَا يَا رَبَّنَا فَاسْقِنَا، فَيُشَارُ إِلَيْهِمْ: أَلاَ تَرِدُونَ؟ فَيُحْشَرُونَ إِلَى النَّارِ كَأَنَّهَا سَرَابٌ يَحْطِمُ بَعْضُهَا بَعْضًا، فَيَتَسَاقَطُونَ فِي النَّارِ، ثُمَّ يُدْعَى النَّصَارَى، فَيُقَالُ لَهُمْ: مَا كُنْتُمْ تَعْبُدُونَ؟ قَالُوا: كُنَّا نَعْبُدُ الْمَسِيحَ ابْنَ اللَّهِ، فَيُقَالُ لَهُمْ: كَذَبْتُمْ، مَا اتَّخَذَ اللَّهُ مِنْ صَاحِبَةٍ وَلاَ وَلَدٍ، فَيُقَالُ لَهُمْ: مَاذَا تَبْغُونَ؟ فَيَقُولُونَ: عَطِشْنَا يَا رَبَّنَا فَاسْقِنَا، قَالَ: فَيُشَارُ إِلَيْهِمْ: أَلاَ تَرِدُونَ؟ فَيُحْشَرُونَ إِلَى جَهَنَّمَ كَأَنَّهَا سَرَابٌ يَحْطِمُ بَعْضُهَا بَعْضًا، فَيَتَسَاقَطُونَ فِي النَّارِ، حَتَّى إِذَا لَمْ يَبْقَ إِلاَّ مَنْ كَانَ يَعْبُدُ اللَّهَ تَعَالَى مِنْ بَرٍّ وَفَاجِرٍ، أَتَاهُمْ رَبُّ الْعَالَمِينَ سُبْحَانَهُ وَتَعَالَى فِي أَدْنَى صُورَةٍ مِنْ الَّتِي رَأَوْهُ فِيهَا، قَالَ: فَمَا تَنْتَظِرُونَ؟ تَتْبَعُ كُلُّ أُمَّةٍ مَا كَانَتْ تَعْبُدُ، قَالُوا: يَا رَبَّنَا! فَارَقْنَا النَّاسَ فِي الدُّنْيَا أَفْقَرَ مَا كُنَّا إِلَيْهِمْ وَلَمْ نُصَاحِبْهُمْ، فَيَقُولُ: أَنَا رَبُّكُمْ، فَيَقُولُونَ: نَعُوذُ بِاللَّهِ مِنْكَ، لاَ نُشْرِكُ بِاللَّهِ شَيْئًا – مَرَّتَيْنِ أَوْ ثَلاَثًا – حَتَّى إِنَّ بَعْضَهُمْ لَيَكَادُ أَنْ يَنْقَلِبَ، فَيَقُولُ: هَلْ بَيْنَكُمْ وَبَيْنَهُ آيَةٌ فَتَعْرِفُونَهُ بِهَا؟ فَيَقُولُونَ: نَعَمْ، فَيُكْشَفُ عَنْ سَاقٍ، فَلاَ يَبْقَى مَنْ كَانَ يَسْجُدُ لِلَّهِ مِنْ تِلْقَاءِ نَفْسِهِ إِلاَّ أَذِنَ اللَّهُ لَهُ بِالسُّجُودِ، وَلاَ يَبْقَى مَنْ كَانَ يَسْجُدُ اتِّقَاءً وَرِيَاءً إِلاَّ جَعَلَ اللَّهُ ظَهْرَهُ طَبَقَةً وَاحِدَةً، كُلَّمَا أَرَادَ أَنْ يَسْجُدَ خَرَّ عَلَى قَفَاهُ، ثُمَّ يَرْفَعُونَ رُءُوسَهُمْ، وَقَدْ تَحَوَّلَ فِي صُورَتِهِ الَّتِي رَأَوْهُ فِيهَا أَوَّلَ مَرَّةٍ. فَقَالَ: أَنَا رَبُّكُمْ، فَيَقُولُونَ:

أَنْتَ رَبُّنَا، ثُمَّ يُضْرَبُ الْجِسْرُ عَلَى جَهَنَّمَ، وَتَحِلُّ الشَّفَاعَةُ، وَيَقُولُونَ: اللَّهُمَّ! سَلِّمْ، سَلِّمْ، قِيلَ: يَا رَسُولَ اللَّهِ! وَمَا الْجِسْرُ؟ قَالَ: ((دَحْضٌ مَزِلَّةٌ، فِيهِ خَطَاطِيفُ وَكَلاَلِيبُ وَحَسَكٌ، تَكُونُ بِنَجْدٍ فِيهَا شُوَيْكَةٌ يُقَالُ لَهَا السَّعْدَانُ، فَيَمُرُّ الْمُؤْمِنُونَ كَطَرْفِ الْعَيْنِ وَكَالْبَرْقِ، وَكَالرِّيحِ وَكَالطَّيْرِ وَكَأَجَاوِيدِ الْخَيْلِ وَالرِّكَابِ، فَنَاجٍ مُسَلَّمٌ، وَمَخْدُوشٌ مُرْسَلٌ، وَمَكْدُوسٌ فِي نَارِ جَهَنَّمَ، حَتَّى إِذَا خَلَصَ الْمُؤْمِنُونَ مِنَ النَّارِ، فَوَالَّذِي نَفْسِي بِيَدِهِ! مَا مِنْكُمْ مِنْ أَحَدٍ بِأَشَدَّ مُنَاشَدَةً لِلَّهِ فِي اسْتِقْصَاءِ الْحَقِّ، مِنَ الْمُؤْمِنِينَ لِلَّهِ يَوْمَ الْقِيَامَةِ لإِخْوَانِهِمُ الَّذِينَ فِي النَّارِ يَقُولُونَ: رَبَّنَا كَانُوا يَصُومُونَ مَعَنَا وَيُصَلُّونَ وَيَحُجُّونَ، فَيُقَالُ لَهُمْ: أَخْرِجُوا مَنْ عَرَفْتُمْ – فَتُحَرَّمُ صُوَرُهُمْ عَلَى النَّارِ – فَيُخْرِجُونَ خَلْقًا كَثِيرًا قَدْ أَخَذَتْ النَّارُ إِلَى نِصْفِ سَاقَيْهِ وَإِلَى رُكْبَتَيْهِ. ثُمَّ يَقُولُونَ: رَبَّنَا! مَا بَقِيَ فِيهَا أَحَدٌ مِمَّنْ أَمَرْتَنَا بِهِ. فَيَقُولُ: ارْجِعُوا، فَمَنْ وَجَدْتُمْ فِي قَلْبِهِ مِثْقَالَ دِينَارٍ مِنْ خَيْرٍ فَأَخْرِجُوهُ، فَيُخْرِجُونَ خَلْقًا كَثِيرًا، ثُمَّ يَقُولُونَ: رَبَّنَا! لَمْ نَذَرْ فِيهَا أَحَدًا مِمَّنْ أَمَرْتَنَا بِهِ. ثُمَّ يَقُولُ: ارْجِعُوا، فَمَنْ وَجَدْتُمْ فِي قَلْبِهِ مِثْقَالَ نِصْفِ دِينَارٍ مِنْ خَيْرٍ فَأَخْرِجُوهُ، فَيُخْرِجُونَ خَلْقًا كَثِيرًا، ثُمَّ يَقُولُونَ: رَبَّنَا! لَمْ نَذَرْ فِيهَا مِمَّنْ أَمَرْتَنَا أَحَدًا، ثُمَّ يَقُولُ: ارْجِعُوا، فَمَنْ وَجَدْتُمْ فِي قَلْبِهِ مِثْقَالَ ذَرَّةٍ مِنْ خَيْرٍ فَأَخْرِجُوهُ، فَيُخْرِجُونَ خَلْقًا كَثِيرًا، ثُمَّ يَقُولُونَ: رَبَّنَا لَمْ نَذَرْ فِيهَا خَيْرًا)).

وَكَانَ أَبُو سَعِيدٍ الْخُدْرِيُّ يَقُولُ: إِنْ لَمْ تُصَدِّقُونِي بِهَذَا الْحَدِيثِ فَاقْرَءُوا إِنْ شِئْتُمْ: ﴿إِنَّ اللَّهَ لاَ يَظْلِمُ مِثْقَالَ ذَرَّةٍ وَإِنْ تَكُ حَسَنَةً يُضَاعِفْهَا وَيُؤْتِ مِنْ لَدُنْهُ أَجْرًا عَظِيمًا﴾.

فَيَقُولُ اللَّهُ عَزَّ وَجَلَّ: شَفَعَتْ الْمَلاَئِكَةُ وَشَفَعَ النَّبِيُّونَ وَشَفَعَ الْمُؤْمِنُونَ، وَلَمْ يَبْقَ إِلاَّ أَرْحَمُ الرَّاحِمِينَ، فَيَقْبِضُ قَبْضَةً مِنَ النَّارِ فَيُخْرِجُ مِنْهَا قَوْمًا لَمْ يَعْمَلُوا خَيْرًا قَطُّ، قَدْ عَادُوا حُمَمًا فَيُلْقِيهِمْ فِي نَهَرٍ فِي أَفْوَاهِ الْجَنَّةِ يُقَالُ لَهُ نَهَرُ الْحَيَاةِ، فَيَخْرُجُونَ كَمَا تَخْرُجُ الْحِبَّةُ فِي حَمِيلِ السَّيْلِ، أَلاَ تَرَوْنَهَا تَكُونُ إِلَى الْحَجَرِ أَوْ إِلَى الشَّجَرِ: مَا يَكُونُ إِلَى الشَّمْسِ أُصَيْفِرُ وَأُخَيْضِرُ، وَمَا يَكُونُ مِنْهَا إِلَى الظِّلِّ يَكُونُ أَبْيَضَ؟)) فَقَالُوا: يَا رَسُولَ اللَّهِ! كَأَنَّكَ كُنْتَ تَرْعَى بِالْبَادِيَةِ، قَالَ: ((فَيَخْرُجُونَ كَاللُّؤْلُؤِ فِي رِقَابِهِمُ الْخَوَاتِمُ، يَعْرِفُهُمْ أَهْلُ الْجَنَّةِ، هَؤُلاَءِ عُتَقَاءُ اللَّهِ الَّذِينَ أَدْخَلَهُمُ اللَّهُ الْجَنَّةَ بِغَيْرِ عَمَلٍ عَمِلُوهُ وَلاَ خَيْرٍ قَدَّمُوهُ، ثُمَّ يَقُولُ: ادْخُلُوا الْجَنَّةَ فَمَا رَأَيْتُمُوهُ فَهُوَ لَكُمْ، فَيَقُولُونَ: رَبَّنَا أَعْطَيْتَنَا مَا لَمْ تُعْطِ أَحَدًا مِنَ الْعَالَمِينَ، فَيَقُولُ: لَكُمْ عِنْدِي أَفْضَلُ مِنْ هَذَا، فَيَقُولُونَ: يَا رَبَّنَا! أَيُّ شَيْءٍ أَفْضَلُ مِنْ هَذَا؟ فَيَقُولُ: رِضَايَ، فَلاَ أَسْخَطُ عَلَيْكُمْ بَعْدَهُ أَبَدًا)).

**[454]-302-(183)** ........ Əbu Səid əl-Xudri ﷺ rəvayət etmişdir ki, Peyğəmbərin ﷺ dövründə bir dəstə adam (Peyğəmbərə ﷺ) dedi: “Ya Rəsulullah! Biz Qiyamət günü Rəbbimizi görə biləcəyikmi?” Peyğəmbər ﷺ buyurdu: “Bəli! Məgər siz günortaüstü, gün işığının qabağını bulud örtmədiyi bir vaxtda günəşi (görmək üçün basabas salıb) bir-birinizə əziyyət verirsinizmi?! On dördüncü

gecədə, ay işığının qabağını bulud örtmədiyi bir vaxtda ayı (görmək üçün) bir-birinizə əziyyət verirsinizmi?!" Onlar: "Xeyr, ya Rəsulullah!"– dedilər. Peyğəmbər ﷺ buyurdu: "Bu ikisindən birini görməyə sizə heç bir şey mane olmadığı kimi, Allah Təbarəkə və Təaləni də Qiyamət günü beləcə görəcəksiniz. Qiyamət günü yetişdiyi zaman carçı səsləyib deyəcək: "Hər bir ümmət nəyə ibadət edirdisə, qoy onun ardınca getsin!" Bundan sonra Allahdan qeyrisinə – bütlərə və dikinə qoyulmuş daşlara ibadət edən elə bir kimsə qalmayacaq ki, Cəhənnəm oduna düşməsin. Axırda isə yalnız Allaha ibadət edənlər – xeyirxah, yaxud günahkar adamlar – habelə Kitab əhlindən (öz peyğəmbərlərinə) sadiq olmuş kimsələr qalacaqdır. (O vaxt) yəhudilər çağırılacaq və onlardan soruşulacaq ki: "Siz nəyə ibadət edirdiniz?" Onlar deyəcəklər: "Biz Allahın oğlu Üzeyirə ibadət edirdik".[1] Onlara deyiləcək: "Yalan danışırsınız! Allah Özünə nə zövcə, nə də övlad götürmüşdür. (Bir deyin görək) siz nə istəyirsiniz?" Onlar deyəcəklər: "Susamışıq, ey Rəbbimiz, bizə su ver." Onda onlara (Cəhənnəm) göstəriləcək (və deyiləcək): "(Bundan) içmək istəmirsinizmi?" Onlar ilğıma bənzər, alovlanan atəşin (kənarına) toplanacaq və bir-birilərini tapdayaraq Cəhənnəmə düşəcəklər. Sonra nəsranilər çağırılacaq və onlardan soruşulacaq: "Siz nəyə ibadət edirdiniz?" Onlar deyəcəklər: "Biz Allahın oğlu Məsihə[2] ibadət edirdik." Onlara deyiləcək: "Yalan danışırsınız! Allah Özünə nə zövcə, nə də övlad götürmüşdür". Sonra onlardan: "Siz nə istəyirsiniz?"– deyə soruşulacaq. Onlar: "Susamışıq, ey Rəbbimiz, bizə su ver"– deyə cavab verəcəklər. Onda onlara (Cəhənnəm) göstəriləcək (və deyiləcək): "(Bundan) içmək istəmirsinizmi?" Onlar ilğıma bənzər, alovlanan atəşin (kənarına) toplanacaq və bir-birilərini tapdayaraq Cəhənnəmə düşəcəklər. Nəhayət, ancaq Allaha ibadət edən kimsələr – xeyirxah, yaxud günahkar adamlar qaldıqda aləmlərin Rəbbi Subhanəhu və Təalə onların yanına Onu gördükləri ən yaxın surətdə[3] gələcək və belə buyuracaq: "Nə gözləyirsiniz?! Qoy hər bir ümmət ibadət etdiyi (məbudun) ardınca getsin!" Onlar deyəcəklər: "Biz dünyada ikən insan-

---

[1] Uca Allah buyurur: **"Yəhudilər: "Üzeyr Allahın oğludur"– dedilər. Xaçpərəstlər də: "Məsih Allahın oğludur"– dedilər. Bu onların ağızlarından çıxan sözlərdir.** ***Bu,*** **daha əvvəlki kafirlərin sözlərinə oxşayır. Allah onları məhv etsin! Gör necə də** ***haqdan*** **döndərilirlər!"** ("ət-Tovbə" surəsi, 30).

[2] Burada Məryəm oğlu İsa ﷺ nəzərdə tutulur.

[3] Yəni Allahın isim və sifətlərinə dair Quran və Sünnədə varid olan dəlillərdən bildikləri vəsflərə uyğun surətdə gələcək.

lara ehtiyacımız ola-ola onlardan ayrıldıq, əsla onlarla birlikdə olmadıq".[1] Onda Allah buyuracaq: "Mən sizin Rəbbinizəm!" Onlar: "Səndən Allaha sığınırıq!" (və iki, yaxud üç dəfə): "Biz heç nəyi Allaha şərik qoşmuruq!"– deyəcəklər. Hətta bəziləri (imtahanın çətinliyi üzündən həqiqətdən) üz döndərmək istəyəcək. O buyuracaq: "Sizinlə Onun arasında bir əlamət varmı ki, bunun sayəsində Onu tanıya biləsiniz?" Onlar: "Bəli!"– deyə cavab verəcəklər. Bu vaxt Ayaq[2] açılacaq və səmimi qəlbdən Allaha səcdə etmiş elə bir kəs qalmayacaq

---

[1] O möminlər dünyada ikən Allaha itaət edir, onun buyuruqlarını yerinə yetirir və qadağan etdiyi şeylərdən çəkinirdilər, üstəlik qohum-əqrəbalarından, habelə digər yaxın adamlarından Allaha asi olan kimsələri sevmirdilər, onlara ehtiyacları olsa da belə, onlara yaxınlıq vermirdilər. Uca Allah Quranda onları belə vəsf edir: **"Allaha və Axirət gününə iman gətirən elə bir camaat tapa bilməzsən ki, onlar Allaha və Onun Elçisinə düşmən olanlarla – öz ataları, oğulları, qardaşları, qohum-əqrəbaları olsalar belə – dostluq etsinlər. Allah onların qəlbinə iman salmış və onları Öz tərəfindən bir ruhla dəstəkləmişdir. *Allah* onları *ağacları* altından çaylar axan Cənnət bağlarına daxil edəcəkdir. Onlar orada əbədi qalacaqlar. Allah onlardan razıdır, onlar da Allahdan razıdırlar. Onlar Allahın firqəsidir. Həqiqətən, məhz Allahın firqəsi nicat tapanlardır"** ("əl-Mucadilə" surəsi, 22).

[2] "Səhih əl-Buxari" əsərində rəvayət edilir ki, Əbu Səid əl-Xudri ﷺ demişdir: "Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: "(Qiyamət günü) Rəbbimiz Ayağını açacaq, hər bir mömin kişi və mömin qadın da Allaha səcdə edəcəkdir. Qalanları isə dünyada ikən riyakarlıqla, şan-şöhrət üçün səcdə edən münafiqlər olacaqdır. (Həmin gün münafiqlərdən hər biri səcdə) etmək istəyəcək, (lakin bacarmayacaqdır). Onların onurğa sümüyü bir bütöv sümük olacaqdır" (4919).

Əhməd ibn Həlim ﷺ demişdir: "Allahın sifətləri ilə bağlı Quranda keçən ayələrin heç birinin mənasına dair səhabələr ixtilaf etməmişlər. Mən, səhabələrdən nəql edilmiş təfsirlərə və onların bu xüsusda rəvayət etdiyi hədislərə nəzər saldım, Uca Allahın istədiyi qədər, yüzdən çox böyük və kiçik təfsir kitablarını araşdırdım, lakin bu günədək səhabələrdən heç birinin Allahın sifətlərinə aid ayə və hədisləri yanlış mənaya yozduğuna rast gəlmədim. Əksinə, onların hamısının bu xüsusda yekdil fikirdə olduğunu və batil əqidədə olan kimsələrin azğın fikirlərini bəyan etdiyini gördüm. Yalnız bir ayədən başqa. Həmin ayədə Uca Allah buyurur: **"Ayaq açılacağı gün..."** ("əl-Qələm" surəsi, 42). İbn Abbasdan ﷺ və bəzi təfsirçilərdən rəvayət edilmişdir ki, ayədə keçən "ayaq" kəlməsi şiddət və çətinlik deməkdir. Yəni Allah Subhanəhu və Təalə Axirət günü şiddət və çətinliyi aradan qaldıracaq. Əbu Səid əl-Xudri ﷺ və digərləri bunun həqiqi mənada Ayaq olduğunu demişlər" ("Məcmuə Fətavə", 22/99-100).

Muhəmməd ibn Saleh ﷺ demişdir: **"Ayağın açılacağı və onlar səcdəyə çağırılacaqları, lakin *buna* qadir ola bilməyəcəkləri gün..."** ayəsindəki ayaq kəlməsi izafə edilmiş olmasa da, bu kəlmə Allaha aid edilə bilər. Səhabələrin və onlardan sonra gələnlərin təfsirlərinə əsasən, burada hər iki məna (yəni həm həqiqi Ayaq, həm də şiddət) qəsd edilə bilər. Lakin birinci məna Əbu Səidin ﷺ rəvayətində öz əksini tapmışdır. Və məlumdur ki, hədis ayəni təfsir edir. ("Şərh əl-Əqidə əs-Səffariniyyə", 1/197).

Muhəmməd Nasirəddin əl-Albani ﷺ demişdir: "Əbu Səid əl-Xudrinin ﷺ rəvayətindən açıq-aydın görünür ki, burada "ayaq" deyildikdə Allah Təbarəkə və Təalənin Ayağı nəzərdə tutulur. Üstəlik Hakimin Əbu Səiddən ﷺ rəvayət etdiyi hədisdə deyilir: "Allah buyuracaq: "Mən sizin Rəbbinizəm!" Onlar: "Səndən Allaha sığınırıq!"– deyəcəklər. Allah buyuracaq: "Sizinlə Onun arasında bir əlamət varmı ki, bunun sayəsində onu tanıya biləsiniz?" Onlar: "Bəli, Ayaqdır"– deyə cavab verəcəklər. Bu vaxt Ayaq açılacaq və onların hamısı səcdəyə qapanacaqlar..." ("əl-Mustədrək", 8736; "Silsilətul-Əhadis əs-Səhihə", 2/82).

ki, Allah ona səcdə etməyə izin verməsin. Həmçinin (insanlardan) qorunmaq məqsədilə və ya riyakarlıqla səcdə etmiş elə bir kəs qalmayacaq ki, Allah onun onurğa sümüyünü bir bütöv sümük etməsin. Beləsi hər dəfə səcdə etmək istədikdə, (əksinə,) qafası üstə düşəcək. Sonra (möminlər) başlarını (səcdədən) qaldıracaqlar. (Allah) ilk dəfə gördükləri surəti dəyişmiş olduğu halda (onlara): "Mən sizin Rəbbinizəm"– deyə buyuracaq. Onlar da: "(Bəli,) Sən bizim Rəbbimizsən!"– deyəcklər.[1] Bundan sonra Cəhənnəmin üzərində körpü qurulacaq və şəfaət etməyə izin veriləcəkdir. (Həmin vaxt peyğəmbərlər): "Allahım, xilas et, xilas et!"– deyəcəklər.

(Peyğəmbərdən ﷺ) soruşdular: "Yə Rəsulullah! Nə körpüdür elə?" Dedi: "Sürüşkən və hamar bir şeydir. Orada çəngəllər, qarmaqlar və dəmir tikanlar vardır. Bunlar Nəcddə[2] bitən, (üstü) tikanla (dolu), sadan deyilən bir bitkiyə (bənzəyir). Möminlərdən – (kimisi) bir göz qırpımında, (kimisi) şimşək tək, (kimisi) külək kimi, (kimisi) quş kimi, (kimisi də) ən bərk qaçan cins at və ya dəvə kimi (sürətlə həmin körpünün üstündən) keçəcək. (Kimisi) sağ-salamat qurtulacaq. Kimisi (tikanlara ilişib) didik-didik ediləcək, lakin axırda xilas olacaq. Bəziləri də Cəhənnəm odunda qalaqlanacaqlar.

Nəhayət, möminlər oddan xilas olduqları zaman – canım Əlində olan *Allaha* and olsun ki – sizlərdən heç kəsin, haqqı araşdırmaq xüsusunda Allaha yalvarıb-yaxarması, Qiyamət günü möminlərdən Cəhənnəmə düşmüş qardaşları üçün Allaha yalvarması qədər şiddətli ola bilməz.[3]

Onlar: "Ey Rəbbimiz! (Bu zavallılar) bizimlə bərabər oruc tutar, namaz qılar və həcc ziyarətini yerinə yetirərdilər"– deyəcəklər. Onda onlara: "Tanıdığınız kimsələri (oddan) çıxardın, onların vücudu Cəhənnəm oduna haram edilir!"– deyiləcək. Beləliklə, onlar, ayağının yarısına qədər, habelə dizinə qədər atəşə giriftar olmuş bir çox insanları (oradan) çıxaracaqlar. Sonra deyəcəklər: "Ey Rəbbimiz! Bizə əmr etdiyin kimsələrdən Cəhənnəmdə heç kəs qalmadı". Onda Allah buyuracaq: "Geri qayıdın, qəlbində dinar ağırlığında iman

---

[1] Bu hədislərdən güman edilə bilər ki, münafiqlər də möminlərlə bərabər Uca Allahı görəcəklər. Lakin bu fikir batil və əsassız bir fikirdir. Peyğəmbərin ﷺ: "Axırda bu ümmət, içində olan münafiqlərilə birlikdə qalacaqdır" sözü münafiqlərin Allahı görəcəklərinə dəlalət etmir. Əksinə, Quran və Sünnədə varid olmuş dəlillərə əsasən, möminlərdən başqa heç kəs Allahı görməyəcəkdir.

[2] 100-cü hədisin qeydlərinə bax.

[3] Yəni biriniz bu dünyada haqqı tapmaq və haqq yolu tutub getmək üçün Allaha nə qədər çox yalvarırsa, Qiyamət günü möminlər öz qardaşlarını Cəhənnəm odundan qurtarmaq üçün Allaha daha əzmlə yalvaracaqlar.

olan (hər) kəsi (oradan) çıxarın!" Onlar yenə bir çoxlarını (oddan) çıxaracaqlar. Sonra deyəcəklər: "Ey Rəbbimiz! Bizə əmr etdiyin kimsələrdən heç kəsi Cəhənnəmdə buraxmadıq, (hamısını çıxartdıq)". Allah buyuracaq: "Geri dönün, qəlbində yarım dinar ağırlığında iman olan bir kimsə tapsanız, onu da (oradan) çıxarın!" Onlar yenə bir çoxlarını (oradan) çıxaracaqlar. Sonra deyəcəklər: "Ey Rəbbimiz! Bizə əmr etdiyin kimsələrdən heç kəsi orada buraxmadıq". Allah buyuracaq: "Geri dönün, qəlbində zərrə ağırlığında iman olan bir kimsə tapsanız, onu da (oradan) çıxarın!" Onlar yenə bir çoxlarını (oradan) çıxaracaqlar. Sonra deyəcəklər: "Ey Rəbbimiz! Biz orada bir nəfər xeyirxah adam qoymadıq".

Əbu Səid əl-Xudri deyərdi: "Mənim danışdığım bu hədisə inanmırsınızsa, (bu ayəni) oxuyun: **"Həqiqətən, Allah zərrə qədər də olsa zülm etməz. Əgər *qulun gördüyü iş* yaxşı əməl olarsa, *Allah* bunu artırar və Öz tərəfindən *ona* böyük mükafat verər".**[1]

Bundan sonra İzzətli və Qüdrətli Allah: "Mələklər şəfaət etdilər, peyğəmbərlər şəfaət etdilər, möminlər şəfaət etdilər.[2] (Şəfaət etməyən) bircə rəhmli-

---

[1] "ən-Nisa" surəsi, 40.

[2] Şəfaət: birisinin mənfəət əldə etməsi və ya ziyana düşməməsi üçün (onunla başqa birisinin arasında) vasitəçilik etmək deməkdir.

Birincisinə – yəni mənfəət əldə etməyə, Cənnət əhlinin Cənnətə daxil olmasında Peyğəmbərimizin ﷺ onlar üçün şəfaət etməsini misal çəkmək olar.

İkincinə – yəni zərəri dəf etməyə isə, Cəhənnəmə girənlərin oradan çıxarılmasında Peyğəmbərimizin ﷺ onlar üçün şəfaət etməsini misal çəkmək olar.

Demək, şəfaət, ya xeyir əldə etmək, ya da zərəri dəf etmək üçün edilir...

Onu da qeyd etmək lazımdır ki, şəfaət iki qismə bölünür:

a) Şəriətə uyğun şəfaət; b) Şirk sayılan şəfaət.

Şəriətə uyğun şəfaət yalnız üç şərtlə gerçəkləşə bilər:

1. Allahın şəfaət edən kimsədən razı qalması;
2. Allahın şəfaət edilən kimsədən razı qalması;
3. Və Allahın şəfaət etməyə izin verməsi ilə.

Bu şərtlərə aşağıdakı ayələri dəlil göstərmək olar:

– **"Onlar yalnız Allahın razı qaldığı şəxslərdən ötrü şəfaət diləyir və Onun qorxusundan tir-tir əsirlər"** ("əl-Ənbiya" surəsi, 28).

– **"Göylərdə neçə-neçə mələklər vardır ki, onların şəfaəti Allahın istədiyi və Özünün razı qaldığı kimsələrdən başqa, *heç kəsə* heç bir fayda verməz"** (ən-Nəcm, 26); **"O gün Mərhəmətli *Allahın* izin verdiyi və söz deməsinə razı olduğu şəxslərdən başqa, heç kimin şəfaəti fayda verməyəcəkdir"** ("Ta ha" surəsi, 109).

– **"Onun izni olmadan Onun yanında kim havadarlıq edə bilər?"** ("əl-Bəqərə" surəsi, 255).

Şirk sayılan şəfaətə gəlincə, bu, müşriklərin öz tanrılarını Allaha yaxınlaşmaq üçün vasitə tutmasıdır. Onlar iddia edirlər ki, guya tanrılardan yox, məhz Allahdan xeyir umurlar və onlardan sadəcə şəfaət etmələrini diləyirlər....

Şəriətə uyğun şəfaət iki qismə bölünür – ümumi və xüsusi.

Xüsusi şəfaət Peyğəmbərimizə ﷺ xas olan şəfaətdir. Bunun özü də üç qismə bölünür:

lərin Rəhmlisi qaldı"– deyə buyuracaq. Sonra da heç vaxt yaxşılıq etməmiş, (odda) yanıb kömürə dönmüş bir toplumu ovuclayıb Cəhənnəmdən çıxaracaq və onları Cənnətin yollarında axan, Həyat çayı deyilən bir çaya atacaq. Beləliklə, onlar selin gətirdiyi toxumun cücərib yetişdiyi kimi diriləcəklər. Məgər (o, yabanı toxumların) istər daşın, istərsə də ağacın dibində necə cücərdiyini görmürsünüz?! Günəş (şüaları) altında qalanı sarı və yaşıl, kölgədə qalanı isə ağ olur". (Səhabələrdən bəziləri) dedilər: "Ya Rəsulullah! Sən sanki səhrada çobanlıq etmisən".

(Peyğəmbər ﷺ davam edib) dedi: "Onlar boyunlarında (gözoxşayan) halqalar olduğu halda, özləri də mirvari tək gözəl görkəmdə (Həyat çayından) çıxacaqlar. Cənnət əhli onları tanıyacaq (və deyəcək ki): "Nə bir (yaxşı) əməli, nə də özləri üçün əvvəlcədən tədarük gördükləri xeyirləri olmadığı halda, Allahın Cənnətə daxil etdiyi, azadlığa buraxdığı kimsələr bunlardır!" Sonra Allah (onlara) belə buyuracaq: "Cənnətə girin! Gözünüzün gördüyü hər nə varsa, sizindir". Onlar deyəcəklər: "Ey Rəbbimiz! Sən aləmlərdən heç kəsə verməmədiyin nemətləri bizə verdin!" Allah buyuracaq: "Sizə bundan da üstün olanını hazırlamışam!" Onlar deyəcəklər: "Ey Rəbbimiz! Bundan üstün nə ola bilər ki?" Allah buyuracaq: "Mənim rizam! Artıq bundan sonra Mənim sizə heç vaxt qəzəbim tutmayacaq".

---

1. Məhşər günü onun yanına gələn insanlar üçün edəcəyi ən böyük şəfaət. (478, 479, 480 və 482 saylı hədislərə bax). Uca Allah buyurur: **"Ola bilsin ki, *buna görə* Rəbbin səni tərifəlayiq bir məqama yüksəltsin"** ("əl-İsra" surəsi, 79);

2. Cənnət əhlinin Cənnətə daxil olması üçün şəfaət etməsi. (486-cı hədisə bax);

3. Əmisi Əbu Talibin əzabının yüngülləşdirilməsi üçün şəfaət etməsi. (510, 511 və 513 saylı hədislərə bax).

Ümumi şəfaətə gəldikdə isə, bu, Peyğəmbərimizə ﷺ və digər peyğəmbərlərə, habelə mələklərə və möminlərə aid olan şəfaətdir. O da həmçinin üç qismə bölünür:

1. Cəhənnəmə layiq olanların Cəhənnəmə girməməsi üçün şəfaət etmək; Peyğəmbər ﷺ demişdir: "Vəfat etdikdən sonra cənazəsinin başında, Allaha heç bir şeyi şərik qoşmayan qırx kişi durmuş elə bir müsəlman yoxdur ki, Allah onların şəfaəti sayəsində o müsəlmana mərhəmət etməsin" ("Səhih Muslim", 2242).

2. Cəhənnəmə giriftar olanların oradan çıxması üçün şəfaət etmək; (457 və 459 saylı hədislərə bax.)

3. Cənnət əhlinin Cənnətdəki dərəcələrinin artması üçün şəfaət etmək; Peyğəmbər demişdir: "Allahım! Əbu Sələməni bağışla, doğru yolda olanlar arasında onun dərəcəsini yüksəlt, geridə qalanlara (onun yaxınlarına) vəkil ol! Ey aləmlərin Rəbbi! Bizi də, onu da bağışla! Onun qəbrini geniş et və oranı onun üçün nurlandır!" "Səhih Muslim", 2169. ("Şərh Əqidətu əs-Səffariniyyə", 1/389-392; "Şərh Lumatul-İtiqad", 1/36; "əl-Qovl əl-Mufid", 1/333).

**[٤٥٥] قَالَ مُسْلِم:** قَرَأْتُ عَلَى عِيسَى بْنِ حَمَّادٍ زُغْبَةَ الْمِصْرِيِّ هَذَا الْحَدِيثَ فِي الشَّفَاعَةِ وَقُلْتُ لَهُ: أُحَدِّثُ بِهَذَا الْحَدِيثِ عَنْكَ أَنَّكَ سَمِعْتَ مِنَ اللَّيْثِ بْنِ سَعْدٍ؟ فَقَالَ: نَعَمْ، قُلْتُ لِعِيسَى بْنِ حَمَّادٍ: أَخْبَرَكُمُ اللَّيْثُ بْنُ سَعْدٍ، عَنْ خَالِدِ بْنِ يَزِيدَ، عَنْ سَعِيدِ بْنِ أَبِي هِلاَلٍ، عَنْ زَيْدِ بْنِ أَسْلَمَ، عَنْ عَطَاءِ بْنِ يَسَارٍ، عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ أَنَّهُ قَالَ: قُلْنَا: يَا رَسُولَ اللَّهِ! أَنَرَى رَبَّنَا؟ قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((هَلْ تُضَارُّونَ فِي رُؤْيَةِ الشَّمْسِ إِذَا كَانَ يَوْمٌ صَحْوٌ؟)) قُلْنَا: لاَ، وَسُقْتُ الْحَدِيثَ حَتَّى انْقَضَى آخِرُهُ وَهُوَ نَحْوُ حَدِيثِ حَفْصِ بْنِ مَيْسَرَةَ، وَزَادَ بَعْدَ قَوْلِهِ: بِغَيْرِ عَمَلٍ عَمِلُوهُ وَلاَ قَدَمٍ قَدَّمُوهُ ((فَيُقَالُ لَهُمْ: لَكُمْ مَا رَأَيْتُمْ وَمِثْلُهُ مَعَهُ)).

قَالَ أَبُو سَعِيدٍ الْخُدْرِيُّ: بَلَغَنِي أَنَّ الْجِسْرَ أَدَقُّ مِنْ الشَّعْرَةِ وَأَحَدُّ مِنْ السَّيْفِ.

وَلَيْسَ فِي حَدِيثِ اللَّيْثِ ((فَيَقُولُونَ: رَبَّنَا! أَعْطَيْتَنَا مَا لَمْ تُعْطِ أَحَدًا مِنْ الْعَالَمِينَ وَمَا بَعْدَهُ)).

فَأَقَرَّ بِهِ عِيسَى بْنُ حَمَّادٍ.

**[455] Muslim demişdir:** "Mən şəfaət barəsində olan bu hədisi, İsa ibn Həmmad Zuğbə əl-Misrinin yanında oxudum və ondan: "Bu hədisi sənin adından rəvayət edirəm, (de görək,) sən bu hədisi Leys ibn Səddən eşitmisənmi?" O: "Bəli!"– dedi. Mən İsa ibn Həmmada dedim: "Sizə Leys ibn Səd, Xalid ibn Yeziddən, o da Səid ibn Əbu Hilaldan, o da Zeyd ibn Əsləmdən, o da Əta ibn Yəsardan, o da Əbu Səid əl-Xudridən belə rəvayət etmişdir: "Əbu Səid əl-Xudri demişdir: "Biz soruşduq: "Ya Rəsulullah! Biz Rəbbimizi görə biləcəyikmi?" Peyğəmbər ﷺ buyurdu: "Məgər siz gün işığının qabağını bulud örtmədiyi bir vaxtda günəşi (görmək üçün basabas salıb) bir-birinizə əziyyət verirsinizmi?" Biz: "Xeyr"– deyə cavab verdik..." Beləcə mən bu hədisi axıra qədər rəvayət etdim. Bu da Həfs ibn Meysərənin hədisi kimidir. Fəqət: "Nə bir (yaxşı) əməli, nə də özləri üçün əvvəlcədən tədarük gördükləri xeyirləri olmadığı halda..." sözündən sonra bunu əlavə etmişdir: "Onlara: "Gördükləriniz və bir o qədəri də sizindir"– deyiləcək".

Əbu Səid əl-Xudri demişdir: "O körpünün tükdən nazik və qılıncdan iti olduğu mənə xəbər verilmişdir".

Leysin hədisində: "Ey Rəbbimiz! Sən aləmlərdən heç kəsə vermədiyin nemətləri bizə verdin!" kəlməsi və sonrası rəvayət edilməmişdir. Bunu İsa ibn Həmmad da təsdiq etmişdir.

**[٤٥٦] ٣٠٣**–(...) و حَدَّثَنَاه أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا جَعْفَرُ بْنُ عَوْنٍ: حَدَّثَنَا هِشَامُ بْنُ سَعْدٍ: حَدَّثَنَا زَيْدُ بْنُ أَسْلَمَ بِإِسْنَادِهِمَا، نَحْوَ حَدِيثِ حَفْصِ بْنِ مَيْسَرَةَ إِلَى آخِرِهِ، وَقَدْ زَادَ وَنَقَصَ شَيْئًا.

**[456]-303-(...)** ........ Zeyd ibn Əsləm bu hədisi – Həfs ibn Meysərənin və Səd ibn Hilalın rəvayət etdiyi isnadlarla – Həfs ibn Meysərənin rəvayət etdiyi hədisin bənzərini axıra kimi rəvayət etmişdir. Onun (bu hədisdə) əlavə etdiyi və əskiltdiyi bəzi şeylər vardır.

## (٨٢) – بَابُ إِثْبَاتِ الشَّفَاعَةِ وَإِخْرَاجِ الْمُوَحِّدِينَ مِنْ النَّارِ

## 82-ci fəsil. Şəfaət etməyin isbatı və tövhid[1] əhlinin Cəhənnəm odundan çıxarılması

**[٤٥٧] ٣٠٤**–(١٨٤) و حَدَّثَنِي هَارُونُ بْنُ سَعِيدٍ الأَيْلِيُّ: حَدَّثَنَا ابْنُ وَهْبٍ قَالَ: أَخْبَرَنِي مَالِكُ بْنُ أَنَسٍ عَنْ عَمْرِو بْنِ يَحْيَى بْنِ عُمَارَةَ قَالَ: حَدَّثَنِي أَبِي عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ: أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: ((يُدْخِلُ اللَّهُ أَهْلَ الْجَنَّةِ الْجَنَّةَ، يُدْخِلُ مَنْ يَشَاءُ بِرَحْمَتِهِ، وَيُدْخِلُ أَهْلَ النَّارِ النَّارَ، ثُمَّ يَقُولُ: انْظُرُوا مَنْ وَجَدْتُمْ فِي قَلْبِهِ مِثْقَالَ حَبَّةٍ مِنْ خَرْدَلٍ مِنْ إِيمَانٍ فَأَخْرِجُوهُ، فَيُخْرَجُونَ مِنْهَا حُمَمًا قَدْ امْتَحَشُوا، فَيُلْقَوْنَ فِي نَهَرِ الْحَيَاةِ، أَوْ الْحَيَا فَيَنْبُتُونَ فِيهِ كَمَا تَنْبُتُ الْحِبَّةُ إِلَى جَانِبِ السَّيْلِ، أَلَمْ تَرَوْهَا كَيْفَ تَخْرُجُ صَفْرَاءَ مُلْتَوِيَةً؟)).

**[457]-304-(184)** ........ Əbu Səid əl-Xudri ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Allah Cənnət əhlini Cənnətə salacaq, dilədiyi kimsələri Öz rəhməti ilə Cənnətə daxil edəcək, Cəhənnəm əhlini də Cəhənnəmə daxil edəcək, sonra da belə buyuracaq: "Baxın, qəlbində xardal dənəsi ağırlığında imanı olan hər kəsi (Cəhənnəmdən) çıxarın!" Beləcə, onlar oradan kömür kimi yanmış halda çıxarılıb Həyat çayına, yaxud Həya çayına atılacaq və selin kənarında qalan yabanı toxumlar cücərdiyi kimi cücərəcəklər. Məgər (torpağın üstünə) çıxan sapsarı, əyilmiş cücərtiləri görmədinizmi?"

**[٤٥٨] ٣٠٥**–(...) و حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا عَفَّانُ حَدَّثَنَا وُهَيْبٌ؛ ح: و حَدَّثَنَا حَجَّاجُ بْنُ الشَّاعِرِ: حَدَّثَنَا عَمْرُو بْنُ عَوْنٍ: أَخْبَرَنَا خَالِدٌ، كِلَاهُمَا عَنْ عَمْرِو بْنِ يَحْيَى بِهَذَا الإِسْنَادِ، وَقَالَا: ((فَيُلْقَوْنَ فِي نَهَرٍ يُقَالُ لَهُ الْحَيَاةُ))، وَلَمْ يَشُكَّا. وَفِي حَدِيثِ خَالِدٍ: كَمَا تَنْبُتُ الْغُثَاءَةُ فِي جَانِبِ السَّيْلِ، وَفِي حَدِيثِ وُهَيْبٍ: كَمَا تَنْبُتُ الْحِبَّةُ فِي حَمِئَةٍ أَوْ حَمِيلَةِ السَّيْلِ.

**[458]-305-(...)** ........ Vuheyb və Xalid – hər ikisi (bu hədisi) Amr ibn Yəhyadan bu isnadla: "Onlar Həyat deyilən bir çaya atılacaqlar"– deyə rəvayət et-

[1] 132-ci hədisin qeydlərinə bax.

dilər və şəkk etmədilər. Xalidin hədisində deyilir: "Sel kənarında selin gətirdiyi toxumlar bitdiyi kimi". Vuheybin hədisində isə deyilir: "Selin kənarındakı palçıq içində, yaxud selin gətirdiyi çör-çöp içində yabanı toxumların bitdiyi kimi".

**[٤٥٩] ٣٠٦**–(١٨٥) و حَدَّثَنِي نَصْرُ بْنُ عَلِيٍّ الْجَهْضَمِيُّ: حَدَّثَنَا بِشْرٌ يَعْنِي ابْنَ الْمُفَضَّلِ عَنْ أَبِي مَسْلَمَةَ، عَنْ أَبِي نَضْرَةَ، عَنْ أَبِي سَعِيدٍ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((أَمَّا أَهْلُ النَّارِ الَّذِينَ هُمْ أَهْلُهَا، فَإِنَّهُمْ لاَ يَمُوتُونَ فِيهَا وَلاَ يَحْيَوْنَ، وَلَكِنْ نَاسٌ أَصَابَتْهُمُ النَّارُ بِذُنُوبِهِمْ – أَوْ قَالَ بِخَطَايَاهُمْ – فَأَمَاتَهُمُ اللهُ تَعَالَى إِمَاتَةً، حَتَّى إِذَا كَانُوا فَحْمًا أُذِنَ بِالشَّفَاعَةِ، فَجِيءَ بِهِمْ ضَبَائِرَ ضَبَائِرَ، فَبُثُّوا عَلَى أَنْهَارِ الْجَنَّةِ، ثُمَّ قِيلَ: يَا أَهْلَ الْجَنَّةِ أَفِيضُوا عَلَيْهِمْ، فَيَنْبُتُونَ نَبَاتَ الْحِبَّةِ تَكُونُ فِي حَمِيلِ السَّيْلِ))، فَقَالَ رَجُلٌ مِنَ الْقَوْمِ: كَأَنَّ رَسُولَ اللَّهِ ﷺ قَدْ كَانَ بِالْبَادِيَةِ.

**[459]-306-(185)** ........ Əbu Səid ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Cəhənnəm əhli olan cəhənnəmliklərə gəlincə, onlar orada nə ölüb (əzabdan qurtula biləcəklər), nə də yaşayıb (həyatdan zövq ala biləcəklər).[1] Ancaq (orada) günahları (və ya xətaları) üzündən atəşə giriftar olmuş bir qrup insan olacaq ki, Allah (bu insanlara bir müddət əzab verdikdən sonra) onları öldürəcək. Nəhayət, kömür kimi olduqları zaman (onlara) şəfaət edilməsinə izin veriləcək və onlar dəstə-dəstə Cənnət çaylarının başına gətiriləcəklər. Sonra belə buyurulacaq: "Ey Cənnət əhli! Bunların üstünə (su) tökün".

Beləliklə, onlar selin gətirdiyi (çör-çöp) içində olan toxumların cücərib yetişdiyi kimi diriləcəklər.

Bu vaxt camaatın arasından bir nəfər dedi: "Peyğəmbər ﷺ yəqin ki, səhrada olmuşdur".

**[٤٦٠] ٣٠٧**–(...) و حَدَّثَنَاه مُحَمَّدُ بْنُ الْمُثَنَّى وَابْنُ بَشَّارٍ قَالاَ: حَدَّثَنَا مُحَمَّدُ بْنُ جَعْفَرٍ: حَدَّثَنَا شُعْبَةُ عَنْ أَبِي مَسْلَمَةَ قَالَ: سَمِعْتُ أَبَا نَضْرَةَ عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ عَنِ النَّبِيِّ ﷺ بِمِثْلِهِ، إِلَى قَوْلِهِ: فِي حَمِيلِ السَّيْلِ، وَلَمْ يَذْكُرْ مَا بَعْدَهُ.

**[460]-307-(...)** ........ Əbu Məsləmə demişdir: "Mən Əbu Nədrədən eşitdim. (Rəvayət edirdi ki,) o, Əbu Səid əl-Xudridən, o da Peyğəmbərdən ﷺ bu hədisi

---

[1] Uca Allah buyurur: **"O kimsə ki, Cəhənnəmə atılacaq. O orada nə öləcək, nə də yaşaya biləcəkdir"** ("əl-Əla" surəsi, 12-13); **"Kafirləri isə Cəhənnəm odu gözləyir. Orada nə öldürülməzlər ki, ölüb canları qurtarsın, nə də bu odun əzabı** ***onlar üçün*** **yüngülləşdirilər. Biz hər bir kafiri belə cəzalandırırıq"** ("Fatir" surəsi, 36).

“selin gətirdiyi (çör-çöp) içində (olan toxumların cücərib yetişdiyi kimi diriləcəklər)” sözünə qədər rəvayət etmiş və bundan sonrasını zikr etməmişdir”.

## (٨٣) – بَابُ آخرِ أَهْلِ النَّارِ خُرُوجًا

## 83-cü fəsil. Cəhənnəmdən ən son çıxan kimsə haqqında

**[٤٦١] ٣٠٨**–(١٨٦) حَدَّثَنَا عُثْمَانُ بْنُ أَبِي شَيْبَةَ وَإِسْحَقُ بْنُ إِبْرَاهِيمَ الْحَنْظَلِيُّ، كِلاَهُمَا عَنْ جَرِيرٍ – قَالَ: عُثْمَانُ حَدَّثَنَا جَرِيرٌ – عَنْ مَنْصُورٍ، عَنْ إِبْرَاهِيمَ، عَنْ عَبِيدَةَ، عَنْ عَبْدِ اللَّهِ بْنِ مَسْعُودٍ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((إِنِّي لأَعْلَمُ آخِرَ أَهْلِ النَّارِ خُرُوجًا مِنْهَا، وَآخِرَ أَهْلِ الْجَنَّةِ دُخُولاً الْجَنَّةَ: رَجُلٌ يَخْرُجُ مِنَ النَّارِ حَبْوًا، فَيَقُولُ اللَّهُ تَبَارَكَ وَتَعَالَى لَهُ: اذْهَبْ فَادْخُلْ الْجَنَّةَ، فَيَأْتِيهَا فَيُخَيَّلُ إِلَيْهِ أَنَّهَا مَلأَى، فَيَرْجِعُ فَيَقُولُ: يَا رَبِّ! وَجَدْتُهَا مَلأَى. فَيَقُولُ اللَّهُ تَبَارَكَ وَتَعَالَى لَهُ: اذْهَبْ فَادْخُلْ الْجَنَّةَ، قَالَ: فَيَأْتِيهَا فَيُخَيَّلُ إِلَيْهِ أَنَّهَا مَلأَى، فَيَرْجِعُ فَيَقُولُ: يَا رَبِّ! وَجَدْتُهَا مَلأَى، فَيَقُولُ اللَّهُ لَهُ: اذْهَبْ فَادْخُلْ الْجَنَّةَ، فَإِنَّ لَكَ مِثْلَ الدُّنْيَا وَعَشَرَةَ أَمْثَالِهَا – أَوْ إِنَّ لَكَ عَشَرَةَ أَمْثَالِ الدُّنْيَا – قَالَ فَيَقُولُ أَتَسْخَرُ بِي – أَوْ أَتَضْحَكُ بِي – وَأَنْتَ الْمَلِكُ؟)) قَالَ: لَقَدْ رَأَيْتُ رَسُولَ اللَّهِ ﷺ ضَحِكَ حَتَّى بَدَتْ نَوَاجِذُهُ.

قَالَ فَكَانَ يُقَالُ: ذَاكَ أَدْنَى أَهْلِ الْجَنَّةِ مَنْزِلَةً.

**[461]-308-(186)** ........ Abdullah ibn Məsud ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Mən cəhənnəmliklərdən Cəhənnəmdən son çıxacaq və cənnətliklərdən Cənnətə son girəcək kimsəni tanıyıram. O kimsə ki, iməkləyə-iməkləyə Cəhənnəmdən çıxacaq və Allah Təbarəkə və Təalə ona: “Get, Cənnətə gir!”– deyə buyuracaq. O kimsə Cənnətə yaxınlaşacaq və ona elə gələcək ki, Cənnət dopdoludur. Onda o, geri qayıdıb deyəcək: “Ey Rəbbim! Mən Cənnəti dopdolu gördüm”. Allah Təbarəkə və Təalə yenə ona: “Get, Cənnətə gir!”– deyə buyuracaq. O kimsə Cənnətə yaxınlaşacaq və yenə ona elə gələcək ki, Cənnət dopdoludur. O geri dönüb deyəcək: “Ey Rəbbim! Mən Cənnəti dopdolu gördüm”. Onda Allah ona belə buyuracaq: “Get, Cənnətə gir! Dünya və onun on misli qədər (yer) sənindir, (yaxud dünyanın on misli qədər (yer) sənindir)”. Onda bu adam deyəcək: “Sən Hökmdar olduğun halda mənə lağ edirsən, (yaxud mənə gülürsən)?”

(Abdullah dedi): Mən Peyğəmbərin ﷺ arxa dişləri görünənədək güldüyünü gördüm. (Səhabələr): “Cənnət əhlinin ən aşağı dərəcə sahibi bu kimsədir”– deyərdilər.

**[٤٦٢] ٣٠٩**-(...) و حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ وَأَبُو كُرَيْبٍ - وَاللَّفْظُ لأَبِي كُرَيْبٍ - قَالاَ: حَدَّثَنَا أَبُو مُعَاوِيَةَ عَنْ الأَعْمَشِ، عَنْ إِبْرَاهِيمَ، عَنْ عَبِيدَةَ، عَنْ عَبْدِ اللَّهِ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((إِنِّي لأَعْرِفُ آخِرَ أَهْلِ النَّارِ خُرُوجًا مِنْ النَّارِ، رَجُلٌ يَخْرُجُ مِنْهَا زَحْفًا فَيُقَالُ لَهُ: انْطَلِقْ فَادْخُلْ الْجَنَّةَ، قَالَ: فَيَذْهَبُ فَيَدْخُلُ الْجَنَّةَ، فَيَجِدُ النَّاسَ قَدْ أَخَذُوا الْمَنَازِلَ، فَيُقَالُ لَهُ: أَتَذْكُرُ الزَّمَانَ الَّذِي كُنْتَ فِيهِ؟ فَيَقُولُ: نَعَمْ، فَيُقَالُ لَهُ: تَمَنَّ فَيَتَمَنَّى، فَيُقَالُ لَهُ: لَكَ الَّذِي تَمَنَّيْتَ وَعَشَرَةَ أَضْعَافِ الدُّنْيَا، فَيَقُولُ: أَتَسْخَرُ بِي وَأَنْتَ الْمَلِكُ؟)) قَالَ: فَلَقَدْ رَأَيْتُ رَسُولَ اللَّهِ ﷺ ضَحِكَ حَتَّى بَدَتْ نَوَاجِذُهُ.

**[462]-309-(...)** ........ Abdullah ibn Məsud ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Mən cəhənnəmliklərdən Cəhənnəmdən son çıxacaq kimsəni tanıyıram. O kimsə ki, yanı üstə sürünə-sürünə Cəhənnəmdən çıxacaq və ona: "Get, Cənnətə gir!"– deyə buyurulacaq. Bu adam gedib Cənnətə girəcək və görəcək ki, insanlar artıq öz yerlərini tutmuşlar. Onda ona deyiləcək: "(Dünyada) keçirdiyin vaxtları xatırlayırsanmı?" O: "Bəli!"– deyə cavab verəcək. Ona: "Təmənna et!"– deyiləcək, o da təmənna edəcəkdir. Sonra ona: "Təmənna etdiyin və dünyanın on qatı qədər (yer) sənindir"– deyiləcək. Onda bu adam deyəcək: "Sən Hökmdar ola-ola mənə lağ edirsən?"

(Abdullah dedi): "Mən Peyğəmbərin ﷺ arxa dişləri görünənədək güldüyünü gördüm".

**[٤٦٣] ٣١٠**-(١٨٧) حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا عَفَّانُ بْنُ مُسْلِمٍ: حَدَّثَنَا حَمَّادُ بْنُ سَلَمَةَ: حَدَّثَنَا ثَابِتٌ عَنْ أَنَسٍ، عَنْ ابْنِ مَسْعُودٍ؛ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: ((آخِرُ مَنْ يَدْخُلُ الْجَنَّةَ رَجُلٌ، فَهْوَ يَمْشِي مَرَّةً وَيَكْبُو مَرَّةً، وَتَسْفَعُهُ النَّارُ مَرَّةً، فَإِذَا مَا جَاوَزَهَا الْتَفَتَ إِلَيْهَا، فَقَالَ: تَبَارَكَ الَّذِي نَجَّانِي مِنْكِ، لَقَدْ أَعْطَانِي اللَّهُ شَيْئًا مَا أَعْطَاهُ أَحَدًا مِنْ الأَوَّلِينَ وَالآخِرِينَ، فَتُرْفَعُ لَهُ شَجَرَةٌ فَيَقُولُ: أَيْ رَبِّ! أَدْنِنِي مِنْ هَذِهِ الشَّجَرَةِ فَلأَسْتَظِلَّ بِظِلِّهَا وَأَشْرَبَ مِنْ مَائِهَا، فَيَقُولُ اللَّهُ عَزَّ وَجَلَّ: يَا ابْنَ آدَمَ! لَعَلِّي إِنْ أَعْطَيْتُكَهَا سَأَلْتَنِي غَيْرَهَا، فَيَقُولُ: لاَ، يَا رَبِّ! وَيُعَاهِدُهُ أَنْ لاَ يَسْأَلَهُ غَيْرَهَا، وَرَبُّهُ يَعْذِرُهُ، لأَنَّهُ يَرَى مَا لاَ صَبْرَ لَهُ عَلَيْهِ، فَيُدْنِيهِ مِنْهَا فَيَسْتَظِلُّ بِظِلِّهَا وَيَشْرَبُ مِنْ مَائِهَا، ثُمَّ تُرْفَعُ لَهُ شَجَرَةٌ هِيَ أَحْسَنُ مِنْ الأُولَى، فَيَقُولُ: أَيْ رَبِّ! أَدْنِنِي مِنْ هَذِهِ لأَشْرَبَ مِنْ مَائِهَا وَأَسْتَظِلَّ بِظِلِّهَا، لاَ أَسْأَلُكَ غَيْرَهَا، فَيَقُولُ: يَا ابْنَ آدَمَ! أَلَمْ تُعَاهِدْنِي أَنْ لاَ تَسْأَلَنِي غَيْرَهَا؟ فَيَقُولُ: لَعَلِّي إِنْ أَدْنَيْتُكَ مِنْهَا تَسْأَلُنِي غَيْرَهَا؟ فَيُعَاهِدُهُ أَنْ لاَ يَسْأَلَهُ غَيْرَهَا، وَرَبُّهُ يَعْذِرُهُ، لأَنَّهُ يَرَى مَا لاَ صَبْرَ لَهُ عَلَيْهِ، فَيُدْنِيهِ مِنْهَا، فَيَسْتَظِلُّ بِظِلِّهَا وَيَشْرَبُ مِنْ مَائِهَا، ثُمَّ تُرْفَعُ لَهُ شَجَرَةٌ عِنْدَ بَابِ الْجَنَّةِ هِيَ أَحْسَنُ مِنْ الأُولَيَيْنِ، فَيَقُولُ: أَيْ رَبِّ! أَدْنِنِي مِنْ هَذِهِ لأَسْتَظِلَّ بِظِلِّهَا وَأَشْرَبَ مِنْ مَائِهَا، لاَ أَسْأَلُكَ غَيْرَهَا، فَيَقُولُ: يَا ابْنَ آدَمَ! أَلَمْ تُعَاهِدْنِي

أَنْ لاَ تَسْأَلَنِي غَيْرَهَا؟ قَالَ: بَلَى، يَا رَبِّ هَذِهِ! لاَ أَسْأَلُكَ غَيْرَهَا، وَرَبُّهُ يَعْذِرُهُ لأَنَّهُ يَرَى مَا لاَ صَبْرَ لَهُ عَلَيْهَا، فَيُدْنِيهِ مِنْهَا، فَإِذَا أَدْنَاهُ مِنْهَا، فَيَسْمَعُ أَصْوَاتَ أَهْلِ الْجَنَّةِ، فَيَقُولُ: أَيْ رَبِّ! أَدْخِلْنِيهَا، فَيَقُولُ: يَا ابْنَ آدَمَ! مَا يَصْرِينِي مِنْكَ؟ أَيُرْضِيكَ أَنْ أُعْطِيَكَ الدُّنْيَا وَمِثْلَهَا مَعَهَا؟ يَقُولُ: يَا رَبِّ أَتَسْتَهْزِئُ مِنِّي وَأَنْتَ رَبُّ الْعَالَمِينَ)).

فَضَحِكَ ابْنُ مَسْعُودٍ فَقَالَ: أَلاَ تَسْأَلُونِي مِمَّ أَضْحَكُ؟ فَقَالُوا: مِمَّ تَضْحَكُ؟ قَالَ: هَكَذَا ضَحِكَ رَسُولُ اللَّهِ ﷺ، فَقَالُوا: مِمَّ تَضْحَكُ يَا رَسُولَ اللَّهِ؟ فَقَالَ: ((مِنْ ضِحْكِ رَبِّ الْعَالَمِينَ حِينَ قَالَ: أَتَسْتَهْزِئُ مِنِّي وَأَنْتَ رَبُّ الْعَالَمِينَ؟ فَيَقُولُ: إِنِّي لاَ أَسْتَهْزِئُ مِنْكَ، وَلَكِنِّي عَلَى مَا أَشَاءُ قَادِرٌ)).

**[463]-310-(187)** ........ Abdullah ibn Məsud رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Cənnətə girənlərin sonuncusu o kimsə olacaq ki, o, (körpüdən keçərkən) gah yeriyəcək, gah üzüqoylu yerə yıxılacaq, gah da Cəhənnəm alovu onun üzünə çırpılacaq. Nəhayət, Cəhənnəmi ötüb-keçdiyi zaman ona tərəf çevrilib deyəcək: "Məni səndən xilas edən Allah nə qədər Uludur! O, əvvəlkilərdən və sonrakılardan heç kəsə vermədiyini mənə vermişdir". Sonra ona bir ağac göstəriləcək. Onda həmin adam deyəcək: "Ey Rəbbim! Məni bu ağaca yaxınlaşdır, onun kölgəsində kölgələnim, suyundan içim". İzzətli və Qüdrətli Allah buyuracaq: "Ey Adəm oğlu! Əgər bu istədiyini sənə versəm, yəqin ki, daha artığını istəyəcəksən". O: "Yox, (istəmərəm), ey Rəbbim"– deyəcək və Allahdan bundan başqa (heç nə) istəməyəcəyinə dair Ona söz verəcək. Rəbbi onun bu nemətə qarşı səbirsiz olduğunu yəqin bildiyindən, onu üzürlü sayacaq və onu bu ağaca yaxınlaşdıracaq. Adam (bir müddət) bu ağacın kölgəsində kölgələnəcək və onun suyundan içəcəkdir. Sonra ona əvvəlkindən daha gözəl bir ağac göstəriləcək. Onda o deyəcək: "Ey Rəbbim! Məni bu ağaca yaxınlaşdır, onun suyundan içim, kölgəsində kölgələnim. Səndən bundan başqa bir şey istəməyəcəyəm". Allah buyuracaq: "Ey Adəm oğlu! Məgər sən bundan başqa bir şey istəməyəcəyinə dair Mənə söz verməmişdinmi?! Əgər səni ona yaxınlaşdırsam, yəqin ki, daha artığını istəyəcəksən". Onda o, bundan başqa (heç nə) istəməyəcəyinə dair Allaha söz verəcək. Rəbbi onun bu nemətə qarşı səbirsiz olduğunu yəqin bildiyindən onu üzürlü sayacaq və onu bu ağaca yaxınlaşdıracaq. Adam (bir müddət) bu ağacın kölgəsində kölgələnəcək və onun suyundan içəcəkdir. Sonra ona Cənnət qapısının yanında, əvvəlkilərdən daha gözəl bir ağac göstəriləcək. Onda o deyəcək: "Ey Rəbbim! Məni bu ağaca yaxınlaşdır, onun kölgəsində kölgələnim, suyundan içim. Səndən bundan başqa bir şey istəməyəcəyəm". Allah buyuracaq: "Ey Adəm oğlu! Məgər sən

bundan başqa bir şey istəməyəcəyinə dair Mənə söz verməmişdinmi?!" O deyəcək: "Elədir, ey Rəbbim! Bunu da (ver), Səndən daha heç nə istəməyəcəyəm". Rəbbi onun bu nemətə qarşı səbirsiz olduğunu yəqin bildiyindən, onu üzürlü sayacaq və onu bu ağaca yaxınlaşdıracaq. O, bu ağaca yaxınlaşdığı və Cənnət əhlinin səsini eşitdiyi zaman: "Ey Rəbbim! Məni oraya daxil et!"– deyə yalvaracaq. Allah buyuracaq: "Ey Adəm oğlu! İstəklərinə son qoyacaqsanmı?! Sənə (orada) dünya və onun misli qədər (yer) versəm, razı qalarsanmı?" O deyəcək: "Ey Rəbbim! Sən aləmlərin Rəbbi olduğun halda mənə istehzamı edirsən?"

(Bunu deyəndə) İbn Məsud güldü və (oradakılardan): "Nə üçün gülməyimin səbəbini soruşmursunuz?"– deyə soruşdu. Onlar: "Niyə güldün?"– deyə soruşdular. İbn Məsud dedi: "Rəsulullah ﷺ belə güldü və (səhabələr ondan): "Niyə güldün, ya Rəsulullah?"– deyə soruşduqda o buyurdu: "Bu adamın: Sən aləmlərin Rəbbi olduğun halda mənə istehzamı edirsən?"– dediyi vaxt aləmlərin Rəbbinin gülməyinə güldüm".

Sonra Allah buyurdu: "Mən sənə istehza etmirəm, sadəcə Mən istədiyimi etməyə qadirəm".

## (٨٤) – بَابُ أَدْنَى أَهْلِ الْجَنَّةِ مَنْزِلَةً فِيهَا

## 84-cü fəsil. Cənnətin ən aşağı təbəqəsində[1] olan kəslər

**[٤٦٤] ٣١١–(١٨٨)** حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا يَحْيَى بْنُ أَبِي بُكَيْرٍ: حَدَّثَنَا زُهَيْرُ بْنُ مُحَمَّدٍ، عَنْ سُهَيْلِ بْنِ أَبِي صَالِحٍ، عَنِ النُّعْمَانِ بْنِ أَبِي عَيَّاشٍ، عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ، أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: ((إِنَّ أَدْنَى أَهْلِ الْجَنَّةِ مَنْزِلَةً رَجُلٌ صَرَفَ اللَّهُ وَجْهَهُ عَنِ النَّارِ قِبَلَ الْجَنَّةِ، وَمَثَّلَ لَهُ شَجَرَةً ذَاتَ ظِلٍّ، فَقَالَ: أَيْ رَبِّ! قَدِّمْنِي إِلَى هَذِهِ الشَّجَرَةِ أَكُونُ فِي ظِلِّهَا)). وَسَاقَ الْحَدِيثَ بِنَحْوِ حَدِيثِ ابْنِ مَسْعُودٍ، وَلَمْ يَذْكُرْ: ((فَيَقُولُ: يَا ابْنَ آدَمَ! مَا يَصْرِينِي مِنْكَ)) إِلَى آخِرِ الْحَدِيثِ، وَزَادَ فِيهِ ((وَيُذَكِّرُهُ اللَّهُ سَلْ كَذَا وَكَذَا، فَإِذَا انْقَطَعَتْ بِهِ الأَمَانِيُّ قَالَ اللَّهُ: هُوَ لَكَ وَعَشَرَةُ أَمْثَالِهِ)) قَالَ: ((ثُمَّ يَدْخُلُ بَيْتَهُ فَتَدْخُلُ عَلَيْهِ زَوْجَتَاهُ مِنَ الْحُورِ الْعِينِ، فَتَقُولاَنِ: الْحَمْدُ لِلَّهِ الَّذِي أَحْيَاكَ لَنَا، وَأَحْيَانَا لَكَ، قَالَ فَيَقُولُ: مَا أُعْطِيَ أَحَدٌ مِثْلَ مَا أُعْطِيتُ)).

---

[1] Peyğəmbər ﷺ demişdir: "Cənnətdə Allahın, Onun yolunda cihad edənlər üçün hazırladığı yüz mərtəbə vardır. (Bu mərtəbələrdən) hər iki mərtəbə arasındakı məsafə yerlə göy arasında olan məsafəyə bərabərdir. Allahdan (nə isə) dilədiyiniz zaman Firdovs cənnətini diləyin! Çünki Firdovs, Cənnətin tam ortası və ən yüksək mərtəbəsidir. Onun üstündə isə ər-Rəhmanın Ərşi yerləşir. Cənnət çayları oradan qaynayıb axır" ("Səhih əl-Buxari", 2790).

**[464]-311-(188)** ........ Əbu Səid əl-Xudri ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Cənnət əhlinin ən aşağı təbəqəsində olacaq cənnətlik o kimsədir ki, Allah onun üzünü Cəhənnəmdən Cənnətə tərəf döndərəcək və ona kölgəsi olan bir ağac göstərəcək". Onda bu adam deyəcək: "Ey Rəbbim! Məni bu ağaca yaxınlaşdır ki, mən onun kölgəsində olum..."

Əbu Səid bu hədisi İbn Məsudun hədisi kimi rəvayət etmiş, lakin: "Allah buyuracaq: "Ey Adəm oğlu! İstəklərinə son qoyacaqsanmı?!..." sözünü axıra kimi zikr etməmişdir. Üstəlik bunu əlavə etmişdir: "Allah ona: "Filan şeyi və filan şeyi də istə"– deyə xatırladacaq. Artıq onun heç bir istəyi qalmadıqda Allah buyuracaq: "Bu (istədiklərin) və onun on misli sənindir". Sonra o, (Cənnətdəki) evinə girəcək. Bu vaxt hurilərdən[1] olan iki zövcəsi onun yanına girəcək və: "Səni bizim üçün yaradan, bizi də sənin üçün yaradan Allaha həmd olsun!"– deyəcəklər". (O kimsə də belə) deyəcək: "Mənə verilən nemətlər heç kəsə verilməmişdir".

**[٤٦٥] ٣١٢-(١٨٩)** حَدَّثَنَا سَعِيدُ بْنُ عَمْرٍو الأَشْعَثِيُّ: حَدَّثَنَا سُفْيَانُ بْنُ عُيَيْنَةَ عَنْ مُطَرِّفٍ وَابْنِ أَبْجَرَ، عَنْ الشَّعْبِيِّ، قَالَ: سَمِعْتُ الْمُغِيرَةَ بْنَ شُعْبَةَ – رِوَايَةً إِنْ شَاءَ اللَّهُ؛ ح: و حَدَّثَنَا ابْنُ أَبِي عُمَرَ: حَدَّثَنَا سُفْيَانُ: حَدَّثَنَا مُطَرِّفُ بْنُ طَرِيفٍ وَعَبْدُ الْمَلِكِ بْنُ سَعِيدٍ سَمِعَا الشَّعْبِيَّ يُخْبِرُ عَنْ الْمُغِيرَةِ بْنِ شُعْبَةَ قَالَ: سَمِعْتُهُ عَلَى الْمِنْبَرِ، يَرْفَعُهُ إِلَى رَسُولِ اللَّهِ ﷺ؛ ح: و حَدَّثَنِي بِشْرُ بْنُ الْحَكَمِ – وَاللَّفْظُ لَهُ –: حَدَّثَنَا سُفْيَانُ بْنُ عُيَيْنَةَ: حَدَّثَنَا مُطَرِّفٌ وَابْنُ أَبْجَرَ، سَمِعَا الشَّعْبِيَّ يَقُولُ: سَمِعْتُ الْمُغِيرَةَ بْنَ شُعْبَةَ يُخْبِرُ بِهِ النَّاسَ عَلَى الْمِنْبَرِ – قَالَ سُفْيَانُ: رَفَعَهُ أَحَدُهُمَا – أُرَاهُ ابْنَ أَبْجَرَ – قَالَ: ((سَأَلَ مُوسَى رَبَّهُ تَعَالَى: مَا أَدْنَى أَهْلِ الْجَنَّةِ مَنْزِلَةً؟ قَالَ: هُوَ رَجُلٌ يَجِيءُ بَعْدَ مَا أُدْخِلَ أَهْلُ الْجَنَّةِ الْجَنَّةَ فَيُقَالُ لَهُ: ادْخُلْ الْجَنَّةَ. فَيَقُولُ: أَيْ رَبِّ! كَيْفَ؟ وَقَدْ نَزَلَ النَّاسُ مَنَازِلَهُمْ وَأَخَذُوا أَخَذَاتِهِمْ؟ فَيُقَالُ لَهُ: أَتَرْضَى أَنْ يَكُونَ لَكَ مِثْلُ مُلْكِ مَلِكٍ مِنْ مُلُوكِ الدُّنْيَا؟ فَيَقُولُ: رَضِيتُ، رَبِّ! فَيَقُولُ: لَكَ ذَلِكَ وَمِثْلُهُ وَمِثْلُهُ وَمِثْلُهُ وَمِثْلُهُ. فَقَالَ فِي الْخَامِسَةِ: رَضِيتُ، رَبِّ! فَيَقُولُ: هَذَا لَكَ وَعَشَرَةُ أَمْثَالِهِ، وَلَكَ مَا اشْتَهَتْ نَفْسُكَ وَلَذَّتْ عَيْنُكَ، فَيَقُولُ: رَضِيتُ، رَبِّ! قَالَ: رَبِّ فَأَعْلَاهُمْ مَنْزِلَةً؟ قَالَ: أُولَئِكَ الَّذِينَ أَرَدْتُ، غَرَسْتُ كَرَامَتَهُمْ بِيَدِي. وَخَتَمْتُ عَلَيْهَا فَلَمْ تَرَ عَيْنٌ وَلَمْ تَسْمَعْ أُذُنٌ وَلَمْ يَخْطُرْ عَلَى قَلْبِ بَشَرٍ)) قَالَ: ((وَمِصْدَاقُهُ فِي كِتَابِ اللَّهِ عَزَّ وَجَلَّ: ﴿ فَلَا تَعْلَمُ نَفْسٌ مَّآ أُخْفِىَ لَهُم مِّن قُرَّةِ أَعْيُنٍ ﴾

[1] Adəmin ﵇ nəslinə aidiyyəti olmayan, qeyri-adi gözəlliyə malik və xüsusilə seçilən iri qaragözlü Cənnət qadınları.

**[465]-312-(189)** ........ Abdul-Malik ibn Səid və Mütərrif və ibn Əbcər – hər ikisi Şəbidən eşitmişlər ki, o belə rəvayət etmişdir: “Muğirə ibn Şobə minbərdə ikən camaata xəbər vermişdir ki, (Peyğəmbər ﷺ belə buyurmuşdur): “(Bir dəfə) Musa Uca Rəbbindən: “Cənnət əhlinin ən aşağı təbəqəsində olacaq cənnətlik kimdir?”– deyə soruşdu. Allah buyurdu: “Bu o kimsədir ki, Cənnət əhli Cənnətə daxil olduqdan sonra gələcək və ona: “Cənnətə gir!”– deyiləcək. O isə: “Ya Rəbb! Hər kəs öz yerinə yerləşdikdən, alacağını da aldıqdan sonra (bu) nə cür (ola bilər)?”– deyəcək. Onda ona belə buyurulacaq: “Dünya padşahlarından bir padşahın mülkü qədər mülkün sahibi olmağa razısanmı?” O deyəcək: “Razıyam, ya Rəbb!” Allah buyuracaq: “Bu qədər mülk, üstəlik bir o qədəri də, bir o qədəri də, bir o qədəri də, bir o qədəri də, bir o qədəri də sənindir. Beşincisində o: “Razı qaldım, ya Rəbb!”– deyəcək. Allah buyuracaq: “Bu (mülk) və onun on misli sənindir. Üstəlik nəfsinin istədiyi, gözlərinin zövq aldığı hər şey sənindir”. O: “Razıyam, ya Rəbb!”– deyəcək.

(Bundan sonra) Musa: “Ya Rəbb! Bəs Cənnət əhlinin ən yüksək təbəqəsində olanlar kimlərdir?” Allah buyuracaq: “Bunlar Mənim seçib üstünlük verdiyim qullarımdır. Mən onların kəramətini Öz Əlimlə bərkidib möhürləmişəm.[1] (Bunu isə) nə bir göz görmüş, nə bir qulaq eşitmiş, nə də ki insanlardan bir kimsə qəlbindən keçirmişdir”.

(Ravi dedi): “Buna dəlil olaraq Allahın bu ayəsini göstərmək olar: **“Etdikləri əməllərin mükafatı kimi onlar üçün gözlərinə sevinc gətirəcək nələr saxlandığını heç kəs bilmir”.**[2]

**[٤٦٦] ٣١٣**–(...) حَدَّثَنَا أَبُو كُرَيْب: حَدَّثَنَا عُبَيْدُ اللَّهِ الأَشْجَعِيُّ عَنْ عَبْدِ الْمَلِكِ بْنِ أَبْجَرَ قَالَ: سَمِعْتُ الشَّعْبِيَّ يَقُولُ: سَمِعْتُ الْمُغِيرَةَ بْنَ شُعْبَةَ يَقُولُ عَلَى الْمِنْبَرِ: إِنَّ مُوسَى – عَلَيْهِ السَّلَامُ – سَأَلَ اللَّهَ عَزَّ وَجَلَّ عَنْ أَخَسِّ أَهْلِ الْجَنَّةِ مِنْهَا حَظًّا. وَسَاقَ الْحَدِيثَ بِنَحْوِهِ.

**[466]-313-(...)** ........ Şəbi: “Mən Muğirə ibn Şobənin minbərdə ikən belə dediyini eşitdim: “Musa (aleyhissəlam) İzzətli və Qüdrətli Allahdan Cənnət əhlindən Cənnətdə ən az payı olan kimsənin kim olduğunu soruşdu...”– dedi və bu hədisi yuxarıdakı hədisə bənzər rəvayət etdi.

---

[1] Yəni “onları seçilmiş və hörmətli bəndələrdən (kəramət sahiblərindən) etdim. Onların kəramətini (etdikləri xariqüladə işləri, göstərdikləri möcüzələri) heç kəs və heç nə dəyişdirə bilməz”. (“Tohfətul-Əhvəzi”, 9/42).

[2] “əs-Səcdə” surəsi, 17.

**[٤٦٧] ٣١٤-(١٩٠)** حَدَّثَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللَّهِ بْنِ نُمَيْرٍ: حَدَّثَنَا أَبِي: حَدَّثَنَا الأَعْمَشُ عَنِ الْمَعْرُورِ بْنِ سُوَيْدٍ، عَنْ أَبِي ذَرٍّ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((إِنِّي لأَعْلَمُ آخِرَ أَهْلِ الْجَنَّةِ دُخُولاً الْجَنَّةَ، وَآخِرَ أَهْلِ النَّارِ خُرُوجًا مِنْهَا، رَجُلٌ يُؤْتَى بِهِ يَوْمَ الْقِيَامَةِ، فَيُقَالُ: اعْرِضُوا عَلَيْهِ صِغَارَ ذُنُوبِهِ وَارْفَعُوا عَنْهُ كِبَارَهَا، فَتُعْرَضُ عَلَيْهِ صِغَارُ ذُنُوبِهِ، فَيُقَالُ: عَمِلْتَ يَوْمَ كَذَا وَكَذَا، كَذَا وَكَذَا. وَعَمِلْتَ يَوْمَ كَذَا وَكَذَا، كَذَا وَكَذَا. فَيَقُولُ: نَعَمْ، لاَ يَسْتَطِيعُ أَنْ يُنْكِرَ، وَهُوَ مُشْفِقٌ مِنْ كِبَارِ ذُنُوبِهِ أَنْ تُعْرَضَ عَلَيْهِ، فَيُقَالُ لَهُ: فَإِنَّ لَكَ مَكَانَ كُلِّ سَيِّئَةٍ حَسَنَةً فَيَقُولُ: رَبِّ! قَدْ عَمِلْتُ أَشْيَاءَ لاَ أَرَاهَا هَا هُنَا)).

فَلَقَدْ رَأَيْتُ رَسُولَ اللَّهِ ﷺ ضَحِكَ حَتَّى بَدَتْ نَوَاجِذُهُ.

**[467]-314-(190)** ........ Əbu Zərr ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Mən cənnətliklərdən Cənnətə son girəcək və cəhənnəmliklərdən Cəhənnəmdən son çıxacaq kimsəni tanıyıram. Bu o kimsədir ki, Qiyamət günü (məhşərə) gətiriləcək və: "Kiçik günahlarını ona göstərin, böyük günahlarını isə (əməl dəftərindən) silin"– deyiləcək. Sonra ona kiçik günahları göstəriləcək və (ona) belə deyiləcək: "Sən filan və filan gün, filan, filan işləri gördün, filan və filan gün də, filan, filan işləri gördün". O: "Bəli!"– deyə cavab verəcək və bunu inkar edə bilməyəcək. (Həmin an) o, böyük günahlarının ona ərz edilməsindən ehtiyat edəcək. Bu vaxt ona belə buyurulacaq: "Hər günahının yerinə sənin üçün bir savab vardır". Onda o deyəcək: "Ey Rəbbim! Mən bir çox işlər görmüşəm ki, onları burada görmürəm".

Mən Peyğəmbərin ﷺ arxa dişləri görünənədək güldüyünü gördüm.

**[٤٦٨] ٣١٥-(...)** و حَدَّثَنَا ابْنُ نُمَيْرٍ: حَدَّثَنَا أَبُو مُعَاوِيَةَ وَوَكِيعٌ؛ **ح**: و حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا وَكِيعٌ؛ **ح**: و حَدَّثَنَا أَبُو كُرَيْبٍ: حَدَّثَنَا أَبُو مُعَاوِيَةَ، كِلاَهُمَا عَنِ الأَعْمَشِ بِهَذَا الإِسْنَادِ.

**[468]-315-(...)** ........ Vəkiy və Əbu Müaviyə - hər ikisi (bu hədisi) Aməşdən bu isnadla rəvayət etmişdir.

**[٤٦٩] ٣١٦-(١٩١)** حَدَّثَنِي عُبَيْدُ اللَّهِ بْنُ سَعِيدٍ وَإِسْحَقُ بْنُ مَنْصُورٍ، كِلاَهُمَا عَنْ رَوْحٍ – قَالَ عُبَيْدُ اللَّهِ: حَدَّثَنَا رَوْحُ بْنُ عُبَادَةَ الْقَيْسِيُّ: حَدَّثَنَا ابْنُ جُرَيْجٍ قَالَ: أَخْبَرَنِي أَبُو الزُّبَيْرِ، أَنَّهُ سَمِعَ جَابِرَ بْنَ عَبْدِ اللَّهِ يُسْأَلُ عَنِ الْوُرُودِ؟ فَقَالَ: نَجِيءُ نَحْنُ يَوْمَ الْقِيَامَةِ عَنْ كَذَا وَكَذَا – انْظُرْ – أَيْ: ذَلِكَ فَوْقَ النَّاسِ. قَالَ فَتُدْعَى الأُمَمُ بِأَوْثَانِهَا وَمَا كَانَتْ تَعْبُدُ، الأَوَّلُ فَالأَوَّلُ، ثُمَّ يَأْتِينَا رَبُّنَا بَعْدَ ذَلِكَ فَيَقُولُ: مَنْ تَنْظُرُونَ؟ فَيَقُولُونَ: نَنْظُرُ رَبَّنَا، فَيَقُولُ: أَنَا رَبُّكُمْ، فَيَقُولُونَ: حَتَّى نَنْظُرَ إِلَيْكَ، فَيَتَجَلَّى لَهُمْ يَضْحَكُ، قَالَ فَيَنْطَلِقُ بِهِمْ وَيَتَّبِعُونَهُ، وَيُعْطَى كُلُّ إِنْسَانٍ مِنْهُمْ

– مُنَافِقٍ أَوْ مُؤْمِنٍ – نُورًا، ثُمَّ يَتَّبِعُونَهُ، وَعَلَى جِسْرِ جَهَنَّمَ كَلاَلِيبُ وَحَسَكٌ، تَأْخُذُ مَنْ شَاءَ اللَّهُ، ثُمَّ يُطْفَأُ نُورُ الْمُنَافِقِينَ، ثُمَّ يَنْجُو الْمُؤْمِنُونَ، فَتَنْجُو أَوَّلُ زُمْرَةٍ وُجُوهُهُمْ كَالْقَمَرِ لَيْلَةَ الْبَدْرِ، سَبْعُونَ أَلْفًا لاَ يُحَاسَبُونَ، ثُمَّ الَّذِينَ يَلُونَهُمْ كَأَضْوَإِ نَجْمٍ فِي السَّمَاءِ، ثُمَّ كَذَلِكَ، ثُمَّ تَحِلُّ الشَّفَاعَةُ، وَيَشْفَعُونَ حَتَّى يَخْرُجَ مِنَ النَّارِ مَنْ قَالَ: لاَ إِلَهَ إِلاَّ اللَّهُ، وَكَانَ فِي قَلْبِهِ مِنَ الْخَيْرِ مَا يَزِنُ شَعِيرَةً، فَيُجْعَلُونَ بِفِنَاءِ الْجَنَّةِ، وَيَجْعَلُ أَهْلُ الْجَنَّةِ يَرُشُّونَ عَلَيْهِمُ الْمَاءَ حَتَّى يَنْبُتُوا نَبَاتَ الشَّيْءِ فِي السَّيْلِ، وَيَذْهَبُ حُرَاقُهُ ثُمَّ يَسْأَلُ حَتَّى تُجْعَلَ لَهُ الدُّنْيَا وَعَشَرَةُ أَمْثَالِهَا مَعَهَا.

**[469]-316-(191)** ........ Əbu Zubeyr rəvayət etmişdir ki, o, Cabir ibn Abdullahın (Sirat[1] körpüsündən) keçmək barəsində soruşulduğunu eşitmişdir. Cabir (bu suala belə) cavab vermişdir: "Biz (müsəlmanlar) Qiyamət günü (bəlli bir) yerə gələcəyik.[2] Bax, bu, insanların fövqündə bir yer olacaq. Ümmətlər öz bütləri ilə və tapındıqları (tanrılarla) birgə növbə ilə çağırılacaqlar. Bundan sonra Rəbbimiz bizim yanımıza gələcək və: "Kimi gözləyirsiniz?"– deyə soruşacaq. (Müsəlmanlar): "Rəbbimizi gözləyirik"– deyə cavab verəcəklər. Allah buyuracaq: "Mən sizin Rəbbinizəm!" Onlar deyəcəklər: "(Elə isə) qoy baxaq Sənə". Onda (Allah) gülərək Özünü onlara göstərəcək, sonra onları (Özü ilə) aparacaq və onlar da Onun ardınca gedəcəklər. Onlardan – istər münafiq, istərsə də mömin olsun – hər bir insana nur veriləcək. Sonra yenə Onun ardınca gedəcəklər. Cəhənnəm körpüsü üstündə bir çox qarmaqlar və dəmir tikanlar vardır ki, bunlar ancaq Allahın dilədiyi kimsələri yaxalayacaqlar. Bu əsnada münafiqlərin nuru sönəcək. Möminlər isə xilas olacaqlar. Yetmiş min nəfərdən ibarət ilk zümrə, üzləri bədr gecəsindəki ay kimi,[3] özləri də sorğu-suala çəkilmədən (körpüdən keçib) xilas olacaqlar. Onlardan sonra keçənlər göydəki ən parlaq ulduz kimi nur saçacaqlar. Daha sonra filan cür (və filan cür keçənlər də) olacaqdır. Sonra şəfaət etməyə izin veriləcək və onlar (dilədikləri kimsələrdən ötrü) şəfaət edəcəklər. Axırda "lə ilahə illəllah" deyən və qəlbin-

---

[1] Sirat: (a) yol; (b) Cəhənnəmin üstündən salınmış körpünün adı. Qiyamət günü adamlar onun üstündən keçməlidir. Bu körpü tükdən nazik və qılıncın tiyəsindən itidir. Onun üstündə qarmaqlar sallanır ki, günahkar insanları qamarlayıb Cəhənnəmə atsınlar.

[2] Peyğəmbər ﷺ demişdir: "Qiyamət günü insanlar məhşərə toplanacaqlar. Mən öz ümmətimlə birgə bir təpənin üstünə yığışacağıq. O zaman Rəbbim mənə yaşıl bir libas əta edəcək. Sonra mənə (danışmağa) izin veriləcək və mən Allahın istədiyi qədər danışacağam. Təriflənən məqam da elə budur" ("Səhih ibn Hibban", 6445; "Müsnəd imam Əhməd", 3/465; "Silsilətul-Əhadis-Səhihə", 2370).

[3] Yəni on dörd gecəlik ay kimi.

də arpa dənəsi ağırlığında iman olan kəslər Cəhənnəmdən çıxacaq. Bundan sonra onlar Cənnət guşəsinə gətiriləcək və Cənnət əhli onların üzərinə (dirilik) suyu səpməyə başlayacaqlar. Nəhayət, onlar selabda[1] bitən bitkilər kimi (sürətlə) dirçələcək və (atəşdən çıxmış hər kəsin) vücudundakı atəş izi itib gedəcək. Sonra (bunların hər biri) o qədər (naz-nemət) istəyəcək ki, nəhayət, ona dünya və onun on misli veriləcəkdir".

**[٤٧٠] ٣١٧**–(...) حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا سُفْيَانُ بْنُ عُيَيْنَةَ عَنْ عَمْرٍو سَمِعَ جَابِرًا يَقُولُ: سَمِعَهُ مِنْ النَّبِيِّ ﷺ بِأُذُنِهِ يَقُولُ: ((إِنَّ اللَّهَ يُخْرِجُ نَاسًا مِنْ النَّارِ فَيُدْخِلَهُمْ الْجَنَّةَ)).

**[470]-317-(...)** ........ Süfyan ibn Uyeynə rəvayət edir ki, Amr, Cabirin belə dediyini eşitmişdir: "Mən bu hədisi Peyğəmbərdən ﷺ öz qulağımla eşitmişəm. (O demişdir): "Allah bir qisim insanı Cəhənnəmdən çıxarıb Cənnətə daxil edəcək".

**[٤٧١] ٣١٨**–(...) حَدَّثَنَا أَبُو الرَّبِيعِ: حَدَّثَنَا حَمَّادُ بْنُ زَيْدٍ قَالَ: قُلْتُ لِعَمْرِو بْنِ دِينَارٍ: أَسَمِعْتَ جَابِرَ بْنَ عَبْدِ اللَّهِ يُحَدِّثُ عَنْ رَسُولِ اللَّهِ ﷺ: ((إِنَّ اللَّهَ يُخْرِجُ قَوْمًا مِنْ النَّارِ بِالشَّفَاعَةِ؟)) قَالَ: نَعَمْ.

**[471]-318-(...)** ........ Həmmad ibn Zeyd demişdir: "Mən Amr ibn Dinardan: "Sən Cabir ibn Abdullahdan, Peyğəmbərin ﷺ: "Allah bir qisim insanı şəfaət sayəsində Cəhənnəmdən çıxardacaq"– dediyini eşitmisənmi?"– deyə soruşdum. O: "Bəli!"– deyə cavab verdi".

**[٤٧٢] ٣١٩**–(...) حَدَّثَنَا حَجَّاجُ بْنُ الشَّاعِرِ: حَدَّثَنَا أَبُو أَحْمَدَ الزُّبَيْرِيُّ: حَدَّثَنَا قَيْسُ بْنُ سُلَيْمٍ الْعَنْبَرِيُّ قَالَ: حَدَّثَنِي يَزِيدُ الْفَقِيرُ حَدَّثَنَا جَابِرُ بْنُ عَبْدِ اللَّهِ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((إِنَّ قَوْمًا يُخْرَجُونَ مِنْ النَّارِ يَحْتَرِقُونَ فِيهَا، إِلاَّ دَارَاتِ وُجُوهِهِمْ، حَتَّى يَدْخُلُونَ الْجَنَّةَ)).

**[472]-319-(...)** ........ Cabir ibn Abdullah ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Bir qisim insan – üzləri istisna olmaqla – (bir müddət) Cəhənnəm odunda yandıqdan sonra oradan çıxarılacaq və nəhayət, Cənnətə girəcəkdir".

**[٤٧٣] ٣٢٠**–(...) و حَدَّثَنَا حَجَّاجُ بْنُ الشَّاعِرِ: حَدَّثَنَا الْفَضْلُ بْنُ دُكَيْنٍ: حَدَّثَنَا أَبُو عَاصِمٍ يَعْنِي مُحَمَّدَ بْنَ أَبِي أَيُّوبَ قَالَ: حَدَّثَنِي يَزِيدُ الْفَقِيرُ قَالَ: كُنْتُ قَدْ شَغَفَنِي رَأْيٌ مِنْ رَأْيِ الْخَوَارِجِ فَخَرَجْنَا فِي عِصَابَةٍ ذَوِي عَدَدٍ نُرِيدُ أَنْ نَحُجَّ، ثُمَّ نَخْرُجَ عَلَى النَّاسِ، قَالَ: فَمَرَرْنَا عَلَى الْمَدِينَةِ فَإِذَا جَابِرُ بْنُ عَبْدِ اللَّهِ يُحَدِّثُ الْقَوْمَ – جَالِسٌ إِلَى

[1] Selin axarkən yuyub əmələ gətirdiyi dərə, oyuq, arx, selin açdığı yol.

سَارِيَةٍ – عَنْ رَسُولِ اللَّهِ ﷺ، قَالَ: فَإِذَا هُوَ قَدْ ذَكَرَ الْجَهَنَّمِيِّينَ، – قَالَ فَقُلْتُ لَهُ: يَا صَاحِبَ رَسُولِ اللَّهِ! مَا هَذَا الَّذِي تُحَدِّثُونَ؟ وَاللَّهُ يَقُولُ: ﴿إِنَّكَ مَن تُدْخِلِ ٱلنَّارَ فَقَدْ أَخْزَيْتَهُۥ﴾ وَ ﴿كُلَّمَآ أَرَادُوٓاْ أَن يَخْرُجُواْ مِنْهَآ أُعِيدُواْ فِيهَا﴾ فَمَا هَذَا الَّذِي تَقُولُونَ؟ قَالَ، فَقَالَ: أَتَقْرَأُ الْقُرْآنَ؟ قُلْتُ: نَعَمْ، قَالَ: فَهَلْ سَمِعْتَ بِمَقَامِ مُحَمَّدٍ ﷺ – يَعْنِي الَّذِي يَبْعَثُهُ اللَّهُ فِيهِ؟ – قُلْتُ: نَعَمْ. قَالَ: فَإِنَّهُ مَقَامُ مُحَمَّدٍ ﷺ الْمَحْمُودُ الَّذِي يُخْرِجُ اللَّهُ بِهِ مَنْ يُخْرِجُ قَالَ: ثُمَّ نَعَتَ وَضْعَ الصِّرَاطِ وَمَرَّ النَّاسِ عَلَيْهِ، قَالَ: وَأَخَافُ أَنْ لاَ أَكُونَ أَحْفَظُ ذَاكَ قَالَ: غَيْرَ أَنَّهُ قَدْ زَعَمَ أَنَّ قَوْمًا يَخْرُجُونَ مِنَ النَّارِ بَعْدَ أَنْ يَكُونُوا فِيهَا قَالَ: يَعْنِي فَيَخْرُجُونَ كَأَنَّهُمْ عِيدَانُ السَّمَاسِمِ، قَالَ–: فَيَدْخُلُونَ نَهَرًا مِنْ أَنْهَارِ الْجَنَّةِ فَيَغْتَسِلُونَ فِيهِ، فَيَخْرُجُونَ كَأَنَّهُمُ الْقَرَاطِيسُ، فَرَجَعْنَا قُلْنَا: وَيْحَكُمْ! أَتُرَوْنَ الشَّيْخَ يَكْذِبُ عَلَى رَسُولِ اللَّهِ ﷺ؟ فَرَجَعْنَا، فَلاَ وَاللَّهِ! مَا خَرَجَ مِنَّا غَيْرُ رَجُلٍ وَاحِدٍ – أَوْ كَمَا قَالَ أَبُو نُعَيْمٍ.

**[473]-320-(...)** ........ Yezid əl-Fəqir demişdir: "Xəvariclərin[1] fikirlərindən bir fikir qəlbimi coşdurmuşdu. (O zaman) biz həcc etmək, sonra da insanları xəvaricliyə dəvət etmək məqsədilə bir dəstə adamla bərabər yola düşdük. Nəhayət, gəlib Mədinəyə çatdıq. Baxdıq ki, Cabir ibn Abdullah bir dirəyin yanında oturub camaata Peyğəmbərdən ﷺ hədis danışır. Bu əsnada o, cəhənnəmlikləri zikr etdi.[2] Onda mən ona dedim: "Ey Rəsulullahın səhabəsi! Bu nə (hədisdir) danışırsan?! Axı, Allah buyurur: **"Sən Oda saldığın kəsi rüsvay edərsən..."**[3] və **"Hər dəfə onlar oddan çıxmaq istədikdə, yenidən ora qaytarılacaqlar".**[4]

(Buna əsasən) bu danışdıqlarınız nədir?!" (Cabir məndən): "Sən Quran oxuyursanmı?"– deyə soruşdu. Mən: "Bəli!"– deyə cavab verdim. Yenə soruşdu: "Muhəmmədin ﷺ məqamı – yəni Allahın onu çatdıracağı yer – barəsində eşitmisənmi?" Mən: "Bəli!"– deyə cavab verdim. Dedi: "Bu, Muhəmmədin ﷺ həmin təriflənən məqamıdır ki, Allah onun vasitəsilə (Cəhənnəmdən) çıxaracaqlarını çıxaracaq". Sonra Cabir qıl körpüsünün harada yerləşdiyini və insanların onun üstündən nə cür keçəcəklərini vəsf etdi. Bunları yadda saxlamamış olduğumdan qorxuram. Ancaq onu deyə bilərəm ki, o bunları söyləmişdir: "Bir qrup adam (bir müddət) Cəhənnəmdə qaldıqdan sonra oradan çıxacaqdır. Onlar sanki simsim[5] çubuqları kimi (qaralmış halda) çıxacaqlar.

---

[1] 277-ci hədisin qeydlərinə bax.
[2] Yəni tövhid-əhlindən Cəhənnəmə düşənlərin nə vaxtsa oradan çıxacaqlarını xəbər verdi.
[3] "Ali-İmran" surəsi, 192.
[4] "əs-Səcdə" surəsi, 20.
[5] Küncüd fəsiləsindən olan qara rəngli bitkidir.

Sonra Cənnət çaylarından birinə daxil olub orada yuyunacaq və oradan kağız kimi (ağappaq) çıxacaqlar".

Sonra biz (həcc ziyarətindən) geri döndük və (səhv fikirdə olanlara) dedik: "Vay sizin halınıza! Yoxsa o şeyxin[1] Peyğəmbərin ﷺ adından yalan danışdığını güman edirsiniz?!" Beləliklə, biz (xəvariclikdən) vaz keçdik. Vallahi, aramızda bir nəfərdən başqa, xəvaric fikirlərində qalan olmamışdı".

Yaxud Əbu Nueym[2] (Fədl ibn Dukeynin) dediyi kimidir.[3]

**[٤٧٤] ٣٢١-(١٩٢)** حَدَّثَنَا هَدَّابُ بْنُ خَالِدٍ الأَزْدِيُّ: حَدَّثَنَا حَمَّادُ بْنُ سَلَمَةَ، عَنْ أَبِي عِمْرَانَ وَثَابِتٍ، عَنْ أَنَسِ بْنِ مَالِكٍ، أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: ((يَخْرُجُ مِنَ النَّارِ أَرْبَعَةٌ فَيُعْرَضُونَ عَلَى اللَّهِ تَعَالَى. فَيَلْتَفِتُ أَحَدُهُمْ فَيَقُولُ: أَيْ رَبِّ! إِذْ أَخْرَجْتَنِي مِنْهَا فَلاَ تُعِدْنِي فِيهَا، فَيُنْجِيهِ اللَّهُ مِنْهَا)).

**[474]-321-(192)** ........ Ənəs ibn Malik ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Dörd nəfər oddan çıxarılacaq və Allah Təaləyə təqdim ediləcək. (Onda) onlardan biri (üzünü Allaha) çevirib deyəcək: "Ey Rəbbim! Məni oddan çıxartdıqdan sonra bir daha ora qaytarma!" Allah da onu oddan xilas edəcək".

**[٤٧٥] ٣٢٢-(١٩٣)** حَدَّثَنَا أَبُو كَامِلٍ فُضَيْلُ بْنُ حُسَيْنٍ الْجَحْدَرِيُّ وَمُحَمَّدُ بْنُ عُبَيْدٍ الْغُبَرِيُّ - وَاللَّفْظُ لأَبِي كَامِلٍ - قَالَ: حَدَّثَنَا أَبُو عَوَانَةَ عَنْ قَتَادَةَ عَنْ أَنَسِ بْنِ مَالِكٍ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((يَجْمَعُ اللَّهُ النَّاسَ يَوْمَ الْقِيَامَةِ، فَيَهْتَمُّونَ لِذَلِكَ - وقَالَ ابْنُ عُبَيْدٍ: فَيُلْهَمُونَ لِذَلِكَ - فَيَقُولُونَ: لَوْ اسْتَشْفَعْنَا عَلَى رَبِّنَا حَتَّى يُرِيحَنَا مِنْ مَكَانِنَا هَذَا! قَالَ: فَيَأْتُونَ آدَمَ عَلَيْهِ السَّلاَمُ فَيَقُولُونَ: أَنْتَ آدَمُ أَبُو الْخَلْقِ، خَلَقَكَ اللَّهُ بِيَدِهِ وَنَفَخَ فِيكَ مِنْ رُوحِهِ، وَأَمَرَ الْمَلاَئِكَةَ فَسَجَدُوا لَكَ، اشْفَعْ لَنَا عِنْدَ رَبِّكَ حَتَّى يُرِيحَنَا مِنْ مَكَانِنَا هَذَا. فَيَقُولُ: لَسْتُ هُنَاكُمْ، - فَيَذْكُرُ خَطِيئَتَهُ الَّتِي أَصَابَ، فَيَسْتَحْيِي رَبَّهُ مِنْهَا، وَلَكِنْ ائْتُوا نُوحًا، أَوَّلَ رَسُولٍ بَعَثَهُ اللَّهُ تَعَالَى، قَالَ: فَيَأْتُونَ نُوحًا عَلَيْهِ السَّلاَمُ، فَيَقُولُ: لَسْتُ هُنَاكُمْ - فَيَذْكُرُ خَطِيئَتَهُ الَّتِي أَصَابَ فَيَسْتَحْيِي رَبَّهُ مِنْهَا - وَلَكِنْ ائْتُوا إِبْرَاهِيمَ عَلَيْهِ السَّلاَمُ الَّذِي اتَّخَذَهُ اللَّهُ خَلِيلاً، فَيَأْتُونَ إِبْرَاهِيمَ عَلَيْهِ السَّلاَمُ فَيَقُولُ، لَسْتُ هُنَاكُمْ - وَيَذْكُرُ خَطِيئَتَهُ الَّتِي أَصَابَ فَيَسْتَحْيِي رَبَّهُ مِنْهَا - وَلَكِنْ ائْتُوا مُوسَى ﷺ، الَّذِي كَلَّمَهُ اللَّهُ وَأَعْطَاهُ التَّوْرَاةَ - قَالَ -: فَيَأْتُونَ مُوسَى عَلَيْهِ السَّلاَمُ فَيَقُولُ: لَسْتُ هُنَاكُمْ - وَيَذْكُرُ خَطِيئَتَهُ الَّتِي أَصَابَ فَيَسْتَحْيِي رَبَّهُ مِنْهَا - وَلَكِنْ ائْتُوا عِيسَى رُوحَ اللَّهِ وَكَلِمَتَهُ، فَيَأْتُونَ عِيسَى رُوحَ اللَّهِ وَكَلِمَتَهُ، فَيَقُولُ: لَسْتُ هُنَاكُمْ، وَلَكِنْ ائْتُوا

---

[1] Yəni Cabir ibn Abdullah ﷺ.

[2] Əbu Nueym, Muslimin şeyxinin şeyxidir.

[3] Bu üslub, mühəddislərin məşhur üslubudur. Belə ki, hədisi məna ilə rəvayət edən hər bir ravi, rəvayət etdiyi hədisi bitirdikdən sonra ehtiyat üçün: "filankəsin dediyi kimidir" deyir.

مُحَمَّدًا ﷺ عَبْدًا قَدْ غُفِرَ لَهُ مَا تَقَدَّمَ مِنْ ذَنْبِهِ وَمَا تَأَخَّرَ)). قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((فَيَأْتُونِي، فَأَسْتَأْذِنُ عَلَى رَبِّي تَعَالَى فَيُؤْذَنُ لِي، فَإِذَا أَنَا رَأَيْتُهُ وَقَعْتُ سَاجِدًا، فَيَدَعُنِي مَا شَاءَ اللَّهُ، فَيُقَالُ: يَا مُحَمَّدُ! ارْفَعْ رَأْسَكَ، قُلْ تُسْمَعْ، سَلْ تُعْطَهْ، اشْفَعْ تُشَفَّعْ، فَأَرْفَعُ رَأْسِي، فَأَحْمَدُ رَبِّي تَعَالَى بِتَحْمِيدٍ يُعَلِّمُنِيهِ رَبِّي ثُمَّ أَشْفَعُ، فَيَحُدُّ لِي حَدًّا فَأُخْرِجُهُمْ مِنَ النَّارِ، وَأُدْخِلُهُمُ الْجَنَّةَ، ثُمَّ أَعُودُ فَأَقَعُ سَاجِدًا، فَيَدَعُنِي مَا شَاءَ اللَّهُ أَنْ يَدَعَنِي ثُمَّ يُقَالُ: ارْفَعْ رَأْسَكَ يَا مُحَمَّدُ قُلْ تُسْمَعْ، سَلْ تُعْطَهْ، اشْفَعْ تُشَفَّعْ، فَأَرْفَعُ رَأْسِي، فَأَحْمَدُ رَبِّي بِتَحْمِيدٍ يُعَلِّمُنِيهِ رَبِّي. ثُمَّ أَشْفَعُ، فَيَحُدُّ لِي حَدًّا فَأُخْرِجَهُمْ مِنَ النَّارِ، وَأُدْخِلُهُمُ الْجَنَّةَ – قَالَ: فَلاَ أَدْرِي فِي الثَّالِثَةِ أَوْ فِي الرَّابِعَةِ قَالَ – فَأَقُولُ: يَا رَبِّ! مَا بَقِيَ فِي النَّارِ إِلاَّ مَنْ حَبَسَهُ الْقُرْآنُ أَيْ وَجَبَ عَلَيْهِ الْخُلُودُ)).

قَالَ ابْنُ عُبَيْدٍ فِي رِوَايَتِهِ: قَالَ قَتَادَةُ: أَيْ: وَجَبَ عَلَيْهِ الْخُلُودُ)).

**[475]-322-(193)** ........ Ənəs ibn Malik ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Qiyamət günü Allah insanları (məhşərə) toplayacaq. (O zaman) onlar diqqət yetirəcək,[1] (onlara ilham veriləcək)[2] və onlar deyəcəklər: "Gəlin Rəbbimizin yanında bizə şəfaət (edəcək bir adam) tapaq, bizi bu (acınacaqlı) vəziyyətdən qurtarsın". Bundan sonra onlar Adəmin ﷺ yanına gəlib deyəcəklər: "Sən bəşəriyyətin atası Adəmsən! Allah səni Öz Əli ilə yaratmış[3] və sənə Öz ruhundan üfürmüşdür.[4] Sonra mələklərə əmr etmiş və onlar sənə səcdə etmişlər. (Elə isə) Rəbbinin yanında bizdən ötrü havadarlıq et, bizi bu (acınacaqlı) vəziyyətdən qurtarsın". Adəm: "Mən bu (məqama) layiq deyiləm"– deyə cavab verəcək, sonra etdiyi xətanı xatırlayacaq, buna görə Rəbbindən utanacaq və (onlara): "Lakin siz Uca Allahın göndərdiyi ilk rəsulun – Nuhun yanına gedin!"– deyəcək. Onda onlar Nuhun ﷺ yanına gələcəklər. Nuh: "Mən bu (məqama) layiq deyiləm"– deyə cavab verəcək, sonra etdiyi xətanı xatırlayacaq, buna görə Rəbbindən utanacaq və (onlara): "Lakin siz Allahın Özünə ən sevimli dost tutduğu[5] İbrahimin ﷺ yanına gedin!"– deyəcək. Onda onlar İbrahimin ﷺ yanına gələcəklər. İbrahim: "Mən bu (məqama) layiq deyiləm"– deyə

[1] İnsanlar canlarını əzabdan qurtarsınlar deyə, özləri üçün şəfaətçi axtaracaqlar.

[2] Bu sözü İbn Ubeyd nəql etmişdir.

[3] Quranda buyurulur: **"*Allah* dedi: "Ey İblis! Sənə Mənim iki Əlimlə yaratdığıma səcdə etməyə mane olan nə idi? Təkəbbür göstərdin, yoxsa özünü yüksək tutdun?"** ("Sad" surəsi, 75).

[4] Allah buyurur: **"Bir zaman sənin Rəbbin mələklərə belə demişdi: "Mən palçıqdan bir insan yaradacağam. Mən ona surət verib Öz ruhumdan üfürdüyüm zaman ona səcdə edin!" Mələklərin hamısı birlikdə səcdə etdi. Yalnız İblisdən başqa! O təkəbbür göstərdi və kafirlərdən oldu"** ("Sad" surəsi, 71-74).

[5] Allah buyurur: **"Allah İbrahimi sevimli dost tutmuşdur"** ("ən-Nisa" surəsi, 125).

cavab verəcək, sonra etdiyi xətanı xatırlayacaq, buna görə Rəbbindən utanacaq və (onlara): "Lakin siz Allahın (bilavasitə) danışdığı,[1] özünə də Tövrat bəxş etdiyi Musanın ﷺ yanına gedin!"– deyəcək. Onda onlar Musanın عليه السلام yanına gələcəklər. Musa: "Mən bu (məqama) layiq deyiləm"– deyə cavab verəcək, sonra etdiyi xətanı xatırlayacaq, buna görə Rəbbindən utanacaq və (onlara): "Lakin siz Allahın Ruhu[2] və Kəlməsi olan İsanın عليه السلام yanına gedin!"– deyəcək. Onda onlar Allahın Ruhu[3] və Kəlməsi olan İsanın yanına gələcəklər. İsa (onlara): "Mən bu (məqama) layiq deyiləm. Lakin siz bütün keçmiş və gələcək xətaları bağışlanmış bir qulun – Muhəmmədin ﷺ yanına gedin!"– deyəcək.

Peyğəmbər ﷺ buyurdu: "Sonra onlar mənim yanıma gələcəklər. Mən Uca Rəbbimdən izin istəyəcəyəm və mənə izin veriləcəkdir. Mən Onu gördüyüm an səcdəyə qapanacağam. Allah istədiyi qədər məni bu vəziyyətdə saxlayacaq. Sonra (mənə belə) buyurulacaq: "Ey Muhəmməd! Başını qaldır, söylə, sözün dinlənəcək, istə, sənə (istədiyin) veriləcək, havadarlıq et, havadarlığın qəbul olunacaq".

Mən başımı (səcdədən) qaldırıb Uca Rəbbimin mənə öyrətdiyi həmd-sənalarla Rəbbimi tərifləyəcəyəm. Sonra şəfaət edəcəyəm. Mənim üçün hədd qoyulacaq və mən (bir çoxlarını) atəşdən çıxardıb Cənnətə daxil edəcəyəm. Sonra qayıdıb səcdəyə qapanacağam. Allah məni saxlamaq istədiyi qədər bu vəziyyətdə saxlayacaq. Sonra (mənə belə) buyurulacaq: "Başını qaldır, ey Muhəmməd! Söylə, sözün dinlənəcək, istə, sənə (istədiyin) veriləcək, havadarlıq et, havadarlığın qəbul olunacaq". Mən başımı (səcdədən) qaldırıb Uca Rəbbimin

---

[1] Allah buyurur: **"Musa təyin etdiyimiz vaxtda gəldikdə, Rəbbi onunla danışdı"** ("əl-Əraf" surəsi, 143).

[2] Muhəmməd Peyğəmbərin ﷺ səhabələri və ilk müsəlman ilahiyyatçıları "Allah" sözünün təyin olduğu iki söz birləşməsi arasında fərq qoyardılar:

**(a)** söz birləşməsində təyin edilən söz canlı şəxs olduqda və ya cansız əşya olduqda. Məsələn, Beytullah (Allahın Evi); Rəsulullah (Allahın Elçisi); Abdullah (Allahın qulu); Ruhullah (Allahın Ruhu). Bu və başqa belə ifadələrdə təyin olunan söz Uca Allah tərəfindən yaradılmışları bildirir. "Allahın Ruhu" ifadəsi onu Allahın yaratdığını və onun Ona məxsus olduğunu bildirir. Bu adla Allahın peyğəmbəri İsa عليه السلام çağırılır. Onu yaradan zaman Allah: "Ol!"- deyə buyurmuş və o peyğəmbər də qeybdən yaranmışdır. Eynilə bu qaydada Adəm peyğəmbərin عليه السلام də ruhu xəlq edilmişdir.

**(b)** söz birləşməsində təyin olunan söz keyfiyyət bildirəndə. Məsələn: Elmullah (Allahın elmi); Kəlamullah (Allahın sözü); Zatullah (Allahın Özü). Bu və digər belə ifadələr Uca Allaha xas olan ilahi keyfiyyətləri əks etdirir.

[3] Allah buyurur: **"İsmətini qoruyan *Məryəmi də yada sal!* Biz ona Öz ruhumuzdan *Cəbrail vasitəsilə* üfürdük, onu və onun oğlunu aləmlərə bir möcüzə etdik"** ("əl-Ənbiya" surəsi, 91).

mənə öyrətdiyi həmd-sənalarla Rəbbimi təriflэyəcəyəm. Sonra şəfaət edəcəyəm. Mənim üçün hədd qoyulacaq və mən (yenə bir çoxlarını) oddan çıxardıb Cənnətə daxil edəcəyəm".

(Ravi demişdir): "Mən bilmirəm, Peyğəmbər ﷺ ya üçüncüsündə, ya dördüncüsündə belə buyurdu. "Nəhayət, mən deyəcəyəm: "Ey Rəbbim! Odda, Quranın tutub saxladıqlarından başqa, (yəni özlərinə əbədi olaraq odda qalmaq vacib buyurulanlardan başqa) bir kimsə qalmamışdır".

İbn Ubeyd öz rəvayətində demişdir: "Qətadə demişdir: "Yəni özlərinə əbədi olaraq (Cəhənnəmdə) qalmaq vacib buyurulanlar".

**[٤٧٦] ٣٢٣**–(...) و حَدَّثَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى وَمُحَمَّدُ بْنُ بَشَّارٍ قَالاَ: حَدَّثَنَا ابْنُ أَبِي عَدِيٍّ عَنْ سَعِيد، عَنْ قَتَادَةَ، عَنْ أَنَسٍ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((يَجْتَمِعُ الْمُؤْمِنُونَ يَوْمَ الْقِيَامَة، فَيَهْتَمُّونَ بِذَلِكَ – أَوْ يُلْهَمُونَ ذَلِكَ)) بِمِثْلِ حَدِيثِ أَبِي عَوَانَة، وَقَالَ فِي الْحَدِيثِ: ((ثُمَّ آتِيهِ الرَّابِعَةَ – أَوْ أَعُودُ الرَّابِعَةَ – فَأَقُولُ: يَا رَبِّ! مَا بَقِيَ إِلاَّ مَنْ حَبَسَهُ الْقُرْآنُ)).

**[476]-323-(...)** ........ Ənəs رضي الله عنه rəvayət etmişdir ki, Peyğəmbər ﷺ demişdir: "Qiyamət günü möminlər (məhşərə) toplanacaq və diqqət yetirəcəklər,[1] (yaxud onlara ilham veriləcək)..." Səid bu hədisi Əbu Əvananın hədisi kimi rəvayət etmişdir. Bu hədisdə (Peyğəmbər ﷺ) belə buyurmuşdur: "Sonra mən dördüncü dəfə gələcəyəm, (yaxud qayıdacağam) və: "Ey Rəbbim! Quranın (Cəhənnəmdə) tutub saxladıqlarından başqa[2] heç kəs qalmamışdır"– deyəcəyəm".

**[٤٧٧] ٣٢٤**–(...) حَدَّثَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى: حَدَّثَنَا مُعَاذُ بْنُ هِشَامٍ قَالَ: حَدَّثَنِي أَبِي عَنْ قَتَادَةَ، عَنْ أَنَسِ بْنِ مَالِكٍ أَنَّ نَبِيَّ اللَّهِ ﷺ قَالَ: ((يَجْمَعُ اللَّهُ الْمُؤْمِنِينَ يَوْمَ الْقِيَامَة، فَيُلْهَمُونَ لِذَلِكَ)) بِمِثْلِ حَدِيثِهِمَا، وَذَكَرَ فِي الرَّابِعَةِ: ((فَأَقُولُ: يَا رَبِّ! مَا بَقِيَ فِي النَّارِ إِلاَّ مَنْ حَبَسَهُ الْقُرْآنُ، أَيْ: وَجَبَ عَلَيْهِ الْخُلُودُ)).

**[477]-324-(...)** ........ Ənəs رضي الله عنه rəvayət etmişdir ki, Peyğəmbər ﷺ demişdir: "Qiyamət günü Allah möminləri (məhşərə) toplayacaq və onlara ilham veriləcək..." Hişam bu hədisi Səid və Əbu Əvananın hədisi kimi rəvayət etmişdir.

Bu hədisdə dördüncü dəfə (Peyğəmbər ﷺ demişdir): "Ey Rəbbim! Odda Quranın tutub saxladıqlarından başqa, yəni özlərinə əbədi olaraq (odda) qalmaq vacib buyurulanlardan başqa bir kimsə qalmamışdır"– deyəcəyəm".

---

[1] 475-ci hədisin qeydlərinə bax.

[2] Yəni Cəhənnəmdə əbədi qalacaqları barədə Quranda xəbər verilən kafirlər.

**[٤٧٨] ٣٢٥**–(...) و حَدَّثَنَا مُحَمَّدُ بْنُ مِنْهَالٍ الضَّرِيرُ: حَدَّثَنَا يَزِيدُ بْنُ زُرَيْعٍ: حَدَّثَنَا سَعِيدُ بْنُ أَبِي عَرُوبَةَ وَهِشَامٌ صَاحِبُ الدَّسْتَوَائِيِّ، عَنْ قَتَادَةَ، عَنْ أَنَسِ بْنِ مَالِكٍ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ؛ ح: و حَدَّثَنِي أَبُو غَسَّانَ الْمِسْمَعِيُّ وَمُحَمَّدُ بْنُ الْمُثَنَّى قَالاَ: حَدَّثَنَا مُعَاذٌ وَهُوَ ابْنُ هِشَامٍ قَالَ: حَدَّثَنِي أَبِي، عَنْ قَتَادَةَ: حَدَّثَنَا أَنَسُ بْنُ مَالِكٍ، أَنَّ النَّبِيَّ ﷺ قَالَ: ((يَخْرُجُ مِنَ النَّارِ مَنْ قَالَ: لاَ إِلَهَ إِلاَّ اللَّهُ، وَكَانَ فِي قَلْبِهِ مِنَ الْخَيْرِ مَا يَزِنُ شَعِيرَةً، ثُمَّ يَخْرُجُ مِنَ النَّارِ مَنْ قَالَ: لاَ إِلَهَ إِلاَّ اللَّهُ وَكَانَ فِي قَلْبِهِ مِنَ الْخَيْرِ مَا يَزِنُ بُرَّةً، ثُمَّ يَخْرُجُ مِنَ النَّارِ مَنْ قَالَ: لاَ إِلَهَ إِلاَّ اللَّهُ وَكَانَ فِي قَلْبِهِ مِنَ الْخَيْرِ مَا يَزِنُ ذَرَّةً)).

زَادَ ابْنُ مِنْهَالٍ فِي رِوَايَتِهِ: قَالَ يَزِيدُ: فَلَقِيتُ شُعْبَةَ فَحَدَّثْتُهُ بِالْحَدِيثِ، فَقَالَ شُعْبَةُ: حَدَّثَنَا بِهِ قَتَادَةُ عَنْ أَنَسِ بْنِ مَالِكٍ عَنِ النَّبِيِّ ﷺ بِالْحَدِيثِ إِلاَّ أَنَّ شُعْبَةَ جَعَلَ مَكَانَ الذَّرَّةِ ذُرَةً، قَالَ يَزِيدُ: صَحَّفَ فِيهَا أَبُو بِسْطَامَ.

**[478]-325-(...)** ........ Ənəs ﷺ rəvayət etmişdir ki, Peyğəmbər ﷺ demişdir: "Lə ilahə illəllah" deyən və qəlbində arpa dənəsi ağırlığında iman olan kimsələr Cəhənnəmdən çıxacaqlar. Bundan sonra "lə ilahə illəllah" deyən və qəlbində buğda dənəsi ağırlığında iman olan kimsələr Cəhənnəmdən çıxacaqlar. Sonra da "lə ilahə illəllah" deyən və qəlbində zərrə qədər iman olan kimsələr Cəhənnəmdən çıxacaqlar".

İbn Minhal öz rəvayətində əlavə edib demişdir: "Mən Şobəyə rast gəldim və bu hədisi ona rəvayət etdim. Şobə dedi: "Bu hədisi bizə Qətadə Ənəs ibn Malikdən, o da Peyğəmbərdən ﷺ rəvayət etmişdir". Lakin Şobə öz rəvayətində: "zərrə"[1] sözü əvəzinə "zurə"[2] sözünü işlətmişdir.

Yezid demişdir: "Bu kəliməni Əbu Bistam təhrif etmişdir".

**[٤٧٩] ٣٢٦**–(...) حَدَّثَنَا أَبُو الرَّبِيعِ الْعَتَكِيُّ: حَدَّثَنَا حَمَّادُ بْنُ زَيْدٍ: حَدَّثَنَا مَعْبَدُ بْنُ هِلاَلٍ الْعَنَزِيُّ؛ ح: و حَدَّثَنَاه سَعِيدُ بْنُ مَنْصُورٍ – وَاللَّفْظُ لَهُ –: حَدَّثَنَا حَمَّادُ بْنُ زَيْدٍ: حَدَّثَنَا مَعْبَدُ بْنُ هِلاَلٍ الْعَنَزِيُّ قَالَ: انْطَلَقْنَا إِلَى أَنَسِ بْنِ مَالِكٍ وَتَشَفَّعْنَا بِثَابِتٍ، فَانْتَهَيْنَا إِلَيْهِ وَهُوَ يُصَلِّي الضُّحَى، فَاسْتَأْذَنَ لَنَا ثَابِتٌ، فَدَخَلْنَا عَلَيْهِ، وَأَجْلَسَ ثَابِتًا مَعَهُ عَلَى سَرِيرِهِ فَقَالَ لَهُ: يَا أَبَا حَمْزَةَ! إِنَّ إِخْوَانَكَ مِنْ أَهْلِ الْبَصْرَةِ يَسْأَلُونَكَ أَنْ تُحَدِّثَهُمْ حَدِيثَ الشَّفَاعَةِ. قَالَ: حَدَّثَنَا مُحَمَّدٌ ﷺ قَالَ: ((إِذَا كَانَ يَوْمُ الْقِيَامَةِ مَاجَ النَّاسُ بَعْضُهُمْ إِلَى بَعْضٍ، فَيَأْتُونَ آدَمَ عَلَيْهِ السَّلاَم فَيَقُولُونَ لَهُ: اشْفَعْ لِذُرِّيَّتِكَ، فَيَقُولُ: لَسْتُ لَهَا، وَلَكِنْ عَلَيْكُمْ بِإِبْرَاهِيمَ عَلَيْهِ السَّلاَم، فَإِنَّهُ خَلِيلُ اللَّهِ. فَيَأْتُونَ إِبْرَاهِيمَ عَلَيْهِ السَّلاَم، فَيَقُولُ: لَسْتُ لَهَا، وَلَكِنْ عَلَيْكُمْ بِمُوسَى عَلَيْهِ السَّلاَم، فَإِنَّهُ كَلِيمُ اللَّهِ فَيُؤْتَى مُوسَى – عَلَيْهِ السَّلاَم – فَيَقُولُ: لَسْتُ لَهَا، وَلَكِنْ عَلَيْكُمْ بِعِيسَى عَلَيْهِ السَّلاَم، فَإِنَّهُ رُوحُ اللَّهِ وَكَلِمَتُهُ، فَيُؤْتَى عِيسَى – عَلَيْهِ السَّلاَم – فَيَقُولُ: لَسْتُ لَهَا، وَلَكِنْ عَلَيْكُمْ بِمُحَمَّدٍ ﷺ، فَأُوتَى فَأَقُولُ: أَنَا لَهَا، فَأَنْطَلِقُ فَأَسْتَأْذِنُ

[1] Zərrə – bir şeyin ən kiçik hissəsi, çox kiçicik hissələr.

[2] Zurə – qarğıdalı.

عَلَى رَبِّي، فَيُؤْذَنُ لِي، فَأَقُومُ بَيْنَ يَدَيْهِ، فَأَحْمَدُهُ بِمَحَامِدَ لاَ أَقْدِرُ عَلَيْهِ الآنَ، يُلْهِمُنِيهِ اللَّهُ تَعَالَى، ثُمَّ أَخِرُّ لَهُ سَاجِدًا، فَيُقَالُ لِي: يَا مُحَمَّدُ! ارْفَعْ رَأْسَكَ، وَقُلْ يُسْمَعْ لَكَ، وَسَلْ تُعْطَهْ، وَاشْفَعْ تُشَفَّعْ، فَأَقُولُ: يَا رَبِّ! أُمَّتِي، أُمَّتِي. فَيُقَالُ لِي: انْطَلِقْ، فَمَنْ كَانَ فِي قَلْبِهِ مِثْقَالُ حَبَّةٍ مِنْ بُرَّةٍ أَوْ شَعِيرَةٍ مِنْ إِيمَانٍ فَأَخْرِجْهُ مِنْهَا، فَأَنْطَلِقُ فَأَفْعَلُ، ثُمَّ أَرْجِعُ إِلَى رَبِّي فَأَحْمَدُهُ بِتِلْكَ الْمَحَامِدِ، ثُمَّ أَخِرُّ لَهُ سَاجِدًا، فَيُقَالُ لِي: يَا مُحَمَّدُ! ارْفَعْ رَأْسَكَ، وَقُلْ يُسْمَعْ لَكَ، وَسَلْ تُعْطَهْ، وَاشْفَعْ تُشَفَّعْ، فَأَقُولُ: يَا رَبِّي! أُمَّتِي، أُمَّتِي. فَيُقَالُ لِي: انْطَلِقْ، فَمَنْ كَانَ فِي قَلْبِهِ مِثْقَالُ حَبَّةٍ مِنْ خَرْدَلٍ مِنْ إِيمَانٍ فَأَخْرِجْهُ مِنْهَا، فَأَنْطَلِقُ فَأَفْعَلُ، ثُمَّ أَعُودُ إِلَى رَبِّي فَأَحْمَدُهُ بِتِلْكَ الْمَحَامِدِ، ثُمَّ أَخِرُّ لَهُ سَاجِدًا، فَيُقَالُ لِي: يَا مُحَمَّدُ! ارْفَعْ رَأْسَكَ، وَقُلْ يُسْمَعْ لَكَ، وَسَلْ تُعْطَهْ، وَاشْفَعْ تُشَفَّعْ، فَأَقُولُ: يَا رَبِّ! أُمَّتِي، أُمَّتِي. فَيُقَالُ لِي: انْطَلِقْ، فَمَنْ كَانَ فِي قَلْبِهِ أَدْنَى أَدْنَى أَدْنَى مِنْ مِثْقَالِ حَبَّةٍ مِنْ خَرْدَلٍ مِنْ إِيمَانٍ فَأَخْرِجْهُ مِنَ النَّارِ، فَأَنْطَلِقُ فَأَفْعَلُ)).

هَذَا حَدِيثُ أَنَسٍ الَّذِي أَنْبَأَنَا بِهِ قَالَ: فَخَرَجْنَا مِنْ عِنْدِهِ، فَلَمَّا كُنَّا بِظَهْرِ الْجَبَّانِ قُلْنَا: لَوْ مِلْنَا إِلَى الْحَسَنِ فَسَلَّمْنَا عَلَيْهِ، وَهُوَ مُسْتَخْفٍ فِي دَارِ أَبِي خَلِيفَةَ. قَالَ فَدَخَلْنَا عَلَيْهِ فَسَلَّمْنَا عَلَيْهِ، فَقُلْنَا: يَا أَبَا سَعِيدٍ جِئْنَا مِنْ عِنْدِ أَخِيكَ أَبِي حَمْزَةَ، فَلَمْ نَسْمَعْ مِثْلَ حَدِيثٍ حَدَّثَنَاهُ فِي الشَّفَاعَةِ، قَالَ: هِيهِ! فَحَدَّثْنَاهُ الْحَدِيثَ، فَقَالَ: هِيهِ! قُلْنَا: مَا زَادَنَا، قَالَ: قَدْ حَدَّثَنَا بِهِ مُنْذُ عِشْرِينَ سَنَةً وَهُوَ يَوْمَئِذٍ جَمِيعٌ وَلَقَدْ تَرَكَ شَيْئًا مَا أَدْرِي أَنَسِيَ الشَّيْخُ أَوْ كَرِهَ أَنْ يُحَدِّثَكُمْ فَتَتَّكِلُوا، قُلْنَا لَهُ: حَدِّثْنَا. فَضَحِكَ وَقَالَ: خُلِقَ الإِنْسَانُ مِنْ عَجَلٍ. مَا ذَكَرْتُ لَكُمْ هَذَا إِلاَّ وَأَنَا أُرِيدُ أَنْ أُحَدِّثَكُمُوهُ، قَالَ: ((ثُمَّ أَرْجِعُ إِلَى رَبِّي فِي الرَّابِعَةِ فَأَحْمَدُهُ بِتِلْكَ الْمَحَامِدِ، ثُمَّ أَخِرُّ لَهُ سَاجِدًا، فَيُقَالُ لِي: يَا مُحَمَّدُ! ارْفَعْ رَأْسَكَ، وَقُلْ يُسْمَعْ لَكَ، وَسَلْ تُعْطَ، وَاشْفَعْ تُشَفَّعْ، فَأَقُولُ: يَا رَبِّ! ائْذَنْ لِي فِيمَنْ قَالَ: لاَ إِلَهَ إِلاَّ اللَّهُ، قَالَ: لَيْسَ ذَاكَ لَكَ – أَوْ قَالَ لَيْسَ ذَاكَ إِلَيْكَ – وَلَكِنْ، وَعِزَّتِي وَكِبْرِيَائِي وَعَظَمَتِي وَجِبْرِيَائِي لأُخْرِجَنَّ مَنْ قَالَ: لاَ إِلَهَ إِلاَّ اللَّهُ)).

قَالَ فَأَشْهَدُ عَلَى الْحَسَنِ، أَنَّهُ حَدَّثَنَا بِهِ، أَنَّهُ سَمِعَ أَنَسَ بْنَ مَالِكٍ، أُرَاهُ قَالَ قَبْلَ عِشْرِينَ سَنَةً، وَهُوَ يَوْمَئِذٍ جَمِيعٌ.

**[479]-326-(...)** ........ Məbəd ibn Hilal əl-Ənəzi demişdir: "Biz Ənəs ibn Malikin yanına getdik və (onun yanına girmək üçün) Sabit (əl-Bunanidən) bizə havadarlıq etməyi xahiş etdik. Biz onun yanına gəlib çatdıqda o, duha namazını qılırdı. Sabit bizim üçün izin istədi və biz Ənəsin yanına daxil olduq. Ənəs Sabiti öz yanında, çarpayısının üstündə oturtdu. Sabit ona dedi: "Ey Əbu Həmzə! Bəsrə əhlindən olan bu qardaşların səndən şəfaət haqqındakı hədisi onlara danışmağını xahiş edirlər".

Ənəs dedi: "Muhəmməd ﷺ bizə belə rəvayət etmişdir: "Qiyamət günü gəldiyi zaman insanlar bir-birinə dəyəcəklər. Sonra da Adəmin ﷺ yanına gəlib ona: "Zürriyyətindən ötrü şəfaət et!"– deyəcəklər. Adəm isə: "Mən buna layiq deyiləm, lakin siz İbrahimin ﷺ yanına gedin. Çünki o, Allahın ən sevimli

dostudur”. Onda onlar İbrahimin yanına gələcəklər. İbrahim (onlara) deyəcək: “Mən buna layiq deyiləm, lakin siz Musanın عليه السلام yanına gedin. Çünki o, Allahın (bilavasitə) danışdırdığı bir kəsdir”. Onda onlar Musanın yanına gedəcəklər. Musa (onlara) deyəcək: “Mən buna layiq deyiləm, lakin siz İsanın عليه السلام yanına gedin. Çünki o, Allahın Ruhu və Onun Kəlməsidir”. Onda onlar İsanın yanına gedəcəklər. İsa (onlara) deyəcək: “Mən buna layiq deyiləm, lakin siz Muhəmmədin ﷺ yanına gedin. Nəhayət, mənim yanıma gələcək və mən (onlara): “Mən bu məqama layiqəm”– deyəcəyəm. Sonra da gedib Rəbbimdən izin istəyəcəyəm və mənə izin veriləcək. Mən Rəbbimin hüzurunda durub ona elə həmd-sənalar edəcəyəm ki, indi mən onu etməyə qadir deyiləm. Bunu etməyə isə mənə Uca Allah ilham verəcəkdir. Sonra mən Onun qarşısında səcdəyə qapanacağam. Həmin vaxt mənə belə buyurulacaq: “Ey Muhəmməd! Başını qaldır, söylə, sözün dinlənəcək, istə, sənə (istədiyin) veriləcək, havadarlıq et, havadarlığın qəbul olunacaq”. Mən (başımı səcdədən qaldırıb): “Ey Rəbbim! Ümmətim, ümmətim!”– deyə şəfaət diləyəcəyəm. Onda mənə: “Get, qəlbində buğda və ya arpa dənəsi ağırlığında iman olan kimsələri Cəhənnəmdən çıxart”– deyiləcək. Mən gedib (əmri) yerinə yetirəcəyəm, sonra Rəbbimin yanına qayıdıb Onu, (söylədiyim) o həmd-sənalarla tərif edəcəyəm və səcdəyə qapanacağam. Yenə mənə deyiləcək: “Ey Muhəmməd! Başını qaldır, söylə, sözün dinlənəcək, istə, sənə (istədiyin) veriləcək, havadarlıq et, havadarlığın qəbul olunacaq”. Mən (başımı qaldırıb): “Ey Rəbbim! Ümmətim, ümmətim!”– deyə şəfaət diləyəcəyəm. Onda mənə: “Get, qəlbində xardal dənəsi ağırlığında iman olan kimsələri Cəhənnəmdən çıxart”– deyiləcək. Mən gedib (əmri) yerinə yetirəcəyəm, sonra Rəbbimin yanına qayıdıb Onu, o həmd-sənalarla tərif edəcəyəm və səcdəyə qapanacağam. Yenə mənə deyiləcək: “Ey Muhəmməd! Başını qaldır, söylə, sözün dinlənəcək, istə, sənə (istədiyin) veriləcək, havadarlıq et, havadarlığın qəbul olunacaq”. Mən (başımı qaldırıb): “Ey Rəbbim! Ümmətim, ümmətim!”– deyə şəfaət diləyəcəyəm. Onda mənə: “Get, qəlbində xardal dənəsi ağırlığından daha az, daha az, daha az iman olan kimsələri Cəhənnəmdən çıxart”– deyiləcək. Mən də gedib (əmri) yerinə yetirəcəyəm”.

Bu, Ənəsin bizə rəvayət etdiyi hədisdir. Sonra biz onun yanından çıxdıq. Nəhayət, səhranın ən hündür yerinə gəlib çatdıqda dedik: “Bəlkə Həsən (əl-Bəsrinin) yanına gedib onunla salamlaşaq. O, Əbu Xəlifənin evində gizlənir”[1].

---

[1] Həmin vaxt Həsən əl-Bəsri zalım Həccacdan gizlənirdi.

Sonra onun yanına gəlib ona salam verdik və dedik: “Ey Əbu Səid! Biz qardaşın[1] Əbu Həmzənin yanından gəlirik. Şəfaət haqqında bizə danışdığı hədisin bənzərini heç eşitməmişik”. O: “Davam edin, (hədisi danışın)”– deyə buyurdu. Biz də ona bu hədisi danışdıq. O yenə: “Davam edin”– deyə buyurdu. Dedik: “Ənəs bizə bundan əlavə heç nə danışmadı”. Həsən dedi: “O, bunu bizə iyirmi il öncə danışmışdır. O zaman onun güclü hafizəsi var idi. (İndi isə) o, bəzi şeyləri tərk etmişdir. Mən bilmirəm, şeyx unutdumu, yoxsa arxayınlaşacaqsınız deyə (bunları) sizə danışmaq istəmədi”. Biz ona: “(Elə isə hədisi) bizə sən danış!”– dedik. (Bunu eşidəndə) o güldü və: “İnsan hövsələsiz yaradılmışdır.[2] Mən bunu sizə sadəcə o hədisi sizlərə rəvayət etmək istədiyim üçün zikr etdim”– dedi. (Sonra da hədisin davamını nəql edərək Peyğəmbərin ﷺ belə dediyini) rəvayət etdi: “Sonra dördüncü dəfə mən Rəbbimin yanına qayıdıb Onu, o həmd-sənalarla tərif edəcəyəm və səcdəyə qapanacağam. Yenə mənə deyiləcək: “Ey Muhəmməd! Başını qaldır, söylə, sözün dinlənəcək, istə, sənə (istədiyin) veriləcək, havadarlıq et, havadarlığın qəbul olunacaq”. Mən (başımı qaldırıb): “Ey Rəbbim! Mənə izin ver “lə ilahə illəllah”– deyən kimsələrə şəfaət edim”– deyəcəyəm. Allah buyuracaq: “Bu sənin üçün deyil, (yaxud bu sənə aid deyil). Lakin İzzətimə, Böyüklüyümə, Əzəmətimə və Ululuğuma and olsun ki, Mən: “Lə ilahə illəllah!”– deyən kəsləri (oddan) çıxardacağam”.

(Ravi) demişdir: “Mən şahidlik edirəm ki, Həsən bu hədisi bizə rəvayət etmişdir və şahidlik edirəm ki, o, bu hədisi Ənəs ibn Malikdən eşitmişdir. Güman edirəm ki, Həsən: “(O bu hədisi bizə) iyirmi il öncə, hələ güclü hafizəsi olarkən rəvayət etmişdir”– dedi”.

**[٤٨٠] ٣٢٧–(١٩٤)** حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ وَمُحَمَّدُ بْنُ عَبْدِ اللَّهِ بْنِ نُمَيْرٍ – وَاتَّفَقَا فِي سِيَاقِ الْحَدِيثِ، إِلاَّ مَا يَزِيدُ أَحَدُهُمَا مِنْ الْحَرْفِ بَعْدَ الْحَرْفِ – قَالاَ: حَدَّثَنَا مُحَمَّدُ بْنُ بِشْرٍ: حَدَّثَنَا أَبُو حَيَّانَ عَنْ أَبِي زُرْعَةَ عَنْ أَبِي هُرَيْرَةَ قَالَ: أُتِيَ رَسُولُ اللَّهِ ﷺ يَوْمًا بِلَحْمٍ، فَرُفِعَ إِلَيْهِ الذِّرَاعُ، وَكَانَتْ تُعْجِبُهُ فَنَهَسَ مِنْهَا نَهْسَةً فَقَالَ: ((أَنَا سَيِّدُ النَّاسِ يَوْمَ الْقِيَامَةِ، وَهَلْ تَدْرُونَ بِمَ ذَاكَ؟ يَجْمَعُ اللَّهُ يَوْمَ الْقِيَامَةِ الأَوَّلِينَ وَالآخِرِينَ فِي صَعِيدٍ وَاحِدٍ، فَيُسْمِعُهُمْ الدَّاعِي وَيَنْفُذُهُمْ الْبَصَرُ، وَتَدْنُو الشَّمْسُ فَيَبْلُغُ النَّاسَ مِنْ الْغَمِّ وَالْكَرْبِ مَا لاَ يُطِيقُونَ وَمَا لاَ يَحْتَمِلُونَ، فَيَقُولُ بَعْضُ النَّاسِ لِبَعْضٍ: أَلاَ تَرَوْنَ مَا أَنْتُمْ فِيهِ؟ أَلاَ تَرَوْنَ مَا قَدْ بَلَغَكُمْ؟ أَلاَ تَنْظُرُونَ مَنْ يَشْفَعُ لَكُمْ إِلَى رَبِّكُمْ فَيَقُولُ بَعْضُ النَّاسِ لِبَعْضٍ: ائْتُوا آدَمَ فَيَأْتُونَ آدَمَ – عَلَيْهِ لاسَّلاَمُ – فَيَقُولُونَ: يَا آدَمُ! أَنْتَ

[1] Burada “qardaşın” deyildikdə din qardaşlığı nəzərdə tutulur.
[2] Quranda belə buyurulur: **“İnsan tələsgən yaradılmışdır”** (“əl-Ənbiya” surəsi, 37); **“Doğrusu, insan tələskəndir”** (“əl-İsra” surəsi, 11).

أَبُو الْبَشَرِ، خَلَقَكَ اللَّهُ بِيَدِهِ وَنَفَخَ فِيكَ مِنْ رُوحِهِ وَأَمَرَ الْمَلاَئِكَةَ فَسَجَدُوا لَكَ اشْفَعْ لَنَا إِلَى رَبِّكَ، أَلاَ تَرَى إِلَى مَا نَحْنُ فِيهِ؟ أَلاَ تَرَى إِلَى مَا قَدْ بَلَغَنَا؟ فَيَقُولُ آدَمُ: إِنَّ رَبِّي غَضِبَ الْيَوْمَ غَضَبًا لَمْ يَغْضَبْ قَبْلَهُ مِثْلَهُ، وَلَنْ يَغْضَبَ بَعْدَهُ مِثْلَهُ، وَإِنَّهُ نَهَانِي عَنْ الشَّجَرَةِ فَعَصَيْتُهُ، نَفْسِي، نَفْسِي. اذْهَبُوا إِلَى غَيْرِي، اذْهَبُوا إِلَى نُوحٍ. فَيَأْتُونَ نُوحًا - عَلَيْهِ لاسَّلاَمُ - فَيَقُولُونَ: يَا نُوحُ! أَنْتَ أَوَّلُ الرُّسُلِ إِلَى الأَرْضِ، وَسَمَّاكَ اللَّهُ عَبْدًا شَكُورًا، اشْفَعْ لَنَا إِلَى رَبِّكَ، أَلاَ تَرَى مَا نَحْنُ فِيهِ؟ أَلاَ تَرَى مَا قَدْ بَلَغَنَا؟ فَيَقُولُ لَهُمْ: إِنَّ رَبِّي قَدْ غَضِبَ الْيَوْمَ غَضَبًا لَمْ يَغْضَبْ قَبْلَهُ مِثْلَهُ، وَلَنْ يَغْضَبَ بَعْدَهُ مِثْلَهُ. وَإِنَّهُ قَدْ كَانَتْ لِي دَعْوَةٌ دَعَوْتُ بِهَا عَلَى قَوْمِي، نَفْسِي، نَفْسِي. اذْهَبُوا إِلَى إِبْرَاهِيمَ ﷺ. فَيَأْتُونَ إِبْرَاهِيمَ فَيَقُولُونَ: أَنْتَ نَبِيُّ اللَّهِ وَخَلِيلُهُ مِنْ أَهْلِ الأَرْضِ، اشْفَعْ لَنَا إِلَى رَبِّكَ، أَلاَ تَرَى إِلَى مَا نَحْنُ فِيهِ؟ أَلاَ تَرَى إِلَى مَا قَدْ بَلَغَنَا؟ فَيَقُولُ لَهُمْ إِبْرَاهِيمُ: إِنَّ رَبِّي قَدْ غَضِبَ الْيَوْمَ غَضَبًا لَمْ يَغْضَبْ قَبْلَهُ مِثْلَهُ وَلاَ يَغْضَبُ بَعْدَهُ مِثْلَهُ، وَذَكَرَ كَذَبَاتِهِ، نَفْسِي، نَفْسِي. اذْهَبُوا إِلَى غَيْرِي، اذْهَبُوا إِلَى مُوسَى، فَيَأْتُونَ مُوسَى ﷺ فَيَقُولُونَ: يَا مُوسَى! أَنْتَ رَسُولُ اللَّهِ، فَضَّلَكَ اللَّهُ بِرِسَالاَتِهِ وَبِتَكْلِيمِهِ عَلَى النَّاسِ، اشْفَعْ لَنَا إِلَى رَبِّكَ، أَلاَ تَرَى إِلَى مَا نَحْنُ فِيهِ؟ أَلاَ تَرَى مَا قَدْ بَلَغَنَا؟ فَيَقُولُ لَهُمْ مُوسَى ﷺ: إِنَّ رَبِّي قَدْ غَضِبَ الْيَوْمَ غَضَبًا لَمْ يَغْضَبْ قَبْلَهُ مِثْلَهُ وَلَنْ يَغْضَبَ بَعْدَهُ مِثْلَهُ، وَإِنِّي قَتَلْتُ نَفْسًا لَمْ أُومَرْ بِقَتْلِهَا، نَفْسِي، نَفْسِي. اذْهَبُوا إِلَى عِيسَى ﷺ، فَيَأْتُونَ عِيسَى فَيَقُولُونَ: يَا عِيسَى! أَنْتَ رَسُولُ اللَّهِ وَكَلَّمْتَ النَّاسَ فِي الْمَهْدِ وَكَلِمَةٌ مِنْهُ أَلْقَاهَا إِلَى مَرْيَمَ، وَرُوحٌ مِنْهُ، فَاشْفَعْ لَنَا إِلَى رَبِّكَ، أَلاَ تَرَى مَا نَحْنُ فِيهِ؟ أَلاَ تَرَى مَا قَدْ بَلَغَنَا؟ فَيَقُولُ لَهُمْ عِيسَى ﷺ: إِنَّ رَبِّي قَدْ غَضِبَ الْيَوْمَ غَضَبًا لَمْ يَغْضَبْ قَبْلَهُ مِثْلَهُ وَلَنْ يَغْضَبَ بَعْدَهُ مِثْلَهُ، وَلَمْ يَذْكُرْ لَهُ ذَنْبًا، نَفْسِي، نَفْسِي. اذْهَبُوا إِلَى غَيْرِي، اذْهَبُوا إِلَى مُحَمَّدٍ ﷺ، فَيَأْتُونِّي فَيَقُولُونَ: يَا مُحَمَّدُ! أَنْتَ رَسُولُ اللَّهِ وَخَاتَمُ الأَنْبِيَاءِ، وَغَفَرَ اللَّهُ لَكَ مَا تَقَدَّمَ مِنْ ذَنْبِكَ وَمَا تَأَخَّرَ، اشْفَعْ لَنَا إِلَى رَبِّكَ، أَلاَ تَرَى مَا نَحْنُ فِيهِ؟ أَلاَ تَرَى مَا قَدْ بَلَغَنَا؟ فَأَنْطَلِقُ فَآتِي تَحْتَ الْعَرْشِ فَأَقَعُ سَاجِدًا لِرَبِّي، ثُمَّ يَفْتَحُ اللَّهُ عَلَيَّ وَيُلْهِمُنِي مِنْ مَحَامِدِهِ وَحُسْنِ الثَّنَاءِ عَلَيْهِ شَيْئًا لَمْ يَفْتَحْهُ لأَحَدٍ قَبْلِي، ثُمَّ يُقَالُ: يَا مُحَمَّدُ! ارْفَعْ رَأْسَكَ، سَلْ تُعْطَهْ، اشْفَعْ تُشَفَّعْ، فَأَرْفَعُ رَأْسِي فَأَقُولُ: يَا رَبِّ! أُمَّتِي، أُمَّتِي. فَيُقَالُ يَا مُحَمَّدُ! أَدْخِلْ الْجَنَّةَ مِنْ أُمَّتِكَ مَنْ لاَ حِسَابَ عَلَيْهِ، مِنْ الْبَابِ الأَيْمَنِ مِنْ أَبْوَابِ الْجَنَّةِ، وَهُمْ شُرَكَاءُ النَّاسِ، فِيمَا سِوَى ذَلِكَ مِنْ الأَبْوَابِ. وَالَّذِي نَفْسُ مُحَمَّدٍ بِيَدِهِ! إِنَّ مَا بَيْنَ الْمِصْرَاعَيْنِ مِنْ مَصَارِيعِ الْجَنَّةِ لَكَمَا بَيْنَ مَكَّةَ وَهَجَرٍ، أَوْ كَمَا بَيْنَ مَكَّةَ وَبُصْرَى)).

**[480]-327-(194)** ........ Əbu Hureyrə ﷺ demişdir: “Bir gün Peyğəmbərə ﷺ cəmdək gətirdilər. Sonra bu cəmdəyin qol tərəfini (bişirib) ona verdilər. Ətin bu yeri onun xoşuna gəlirdi. O, ətdən bir tikə dişlədikdən sonra dedi: “Qiyamət günü mən insanların ən hörmətlisi olacağam. Bunun nə səbəbdən belə olduğunu bilirsinizmi? Allah Qiyamət günü əvvəlkiləri və sonrakıları (dünyada olan insanların hamısını) düz və geniş bir yerə yığacaq. (Elə bir yerə ki,) carçı onları çağıra bilsin, gözlər də onları əhatə etsin. Günəş insanlara yaxınlaşdıqdan sonra onları elə bir dərd və kədər bürüyəcək ki, onlar buna nə tab gətirə-

cək, nə də dözə biləcəklər. Onda onlardan bəziləri digərlərinə deyəcəklər: “Nə vəziyyətə düşdüyünüzü görmürsünüzmü? Başınıza nələr gəldiyini görmürsünüzmü? Bəlkə, Rəbbiniz yanında sizin üçün şəfaət edəcək bir adam tapasınız?” Onda insanların bəziləri digərlərinə: “Haydı, Adəmin yanına gedin!”– deyəcək və onlar Adəmin عليه السلام yanına gəlib: “Ey Adəm! Sən bəşəriyyətin atasısan! Allah səni Öz Əli ilə yaratmış, Öz Ruhundan sənə üfürmüş, sonra da mələklərə əmr etmiş və onlar sənə səcdə etmişlər. (Elə isə) Rəbbinin yanında bizdən ötrü havadarlıq et (şəfaətçi ol)! Məgər sən bizim nə vəziyyətdə olduğumuzu, başımıza nələr gəldiyini görmürsənmi?!”– deyə ona müraciət edəcəklər. Adəm deyəcək: “Bu gün Rəbbim elə qəzəblənmişdir ki, O, bundan əvvəl heç vaxt belə qəzəblənməmiş və bundan sonra əsla belə qəzəblənməyəcəkdir. O mənə (bəlli) bir ağaca yaxınlaşmağı qadağan etdi, lakin mən Ona asi oldum. Ah nəfsim, nəfsim! Gedin başqasının yanına. Gedin Nuhun yanına!” Onlar Nuhun عليه السلام yanına gəlib deyəcəklər: “Ey Nuh! Sən yer üzünə göndərilmiş ilk elçisən. Özünü də Allah, şükür edən bəndə adlandırmışdır. (Elə isə) Rəbbinin yanında bizdən ötrü havadarlıq et! Məgər sən bizim nə vəziyyətdə olduğumuzu, başımıza nələr gəldiyini görmürsənmi?!” Nuh onlara deyəcək: “Bu gün Rəbbim elə qəzəblənmişdir ki, O, bundan əvvəl heç vaxt belə qəzəblənməmiş və bundan sonra əsla belə qəzəblənməyəcəkdir. Mənim dua etməyə imkanım var idi, lakin mən qövmümün əleyhinə bəddua etdim. Ah nəfsim, nəfsim! Gedin İbrahimin ﷺ yanına!” Onlar İbrahimin yanına gəlib deyəcəklər: “Sən həm Allahın peyğəmbəri, həm də yer əhli arasında Allahın ən sevimli dostusan. (Elə isə) Rəbbinin yanında bizdən ötrü havadarlıq et! Məgər sən bizim nə vəziyyətdə olduğumuzu, başımıza nələr gəldiyini görmürsənmi?!” İbrahim onlara deyəcək: “Bu gün Rəbbim elə qəzəblənmişdir ki, O, bundan əvvəl heç vaxt belə qəzəblənməmiş və bundan sonra əsla belə qəzəblənməyəcəkdir”. Sonra o: “(Üç dəfə) yalan danışdığını xatırlayacaq və deyəcək: “Ah nəfsim, nəfsim! Gedin başqasının yanına. Gedin Musanın yanına!” Onlar Musanın ﷺ yanına gəlib deyəcəklər: “Ey Musa! Sən Allahın elçisisən, Allah Öz risaləti[1] ilə, üstəlik səninlə bilavasitə danışmaqla səni digər insanlardan üstün etmişdir. (Elə isə) Rəbbinin yanında bizdən ötrü havadarlıq et! Məgər sən bizim nə vəziyyətdə olduğumuzu, başımıza nələr gəldiyini görmürsənmi?!” Musa ﷺ onlara deyəcək: “Bu gün Rəbbim elə qəzəblənmişdir ki, O, bundan əvvəl heç vaxt

[1] Musaya عليه السلام həvalə etdiyi peyğəmbərlik vəzifəsi.

belə qəzəblənməmiş və bundan sonra əsla belə qəzəblənməyəcəkdir. Mən adam öldürmüşəm. Halbuki onu öldürmək mənə əmr edilməmişdi. Ah nəfsim, nəfsim! Gedin İsanın ﷺ yanına!" Onlar İsanın yanına gəlib deyəcəklər: "Ey İsa! Sən Allahın rəsulusan. Sən hələ körpə ikən beşikdə insanlarla danışırdın. Sən həm Allahın Məryəmə göndərdiyi Kəlməsi, həm də Onun Ruhundansan. (Elə isə) Rəbbinin yanında bizdən ötrü havadarlıq et! Məgər sən bizim nə vəziyyətdə olduğumuzu, başımıza nələr gəldiyini görmürsənmi?!" İsa ﷺ onlara deyəcək: "Bu gün Rəbbim elə qəzəblənmişdir ki, O, bundan əvvəl heç vaxt belə qəzəblənməmiş və bundan sonra əsla belə qəzəblənməyəcəkdir." İsa öz xətasını onlara bildirməyəcək, sadəcə belə deyəcək: "Ah nəfsim, nəfsim! Gedin başqasının yanına. Gedin Muhəmmədin ﷺ yanına!" Onlar mənim yanıma gəlib deyəcəklər:

– Ey Muhəmməd! Sən həm Allahın elçisi, həm də peyğəmbərlərin sonuncususan. Allah sənin keçmiş və gələcək günahlarını bağışlamışdır. (Elə isə) Rəbbinin yanında bizdən ötrü havadarlıq et! Məgər sən bizim nə vəziyyətdə olduğumuzu, başımıza nələr gəldiyini görmürsənmi?!" Onda mən Ərşin altına gəlib, Rəbbimin qarşısında səcdə edəcəyəm. Sonra Allah mənə (elə bir şüur) bəxş edəcək, Özünə edilən həmd-sənalardan və ən gözəl təriflərdən elə bir ilham verəcək ki, məndən əvvəl heç kəsə beləsini verməmişdir. Sonra (mənə) belə buyurulacaq:

– Ey Muhəmməd! Başını qaldır və istə, sənə istədiyin veriləcək, havadarlıq et, havadarlığın qəbul olunacaq. Mən başımı qaldırıb deyəcəyəm: "Ey Rəbbim! Ümmətim, ümmətim!" Onda (mənə) belə buyurulacaq:

– Ey Muhəmməd! Ümmətindən sorğu-suala çəkilməyəcək kimsələri Cənnət qapılarından – sağ qapısından içəri daxil et! Halbuki onlar başqa insanlarla birlikdə (Cənnətin) digər qapılarından da keçə bilərlər.

Muhəmmədin canı Əlində olan Allaha and olsun ki, Cənnət qapılarındakı laylardan hər iki lay arasındakı məsafə Məkkə ilə Həcər,[1] yaxud Məkkə ilə Busra[2] arasındakı məsafə qədərdir".

**[٤٨١] ٣٢٨**–(...) و حَدَّثَنِي زُهَيْرُ بْنُ حَرْبٍ: حَدَّثَنَا جَرِيرٌ عَنْ عُمَارَةَ بْنِ الْقَعْقَاعِ، عَنْ أَبِي زُرْعَةَ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ: وُضِعَتْ بَيْنَ يَدَيْ رَسُولِ اللَّهِ ﷺ قَصْعَةٌ مِنْ ثَرِيدٍ وَلَحْمٍ، فَتَنَاوَلَ الذِّرَاعَ، وَكَانَتْ أَحَبَّ

---

[1] Həcər – Bəhreyndə şəhər adıdır.
[2] Busra – Şamda şəhər adıdır.

الشَّاة إِلَيْه، فَنَهَسَ نَهْسَةً فَقَالَ: ((أَنَا سَيِّدُ النَّاسِ يَوْمَ الْقِيَامَة)) ثُمَّ نَهَسَ أُخْرَى وَ قَالَ: ((أَنَا سَيِّدُ النَّاسِ يَوْمَ الْقِيَامَة)) فَلَمَّا رَأَى أَصْحَابَهُ لاَ يَسْأَلُونَهُ قَالَ: ((أَلاَ تَقُولُونَ كَيْفَهْ؟)) قَالُوا: كَيْفَهْ يَا رَسُولَ اللَّه؟ قَالَ ((يَقُومُ النَّاسُ لِرَبِّ الْعَالَمِينَ)) وَسَاقَ الْحَديثَ بِمَعْنَى حَديث أَبِي حَيَّانَ عَنْ أَبِي زُرْعَةَ، وَزَادَ فِي قِصَّة إِبْرَاهِيمَ – عَلَيْه السَّلاَمُ – فَقَالَ: وَذَكَرَ قَوْلَهُ فِي الْكَوْكَب: هَذَا: رَبِّي، و قَوْله لآلِهَتهِمْ: بَلْ فَعَلَهُ كَبِيرُهُمْ هَذَا، و قَوْله: إِنِّي سَقِيمٌ. قَالَ: ((وَالَّذي نَفْسُ مُحَمَّد بِيَده! إِنَّ مَا بَيْنَ الْمِصْرَاعَيْنِ مِنْ مَصَارِيعِ الْجَنَّة إِلَى عِضَادَتَيْ الْبَابِ لَكَمَا بَيْنَ مَكَّةَ وَهَجَرٍ أَوْ هَجَرٍ وَمَكَّةَ)). قَالَ لاَ أَدْرِي أَيَّ ذَلِكَ قَالَ.

**[481]-328-(...)** ........ Əbu Hureyrə ﷺ demişdir: “(Bir dəfə) Peyğəmbərin ﷺ qabağına bir qab şorba və (bişmiş) ət qoydular. O, əlini (qoçun) qol tərəfinə uzatdı. (Qoçun) bu hissəsi Peyğəmbərin ﷺ ən çox xoşuna gələn yeri idi. O, ətdən bir tikə dişlədikdən sonra dedi: “Qiyamət günü mən insanların ən hörmətlisi olacağam”. Sonra bir dişlək də vurdu və yenə: “Qiyamət günü mən insanların ən hörmətlisi olacağam”– dedi. Nəhayət, səhabələrinin (bunun səbəbini) soruşmadıqlarını gördükdə, dedi: “Niyə soruşmursunuz ki, necə (olacaq)?” Səhabələr: “Necə olacaq, ya Rəsulullah?”– deyə soruşdular. Peyğəmbər ﷺ buyurdu: “(O gün) insanlar aləmlərin Rəbbi qarşısında ayağa qalxacaqlar”.

(Sonra ravi) bu hədisi Əbu Heyyanın Əbu Zurədən rəvayət etdiyi hədisə yaxın mənada nəql etmişdir. Fəqət (hədisdə) İbrahimlə ﷺ olan söhbətə: “O, ulduza baxıb: “Bu mənim Rəbbimdir”[1], habelə bütpərəstlərin tanrıları haqqında: “Bunu onların bu böyüyü etmiş olar”[2], həmçinin: “Mən xəstəyəm”[3] dediyini də əlavə etmişdir. (Axırda Peyğəmbər ﷺ belə buyurdu:) “Muhəmmədin canı Əlində olan (Allaha) and olsun ki, Cənnət qapılarındakı laylardan hər iki lay arasındakı məsafə Məkkə ilə Həcər, yaxud Həcər ilə Məkkə arasındakı məsafə qədərdir”.

(Ravi) demişdir: “Bunun hansını söylədiyi yadıma gəlmir”.

**[٤٨٢] ٣٢٩–(١٩٥)** حَدَّثَنَا مُحَمَّدُ بْنُ طَرِيفِ بْنِ خَلِيفَةَ الْبَجَلِيُّ: حَدَّثَنَا مُحَمَّدُ بْنُ فُضَيْلٍ: حَدَّثَنَا أَبُو مَالِك الأَشْجَعِيُّ، عَنْ أَبِي حَازِمٍ، عَنْ أَبِي هُرَيْرَةَ، وَأَبُو مَالِك، عَنْ رِبْعِيِّ بْنِ حِرَاشٍ، عَنْ حُذَيْفَةَ، قَالا: قَالَ رَسُولُ اللَّه ﷺ: ((يَجْمَعُ اللَّهُ تَبَارَكَ وَتَعَالَى النَّاسَ، فَيَقُومُ الْمُؤْمِنُونَ حَتَّى تُزْلَفَ لَهُمْ الْجَنَّةُ، فَيَأْتُونَ آدَمَ فَيَقُولُونَ: يَا أَبَانَا! اسْتَفْتِحْ لَنَا الْجَنَّةَ، فَيَقُولُ: وَهَلْ أَخْرَجَكُمْ مِنْ الْجَنَّة إِلاَّ خَطِيئَةُ أَبِيكُمْ آدَمَ لَسْتُ بِصَاحِبِ

[1] Bax: “əl-Ənam” surəsi, 75-79.
[2] Bax: “əl-Ənbiya” surəsi, 51-72.
[3] Bax: “əs-Saffat” surəsi, 89.

ذَلكَ. اذْهَبُوا إِلَى ابْنِي إِبْرَاهِيمَ خَلِيلِ اللَّه. قَالَ: فَيَقُولُ إِبْرَاهِيمُ: لَسْتُ بِصَاحِبِ ذَلكَ، إِنَّمَا كُنْتُ خَلِيلاً منْ وَرَاءَ وَرَاءَ. اعْمِدُوا إِلَى مُوسَى الَّذي كَلَّمَهُ اللَّهُ تَكْلِيمًا. فَيَأْتُونَ مُوسَى فَيَقُولُ: لَسْتُ بِصَاحِبِ ذَلكَ. اذْهَبُوا إِلَى عِيسَى كَلمَة اللَّه وَرُوحه. فَيَقُولُ عِيسَى: لَسْتُ بِصَاحِبِ ذَلكَ، فَيَأْتُونَ مُحَمَّدًا ﷺ، فَيَقُومُ فَيُؤْذَنُ لَهُ، وَتُرْسَلُ الأَمَانَةُ وَالرَّحِمُ. فَتَقُومَانِ جَنَبَتَيِ الصِّرَاطِ يَمِينًا وَشِمَالاً، فَيَمُرُّ أَوَّلُكُمْ كَالْبَرْقِ)) قَالَ، قُلْتُ: بِأَبِي أَنْتَ وَأُمِّي أَيُّ شَيْءٍ كَمَرِّ الْبَرْقِ؟ قَالَ: ((أَلَمْ تَرَوْا إِلَى الْبَرْقِ كَيْفَ يَمُرُّ وَيَرْجِعُ فِي طَرْفَةِ عَيْنٍ؟ ثُمَّ كَمَرِّ الرِّيحِ، ثُمَّ كَمَرِّ الطَّيْرِ وَشَدِّ الرِّجَالِ، تَجْرِي بِهِمْ أَعْمَالُهُمْ، وَنَبِيُّكُمْ قَائِمٌ عَلَى الصِّرَاطِ يَقُولُ: رَبِّ سَلِّمْ سَلِّمْ، حَتَّى تَعْجِزَ أَعْمَالُ الْعِبَادِ، حَتَّى يَجِيءَ الرَّجُلُ فَلاَ يَسْتَطِيعُ السَّيْرَ إِلاَّ زَحْفًا. قَالَ: وَفِي حَافَتَيِ الصِّرَاطِ كَلاَلِيبُ مُعَلَّقَةٌ. مَأْمُورَةٌ بِأَخْذِ مَنْ أُمِرَتْ بِهِ. فَمَخْدُوشٌ نَاجٍ وَمَكْدُوسٌ فِي النَّارِ)).

وَالَّذِي نَفْسُ أَبِي هُرَيْرَةَ بِيَدِهِ! إِنَّ قَعْرَ جَهَنَّمَ لَسَبْعُونَ خَرِيفًا.

**[482]-329-(195)** ........ Əbu Hureyrə və Huzeyfə ﷺ rəvayət etmişdir ki, Peyğəmbər ﷺ demişdir: "(Qiyamət günü) Allah Təbarəkə və Təalə insanları (bir yerə) toplayacaq. (O gün) möminlər ayağa qalxacaqlar. Nəhayət, Cənnət onlara yaxınlaşdırılacaq[1] və o zaman onlar Adəmin yanına gəlib deyəcəklər: "Ey atamız! Cənnət (qapılarını) bizim üçün açdır". Adəm deyəcək: "Məgər sizləri Cənnətdən atanız Adəmin xətası çıxartmamışdırmı? Mən şəfaətçi olmağa layiq deyiləm. Siz oğlum İbrahimin – Allahın ən sevimli dostunun yanına gedin". İbrahim deyəcək: "Mən buna layiq deyiləm. Mən ancaq örtük arxasından [2] bir dost olmuşam. Siz Allahın bilavasitə danışdığı Musaya müraciət edin". Onlar Musanın yanına gələcəklər. Musa (onlara): "Mən buna layiq deyiləm. Siz Allahın Kəlməsi və Ruhu olan İsanın yanına gedin"– deyəcək. İsa da (onlara): "Mən buna layiq deyiləm"– deyəcək. Nəhayət, Muhəmmədin ﷺ yanına gələcəklər. O, ayağa qalxacaq və ona (şəfaət etməyə) izin veriləcəkdir. Əmanət və

[1] Uca Allah buyurur: **"Cənnət müttəqilərə yaxınlaşdırılar"** ("əş-Şuəra" surəsi, 90).

[2] Nəvəvi və İbn Həcər demişdir: "Təhrir"in müəllifi (Muhəmməd ibn Abdul-Vahid ﷺ) demişdir: "Bu söz təvazökarlıq əlamətidir. İbrahim ﷺ demək istəyir ki: "Mən o yüksək məqama layiq deyiləm".

Sonra mən bu sözə dair daha gözəl şərhə rast gəldim. Orada bu sözün mənası belə izah edilirdi: "(İbrahim ﷺ demək istəyir ki): "Mənə nazil olmuş vəhylər Cəbrailin ﷺ vasitəsilə nazil edilmişdir. Siz Musanın yanına gedin. Çünki o, Allahın Sözünü eşitmiş və Onunla bilavasitə danışmışdır". Burada o: "örtük arxasında" deməklə Musadan ﷺ da üstün olan, Peyğəmbərimiz Muhəmmədin ﷺ həm (meracda) Allahla bilavasitə danışdığını, həm də Onun nurunu gördüyünü qəsd etmiş və demək istəmişdir ki: "Mən, Muhəmmədin arxasında olan Musanın arxasındayam". Bu, "Təhrir"in müəllifinin axır sözüdür" ("Şərh ən-Nəvəvi", 3/71; "Fəth əl-Bari", 18/410).

qohumluq əlaqəsi də (Allahın onlara verdiyi görkəmdə) gəlib qıl körpüsünün sağında və solunda duracaqlar.[1] Sizin ən birincilərimiz (körpünün üstündən) şimşək kimi keçəcəklər". Mən dedim: "Atam-anam sənə fəda olsun. Şimşəyin keçməyinə bənzəyən şey nədir?" Peyğəmbər ﷺ buyurdu: "Məgər siz şimşəyin bir göz qırpımında necə gedib-gəldiyini görməmisinizmi?! (Bunlardan) sonra (keçənlər) küləyin keçməsi kimi, sonra quşun keçməsi və qaçan adamın keçməsi kimi (körpünün üstündən keçəcəklər). Onları öz əməlləri bu şəkildə (körpüdən) keçirəcəkdir. Peyğəmbəriniz ﷺ isə körpünün başında durub: "Ya Rəbb! Xilas et, xilas et!"– deyəcək. Nəhayət, insanların əməlləri (onları körpüdən keçirməkdə) aciz qalacaq. İş o yerə gəlib çatacaq ki, bir nəfər gəlib (oradan keçmək istəyəcək), lakin yeriməyə taqəti olmadığından iməkləyəcəkdir. Qıl körpüsünün hər iki tərəfində asılmış qarmaqlar vardır ki, tutulmasına əmr verilmiş kimsələri tutmağa hazırdırlar. (Onlardan kimisi tikanlara ilişib) didik-didik ediləcək, lakin axırda xilas olacaq. Bəziləri də Cəhənnəm odunda qalaqlanacaqlar".

Əbu Hureyrənin canı Əlində olan (Allaha) and olsun ki, Cəhənnəmin dibinə (qədər olan məsafə) yetmiş illik məsafəyə bərabərdir.

## (٨٥) – بَابُ فِي قَوْلِ النَّبِيِّ ﷺ أَنَا أَوَّلُ النَّاسِ يَشْفَعُ فِي الْجَنَّةِ وَأَنَا أَكْثَرُ الأَنْبِيَاءِ تَبَعًا

## 85-ci fəsil. Peyğəmbərin ﷺ: "Cənnətə (daxil olmaq üçün) şəfaət edəcək insanların birincisi mən olacağam, üstəlik peyğəmbərlər arasında ümməti ən çox olanı da mənəm" sözü haqqında

**[٤٨٣] ٣٣٠–(١٩٦)** حَدَّثَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ وَإِسْحَقُ بْنُ إِبْرَاهِيمَ قَالَ قُتَيْبَةُ: حَدَّثَنَا جَرِيرٌ عَنْ الْمُخْتَارِ بْنِ فُلْفُلٍ، عَنْ أَنَسِ بْنِ مَالِكٍ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((أَنَا أَوَّلُ النَّاسِ يَشْفَعُ فِي الْجَنَّةِ وَأَنَا أَكْثَرُ الأَنْبِيَاءِ تَبَعًا)).

---

[1] Əmanəti qorumaq və qohumluq əlaqələrini möhkəmləndirmək məsuliyyətli işlərdən olduğuna görə Allah onlara Qiyamət günü özlərinə məxsus bir görkəm verəcək və onlar da gəlib əmanəti xəyanət etməyən və qohumluq əlaqələrini möhkəmləndirən kəsələrin lehinə, xainlərin və qohumluq bağlarını qıran kəslərin isə əleyhinə şahidlik edəcəklər.

Tiybi demişdir: "Ehtimal var ki, hədisdə keçən əmanət sözü Allahın: **"Biz əmanəti göylərə, yerə və dağlara təklif etdik. Onlar onu daşımaqdan *qorxub* imtina etdilər. Lakin insan onu boynuna götürdü. Doğrudan da, o, zalım və cahildir"** ("əl-Əhzab" surəsi, 72) ayəsindəki əmanət sözü ilə, qohumluq əlaqəsi isə Allahın: **"Adı ilə bir-birinizdən *cürbəcür şeylər* istədiyiniz Allahdan və qohumluq əlaqələrini kəsməkdən çəkinin!"** ("ən-Nisa" surəsi, 1) ayəsindəki həmin sözlə eyni mənanı ifadə edir".

**[483]-330-(196)** ........ Ənəs ibn Malik ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Cənnətə (daxil olmaq üçün) şəfaət edəcək insanların birincisi mən olacağam, üstəlik peyğəmbərlər arasında ümməti ən çox olanı da mənəm[1]".

**[٤٨٤] ٣٣١**-(...) و حَدَّثَنَا أَبُو كُرَيْبٍ مُحَمَّدُ بْنُ الْعَلَاءِ: حَدَّثَنَا مُعَاوِيَةُ بْنُ هِشَامٍ عَنْ سُفْيَانَ، عَنْ مُخْتَارِ بْنِ فُلْفُلٍ، عَنْ أَنَسِ بْنِ مَالِكٍ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((أَنَا أَكْثَرُ الأَنْبِيَاءِ تَبَعًا يَوْمَ الْقِيَامَةِ وَأَنَا أَوَّلُ مَنْ يَقْرَعُ بَابَ الْجَنَّةِ)).

**[484]-331-(...)** ........ Ənəs ibn Malik ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Qiyamət günü peyğəmbərlər arasında ümməti ən çox olanı mən olacağam, habelə Cənnətin qapısını döyənlərin birincisi də mən olacağam".

**[٤٨٥] ٣٣٢**-(...) و حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ، حَدَّثَنَا حُسَيْنُ بْنُ عَلِيٍّ عَنْ زَائِدَةَ، عَنْ الْمُخْتَارِ بْنِ فُلْفُلٍ قَالَ: قَالَ أَنَسُ بْنُ مَالِكٍ: قَالَ النَّبِيُّ ﷺ: ((أَنَا أَوَّلُ شَفِيعٍ فِي الْجَنَّةِ، لَمْ يُصَدَّقْ نَبِيٌّ مِنْ الأَنْبِيَاءِ مَا صُدِّقْتُ، وَإِنَّ مِنْ الأَنْبِيَاءِ نَبِيًّا مَا يُصَدِّقُهُ مِنْ أُمَّتِهِ إِلاَّ رَجُلٌ وَاحِدٌ)).

**[485]-332-(...)** ........ Ənəs ibn Malik ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Cənnətə (girmək üçün) şəfaət edəcək insanların birincisi mən olacağam. Peyğəmbərlər arasında mənim təsdiq edildiyim qədər təsdiq edilmiş bir peyğəmbər yoxdur. Peyğəmbərlər içində elə bir peyğəmbər olmuşdur ki, ümmətindən onu yalnız bir kişi təsdiq etmişdir".

---

[1] Aşağıdakı rəvayətlərə diqqət yetirin:

Peyğəmbər ﷺ merac haqqında danışarkən belə demişdir: "...Sonra biz yolumuza davam etdik və nəhayət, gəlib altıncı səmaya çatdıq. Mən Musanın ﷺ yanına gəldim və ona salam verdim. O (mənim salamımı aldıqdan sonra) dedi: "Xoş gəlmisən, ey əməlisaleh qardaş və əməlisaleh peyğəmbər!" Mən onun yanından keçib getdikdə, o ağladı. Ondan: "Niyə ağlayırsan?"– deyə soruşdular. Dedi: "Ey Rəbbim! Məndən sonra göndərdiyin bu cavan oğlanın ümmətindən Cənnətə daxil olanların sayı, mənim ümmətimdən ora daxil olanların sayından qat-qat artıq olacaq" ("Səhih Muslim", 416).

Digər rəvayətdə demişdir: "Ümmətlər mənə göstərildi. Mən peyğəmbər gördüm, yanında bir toplum adam var idi. Başqa bir peyğəmbər gördüm, yanında bir-iki adam var idi. Hətta elə bir peyğəmbər də gördüm ki, yanında heç kəs yox idi. (Həmin vaxt) mənə böyük bir qaraltı göstərildi. Mən onların ümmətim olduğunu zənn etdim. (Mənə): "Bu, Musa ﷺ və onun qövmüdür. Sən üfüqə doğru bax"– deyildi. Mən (dərhal ora) baxdım və orada böyük bir qaraltı gördüm. Mənə yenə: "Üfüqün digər tərəfinə bax!"– deyildi. Yenə əzəmətli bir qaraltı gördüm. Mənə: "Bu sənin ümmətindir. Onlardan yetmiş min nəfəri sorğu-sual olunmadan və əzab çəkmədən Cənnətə girəcəkdir"– deyildi..." ("Səhih əl-Buxari", 1960; "Səhih Muslim", 527).

**[٤٨٦] ٣٣٣**–(١٩٧) و حَدَّثَنِي عَمْرٌو النَّاقِدُ وَزُهَيْرُ بْنُ حَرْب قَالاَ: حَدَّثَنَا هَاشِمُ بْنُ الْقَاسِمِ: حَدَّثَنَا سُلَيْمَانُ بْنُ الْمُغيرَة عَنْ ثَابت، عَنْ أَنَسِ بْنِ مَالك قَالَ: قَالَ رَسُولُ اللَّه ﷺ: ((آتي بَابَ الْجَنَّة يَوْمَ الْقيَامَة، فَأَسْتَفْتِحُ، فَيَقُولُ الْخَازِنُ: مَنْ أَنْتَ؟ فَأَقُولُ: مُحَمَّدٌ، فَيَقُولُ: بِكَ أُمِرْتُ لاَ أَفْتَحُ لأَحَدٍ قَبْلَكَ)).

**[486]-333-(197)** ........ Ənəs ibn Malik ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Mən Qiyamət günü Cənnət qapısının yanına gəlib onun açılmasını xahiş edəcəyəm. Bu vaxt gözətçi: “Sən kimsən?”– deyə soruşacaq. Mən: “Muhəmmədəm”– deyə cavab verəcəyəm. (Bunu eşidəndə) o deyəcək: “Mənə (bu qapıları) səndən əvvəl heç bir kəsə açmamaq – yalnız sənin üçün açmaq əmr edilmişdir”.

## (٨٦) – بَابُ اخْتِبَاءِ النَّبِيِّ ﷺ دَعْوَةَ الشَّفَاعَةِ لأُمَّتِهِ

## 86-cı fəsil. Peyğəmbərin ﷺ ümməti üçün (edəcəyi) şəfaət duasını (Qiyamətə) saxlaması

**[٤٨٧] ٣٣٤**–(١٩٨) حَدَّثَنِي يُونُسُ بْنُ عَبْدِ الأَعْلَى: أَخْبَرَنَا عَبْدُ اللَّه بْنُ وَهْبٍ قَالَ: أَخْبَرَنِي مَالِكُ بْنُ أَنَسٍ عَنْ ابْنِ شِهَاب، عَنْ أَبِي سَلَمَةَ بْنِ عَبْد الرَّحْمَنِ، عَنْ أَبِي هُرَيْرَةَ، أَنَّ رَسُولَ اللَّه ﷺ قَالَ: ((لِكُلِّ نَبِيٍّ دَعْوَةٌ يَدْعُوهَا، فَأُرِيدُ أَنْ أَخْتَبِئَ دَعْوَتِي شَفَاعَةً لأُمَّتِي يَوْمَ الْقِيَامَةِ)).

**[487]-334-(198)** ........ Əbu Hureyrə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Hər peyğəmbərin (qəbul edilmiş) bir duası olmuşdur ki, o (artıq) bu dua ilə (Allaha) müraciət etmişdir. Mən isə duamı Qiyamət günü ümmətimə şəfaət etmək üçün saxlamaq istəyirəm[1]”.

**[٤٨٨] ٣٣٥**–(...) و حَدَّثَنِي زُهَيْرُ بْنُ حَرْبٍ وَعَبْدُ بْنُ حُمَيْد قَالَ زُهَيْرٌ: حَدَّثَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ: حَدَّثَنَا ابْنُ أَخِي ابْنِ شِهَاب، عَنْ عَمِّه، أَخْبَرَنِي أَبُو سَلَمَةَ بْنُ عَبْد الرَّحْمَنِ أَنَّ أَبَا هُرَيْرَةَ قَالَ: قَالَ رَسُولُ اللَّه ﷺ: ((لِكُلِّ نَبِيٍّ دَعْوَةٌ. فَأَرَدْتُ، إِنْ شَاءَ اللَّهُ، أَنْ أَخْتَبِئَ دَعْوَتِي شَفَاعَةً لأُمَّتِي يَوْمَ الْقِيَامَةِ)).

**[488]-335-(...)** ........ Əbu Hureyrə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Hər peyğəmbərin bir duası olmuşdur. Mən isə inşaAllah[2] duamı Qiyamət günü ümmətimə şəfaət etmək üçün saxlamaq istəyirəm”.

---

[1] Bu hədis Peyğəmbərin ﷺ öz ümmətinə artıq dərəcədə şəfqətli və rəhmli olduğunu göstərir.

[2] Uca Allah buyurur: **“Heç bir şey barəsində: “Mən onu sabah edəcəyəm!”– demə! Ancaq: “Əgər Allah istəsə!” (“inşaAllah”- de!)...”** (“əl-Kəhf” surəsi, 23-24).

**[٤٨٩] ٣٣٦**-(...) حَدَّثَنِي زُهَيْرُ بْنُ حَرْبٍ وَعَبْدُ بْنُ حُمَيْدٍ قَالَ زُهَيْرٌ: حَدَّثَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ: حَدَّثَنَا ابْنُ أَخِي ابْنِ شِهَابٍ، عَنْ عَمِّهِ: حَدَّثَنِي عَمْرُو بْنُ أَبِي سُفْيَانَ بْنِ أَسِيدِ بْنِ جَارِيَةَ الثَّقَفِيُّ، مِثْلَ ذَلِكَ، عَنْ أَبِي هُرَيْرَةَ عَنْ رَسُولِ اللَّهِ ﷺ.

**[489]-336-(...)** ........ Amr ibn Əbu Süfyan ibn Əsid ibn Cariyə əs-Səqəfi bu hədisin bənzərini Əbu Hureyrədən, o da Peyğəmbərdən ﷺ rəvayət etmişdir.

**[٤٩٠] ٣٣٧**-(...) و حَدَّثَنِي حَرْمَلَةُ بْنُ يَحْيَى: أَخْبَرَنَا ابْنُ وَهْبٍ: أَخْبَرَنِي يُونُسُ، عَنْ ابْنِ شِهَابٍ أَنَّ عَمْرَو بْنَ أَبِي سُفْيَانَ بْنِ أَسِيدِ بْنِ جَارِيَةَ الثَّقَفِيَّ أَخْبَرَهُ أَنَّ أَبَا هُرَيْرَةَ قَالَ لِكَعْبِ الأَحْبَارِ: إِنَّ نَبِيَّ اللَّهِ ﷺ قَالَ: ((لِكُلِّ نَبِيٍّ دَعْوَةٌ يَدْعُوهَا. فَأَنَا أُرِيدُ، إِنْ شَاءَ اللَّهُ، أَنْ أَخْتَبِئَ دَعْوَتِي شَفَاعَةً لِأُمَّتِي يَوْمَ الْقِيَامَةِ)).

فَقَالَ كَعْبٌ لِأَبِي هُرَيْرَةَ: أَنْتَ سَمِعْتَ هَذَا مِنْ رَسُولِ اللَّهِ ﷺ؟ قَالَ أَبُو هُرَيْرَةَ: نَعَمْ.

**[490]-337-(...)** ........ Amr ibn Əbu Süfyan ibn Əsid ibn Cariyə əs-Səqəfi rəvayət etmişdir ki, (bir dəfə) Əbu Hureyrə Kəb əl-Əhbara dedi: "Allahın Peyğəmbəri ﷺ belə buyurmuşdur: "Hər peyğəmbərin bir duası olmuşdur ki, o (artıq) bu dua ilə (Allaha) müraciət etmişdir. Lakin mən inşaAllah duamı Qiyamət günü ümmətimə şəfaət etmək üçün saxlamaq istəyirəm".

Kəb Əbu Hureyrədən: "Sən bunu Peyğəmbərdənmi ﷺ eşitmisən?"– deyə soruşdu. Əbu Hureyrə: "Bəli!"– deyə cavab verdi.

**[٤٩١] ٣٣٨**-(١٩٩) حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ وَأَبُو كُرَيْبٍ - وَاللَّفْظُ لِأَبِي كُرَيْبٍ - قَالاَ: حَدَّثَنَا أَبُو مُعَاوِيَةَ، عَنْ الأَعْمَشِ، عَنْ أَبِي صَالِحٍ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((لِكُلِّ نَبِيٍّ دَعْوَةٌ مُسْتَجَابَةٌ. فَتَعَجَّلَ كُلُّ نَبِيٍّ دَعْوَتَهُ، وَإِنِّي اخْتَبَأْتُ دَعْوَتِي شَفَاعَةً لِأُمَّتِي يَوْمَ الْقِيَامَةِ، فَهِيَ نَائِلَةٌ إِنْ شَاءَ اللَّهُ، مَنْ مَاتَ مِنْ أُمَّتِي لاَ يُشْرِكُ بِاللَّهِ شَيْئًا)).

**[491]-338-(199)** ........ Əbu Hureyrə ؓ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Hər peyğəmbərin qəbul edilmiş bir duası olmuşdur. Onların hər biri (artıq öz duasından) istifadə etmişdir. Mən isə öz duamı Qiyamət günü ümmətimə şəfaət etmək üçün saxlamışam. Ümmətimdən Allaha şərik qoşmadığı halda ölən kimsələr inşaAllah bu şəfaətə nail olacaqlar".

**[٤٩٢] ٣٣٩**-(...) حَدَّثَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ: حَدَّثَنَا جَرِيرٌ عَنْ عُمَارَةَ وَهُوَ ابْنُ الْقَعْقَاعِ، عَنْ أَبِي زُرْعَةَ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((لِكُلِّ نَبِيٍّ دَعْوَةٌ مُسْتَجَابَةٌ يَدْعُو بِهَا، فَيُسْتَجَابُ لَهُ فَيُؤْتَاهَا، وَإِنِّي اخْتَبَأْتُ دَعْوَتِي شَفَاعَةً لِأُمَّتِي يَوْمَ الْقِيَامَةِ)).

**[492]-339-(...)** ........ Əbu Hureyrə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Hər bir peyğəmbərin qəbul edilmiş duası olmuşdur ki, o bu dua ilə (Allaha) müraciət etmiş, onun duası qəbul olunmuş və ona istədiyi verilmişdir. Mən isə öz duamı Qiyamət günü ümmətimə şəfaət etmək üçün saxlamışam”.

**[٤٩٣] ٣٤٠**-(...) حَدَّثَنَا عُبَيْدُ اللَّهِ بْنُ مُعَاذٍ الْعَنْبَرِيُّ: حَدَّثَنَا أَبِي: حَدَّثَنَا شُعْبَةُ عَنْ مُحَمَّدٍ وَهُوَ ابْنُ زِيَادٍ قَالَ: سَمِعْتُ أَبَا هُرَيْرَةَ يَقُولُ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((لِكُلِّ نَبِيٍّ دَعْوَةٌ دَعَا بِهَا فِي أُمَّتِهِ فَاسْتُجِيبَ لَهُ. وَإِنِّي أُرِيدُ إِنْ شَاءَ اللَّهُ، أَنْ أُؤَخِّرَ دَعْوَتِي شَفَاعَةً لأُمَّتِي يَوْمَ الْقِيَامَةِ)).

**[493]-340-(...)** ........ Əbu Hureyrə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Hər peyğəmbərin bir duası olmuşdur ki, o, ümməti xüsusunda bu dua ilə (Allaha) müraciət etmiş və onun duası qəbul olunmuşdur. Mən isə inşaAllah öz duamı Qiyamət günü ümmətimə şəfaət etmək üçün saxlamaq istəyirəm”.

**[٤٩٤] ٣٤١**-(٢٠٠) حَدَّثَنِي أَبُو غَسَّانَ الْمِسْمَعِيُّ وَمُحَمَّدُ بْنُ الْمُثَنَّى وَابْنُ بَشَّارٍ حَدَّثَانَا – وَاللَّفْظُ لأَبِي غَسَّانَ – قَالُوا: حَدَّثَنَا مُعَاذٌ يَعْنُونَ ابْنَ هِشَامٍ قَالَ: حَدَّثَنِي أَبِي عَنْ قَتَادَةَ: حَدَّثَنَا أَنَسُ بْنُ مَالِكٍ، أَنَّ نَبِيَّ اللَّهِ ﷺ قَالَ: ((لِكُلِّ نَبِيٍّ دَعْوَةٌ دَعَاهَا لأُمَّتِهِ. وَإِنِّي اخْتَبَأْتُ دَعْوَتِي شَفَاعَةً لأُمَّتِي يَوْمَ الْقِيَامَةِ)).

**[494]-341-(200)** ........ Ənəs ibn Malik ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Hər peyğəmbərin bir duası olmuşdur ki, o, bunu ümmətinə sərf etmişdir. Mən isə öz duamı Qiyamət günü ümmətimə şəfaət etmək üçün saxlamışam”.

**[٤٩٥] ٣٤٢**-(...) و حَدَّثَنِيهِ زُهَيْرُ بْنُ حَرْبٍ وَابْنُ أَبِي خَلَفٍ قَالاَ: حَدَّثَنَا رَوْحٌ: حَدَّثَنَا شُعْبَةُ عَنْ قَتَادَةَ بِهَذَا الإِسْنَادِ.

**[495]-342-(...)** ........ Şobə Qətadədən bu isnadla (yuxarıdakı hədisin bənzərini) rəvayət etmişdir.

**[٤٩٦] ٣٤٣**-(...) حَدَّثَنَاه أَبُو كُرَيْبٍ: حَدَّثَنَا وَكِيعٌ؛ ح: و حَدَّثَنِيهِ إِبْرَاهِيمُ بْنُ سَعِيدٍ الْجَوْهَرِيُّ: حَدَّثَنَا أَبُو أُسَامَةَ، جَمِيعًا عَنْ مِسْعَرٍ، عَنْ قَتَادَةَ بِهَذَا الإِسْنَادِ. غَيْرَ أَنَّ فِي حَدِيثِ وَكِيعٍ قَالَ: قَالَ: ((أُعْطِيَ)) وَفِي حَدِيثِ أَبِي أُسَامَةَ عَنْ النَّبِيِّ ﷺ.

**[496]-343-(...)** ........ Vəki və Əbu Usamə – hər ikisi (bu hədisi) Misərdən, o da Qətadədən bu isnadla rəvayət etmişdir. Fəqət Vəkinin rəvayət etdiyi hədisdə:

“ona əta edilmişdir”, Əbu Usamənin hədisində isə: “Peyğəmbərdən ﷺ” sözləri rəvayət edilmişdir.

**[٤٩٧] ٣٤٤**–(...) و حَدَّثَنِي مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى: حَدَّثَنَا الْمُعْتَمِرُ عَنْ أَبِيهِ، عَنْ أَنَسٍ أَنَّ نَبِيَّ اللَّهِ ﷺ قَالَ: فَذَكَرَ نَحْوَ حَدِيثِ قَتَادَةَ، عَنْ أَنَسٍ.

**[497]-344-(...)** ........ (Bu hədisi) mənə Muhəmməd ibn Abdul-Əla rəvayət etmişdir. (O): “Bizə Motəmir öz atasından, o da Ənəsdən, o da Peyğəmbərdən ﷺ rəvayət etmişdir”– demiş və Qətadənin Ənəsdən rəvayət etdiyi hədisin bənzərini rəvayət etmişdir.

**[٤٩٨] ٣٤٥**–(٢٠١) و حَدَّثَنِي مُحَمَّدُ بْنُ أَحْمَدَ بْنِ أَبِي خَلَفٍ: حَدَّثَنَا رَوْحٌ: حَدَّثَنَا ابْنُ جُرَيْجٍ قَالَ: أَخْبَرَنِي أَبُو الزُّبَيْرِ أَنَّهُ سَمِعَ جَابِرَ بْنَ عَبْدِ اللَّهِ يَقُولُ عَنْ النَّبِيِّ ﷺ: ((لِكُلِّ نَبِيٍّ دَعْوَةٌ قَدْ دَعَا بِهَا فِي أُمَّتِهِ، وَخَبَأْتُ دَعْوَتِي شَفَاعَةً لأُمَّتِي يَوْمَ الْقِيَامَةِ)).

**[498]-345-(201)** ........ Cabir ibn Abdullah ؓ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Hər peyğəmbərin bir duası olmuşdur ki, artıq o, ümməti xüsusunda bu dua ilə (Allaha) müraciət etmişdir. Mən isə öz duamı Qiyamət günü ümmətimə şəfaət etmək üçün saxlamışam”.

## (٨٧) – بَابُ دُعَاءِ النَّبِيِّ ﷺ لأُمَّتِهِ وَبُكَائِهِ شَفَقَةً عَلَيْهِمْ

## 87-ci fəsil. Peyğəmbərin ﷺ ümməti üçün dua etməsi və onların halına acıyaraq ağlaması

**[٤٩٩] ٣٤٦**–(٢٠٢) حَدَّثَنِي يُونُسُ بْنُ عَبْدِ الأَعْلَى الصَّدَفِيُّ: أَخْبَرَنَا ابْنُ وَهْبٍ قَالَ: أَخْبَرَنِي عَمْرُو بْنُ الْحَارِثِ: أَنَّ بَكْرَ بْنَ سَوَادَةَ حَدَّثَهُ عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ جُبَيْرٍ، عَنْ عَبْدِ اللَّهِ بْنِ عَمْرِو بْنِ الْعَاصِ، أَنَّ النَّبِيَّ ﷺ تَلاَ قَوْلَ اللَّهِ عَزَّ وَجَلَّ فِي إِبْرَاهِيمَ: ﴿ رَبِّ إِنَّهُنَّ أَضْلَلْنَ كَثِيرًا مِّنَ ٱلنَّاسِۖ فَمَن تَبِعَنِي فَإِنَّهُۥ مِنِّيۖ ﴾ الآيَةَ

وَقَالَ عِيسَى عَلَيْهِ السَّلاَم: ﴿ إِن تُعَذِّبْهُمْ فَإِنَّهُمْ عِبَادُكَۖ وَإِن تَغْفِرْ لَهُمْ فَإِنَّكَ أَنتَ ٱلْعَزِيزُ ٱلْحَكِيمُ ﴾

فَرَفَعَ يَدَيْهِ وَقَالَ: ((اللَّهُمَّ! أُمَّتِي أُمَّتِي)). وَبَكَى. فَقَالَ اللَّهُ عَزَّ وَجَلَّ: يَا جِبْرِيلُ! اذْهَبْ إِلَى مُحَمَّدٍ، وَرَبُّكَ أَعْلَمُ، فَسَلْهُ مَا يُبْكِيكَ؟ فَأَتَاهُ جِبْرِيلُ عَلَيْهِ السَّلاَم فَسَأَلَهُ، فَأَخْبَرَهُ رَسُولُ اللَّهِ ﷺ بِمَا قَالَ، وَهُوَ أَعْلَمُ، فَقَالَ اللَّهُ: يَا جِبْرِيلُ! اذْهَبْ إِلَى مُحَمَّدٍ فَقُلْ: إِنَّا سَنُرْضِيكَ فِي أُمَّتِكَ وَلاَ نَسُوءُكَ)).

**[499]-346-(202)** ........ Abdullah ibn Amr ibn əl-As ﷺ demişdir: “Peyğəmbər ﷺ İzzətli və Qüdrətli Allahın İbrahim haqqında xəbər verdiyi: **“Ey Rəbbim! Həqiqətən də, onlar çox adamı azdırmışlar. Kim mənə tabe olsa, o, məndəndir. Kim də mənə asi olsa,** ***bilsin ki,*** **Sən Bağışlayansan, Rəhmlisən”**[1] ayəsini, habelə İsanın ﷺ: **“Əgər onlara əzab versən, sözsüz ki, onlar Sənin qullarındır. Əgər onları bağışlasan, şübhəsiz ki, Sən Qüdrətlisən, Müdriksən!”**[2] dediyini oxuduqdan sonra əllərini (göyə) qaldırıb: “Allahım! Ümmətim, ümmətim!”– dedi və ağladı. Onda İzzətli və Qüdrətli Allah buyurdu: “Ey Cəbrail! Muhəmmədin yanına get, ondan soruş ki: “Səni ağladan nədir?” (Halbuki Rəbbi onun nə cavab verəcəyini bilir.) Cəbrail ﷺ onun yanına gəldi və ondan (ağlamağının səbəbini) soruşdu. Peyğəmbər ﷺ Cəbrailə (ümmətinə acıdığını) xəbər verdi. (Halbuki Allah bunu daha yaxşı bilir.) Onda Allah buyurdu: “Ey Cəbrail! Muhəmmədin yanına get, (ona) de ki: “Biz səni ümmətin xüsusunda mütləq razı salacağıq[3] və səni kədərləndirməyəcəyik”.[4]

## (٨٨) – بَابُ بَيَانِ أَنَّ مَنْ مَاتَ عَلَى الْكُفْرِ فَهُوَ فِي النَّارِ وَلاَ تَنَالُهُ شَفَاعَةٌ وَلاَ تَنْفَعُهُ قَرَابَةُ الْمُقَرَّبِينَ

## 88-ci fəsil. Kafir olaraq ölən kimsənin cəhənnəmlik olmasının, ona heç bir şəfaətin yetişməyəcəyinin və (Allaha) yaxın olan kimsələrin əqrəbalığının ona fayda verməyəcəyinin bəyan edilməsi

**[٥٠٠] ٣٤٧–(٢٠٣)** حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا عَفَّانُ: حَدَّثَنَا حَمَّادُ بْنُ سَلَمَةَ عَنْ ثَابِتٍ، عَنْ أَنَسٍ أَنَّ رَجُلاً قَالَ: يَا رَسُولَ اللَّهِ! أَيْنَ أَبِي؟ قَالَ: ((فِي النَّارِ)) فَلَمَّا قَفَّى دَعَاهُ فَقَالَ: ((إِنَّ أَبِي وَأَبَاكَ فِي النَّارِ)).

**[500]-347-(203)** ........ Ənəs ﷺ demişdir: “Bir nəfər: “Ya Rəsulullah! Atam haradadır?”– deyə soruşdu. Peyğəmbər ﷺ: “Cəhənnəmdədir”– deyə buyurdu.

---

[1] “İbrahim” surəsi, 36.

[2] “əl-Maidə” surəsi, 118.

[3] Bu, Quranda da öz təsdiqini tapmışdır. “əd-Duha” surəsinin 5-ci ayəsində buyurulur ki: **“Rəbbin sənə** ***nemət*** **bəxş edəcək, sən də razı qalacaqsan”.**

[4] Bu hədis bizə, Peyğəmbərin ﷺ öz ümmətinə qayğı göstərdiyini və onların rifahı üçün can yandırdığını, onun yüksək məqam sahibi və Allah yanında böyük ehtirama layiq olduğunu, habelə dua edərkən əllərini qaldırmağın bəyənilən əməllərdən sayıldığını və bu ümmətin uğur qazanacağını xəbər verir.

Adam çıxıb getdikdə Peyğəmbər ﷺ onu çağırıb dedi: "Mənim də atam, sənin də atan Cəhənnəmdədir[1]".

## (٨٩) – بَابُ فِي قَوْلِهِ تَعَالَى: ﴿وَأَنذِرْ عَشِيرَتَكَ ٱلْأَقْرَبِينَ﴾

## 89-cu fəsil. Uca (Allahın): "Ən yaxın qohumlarını qorxut!"[2] sözü

**[٥٠١] ٣٤٨–(٢٠٤)** حَدَّثَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ وَزُهَيْرُ بْنُ حَرْبٍ قَالاَ: حَدَّثَنَا جَرِيرٌ عَنْ عَبْدِ الْمَلِكِ بْنِ عُمَيْرٍ، عَنْ مُوسَى بْنِ طَلْحَةَ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ: لَمَّا أُنْزِلَتْ هَذِهِ الآيَةُ: ﴿وَ أَنْذِرْ عَشِيرَتَكَ الأَقْرَبِينَ﴾ دَعَا رَسُولُ اللَّهِ ﷺ قُرَيْشًا، فَاجْتَمَعُوا، فَعَمَّ وَخَصَّ فَقَالَ: ((يَا بَنِي كَعْبِ بْنِ لُؤَيٍّ! أَنْقِذُوا أَنْفُسَكُمْ مِنْ النَّارِ. يَا بَنِي مُرَّةَ بنِ كَعْبٍ! أَنْقِذُوا أَنْفُسَكُمْ مِنْ النَّارِ. يَا بَنِي عَبْدِ شَمْسٍ! أَنْقِذُوا أَنْفُسَكُمْ مِنَ النَّارِ. يَا بَنِي عَبْدِ مَنَافٍ! أَنْقِذُوا أَنْفُسَكُمْ مِنْ النَّارِ. يَا بَنِي هَاشِمٍ! أَنْقِذُوا أَنْفُسَكُمْ مِنْ النَّارِ. يَا بَنِي عَبْدِ الْمُطَّلِبِ! أَنْقِذُوا أَنْفُسَكُمْ مِنْ النَّارِ. يَا فَاطِمَةُ! أَنْقِذِي نَفْسَكِ مِنْ النَّارِ. فَإِنِّي لاَ أَمْلِكُ لَكُمْ مِنْ اللَّهِ شَيْئًا، غَيْرَ أَنَّ لَكُمْ رَحِمًا سَأَبُلُّهَا بِبَلاَلِهَا)).

**[501]-348-(204)** ........ Əbu Hureyrə ؓ demişdir: "Bu, **"ən yaxın qohumlarını qorxut!"** ayəsi nazil edildiyi zaman Peyğəmbər ﷺ qureyşliləri çağırdı və onlar (onun yanına) toplandılar. Peyğəmbər ﷺ gah ümumiləşdirərək,[3] gah da xüsusiləşdirərək[4] belə buyurdu: "Ey Kəb ibn Luey[5] oğulları! Canınızı oddan

---

[1] Ərəblərin bütlərə ibadət etdikləri dövrdə, içərilərindən Allaha şərik qoşduğu halda vəfat etmiş kimsələrin hamısı cəhənnəmlikdir. Belə ki, Məkkə müşriklərinə İbrahim aleyhissəlamın dəvəti gəlib çatmış, lakin onlar bunu qəbul etməmişlər. Uca Allah buyurur: **"De: "Allah doğru söylədi. Odur ki, İbrahimin hənif dininin ardınca gedin. O, müşriklərdən deyildi"** ("Ali-İmran" surəsi, 95); **"De: "Həqiqətən, Rəbbim məni doğru yola, həqiqi dinə, hənif İbrahimin dininə yönəltdi. O heç vaxt müşriklərdən olmamışdı"** ("əl-Ənam" surəsi, 161); **"Kitab əhli dedi: "Yəhudi və ya xaçpərəst olun ki, doğru yola yönələsiniz!" De: "Əksinə, *biz* hənif İbrahimin dinindəyik. O, müşriklərdən deyildi"** ("əl-Bəqərə" surəsi, 135); **"İbrahim nə yəhudi, nə də nəsrani idi. O, ancaq hənif bir müsəlman idi və müşriklərdən deyildi"** ("Ali-İmran" surəsi, 67).

[2] "əş-Şuəra" surəsi, 214.

[3] Peyğəmbər ﷺ qureyşliləri əvvəlcə ümumi şəkildə çağırdı. Bu da onun qohumlarının hamısını əhatə etdiyinə dəlalət edir.

[4] Yəni "Ey Fatimə!", digər rəvayətlərdə də: "Ey Abdul-Muttəlibin qızı Səfiyyə!", "Ey Abdul-Muttəlibin oğlu Abbas!" – deyə müraciət edib onları adbaad çağırdı.

[5] Kəb ibn Luey ibn Ğalib ibn Fihr ibn Malik ibn ən-Nədr ibn Kinanə ibn Xuzeymə ibn Mudrikə ibn İlyas ibn Mudar ibn Nizar ibn Məaddi ibn Ədnandır.

qurtarın! Ey Murra ibn Kəb[1] oğulları! Canınızı oddan qurtarın! Ey Abduşəms[2] oğulları! Canınızı oddan qurtarın! Ey Abdumənaf[3] oğulları! Canınızı oddan qurtarın! Ey Haşim[4] oğulları! Canınızı oddan qurtarın! Ey Abdul-Muttəlib[5] oğulları! Canınızı oddan qurtarın! Ey Fatimə! Canını oddan qurtar! Mən sizi Allahın (əzabından) qurtara bilməyəcəyəm.[6] Sadəcə olaraq məni sizə bağlayan qohumluq əlaqələri vardır ki, mən bu əlaqələri qoruyub saxlayacağam".

**[٥٠٢] ٣٤٩**–(...) و حَدَّثَنَا عُبَيْدُ اللَّهِ بْنُ عُمَرَ الْقَوَارِيرِيُّ: حَدَّثَنَا أَبُو عَوَانَةَ عَنْ عَبْدِ الْمَلِكِ بْنِ عُمَيْرٍ بِهَذَا الإِسْنَادِ. وَحَدِيثُ جَرِيرٍ أَتَمُّ وَأَشْبَعُ.

**[502]-349-(...)** ........ Ubeydullah ibn Ömər əl-Qəvariri bizə belə rəvayət etmişdir: "(Bu hədisi) bizə Əbu Əvana, Abdul-Məlik ibn Umeyrdən bu isnadla rəvayət etmişdir". Cəririn rəvayət etdiyi hədis isə daha tam və daha qaneedicidir.

**[٥٠٣] ٣٥٠**–(٢٠٥) حَدَّثَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللَّهِ بْنِ نُمَيْرٍ: حَدَّثَنَا وَكِيعٌ وَيُونُسُ بْنُ بُكَيْرٍ قَالاَ: حَدَّثَنَا هِشَامُ بْنُ عُرْوَةَ عَنْ أَبِيهِ، عَنْ عَائِشَةَ قَالَتْ: لَمَّا نَزَلَتْ: ﴿وَ أَنْذِرْ عَشِيرَتَكَ الأَقْرَبِينَ﴾ قَامَ رَسُولُ اللَّهِ ﷺ عَلَى الصَّفَا فَقَالَ: ((يَا فَاطِمَةُ بِنْتَ مُحَمَّدٍ! يَا صَفِيَّةُ بِنْتَ عَبْدِ الْمُطَّلِبِ! يَا بَنِي عَبْدِ الْمُطَّلِبِ! لاَ أَمْلِكُ لَكُمْ مِنَ اللَّهِ شَيْئًا، سَلُونِي مِنْ مَالِي مَا شِئْتُمْ)).

---

[1] Murra ibn Kəb ibn Luey ibn Ğalib ibn Fihr ibn Malik ibn ən-Nədr ibn Kinanə ibn Xuzeymə ibn Mudrikə ibn İlyas ibn Mudar ibn Nizar ibn Məaddi ibn Ədnandır.

[2] Abduşəms ibn Abdumənaf ibn Qusey ibn Kilab ibn Murra ibn Kəb ibn Luey ibn Ğalib ibn Fihr ibn Malik ibn ən-Nədr ibn Kinanə ibn Xuzeymə ibn Mudrikə ibn İlyas ibn Mudar ibn Nizar ibn Məaddi ibn Ədnandır.

[3] Abdumənaf ibn Qusey ibn Kilab ibn Murra ibn Kəb ibn Luey ibn Ğalib ibn Fihr ibn Malik ibn ən-Nədr ibn Kinanə ibn Xuzeymə ibn Mudrikə ibn İlyas ibn Mudar ibn Nizar ibn Məaddi ibn Ədnandır.

[4] Haşim ibn Abdumənaf ibn Qusey ibn Kilab ibn Murra ibn Kəb ibn Luey ibn Ğalib ibn Fihr ibn Malik ibn ən-Nədr ibn Kinanə ibn Xuzeymə ibn Mudrikə ibn İlyas ibn Mudar ibn Nizar ibn Məaddi ibn Ədnandır.

[5] Abdul-Muttəlib ibn Haşim ibn Abdumənaf ibn Qusey ibn Kilab ibn Murra ibn Kəb ibn Luey ibn Ğalib ibn Fihr ibn Malik ibn ən-Nədr ibn Kinanə ibn Xuzeymə ibn Mudrikə ibn İlyas ibn Mudar ibn Nizar ibn Məaddi ibn Ədnandır.

[6] Bu hədisdən açıq-aydın görünür ki, kafir adam peyğəmbərin yaxını olsa belə, axirətdə bu ona heç bir fayda verməyəcək. Bu fikir Uca Allahın aşağıdakı ayəsində də öz əksini tapmışdır.

**"Allah kafirlərə Nuhun arvadı ilə Lutun arvadını misal çəkdi. Onlar Bizim əməlisaleh qullarımızdan iki qulun nikahı altında idilər. Onlar ərlərinə xəyanət etdilər və bunlar onları Allahdan heç cür xilas edə bilmədilər. Onlara: "Girənlərlə birgə ikiniz də Oda girin!"– deyildi"** ("Hud" surəsi, 8).

**[503]-350-(205)** ........ Aişə ﷺ demişdir: **“Ən yaxın qohumlarını qorxut!”** ayəsi nazil olduqda Peyğəmbər ﷺ Səfa[1] dağına qalxıb (uca səslə) dedi: “Ey Muhəmmədin qızı Fatimə! Ey Abdul-Muttəlibin qızı Səfiyyə! Ey Abdul-Muttəlib oğulları! Mən sizi Allahın (əzabından) qurtara bilməyəcəyəm. Malımdan isə nə diləyirsinizsə, diləyin!”

**[٥٠٤] ٣٥١**–(٢٠٦) و حَدَّثَنِي حَرْمَلَةُ بْنُ يَحْيَى: أَخْبَرَنَا ابْنُ وَهْبٍ قَالَ: أَخْبَرَنِي يُونُسُ، عَنِ ابْنِ شِهَابٍ قَالَ: أَخْبَرَنِي ابْنُ الْمُسَيَّبِ وَأَبُو سَلَمَةَ بْنُ عَبْدِ الرَّحْمَنِ أَنَّ أَبَا هُرَيْرَةَ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ حِينَ أُنْزِلَ عَلَيْهِ: ﴿وَ أَنْذِرْ عَشِيرَتَكَ الأَقْرَبِينَ﴾ ((يَا مَعْشَرَ قُرَيْشٍ! اشْتَرُوا أَنْفُسَكُمْ مِنَ اللَّهِ، لاَ أُغْنِي عَنْكُمْ مِنَ اللَّهِ شَيْئًا. يَا بَنِي عَبْدِ الْمُطَّلِبِ! لاَ أُغْنِي عَنْكُمْ مِنَ اللَّهِ شَيْئًا. يَا عَبَّاسَ بْنَ عَبْدِ الْمُطَّلِبِ! لاَ أُغْنِي عَنْكَ مِنَ اللَّهِ شَيْئًا. يَا صَفِيَّةُ عَمَّةَ رَسُولِ اللَّهِ! لاَ أُغْنِي عَنْكِ مِنَ اللَّهِ شَيْئًا. يَا فَاطِمَةُ بِنْتَ رَسُولِ اللَّهِ! سَلِينِي بِمَا شِئْتِ، لاَ أُغْنِي عَنْكِ مِنَ اللَّهِ شَيْئًا)).

**[504]-351-(206)** ........ Əbu Hureyrə ﷺ demişdir: “Peyğəmbərə ﷺ: **“Ən yaxın qohumlarını qorxut!”** ayəsi nazil edildikdə o, (qohum-əqrəbasını çağırıb) dedi: “Ey qureyşlilər, canınızı Allahdan satın alın!”[2] Mən sizi Allahın (əzabından) qurtara bilməyəcəyəm. Ey Abdul-Muttəlib oğulları, mən sizi Allahın (əzabından) qurtara bilməyəcəyəm. Ey Abdul-Muttəlibin oğlu Abbas, mən səni Allahın (əzabından) qurtara bilməyəcəyəm. Ey Peyğəmbərin bibisi Səfiyyə, mən səni Allahın (əzabından) qurtara bilməyəcəyəm. Ey Rəsulullahın qızı Fatimə, məndən nə istəyirsənsə, istə. Mən səni Allahın (əzabından) qurtara bilməyəcəyəm”.

**[٥٠٥] ٣٥٢**–(...) و حَدَّثَنِي عَمْرٌو النَّاقِدُ: حَدَّثَنَا مُعَاوِيَةُ بْنُ عَمْرٍو: حَدَّثَنَا زَائِدَةُ: حَدَّثَنَا عَبْدُ اللَّهِ بْنُ ذَكْوَانَ، عَنِ الأَعْرَجِ عَنْ أَبِي هُرَيْرَةَ عَنِ النَّبِيِّ ﷺ نَحْوَ هَذَا.

**[505]-352-(...)** ........ Abdullah ibn Zəkvan, Ə′rəcdən, o da Əbu Hureyrədən, o da Peyğəmbərdən ﷺ bu hədisin bənzərini rəvayət etmişdir.

**[٥٠٦] ٣٥٣**–(٢٠٧) حَدَّثَنَا أَبُو كَامِلٍ الْجَحْدَرِيُّ: حَدَّثَنَا يَزِيدُ بْنُ زُرَيْعٍ: حَدَّثَنَا التَّيْمِيُّ عَنْ أَبِي عُثْمَانَ، عَنْ قَبِيصَةَ بْنِ الْمُخَارِقِ وَزُهَيْرِ بْنِ عَمْرٍو قَالاَ: لَمَّا نَزَلَتْ: ﴿وَ أَنْذِرْ عَشِيرَتَكَ الأَقْرَبِينَ﴾ قَالَ: انْطَلَقَ نَبِيُّ اللَّهِ ﷺ إِلَى رَضْمَةٍ مِنْ جَبَلٍ فَعَلاَ أَعْلاَهَا حَجَرًا، ثُمَّ نَادَى: ((يَا بَنِي عَبْدِ مَنَافَاهْ! إِنِّي نَذِيرٌ، إِنَّمَا مَثَلِي وَمَثَلُكُمْ كَمَثَلِ رَجُلٍ رَأَى الْعَدُوَّ فَانْطَلَقَ يَرْبَأُ أَهْلَهُ، فَخَشِيَ أَنْ يَسْبِقُوهُ فَجَعَلَ يَهْتِفُ: يَا صَبَاحَاهْ!)).

---

[1] Məscidul-Həramın şərq hissəsində yerləşmiş iki təpəlikdən biri. Zəvvarlar Səfa və Mərvə təpələri arasında ənənəvi qaçış keçirirlər ki, buna da “təvaf və ya səy etmək” deyilir.

[2] Yəni canınızı Allahın əzabından qurtarın.

**[506]-353-(207)** ........ Teymiy,[1] Əbu Osmandan, o da Qəbisə ibn Muxariq və Zuheyr ibn Amrdan rəvayət etmişdir ki, onlar belə demişlər: **“Ən yaxın qohumlarını qorxut!”** ayəsi nazil olduqdan sonra Peyğəmbər ﷺ dağdan qopub düşmüş daşların yanına gəldi. Sonra ən böyük daşın üstünə qalxdı və uca səslə çağırıb dedi: “Ey Abdumənaf oğulları! Mən sizi (əzabla) qorxudan bir peyğəmbərəm! Mənimlə sizin misalınız, düşməni görüb qövmünü qorumaq üçün (düşmənə) göz qoyan və düşmənin onu qabaqlayacağından ehtiyat edib uca səslə (qövmünü səsləyib): “Haydı, canınızı qurtarın!” deyən kimsənin misalına bənzəyir”.

**[٥٠٧] ٣٥٤**–(...) و حَدَّثَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى: حَدَّثَنَا الْمُعْتَمِرُ عَنْ أَبِيهِ: حَدَّثَنَا أَبُو عُثْمَانَ عَنْ زُهَيْرِ بْنِ عَمْرٍو وَقَبِيصَةَ بْنِ مُخَارِقٍ عَنْ النَّبِيِّ ﷺ بِنَحْوِهِ.

**[507]-354-(...)** ........ (Bu hədisi) bizə Muhəmməd ibn Abdul-Əla rəvayət etmişdir. (O demişdir): “Bizə Motəmir öz atasından, o da Əbu Osmandan, o da Zuheyr ibn Amr və Qəbisə ibn Muxariqdən, onlar da Peyğəmbərdən ﷺ bu hədisin bənzərini rəvayət etmişdir.

**[٥٠٨] ٣٥٥**–(٢٠٨) و حَدَّثَنَا أَبُو كُرَيْبٍ مُحَمَّدُ بْنُ الْعَلاَءِ: حَدَّثَنَا أَبُو أُسَامَةَ عَنْ الأَعْمَشِ عَنْ عَمْرِو بْنِ مُرَّةَ، عَنْ سَعِيدِ بْنِ جُبَيْرٍ، عَنْ ابْنِ عَبَّاسٍ قَالَ: لَمَّا نَزَلَتْ هَذِهِ الآيَةُ: ﴿وَ أَنْذِرْ عَشِيرَتَكَ الأَقْرَبِينَ﴾ وَرَهْطَكَ مِنْهُمْ الْمُخْلَصِينَ، خَرَجَ رَسُولُ اللَّهِ ﷺ حَتَّى صَعِدَ الصَّفَا، فَهَتَفَ: ((يَا صَبَاحَاهْ!)) فَقَالُوا: مَنْ هَذَا الَّذِي يَهْتِفُ؟ قَالُوا: مُحَمَّدٌ، فَاجْتَمَعُوا إِلَيْهِ، فَقَالَ: ((يَا بَنِي فُلاَنٍ! يَا بَنِي فُلاَنٍ! يَا بَنِي فُلاَنٍ! يَا بَنِي عَبْدِ مَنَافٍ! يَا بَنِي عَبْدِ الْمُطَّلِبِ! فَاجْتَمَعُوا إِلَيْهِ، فَقَالَ: ((أَرَأَيْتَكُمْ لَوْ أَخْبَرْتُكُمْ أَنَّ خَيْلاً تَخْرُجُ بِسَفْحِ هَذَا الْجَبَلِ أَكُنْتُمْ مُصَدِّقِيَّ))؟ قَالُوا: مَا جَرَّبْنَا عَلَيْكَ كَذِبًا، قَالَ: ((فَإِنِّي نَذِيرٌ لَكُمْ بَيْنَ يَدَيْ عَذَابٍ شَدِيدٍ))

قَالَ: فَقَالَ أَبُو لَهَبٍ: تَبًّا لَكَ! أَمَا جَمَعْتَنَا إِلاَّ لِهَذَا؟ ثُمَّ قَامَ: فَنَزَلَتْ هَذِهِ السُّورَةُ: ﴿تَبَّتْ يَدَا أَبِى لَهَبٍ وَقَدْ تَبَّ﴾ كَذَا قَرَأَ الأَعْمَشُ إِلَى آخِرِ السُّورَةِ.

**[508]-355-(208)** ........ İbn Abbas ﵁ demişdir: “Bu: **“Ən yaxın qohumlarını –** içərilərindən ən səmimi olanlarını,[2] – **qorxut!”** ayəsi nazil olduqda Peyğəmbər ﷺ (evindən) çıxdı. Nəhayət, gəlib Səfa dağına qalxdı və: “Haydı, canınızı

---

[1] Adı: Suleyman ibn Tərxandır.

[2] Bu hədisin şərhində deyilir ki, “içərilərindən ən səmimi olanlarını” sözü əvvəlcə ayə olaraq nazil olmuş, sonra isə nəsx edilmişdir. Qeyd etmək lazımdır ki, bu əlavə Buxarinin “Səhih” əsərində nəql edilməmişdir (“Şərh ən-Nəvəvi”, 1/353).

qurtarın!"– deyə (qureyşliləri) səsləməyə başladı. (Bəziləri): "Bu qışqıran kimdir?"– deyə soruşdular. Digərləri: "Muhəmməddir"– dedilər və onun yanına toplanmağa başladılar. Peyğəmbər ﷺ buyurdu: "Ey filankəs oğulları! Ey filankəs oğulları! Ey filankəs oğulları! Ey Abdumənȧf oğulları! Ey Abdul-Muttəlib oğulları!" (Nəhayət, hamısı) onun yanına toplandı. Peyğəmbər ﷺ buyurdu: "Deyin görək, əgər mən sizə bu dağın ətəyindən bir dəstə atlı çıxıb (üstünüzə hücum edəcəyini) xəbər versəm, mənə inanarsınızmı?" Onlar: "Biz səndən yalan eşitməmişik[1]"– deyə cavab verdilər. Peyğəmbər ﷺ buyurdu: "Mən sizi gələcək şiddətli əzabla qorxudan bir peyğəmbərəm". (Bunu eşidəndə) Əbu Ləhəb[2] dedi: "Ölüm olsun sənə! Bizi buna görəmi yığmısan?" (Elə bu səbəbdən də) bu surə nazil oldu: **"Əbu Ləhəbin əlləri qurusun, artıq qurudu da!"**[3]

Aməş bu surəni bu qiraətlə[4] axıra kimi oxudu.[5]

**[٥٠٩] ٣٥٦**–(...) و حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ وَأَبُو كُرَيْبٍ قَالَ: حَدَّثَنَا أَبُو مُعَاوِيَةَ عَنْ الأَعْمَشِ، بِهَذَا الإِسْنَادِ، قَالَ: صَعِدَ رَسُولُ اللَّهِ ﷺ ذَاتَ يَوْمٍ الصَّفَا فَقَالَ: ((يَا صَبَاحَاهْ!)) بِنَحْوِ حَدِيثِ أَبِي أُسَامَةَ وَلَمْ يَذْكُرْ نُزُولَ الآيَةِ: ﴿وَ أَنْذِرْ عَشِيرَتَكَ الأَقْرَبِينَ﴾.

**[509]-356-(...)** ......Əbu Müaviyə Aməşdən bu isnadla: "Bir gün Peyğəmbər ﷺ Səfa dağına qalxdı və: "Haydı, canınızı qurtarın!"– deyə (qureyşliləri) səsləməyə başladı..." deyərək Əbu Usamənin rəvayət etdiyi hədisin bənzərini rəvayət etmiş, fəqət (bu rəvayətdə) **"Ən yaxın qohumlarını qorxut!"** ayəsinin nazil olduğunu zikr etməmişdir.

---

[1] İmam Buxarinin rəvayət etdiyi uzun hədisdə xəbər verilir ki, Herakl Əbu Süfyandan: "Söylədiklərini deməzdən (yəni bu dinə dəvət etməzdən) əvvəl heç onu yalan danışmaqda ittiham etmisinizmi?"– deyə soruşmuş və Əbu Süfyan ona: "Xeyr!"– deyə cavab vermişdir. Nəhayət, suallarını verib qurtardıqdan sonra o, Əbu Süfyana: "Söylədiklərini deməzdən əvvəl onu yalan danışmaqda ittiham etmisinizmi deyə soruşdum, dedin ki, xeyr. Mənə aydın oldu ki, insanlara yalan danışmayan adam, Allahın adından da yalan danışmaz"– deyə etirazını bildirmiş, axırda da Muhəmməd səllallahu aleyhi və səlləmin həqiqətən peyğəmbər olduğunu təsdiqləyib demişdir: "Əgər sənin dediklərin doğrudursa, onda o, bu ayaqlarımın basdığı yerə sahib olacaq. Mən bilirdim ki, o gələcək, lakin sizlərdən olacağını güman etmirdim. Əgər onun yanına gedib çata biləcəyimə arxayın olsaydım, hər halda onunla görüşməyə çalışardım. Və əgər yanında olsaydım, ayaqlarını yuyardım" ("Səhih əl-Buxari", 7).

[2] Əbu Ləhəb Abdul-Uzzə ibn Abdul-Muttəlib Peyğəmbərin ﷺ əmisi və ən qatı düşmənlərindən biri olmuşdur.

[3] "əl-Məsəd" surəsi, 1.

[4] Bu qiraətdə "وَ تَبَّ" (qurudu da) yerinə "وَ قَدْ تَبَّ" (artıq qurudu da) deyilir.

[5] **"Əbu Ləhəbin əlləri qurusun, qurudu da! Nə var-dövləti, nə də qazandıqları onu qurtara bilməyəcək. O, alovlanan oda atılacaqdır. Onun odun şələsi daşıyan arvadı da. Arvadının boynunda xurma liflərindən kəndir olacaqdır"** ("əl-Məsəd" surəsi, 1-5).

## (٩٠) – بَابُ شَفَاعَةِ النَّبِيِّ ﷺ لأَبِي طَالِبٍ وَالتَّخْفِيفِ عَنْهُ بِسَبَبِهِ

## 90-cu fəsil. Peyğəmbərin ﷺ Əbu Talibə[1] şəfaət etməsi və məhz onun sayəsində Əbu Talibin əzabının yüngülləşdirilməsi

**[٥١٠] ٣٥٧**–(٢٠٩) و حَدَّثَنَا عُبَيْدُ اللَّهِ بْنُ عُمَرَ الْقَوَارِيرِيُّ وَمُحَمَّدُ بْنُ أَبِي بَكْرٍ الْمُقَدَّمِيُّ وَمُحَمَّدُ بْنُ عَبْدِ الْمَلِكِ الأُمَوِيُّ قَالُوا: حَدَّثَنَا أَبُو عَوَانَةَ عَنْ عَبْدِ الْمَلِكِ بْنِ عُمَيْرٍ، عَنْ عَبْدِ اللَّهِ بْنِ الْحَارِثِ بْنِ نَوْفَلٍ، عَنْ الْعَبَّاسِ بْنِ عَبْدِ الْمُطَّلِبِ أَنَّهُ قَالَ: يَا رَسُولَ اللَّهِ! هَلْ نَفَعْتَ أَبَا طَالِبٍ بِشَيْءٍ، فَإِنَّهُ كَانَ يَحُوطُكَ وَيَغْضَبُ لَكَ؟ قَالَ: ((نَعَمْ، هُوَ فِي ضَحْضَاحٍ مِنْ نَارٍ، وَلَوْلاَ أَنَا لَكَانَ فِي الدَّرْكِ الأَسْفَلِ مِنْ النَّارِ)).

**[510]-357-(209)** ........ Rəvayət edilir ki, (bir dəfə) Abbas ibn Abdul-Muttəlib ﷺ (Peyğəmbərə ﷺ) dedi: “Ya Rəsulullah! Əbu Talibə sənin nə köməyin dəyib? Axı, o, səni müdafiə edərdi, (kimsə) sənin (xətrinə dəyəndə) qəzəblənərdi.” Peyğəmbər ﷺ dedi: “Bəli, o, Cəhənnəmin dayaz bir yerindədir. Əgər mən olmasaydım, o, Cəhənnəmin ən aşağı təbəqəsində[2] olardı”.

**[٥١١] ٣٥٨**–(...) حَدَّثَنَا ابْنُ أَبِي عُمَرَ: حَدَّثَنَا سُفْيَانُ عَنْ عَبْدِ الْمَلِكِ بْنِ عُمَيْرٍ عَنْ عَبْدِ اللَّهِ بْنِ الْحَارِثِ قَالَ: سَمِعْتُ الْعَبَّاسَ يَقُولُ: قُلْتُ: يَا رَسُولَ اللَّهِ! إِنَّ أَبَا طَالِبٍ كَانَ يَحُوطُكَ وَيَنْصُرُكَ، فَهَلْ نَفَعَهُ ذَلِكَ؟ قَالَ: ((نَعَمْ، وَجَدْتُهُ فِي غَمَرَاتٍ مِنْ النَّارِ فَأَخْرَجْتُهُ إِلَى ضَحْضَاحٍ)).

**[511]-358-(...)** ........ Abdullah ibn Haris demişdir: “Mən Abbasın belə dediyini eşitdim: “Mən (Peyğəmbərə ﷺ) dedim: “Ya Rəsulullah! Əbu Talib səni qoruyardı və sənə yardım edərdi. (Söylə görək,) bu ona fayda verəcəkmi?” Peyğəmbər ﷺ dedi: “Bəli! Mən onu Cəhənnəmin dərin bir yerində tapdım və onu dayaz yerə çıxartdım”.

**[٥١٢] ٣٥٩**–(...) و حَدَّثَنِيهِ مُحَمَّدُ بْنُ حَاتِمٍ: حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ عَنْ سُفْيَانَ قَالَ: حَدَّثَنِي عَبْدُ الْمَلِكِ بْنُ عُمَيْرٍ قَالَ: حَدَّثَنِي عَبْدُ اللَّهِ بْنُ الْحَارِثِ قَالَ: أَخْبَرَنِي الْعَبَّاسُ بْنُ عَبْدِ الْمُطَّلِبِ؛ ح: و حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا وَكِيعٌ عَنْ سُفْيَانَ بِهَذَا الإِسْنَادِ، عَنْ النَّبِيِّ ﷺ، بِنَحْوِ حَدِيثِ أَبِي عَوَانَةَ.

**[512]-359-(...)** ........ Ravilər Abbas ibn Abdul-Muttəlibin rəvayət etdiyi həmin hədisi bu isnadla Peyğəmbərdən ﷺ, Əbu Əvanənin rəvayət etdiyi hədisə bənzər rəvayət etmişlər.

---

[1] Əbu Talib Peyğəmbərin ﷺ əmisidir.
[2] Burada ən aşağı təbəqə deyildikdə Cəhənnəmin dibi nəzərdə tutulur.

**[٥١٣] ٣٦٠-(٢١٠)** و حَدَّثَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ: حَدَّثَنَا لَيْثٌ عَنْ ابْنِ الْهَادِ، عَنْ عَبْدِ اللَّهِ بْنِ خَبَّابٍ، عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ أَنَّ رَسُولَ اللَّهِ ﷺ ذُكِرَ عِنْدَهُ عَمُّهُ أَبُو طَالِبٍ، فَقَالَ: ((لَعَلَّهُ تَنْفَعُهُ شَفَاعَتِي يَوْمَ الْقِيَامَةِ، فَيُجْعَلُ فِي ضَحْضَاحٍ مِنْ نَارٍ، يَبْلُغُ كَعْبَيْهِ، يَغْلِي مِنْهُ دِمَاغُهُ)).

**[513]-360-(210)** ........ Əbu Səid əl-Xudri ﷺ demişdir: "(Bir dəfə) Rəsulullahın ﷺ yanında əmisi Əbu Talib zikr edildi. Onda o, belə buyurdu: "Ümidvaram ki, Qiyamət günü mənim şəfaətim ona fayda verəcək və o, Cəhənnəmin dayaz yerinə yerləşdiriləcək. (Orada) alov onun topuqlarına çatacaq və istisindən onun beyni qaynayacaq".

## (٩١) - بَابُ أَهْوَنِ أَهْلِ النَّارِ عَذَابًا

## 91-ci fəsil. Cəhənnəmdə ən yüngül əzab çəkəcək kimsə haqqında

**[٥١٤] ٣٦١-(٢١١)** حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا يَحْيَى بْنُ أَبِي بُكَيْرٍ: حَدَّثَنَا زُهَيْرُ بْنُ مُحَمَّدٍ، عَنْ سُهَيْلِ بْنِ أَبِي صَالِحٍ، عَنْ النُّعْمَانِ بْنِ أَبِي عَيَّاشٍ، عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: ((إِنَّ أَدْنَى أَهْلِ النَّارِ عَذَابًا، يَنْتَعِلُ بِنَعْلَيْنِ مِنْ نَارٍ، يَغْلِي دِمَاغُهُ مِنْ حَرَارَةِ نَعْلَيْهِ)).

**[514]-361-(211)** ........ Əbu Səid əl-Xudri ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Cəhənnəmdə ən yüngül əzab çəkəcək kimsə alovdan iki başmaq geyəcək. Bu başmaqların hərarətindən onun beyni qaynayacaq".

**[٥١٥] ٣٦٢-(٢١٢)** و حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا عَفَّانُ: حَدَّثَنَا حَمَّادُ بْنُ سَلَمَةَ: حَدَّثَنَا ثَابِتٌ، عَنْ أَبِي عُثْمَانَ النَّهْدِيِّ، عَنْ ابْنِ عَبَّاسٍ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: ((أَهْوَنُ أَهْلِ النَّارِ عَذَابًا أَبُو طَالِبٍ، وَهُوَ مُنْتَعِلٌ بِنَعْلَيْنِ يَغْلِي مِنْهُمَا دِمَاغُهُ)).

**[515]-362-(212)** ........ İbn Abbas رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Cəhənnəmdə ən yüngül əzab çəkəcək adam Əbu Talib olacaq. O, alovdan iki başmaq geyəcək və bunların (istisindən) onun beyni qaynayacaq".

**[٥١٦] ٣٦٣-(٢١٣)** و حَدَّثَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى وَابْنُ بَشَّارٍ - وَاللَّفْظُ لِابْنِ الْمُثَنَّى - قَالَا: حَدَّثَنَا مُحَمَّدُ بْنُ جَعْفَرٍ، حَدَّثَنَا شُعْبَةُ قَالَ: سَمِعْتُ أَبَا إِسْحَقَ يَقُولُ: سَمِعْتُ النُّعْمَانَ بْنَ بَشِيرٍ يَخْطُبُ وَهُوَ يَقُولُ:

سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ: ((إِنَّ أَهْوَنَ أَهْلِ النَّارِ عَذَابًا يَوْمَ الْقِيَامَةِ، لَرَجُلٌ تُوضَعُ فِي أَخْمَصِ قَدَمَيْهِ جَمْرَتَانِ، يَغْلِي مِنْهُمَا دِمَاغُهُ)).

**[516]-363-(213)** ........ Nomən ibn Bəşir ﷺ xütbə verərkən demişdir: “Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: “Qiyamət günü Cəhənnəm əhlinin ən yüngül əzab çəkəni o kimsə olacaq ki, ayağının altındakı çuxurlara köz qoyulacaq, bunların istisindən onun beyni qaynacaq”.

**[٥١٧] ٣٦٤**-(...) و حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا أَبُو أُسَامَةَ عَنْ الأَعْمَشِ، عَنْ أَبِي إِسْحَقَ، عَنْ النُّعْمَانِ بْنِ بَشِيرٍ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((إِنَّ أَهْوَنَ أَهْلِ النَّارِ عَذَابًا مَنْ لَهُ نَعْلاَنِ وَشِرَاكَانِ مِنْ نَارٍ، يَغْلِي مِنْهُمَا دِمَاغُهُ، كَمَا يَغْلِ الْمِرْجَلُ مَا يَرَى أَنَّ أَحَدًا أَشَدُّ مِنْهُ عَذَابًا، وَإِنَّهُ لأَهْوَنُهُمْ عَذَابًا)).

**[517]-364-(...)** ........ Nomən ibn Bəşir ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Cəhənnəm əhlinin ən yüngül əzab çəkəni o kimsə olacaq ki, onun alovdan iki səndəli, (bunların da) iki qaytanı olacaq. Bu səndəllərin (hərarətindən) onun beyni tiyan[1] qaynadığı kimi qaynayacaq. (Buna rəğmən) o, özündən başqa heç kəsin bu cür şiddətli əzaba düçar olduğunu güman etməyəcək. Halbuki o, cəhənnəmliklərin ən yüngül əzab çəkəni olacaq”.

## (٩٢) – بَابُ الدَّلِيلِ عَلَى أَنَّ مَنْ مَاتَ عَلَى الْكُفْرِ لاَ يَنْفَعُهُ عَمَلٌ

## 92-ci fəsil. Kafir olaraq ölən kimsənin (yaxşı) əməlinin özünə fayda verməyəcəyinə dair dəlil

**[٥١٨] ٣٦٥**-(٢١٤) حَدَّثَنِي أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا حَفْصُ بْنُ غِيَاثٍ عَنْ دَاوُدَ، عَنْ الشَّعْبِيِّ، عَنْ مَسْرُوقٍ، عَنْ عَائِشَةَ قَالَتْ، قُلْتُ: يَا رَسُولَ اللَّهِ! ابْنُ جُدْعَانَ كَانَ فِي الْجَاهِلِيَّةِ يَصِلُ الرَّحِمَ، وَيُطْعِمُ الْمِسْكِينَ، فَهَلْ ذَاكَ نَافِعُهُ؟ قَالَ: ((لاَ يَنْفَعُهُ، إِنَّهُ لَمْ يَقُلْ يَوْمًا: رَبِّ اغْفِرْ لِي خَطِيئَتِي يَوْمَ الدِّينِ)).

**[518]-365-(214)** ........ Aişə ﵂ demişdir: “Mən (Peyğəmbərdən ﷺ) soruşdum: “Ya Rəsulullah! İbn Cudan[2] cahiliyyət dövründə qohumluq əlaqələrini saxlayar, kasıbları yedirərdi. Görəsən, bu ona fayda verəcəkmi?” Peyğəm-

---

[1] Dəmirdən, misdən, daşdan, yaxud da gildən qayrılmış çox iri, dərin qazan.

[2] İbn Cudan qureyşlilərin böyüklərindən olmuşdur.

bər ﷺ buyurdu: “(Bu) ona fayda verməyəcək.[1] Çünki o, heç vaxt: “Ey Rəbbim! Din günü[2] mənim xətalarımı bağışla!”[3]– deməmişdir”.

## (٩٣) – بَابُ مُوَالاَةِ الْمُؤْمِنِينَ وَمُقَاطَعَةِ غَيْرِهِمْ وَالْبَرَاءَةِ مِنْهُمْ

## 93-cü fəsil. Möminlərin bir-birilə dost olmaları, həm də qeyrilərindən əlaqələri kəsib uzaq durmaları

**[٥١٩] ٣٦٦-(٢١٥)** حَدَّثَنِي أَحْمَدُ بْنُ حَنْبَلٍ: حَدَّثَنَا مُحَمَّدُ بْنُ جَعْفَرٍ: حَدَّثَنَا شُعْبَةُ عَنْ إِسْمَعِيلَ بْنِ أَبِي خَالِد، عَنْ قَيْسٍ، عَنْ عَمْرِو بْنِ الْعَاصِ، قَالَ: سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ جِهَارًا غَيْرَ سِرٍّ يَقُولُ: ((أَلاَ إِنَّ آلَ أَبِي يَعْنِي فُلاَنًا، لَيْسُوا لِي بِأَوْلِيَاءَ، إِنَّمَا وَلِيِّيَ اللَّهُ وَصَالِحُ الْمُؤْمِنِينَ)).

**[519]-366-(215)** ........ Amr ibn əl-As ؓ demişdir: “Mən Peyğəmbərin ﷺ gizli deyil, aşkarda belə buyurduğunu eşitdim: “Agah olun ki, əbu filankəsin[4] ailəsi mənim dostlarım deyillər. Mənim dostum ancaq Allah və əməlisaleh möminlərdir[5]”.

## (٩٤) – بَابُ الدَّلِيلِ عَلَى دُخُولِ طَوَائِفَ مِنَ الْمُسْلِمِينَ الْجَنَّةَ بِغَيْرِ حِسَابٍ وَلاَ عَذَابٍ

## 94-cü fəsil. Müsəlmanlardan bir çoxlarının sorğu-sual olunmadan və əzab çəkmədən Cənnətə girəcəyinə dair dəlil

**[٥٢٠] ٣٦٧-(٢١٦)** حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ بْنُ سَلاَّمِ بْنِ عُبَيْدِ اللَّهِ الْجُمَحِيُّ: حَدَّثَنَا الرَّبِيعُ يَعْنِي ابْنَ مُسْلِمٍ، عَنْ مُحَمَّدِ بْنِ زِيَادٍ، عَنْ أَبِي هُرَيْرَةَ أَنَّ النَّبِيَّ ﷺ قَالَ: ((يَدْخُلُ مِنْ أُمَّتِي الْجَنَّةَ سَبْعُونَ أَلْفًا بِغَيْرِ

---

[1] Bu dəlildir ki, kafir yaxşı əməl etsə belə, bu ondan qəbul olunmur. Çünki o, bunu Allah üçün yox, başqa niyyətlə edir. Uca Allah buyurur: **“Biz onların etdikləri əməllərə baxdıqdan sonra onları sovrulmuş toz dənəciklərinə çevirərik”** (“əl-Furqan” surəsi, 23); **“Kim dünya həyatını və onun bərbəzəyini istəyirsə, onlara əməllərinin əvəzini orada tam verərik və onlar orada zərər çəkməzlər. Onlar, Axirətdə özləri üçün oddan başqa heç bir şeyi olmayan kimsələrdir. Onların dünyada gördükləri işlər boşa çıxar və tutduqları əməllər puç olar”** (“Hud” surəsi, 15-16).

[2] Bu, Qiyamət gününün adlarından biridir.

[3] Transkripsiyası: Rabbiğ-firli xətiəti yovməddin!

[4] Burada qeyri-müsəlmanlar nəzərdə tutulur. Kafir yaxın adam olsa belə, onu dost tutmaq olmaz. Uca Allah buyurur: **“Ey iman gətirənlər! Möminləri qoyub kafirləri *özünüzə* dost tutmayın. Yoxsa Allaha öz əleyhinizə açıq-aydın bir dəlil verməkmi istəyirsiniz?”** (“ən-Nisa” surəsi, 144); **“Ey iman gətirənlər! Əgər atalarınız və qardaşlarınız küfrü imandan üstün sayırlarsa, onları dost tutmayın. Sizlərdən onları dost tutanlar zalımlardır”** (“ət-Tovbə” surəsi, 23).

[5] Quranda belə buyurulur: **“Əgər *Peyğəmbərə* qarşı bir-birinizə dəstək versəniz, *bilin ki,* Allah, Cəbrail və əməlisaleh möminlər onun dostu və yardımçısıdır. Bunlardan başqa mələklər də onun yardımçılarıdır”** (“ət-Təhrim” surəsi, 4).

حِسَابٍ)) فَقَالَ رَجُلٌ: يَا رَسُولَ اللَّهِ! ادْعُ اللَّهَ أَنْ يَجْعَلَنِي مِنْهُمْ، قَالَ: ((اللَّهُمَّ! اجْعَلْهُ مِنْهُمْ)) ثُمَّ قَامَ آخَرُ فَقَالَ: يَا رَسُولَ اللَّهِ! ادْعُ اللَّهَ أَنْ يَجْعَلَنِي مِنْهُمْ، قَالَ: ((سَبَقَكَ بِهَا عُكَّاشَةُ)).

**[520]-367-(216)** ........ Əbu Hureyrə ﷺ rəvayət edir ki, (bir dəfə) Peyğəmbər ﷺ: "Ümmətimdən yetmiş min nəfər sorğu-sualsız Cənnətə girəcək[1]"– deyə buyurdu. (Bu vaxt) bir nəfər[2]: "Ya Rəsulullah! Allaha dua et, məni onlardan etsin!"– dedi. Peyğəmbər ﷺ də: "Allahım! Bunu o kəslərdən et!"– deyə dua etdi. Sonra başqa birisi qalxıb: "Ya Rəsulullah! Allaha dua et, məni də onlardan etsin!"– dedi. Peyğəmbər ﷺ buyurdu: "Bu xüsusda Ukkaşə səni qabaqladı".

**[٥٢١] ٣٦٨**–(...) و حَدَّثَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ: حَدَّثَنَا مُحَمَّدُ بْنُ جَعْفَرٍ: حَدَّثَنَا شُعْبَةُ قَالَ: سَمِعْتُ مُحَمَّدَ بْنَ زِيَادٍ قَالَ: سَمِعْتُ أَبَا هُرَيْرَةَ يَقُولُ: سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ، بِمِثْلِ حَدِيثِ الرَّبِيعِ.

**[521]-368-(...)** ........ Şobə: "Mən Muhəmməd ibn Ziyadın belə dediyini eşitdim, o da: "Mən Əbu Hureyrənin belə dediyini eşitdim"; o da: "Mən Peyğəmbərin ﷺ belə dediyini eşitdim" deyərək Rəbinin rəvayət etdiyi hədisin bənzərini rəvayət etmişdir.

**[٥٢٢] ٣٦٩**–(...) حَدَّثَنِي حَرْمَلَةُ بْنُ يَحْيَى: أَخْبَرَنَا ابْنُ وَهْبٍ قَالَ: أَخْبَرَنِي يُونُسُ عَنْ ابْنِ شِهَابٍ قَالَ: حَدَّثَنِي سَعِيدُ بْنُ الْمُسَيَّبِ أَنَّ أَبَا هُرَيْرَةَ حَدَّثَهُ قَالَ: سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ: ((يَدْخُلُ مِنْ أُمَّتِي زُمْرَةٌ هُمْ سَبْعُونَ أَلْفًا، تُضِيءُ وُجُوهُهُمْ إِضَاءَةَ الْقَمَرِ لَيْلَةَ الْبَدْرِ)).

قَالَ أَبُو هُرَيْرَةَ: فَقَامَ عُكَّاشَةُ بْنُ مِحْصَنٍ الأَسَدِيُّ، يَرْفَعُ نَمِرَةً عَلَيْهِ، فَقَالَ: يَا رَسُولَ اللَّهِ! ادْعُ اللَّهَ أَنْ يَجْعَلَنِي مِنْهُمْ، فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: ((اللَّهُمَّ! اجْعَلْهُ مِنْهُمْ)) ثُمَّ قَامَ رَجُلٌ مِنْ الأَنْصَارِ فَقَالَ: يَا رَسُولَ اللَّهِ! ادْعُ اللَّهَ أَنْ يَجْعَلَنِي مِنْهُمْ، فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: ((سَبَقَكَ بِهَا عُكَّاشَةُ)).

**[522]-369-(...)** ........ Əbu Hureyrə ﷺ demişdir: "Mən Peyğəmbərin ﷺ belə dediyini eşitdim: "Ümmətimdən yetmiş min nəfərlik bir zümrə (Cənnətə) girəcək. Onların üzü bədr[3] gecəsindəki ay kimi nur saçacaqdır".

---

[1] Bu, Ukkaşə ibn Mihsən əl-Əsədi idi.

[2] Peyğəmbər ﷺ demişdir: "Ümmətimdən yetmiş min nəfər sorğu-sualsız Cənnətə girəcək. Onların üzü bədr gecəsindəki ay kimi nur saçacaq, qəlbləri də (mömin) bir adamın qəlbi kimi olacaq. Rəbbimdən bundan artığını istədim, O mənə (həmin yetmiş min nəfərdən) hər bir kəslə yetmiş min də əlavə Cənnətə sorğu-sualsız girəcəyini nəsib etdi" ("Müsnəd imam Əhməd", 1/203; "Səhih əl-Cami", 1057).

[3] Burada bədr deyildikdə qəməri aylarda ayın on dördüncü gecəsi qəsd edilir. Elə buna görə də on dörd gecəlik, yəni tam dairə şəklinə düşmüş aya bədrlənmiş ay deyilir.

Əbu Hureyrə ﷺ dedi: “(Bunu eşidəndə) Ukkaşə ibn Mihsən əl-Əsədi əynində olan bəbir dərisinə bənzər bürüncəyinin ətəyini çəkərək ayağa qalxıb dedi: “Ya Rəsulullah! Allaha dua et, məni onlardan etsin!” Peyğəmbər ﷺ də: “Allahım! Bunu o kəslərdən et!”– deyə dua etdi. Sonra ənsardan olan başqa birisi qalxıb: “Ya Rəsulullah! Allaha dua et, məni də onlardan etsin!”– dedi. Peyğəmbər ﷺ buyurdu: “Bu xüsusda Ukkaşə səni qabaqladı”.

**[٥٢٣] ٣٧٠-(٢١٧)** و حَدَّثَنِي حَرْمَلَةُ بْنُ يَحْيَى: حَدَّثَنَا عَبْدُ اللَّهِ بْنُ وَهْبٍ: أَخْبَرَنِي حَيْوَةُ قَالَ: حَدَّثَنِي أَبُو يُونُسَ عَنْ أَبِي هُرَيْرَةَ، أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: ((يَدْخُلُ الْجَنَّةَ مِنْ أُمَّتِي سَبْعُونَ أَلْفًا، زُمْرَةٌ وَاحِدَةٌ مِنْهُمْ، عَلَى صُورَةِ الْقَمَرِ)).

**[523]-370-(217)** ........ Əbu Hureyrə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Ümmətimdən yetmiş min nəfər Cənnətə girəcək. Bu zümrədəkilərin hər biri (bədirlənmiş) aya bənzəyəcəkdir”.

**[٥٢٤] ٣٧١-(٢١٨)** حَدَّثَنَا يَحْيَى بْنُ خَلَفٍ الْبَاهِلِيُّ: حَدَّثَنَا الْمُعْتَمِرُ عَنْ هِشَامِ بْنِ حَسَّانَ، عَنْ مُحَمَّدٍ يَعْنِي ابْنَ سِيرِينَ، قَالَ: حَدَّثَنِي عِمْرَانُ قَالَ: قَالَ نَبِيُّ اللَّهِ ﷺ: ((يَدْخُلُ الْجَنَّةَ مِنْ أُمَّتِي سَبْعُونَ أَلْفًا بِغَيْرِ حِسَابٍ)) قَالُوا: وَمَنْ هُمْ يَا رَسُولَ اللَّهِ؟ قَالَ: ((هُمُ الَّذِينَ لاَ يَكْتَوُونَ وَلاَ يَسْتَرْقُونَ، وَعَلَى رَبِّهِمْ يَتَوَكَّلُونَ)) فَقَامَ عُكَّاشَةُ فَقَالَ: ادْعُ اللَّهَ أَنْ يَجْعَلَنِي مِنْهُمْ، قَالَ: ((أَنْتَ مِنْهُمْ)) قَالَ: فَقَامَ رَجُلٌ فَقَالَ يَا نَبِيَّ اللَّهِ! ادْعُ اللَّهَ أَنْ يَجْعَلَنِي مِنْهُمْ، قَالَ: ((سَبَقَكَ بِهَا عُكَّاشَةُ)).

**[524]-371-(218)** ........ İmran ﷺ rəvayət edir ki, (bir dəfə) Allahın peyğəmbəri ﷺ dedi: “Ümmətimdən yetmiş min nəfər sorğu-sualsız Cənnətə girəcək”. (Səhabələr) soruşdular: “Kimdir onlar, ya Rəsulullah?” Peyğəmbər ﷺ buyurdu: “Bunlar (müalicə məqsədilə) bədənlərinə dağ basmayan, özlərinə ruqya[1] oxunmasını tələb etməyən və yalnız Rəbbinə təvəkkül edən kimsələrdir”. (Bu vaxt) Ukkaşə ayağa qalxıb dedi: “(Ya Rəsulullah!) Allaha dua et, məni onlardan etsin!” Peyğəmbər ﷺ: “Sən onlardansan!”– dedi. Sonra başqa bir adam ayağa qalxıb: “Ey Allahın peyğəmbəri! Allaha dua et, məni onlardan etsin!”– dedi. Peyğəmbər ﷺ buyurdu: “Bu xüsusda Ukkaşə səni qabaqladı”.

[1] Hərfi tərcümədə ovsun deməkdir. Lakin burada ovsun deyildikdə sehr, cadu, pitik deyil, əksinə, mübarək sözlərlə – Allahın Kəlamı və ya Peyğəmbərin ﷺ duaları vasitəsilə xəstəni müalicə etmək nəzərdə tutulur.

**[٥٢٥] ٣٧٢**–(...) حَدَّثَنِي زُهَيْرُ بْنُ حَرْبٍ: حَدَّثَنَا عَبْدُ الصَّمَدِ بْنُ عَبْدِ الْوَارِثِ: حَدَّثَنَا حَاجِبُ بْنُ عُمَرَ أَبُو خُشَيْنَةَ الثَّقَفِيُّ: حَدَّثَنَا الْحَكَمُ بْنُ الأَعْرَجِ، عَنْ عِمْرَانَ بْنِ حُصَيْنٍ، أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: ((يَدْخُلُ الْجَنَّةَ مِنْ أُمَّتِي سَبْعُونَ أَلْفًا بِغَيْرِ حِسَابٍ)) قَالُوا: مَنْ هُمْ يَا رَسُولَ اللَّهِ؟ قَالَ: ((هُمُ الَّذِينَ لاَ يَسْتَرْقُونَ، وَلاَ يَتَطَيَّرُونَ، وَلاَ يَكْتَوُونَ، وَعَلَى رَبِّهِمْ يَتَوَكَّلُونَ)).

**[525]-372-(...)** ........ İmran ibn Husayn ﷺ rəvayət edir ki, (bir dəfə) Rəsulullah ﷺ dedi: “Ümmətimdən yetmiş min nəfər sorğu-sualsız Cənnətə girəcək”. (Səhabələr) soruşdular: “Kimdir onlar, ya Rəsulullah?” Peyğəmbər ﷺ buyurdu: “Bunlar özlərinə ovsun oxunmasını tələb etməyən, (hər hansı bir hadisəni) uğursuzluq əlaməti hesab etməyən,[1] (müalicə məqsədilə) bədənlərinə dağ basmayan və yalnız Rəbbinə təvəkkül edən kimsələrdir”.

**[٥٢٦] ٣٧٣**–(٢١٩) حَدَّثَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ: حَدَّثَنَا عَبْدُ الْعَزِيزِ يَعْنِي ابْنَ أَبِي حَازِمٍ، عَنْ أَبِي حَازِمٍ، عَنْ سَهْلِ بْنِ سَعْدٍ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: ((لَيَدْخُلَنَّ الْجَنَّةَ مِنْ أُمَّتِي سَبْعُونَ أَلْفًا، أَوْ سَبْعُ مِائَةِ أَلْفٍ – لاَ يَدْرِي أَبُو حَازِمٍ أَيَّهُمَا قَالَ – مُتَمَاسِكُونَ، آخِذٌ بَعْضُهُمْ بَعْضًا. لاَ يَدْخُلُ أَوَّلُهُمْ حَتَّى يَدْخُلَ آخِرُهُمْ وُجُوهُهُمْ عَلَى صُورَةِ الْقَمَرِ لَيْلَةَ الْبَدْرِ)).

**[526]-373-(219)** ........ Səhl ibn Səd ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Ümmətimdən yetmiş min, yaxud yeddi yüz min, (Əbu Hazim bunlardan hansını söylədiyini bilmir) – nəfər sorğu-sualsız, həm də əl-ələ verib bir-birilərindən (bərk-bərk) tutmuş halda Cənnətə daxil olacaqlar. Axırıncıları içəri daxil olmayınca əvvəlinciləri daxil olmayacaq.[2] Onların üzü on dörd gecəlik ay kimi (gözəl və parlaq) olacaq”.

---

[1] Cahiliyyət dövründə ərəblərdən kimsə bir işi görmək istədikdə, göyə baxar və göydə gördüyü quşun sağ tərəfə, yaxud sol tərəf uçmasıyla, görmək istədiyi işin uğurlu və ya uğursuz olacağını təyin edərdi. Habelə xoşagəlməz bir səs eşitdikdə və ya arzu edilməyən bir adam gördükdə, bunu uğursuzluq əlaməti hesab edərdilər. Bəziləri şəvval ayında evlənməyi uğursuzluq sayardılar. Aişə ﷺ bu cür etiqadın batil olduğunu bildirib demişdir: “Allahın Rəsulu mənimlə şəvval ayında nikah bağlamış, habelə məni şəvval ayında öz evinə gətirmişdir...”

Bundan başqa o vaxt ərəblər çərşənbə gününü, habelə səfər ayını da uğuzsuz əlamət hesab edərdilər. Qeyd etmək lazımdır ki, bunların və bunlara bənzər inancların hamısı batildir...” (“əl-Qovl əl-Mufid”, 1/103-104).

[2] Yəni bir cərgəyə düzülmüş halda hamı birdən Cənnətə daxil olacaq. Bu da Cənnət qapılarının həddən ziyadə geniş olduğuna dəlalət edir.

**[٥٢٧] ٣٧٤-(٢٢٠)** حَدَّثَنَا سَعِيدُ بْنُ مَنْصُورٍ: حَدَّثَنَا هُشَيْمٌ: أَخْبَرَنَا حُصَيْنُ بْنُ عَبْدِ الرَّحْمَنِ قَالَ: كُنْتُ عِنْدَ سَعِيدِ بْنِ جُبَيْرٍ فَقَالَ: أَيُّكُمْ رَأَى الْكَوْكَبَ الَّذِي انْقَضَّ الْبَارِحَةَ؟ قُلْتُ: أَنَا. ثُمَّ قُلْتُ: أَمَا إِنِّي لَمْ أَكُنْ فِي صَلاَةٍ وَلَكِنِّي لُدِغْتُ، قَالَ: فَمَاذَا صَنَعْتَ؟ قُلْتُ: اسْتَرْقَيْتُ. قَالَ: فَمَا حَمَلَكَ عَلَى ذَلِكَ؟ قُلْتُ: حَدِيثٌ حَدَّثَنَاهُ الشَّعْبِيُّ، فَقَالَ: وَمَا حَدَّثَكُمْ الشَّعْبِيُّ؟ قُلْتُ: حَدَّثَنَا عَنْ بُرَيْدَةَ بْنِ حُصَيْبٍ الأَسْلَمِيِّ، أَنَّهُ قَالَ: لاَ رُقْيَةَ إِلاَّ مِنْ عَيْنٍ أَوْ حُمَةٍ. فَقَالَ: قَدْ أَحْسَنَ مَنْ انْتَهَى إِلَى مَا سَمِعَ، وَلَكِنْ حَدَّثَنَا ابْنُ عَبَّاسٍ عَنْ النَّبِيِّ ﷺ قَالَ: ((عُرِضَتْ عَلَيَّ الأُمَمُ، فَرَأَيْتُ النَّبِيَّ وَمَعَهُ الرُّهَيْطُ، وَالنَّبِيَّ وَمَعَهُ الرَّجُلُ وَالرَّجُلاَنِ، وَالنَّبِيَّ لَيْسَ مَعَهُ أَحَدٌ. إِذْ رُفِعَ لِي سَوَادٌ عَظِيمٌ، فَظَنَنْتُ أَنَّهُمْ أُمَّتِي، فَقِيلَ لِي: هَذَا مُوسَى ﷺ وَقَوْمُهُ. وَلَكِنْ انْظُرْ إِلَى الأُفُقِ، فَنَظَرْتُ، فَإِذَا سَوَادٌ عَظِيمٌ، فَقِيلَ لِي: انْظُرْ إِلَى الأُفُقِ الآخَرِ، فَإِذَا سَوَادٌ عَظِيمٌ، فَقِيلَ لِي: هَذِهِ أُمَّتُكَ، وَمَعَهُمْ سَبْعُونَ أَلْفًا يَدْخُلُونَ الْجَنَّةَ بِغَيْرِ حِسَابٍ وَلاَ عَذَابٍ)).

ثُمَّ نَهَضَ فَدَخَلَ مَنْزِلَهُ، فَخَاضَ النَّاسُ فِي أُولَئِكَ الَّذِينَ يَدْخُلُونَ الْجَنَّةَ بِغَيْرِ حِسَابٍ وَلاَ عَذَابٍ. فَقَالَ بَعْضُهُمْ: فَلَعَلَّهُمْ الَّذِينَ صَحِبُوا رَسُولَ اللَّهِ ﷺ، وَقَالَ بَعْضُهُمْ: فَلَعَلَّهُمْ الَّذِينَ وُلِدُوا فِي الإِسْلاَمِ وَلَمْ يُشْرِكُوا بِاللَّهِ. وَذَكَرُوا أَشْيَاءَ، فَخَرَجَ عَلَيْهِمْ رَسُولُ اللَّهِ ﷺ فَقَالَ: ((مَا الَّذِي تَخُوضُونَ فِيهِ؟)) فَأَخْبَرُوهُ. فَقَالَ: ((هُمْ الَّذِينَ لاَ يَرْقُونَ، وَلاَ يَسْتَرْقُونَ، وَلاَ يَتَطَيَّرُونَ، وَعَلَى رَبِّهِمْ يَتَوَكَّلُونَ)) فَقَامَ عُكَّاشَةُ بْنُ مِحْصَنٍ، فَقَالَ: ادْعُ اللَّهَ أَنْ يَجْعَلَنِي مِنْهُمْ. فَقَالَ: ((أَنْتَ مِنْهُمْ)) ثُمَّ قَامَ رَجُلٌ آخَرُ فَقَالَ: ادْعُ اللَّهَ أَنْ يَجْعَلَنِي مِنْهُمْ. فَقَالَ: ((سَبَقَكَ بِهَا عُكَّاشَةُ)).

**[527]-374-(220)** ........ Husayn ibn Abdur-Rəhman demişdir: "Mən Səid ibn Cubeyrin yanında ikən o (bizdən): "Dünən gecə düşən ulduzu hansınız gördü?[1]"– deyə soruşdu. Dedim: "Mən (gördüm). Çünki (həmin vaxt) mən namazda deyildim, məni əqrəb sancmışdı". O: "Sən nə etdin?"– deyə soruşdu. Dedim: "(Birisindən mənə) ovsun oxumağını tələb etdim". Soruşdu: "Bunu etməyə səni sövq edən nə idi?" Dedim: "Şəbinin bizə rəvayət etdiyi bir hədis". Soruşdu: "Şəbi sizə nə rəvayət etmişdir?" Dedim: "O bizə Bureydə ibn Husayb əl-Əsləminin belə rəvayət etdiyini xəbər vermişdir: "Yalnız göz dəymiş[2] və ya (əqrəb və s. tərəfindən) sancılmış (adamı müalicə etmək məqsədilə) ovsun oxu-

[1] Səid ibn Cubeyr onlardan hansı birinin həmin gecə yatmadığını öyrənmək istəyirdi.

[2] Gözdəymə həqiqətdir və bir adam başqa birisini gözə gətirməsin deyə, onda olan gözəl bir şeyi gördükdə ona "Mübarək olsun!", "Allah xeyir versin! ", "Xeyirli-bərəkətli olsun!" və başqa bu kimi gözəl sözlərlə onun üçün Allahdan xeyir diləsin.

maq olar[1]". (Səid ibn Cubeyr) dedi: "Eşitdiyi ilə kifayətlənən kimsə nə gözəl iş görmüşdür! Lakin İbn Abbas rəvayət etmişdir ki, Peyğəmbər ﷺ demişdir: "Ümmətlər[2] mənə göstərildi.[3] Mən peyğəmbər gördüm, yanında bir toplum adam var idi. Başqa bir peyğəmbər gördüm, yanında bir və ya iki adam var idi. Hətta elə bir peyğəmbər də gördüm ki, yanında heç kəs yox idi. (Həmin vaxt) mənə böyük bir qaraltı göstərildi. Mən onların ümmətim olduğunu zənn etdim. (Mənə): "Bu, Musa ﷺ və onun qövmüdür. Sən üfüqə doğru bax"– deyildi. Mən (dərhal ora) baxdım və orada böyük bir qaraltı gördüm. Mənə yenə: "Üfüqün digər tərəfinə bax!"– deyildi. (Mən daha) əzəmətli bir qaraltı gördüm. Mənə: "Bu sənin ümmətindir. Onlardan yetmiş min nəfəri sorğu-sual olunmadan və əzab çəkmədən Cənnətə girəcəkdir"– deyildi".

(Bunu deyəndən) sonra Peyğəmbər ﷺ qalxıb evinə daxil oldu. Camaat sorğu-suala çəkilmədən və əzaba giriftar olmadan Cənnətə girəcək o kimsələr ba-

---

[1] Rəvayət edilir ki, Əbu Səid əl-Xudri ؓ demişdir: "(Bir dəfə) Peyğəmbərin ﷺ səhabələrindən bir dəstə səfərə yola düşdü. Nəhayət, onlar gəlib bədəvi qəbilələrindən birinə məxsus bir kənddə dayandılar. Səhabələr onların evində qonaq olmaq istədilər, lakin onlar səhabələri (yeməyə) qonaq etmək istəmədilər. Bu əsnada qəbilə başçısını (əqrəb) sancdı. Kənddəkilər ona əllərindən gələn köməyi göstərməyə çalışdılar, lakin bu cəhdlərin heç bir faydası olmadı. Onlardan bəzisi dedi: "Yaxşı olar ki, gedib (kəndimizə) təşrif buyurmuş adamlara müraciət edəsiniz, bəlkə onlarda nə isə tapıla". Onlar səhabələrin yanına gəlib dedilər: "Ay camaat! Qəbilə başçımızı (əqrəb) sancmışdır. Nə qədər çalışdıqsa, əlac tapa bilmədik. Bəlkə sizdən birinizdə bir şey tapıla?" Səhabələrdən birisi dedi: "Bəli, vallahi ki, mən ruqya oxuya bilirəm. Vallahi, biz sizin qonağınız olmaq istədik, lakin siz bizi (yeməyə) qonaq etmədiniz. Elə buna görə də bizə zəhmət haqqı verməyincə, mən sizin (xəstəniz) üçün ruqya oxumayacağam." Sonra onlar (müalicə müqabilində) səhabələrə bir sürü qoyun verəcəklərinə razılaşdılar. Bundan sonra o, (qəbilə başçısının yanına gəlib onun yarasına) yüngülcə tüpürdü və "əl-Fatihə" surəsini oxudu. (Bir az keçdikdən) sonra qəbilə başçısı sanki buxovdan azad oldu və xəstə deyilmiş kimi ayağa qalxıb gəzməyə başladı. Onlar səhabələrə razılaşdıqları zəhmət haqqını verdilər. Bu vaxt səhabələrdən biri: "(Qoyunları) bölüşdürün!"– dedi. Ruqya oxuyan səhabə isə: "Peyğəmbərin ﷺ yanına gedib hadisəni ona danışmayınca və onun nə hökm verəcəyini öyrənməyincə, heç (bir şey) etməyin!"– deyə etiraz etdi. Onlar Peyğəmbərin ﷺ yanına gəlib hadisəni ona danışdıqda, o soruşdu: "Sən nə bilirdin ki, bu, ruqyadır?" Sonra əlavə edib dedi: "Siz düz etmisiniz. (Qoyunları) bölüşdürün və özünüzlə yanaşı mənim üçün də bir pay ayırın." (Bunu deyəndən) sonra Peyğəmbər ﷺ gülümsədi" ("Səhih əl-Buxari", 2276).

[2] Burada elçilərin göndərildiyi ümmətlər nəzərdə tutulur. Uca Allah buyurur: **"Biz hər ümmətə: "Allaha ibadət edin, tağutdan uzaq olun"– *deyə*, elçi göndərdik"** ("ən-Nəhl" surəsi, 36).

[3] Olsun ki, Peyğəmbər ﷺ bunu yuxuda görmüşdür. ("Fəth əl-Bari", 11/407).

rədə ixtilafa düşdü. Bəziləri: "Yəqin ki, bunlar Peyğəmbərə ﷺ yoldaş olmuş[1] kimsələrdir"– dedilər. Bəziləri də: "Ola bilsin ki, bunlar İslam dini gəldikdən sonra doğulmuş və Allaha şərik qoşmamış kimsələrdir"– dedilər. Beləcə, onlar bir çox şeylər zikr etdilər. Bu vaxt Peyğəmbər ﷺ bayıra çıxdı və: "Nə haqda mübahisə edirsiniz?"– deyə soruşdu. (Səhabələr mübahisə etdikləri məsələ barədə) ona xəbər verdilər. Onda Peyğəmbər ﷺ buyurdu: "Bunlar ovsun oxumayan,[2] özlərinə ovsun oxunmasını tələb etməyən, (hər hansı bir hadisəni) uğursuzluq əlaməti hesab etməyən və yalnız Rəbbinə təvəkkül edən kimsələrdir". (Bu vaxt) Ukkaşə ibn Mihsən ayağa qalxıb dedi: "(Ya Rəsulullah!) Allaha dua et, məni onlardan etsin!" Peyğəmbər ﷺ: "Sən onlardansan!"– dedi. Sonra başqa bir adam ayağa qalxıb: "(Ya Rəsulullah!) Allaha dua et, məni onlardan etsin!"– dedi. Peyğəmbər ﷺ buyurdu: "Bu xüsusda Ukkaşə səni qabaqladı".

**[٥٢٨] ٣٧٥**–(...) حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا مُحَمَّدُ بْنُ فُضَيْلٍ عَنْ حُصَيْنٍ، عَنْ سَعِيدِ بْنِ جُبَيْرٍ: حَدَّثَنَا ابْنُ عَبَّاسٍ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((عُرِضَتْ عَلَيَّ الأُمَمُ)) ثُمَّ ذَكَرَ بَاقِيَ الْحَدِيثِ نَحْوَ حَدِيثِ هُشَيْمٍ وَلَمْ يَذْكُرْ أَوَّلَ حَدِيثِهِ.

**[528]-375-(...)** ........ İbn Abbas رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Ümmətlər mənə göstərildi..." Sonra (ravi) bu hədisin qalan hissəsini Huşeymin hədisinə bənzər rəvayət etmiş və hədisin əvvəlini[3] zikr etməmişdir.

---

[1] Burada ya səhabələrin hamısı, ya da yalnız Peyğəmbərlə ﷺ birlikdə Məkkədən Mədinəyə hicrət edənlər nəzərdə tutulur.

[2] Bu ləfz ravinin xətasıdır. Belə ki, Peyğəmbər ﷺ həm özünə, həm də başqalarına ruqya edərdi, habelə həm Cəbrail عليه السلام, həm də Aişə رضي الله عنها ona ruqya edərdilər, həmçinin səhabələr də ruqya edərdi. Aişə رضي الله عنها rəvayət edir ki, Peyğəmbər ﷺ xəstələndikdə, şərdən qoruyan surələri ("əl-İxlas", "əl-Fələq" və "ən-Nas" surələrini) özünə oxuyub üfürərdi. Xəstəliyi şiddətləndikdə isə mən bu surələrin bərəkətini (Allahdan) umaraq onları onun üçün oxuyub əllərini *bədəninə* sürtərdim" ("Səhih əl-Buxari", 5016); Digər rəvayətdə Aişə demişdir: "Peyğəmbər ﷺ hər gecə yatağına uzandıqda əllərini cütləşdirib onların içinə üfürər, sonra ora "əl-İxlas", "əl-Fələq" və "ən-Nas" surələrini oxuyar, daha sonra isə əllərini baş və üz nahiyəsindən başlayaraq, bacardığı qədər bədəninin hər yerinə sürtərdi. Beləcə, o, bunu üç dəfə təkrar edərdi" ("Səhih əl-Buxari", 5017); Ənəs ibn Malik رضي الله عنه demişdir: "Peyğəmbər ﷺ ənsardan olan bir ailəyə (zəhərli heyvan) sancmasını və qulaq ağrısını (müalicə etmək üçün) ruqya oxumağa izin vermişdir" ("Səhih əl-Buxari", 5719); Aişə رضي الله عنها demişdir: "Peyğəmbər ﷺ mənə (və ya qeyrisinə) gözdəyməyə qarşı ruqya oxumağı buyurdu" ("Səhih əl-Buxari", 5738); Ummu Sələmə رضي الله عنها rəvayət edir ki, (bir dəfə) Peyğəmbər ﷺ onun evində üzünün rəngi dəyişmiş bir qız uşağı görüb dedi: "Bu qızcığaza ruqya oxuyun, çünki ona göz dəyib" ("Səhih əl-Buxari", 5739).

[3] Yəni Husayn ibn Abdur-Rəhmanla Səid ibn Cubeyrin arasında olan söhbəti zikr etməmişdir.

## (٩٥) – بَابُ كَوْنِ هَذِهِ الأُمَّةِ نِصْفَ أَهْلِ الْجَنَّةِ

## 95-ci fəsil. Bu ümmətin Cənnət əhlinin yarısını təşkil etməsi haqqında

**[٥٢٩] ٣٧٦**–(٢٢١) حَدَّثَنَا هَنَّادُ بْنُ السَّرِيِّ: حَدَّثَنَا أَبُو الأَحْوَصِ، عَنْ أَبِي إِسْحَقَ، عَنْ عَمْرِو بْنِ مَيْمُونٍ، عَنْ عَبْدِ اللَّهِ قَالَ: قَالَ لَنَا رَسُولُ اللَّهِ ﷺ: ((أَمَا تَرْضَوْنَ أَنْ تَكُونُوا رُبُعَ أَهْلِ الْجَنَّةِ؟)) قَالَ: فَكَبَّرْنَا، ثُمَّ قَالَ: ((أَمَا تَرْضَوْنَ أَنْ تَكُونُوا ثُلُثَ أَهْلِ الْجَنَّةِ؟)) قَالَ: فَكَبَّرْنَا، ثُمَّ قَالَ: ((إِنِّي لأَرْجُو أَنْ تَكُونُوا شَطْرَ أَهْلِ الْجَنَّةِ، وَسَأُخْبِرُكُمْ عَنْ ذَلِكَ. مَا الْمُسْلِمُونَ فِي الْكُفَّارِ إِلاَّ كَشَعْرَةٍ بَيْضَاءَ فِي ثَوْرٍ أَسْوَدَ، أَوْ كَشَعْرَةٍ سَوْدَاءَ فِي ثَوْرٍ أَبْيَضَ)).

**[529]-376-(221)** ........ Abdullah (ibn Məsud) ﷺ demişdir: "(Bir dəfə) Peyğəmbər ﷺ bizə belə buyurdu: "Siz Cənnət əhlinin dörddə biri olmağınıza razı deyilsinizmi?!" (Bunu eşidəndə) Biz: "Allahu Əkbər!"– dedik. Sonra o buyurdu: "Cənnət əhlinin üçdə biri olmağınıza razı deyilsinizmi?!" Biz (yenə): "Allahu Əkbər!"– dedik. Sonra o belə buyurdu: "Mən sizin Cənnət əhlinin yarısını təşkil edəcəyinizə ümid edirəm. Və mən sizi bundan xəbərdar edəcəyəm. Müsəlmanlar kafirlər arasında qara öküzün dərisindəki ağ tük və ya ağ öküzün dərisindəki qara tük kimidirlər[1]".

**[٥٣٠] ٣٧٧**–(...) حَدَّثَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى وَمُحَمَّدُ بْنُ بَشَّارٍ – وَاللَّفْظُ لاِبْنِ الْمُثَنَّى – قَالاَ: حَدَّثَنَا مُحَمَّدُ بْنُ جَعْفَرٍ: حَدَّثَنَا شُعْبَةُ، عَنْ أَبِي إِسْحَقَ، عَنْ عَمْرِو بْنِ مَيْمُونٍ، عَنْ عَبْدِ اللَّهِ قَالَ: كُنَّا مَعَ رَسُولِ اللَّهِ ﷺ فِي قُبَّةٍ، نَحْوًا مِنْ أَرْبَعِينَ رَجُلاً، فَقَالَ: ((أَتَرْضَوْنَ أَنْ تَكُونُوا رُبُعَ أَهْلِ الْجَنَّةِ؟)) قَالَ: قُلْنَا: نَعَمْ. فَقَالَ: ((أَتَرْضَوْنَ أَنْ تَكُونُوا ثُلُثَ أَهْلِ الْجَنَّةِ؟)) فَقُلْنَا: نَعَمْ. فَقَالَ: ((وَالَّذِي نَفْسُ مُحَمَّدٍ بِيَدِهِ! إِنِّي لأَرْجُو أَنْ تَكُونُوا نِصْفَ أَهْلِ الْجَنَّةِ، وَذَاكَ أَنَّ الْجَنَّةَ لاَ يَدْخُلُهَا إِلاَّ نَفْسٌ مُسْلِمَةٌ، وَمَا أَنْتُمْ فِي أَهْلِ الشِّرْكِ إِلاَّ كَالشَّعْرَةِ الْبَيْضَاءِ فِي جِلْدِ الثَّوْرِ الأَسْوَدِ، أَوْ كَالشَّعْرَةِ السَّوْدَاءِ فِي جِلْدِ الثَّوْرِ الأَحْمَرِ)).

**[530]-377-(...)** ........ Abdullah (ibn Məsud) ﷺ demişdir: "(Bir dəfə) biz – qırxa yaxın səhabə Peyğəmbərlə ﷺ birlikdə bir çadırın içində idik. Bu vaxt Peyğəmbər ﷺ buyurdu: "Cənnət əhlinin dörddə biri olmaq istəyirsinizmi?" Biz: "Bəli!"– deyə cavab verdik. Yenə soruşdu: "Cənnət əhlinin üçdə biri olmaq istə-

---

[1] Yəni onlardan seçiləcəklər.

yirsinizmi?" Biz (bu səfər də): "Bəli!"– deyə cavab verdik. Onda Peyğəmbər ﷺ belə buyurdu: "Muhəmmədin canı Əlində olan (Allaha) and olsun ki, mən sizin Cənnət əhlinin yarısını təşkil edəcəyinizə ümid edirəm. (Agah olun ki,) Cənnətə yalnız müsəlman olan kəs girər. (Bilin ki,) siz, müşriklər arasında qara öküzün dərisindəki ağ tük və ya qırmızı öküzün dərisindəki qara tük kimisiniz".

**[٥٣١] ٣٧٨**–(...) حَدَّثَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللَّهِ بْنِ نُمَيْرٍ: حَدَّثَنَا أَبِي: حَدَّثَنَا مَالِكٌ وَهُوَ ابْنُ مِغْوَلٍ، عَنْ أَبِي إِسْحَقَ، عَنْ عَمْرِو بْنِ مَيْمُونٍ، عَنْ عَبْدِ اللَّهِ قَالَ: خَطَبَنَا رَسُولُ اللَّهِ ﷺ فَأَسْنَدَ ظَهْرَهُ إِلَى قُبَّةِ أَدَمٍ، فَقَالَ: ((أَلاَ، لاَ يَدْخُلُ الْجَنَّةَ إِلاَّ نَفْسٌ مُسْلِمَةٌ، اللَّهُمَّ! هَلْ بَلَّغْتُ؟ اللَّهُمَّ! اشْهَدْ، أَتُحِبُّونَ أَنَّكُمْ رُبُعُ أَهْلِ الْجَنَّةِ؟)) فَقُلْنَا: نَعَمْ، يَا رَسُولَ اللَّه! فَقَالَ: ((أَتُحِبُّونَ أَنْ تَكُونُوا ثُلُثَ أَهْلِ الْجَنَّةِ؟)) قَالُوا: نَعَمْ، يَا رَسُولَ اللَّه! قَالَ إِنِّي لأَرْجُو أَنْ تَكُونُوا شَطْرَ أَهْلِ الْجَنَّةِ، مَا أَنْتُمْ فِي سِوَاكُمْ مِنْ الأُمَمِ، إِلاَّ كَالشَّعْرَةِ السَّوْدَاءِ فِي الثَّوْرِ الأَبْيَضِ، أَوْ كَالشَّعْرَةِ الْبَيْضَاءِ فِي الثَّوْرِ الأَسْوَدِ)).

**[531]-378-(...)** ........ Abdullah (ibn Məsud) ﷺ rəvayət edir ki, (bir dəfə) Peyğəmbər ﷺ kürəyini dəridən olan bir çadıra söykəmiş halda bizə xitab edib belə buyurdu: "Agah olun ki, Cənnətə yalnız müsəlman kəs daxil olar. Allahım, təbliğ etdimmi?! Allahım, şahid ol! Siz Cənnət əhlinin dörddə biri olmaq istəyirsinizmi?" Biz: "Bəli, ya Rəsulullah!"– deyə cavab verdik. Yenə soruşdu: "Cənnət əhlinin üçdə biri olmaq istəyirsinizmi?" Biz (bu səfər də): "Bəli, ya Rəsulullah!"– deyə cavab verdik. Onda Peyğəmbər ﷺ belə buyurdu: "Mən sizin Cənnət əhlinin yarısını təşkil edəcəyinizə ümid edirəm. (Bilin ki,) digər ümmətlərlə müqayisədə siz, ağ öküzün dərisindəki qara tük və ya qara öküzün dərisindəki ağ tük kimisiniz".

## (٩٦) – بَابُ قَوْلِهِ: ((يَقُولُ اللَّهُ لآدَمَ: أَخْرِجْ بَعْثَ النَّارِ مِنْ كُلِّ أَلْفٍ تِسْعَ مِائَةٍ وَتِسْعَةً وَتِسْعِينَ))

## 96-cı fəsil. Peyğəmbərin ﷺ: "Allah Adəmə belə buyuracaq: "Hər min nəfərdən doqquz yüz doxsan doqquzunu Cəhənnəmə göndərmək üçün ayır" sözü

**[٥٣٢] ٣٧٩**–(٢٢٢) حَدَّثَنَا عُثْمَانُ بْنُ أَبِي شَيْبَةَ الْعَبْسِيُّ: حَدَّثَنَا جَرِيرٌ عَنْ الأَعْمَشِ، عَنْ أَبِي صَالِحٍ، عَنْ أَبِي سَعِيدٍ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((يَقُولُ اللَّهُ عَزَّ وَجَلَّ: يَا آدَمُ! فَيَقُولُ: لَبَّيْكَ وَسَعْدَيْكَ! وَالْخَيْرُ فِي

يَدَيْكَ! قَالَ: يَقُولُ: أَخْرِجْ بَعْثَ النَّارِ، قَالَ: وَمَا بَعْثُ النَّارِ؟ قَالَ: مِنْ كُلِّ أَلْفٍ تِسْعَ مِائَةٍ وَتِسْعَةً وَتِسْعِينَ؛ قَالَ: فَذَاكَ حِينَ يَشِيبُ الصَّغِيرُ وَتَضَعُ كُلُّ ذَاتِ حَمْلٍ حَمْلَهَا وَتَرَى النَّاسَ سُكَارَى وَمَا هُمْ بِسُكَارَى وَلَكِنَّ عَذَابَ اللَّهِ شَدِيدٌ)). قَالَ فَاشْتَدَّ عَلَيْهِمْ. قَالُوا: يَا رَسُولَ اللَّهِ! أَيُّنَا ذَلِكَ الرَّجُلُ؟ فَقَالَ: ((أَبْشِرُوا، فَإِنَّ مِنْ يَأْجُوجَ وَمَأْجُوجَ أَلْفٌ، وَمِنْكُمْ رَجُلٌ)) قَالَ: ثُمَّ قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((وَالَّذِي نَفْسِي بِيَدِهِ! إِنِّي لَأَطْمَعُ أَنْ تَكُونُوا رُبُعَ أَهْلِ الْجَنَّةِ)) فَحَمِدْنَا اللَّهَ وَكَبَّرْنَا. ثُمَّ قَالَ: ((وَالَّذِي نَفْسِي بِيَدِهِ! إِنِّي لَأَطْمَعُ أَنْ تَكُونُوا ثُلُثَ أَهْلِ الْجَنَّةِ)) فَحَمِدْنَا اللَّهَ وَكَبَّرْنَا. ثُمَّ قَالَ: ((وَالَّذِي نَفْسِي بِيَدِهِ! إِنِّي لَأَطْمَعُ أَنْ تَكُونُوا شَطْرَ أَهْلِ الْجَنَّةِ. إِنَّ مَثَلَكُمْ فِي الأُمَمِ كَمَثَلِ الشَّعْرَةِ الْبَيْضَاءِ فِي جِلْدِ الثَّوْرِ الأَسْوَدِ أَوْ كَالرَّقْمَةِ فِي ذِرَاعِ الْحِمَارِ)).

**[532]-379-(222)** ........ Əbu Səid əl-Xudri ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "(Qiyamət günü) İzzətli və Qüdrətli Allah: "Ey Adəm!"– deyə buyuracaq. Adəm deyəcək: "Buyur, hüzurundayam və əmrinə müntəzirəm. Xeyir yalnız Sənin Əlindədir!" Allah buyuracaq: "Cəhənnəmə vasil olacaq kimsələri ayır!" Adəm deyəcək: "Cəhənnəmə vasil olanların (sayı) nə qədərdir?" Allah buyuracaq: "Hər min nəfərdən doqquz yüz doxsan doqquzu (Cəhənnəmə gedəcək)". O zaman uşaqların saçları ağaracaq, hamilə qadın bətnindəkini salacaq, insanları sərxoş görəcəksən, halbuki onlar sərxoş olmayacaqlar. Ancaq Allahın əzabı çox şiddətlidir.[1] Səhabələrə bu ağır gəldi və onlar: "Ya Rəsulullah, hansımız o bir nəfərdən olacaq?"– deyə soruşdular. Peyğəmbər ﷺ buyurdu: "Sevinin! Heç şübhəsiz ki, sizdən hər bir nəfərin müqabilində Yəcuc və Məcuc tayfalarından min nəfər[2] (Cəhənnəmə atılacaq)". Sonra Peyğəmbər ﷺ davam edib buyurdu: "Canım Əlində olan *Allaha* and olsun ki, mən sizin Cənnət əhlinin dörddə birini təşkil edəcəyinizə ümid edirəm". (Bunu eşidəndə) biz: "Allaha həmd etdik və təkbir gətirdik"[3]. Sonra o buyurdu: "Canım Əlində olan *Allaha* and olsun ki, mən sizin Cənnət əhlinin üçdə birini təşkil edəcəyinizə ümid edirəm". Biz (yenə): "Allaha həmd etdik və təkbir gətirdik". Sonra o belə buyurdu: "Canım Əlində olan *Allaha* and olsun ki, mən sizin Cənnət əhlinin yarısını təşkil edəcəyinizə ümid edirəm. Sizinlə əvvəlki ümmətlərin misalı, qara öküzün dərisindəki ağ tükün və ya uzunqulağın qılçasının iç tərəfində olan dairəvarı ləkənin misalına bənzəyir".

---

[1] "əl-Həcc" surəsi, 2.

[2] İmam Qurtubi ﷺ demişdir: "Yəcuc və Məcuc tayfalarından" deyildikdə həm onlar, həm də digər kafirlər, həmçinin "sizdən" deyildikdə həm səhabələr, həm də onlar kimi mömin olan kimsələr nəzərdə tutulur ("Fəth əl-Bari", 11/392).

[3] Yəni "Allahu Əkbər"– dedik.

**[٥٣٣] ٣٨٠**-(...) حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا وَكِيعٌ؛ **ح**: و حَدَّثَنَا أَبُو كُرَيْبٍ: حَدَّثَنَا أَبُو مُعَاوِيَةَ، كِلاَهُمَا عَنْ الأَعْمَشِ بِهَذَا الإِسْنَادِ؛ غَيْرَ أَنَّهُمَا قَالاَ: ((مَا أَنْتُمْ يَوْمَئِذٍ فِي النَّاسِ إِلاَّ كَالشَّعْرَةِ الْبَيْضَاءِ فِي الثَّوْرِ الأَسْوَدِ أَوْ كَالشَّعْرَةِ السَّوْدَاءِ فِي الثَّوْرِ الأَبْيَضِ)) وَلَمْ يَذْكُرَا أَوْ كَالرَّقْمَةِ فِي ذِرَاعِ الْحِمَارِ.

**[533]-380-(...)** ........ Vəki və Əbu Müaviyə – hər ikisi (bu hədisi) Aməşdən bu isnadla rəvayət etmişdir. Fəqət bu rəvayətdə onlar (Peyğəmbərin ﷺ): “O gün siz insanlar arasında, qara öküzün dərisindəki ağ tük və ya ağ öküzün dərisindəki qara tük kimi olacaqsınız” (dediyini) nəql etmiş və: “və ya uzunqulağın qılçasının iç tərəfində olan dairəvarı ləkənin misalına bənzəyir” (sözünü) zikr etməmişlər.

# ١ – كِتابُ الطهارة

# 1 – Təmizlənmə kitabı

## (١) – بَابُ فَضْلِ الْوُضُوءِ

## 1-ci fəsil. Dəstəmazın fəziləti

**[٥٣٤] ١–(٢٢٣)** حَدَّثَنَا إِسْحَقُ بْنُ مَنْصُورٍ: حَدَّثَنَا حَبَّانُ بْنُ هِلَالٍ: حَدَّثَنَا أَبَانُ: حَدَّثَنَا يَحْيَى أَنَّ زَيْدًا حَدَّثَهُ أَنَّ أَبَا سَلَّامٍ حَدَّثَهُ عَنْ أَبِي مَالِكٍ الْأَشْعَرِيِّ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((الطُّهُورُ شَطْرُ الإِيمَانِ، وَالْحَمْدُ لِلَّهِ تَمْلأُ الْمِيزَانَ وَسُبْحَانَ اللَّهِ وَالْحَمْدُ لِلَّهِ تَمْلآنِ – أَوْ تَمْلأُ – مَا بَيْنَ السَّمَاوَاتِ وَالأَرْضِ، وَالصَّلَاةُ نُورٌ، وَالصَّدَقَةُ بُرْهَانٌ، وَالصَّبْرُ ضِيَاءٌ، وَالْقُرْآنُ حُجَّةٌ لَكَ أَوْ عَلَيْكَ، كُلُّ النَّاسِ يَغْدُو فَبَايِعٌ نَفْسَهُ فَمُعْتِقُهَا أَوْ مُوبِقُهَا)).

**[534]-1-(223)** ........ Əbu Malik əl-Əşari[1] ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Təmizlik imanın yarısıdır.[2] Əlhəmdulillah[3] tərəzini doldurur.[4] Subhanəllah[5] vəlhəmdulillah göylərlə yer arasını doldururlar.[6] Namaz bir nurdur.[7]

---

[1] Əbu Malik əl-Əşari ﵁ Peyğəmbərin ﷺ səhabəsidir. Adı: Kəb ibn Asimdir. Hicrətin 18-ci ilində vəfat etmişdir.

[2] Hədisdə ərəbcə "şətrul-iman" (imanın yarısıdır) cümləsi, həm də imanı təmizləyən və kənarlaşdıran mənasını da ifadə edir. Belə ki, pak olmaq, qəlbi murdar şeylərdən təmizləyir və imanı şirkdən uzaqlaşdırır ("Şərh əl-Ərbəin", 1/24).

[3] Tərcüməsi: Həmd olsun Allaha!

[4] Burada tərəzi deyildikdə Qiyamət günü qurulacaq ədalət tərəzisi nəzərdə tutulur. Uca Allah buyurur: **"Biz Qiyamət günü ədalət tərəziləri ilə haqq-hesab çəkəcəyik. Heç kəsə hər hansı bir şeydə ədalətsizlik edilməyəcəkdir.** ***Görülmüş iş*** **bir xardal dənəsi mislində olsa belə, onu gətirib** ***tərəziyə*** **qoyacağıq. Biz haqqı araşdırmağa bəs edərik"** ("əl-Ənbiya" surəsi, 47).

[5] Tərcüməsi: Allah pak və müqəddəsdir!

[6] Peyğəmbər ﷺ demişdir: "Mərhəmətli Allaha sevimli, tələffüzü asan və tərəzidə ağır gələn iki kəlmə *vardır ki, bunlar*: "Subhanəllahi və bihəmdihi, subhanəllahil-əzim!" *kəlmələridir*" ("Səhih əl-Buxari", 7563).

[7] Namaz mömінin qəlbinə nur saçır və elə ki qəlbi nurlandı, bu nur onun üzündə də özünü büruzə verir. Qiyamət günü də mömінin yoluna nur saçacaq. Uca Allah buyurur: **"O gün sən mömin kişilərin və mömin qadınların nurunun onların önlərindən və sağ tərəflərindən yayıldığını görəcəksən.** ***Onlara:*** **"Bu gün sizin müjdəniz** ***ağacları*** **altından çaylar axan Cənnət bağlarıdır. Siz orada əbədi qalacaqsınız!"–** ***deyiləcək.*** **Bu, böyük uğurdur"** ("əl-Hədid" surəsi, 12).

Sədəqə bir dəlildir.[1] Səbir bir işıqdır.[2] Quran isə sənin ya lehinə, ya da əleyhinə bir hüccətdir.[3] Hər bir insan səhər (evindən çıxıb iş dalınca gedər və) nəfsini satar; kimisi onu azad edər, kimisi də onu məhv edər"[4].

---

[1] Yəni o, sahibinin səmimi olmasına dəlildir. Çünki mömin sədəqə verməklə Allaha yaxınlaşmaq və bunun sayəsində də savab qazanmaq istəyir. Beləliklə də, o, özünə əziz olan bir şeyi ona daha əziz olan Allahın yolunda sərf etmiş olur. Bu da onun imanının təmiz olduğuna dəlalət edir.

[2] Şəriətin buyurduğu səbir üç növdür:
– Allaha və Onun elçisinə itaət etməkdə səbir etmək;
– Allahın və Onun elçisinin qadağan etdiyi şeylərdən çəkinməkdə səbir etmək;
– Müsibətlərə səbir etmək.

Diqqət edin! Burada Peyğəmbər ﷺ "səbir bir nurdur" demir, işıqdır deyir. Çünki işıqda hərarət də olur. Uca Allah buyurur: **"Günəşi işıqlı, ayı nurlu edən, illərin sayını və hesabı biləsiniz deyə ona mənzillər (səfhələr) müəyyən edən Odur. Allah bunları yalnız haqq naminə yaratmışdır. O, ayələri bilən adamlara *belə* izah edir"** ("Yunus" surəsi, 5). Günəş həm işıq saçır, həm də istilik verir. Səbir də həmçinin sahibinin qəlbinə və bədəninə istilik verir.

[3] Yəni əgər mömin bəndə Quranın buyurduqlarına əməl edib qadağan etdiklərindən çəkinərsə, həmin bəndə qəbirdə sorğu-suala çəkilərkən, məhşər günü haqq-ədalət tərəziləri qoyularkən və Allahın hüzuruna gətirilərkən, Quran onun lehinə, əks halda isə əleyhinə şahidlik edər.

[4] Bilin ki, hər bir əməl sahibi (etdiyi əməllər sayəsində) ya nəfsini azad etmiş, ya da onu məhv etmiş olur. Allaha və Onun elçisinə itaət etməklə nəfsini azad etmiş və şeytandan canını qurtarmış, əks halda isə nəfsini həlaka uğratmış olur.

Diqqət edin! Hər bir müsəlman səhər yuxudan oyandıqda ilk əvvəl: "Bizi öldürdükdən sonra dirildən Allaha həmd olsun. (Ölüb dirildikdən sonra isə) qayıdış Onadır", "Bədənimə salamatlıq verən, ruhumu mənə qaytaran və mənə Onu yad etməyə izin verən Allaha həmd olsun!", "Allahdan başqa məbud yoxdur, O təkdir, Onun şəriki yoxdur. Mülk Onundur və həmd Onadır! O hər şeyə Qadirdir. Allah pak və müqəddəsdir. Həmd Allahadır. Allahdan başqa məbud yoxdur. Allah ən Böyükdür. Qüdrət və güc yalnız Uca və Böyük Allahdadır! Ey Rəbbim məni bağışla!"– deyə dua edir, sonra qalxıb "Bismillah"– deyib dəstəmaz alır, sonra da "Allahu Əkbər"– deyib namaza başlayır və beləliklə də səhərini xeyir-bərəkətlə açır. Peyğəmbərimizin ﷺ bu xüsusda söylədiyi gözəl bir hədisə nəzər salın. O demişdir: "Sizlərdən biri yatdığı zaman şeytan onun boynunun ardına üç düyün vurur və hər düyün vurduqca: "Gecə uzundur, yat!"– (deyir). Əgər o kimsə oyanıb Allahı zikr etsə, düyünlərdən biri açılar, dəstəmaz alsa, ikincisi açılar, namaz qılsa, üçüncüsü açılar və beləliklə də o adam səhər gümrah və əhvali-ruhiyyəsi yaxşı olduğu halda yuxudan oyanar. Əks halda isə o, əhvali-ruhiyyəsi çox pis, özü də əzgin halda yuxudan oyanar". ("Səhih əl-Buxari", 1142).

Kafir isə əksinə, gününü həlakedici əməllərlə başlayır. Kafir Allaha və Onun Rəsuluna ﷺ asi olduğundan, yediyi hər loxmaya, içdiyi hər qurtum suya və geydiyi hər libasa görə Qiyamət günü Allahın hüzurunda cavab verməli olacaq. Buna dəlil Allahın bu ayəsidir: **"De: "Allahın Öz qulları üçün üzə çıxartdığı zinəti və təmiz ruziləri kim haram etmişdir?" De: "Bunlar dünya həyatında *hamıya*, Qiyamət günü isə yalnız möminlərə məxsusdur". Biz dərk edən adamlar üçün ayələri belə izah edirik"** ("əl-Əraf" surəsi, 32). Ayədən görünür ki, halal və təmiz ruzilər Qiyamət günü yalnız möminlərə məxsus olacaq, möminlərdən qeyrisinə haram olacaq. Yenə, Uca Allah buyurur: **"İman gətirib yaxşı işlər görənlərə, *Allahdan* qorxaraq iman gətirib yaxşı işlər gördükləri, sonra *yenə Allahdan* qorxaraq iman gətirdikləri, sonra *yenə də Allahdan* qorxaraq yaxşı işlər gördükləri təqdirdə, daddıqları şeylərə görə heç bir günah gəlməz. Allah yaxşı iş görənləri sevir"** ("əl-Maidə" surəsi, 93). Demək, qeyri-müsəlmanlar yeyib-içdiklərinə görə sorğu-suala çəkiləcəklər.

## (٢) – بَابُ وُجُوبِ الطَّهَارَةِ لِلصَّلاَةِ

## 2-ci fəsil. Namaz qılmaq üçün təmizlənməyin[1] vacibliyi

**[٥٣٥]** (**٢٢٤**) حَدَّثَنَا سَعِيدُ بْنُ مَنْصُورٍ وَقُتَيْبَةُ بْنُ سَعِيدٍ وَأَبُو كَامِلٍ الْجَحْدَرِيُّ – وَاللَّفْظُ لِسَعِيدٍ – قَالُوا: حَدَّثَنَا أَبُو عَوَانَةَ عَنْ سِمَاكِ بْنِ حَرْبٍ، عَنْ مُصْعَبِ بْنِ سَعْدٍ قَالَ: دَخَلَ عَبْدُ اللَّهِ بْنُ عُمَرَ عَلَى ابْنِ عَامِرٍ يَعُودُهُ وَهُوَ مَرِيضٌ، فَقَالَ: أَلاَ تَدْعُو اللَّهَ لِي، يَا ابْنَ عُمَرَ؟ قَالَ: إِنِّي سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ: ((لاَ تُقْبَلُ صَلاَةٌ بِغَيْرِ طُهُورٍ، وَلاَ صَدَقَةٌ مِنْ غُلُولٍ)) وَكُنْتَ عَلَى الْبَصْرَةِ.

**[535] (224)** ........ Musab ibn Səd demişdir: “İbn Amir xəstə ikən Abdullah ibn Ömər ona baş çəkdi və yanına daxil olduqda (İbn Amir ona): “Ey Ömərin oğlu! Mənim üçün Allaha dua etməyəcəksənmi?”– deyə müraciət etdi. İbn Ömər dedi: “Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: “Nə dəstəmazsız (və ya qüslsüz) namaz, nə də xəyanətlə əldə edilmiş maldan sədəqə qəbul olunar”. Sən də ki, (ey ibn Amir), Bəsrənin əmiri olmusan”[2].

**[٥٣٦]** (...) حَدَّثَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى وَابْنُ بَشَّارٍ قَالاَ: حَدَّثَنَا مُحَمَّدُ بْنُ جَعْفَرٍ: حَدَّثَنَا شُعْبَةُ؛ **ح**: و حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا حُسَيْنُ بْنُ عَلِيٍّ عَنْ زَائِدَةَ؛ **ح**: قَالَ أَبُو بَكْرٍ وَوَكِيعٌ عَنْ إِسْرَائِيلَ، كُلُّهُمْ عَنْ سِمَاكِ بْنِ حَرْبٍ بِهَذَا الإِسْنَادِ عَنِ النَّبِيِّ ﷺ بِمِثْلِهِ.

**[536] (...)** ........ Şobə, Zaidə və İsrail – onların hamısı Simak ibn Hərbdən bu isnadla Peyğəmbərdən ﷺ bu hədisin bənzərini rəvayət etmişlər.

**[٥٣٧]** **٢**–(**٢٢٥**) حَدَّثَنَا مُحَمَّدُ بْنُ رَافِعٍ: حَدَّثَنَا عَبْدُ الرَّزَّاقِ بْنُ هَمَّامٍ: حَدَّثَنَا مَعْمَرُ بْنُ رَاشِدٍ عَنْ هَمَّامِ بْنِ مُنَبِّهٍ أَخِي وَهْبِ بْنِ مُنَبِّهٍ قَالَ: هَذَا مَا حَدَّثَنَا أَبُو هُرَيْرَةَ عَنْ مُحَمَّدٍ رَسُولِ اللَّهِ ﷺ، فَذَكَرَ أَحَادِيثَ: مِنْهَا وَقَالَ رَسُولُ اللَّهِ ﷺ: ((لاَ تُقْبَلُ صَلاَةُ أَحَدِكُمْ، إِذَا أَحْدَثَ حَتَّى يَتَوَضَّأَ)).

---

[1] Burada təmizlənmək deyildikdə qüsl etmək və ya dəstəmaz almaq nəzərdə tutulur.

[2] İbn Ömər رضي الله عنهما ona demək istəyir ki, dəstəmazsız namazın və xəyanətlə əldə edilmiş maldan verilən sədəqənin faydası olmadığı kimi, günaha batdıqdan sonra Allahdan bağışlanma diləməyən kimsə üçün dua etməyin də faydası yoxdur. İbn Ömər bunu ona, etdiyi günahlara görə Allahdan bağışlanma diləməyə sövq etmək üçün söyləmişdir. Yoxsa ki, Peyğəmbər ﷺ və onun səhabələri, – müşriklər, kafirlər və münafiqlər istisna olmaqla, – günahkar adam üçün Allahdan bağışlanma diləmişlər.

İbn Amirə gəlincə, bu Abdullah ibn Amir ibn Kureyz ibn Rəbiə ibn Həbib ibn Abduşəms ibn Abdumənafdır. Hicrətdən dörd il sonra Məkkədə dünyaya gəlmişdir; Peyğəmbər ﷺ hicrətin yeddinci ilində Məkkəyə gəldikdə yaxınları onu Peyğəmbərin ﷺ yanına gətirmiş və o, xurmanı əzib uşağın ağzına qoymuşdur. Osmanın رضي الله عنه xilafəti dövründə Bəsrənin əmiri olmuşdur.

**[537]-2-(225)** ........ Həmmam ibn Munəbbih: "Bu, Əbu Hureyrənin bizə Allahın elçisi Muhəmməddən ﷺ rəvayət etdikləridir..."– demiş və bir neçə hədis rəvayət etmişdir. Bu hədislərdən biri də budur. "Peyğəmbər ﷺ demişdir: "Sizdən biriniz təbii ehtiyacını rəf etdikdən sonra[1] dəstəmaz almayınca, onun namazı qəbul olunmaz!"

## (٣) – بَابُ صِفَةِ الْوُضُوءِ وَكَمَالِهِ

## 3-cü fəsil. Dəstəmaz almağın qaydası və onun kamilliyi

**[٥٣٨] ٣–(٢٢٦)** حَدَّثَنِي أَبُو الطَّاهِرِ أَحْمَدُ بْنُ عَمْرِو بْنِ عَبْدِ اللَّهِ بْنِ عَمْرِو بْنِ سَرْحٍ، وَحَرْمَلَةُ بْنُ يَحْيَى التُّجِيبِيُّ قَالاَ: أَخْبَرَنَا ابْنُ وَهْبٍ عَنْ يُونُسَ، عَنِ ابْنِ شِهَابٍ أَنَّ عَطَاءَ بْنَ يَزِيدَ اللَّيْثِيَّ أَخْبَرَهُ أَنَّ حُمْرَانَ مَوْلَى عُثْمَانَ أَخْبَرَهُ أَنَّ عُثْمَانَ بْنَ عَفَّانَ ﷺ دَعَا بِوَضُوءٍ فَتَوَضَّأَ، فَغَسَلَ كَفَّيْهِ ثَلاَثَ مَرَّاتٍ، ثُمَّ مَضْمَضَ وَاسْتَنْثَرَ، ثُمَّ غَسَلَ وَجْهَهُ ثَلاَثَ مَرَّاتٍ، ثُمَّ غَسَلَ يَدَهُ الْيُمْنَى إِلَى الْمِرْفَقِ ثَلاَثَ مَرَّاتٍ، ثُمَّ غَسَلَ يَدَهُ الْيُسْرَى مِثْلَ ذَلِكَ، ثُمَّ مَسَحَ رَأْسَهُ، ثُمَّ غَسَلَ رِجْلَهُ الْيُمْنَى إِلَى الْكَعْبَيْنِ ثَلاَثَ مَرَّاتٍ، ثُمَّ غَسَلَ الْيُسْرَى مِثْلَ ذَلِكَ، ثُمَّ قَالَ: رَأَيْتُ رَسُولَ اللَّهِ ﷺ تَوَضَّأَ نَحْوَ وُضُوئِي هَذَا، ثُمَّ قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((مَنْ تَوَضَّأَ نَحْوَ وُضُوئِي هَذَا، ثُمَّ قَامَ فَرَكَعَ رَكْعَتَيْنِ، لاَ يُحَدِّثُ فِيهِمَا نَفْسَهُ، غُفِرَ لَهُ مَا تَقَدَّمَ مِنْ ذَنْبِهِ)).

قَالَ ابْنُ شِهَابٍ: وَكَانَ عُلَمَاؤُنَا يَقُولُونَ: هَذَا الْوُضُوءُ أَسْبَغُ مَا يَتَوَضَّأُ بِهِ أَحَدٌ لِلصَّلاَةِ.

**[538]-3-(226)** ........ Osmanın ﷺ mövlası[2] Humran belə rəvayət etmişdir: "(Bir dəfə) Osman su gətizdirdi və dəstəmaz aldı. (Əvvəlcə) əllərini üç dəfə yudu,[3] sonra (sağ əli ilə qabdan su götürüb) həm ağzını yaxaladı, həm də burnunun içini yudu, sonra üç dəfə üzünü yudu, sonra üç dəfə sağ qolunu dirsəyə qədər yudu, sonra da sol qolunu eyni qaydada yudu, sonra başına məsh çəkdi, sonra üç dəfə[4] sağ ayağını topuğa qədər yudu, sonra da sol ayağını eyni qaydada yudu, sonra belə dedi: "Mən Peyğəmbərin ﷺ mənim dəstəmaz aldığım kimi

---

[1] Bu, dəstəmazı pozan amillərdən biridir. Ümumiyyətlə dəstəmazı pozan amillər dörddür:
– Ön və arxa ifrazat çıxışlrından xaric olan sidik, nəcis, məzi, yel və s.
– Dərin yuxuya getmək və ya huşu itirmək;
– Dəvə əti yemək (bəzi alimlərin rəyinə görə);
– Övrət yerinə bilavasitə toxunmaq (bəzi alimlərin rəyinə görə).

[2] Yəni azad etdiyi kölə.

[3] Alimlərin yekdil rəyinə əsasən dəstəmaza başladıqda əlləri üç dəfə yumaq müstəhəbdir.

[4] Üzü, qolları və ayaqları üç dəfə yumaq müstəhəb, bir dəfə yumaq isə vacibdir.

dəstəmaz aldığını gördüm.[1] (O, dəstəmaz aldıqdan sonra belə) buyurdu: "Hər kim mənim dəstəmaz aldığım kimi dəstəmaz alar, sonra qalxıb iki rükət namaz qılar və namaz əsnasında heç bir şey haqda düşünməzsə, onun keçmiş günahları bağışlanar[2]".

İbn Şihab demişdir: "Alimlərimiz deyərdilər ki: "Bu dəstəmaz, bir kimsənin namaz qılmaq üçün alacağı dəstəmazın ən kamilidir".

**[٥٣٩] ٤**-(...) و حَدَّثَنِي زُهَيْرُ بْنُ حَرْبٍ: حَدَّثَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ: حَدَّثَنَا أَبِي عَنْ ابْنِ شِهَابٍ، عَنْ عَطَاءِ بْنِ يَزِيدَ اللَّيْثِيِّ، عَنْ حُمْرَانَ مَوْلَى عُثْمَانَ أَنَّهُ رَأَى عُثْمَانَ دَعَا بِإِنَاءٍ، فَأَفْرَغَ عَلَى كَفَّيْهِ ثَلاَثَ مِرَارٍ، فَغَسَلَهُمَا، ثُمَّ أَدْخَلَ يَمِينَهُ فِي الإِنَاءِ فَمَضْمَضَ وَاسْتَنْثَرَ، ثُمَّ غَسَلَ وَجْهَهُ ثَلاَثَ مَرَّاتٍ وَيَدَيْهِ إِلَى الْمِرْفَقَيْنِ ثَلاَثَ مَرَّاتٍ، ثُمَّ مَسَحَ بِرَأْسِهِ، ثُمَّ غَسَلَ رِجْلَيْهِ ثَلاَثَ مَرَّاتٍ، ثُمَّ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((مَنْ تَوَضَّأَ نَحْوَ وُضُوئِي هَذَا، ثُمَّ صَلَّى رَكْعَتَيْنِ لاَ يُحَدِّثُ فِيهِمَا نَفْسَهُ، غُفِرَ لَهُ مَا تَقَدَّمَ مِنْ ذَنْبِهِ)).

**[539]-4-(...)** ........ Osmanın ﵁ mövlası Humran Osmanın (dəstəmaz aldığını) görmüş (və bunu belə vəsf etmişdir): "Osman bir qab (su) gətizdirdi; əllərinə üç dəfə su töküb onları yudu, sonra sağ əlini qaba salıb *su götürdü*[3] *və bununla* həm ağzını yaxaladı, həm də burnunun içini yudu, sonra üç dəfə üzünü və üç dəfə qollarını dirsəklərə qədər yudu, sonra başına məsh çəkdi, sonra üç dəfə ayaqlarını (topuqlara qədər) yudu, sonra da dedi: "Peyğəmbər ﷺ belə buyurmuşdur: "Hər kim mənim kimi dəstəmaz alar, sonra da iki rükət namaz qılar və namaz əsnasında heç bir şey haqda düşünməzsə, onun keçmiş günahları bağışlanar".

## (٤) – بَابُ فَضْلِ الْوُضُوءِ وَالصَّلاَةِ عَقِبَهُ

## 4-cü fəsil. Dəstəmaz almağın və onun ardından namaz qılmağın fəziləti

**[٥٤٠] ٥**-(٢٢٧) حَدَّثَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ وَعُثْمَانُ بْنُ مُحَمَّدِ بْنِ أَبِي شَيْبَةَ وَإِسْحَقُ بْنُ إِبْرَاهِيمَ الْحَنْظَلِيُّ – وَاللَّفْظُ لِقُتَيْبَةَ – قَالَ إِسْحَقُ: أَخْبَرَنَا. وَقَالَ الآخَرَانِ: حَدَّثَنَا جَرِيرٌ عَنْ هِشَامِ بْنِ عُرْوَةَ، عَنْ أَبِيهِ، عَنْ حُمْرَانَ

---

[1] Hədisdən belə nəticə çıxır ki, üzü, qolları və ayaqları yumaq, habelə başa məsh etmək vacibdir. Bu vaciblər "əl-Maidə" surəsinin 6-cı ayəsində öz əksini tapmışdır. Onu da qeyd etmək lazımdır ki, burada, üzü yumaq deyəndə, ağız və burunu yaxalamaq, habelə başa məsh etmək deyəndə, qulaqlara da məsh etmək də buna aid edilir.

[2] Söhbət kiçik günahlardan gedir.

[3] Digər hədisdə Peyğəmbər ﷺ demişdir: "Biriniz yuxudan oyandığı zaman əlini üç dəfə yumayınca su qabının içinə salmasın. Çünki o, əlinin haralara dəydiyini bilmir" ("Səhih Muslim", 643).

مَوْلَى عُثْمَانَ قَالَ: سَمِعْتُ عُثْمَانَ بْنَ عَفَّانَ – وَهُوَ بِفِنَاءِ الْمَسْجِدِ – فَجَاءَهُ الْمُؤَذِّنُ عِنْدَ الْعَصْرِ، فَدَعَا بِوَضُوءٍ فَتَوَضَّأَ، ثُمَّ قَالَ: وَاللَّهِ لأُحَدِّثَنَّكُمْ حَدِيثًا، لَوْلاَ آيَةٌ فِي كِتَابِ اللَّهِ مَا حَدَّثْتُكُمْ، إِنِّي سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ: ((لاَ يَتَوَضَّأُ رَجُلٌ مُسْلِمٌ فَيُحْسِنُ الْوُضُوءَ، فَيُصَلِّي صَلاَةً، إِلاَّ غَفَرَ اللَّهُ لَهُ مَا بَيْنَهُ وَبَيْنَ الصَّلاَةِ الَّتِي تَلِيهَا)).

**[540]-5-(227)** ........ Osmanın ﷺ mövlası Humran demişdir: “Osman ibn Əffan məscidin həyətində ikən mən onun belə dediyini eşitdim. Axşamtərəfi müəzzin Osmanın yanına gəldikdə Osman su gətizdirib dəstəmaz aldı, sonra da belə buyurdu: “Sizə elə bir hədis danışacağam ki, vallahi əgər Allahın Kitabındakı ayə[1] olmasaydı, onu sizə danışmazdım. Mən Peyğəmbərin ﷺ belə dediyini eşitdim: “Gözəl tərzdə[2] dəstəmaz alıb, sonra namaz qılan elə bir müsəlman yoxdur ki, Allah onun dəstəmazı ilə qılacağı namaz arasındakı (vaxt ərzindəki) günahlarını bağışlamasın”.

**[٥٤١]** (...) و حَدَّثَنَا أَبُو كُرَيْبٍ: حَدَّثَنَا أَبُو أُسَامَةَ؛ ح: و حَدَّثَنَا زُهَيْرُ بْنُ حَرْبٍ وَأَبُو كُرَيْبٍ قَالاَ: حَدَّثَنَا وَكِيعٌ؛ ح: حَدَّثَنَا ابْنُ أَبِي عُمَرَ: حَدَّثَنَا سُفْيَانُ، جَمِيعًا عَنْ هِشَامٍ بِهَذَا الإِسْنَادِ، وَفِي حَدِيثِ أَبِي أُسَامَةَ: ((فَيُحْسِنُ وُضُوءَهُ ثُمَّ يُصَلِّي الْمَكْتُوبَةَ)).

**[541] (...)** ........ Əbu Usamə, Vəkiy və Süfyan – hamısı (bu hədisi) Hişamdan bu isnadla rəvayət etmişdir. Fəqət Əbu Usamənin hədisində belə deyilir: “Gözəl tərzdə dəstəmaz alıb, vacib buyurulmuş namazı qılan.....”

---

[1] Osmanın ﷺ qəsd etdiyi ayə budur: **“Kitabda insanlara bəyan etdiyimiz açıq-aydın dəlilləri və doğru yol göstərən ayələri nazil etdikdən sonra onları gizli saxlayanlara həm Allah lənət edir, həm də lənət edə bilənlər lənət oxuyurlar!”** (“əl-Bəqərə” surəsi, 159).

[2] Yəni kamil şəkildə. Kamil şəkildə dəstəmaz almağın qaydası isə belədir:

Dəstəmaz alan şəxs ürəyində dəstəmaz almaq üçün niyyət etməli, sonra "bismillah" deyib əllərini üç dəfə yumalı, sonra üç dəfə ağzını yaxalamalı, üç dəfə burnuna su çəkib qaytarmalı və üç dəfə üzünü bir qulağından o birinədək eninə və başının tük bitən yerindən başlayaraq çənənin aşağısınadək uzununa yumalı, sonra hər iki qolunu barmaqların ucundan dirsəklərə qədər (dirsəklər də daxil olmaqla) sağ qoldan başlayaraq üç dəfə yumalı, sonra yaş əllərlə bir dəfə başına məsh etməli (yaş əllərini başının qabaq hissəsindən ənsəsinədək aparmalı, sonra başladığı yerə qaytarmalı), sonra şəhadət barmaqlarını qulaqların deşiklərinə salıb baş barmaqları qulaqların arxasına çəkməklə qulaqlara məsh etməli, sonra ayaqları barmaqların ucundan topuqlara qədər (topuqlar da daxil olmaqla), əvvəl sağ, sonra sol ayağı üç dəfə yumalı, ayaqları yuyarkən ayaq barmaqlarının arasını da yuyulmalıdır. Dəstəmaz alıb qurtardıqdan sonra da bu duanı oxumalıdır. **«Əşhədu ən lə ilahə illəllahu vəhdəhu lə şərikə ləhu və əşhədu ənnə Muhəmmədən abduhu və Rasuluhu. Allahumməc'alni minət-təvvabinə vəc'alni minəl-mutətahhirin!»** (Duanın tərcüməsi: Mən şahidlik edirəm ki, Allahdan başqa məbud yoxdur, O Təkdir, Onun şəriki yoxdur və şahidlik edirəm ki, Muhəmməd Onun qulu və elçisidir! Allahım, məni tövbə edənlərdən və təmizlənənlərdən et!)

**[٥٤٢]** ٦-(...) و حَدَّثَنَا زُهَيْرُ بْنُ حَرْبٍ: حَدَّثَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ: حَدَّثَنَا أَبِي عَنْ صَالِحٍ قَالَ: قَالَ ابْنُ شِهَابٍ: وَلَكِنْ عُرْوَةُ يُحَدِّثُ عَنْ حُمْرَانَ أَنَّهُ قَالَ: فَلَمَّا تَوَضَّأَ عُثْمَانُ قَالَ: وَاللَّه! لأُحَدِّثَنَّكُمْ حَدِيثًا، وَاللَّه! لَوْلاَ آيَةٌ فِي كِتَابِ اللَّهِ مَا حَدَّثْتُكُمُوهُ، إِنِّي سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ: ((لاَ يَتَوَضَّأُ رَجُلٌ فَيُحْسِنُ وُضُوءَهُ، ثُمَّ يُصَلِّي الصَّلاَةَ، إِلاَّ غُفِرَ لَهُ مَا بَيْنَهُ وَبَيْنَ الصَّلاَةِ الَّتِي تَلِيهَا)).

قَالَ عُرْوَةُ الآيَةُ: ﴿إِنَّ ٱلَّذِينَ يَكۡتُمُونَ مَآ أَنزَلۡنَا مِنَ ٱلۡبَيِّنَٰتِ وَٱلۡهُدَىٰ﴾ إِلَى قَوْلِهِ ﴿ٱللَّٰعِنُونَ﴾

**[542]-6-(...)** ........ Humran belə rəvayət etmişdir: “Osman dəstəmaz aldıqdan sonra dedi: “Vallahi, sizə elə bir hədis danışacağam ki, əgər Allahın Kitabındakı ayə olmasaydı, vallahi ki, onu sizə danışmazdım. Mən Peyğəmbərin ﷺ belə buyurduğunu eşitdim: “Gözəl tərzdə dəstəmaz alıb, sonra namaz qılan elə bir kəs yoxdur ki, dəstəmaz ilə qılacağı namaz arasındakı (vaxt ərzindəki) günahları bağışlanmasın”.

Urva demişdir: “(Osmanın ﷺ qəsd etdiyi) ayə budur: **“Kitabda insanlara bəyan etdiyimiz açıq-aydın dəlilləri və doğru yol göstərən ayələri nazil etdikdən sonra onları gizli saxlayanlara həm Allah lənət edir, həm də lənət edə bilənlər lənət oxuyurlar!”[1]**

**[٥٤٣]** ٧-(٢٢٨) حَدَّثَنَا عَبْدُ بْنُ حُمَيْدٍ وَحَجَّاجُ بْنُ الشَّاعِرِ، كِلاَهُمَا عَنْ أَبِي الْوَلِيدِ قَالَ عَبْدٌ: حَدَّثَنِي أَبُو الْوَلِيدِ: حَدَّثَنَا إِسْحَقُ بْنُ سَعِيدِ بْنِ عَمْرِو بْنِ سَعِيدِ بْنِ الْعَاصِ: حَدَّثَنِي أَبِي عَنْ أَبِيهِ قَالَ: كُنْتُ عِنْدَ عُثْمَانَ، فَدَعَا بِطَهُورٍ فَقَالَ: سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ: ((مَا مِنْ امْرِئٍ مُسْلِمٍ تَحْضُرُهُ صَلاَةٌ مَكْتُوبَةٌ، فَيُحْسِنُ وُضُوءَهَا وَخُشُوعَهَا وَرُكُوعَهَا، إِلاَّ كَانَتْ كَفَّارَةً لِمَا قَبْلَهَا مِنَ الذُّنُوبِ، مَا لَمْ يُؤْتِ كَبِيرَةً وَذَلِكَ الدَّهْرَ كُلَّهُ)).

**[543]-7-(228)** ........ Amr ibn Səid demişdir: “Mən Osmanın yanında ikən o, (dəstəmaz almaq üçün) su gətizdirdi və dedi: “Mən Peyğəmbərin ﷺ belə buyurduğunu eşitdim: “Bir fərz namazının vaxtı yetişdikdə onun dəstəmazını, xuşusunu[2] və rükusunu[3] gözəl tərzdə yerinə yetirən elə bir müsəlman bəndə

---

[1] “əl-Bəqərə” surəsi, 159.

[2] Tiybi demişdir: “Namazda xuşu deyildikdə gözləri ancaq səcdə yerinə zilləyərək, fikri-zikri cəm edib başqa heç bir şey haqqında düşünmədən, qorxa-qorxa namaz qılmaq nəzərdə tutulur (“ət-Təysir bi Şərh əl-Cami əs-Səğir”, 1/793).

[3] Rüku – fiqh istilahı olub, qabağa əyilmə, namazda qiraətdən sonra yerə, təzim edirmiş kimi, paralel şəkildə önə əyilməni bildirir. Rüku namazın rüknlərindən – vacib ünsürlərindən biridir və fərzdir. Rükuda əllər dizlərə qoyulur.

yoxdur ki, böyük günah işləmədikcə bu namazı onun əvvəlki günahlarına kəffarə olmasın.[1] Bu da hər zaman beləcə davam edər".

**[٥٤٤] ٨-(٢٢٩)** حَدَّثَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ وَأَحْمَدُ بْنُ عَبْدَةَ الضَّبِّيُّ قَالاَ: حَدَّثَنَا عَبْدُ الْعَزِيزِ، وَهُوَ الدَّرَاوَرْدِيُّ، عَنْ زَيْدِ بْنِ أَسْلَمَ عَنْ حُمْرَانَ مَوْلَى عُثْمَانَ قَالَ: أَتَيْتُ عُثْمَانَ بْنَ عَفَّانَ بِوَضُوءٍ، فَتَوَضَّأَ ثُمَّ قَالَ: إِنَّ نَاسًا يَتَحَدَّثُونَ عَنْ رَسُولِ اللَّهِ ﷺ أَحَادِيثَ، لاَ أَدْرِي مَا هِيَ. إِلاَّ أَنِّي رَأَيْتُ رَسُولَ اللَّهِ ﷺ تَوَضَّأَ مِثْلَ وُضُوئِي هَذَا، ثُمَّ قَالَ: ((مَنْ تَوَضَّأَ هَكَذَا غُفِرَ لَهُ مَا تَقَدَّمَ مِنْ ذَنْبِهِ، وَكَانَتْ صَلاَتُهُ وَمَشْيُهُ إِلَى الْمَسْجِدِ نَافِلَةً)).

وَفِي رِوَايَةِ ابْنِ عَبْدَةَ أَتَيْتُ عُثْمَانَ فَتَوَضَّأَ.

**[544]-8-(229)** ........ Osmanın mövlası Humran demişdir: "(Bir dəfə) Mən Osman ibn Əffana (dəstəmaz almaq üçün) su gətirdim. O, dəstəmaz aldıqdan sonra dedi: "(Bəzi) adamlar Peyğəmbərdən ﷺ hədislər danışırlar ki, mən bunların nə məna daşıdığını bilmirəm? Ancaq onu deyə bilərəm ki, mən Peyğəmbəri ﷺ gördüm, o, mənim dəstəmaz aldığım kimi dəstəmaz aldı, sonra da belə buyurdu: "Kim bu cür dəstəmaz alsa, onun keçmiş günahları bağışlanar. Üstəlik namaz qılmağı və məscidə getməyi (onun savabını) artırar".

İbn Əbdənin rəvayətində deyilir: "Mən Osmanın yanına gəldim. O, dəstəmaz aldı..."

**[٥٤٥] ٩-(٢٣٠)** حَدَّثَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ وَأَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ وَزُهَيْرُ بْنُ حَرْبٍ - وَاللَّفْظُ لِقُتَيْبَةَ وَأَبِي بَكْرٍ - قَالُوا: حَدَّثَنَا وَكِيعٌ، عَنْ سُفْيَانَ، عَنْ أَبِي النَّضْرِ، عَنْ أَبِي أَنَسٍ: أَنَّ عُثْمَانَ تَوَضَّأَ بِالْمَقَاعِدِ، فَقَالَ: أَلاَ أُرِيكُمْ وُضُوءَ رَسُولِ اللَّهِ ﷺ؟ ثُمَّ تَوَضَّأَ ثَلاَثًا ثَلاَثًا.

وَزَادَ قُتَيْبَةُ فِي رِوَايَتِهِ، قَالَ سُفْيَانُ: قَالَ أَبُو النَّضْرِ عَنْ أَبِي أَنَسٍ، قَالَ: وَعِنْدَهُ رِجَالٌ مِنْ أَصْحَابِ رَسُولِ اللَّهِ ﷺ.

**[545]-9-(230)** ........ Əbu Ənəs rəvayət edir ki, (bir dəfə) Osman oturaqlarda[2] dəstəmaz aldı və: "Rəsulullahın necə dəstəmaz aldığını sizə göstərimmi?!"– dedi, sonra da (hər bir əzasını) üç dəfə (yuyaraq) dəstəmaz aldı.

Quteybə öz rəvayətində bunu da əlavə etmişdir: "Süfyan demişdir: "Əbu Nədr Əbu Ənəsdən rəvayət etmişdir. Əbu Ənəs demişdir: "(Həmin vaxt) Peyğəmbərin ﷺ səhabələrindən bəziləri Osmanın yanında idilər".

---

[1] Müsəlman olan kəs gözəl tərzdə dəstəmaz alıb lazımi qaydada namaz qılarsa, bu namaz onun kiçik günahlarını silib aparar.

[2] Oturulan, mənzil salınan yer, oturacaq yer, istirahət yeri, düşərgə və s. Hədisdə oturaq deyildikdə Osmanın ﵁ həyətindəki dükanlar, yaxud istirahətxanalar nəzərdə tutulur.

**[٥٤٦] ١٠**–(**٢٣١**) حَدَّثَنَا أَبُو كُرَيْبٍ مُحَمَّدُ بْنُ الْعَلاَءِ وَإِسْحَقُ بْنُ إِبْرَاهِيمَ، جَمِيعًا عَنْ وَكِيعٍ، قَالَ أَبُو كُرَيْبٍ: حَدَّثَنَا وَكِيعٌ عَنْ مِسْعَرٍ، عَنْ جَامِعِ بْنِ شَدَّادٍ أَبِي صَخْرَةَ قَالَ: سَمِعْتُ حُمْرَانَ بْنَ أَبَانَ قَالَ: كُنْتُ أَضَعُ لِعُثْمَانَ طَهُورَهُ، فَمَا أَتَى عَلَيْهِ يَوْمٌ إِلاَّ وَهُوَ يُفِيضُ عَلَيْهِ نُطْفَةً، وَقَالَ عُثْمَانُ: حَدَّثَنَا رَسُولُ اللَّهِ ﷺ عِنْدَ انْصِرَافِنَا مِنْ صَلاَتِنَا هَذِهِ – قَالَ مِسْعَرٌ: أُرَاهَا الْعَصْرَ – فَقَالَ: ((مَا أَدْرِي، أُحَدِّثُكُمْ بِشَيْءٍ أَوْ أَسْكُتُ؟)) فَقُلْنَا: يَا رَسُولَ اللَّهِ! إِنْ كَانَ خَيْرًا فَحَدِّثْنَا، وَإِنْ كَانَ غَيْرَ ذَلِكَ فَاللَّهُ وَرَسُولُهُ أَعْلَمُ. قَالَ: ((مَا مِنْ مُسْلِمٍ يَتَطَهَّرُ، فَيُتِمُّ الطُّهُورَ الَّذِي كَتَبَ اللَّهُ عَلَيْهِ، فَيُصَلِّي هَذِهِ الصَّلَوَاتِ الْخَمْسَ، إِلاَّ كَانَتْ كَفَّارَاتٍ لِمَا بَيْنَهَا)).

**[546]-10-(231)** ........ Humran ibn Əban demişdir: "Mən Osmanın dəstəmaz almaq üçün suyunu hazır qoyardım. Və elə bir gün olmazdı ki, o, az miqdarda su ilə (olsa belə) yuyunmasın. (Bir dəfə) Osman dedi: "Bu namazımızı bitirdikdən sonra Peyğəmbər ﷺ bizə belə buyurdu (Misar: "Mən bunun əsr namazı olduğunu güman edirəm"– demişdir): "Bilmirəm, sizə bir şey danışımmı, yaxud susummu?" Biz dedik: "Ya Rəsulullah! Əgər xeyirdisə, (onu) bizə danış, yox əgər başqa bir şeydirsə, onda Allah və Onun rəsulu daha yaxşı bilir". Peyğəmbər ﷺ buyurdu: "(Gözəl tərzdə) yuyunaraq Allahın fərz buyurduğu dəstəmazı tam şəkildə yerinə yetirib bu beş namazı qılan elə bir müsəlman yoxdur ki, bu namazlar, aralarındakı günahlar üçün kəffarə olmasın[1]".

**[٥٤٧] ١١**–(...) حَدَّثَنَا عُبَيْدُ اللَّهِ بْنُ مُعَاذٍ: حَدَّثَنَا أَبِي؛ ح: و حَدَّثَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى وَابْنُ بَشَّارٍ قَالاَ: حَدَّثَنَا مُحَمَّدُ بْنُ جَعْفَرٍ قَالاَ جَمِيعًا: حَدَّثَنَا شُعْبَةُ، عَنْ جَامِعِ بْنِ شَدَّادٍ قَالَ: سَمِعْتُ حُمْرَانَ بْنَ أَبَانَ يُحَدِّثُ أَبَا بُرْدَةَ فِي هَذَا الْمَسْجِدِ، فِي إِمَارَةِ بِشْرٍ أَنَّ عُثْمَانَ بْنَ عَفَّانَ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((مَنْ أَتَمَّ الْوُضُوءَ كَمَا أَمَرَهُ اللَّهُ تَعَالَى، فَالصَّلَوَاتُ الْمَكْتُوبَاتُ كَفَّارَاتٌ لِمَا بَيْنَهُنَّ)).

هَذَا حَدِيثُ ابْنِ مُعَاذٍ. وَلَيْسَ فِي حَدِيثِ غُنْدَرٍ: فِي إِمَارَةِ بِشْرٍ، وَلاَ ذِكْرُ الْمَكْتُوبَاتِ.

**[547]-11-(...)** ........ Cami ibn Şəddad demişdir: "Mən Humran ibn Əbanın, Bişrin[2] əmir olduğu dövrdə, bu məsciddə Əbu Burdəyə belə bir hədis danışdığını eşitdim: "Osman ibn Əffan rəvayət etmişdir ki, Peyğəmbər ﷺ belə buyurmuşdur: "Hər kim Uca Allahın əmr etdiyi kimi dəstəmazı tam şəkildə yerinə yetirsə, (qıldığı) fərz buyurulmuş namazları, aralarındakı günahlar üçün kəffarə olar".

Bu, İbn Muazın hədisidir. Ğundərin hədisində isə: "Bişrin əmir olduğu dövrdə" və "fərz buyurulmuş" sözləri yoxdur.

---

[1] 543-cü hədisin qeydlərinə bax.

[2] Həmin dövrdə Bişr ibn Mərvan Kufənin əmiri idi.

[٥٤٨] ١٢-(٢٣٢) حَدَّثَنَا هَارُونُ بْنُ سَعِيدٍ الأَيْلِيُّ: حَدَّثَنَا ابْنُ وَهْبٍ: وَأَخْبَرَنِي مَخْرَمَةُ بْنُ بُكَيْرٍ، عَنْ أَبِيهِ، عَنْ حُمْرَانَ مَوْلَى عُثْمَانَ قَالَ: تَوَضَّأَ عُثْمَانُ بْنُ عَفَّانَ يَوْمًا وُضُوءًا حَسَنًا، ثُمَّ قَالَ: رَأَيْتُ رَسُولَ اللَّهِ ﷺ تَوَضَّأَ فَأَحْسَنَ الْوُضُوءَ، ثُمَّ قَالَ: ((مَنْ تَوَضَّأَ هَكَذَا، ثُمَّ خَرَجَ إِلَى الْمَسْجِدِ لاَ يَنْهَزُهُ إِلاَّ الصَّلاَةُ، غُفِرَ لَهُ مَا خَلاَ مِنْ ذَنْبِهِ)).

**[548]-12-(232)** ........ Osmanın mövlası Humran demişdir: "Bir gün Osman ibn Əffan gözəl şəkildə dəstəmaz aldı. Sonra belə dedi: "Mən Peyğəmbəri ﷺ gördüm. O, dəstəmaz aldı və bunu gözəl şəkildə yerinə yetirdi. Sonra da buyurdu: "Kim bu şəkildə dəstəmaz alar, sonra da nəfsini yalnız namaz qılmağa təhrik edərək məscidə gedərsə, keçmiş günahları bağışlanar".

[٥٤٩] ١٣-(...) و حَدَّثَنِي أَبُو الطَّاهِرِ وَيُونُسُ بْنُ عَبْدِ الأَعْلَى قَالاَ: أَخْبَرَنَا عَبْدُ اللَّهِ بْنُ وَهْبٍ عَنْ عَمْرِو بْنِ الْحَارِثِ أَنَّ الْحُكَيْمَ بْنَ عَبْدِ اللَّهِ الْقُرَشِيَّ حَدَّثَهُ أَنَّ نَافِعَ بْنَ جُبَيْرٍ وَعَبْدَ اللَّهِ بْنَ أَبِي سَلَمَةَ حَدَّثَاهُ أَنَّ مُعَاذَ بْنَ عَبْدِ الرَّحْمَنِ حَدَّثَهُمَا عَنْ حُمْرَانَ مَوْلَى عُثْمَانَ بْنِ عَفَّانَ، عَنْ عُثْمَانَ بْنِ عَفَّانَ قَالَ: سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ: ((مَنْ تَوَضَّأَ لِلصَّلاَةِ فَأَسْبَغَ الْوُضُوءَ، ثُمَّ مَشَى إِلَى الصَّلاَةِ الْمَكْتُوبَةِ، فَصَلاَّهَا مَعَ النَّاسِ، أَوْ مَعَ الْجَمَاعَةِ، أَوْ فِي الْمَسْجِدِ، غَفَرَ اللَّهُ لَهُ ذُنُوبَهُ)).

**[549]-13-(...)** ........ Osman ibn Əffan ؓ demişdir: "Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: "Kim namaz qılmaq üçün dəstəmaz alar və dəstəmazını tam şəkildə yerinə yetirər, sonra da fərz namazını qılmağa gedər və bu namazı insanlarla, yaxud camaatla birgə, ya da məsciddə qılarsa, Allah onun günahlarını bağışlayar".

## (٥) - بَابُ الصَّلَوَاتِ الْخَمْسُ وَالْجُمْعَةُ إِلَى الْجُمْعَةِ وَرَمَضَانُ إِلَى رَمَضَانَ مُكَفِّرَاتٌ لِمَا بَيْنَهُنَّ مَا اجْتُنِبَتْ الْكَبَائِرُ

## 5-ci fəsil. Böyük günahlardan çəkinildiyi təqdirdə, beş vaxt namaz, habelə cümə namazı, növbəti cüməyədək və Ramazan ayı, növbəti ramazanadək arada olan (kiçik günahlar üçün) kəffarədir

[٥٥٠] ١٤-(٢٣٣) حَدَّثَنَا يَحْيَى بْنُ أَيُّوبَ وَقُتَيْبَةُ بْنُ سَعِيدٍ وَعَلِيُّ بْنُ حُجْرٍ، كُلُّهُمْ عَنْ إِسْمَعِيلَ، قَالَ ابْنُ أَيُّوبَ: حَدَّثَنَا إِسْمَعِيلُ بْنُ جَعْفَرٍ: أَخْبَرَنِي الْعَلاَءُ بْنُ عَبْدِ الرَّحْمَنِ بْنِ يَعْقُوبَ، مَوْلَى الْحُرَقَةِ، عَنْ أَبِيهِ، عَنْ أَبِي هُرَيْرَةَ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: ((الصَّلاَةُ الْخَمْسُ، وَالْجُمْعَةُ إِلَى الْجُمْعَةِ، كَفَّارَةٌ لِمَا بَيْنَهُنَّ، مَا لَمْ تُغْشَ الْكَبَائِرُ)).

**[550]-14-(233)** ........ Əbu Hureyrə ﷺ rəvayət edir ki, Rəsulullah ﷺ demişdir: "Böyük günahlar işlətmədikcə, beş (vaxt) namaz, (bunların arasındakı günahların), habelə cümə namazı, növbəti cüməyədək arada olan günahların kəffarəsidir".

**[٥٥١] ١٥**–(...) حَدَّثَنِي نَصْرُ بْنُ عَلِيٍّ الْجَهْضَمِيُّ: أَخْبَرَنَا عَبْدُ الأَعْلَى: حَدَّثَنَا هِشَامٌ عَنْ مُحَمَّدٍ، عَنْ أَبِي هُرَيْرَةَ عَنِ النَّبِيِّ ﷺ قَالَ: ((الصَّلَوَاتُ الْخَمْسُ، وَالْجُمْعَةُ إِلَى الْجُمْعَةِ، كَفَّارَاتٌ لِمَا بَيْنَهُنَّ)).

**[551]-15-(...)** ........ Əbu Hureyrə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Beş (vaxt) namaz, (bunların arasındakı günahların), habelə cümə namazı, növbəti cüməyədək arada olan günahların kəffarəsidir".

**[٥٥٢] ١٦**–(...) حَدَّثَنِي أَبُو الطَّاهِرِ وَهَارُونُ بْنُ سَعِيدٍ الأَيْلِيُّ قَالاَ: أَخْبَرَنَا ابْنُ وَهْبٍ عَنْ أَبِي صَخْرٍ، أَنَّ عُمَرَ بْنَ إِسْحَقَ مَوْلَى زَائِدَةَ حَدَّثَهُ عَنْ أَبِيهِ، عَنْ أَبِي هُرَيْرَةَ أَنَّ رَسُولَ اللَّهِ ﷺ كَانَ يَقُولُ: ((الصَّلَوَاتُ الْخَمْسُ، وَالْجُمْعَةُ إِلَى الْجُمْعَةِ، وَرَمَضَانُ إِلَى رَمَضَانَ، مُكَفِّرَاتٌ مَا بَيْنَهُنَّ، إِذَا اجْتَنَبَ الْكَبَائِرَ)).

**[552]-16-(...)** ........ Əbu Hureyrə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: Böyük günahlardan çəkinildiyi təqdirdə, beş (vaxt) namaz, (bunların arasındakı günahlar üçün), habelə cümə namazı, növbəti cüməyədək və Ramazan ayı, növbəti Ramazan ayınadək arada olan (kiçik günahlar üçün) kəffarədir".

## (٦) – بَابُ الذِّكْرِ الْمُسْتَحَبِّ عَقِبَ الْوُضُوءِ

## 6-cı fəsil. Dəstəmazdan sonra oxunulması müstəhəb[1] sayılan zikr

**[٥٥٣] ١٧**–(**٢٣٤**) حَدَّثَنِي مُحَمَّدُ بْنُ حَاتِمِ بْنِ مَيْمُونٍ: حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ بْنُ مَهْدِيٍّ: حَدَّثَنَا مُعَاوِيَةُ بْنُ صَالِحٍ عَنْ رَبِيعَةَ، يَعْنِي ابْنَ يَزِيدَ، عَنْ أَبِي إِدْرِيسَ الْخَوْلاَنِيِّ، عَنْ عُقْبَةَ بْنِ عَامِرٍ؛ ح: وَحَدَّثَنِي أَبُو

[1] Bəyənilən və könüllü olaraq yerinə yetirilən. Dəstəməzda müstəhəb sayılan əməllər aşağıdakılardır:
– dəstəmaza başladıqda "bismillah" demək;
– misvakla dişləri təmizləmək;
– dəstəmaza başladıqda əlləri yumaq;
– əl barmaqlarının arasını yumaq;
– sıx saqqalın dibinə su çatdırmaq;
– dəstəmaz əzalarını iki və ya üç dəfə yumaq;
– əzaları sağ tərəfdən başlayaraq yumaq;
– dəstəmazdan sonra (bu fəsildə zikr edilmiş) duanı oxumaq;
– suyu israf etməmək.

عُثْمَانَ عَنْ جُبَيْرِ بْنِ نُفَيْرٍ، عَنْ عُقْبَةَ بْنِ عَامِرٍ قَالَ: كَانَتْ عَلَيْنَا رِعَايَةُ الإِبِلِ فَجَاءَتْ نَوْبَتِي، فَرَوَّحْتُهَا بِعَشِيٍّ، فَأَدْرَكْتُ رَسُولَ اللَّهِ ﷺ قَائِمًا يُحَدِّثُ النَّاسَ، فَأَدْرَكْتُ مِنْ قَوْلِهِ: ((مَا مِنْ مُسْلِمٍ يَتَوَضَّأُ فَيُحْسِنُ وُضُوءَهُ، ثُمَّ يَقُومُ فَيُصَلِّي رَكْعَتَيْنِ، مُقْبِلٌ عَلَيْهِمَا بِقَلْبِهِ وَوَجْهِهِ، إِلاَّ وَجَبَتْ لَهُ الْجَنَّةُ)) قَالَ فَقُلْتُ: مَا أَجْوَدَ هَذِهِ فَإِذَا قَائِلٌ بَيْنَ يَدَيَّ يَقُولُ: الَّتِي قَبْلَهَا أَجْوَدُ، فَنَظَرْتُ فَإِذَا عُمَرُ. قَالَ: إِنِّي قَدْ رَأَيْتُكَ جِئْتَ آنِفًا. قَالَ: ((مَا مِنْكُمْ مِنْ أَحَدٍ يَتَوَضَّأُ فَيُبْلِغُ – أَوْ فَيُسْبِغُ – الْوَضُوءَ ثُمَّ يَقُولُ: أَشْهَدُ أَنْ لاَ إِلَهَ إِلاَّ اللَّهُ وَأَنَّ مُحَمَّدًا عَبْدُ اللَّهِ وَرَسُولُهُ، إِلاَّ فُتِحَتْ لَهُ أَبْوَابُ الْجَنَّةِ الثَّمَانِيَةُ، يَدْخُلُ مِنْ أَيِّهَا شَاءَ)).

**[553]-17-(234)** ........ Uqbə ibn Amir ﷺ demişdir: “Dəvələri otarmaq bizə[1] həvalə edilmişdi. Nəhayət, mənim növbəm gəlib çatdı və mən (vəzifəmi yerinə yetirdikdən sonra) axşamüstü dəvələri sürüb (tövləyə) apardım. Sonra Peyğəmbərin ﷺ (yanına getdim və onun) ayaq üstə durub camaata (öyüd-nəsihət) verdiyini gördüm. Söylədiklərindən eşitdiyim isə bu oldu: “Hansı bir müsəlman dəstəmaz alar və onu gözəl şəkildə yerinə yetirər, sonra da qalxıb qəlbi və vəchi ilə namaza yönəldərək iki rükət namaz qılarsa, Cənnət mütləq ona vacib olar”.

(Uqbə) dedi: “Mən (öz-özümə): “Bu nə gözəl sözlərdir!”– dedim. Birdən qarşımda oturan adam (mənə): “Bundan əvvəlki daha gözəl idi”– dedi. Baxdım ki, bu Ömərdir. O dedi: “Mən sənin bir qədər əvvəl gəldiyini gördüm. (Sən gəlməmişdən öncə) Peyğəmbər ﷺ belə buyurdu: “Sizlərdən hansı biriniz dəstəmaz alar və dəstəmazını kamil şəkildə, (yaxud tam şəkildə) yerinə yetirər, sonra da: “Əşhədu ən lə ilahə illəllah və ənnə Muhəmmədən abdullahi və Rəsuluhu!”[2]– deyərsə, Cənnətin səkkiz qapısı onun üçün açılar və o, hansından istəsə, (oradan Cənnətə) daxil olar”.

**[٥٥٤]** (...) و حَدَّثَنَاه أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا زَيْدُ بْنُ الْحُبَابِ: حَدَّثَنَا مُعَاوِيَةُ بْنُ صَالِحٍ، عَنْ رَبِيعَةَ بْنِ يَزِيدَ، عَنْ أَبِي إِدْرِيسَ الْخَوْلاَنِيِّ وَأَبِي عُثْمَانَ، عَنْ جُبَيْرِ بْنِ نُفَيْرِ بْنِ مَالِكٍ الْحَضْرَمِيِّ، عَنْ عُقْبَةَ بْنِ عَامِرٍ الْجُهَنِيِّ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: فَذَكَرَ مِثْلَهُ غَيْرَ أَنَّهُ قَالَ: ((مَنْ تَوَضَّأَ فَقَالَ: أَشْهَدُ أَنْ لاَ إِلَهَ إِلاَّ اللَّهُ وَحْدَهُ لاَ شَرِيكَ لَهُ وَأَشْهَدُ أَنَّ مُحَمَّدًا عَبْدُهُ وَرَسُولُهُ)).

**[554] (...)** ........ Uqbə ibn Amir əl-Cuhəni ﷺ: “Peyğəmbər ﷺ belə buyurmuşdur...”– deyərək hədisi eynilə rəvayət etmiş, fəqət bu rəvayətdə: “Hər kim dəs-

[1] Yəni səhabələrdən bəzilərinə.

[2] Tərcüməsi: Mən şahidlik edirəm ki, Allahdan başqa (ibadətə haqqı olan) məbud yoxdur və (şahidlik edirəm ki,) Muhəmməd Allahın qulu və elçisidir.

təmaz alıb: “Əşhədu ən lə ilahə illəllahu, vəhdəhu lə şərikə ləhu və əşhədu ənnə Muhəmmədən abduhu və Rəsuluhu!”[1]– desə....” (sözünü) əlavə etmişdir.

## (٧) – بَابُ فِي وُضُوءِ النَّبِيِّ ﷺ

## 7-ci fəsil. Peyğəmbərin ﷺ dəstəmaz alması haqqında

**[٥٥٥] ١٨–(٢٣٥)** حَدَّثَنِي مُحَمَّدُ بْنُ الصَّبَّاحِ: حَدَّثَنَا خَالِدُ بْنُ عَبْدِ اللَّهِ، عَنْ عَمْرِو بْنِ يَحْيَى بْنِ عُمَارَةَ، عَنْ أَبِيهِ عَنْ عَبْدِ اللَّهِ بْنِ زَيْدِ بْنِ عَاصِمٍ الأَنْصَارِيِّ – وَكَانَتْ لَهُ صُحْبَةٌ – قَالَ: قِيلَ لَهُ: تَوَضَّأْ لَنَا وُضُوءَ رَسُولِ اللَّهِ ﷺ. فَدَعَا بِإِنَاءٍ، فَأَكْفَأَ مِنْهَا عَلَى يَدَيْهِ، فَغَسَلَهُمَا ثَلاثًا، ثُمَّ أَدْخَلَ يَدَهُ فَاسْتَخْرَجَهَا، فَمَضْمَضَ وَاسْتَنْشَقَ مِنْ كَفٍّ وَاحِدَةٍ، فَفَعَلَ ذَلِكَ ثَلاثًا، ثُمَّ أَدْخَلَ يَدَهُ فَاسْتَخْرَجَهَا فَغَسَلَ وَجْهَهُ ثَلاثًا، ثُمَّ أَدْخَلَ يَدَهُ فَاسْتَخْرَجَهَا فَغَسَلَ يَدَيْهِ إِلَى الْمِرْفَقَيْنِ، مَرَّتَيْنِ مَرَّتَيْنِ، ثُمَّ أَدْخَلَ يَدَهُ فَاسْتَخْرَجَهَا فَمَسَحَ بِرَأْسِهِ، فَأَقْبَلَ بِيَدَيْهِ وَأَدْبَرَ، ثُمَّ غَسَلَ رِجْلَيْهِ إِلَى الْكَعْبَيْنِ، ثُمَّ قَالَ: هَكَذَا كَانَ وُضُوءُ رَسُولِ اللَّهِ ﷺ.

**[555]-18-(235)** ........ Rəvayət edilir ki, (bir dəfə) Abdullah ibn Zeyd ibn Asim əl-Ənsariyə ﷺ: “Peyğəmbərin ﷺ dəstəmaz aldığı kimi dəstəmaz al”– deyildi. (Bunu eşitdikdə) o, bir qab (su) gətizdirdi. Sonra qabdan əllərinə su tökdü və onları üç dəfə yudu. Sonra (sağ) əlini qabın içinə salıb-çıxartdı və bir ovuc su ilə həm ağzını yaxaladı, həm də burnunun içini yudu. Bunu üç dəfə təkrar etdi. Sonra (yenə) əlini qabın içinə salıb-çıxartdı və (ovuclarındakı su ilə) üç dəfə üzünü yudu. Sonra (yenə) əlini qabın içinə salıb-çıxartdı və əllərini dirsəklərə qədər iki dəfə-iki dəfə yudu. Sonra (yenə) əlini qabın içinə salıb-çıxartdı və (yaş əlləri ilə) başına məsh çəkdi, əllərini qabağa və dala apardı.[2] Sonra ayaqlarını topuqlara qədər yudu. Sonra dedi: “Peyğəmbər ﷺ belə dəstəmaz alardı”.

**[٥٥٦]** (...) و حَدَّثَنِي الْقَاسِمُ بْنُ زَكَرِيَّاءَ: حَدَّثَنَا خَالِدُ بْنُ مَخْلَدٍ عَنْ سُلَيْمَانَ هُوَ ابْنُ بِلَالٍ، عَنْ عَمْرِو بْنِ يَحْيَى بِهَذَا الإِسْنَادِ نَحْوَهُ، وَلَمْ يَذْكُرْ الْكَعْبَيْنِ.

**[556] (...)** ........ Qasim ibn Zəkəriyya mənə belə rəvayət etmişdir: “Bizə Xalid ibn Müxəlləd, Süleyman ibn Bilaldan, o da Amr ibn Yəhyadan bu isnadla hədisi eynilə rəvayət etmiş, fəqət “topuqlar” sözünü zikr etməmişdir.

---

[1] Tərcüməsi: Mən şahidlik edirəm ki, Allahdan başqa (ibadətə haqqı olan) məbud yoxdur, O, Təkdir, Onun heç bir şəriki yoxdur və (şahidlik edirəm ki,) Muhəmməd Onun qulu və elçisidir.

[2] Yəni əllərini başının ön tərəfindən ənsəsinə qədər apardı, sonra da başladığı yerə qaytardı.

**[٥٥٧]** (...) و حَدَّثَنِي إِسْحَقُ بْنُ مُوسَى الأَنْصَارِيُّ: حَدَّثَنَا مَعْنٌ: حَدَّثَنَا مَالِكُ بْنُ أَنَسٍ عَنْ عَمْرِو بْنِ يَحْيَى بِهَذَا الإِسْنَادِ، وَقَالَ: مَضْمَضَ وَاسْتَنْثَرَ ثَلاَثًا، وَلَمْ يَقُلْ: مِنْ كَفٍّ وَاحِدَةٍ. وَزَادَ بَعْدَ قَوْلِهِ، فَأَقْبَلَ بِهِمَا وَأَدْبَرَ: بَدَأَ بِمُقَدَّمِ رَأْسِهِ ثُمَّ ذَهَبَ بِهِمَا إِلَى قَفَاهُ، ثُمَّ رَدَّهُمَا حَتَّى رَجَعَ إِلَى الْمَكَانِ الَّذِي بَدَأَ مِنْهُ، وَغَسَلَ رِجْلَيْهِ.

**[557] (...)** ........ Malik ibn Ənəs (hədisi) Amr ibn Yəhyadan bu isnadla rəvayət etmiş və (bu rəvayətdə): "üç dəfə ağzını yaxalamış və (üç dəfə) burnunu yumuşdur"– demiş, amma: "bir ovucla" sözünü qeyd etməmişdir, üstəlik bunu da əlavə etmişdir: "başının ön tərəfindən başladı və əvvəlcə əllərini ənsəsinə[1] doğru apardı, sonra da onları başladığı yerə qaytardı. Daha sonra ayaqlarını yudu".

**[٥٥٨]** (...) حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ بْنُ بِشْرٍ الْعَبْدِيُّ: حَدَّثَنَا بَهْزٌ: حَدَّثَنَا وُهَيْبٌ: حَدَّثَنَا عَمْرُو بْنُ يَحْيَى بِمِثْلِ إِسْنَادِهِمْ، وَاقْتَصَّ الْحَدِيثَ، وَقَالَ فِيهِ: فَمَضْمَضَ وَاسْتَنْشَقَ وَاسْتَنْثَرَ مِنْ ثَلاَثِ غَرَفَاتٍ، وَقَالَ أَيْضًا فَمَسَحَ بِرَأْسِهِ فَأَقْبَلَ بِهِ وَأَدْبَرَ مَرَّةً وَاحِدَةً.

قَالَ بَهْزٌ: أَمْلَى عَلَيَّ وُهَيْبٌ هَذَا الْحَدِيثَ. و قَالَ وُهَيْبٌ: أَمْلَى عَلَيَّ عَمْرُو بْنُ يَحْيَى هَذَا الْحَدِيثَ مَرَّتَيْنِ.

**[558] (...)** ........ Amr ibn Yəhya (bu hədisi) yuxarıdakı isnadlara bənzər (bir isnadla) rəvayət etmiş və hədisi belə nəql etmişdir: "Üç ovuc su ilə ağzını yaxaladı, burnuna su çəkib-çıxartmaqla onu yudu". O həmçinin: "Başına məsh çəkdi. (Əllərini) bir dəfə qabağa və dala apardı" sözünü də nəql etmişdir.

Bəhz: "Bu hədisi mənə Vuheyb yazdırmışdır"– dedi. Vuheyb də: "Bu hədisi mənə Amr ibn Yəhya iki dəfə yazdırmışdır"– dedi.

**[٥٥٩] ١٩–(٢٣٦)** حَدَّثَنَا هَارُونُ بْنُ مَعْرُوفٍ؛ **ح**: و حَدَّثَنِي هَارُونُ بْنُ سَعِيدٍ الأَيْلِيُّ وَأَبُو الطَّاهِرِ قَالُوا: حَدَّثَنَا ابْنُ وَهْبٍ: أَخْبَرَنِي عَمْرُو بْنُ الْحَارِثِ أَنَّ حَبَّانَ بْنَ وَاسِعٍ حَدَّثَهُ أَنَّ أَبَاهُ حَدَّثَهُ أَنَّهُ سَمِعَ عَبْدَ اللَّهِ بْنَ زَيْدِ بْنِ عَاصِمٍ الْمَازِنِيَّ يَذْكُرُ أَنَّهُ رَأَى رَسُولَ اللَّهِ ﷺ تَوَضَّأَ، فَمَضْمَضَ، ثُمَّ اسْتَنْثَرَ، ثُمَّ غَسَلَ وَجْهَهُ ثَلاَثًا، وَيَدَهُ الْيُمْنَى ثَلاَثًا، وَالأُخْرَى ثَلاَثًا، وَمَسَحَ بِرَأْسِهِ بِمَاءٍ غَيْرِ فَضْلِ يَدِهِ، وَغَسَلَ رِجْلَيْهِ حَتَّى أَنْقَاهُمَا.

قَالَ أَبُو الطَّاهِرِ حَدَّثَنَا ابْنُ وَهْبٍ عَنْ عَمْرِو بْنِ الْحَارِثِ.

**[559]-19-(236)** ........ Abdullah ibn Zeyd ibn Asim əl-Mazini ﵁ Peyğəmbəri ﷺ dəstəmaz alarkən gördüyünü belə vəsf etmişdir: "Ağzını yaxaladı, sonra burnuna su çəkib çıxartdı. Sonra üç dəfə üzünü yudu. Sonra üç dəfə sağ əlini, üç dəfə də digər əlini yudu. (Sonra) başına, əlinin artığı olmayan su ilə[2] məsh çəkdi. Sonra ayaqlarını tərtəmiz edincəyə qədər yudu".

---

[1] Ənsə: başın arxa tərəfi.

[2] Əllərini təzədən suya salıb yaş əlləri ilə başına məsh çəkdi.

Əbu Tahir demişdir: “İbn Vəhb (bu hədisi) bizə Amr ibn əl-Harisdən rəvayət etmişdir”.

## (٨) – بَابُ الإِيتَارِ فِي الاِسْتِنْثَارِ وَالاِسْتِجْمَارِ

## 8-ci fəsil. Burunu yaxaladıqda, habelə (ayaqyolunda) daşla təmizləndikdə (bunu) tək sayda etmək

**[٥٦٠] ٢٠**–(٢٣٧) حَدَّثَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ وَعَمْرٌو النَّاقِدُ وَمُحَمَّدُ بْنُ عَبْدِ اللَّهِ بْنِ نُمَيْرٍ، جَمِيعًا عَنِ ابْنِ عُيَيْنَةَ، قَالَ قُتَيْبَةُ: حَدَّثَنَا سُفْيَانُ، عَنْ أَبِي الزِّنَادِ، عَنِ الأَعْرَجِ، عَنْ أَبِي هُرَيْرَةَ يَبْلُغُ بِهِ النَّبِيَّ ﷺ قَالَ: ((إِذَا اسْتَجْمَرَ أَحَدُكُمْ فَلْيَسْتَجْمِرْ وِتْرًا، وَإِذَا تَوَضَّأَ أَحَدُكُمْ فَلْيَجْعَلْ فِي أَنْفِهِ مَاءً ثُمَّ لِيَنْتَثِرْ)).

**[560]-20-(237)** ........ Əbu Hureyrə ﷺ bu hədisi Peyğəmbərə ﷺ istinad edərək demişdir: “Peyğəmbər ﷺ belə buyurmuşdur: “Hansı biriniz ayaqyolunda daşla təmizlənsə, qoy bunu tək sayda etsin (ən azı üç daşla təmizlənsin).[1] Bir də ki, hansı biriniz dəstəmaz almış olsa, qoy burnuna su alsın, sonra (onu) çıxartsın”.

---

[1] Bu, subaşına çıxmağın ədəblərindəndir. Ümumiyyətlə isə subaşına çıxmağın ədəbləri aşağıdakılardır:

– Subaşına çıxan şəxs elə yer seçməlidir ki, insanlar onun nə özünü görə bilsinlər, nə orqanizmdən qazburaxma zamanı ehtimal olunan səsi eşitsinlər, nə də ifrazatın və qazın iyini duya bilsinlər;

– Ayaqyoluna girən adam ora daxil olarkən aşağıdakı duanı oxumalıdır;

**«Allahummə inni əuzu bikə minəl-xubsi vəl-xəbais»** (Allahım, pislikdən və pis əməllərdən (erkək və dişi cinlərdən) Sənə sığınıram!)

– Ayaqyolunda olan adam danışmamalı, salam verib-almamalı, zərurət olmadan çağırana cavab verməməlidir;

– Subaşına çıxan şəxs qibləyə təzim etmək, onun ehtiramını gözləmək naminə üzünü və ya arxasını qibləyə çevirməməlidir;

– Subaşına çıxan şəxs bədəninə nəcis və sidik dəyməsindən özünü gözləməlidir;

– Subaşına çıxan şəxs insanların gedib-gəlmək üçün istifadə etdikləri yollardan və istirahət etmək üçün nəzərdə tutulan yerlərdən kənara çəkilməlidir;

– Subaşına çıxan şəxs axmayan durğun sulara, özünün çimdiyi suyun içinə nəcis və ya sidik salmamalıdır;

– Sidik ifraz etdikdə ayaq üstə durmaq bəyənilmir. Subaşına çıxan şəxs yalnız iki şərtlə bunu edə bilər;

a) Sidiyin paltarına və ya bədəninə sıçramayacağına əmin olduqda;

b) Başqalarının onun ayıb yerlərini görməyəcəyinə əmin olduqda.

– Hər iki ifrazat üzvünün çıxışı su ilə (su tapılmadıqda isə daş və s.) ilə təmizlənməlidir;

– Ayaqyolunda sol əl ilə təmizlənmək lazımdır;

– Ayaqyolundan çıxan adam oradan çıxdıqda aşağıdakı duanı oxumalıdır;

**«Ğufranəkə»** - (Allahım! Məni bağışla).

– Ayaqyoluna sol ayaqla daxil olmaq və sağ ayaqla çıxmaq gərəkdir.

**[٥٦١] ٢١**–(...) حَدَّثَنِي مُحَمَّدُ بْنُ رَافِعٍ: حَدَّثَنَا عَبْدُ الرَّزَّاقِ بْنُ هَمَّامٍ: أَخْبَرَنَا مَعْمَرٌ عَنْ هَمَّامِ بْنِ مُنَبِّهٍ قَالَ: هَذَا مَا حَدَّثَنَا أَبُو هُرَيْرَةَ، عَنْ مُحَمَّدٍ رَسُولِ اللَّهِ ﷺ. فَذَكَرَ أَحَادِيثَ مِنْهَا، وَقَالَ رَسُولُ اللَّهِ ﷺ: ((إِذَا تَوَضَّأَ أَحَدُكُمْ فَلْيَسْتَنْشِقْ بِمَنْخِرَيْهِ مِنَ الْمَاءِ ثُمَّ لِيَنْتَثِرْ)).

**[561]-21-(...)** ........ Həmmam ibn Munəbbih: "Bu, Əbu Hureyrənin bizə Allahın elçisi Muhəmməddən ﷺ rəvayət etdikləridir..."– demiş və bir neçə hədis rəvayət etmişdir. Bu hədislərdən biri də budur: "Peyğəmbər ﷺ belə buyurmuşdur: "Sizlərdən biri dəstəmaz aldığı zaman burnunun dəliklərinə su çəksin, sonra (onu) çıxartsın".

**[٥٦٢] ٢٢**–(...) حَدَّثَنَا يَحْيَى بْنُ يَحْيَى قَالَ: قَرَأْتُ عَلَى مَالِكٍ عَنْ ابْنِ شِهَابٍ، عَنْ أَبِي إِدْرِيسَ الْخَوْلَانِيِّ، عَنْ أَبِي هُرَيْرَةَ، أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: ((مَنْ تَوَضَّأَ فَلْيَسْتَنْثِرْ وَمَنْ اسْتَجْمَرَ فَلْيُوتِرْ)).

**[562]-22-(...)** ........ Yəhya ibn Yəhya bizə rəvayət edib demişdir: "Mən Malikin hüzurunda (bu hədisi) oxudum. (Dedim ki:) İbn Şihab Əbu İdris əl-Xövlanidən, o da Əbu Hureyrədən rəvayət etmişdir ki, Peyğəmbər ﷺ belə buyurmuşdur: "Kim dəstəmaz alarsa, burnunun içini yusun və kim ayaqyolunda daşla təmizlənərsə, (daşların sayını) tək sayda etsin".

**[٥٦٣]** (...)حَدَّثَنَا سَعِيدُ بْنُ مَنْصُورٍ: حَدَّثَنَا حَسَّانُ بْنُ إِبْرَاهِيمَ: حَدَّثَنَا يُونُسُ بْنُ يَزِيدَ؛ **ح**: و حَدَّثَنِي حَرْمَلَةُ بْنُ يَحْيَى: أَخْبَرَنَا ابْنُ وَهْبٍ: أَخْبَرَنِي يُونُسُ، عَنْ ابْنِ شِهَابٍ: أَخْبَرَنِي أَبُو إِدْرِيسَ الْخَوْلَانِيُّ أَنَّهُ سَمِعَ أَبَا هُرَيْرَةَ وَأَبَا سَعِيدٍ الْخُدْرِيَّ يَقُولَانِ: قَالَ رَسُولُ اللَّهِ ﷺ بِمِثْلِهِ.

**[563] (...)** ........ Əbu İdris əl-Xövlani demişdir: "Mən Əbu Hureyrənin və Əbu Səid əl-Xudrinin: "Peyğəmbər ﷺ belə buyurmuşdur..."– deyərək hədisi eynilə rəvayət etdiyini eşitmişəm.

**[٥٦٤] ٢٣**–(٢٣٨) حَدَّثَنِي بِشْرُ بْنُ الْحَكَمِ الْعَبْدِيُّ: حَدَّثَنَا عَبْدُ الْعَزِيزِ يَعْنِي الدَّرَاوَرْدِيَّ، عَنْ ابْنِ الْهَادِ، عَنْ مُحَمَّدِ بْنِ إِبْرَاهِيمَ، عَنْ عِيسَى بْنِ طَلْحَةَ، عَنْ أَبِي هُرَيْرَةَ، أَنَّ النَّبِيَّ ﷺ قَالَ: ((إِذَا اسْتَيْقَظَ أَحَدُكُمْ مِنْ مَنَامِهِ فَلْيَسْتَنْثِرْ ثَلَاثَ مَرَّاتٍ، فَإِنَّ الشَّيْطَانَ يَبِيتُ عَلَى خَيَاشِيمِهِ)).

**[564]-23-(238)** ........ Əbu Hureyrə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Biriniz yuxudan oyandığı zaman üç dəfə burnuna su alıb çıxartsın. Çünki şeytan onun burun çəpərlərinin üstündə gecələyir"[1].

---

[1] Ehtimal olunur ki, bu, Ayətəl-Kursini ("əl-Bəqərə" surəsinin 255-ci ayəsini) oxumayan kimsələrə aiddir, ya da bu o deməkdir ki, şeytanın özü insanın burun çəpərinin üstündə gecələsə də, onun vəsvəsəsi, yatmamışdan əvvəl zikrlərini edən möminin qəlbinə girə bilməz.

**[٥٦٥] ٢٤-(٢٣٩)** حَدَّثَنَا إِسْحَقُ بْنُ إِبْرَاهِيمَ وَمُحَمَّدُ بْنُ رَافِعٍ قَالَ ابْنُ رَافِعٍ: حَدَّثَنَا عَبْدُ الرَّزَّاقِ: أَخْبَرَنَا ابْنُ جُرَيْجٍ: أَخْبَرَنِي أَبُو الزُّبَيْرِ أَنَّهُ سَمِعَ جَابِرَ بْنَ عَبْدِ اللَّهِ يَقُولُ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((إِذَا اسْتَجْمَرَ أَحَدُكُمْ فَلْيُوتِرْ)).

**[565]-24-(239)** ........ Cabir ibn Abdullah ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Biriniz ayaqyolunda daşla təmizləndiyi zaman bunu tək sayda etsin”.

## (٩) - بَابُ وُجُوبِ غَسْلِ الرِّجْلَيْنِ بِكَمَالِهِمَا

## 9-cu fəsil. Ayaqları tam şəkildə yumağın vacibliyi

**[٥٦٦] ٢٥-(٢٤٠)** حَدَّثَنَا هَارُونُ بْنُ سَعِيدٍ الأَيْلِيُّ وَأَبُو الطَّاهِرِ وَأَحْمَدُ بْنُ عِيسَى قَالُوا: أَخْبَرَنَا عَبْدُ اللَّهِ بْنُ وَهْبٍ، عَنْ مَخْرَمَةَ بْنِ بُكَيْرٍ، عَنْ أَبِيهِ، عَنْ سَالِمٍ مَوْلَى شَدَّادٍ قَالَ: دَخَلْتُ عَلَى عَائِشَةَ زَوْجِ النَّبِيِّ ﷺ يَوْمَ تُوُفِّيَ سَعْدُ بْنُ أَبِي وَقَّاصٍ، فَدَخَلَ عَبْدُ الرَّحْمَنِ بْنُ أَبِي بَكْرٍ فَتَوَضَّأَ عِنْدَهَا، فَقَالَتْ: يَا عَبْدَ الرَّحْمَنِ! أَسْبِغْ الْوُضُوءَ، فَإِنِّي سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ: ((وَيْلٌ لِلأَعْقَابِ مِنَ النَّارِ)).

**[566]-25-(240)** ........ Şəddadın mövlası Salim demişdir: “Səd ibn Əbu Vəqqas vəfat etdiyi gün mən Peyğəmbərin ﷺ zövcəsi Aişənin yanına gəldim. Bu vaxt Abdur-Rəhman[1] ibn Əbu Bəkr içəri girdi və onun yanında dəstəmaz aldı. Aişə (ona): “Ey Abdur-Rəhman! Dəstəmazı tam şəkildə al! Çünki mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: “Oda girəcək dabanların vay halına!”[2]

**[٥٦٧]** (...) و حَدَّثَنِي حَرْمَلَةُ بْنُ يَحْيَى: حَدَّثَنَا ابْنُ وَهْبٍ: أَخْبَرَنِي حَيْوَةُ: أَخْبَرَنِي مُحَمَّدُ بْنُ عَبْدِ الرَّحْمَنِ، أَنَّ أَبَا عَبْدِ اللَّهِ مَوْلَى شَدَّادِ بْنِ الْهَادِ حَدَّثَهُ، أَنَّهُ دَخَلَ عَلَى عَائِشَةَ. فَذَكَرَ عَنْهَا عَنِ النَّبِيِّ ﷺ بِمِثْلِهِ.

**[567] (...)** ........ Şəddad ibn Hadın mövlası Əbu Abdullah rəvayət etmişdir ki, o, Aişənin yanına gəlmişdir. Sonra da (Aişənin) Peyğəmbərdən ﷺ rəvayət etdiyi hədisi zikr etmişdir.

**[٥٦٨]** (...) حَدَّثَنِي مُحَمَّدُ بْنُ حَاتِمٍ وَأَبُو مَعْنٍ الرَّقَاشِيُّ قَالاَ: حَدَّثَنَا عُمَرُ بْنُ يُونُسَ: حَدَّثَنَا عِكْرِمَةُ بْنُ عَمَّارٍ: حَدَّثَنِي يَحْيَى بْنُ أَبِي كَثِيرٍ قَالَ: حَدَّثَنِي - أَوْ حَدَّثَنَا - أَبُو سَلَمَةَ بْنُ عَبْدِ الرَّحْمَنِ: حَدَّثَنِي سَالِمٌ مَوْلَى

---

[1] Abdur-Rəhman ibn Əbu Bəkr ﵄ Aişənin ﵄ doğma qardaşıdır.

[2] Bu, dəstəmaz alarkən ayaqları yumağın vacib olmasına dəlildir.

الْمَهْرِيِّ قَالَ: خَرَجْتُ أَنَا وَعَبْدُ الرَّحْمَنِ بْنُ أَبِي بَكْرٍ فِي جَنَازَةِ سَعْدِ بْنِ أَبِي وَقَّاصٍ، فَمَرَرْنَا عَلَى بَابِ حُجْرَةِ عَائِشَةَ، فَذَكَرَ عَنْهَا عَنْ النَّبِيِّ ﷺ مِثْلَهُ.

**[568] (...)** ........ Məhrinin mövlası Salim: "Mən Abdur-Rəhman ibn Əbu Bəkr ilə birgə Səd ibn Əbu Vəqqasın cənazəsində iştirak etməyə getdik. Bu əsnada Aişənin evinin qapısının önündən keçdik..."– dedi və Aişənin Peyğəmbərdən ﷺ rəvayət etdiyi hədisi zikr etdi.

**[٥٦٩]** (...) حَدَّثَنِي سَلَمَةُ بْنُ شَبِيبٍ: حَدَّثَنَا الْحَسَنُ بْنُ أَعْيَنَ: حَدَّثَنَا فُلَيْحٌ: حَدَّثَنِي نُعَيْمُ بْنُ عَبْدِ اللَّهِ عَنْ سَالِمٍ مَوْلَى شَدَّادِ بْنِ الْهَادِ قَالَ: كُنْتُ أَنَا مَعَ عَائِشَةَ رضي الله عنها فَذَكَرَ عَنْهَا عَنْ النَّبِيِّ ﷺ بِمِثْلِهِ.

**[569] (...)** ........ Şəddad ibn Hadın mövlası Salim: "Mən Aişənin yanında idim"– dedi və Aişənin Peyğəmbərdən ﷺ rəvayət etdiyi hədisin bənzərini zikr etdi.

**[٥٧٠] ٢٦–(٢٤١)** و حَدَّثَنِي زُهَيْرُ بْنُ حَرْبٍ: حَدَّثَنَا جَرِيرٌ؛ **ح**: و حَدَّثَنَا إِسْحَقُ: أَخْبَرَنَا جَرِيرٌ عَنْ مَنْصُورٍ، عَنْ هِلَالِ بْنِ يِسَافٍ، عَنْ أَبِي يَحْيَى، عَنْ عَبْدِ اللَّهِ بْنِ عَمْرٍو قَالَ: رَجَعْنَا مَعَ رَسُولِ اللَّهِ ﷺ مِنْ مَكَّةَ إِلَى الْمَدِينَةِ، حَتَّى إِذَا كُنَّا بِمَاءٍ بِالطَّرِيقِ، تَعَجَّلَ قَوْمٌ عِنْدَ الْعَصْرِ. فَتَوَضَّئُوا وَهُمْ عِجَالٌ، فَانْتَهَيْنَا إِلَيْهِمْ، وَأَعْقَابُهُمْ تَلُوحُ لَمْ يَمَسَّهَا الْمَاءُ، فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: ((وَيْلٌ لِلأَعْقَابِ مِنْ النَّارِ، أَسْبِغُوا الْوُضُوءَ)).

**[570]-26-(241)** ........ Abdullah ibn Amr رضي الله عنه demişdir: "Biz Peyğəmbərlə ﷺ birlikdə Məkkədən Mədinəyə qayıdırdıq. Nəhayət, gəlib yol üstündəki su başına yetişdik. Əsr çağında camaat tələsdi və tələsə-tələsə dəstəmaz aldı. (Nəhayət,) biz onlara yetişdik. Onların dabanlarına su dəymədiyi (apaydın) görünürdü. (Bunu görəndə) Peyğəmbər ﷺ buyurdu: "Oda girəcək dabanların vay halına! Elə isə dəstəmazı tam şəkildə alın!"

**[٥٧١]** (...) و حَدَّثَنَاه أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا وَكِيعٌ عَنْ سُفْيَانَ؛ **ح**: و حَدَّثَنَا ابْنُ الْمُثَنَّى وَابْنُ بَشَّارٍ قَالَا: حَدَّثَنَا مُحَمَّدُ بْنُ جَعْفَرٍ قَالَ: حَدَّثَنَا شُعْبَةُ كِلَاهُمَا، عَنْ مَنْصُورٍ بِهَذَا الإِسْنَادِ. وَلَيْسَ فِي حَدِيثِ شُعْبَةَ: ((أَسْبِغُوا الْوُضُوءَ)) وَفِي حَدِيثِهِ، عَنْ أَبِي يَحْيَى الأَعْرَجِ.

**[571] (...)** ........ Süfyan və Şobə – hər ikisi (bu hədisi) Mənsurdan bu isnadla rəvayət etmişdir. Lakin Şobənin rəvayətində: "dəstəmazı tam şəkildə alın" sözü qeyd edilməmişdir. Onun rəvayət etdiyi hədisin (isnadında deyilir): "Əbu Yəhya Ərəcdən..."

**[٥٧٢] ٢٧-(٢٤٢)** حَدَّثَنَا شَيْبَانُ بْنُ فَرُّوخَ وَأَبُو كَامِلٍ الْجَحْدَرِيُّ، جَمِيعًا عَنْ أَبِي عَوَانَةَ، قَالَ أَبُو كَامِلٍ: حَدَّثَنَا أَبُو عَوَانَةَ عَنْ أَبِي بِشْرٍ، عَنْ يُوسُفَ بْنِ مَاهَكَ، عَنْ عَبْدِ اللَّهِ بْنِ عَمْرٍو قَالَ: تَخَلَّفَ عَنَّا النَّبِيُّ ﷺ فِي سَفَرٍ سَافَرْنَاهُ، فَأَدْرَكَنَا وَقَدْ حَضَرَتْ صَلاَةُ الْعَصْرِ، فَجَعَلْنَا نَمْسَحُ عَلَى أَرْجُلِنَا، فَنَادَى: ((وَيْلٌ لِلأَعْقَابِ مِنْ النَّارِ)).

**[572]-27-(242)** ........ Abdullah ibn Amr ﷺ demişdir: "Biz səfərdə olduğumuz zaman Peyğəmbər ﷺ bizdən geri qaldı, sonra da əsr namazının vaxtında gəlib bizə çatdı. (Namazın vaxtı çıxacaqdı deyə,) biz ayaqlarımıza məsh etməyə başladıq. Peyğəmbər ﷺ (bunu görcək) uca səslə dedi: "Atəşə girəcək dabanların vay halına!"

**[٥٧٣] ٢٨-(...)** حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ بْنُ سَلاَّمٍ الْجُمَحِيُّ: حَدَّثَنَا الرَّبِيعُ يَعْنِي ابْنَ مُسْلِمٍ عَنْ مُحَمَّدٍ وَهُوَ ابْنُ زِيَادٍ، عَنْ أَبِي هُرَيْرَةَ أَنَّ النَّبِيَّ ﷺ رَأَى رَجُلاً لَمْ يَغْسِلْ عَقِبَيْهِ فَقَالَ: ((وَيْلٌ لِلأَعْقَابِ مِنْ النَّارِ)).

**[573]-28-(...)** ........ Əbu Hureyrə ﷺ rəvayət edir ki, (bir dəfə) Peyğəmbər ﷺ bir nəfərin (dəstəmaz alarkən) dabanlarını yumadığını görüb dedi: "Atəşə girəcək dabanların vay halına!"

**[٥٧٤] ٢٩-(...)** حَدَّثَنَا قُتَيْبَةُ وَأَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ وَأَبُو كُرَيْبٍ، قَالُوا: حَدَّثَنَا وَكِيعٌ عَنْ شُعْبَةَ، عَنْ مُحَمَّدِ بْنِ زِيَادٍ، عَنْ أَبِي هُرَيْرَةَ أَنَّهُ رَأَى قَوْمًا يَتَوَضَّئُونَ مِنْ الْمَطْهَرَةِ، فَقَالَ أَسْبِغُوا الْوُضُوءَ فَإِنِّي سَمِعْتُ أَبَا الْقَاسِمِ ﷺ يَقُولُ: ((وَيْلٌ لِلْعَرَاقِيبِ مِنْ النَّارِ)).

**[574]-29-(...)** ........ Rəvayət edilir ki, (bir dəfə) Əbu Hureyrə ﷺ bir su qabından dəstəmaz alan bir camaatı görüb dedi: "Dəstəmazı tam şəkildə alın! Çünki mən Əbul-Qasimin[1] ﷺ belə dediyini eşitmişəm: "Oda girəcək daban üstündəki vətərlərin[2] vay halına!"

**[٥٧٥] ٣٠-(...)** حَدَّثَنِي زُهَيْرُ بْنُ حَرْبٍ: حَدَّثَنَا جَرِيرٌ عَنْ سُهَيْلٍ، عَنْ أَبِيهِ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((وَيْلٌ لِلأَعْقَابِ مِنْ النَّارِ)).

**[575]-30-(...)** ........ Əbu Hureyrə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Oda girəcək dabanların vay halına!"

---

[1] Əbul-Qasim – Peyğəmbərin ﷺ kunyəsidir. "Qasim" – bölüşdürən, paylaşdıran deməkdir. Belə ki, o, nə isə verdikdə və ya nədənsə imtina etdikdə, bunu ancaq Allahın izini və istəyi ilə yerinə yetirərdi.

[2] Əzələləri sümüklərə bağlayan lent və lövhə şəklində sıx birləşdirici toxumadan ibarət elastik törəmə.

## (١٠) – بَابُ وُجُوبِ اسْتِيعَابِ جَمِيعِ أَجْزَاءِ مَحَلِّ الطَّهَارَةِ

## 10-cu fəsil. Yuyulan əzaların hər tərəfini yaxşıca yumağın vacibliyi

**[٥٧٦] ٣١-(٢٤٣)** حَدَّثَنِي سَلَمَةُ بْنُ شَبِيبٍ: حَدَّثَنَا الْحَسَنُ بْنُ مُحَمَّدِ بْنِ أَعْيَنَ: حَدَّثَنَا مَعْقِلٌ عَنْ أَبِي الزُّبَيْرِ، عَنْ جَابِرٍ: أَخْبَرَنِي عُمَرُ بْنُ الْخَطَّابِ أَنَّ رَجُلاً تَوَضَّأَ فَتَرَكَ مَوْضِعَ ظُفُرٍ عَلَى قَدَمِهِ، فَأَبْصَرَهُ النَّبِيُّ ﷺ فَقَالَ: ((ارْجِعْ فَأَحْسِنْ وُضُوءَكَ)) فَرَجَعَ ثُمَّ صَلَّى.

**[576]-31-(243)** ........ Ömər ibn Xəttab ؓ belə xəbər vermişdir: "Bir nəfər dəstəmaz aldı və ayağında bir dırnaq boyda yeri buraxdı (yumadı). Peyğəmbər ﷺ bunu görəndə (ona) belə buyurdu: "Qayıt, dəstəmazını gözəl şəkildə yerinə yetir!" O kimsə qayıdıb (dəstəmaz aldı) və namaz qıldı.

## (١١) – بَابُ خُرُوجِ الْخَطَايَا مَعَ مَاءِ الْوُضُوءِ

## 11-ci fəsil. Dəstəmaz suyu ilə bərabər xətaların (bədəndən) xaric olması

**[٥٧٧] ٣٢-(٢٤٤)** حَدَّثَنَا سُوَيْدُ بْنُ سَعِيدٍ عَنْ مَالِكِ بْنِ أَنَسٍ؛ ح: و حَدَّثَنَا أَبُو الطَّاهِرِ – وَاللَّفْظُ لَهُ –: أَخْبَرَنَا عَبْدُ اللَّهِ بْنُ وَهْبٍ عَنْ مَالِكِ بْنِ أَنَسٍ، عَنْ سُهَيْلِ بْنِ أَبِي صَالِحٍ، عَنْ أَبِيهِ، عَنْ أَبِي هُرَيْرَةَ: أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: ((إِذَا تَوَضَّأَ الْعَبْدُ الْمُسْلِمُ – أَوْ الْمُؤْمِنُ – فَغَسَلَ وَجْهَهُ، خَرَجَ مِنْ وَجْهِهِ كُلُّ خَطِيئَةٍ نَظَرَ إِلَيْهَا بِعَيْنَيْهِ مَعَ الْمَاءِ – أَوْ مَعَ آخِرِ قَطْرِ الْمَاءِ – فَإِذَا غَسَلَ يَدَيْهِ خَرَجَ مِنْ يَدَيْهِ كُلُّ خَطِيئَةٍ كَانَ بَطَشَتْهَا يَدَاهُ مَعَ الْمَاءِ – أَوْ مَعَ آخِرِ قَطْرِ الْمَاءِ – فَإِذَا غَسَلَ رِجْلَيْهِ خَرَجَتْ كُلُّ خَطِيئَةٍ مَشَتْهَا رِجْلَاهُ مَعَ الْمَاءِ – أَوْ مَعَ آخِرِ قَطْرِ الْمَاءِ – حَتَّى يَخْرُجَ نَقِيًّا مِنْ الذُّنُوبِ)).

**[577]-32-(244)** ........ Əbu Hureyrə ؓ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Müsəlman (yaxud mömin) bir bəndə dəstəmaz aldığı zaman üzünü yuduqda, gözləri ilə gördüyü hər bir xəta[1] su ilə, (yaxud suyun son damlasıyla) bərabər üzündən çıxar. Əllərini yuduqda, əlləri ilə tutduğu hər bir xəta su ilə, (yaxud suyun son damlasıyla) bərabər əllərindən çıxar. Ayaqlarını yuduqda, ayaq-

[1] Burada söhbət kiçik günahlardan gedir.

ları ilə batdığı hər bir xəta su ilə, (yaxud suyun son damlasıyla) bərabər ayaqlarından çıxar. Nəhayət, o bəndə günahlardan təmizlənmiş halda (üzə) çıxar”.

**[٥٧٨] ٣٣**–(**٢٤٥**) حَدَّثَنَا مُحَمَّدُ بْنُ مَعْمَرِ بْنِ رِبْعِيٍّ الْقَيْسِيُّ: حَدَّثَنَا أَبُو هِشَامٍ الْمَخْزُومِيُّ عَنْ عَبْدِ الْوَاحِدِ وَهُوَ ابْنُ زِيَادٍ: حَدَّثَنَا عُثْمَانُ بْنُ حَكِيمٍ: حَدَّثَنَا مُحَمَّدُ بْنُ الْمُنْكَدِرِ عَنْ حُمْرَانَ، عَنْ عُثْمَانَ بْنِ عَفَّانَ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((مَنْ تَوَضَّأَ فَأَحْسَنَ الْوُضُوءَ خَرَجَتْ خَطَايَاهُ مِنْ جَسَدِهِ، حَتَّى تَخْرُجَ مِنْ تَحْتِ أَظْفَارِهِ)).

**[578]-33-(245)** ........ Osman ibn Əffan ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Hər kim dəstəmaz alar və dəstəmazını gözəl şəkildə yerinə yetirərsə, günahları vücudundan xaric olar, hətta dırnaqlarının altından (kənara) çıxar”.

## (١٢) – بَابُ اسْتِحْبَابِ إِطَالَةِ الْغُرَّةِ وَالتَّحْجِيلِ فِي الْوُضُوءِ

## 12-ci fəsil. Dəstəmaz aldıqda üz, əl və ayaqlardakı nuru artırmağın müstəhəbliyi[1]

**[٥٧٩] ٣٤**–(**٢٤٦**) حَدَّثَنِي أَبُو كُرَيْبٍ مُحَمَّدُ بْنُ الْعَلَاءِ وَالْقَاسِمُ بْنُ زَكَرِيَّاءَ بْنِ دِينَارٍ وَعَبْدُ بْنُ حُمَيْدٍ، قَالُوا: حَدَّثَنَا خَالِدُ بْنُ مَخْلَدٍ عَنْ سُلَيْمَانَ بْنِ بِلَالٍ: حَدَّثَنِي عُمَارَةُ بْنُ غَزِيَّةَ الْأَنْصَارِيُّ عَنْ نُعَيْمِ بْنِ عَبْدِ اللَّهِ الْمُجْمِرِ قَالَ: رَأَيْتُ أَبَا هُرَيْرَةَ يَتَوَضَّأُ فَغَسَلَ وَجْهَهُ فَأَسْبَغَ الْوُضُوءَ، ثُمَّ غَسَلَ يَدَهُ الْيُمْنَى حَتَّى أَشْرَعَ فِي الْعَضُدِ، ثُمَّ يَدَهُ الْيُسْرَى حَتَّى أَشْرَعَ فِي الْعَضُدِ، ثُمَّ مَسَحَ رَأْسَهُ، ثُمَّ غَسَلَ رِجْلَهُ الْيُمْنَى حَتَّى أَشْرَعَ فِي السَّاقِ، ثُمَّ غَسَلَ رِجْلَهُ الْيُسْرَى حَتَّى أَشْرَعَ فِي السَّاقِ، ثُمَّ قَالَ: هَكَذَا رَأَيْتُ رَسُولَ اللَّهِ ﷺ يَتَوَضَّأُ وَقَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((أَنْتُمُ الْغُرُّ الْمُحَجَّلُونَ يَوْمَ الْقِيَامَةِ، مِنْ إِسْبَاغِ الْوُضُوءِ، فَمَنِ اسْتَطَاعَ مِنْكُمْ فَلْيُطِلْ غُرَّتَهُ وَتَحْجِيلَهُ)).

**[579]-34-(246)** ........ Nueym ibn Abdullah əl-Mucmir ﵀ demişdir: “Mən Əbu Hureyrənin dəstəmaz aldığını gördüm. O, üzünü yudu, dəstəmazı tam şəkildə yerinə yetirdi. Sonra sağ əlini çiyninə qədər yudu. Sonra sol əlini çiyninə qədər yudu. Sonra başına məsh çəkdi. Sonra sağ ayağını – baldırı da daxil olmaqla – yudu. Sonra sol ayağını – baldırı da daxil olmaqla – yudu. Sonra dedi: “Mən Peyğəmbərin ﷺ bu cür dəstəmaz aldığını gördüm. Peyğəmbər ﷺ (dəstəmaz aldıqdan sonra belə) buyurdu: “Dəstəmazı tam şəkildə yerinə yetirməyinizdən dolayı Qiyamət günü üzləriniz parlayacaq, əlləriniz və ayaq-

[1] 6-cı fəslin qeydlərinə bax.

larınız nur saçacaqdır. Sizlərdən kimin gücü çatırsa, qoy üzünün parlaqlığını, əllərinin və ayaqlarının nurunu artırsın!”[1]

**[٥٨٠] ٣٥**-(...) و حَدَّثَنِي هَارُونُ بْنُ سَعِيدٍ الأَيْلِيُّ: حَدَّثَنِي ابْنُ وَهْبٍ: أَخْبَرَنِي عَمْرُو بْنُ الْحَارِثِ عَنْ سَعِيدِ بْنِ أَبِي هِلاَلٍ، عَنْ نُعَيْمِ بْنِ عَبْدِ اللَّهِ: أَنَّهُ رَأَى أَبَا هُرَيْرَةَ يَتَوَضَّأُ، فَغَسَلَ وَجْهَهُ وَيَدَيْهِ حَتَّى كَادَ يَبْلُغُ الْمَنْكِبَيْنِ، ثُمَّ غَسَلَ رِجْلَيْهِ حَتَّى رَفَعَ إِلَى السَّاقَيْنِ، ثُمَّ قَالَ: سَمِعْتُ رَسُولَ ﷺ يَقُولُ: ((إِنَّ أُمَّتِي يَأْتُونَ يَوْمَ الْقِيَامَةِ غُرًّا مُحَجَّلِينَ مِنْ أَثَرِ الْوُضُوءِ، فَمَنِ اسْتَطَاعَ مِنْكُمْ أَنْ يُطِيلَ غُرَّتَهُ فَلْيَفْعَلْ)).

**[580]-35-(...)** ........ Nueym ibn Abdullah Əbu Hureyrənin dəstəmaz aldığını görmüş (və bunu belə vəsf etmişdir): “O, əvvəlcə üzünü, sonra da əllərini az qala çiyinlərinə qədər yudu. Sonra ayaqlarını baldırının yuxarı hissəsinə qədər yudu. Sonra dedi. Mən Peyğəmbərin ﷺ belə dediyini eşitdim: “Ümmətim Qiyamət günü dəstəmaz izindən dolayı üzləri parlaq, əlləri və ayaqları nurlu olduğu halda gələcəklər. Sizlərdən kim üzünün parlaqlığını uzada bilirsə, qoy uzatsın![2]”

**[٥٨١] ٣٦**-(٢٤٧) حَدَّثَنَا سُوَيْدُ بْنُ سَعِيدٍ وَابْنُ أَبِي عُمَرَ، جَمِيعًا عَنْ مَرْوَانَ الْفَزَارِيِّ، قَالَ ابْنُ أَبِي عُمَرَ: حَدَّثَنَا مَرْوَانُ، عَنْ أَبِي مَالِكٍ الأَشْجَعِيِّ سَعْدِ بْنِ طَارِقٍ، عَنْ أَبِي حَازِمٍ، عَنْ أَبِي هُرَيْرَةَ، أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: ((إِنَّ حَوْضِي أَبْعَدُ مِنْ أَيْلَةَ مِنْ عَدَنٍ، لَهُوَ أَشَدُّ بَيَاضًا مِنَ الثَّلْجِ، وَأَحْلَى مِنَ الْعَسَلِ بِاللَّبَنِ، وَلآنِيَتُهُ أَكْثَرُ مِنْ عَدَدِ النُّجُومِ، وَإِنِّي لأَصُدُّ النَّاسَ عَنْهُ كَمَا يَصُدُّ الرَّجُلُ إِبِلَ النَّاسِ عَنْ حَوْضِهِ)) قَالُوا: يَا رَسُولَ اللَّهِ! أَتَعْرِفُنَا يَوْمَئِذٍ؟ قَالَ: ((نَعَمْ، لَكُمْ سِيمَا لَيْسَتْ لأَحَدٍ مِنَ الأُمَمِ، تَرِدُونَ عَلَيَّ غُرًّا مُحَجَّلِينَ مِنْ أَثَرِ الْوُضُوءِ)).

**[581]-36-(247)** ........ Əbu Hureyrə ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Mənim hovuzumun (iki tərəfi arasındakı məsafə) Əylə[3] ilə Ədən[4] arasın-

---

[1] “Sizlərdən kimin gücü çatırsa, qoy üzünün parlaqlığını, əllərinin və ayaqlarının nurunu uzatsın!” ifadəsi Peyğəmbərin ﷺ yox, Əbu Hureyrənin ﵁ sözüdür. Buna ərəbcə "mudrəc" deyilir. Bu kəlmə ( مُدْرَجٌ ) ərəbcə «ədrəcə» ( أَدْرَجَ ) felinin məchul növündən əmələ gəlmiş feli sifətdir. Bir şeyi başqa bir şeyə idrac etmək, onlardan birini digərinə idxal etmək və tərkibinə aid etmək deməkdir (Mocəm əl-Vəsit, səh. 277).

İstilahi mənada isə bu o hədisdir ki, isnadının üslubu dəyişdirilmiş, ya da mətninə aid olmayan bir şeyi ondan ayrı olduğu göstərilmədən ona əlavə edilmişdir (Tədrib ər-Ravi, 1/239, Təysir əl-Mustələh əl-Hədis, səh: 103).

[2] “Sizlərdən kimin gücü çatırsa, qoy üzünün parlaqlığını, əllərinin və ayaqlarının nurunu artırsın!” ifadəsi əvvəlki kimi izah edilir.

[3] Əylə: Şam diyarında, dənizin sahilində yerləşən bir şəhərdir.

[4] Ədən: dəniz sahili ilə Yəmənin axırında Hindistana yaxın yerdə yerləşir.

dakı məsafədən daha uzaqdır. Onun suyu qardan ağ və südlə qatışdırılmış baldan daha şirindir. (Ətrafına düzülmüş) qədəhləri ulduzların sayından daha çoxdur. Bir adam insanların dəvələrini hovuzunun yanına buraxmadığı kimi, mən də (yad) adamları hovuzumun yanına buraxmayacağam". (Səhabələr) dedilər: "Ya Rəsulullah! O gün sən bizləri tanıyacaqsanmı?" Peyğəmbər ﷺ buyurdu: "Bəli! Sizin başqa ümmətlərdən heç birində olmayan bir əlamətiniz vardır. Siz mənim yanıma dəstəmaz izindən dolayı üzləriniz parlaq, əlləriniz və ayaqlarınız nurlu halda gələcəksiniz".

**[٥٨٢] ٣٧**-(...) و حَدَّثَنَا أَبُو كُرَيْبٍ وَوَاصِلُ بْنُ عَبْدِ الأَعْلَى – وَاللَّفْظُ لِوَاصِلٍ – قَالاَ: حَدَّثَنَا ابْنُ فُضَيْلٍ عَنْ أَبِي مَالِكٍ الأَشْجَعِيِّ، عَنْ أَبِي حَازِمٍ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((تَرِدُ عَلَيَّ أُمَّتِي الْحَوْضَ، وَأَنَا أَذُودُ النَّاسَ عَنْهُ كَمَا يَذُودُ الرَّجُلُ إِبِلَ الرَّجُلِ عَنْ إِبِلِهِ)) قَالُوا: يَا نَبِيَّ اللَّهِ! أَتَعْرِفُنَا؟ قَالَ: ((نَعَمْ، لَكُمْ سِيمَا لَيْسَتْ لأَحَدٍ غَيْرِكُمْ، تَرِدُونَ عَلَيَّ غُرًّا مُحَجَّلِينَ مِنْ آثَارِ الْوُضُوءِ، وَلَيُصَدَّنَّ عَنِّي طَائِفَةٌ مِنْكُمْ فَلاَ يَصِلُونَ. فَأَقُولُ: يَا رَبِّ! هَؤُلاَءِ مِنْ أَصْحَابِي، فَيُجِيبُنِي مَلَكٌ فَيَقُولُ: وَهَلْ تَدْرِي مَا أَحْدَثُوا بَعْدَكَ؟)).

**[582]-37-(...)** ........ Əbu Hureyrə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "(Qiyamət günü) ümmətim hovuzun başına, mənim yanıma gələcəklər. Bir adam başqa birisinin dəvələrini öz dəvələrinin yanına buraxmadığı kimi, mən də (yad) adamları hovuzumun yanına buraxmayacağam". (Səhabələr) dedilər: "Ey Allahın Peyğəmbəri! O gün sən bizləri tanıyacaqsanmı?" Peyğəmbər ﷺ buyurdu: "Bəli! Sizin başqa ümmətlərdən heç birində olmayan bir əlamətiniz vardır. Siz mənim yanıma dəstəmaz izindən dolayı üzləriniz parlaq, əlləriniz və ayaqlarınız nurlu halda gələcəksiniz. Fəqət aranızdan bir toplum mənim yanıma buraxılmayacaq (deyə gəlib mənə) qovuşa bilməyəcək. (O zaman) mən: "Ey Rəbbim! Bunlar mənim səhabələrimdəndirlər[1]"– deyəcəyəm. Mələklərdən biri mənə belə cavab verəcək: "Heç bilirsənmi onlar səndən sonra (dində) nə yeniliklər ediblər?!"

**[٥٨٣] ٣٨**-(٢٤٨) و حَدَّثَنَا عُثْمَانُ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا عَلِيُّ بْنُ مُسْهِرٍ عَنْ سَعْدِ بْنِ طَارِقٍ، عَنْ رِبْعِيِّ بْنِ حِرَاشٍ، عَنْ حُذَيْفَةَ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((إِنَّ حَوْضِي لأَبْعَدُ مِنْ أَيْلَةَ مِنْ عَدَنٍ، وَالَّذِي نَفْسِي

---

[1] Burada Peyğəmbərin vəfatından sonra mürtəd, kafir olanlar nəzərdə tutulur. Onlar üç qisim idilər: bir qismi cahiliyyət dövründəki etiqadlarına – bütpərəstliyə qayıtdılar, bir qismi peyğəmbərlik iddiasında olan Museyləməyə və Əsvəd əl-Ənəsiyə uydular, bir qismi də müsəlman olduqlarını iddia etdikləri halda, zəkat verməkdən boyun qaçırdılar və bunu inkar etdilər.

بِيَدِهِ! إِنِّي لأَذُودُ عَنْهُ الرِّجَالَ كَمَا يَذُودُ الرَّجُلُ الإِبِلَ الْغَرِيبَةَ عَنْ حَوْضِهِ)) قَالُوا: يَا رَسُولَ اللَّهِ! وَتَعْرِفُنَا؟ قَالَ: ((نَعَمْ، تَرِدُونَ عَلَيَّ غُرًّا مُحَجَّلِينَ مِنْ آثَارِ الْوُضُوءِ، لَيْسَتْ لأَحَدٍ غَيْرِكُمْ)).

**[583]-38-(248)** ........ Huzeyfə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Mənim hovuzumun (iki tərəfi arasındakı məsafə) Əylə ilə Ədən arasındakı məsafədən daha uzaqdır. Canım Əlində olan *Allaha* and olsun ki, bir adam özgə dəvələri hovuzunun yanına buraxmadığı kimi, mən də (yad) adamları hovuzumun yanına buraxmayacağam". (Səhabələr) dedilər: "Ya Rəsulullah! (O gün) sən bizləri tanıyacaqsanmı?" Peyğəmbər ﷺ buyurdu: "Bəli! Siz mənim yanıma, dəstəmaz izindən dolayı üzləriniz parlaq, əlləriniz və ayaqlarınız nurlu halda gələcəksiniz. (Bu əlamət isə) sizdən başqa heç kəsdə olmayacaq".

**[٥٨٤] ٣٩-(٢٤٩)** حَدَّثَنَا يَحْيَى بْنُ أَيُّوبَ وَسُرَيْجُ بْنُ يُونُسَ وَقُتَيْبَةُ بْنُ سَعِيدٍ وَعَلِيُّ بْنُ حُجْرٍ، جَمِيعًا عَنْ إِسْمَعِيلَ بْنِ جَعْفَرٍ، قَالَ ابْنُ أَيُّوبَ: حَدَّثَنَا إِسْمَعِيلُ: أَخْبَرَنِي الْعَلاَءُ عَنْ أَبِيهِ، عَنْ أَبِي هُرَيْرَةَ، أَنَّ رَسُولَ اللَّهِ ﷺ أَتَى الْمَقْبُرَةَ فَقَالَ: ((السَّلاَمُ عَلَيْكُمْ دَارَ قَوْمٍ مُؤْمِنِينَ، وَإِنَّا إِنْ شَاءَ اللَّهُ بِكُمْ لاَحِقُونَ، وَدِدْتُ أَنَّا قَدْ رَأَيْنَا إِخْوَانَنَا)) قَالُوا: أَوَلَسْنَا إِخْوَانَكَ يَا رَسُولَ اللَّهِ؟ قَالَ: ((أَنْتُمْ أَصْحَابِي، وَإِخْوَانُنَا الَّذِينَ لَمْ يَأْتُوا بَعْدُ)) فَقَالُوا كَيْفَ تَعْرِفُ مَنْ لَمْ يَأْتِ بَعْدُ مِنْ أُمَّتِكَ يَا رَسُولَ اللَّهِ؟ فَقَالَ: ((أَرَأَيْتَ لَوْ أَنَّ رَجُلاً لَهُ خَيْلٌ غُرٌّ مُحَجَّلَةٌ، بَيْنَ ظَهْرَيْ خَيْلٍ دُهْمٍ بُهْمٍ، أَلاَ يَعْرِفُ خَيْلَهُ؟)) قَالُوا: بَلَى، يَا رَسُولَ اللَّهِ، قَالَ: ((فَإِنَّهُمْ يَأْتُونَ غُرًّا مُحَجَّلِينَ مِنْ الْوُضُوءِ، وَأَنَا فَرَطُهُمْ عَلَى الْحَوْضِ، أَلاَ لَيُذَادَنَّ رِجَالٌ عَنْ حَوْضِي كَمَا يُذَادُ الْبَعِيرُ الضَّالُّ أُنَادِيهِمْ: أَلاَ هَلُمَّ، فَيُقَالُ: إِنَّهُمْ قَدْ بَدَّلُوا بَعْدَكَ، فَأَقُولُ: سُحْقًا سُحْقًا)).

**[584]-39-(249)** ........ Əbu Hureyrə ﷺ rəvayət edir ki, (bir dəfə) Peyğəmbər ﷺ qəbiristanlığa gəlib dedi: "Salam olsun sizlərə, ey (bu) diyarın mömin sakinləri! Allah istəsə biz də sizə qovuşacağıq. Qardaşlarımızı görməyimizə ümid edirəm!" (Səhabələr) soruşdular: "Biz sənin qardaşların deyilikmi, ya Rəsulullah?" (Peyğəmbər ﷺ) buyurdu: "Siz mənim səhabələrimsiniz. Qardaşlarımız isə hələ (dünyaya) gəlməmiş kimsələrdir"[1]. (Səhabələr) soruşdular: "Hələ (dünyaya) gəlməmiş kimsələrin sənin ümmətindən olduğunu necə tanıyacaqsan, ya Rəsulullah?" (Peyğəmbər ﷺ) buyurdu: "Bir deyin görək, əgər bir adamın alnında və ayaqlarında ağ ləkə olan atları olsa və bu atlar, rənginə başqa rəng qarışmamış qapqara atların arasında olarsa, o adam öz atını tanımazmı?" (Sə-

[1] Digər rəvayətdə Peyğəmbər ﷺ demişdir: "Qardaşlarım isə, məni görməyib mənə iman gətirən kimsələrdir" ("Silsilətul-Əhadis əs-Səhihə", 2888-ci hədis).

habələr): “Bəli, (tanıyar), ya Rəsulullah!”– deyə cavab verdilər. (Peyğəmbər ﷺ) buyurdu: “Heç şübhəsiz ki, onlar da (Qiyamət günü) dəstəmaz almaqdan dolayı üzləri parlaq, əlləri və ayaqları nurlu halda (məhşərə) gələcəklər. Hamıdan əvvəl hovuzun başına gələn kimsə mən olacağam. Biləsiniz! İtmiş dəvə qovulduğu kimi bir çox insanlar da mənim hovuzumun yanından qovulacaqlar. Mən: “Haydı, bura gəlin!”– deyə onları səsləyəcəyəm. (Cavabında) mənə: “Onlar səndən sonra (dində) dəyişikliklər etmişlər”– deyiləcək. Onda mən deyəcəyəm: “Allah (onları məndən) uzaq eləsin, uzaq!”

**[٥٨٥]** (...) حَدَّثَنَا قُتَيْبَةُ بْنُ سَعِيد: حَدَّثَنَا عَبْدُ الْعَزِيزِ يَعْنِي الدَّرَاوَرْدِيَّ؛ ح: و حَدَّثَنِي إِسْحَقُ بْنُ مُوسَى الأَنْصَارِيُّ: حَدَّثَنَا مَعْنٌ: حَدَّثَنَا مَالِكٌ جَمِيعًا عَنْ الْعَلاَءِ بْنِ عَبْدِ الرَّحْمَنِ عَنْ أَبِيه، عَنْ أَبِي هُرَيْرَةَ، أَنَّ رَسُولَ اللَّهِ ﷺ خَرَجَ إِلَى الْمَقْبُرَةِ فَقَالَ: ((السَّلاَمُ عَلَيْكُمْ دَارَ قَوْمٍ مُؤْمِنِينَ. وَإِنَّا، إِنْ شَاءَ اللَّهُ، بِكُمْ لاَحِقُونَ)) بِمِثْلِ حَدِيثِ إِسْمَعِيلَ بْنِ جَعْفَرٍ. غَيْرَ أَنَّ حَدِيثَ مَالِكٍ ((فَلَيُذَادَنَّ رِجَالٌ عَنْ حَوْضِي)).

**[585] (...)** ........ Əbu Hureyrə ﷺ rəvayət edir ki, (bir dəfə) Peyğəmbər ﷺ qəbiristanlığa gəlib dedi: “Salam olsun sizlərə, ey (bu) diyarın mömin sakinləri! Allah istəsə, biz də sizə qovuşacağıq...”

(Bu hədis də) bundan əvvəlki İsmail ibn Cəfərin hədisi kimidir. Lakin Malikin rəvayət etdiyi hədisdə deyilir: “Bir çox adamlar mənim hovuzumun yanından qovulacaqlar...”

## (١٣) – بَابُ تَبْلُغُ الْحِلْيَةُ حَيْثُ يَبْلُغُ الْوَضُوءُ

## **13-cü fəsil.** (Möminin) **zinətinin**[1] **dəstəmaz suyunun dəydiyi yerlərə çatması**

**[٥٨٦] ٤٠–(٢٥٠)** حَدَّثَنَا قُتَيْبَةُ بْنُ سَعِيد: حَدَّثَنَا خَلَفٌ يَعْنِي ابْنَ خَلِيفَةَ عَنْ أَبِي مَالِك الأَشْجَعِيِّ، عَنْ أَبِي حَازِمٍ قَالَ: كُنْتُ خَلْفَ أَبِي هُرَيْرَةَ وَهُوَ يَتَوَضَّأُ لِلصَّلاَة، فَكَانَ يَمُدُّ يَدَهُ حَتَّى تَبْلُغَ إِبْطَهُ، فَقُلْتُ لَهُ: يَا أَبَا هُرَيْرَةَ! مَا هَذَا الْوُضُوءُ؟ فَقَالَ: يَا بَنِي فَرُّوخَ! أَنْتُمْ هَاهُنَا؟ لَوْ عَلِمْتُ أَنَّكُمْ هَاهُنَا مَا تَوَضَّأْتُ هَذَا الْوُضُوءَ. سَمِعْتُ خَلِيلِي ﷺ يَقُولُ: ((تَبْلُغُ الْحِلْيَةُ مِنْ الْمُؤْمِنِ حَيْثُ يَبْلُغُ الْوَضُوءُ)).

---

[1] Burada zinət deyildikdə Qiyamət günü mömin kişi və mömin qadınların taxacağı qızıl, gümüş və mirvari bilərziklər, geyəcəyi ipək libaslar nəzərdə tutulur. Uca Allah buyurur: **“Onlar Cənnətdə qızıl bilərziklərlə və incilərlə bəzədiləcək, libasları da ipəkdən olacaqdır”.** (“Fatir” surəsi, 33). Onlar bu zinətlərlə bəzəndikdən sonra daha gözəl görünəcəklər (İbn Useymin “Şərh Riyad əs-Salihin”, 1/1177)

**[586]-40-(250)** ........ Əbu Hazim demişdir: “(Bir dəfə) Əbu Hureyrə dəstəmaz alarkən mən onun arxasında durmuşdum. O, əlini ta qoltuğunun altına qədər yuyurdu. Mən ondan: “Ey Əbu Hureyrə! Bu nə cür dəstəmaz almaqdır?”– deyə soruşdum. O dedi: “Ey Fərrux oğulları! Siz buradasınızmı?! Əgər mən sizin burada olduğunuzu bilsəydim, bu cür dəstəmaz almazdım. Doğrusu, mən sevimli dostum (Peyğəmbərin) ﷺ belə dediyini eşitmişəm: “Möminin zinəti, dəstəmaz suyunun dəydiyi yerlərə çatacaq”.

## (١٤) – بَابُ فَضْلِ إِسْبَاغِ الْوُضُوءِ عَلَى الْمَكَارِهِ

## 14-cü fəsil. Dəstəmazı kamil şəkildə almağa əngəl törədən bütün çətinliklərə baxmayaraq, kamil şəkildə dəstəmaz almağın fəziləti

**[٥٨٧]** ٤١–(٢٥١) حَدَّثَنَا يَحْيَى بْنُ أَيُّوبَ وَقُتَيْبَةُ وَابْنُ حُجْرٍ، جَمِيعًا عَنْ إِسْمَعِيلَ بْنِ جَعْفَرٍ، قَالَ ابْنُ أَيُّوبَ: حَدَّثَنَا إِسْمَعِيلُ: أَخْبَرَنِي الْعَلاَءُ عَنْ أَبِيهِ، عَنْ أَبِي هُرَيْرَةَ، أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: ((أَلاَ أَدُلُّكُمْ عَلَى مَا يَمْحُو اللَّهُ بِهِ الْخَطَايَا وَيَرْفَعُ بِهِ الدَّرَجَاتِ؟)) قَالُوا: بَلَى، يَا رَسُولَ اللَّهِ! قَالَ: ((إِسْبَاغُ الْوُضُوءِ عَلَى الْمَكَارِهِ، وَكَثْرَةُ الْخُطَا إِلَى الْمَسَاجِدِ، وَانْتِظَارُ الصَّلاَةِ بَعْدَ الصَّلاَةِ، فَذَلِكُمْ الرِّبَاطُ)).

**[587]-41-(251)** ........ Əbu Hureyrə ﷺ rəvayət edir ki, (bir dəfə) Peyğəmbər ﷺ (səhabələrinə) buyurdu: “Allahın, sayəsində günahları silib dərəcələri artıracağı şeyi sizə öyrədimmi?” Onlar: “Bəli, ya Rəsulullah!”– deyə cavab verdilər. Peyğəmbər ﷺ buyurdu: “Çətinliklərə rəğmən dəstəmazı kamil şəkildə almaq, məscidlərə getdikdə addımları çoxaltmaq[1] və namazdan sonra (növbəti) namazı gözləməkdir. Bunlar keşiyində durmağa layiq işlərdir”[2].

**[٥٨٨]** (...) حَدَّثَنِي إِسْحَقُ بْنُ مُوسَى الأَنْصَارِيُّ: حَدَّثَنَا مَعْنٌ: حَدَّثَنَا مَالِكٌ؛ ح: و حَدَّثَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى: حَدَّثَنَا مُحَمَّدُ بْنُ جَعْفَرٍ: حَدَّثَنَا شُعْبَةُ، جَمِيعًا عَنِ الْعَلاَءِ بْنِ عَبْدِ الرَّحْمَنِ بِهَذَا الإِسْنَادِ. وَلَيْسَ فِي حَدِيثِ شُعْبَةَ ذِكْرُ الرِّبَاطِ، وَفِي حَدِيثِ مَالِكٍ ثِنْتَيْنِ ((فَذَلِكُمْ الرِّبَاطُ، فَذَلِكُمْ الرِّبَاطُ)).

---

[1] Burada uzaq məsafədən məscidə gəlmək nəzərdə tutulur.

[2] Hədisdə “keşiyində durmağa layiq işlər” deyildikdə üş şeydən biri qəsd edilir:
– ya həqiqətən də, sərhədin keşiyində durmaq qəsd edilir. Yəni sərhədin keşiyində duran adam düşməni gözətlədiyi kimi, abid adam da Allah üçün etdiyi ibadətləri qoruyur;
– ya Allah üçün olan xeyirxah işlərin keşiyində durmaq qəsd edilir;
– ya da keşik çəkmək deyildikdə nəfslə mübarizə aparmaq nəzərdə tutulur.

**[588] (...)** ........ Malik və Şobə – hər ikisi (bu hədisi) Əla ibn Abdur-Rəhmandan bu isnadla rəvayət etmişdir. Şobənin hədisində: “keşiyində durmağa layiq işlər” sözü zikr edilməmişdir. Malikin hədisində isə iki kərə: “Bunlar, keşiyində durmağa layiq işlərdir, bunlar, keşiyində durmağa layiq işlərdir”– deyilir.

## (١٥) – بَابُ السِّوَاكِ

## 15-ci fəsil. Misvak[1]

**[٥٨٩] ٤٢–(٢٥٢)** حَدَّثَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ وَعَمْرٌو النَّاقِدُ وَزُهَيْرُ بْنُ حَرْبٍ قَالُوا: حَدَّثَنَا سُفْيَانُ عَنْ أَبِي الزِّنَادِ، عَنْ الأَعْرَجِ، عَنْ أَبِي هُرَيْرَةَ عَنْ النَّبِيِّ ﷺ قَالَ: ((لَوْلاَ أَنْ أَشُقَّ عَلَى الْمُؤْمِنِينَ – وَفِي حَدِيثِ زُهَيْرٍ، عَلَى أُمَّتِي – لأَمَرْتُهُمْ بِالسِّوَاكِ عِنْدَ كُلِّ صَلاَةٍ)).

**[589]-42-(252)** ........ Əbu Hureyrə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Əgər möminlərə, (Zuheyrin rəvayətində: ümmətimə) əziyyət vermiş olmasaydım, onlara hər namazdan əvvəl (dişlərini) misvakla təmizləməyi əmr edərdim”.

**[٥٩٠] ٤٣–(٢٥٣)** حَدَّثَنَا أَبُو كُرَيْبٍ مُحَمَّدُ بْنُ الْعَلاَءِ: حَدَّثَنَا ابْنُ بِشْرٍ عَنْ مِسْعَرٍ عَنْ الْمِقْدَامِ بْنِ شُرَيْحٍ، عَنْ أَبِيهِ قَالَ: سَأَلْتُ عَائِشَةَ، قُلْتُ: بِأَيِّ شَيْءٍ كَانَ يَبْدَأُ النَّبِيُّ ﷺ إِذَا دَخَلَ بَيْتَهُ؟ قَالَتْ: بِالسِّوَاكِ.

**[590]-43-(253)** ........ Şureyh demişdir: “Mən Aişədən soruşdum: “Peyğəmbər ﷺ evinə girdiyi zaman ilk əvvəl nə edərdi?” Dedi: “Misvakla dişlərini təmizləyərdi”.

**[٥٩١] ٤٤–(...)** و حَدَّثَنِي أَبُو بَكْرِ بْنُ نَافِعٍ الْعَبْدِيُّ: حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ، عَنْ سُفْيَانَ، عَنْ الْمِقْدَامِ بْنِ شُرَيْحٍ، عَنْ أَبِيهِ، عَنْ عَائِشَةَ أَنَّ النَّبِيَّ ﷺ كَانَ إِذَا دَخَلَ بَيْتَهُ بَدَأَ بِالسِّوَاكِ.

**[591]-44-(...)** ........ Aişə demişdir: “Peyğəmbər ﷺ evə daxil olduqda ilk əvvəl misvakla dişlərini təmizləyərdi”.

**[٥٩٢] ٤٥–(٢٥٤)** حَدَّثَنَا يَحْيَى بْنُ حَبِيبٍ الْحَارِثِيُّ: حَدَّثَنَا حَمَّادُ بْنُ زَيْدٍ عَنْ غَيْلاَنَ وَهُوَ ابْنُ جَرِيرٍ الْمَعْوَلِيُّ عَنْ أَبِي بُرْدَةَ، عَنْ أَبِي مُوسَى قَالَ: دَخَلْتُ عَلَى النَّبِيِّ ﷺ وَطَرَفُ السِّوَاكِ عَلَى لِسَانِهِ.

**[592]-45-(254)** ........ Əbu Musa ﷺ demişdir: “Mən Peyğəmbərin ﷺ yanına daxil olduqda (gördüm ki,) misvakın bir tərəfi onun dilinin üstündədir”.

[1] Misvak – ərak ağacından dişləri təmizləmək üçün düzəldilmiş təbii fırça.

**[٥٩٣] ٤٦-(٢٥٥)** حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا هُشَيْمٌ عَنْ حُصَيْنٍ، عَنْ أَبِي وَائِلٍ، عَنْ حُذَيْفَةَ قَالَ: كَانَ رَسُولُ اللَّهِ ﷺ إِذَا قَامَ لِيَتَهَجَّدَ، يَشُوصُ فَاهُ بِالسِّوَاكِ.

**[593]-46-(255)** ........ Huzeyfə ؓ demişdir: "Peyğəmbər ﷺ gecə namazını qılmaq üçün (yatağından) qalxdığı zaman ağzını misvakla təmizləyərdi".

**[٥٩٤]** (...) حَدَّثَنَا إِسْحَقُ بْنُ إِبْرَاهِيمَ: أَخْبَرَنَا جَرِيرٌ عَنْ مَنْصُورٍ؛ **ح**: و حَدَّثَنَا ابْنُ نُمَيْرٍ: حَدَّثَنَا أَبِي وَأَبُو مُعَاوِيَةَ عَنْ الأَعْمَشِ، كِلاَهُمَا عَنْ أَبِي وَائِلٍ، عَنْ حُذَيْفَةَ قَالَ: كَانَ رَسُولُ اللَّهِ ﷺ إِذَا قَامَ مِنْ اللَّيْلِ. بِمِثْلِهِ وَلَمْ يَقُولُوا لِيَتَهَجَّدَ.

**[594] (...)** ........ (Digər rəvayətdə) Huzeyfə ؓ: "Peyğəmbər ﷺ gecə yuxudan qalxdığı zaman..."– deyərək (bu hədisi) eynilə rəvayət etmiş, lakin: "gecə namazı qılmaq üçün" sözünü zikr etməmişdir.

**[٥٩٥] ٤٧-(...)** حَدَّثَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى وَابْنُ بَشَّارٍ قَالاَ: حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ: حَدَّثَنَا سُفْيَانُ، عَنْ مَنْصُورٍ، وَحُصَيْنٌ وَالأَعْمَشُ عَنْ أَبِي وَائِلٍ، عَنْ حُذَيْفَةَ: أَنَّ رَسُولَ اللَّهِ ﷺ كَانَ إِذَا قَامَ مِنَ اللَّيْلِ يَشُوصُ فَاهُ بِالسِّوَاكِ.

**[595]-47-(...)** ........ Huzeyfə ؓ demişdir: "Peyğəmbər ﷺ gecə yuxudan qalxdığı zaman ağzını misvakla təmizləyərdi[1]".

**[٥٩٦] ٤٨-(٢٥٦)** حَدَّثَنَا عَبْدُ بْنُ حُمَيْدٍ: حَدَّثَنَا أَبُو نُعَيْمٍ: حَدَّثَنَا إِسْمَعِيلُ بْنُ مُسْلِمٍ: حَدَّثَنَا أَبُو الْمُتَوَكِّلِ أَنَّ ابْنَ عَبَّاسٍ حَدَّثَهُ، أَنَّهُ بَاتَ عِنْدَ النَّبِيِّ ﷺ ذَاتَ لَيْلَةٍ، فَقَامَ نَبِيُّ اللَّهِ ﷺ مِنْ آخِرِ اللَّيْلِ، فَخَرَجَ فَنَظَرَ فِي السَّمَاءِ، ثُمَّ تَلاَ هَذِهِ الآيَةَ فِي آلِ عِمْرَانَ:

﴿ إِنَّ فِي خَلْقِ ٱلسَّمَٰوَٰتِ وَٱلْأَرْضِ وَٱخْتِلَٰفِ ٱلَّيْلِ وَٱلنَّهَارِ ﴾ حَتَّى بَلَغَ ﴿فَقِنَا عَذَابَ ٱلنَّارِ﴾

ثُمَّ رَجَعَ إِلَى الْبَيْتِ فَتَسَوَّكَ وَتَوَضَّأَ، ثُمَّ قَامَ فَصَلَّى، ثُمَّ اضْطَجَعَ، ثُمَّ قَامَ فَخَرَجَ فَنَظَرَ إِلَى السَّمَاءِ فَتَلاَ هَذِهِ الآيَةَ، ثُمَّ رَجَعَ فَتَسَوَّكَ فَتَوَضَّأَ، ثُمَّ قَامَ فَصَلَّى.

---

[1] Yuxarıdakı hədislər misvakdan tez-tez istifadə etməyin müstəhəb olmasına dəlalət edir. İstənilən vaxt misvakdan istfadə etmək bəyənilən əməllərdəndir. Lakin beş vaxt vardır ki, bu vaxtlarda ondan istifadə etmək daha yaxşıdır:

a) Dəstəmaz əsnasında;

b) Namaza başladıqda;

c) Quran oxunacağı zaman;

d) Yuxudan oyandıqda;

e) Ağız qoxusu dəyişdikdə;

**[596]-48-(256)** ........ Rəvayət edilir ki, İbn Abbas ﵄ bir gecə Peyğəmbərin ﷺ yanında qalmış (və gördüklərini) belə rəvayət etmişdir: "Peyğəmbər ﷺ gecənin axırında qalxıb bayıra çıxdı və səmaya baxdı, sonra da "Ali-İmran" surəsinin bu ayələrini oxudu: **"Həqiqətən də, göylərin və yerin yaradılmasında, gecə ilə gündüzün bir-birini əvəz etməsində ağıllı adamlar üçün dəlillər vardır. O kəslər ki, ayaq üstə olanda da, oturanda da, uzananda da Allahı yad edir, göylərin və yerin yaradılması haqqında düşünür** ***və deyirlər:*** **"Ey Rəbbimiz! Sən bunları əbəs yerə xəlq etməmisən. Sən pak və müqəddəssən. Bizi Cəhənnəm əzabından qoru!"[1]**

Sonra evə qayıtdı, misvakdan istifadə etdi və dəstəmaz aldı. Sonra qalxıb namaz qıldı. Sonra da (uzanıb) yatdı. (Bir müddətdən) sonra qalxıb yenə eşiyə çıxdı və səmaya baxdı. Bir daha bu ayələri oxudu. Sonra qayıdıb misvaklandı və dəstəmaz aldı. Sonra qalxıb namaz qıldı".

## (١٦) – بَابُ خِصَالِ الْفِطْرَةِ

## 16-cı fəsil. Fitrət[2] xislətləri

**[٥٩٧] ٤٩–(٢٥٧)** حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ وَعَمْرٌو النَّاقِدُ وَزُهَيْرُ بْنُ حَرْبٍ، جَمِيعًا، عَنْ سُفْيَانَ، قَالَ أَبُو بَكْرٍ: حَدَّثَنَا ابْنُ عُيَيْنَةَ عَنِ الزُّهْرِيِّ، عَنْ سَعِيدِ بْنِ الْمُسَيَّبِ، عَنْ أَبِي هُرَيْرَةَ عَنِ النَّبِيِّ ﷺ قَالَ: ((الْفِطْرَةُ خَمْسٌ – أَوْ خَمْسٌ مِنْ الْفِطْرَةِ – الْخِتَانُ، وَالاِسْتِحْدَادُ، وَتَقْلِيمُ الأَظْفَارِ، وَنَتْفُ الإِبِطِ، وَقَصُّ الشَّارِبِ)).

**[597]-49-(257)** ........ Əbu Hureyrə ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Fitrət beşdir (yaxud beş şey fitrətdəndir[3]): sünnət etmək[4], qasığı qırxmaq, dırnaqları kəsmək, qoltuqaltı tükləri qopartmaq və bığları qısaltmaq".

---

[1] "Ali-İmran" surəsi, 190-191.

[2] Alimlərin çoxu "fitrət sünnəyə aiddir" demişlər. Odur ki, bütün bunlar peyğəmbərlərin sünnəsi deməkdir. Qeyd etmək lazımdır ki, fitrət din mənasında da işlənir. Lüğətdə isə yaradılış, xilqət, xasiyyət deməkdir.

[3] Burada "beş şey" deyildikdə yalnız bu beş şeyin fitrətdən olduğu qəsd edilmir. Belə ki, sonrakı hədislərdə on şeyin fitrətdən olduğu rəvayət edilir. Bu da fitrətdən olan əməllərin daha çox olduğunu göstərir.

[4] Müsəlmanlarda və yəhudilərdə yetkinlik yaşına çatmamış oğlan uşaqlarının kişilik əzasının dəri hissəsinin kəsilməsindən ibarət əməliyyat.

**[٥٩٨] ٥٠**–(...) حَدَّثَنِي أَبُو الطَّاهِرِ وَحَرْمَلَةُ بْنُ يَحْيَى قَالاَ: أَخْبَرَنَا ابْنُ وَهْبٍ: أَخْبَرَنِي يُونُسُ عَنْ ابْنِ شِهَابٍ، عَنْ سَعِيدِ بْنِ الْمُسَيَّبِ عَنْ أَبِي هُرَيْرَةَ عَنْ رَسُولِ اللَّهِ ﷺ أَنَّهُ قَالَ: ((الْفِطْرَةُ خَمْسٌ: الاِخْتِتَانُ، وَالاِسْتِحْدَادُ، وَقَصُّ الشَّارِبِ، وَتَقْلِيمُ الأَظْفَارِ، وَنَتْفُ الإِبِطِ)).

**[598]-50-(...)** ........ Əbu Hureyrə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Fitrət beşdir: sünnət etmək, qasığı qırxmaq, bığları qısaltmaq, dırnaqları kəsmək və qoltuqaltı tükləri qopartmaq".

**[٥٩٩] ٥١**–(٢٥٨) حَدَّثَنَا يَحْيَى بْنُ يَحْيَى وَقُتَيْبَةُ بْنُ سَعِيدٍ، كِلاَهُمَا عَنْ جَعْفَرٍ، قَالَ يَحْيَى: أَخْبَرَنَا جَعْفَرُ بْنُ سُلَيْمَانَ، عَنْ أَبِي عِمْرَانَ الْجَوْنِيِّ، عَنْ أَنَسِ بْنِ مَالِكٍ قَالَ: قَالَ أَنَسٌ: وُقِّتَ لَنَا فِي قَصِّ الشَّارِبِ، وَتَقْلِيمِ الأَظْفَارِ، وَنَتْفِ الإِبِطِ، وَحَلْقِ الْعَانَةِ، أَنْ لاَ نَتْرُكَ أَكْثَرَ مِنْ أَرْبَعِينَ لَيْلَةً.

**[599]-51-(258)** ........ Ənəs ibn Malik ﷺ demişdir: "Bığları qısaltmaq, dırnaqları kəsmək, qoltuqaltı tükləri qopartmaq və qasığı qırxmaq xüsusunda, qırx gündən o yana saxlamamaq bizim üçün təyin edilmişdir[1]".

**[٦٠٠] ٥٢**–(٢٥٩) حَدَّثَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى: حَدَّثَنَا يَحْيَى يَعْنِي ابْنَ سَعِيدٍ؛ ح: و حَدَّثَنَا ابْنُ نُمَيْرٍ: حَدَّثَنَا أَبِي، جَمِيعًا عَنْ عُبَيْدِ اللَّهِ، عَنْ نَافِعٍ، عَنْ ابْنِ عُمَرَ عَنْ النَّبِيِّ ﷺ قَالَ: ((أَحْفُوا الشَّوَارِبَ وَأَعْفُوا اللِّحَى)).

**[600]-52-(259)** ........ İbn Ömər رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Bığları qısaldın və saqqal buraxın!"

**[٦٠١] ٥٣**–(...) و حَدَّثَنَاه قُتَيْبَةُ بْنُ سَعِيدٍ عَنْ مَالِكِ بْنِ أَنَسٍ، عَنْ أَبِي بَكْرِ بْنِ نَافِعٍ، عَنْ أَبِيهِ، عَنْ ابْنِ عُمَرَ عَنْ النَّبِيِّ ﷺ أَنَّهُ أَمَرَ بِإِحْفَاءِ الشَّوَارِبِ وَإِعْفَاءِ اللِّحْيَةِ.

**[601]-53-(...)** ........ İbn Ömər رضي الله عنهما rəvayət etmişdir ki, Peyğəmbər ﷺ (səhabələrinə) bığları qısaltmağı və saqqal buraxmağı əmr etmişdir!"

**[٦٠٢] ٥٤**–(...) حَدَّثَنَا سَهْلُ بْنُ عُثْمَانَ: حَدَّثَنَا يَزِيدُ بْنُ زُرَيْعٍ، عَنْ عُمَرَ بْنِ مُحَمَّدٍ: حَدَّثَنَا نَافِعٌ، عَنْ ابْنِ عُمَرَ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((خَالِفُوا الْمُشْرِكِينَ، أَحْفُوا الشَّوَارِبَ وَأَوْفُوا اللِّحَى)).

**[602]-54-(...)** ........ İbn Ömər رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ buyurmuşdur: "Müşriklərə müxalif olun – bığları qısaldın və saqqal buraxın!"

---

[1] Bığları, dırnaqları, qoltuqaltı, habelə qasıqda bitən tükləri qırx gündən artıq saxlamaq Peyğəmbərin ﷺ sünnəsinə ziddir.

**[٦٠٣] ٥٥**–(**٢٦٠**) حَدَّثَنِي أَبُو بَكْرِ بْنُ إِسْحَقَ: أَخْبَرَنَا ابْنُ أَبِي مَرْيَمَ: أَخْبَرَنَا مُحَمَّدُ بْنُ جَعْفَرٍ: أَخْبَرَنِي الْعَلاَءُ بْنُ عَبْدِ الرَّحْمَنِ بْنِ يَعْقُوبَ مَوْلَى الْحُرَقَةِ، عَنْ أَبِيهِ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((جُزُّوا الشَّوَارِبَ وَأَرْخُوا اللِّحَى، خَالِفُوا الْمَجُوسَ)).

**[603]-55-(260)** ........ Əbu Hureyrə rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Bığları qısaldın və saqqal buraxın, (beləliklə də,) məcusilərə[1] müxalif olun!"

**[٦٠٤] ٥٦**–(**٢٦١**) حَدَّثَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ وَأَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ وَزُهَيْرُ بْنُ حَرْبٍ، قَالُوا: حَدَّثَنَا وَكِيعٌ، عَنْ زَكَرِيَّاءَ بْنِ أَبِي زَائِدَةَ، عَنْ مُصْعَبِ بْنِ شَيْبَةَ، عَنْ طَلْقِ بْنِ حَبِيبٍ، عَنْ عَبْدِ اللَّهِ بْنِ الزُّبَيْرِ، عَنْ عَائِشَةَ قَالَتْ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((عَشْرٌ مِنَ الْفِطْرَةِ: قَصُّ الشَّارِبِ، وَإِعْفَاءُ اللِّحْيَةِ، وَالسِّوَاكُ، وَاسْتِنْشَاقُ الْمَاءِ، وَقَصُّ الأَظْفَارِ، وَغَسْلُ الْبَرَاجِمِ، وَنَتْفُ الإِبطِ، وَحَلْقُ الْعَانَةِ، وَانْتِقَاصُ الْمَاءِ)).

قَالَ زَكَرِيَّاءُ: قَالَ مُصْعَبٌ: وَنَسِيتُ الْعَاشِرَةَ، إِلاَّ أَنْ تَكُونَ الْمَضْمَضَةَ.

زَادَ قُتَيْبَةُ: قَالَ وَكِيعٌ: انْتِقَاصُ الْمَاءِ يَعْنِي الاِسْتِنْجَاءَ.

**[604]-56-(261)** ........ Aişə ﵂ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "On şey fitrətdəndir: bığları qısaltmaq, saqqal buraxmaq, misvaklanmaq, buruna su çəkib (içini təmizləmək), dırnaqları kəsmək, barmaq buğumlarını yumaq, qoltuqaltı tükləri qopartmaq, qasığı qırxmaq və (ayaqyolunda) su ilə yuyunmaq".

Zəkəriyya dedi: "Musab demişdir: "Onuncusunu unutmuşam. Yəqin ki, bu, ağızı yaxalamaqdır".

Quteybə bunu əlavə etmişdir: "Vəkiy demişdir: "Su ilə yuyunmaq deyildikdə ayaqyoluna çıxdıqda ön və arxa ifrazat çıxışlarını su ilə yumaq nəzərdə tutulur".

**[٦٠٥]** (...) و حَدَّثَنَاه أَبُو كُرَيْبٍ: أَخْبَرَنَا ابْنُ أَبِي زَائِدَةَ عَنْ أَبِيهِ، عَنْ مُصْعَبِ بْنِ شَيْبَةَ فِي هَذَا الإِسْنَادِ، مِثْلَهُ، غَيْرَ أَنَّهُ قَالَ: قَالَ أَبُوهُ: وَنَسِيتُ الْعَاشِرَةَ.

**[605] (...)** ........ İbn Əbu Zaidə atasından, o da Musab ibn Şeybədən bu isnadla bu hədisin bənzərini rəvayət etmişdir. Ancaq o demişdir ki: "Atam: "Onuncusunu unutmuşam"– demişdir".

---

[1] Burada məcusi deyildikdə zərdüşt "dininə" mənsub olan atəşpərəstlər nəzərdə tutulur. Bir ehtimala görə Zərdüşt e.ə. 6-7 minilliklərdə yaşayıb və Qədim İran şahı I Daranın müasiri idi. Əfsanələrə görə Zərdüşt, ildırımdan ölən I Daranın atası ilə eyniləşdirilən Baktriya çarı Viştaspunu yeni dinə döndərib. Zərdüştün real şəxs olmasına heç bir sübut yoxdur (Z. Bünyadov, "Dinlər, Təriqətlər, Məzhəblər", səh. 320).

## (١٧) – بَابُ الاسْتِطَابَةِ

## 17-ci fəsil. Ayaqyolunda təmizlənmə

**[٦٠٦] ٥٧-(٢٦٢)** حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا أَبُو مُعَاوِيَةَ وَوَكِيعٌ عَنْ الأَعْمَشِ؛ ح: و حَدَّثَنَا يَحْيَى بْنُ يَحْيَى – وَاللَّفْظُ لَهُ: أَخْبَرَنَا أَبُو مُعَاوِيَةَ عَنْ الأَعْمَشِ، عَنْ إِبْرَاهِيمَ عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ يَزِيدَ، عَنْ سَلْمَانَ قَالَ: قِيلَ لَهُ: قَدْ عَلَّمَكُمْ نَبِيُّكُمْ ﷺ كُلَّ شَيْءٍ حَتَّى الْخِرَاءَةَ. قَالَ، فَقَالَ: أَجَلْ، لَقَدْ نَهَانَا أَنْ نَسْتَقْبِلَ الْقِبْلَةَ لِغَائِطٍ أَوْ بَوْلٍ، أَوْ أَنْ نَسْتَنْجِيَ بِالْيَمِينِ، أَوْ أَنْ نَسْتَنْجِيَ بِأَقَلَّ مِنْ ثَلاَثَةِ أَحْجَارٍ، أَوْ أَنْ نَسْتَنْجِيَ بِرَجِيعٍ أَوْ بِعَظْمٍ.

**[606]-57-(262)** ........ Rəvayət edilir ki, (bir dəfə) Salman (əl-Farisiyə) ﷺ dedilər: "Peyğəmbəriniz ﷺ sizə hər şeyi, hətta ayaqyolunda oturmağın qaydasını belə öyrətmişdir". Salman dedi: "Bəli, Peyğəmbər ﷺ bizlərə, təbii ehtiyacı rəf edərkən qibləyə[1] yönəlməyi, sağ əllə və üçdən az sayda daşla təmizlənməyi, habelə təzək və ya sümüklə təmizlənməyi qadağan etmişdir".

**[٦٠٧]** (...) حَدَّثَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى: حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ: حَدَّثَنَا سُفْيَانُ عَنْ الأَعْمَشِ وَمَنْصُورٍ، عَنْ إِبْرَاهِيمَ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ يَزِيدَ، عَنْ سَلْمَانَ قَالَ: قَالَ لَنَا الْمُشْرِكُونَ: إِنِّي أَرَى صَاحِبَكُمْ يُعَلِّمُكُمْ، حَتَّى يُعَلِّمَكُمْ الْخِرَاءَةَ. فَقَالَ: أَجَلْ، إِنَّهُ نَهَانَا أَنْ يَسْتَنْجِيَ أَحَدُنَا بِيَمِينِهِ، أَوْ يَسْتَقْبِلَ الْقِبْلَةَ، وَنَهَى عَنْ الرَّوْثِ وَالْعِظَامِ، وَقَالَ: ((لاَ يَسْتَنْجِي أَحَدُكُمْ بِدُونِ ثَلاَثَةِ أَحْجَارٍ)).

**[607] (...)** ........ Salman ﷺ demişdir: "Müşriklər bizə: "Görürük, dostunuz[2] sizə hər şeyi öyrətmişdir. Hətta ayaqyolunda nə cür oturmağı belə öyrətmişdir"– dedilər. Salman cavabında (onlara) belə dedi: "Bəli, o, birimizin (ayaqyolunda) sağ əllə təmizlənməsini, habelə qibləyə yönəlməsini bizə qadağan etmişdir. Həm-

---

[1] Namaz qılınarkən və bir sıra digər ibadət ayinlərinin icra edildiyi vaxtlarda müsəlmanların üzlərini çevirdikləri, Məkkə şəhərindəki Məscidul-Həramda yerləşən Kəbəyə olan istiqamət. İslamın yayıldığı ilk dönəmdə qiblə Beytul-Məqdis idi. Bəra ibn Azib ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ on altı və ya on yeddi ay Beytul-Məqdisə tərəf namaz qıldı. Lakin Peyğəmbər ﷺ çox istəyirdi ki, qiblə Kəbəyə tərəf olsun və Allah (bu xüsusda) ayə nazil etdi: **"Biz sənin üzünün göyə tərəf çevrildiyini gördük və Biz səni razı qalacağın qibləyə tərəf döndərəcəyik. Sən üzünü Məscidul-Hərama tərəf çevir! Harada olursunuzsa olun, üzünüzü ona tərəf çevirin!.."** ("əl-Bəqərə" surəsi, 144) Bundan sonra Peyğəmbər ﷺ Kəbəyə tərəf üz tutdu. ("Səhih əl-Buxari", 399).

[2] Müşriklər Peyğəmbəri ﷺ nəzərdə tuturdular.

çinin təzək və sümüklə (təmizlənməyi) də qadağan etmişdir. Və (bizə): “Biriniz (su başına çıxdıqda) üçdən az daşla təmizlənməsin”– deyə buyurmuşdur.

**[٦٠٨] ٥٨–(٢٦٣)** حَدَّثَنَا زُهَيْرُ بْنُ حَرْبٍ: حَدَّثَنَا رَوْحُ بْنُ عُبَادَةَ: حَدَّثَنَا زَكَرِيَّاءُ بْنُ إِسْحَقَ: حَدَّثَنَا أَبُو الزُّبَيْرِ، أَنَّهُ سَمِعَ جَابِرًا يَقُولُ: نَهَى رَسُولُ اللَّهِ ﷺ أَنْ يُتَمَسَّحَ بِعَظْمٍ أَوْ بِبَعْرٍ.

**[608]-58-(263)** ........ Cabir (ibn Abdullah) ﵁ demişdir: “Peyğəmbər ﷺ sümük və ya təzəklə silinməyi qadağan etmişdir”.

**[٦٠٩] ٥٩–(٢٦٤)** و حَدَّثَنَا زُهَيْرُ بْنُ حَرْبٍ وَابْنُ نُمَيْرٍ قَالاَ: حَدَّثَنَا سُفْيَانُ بْنُ عُيَيْنَةَ؛ ح: و حَدَّثَنَا يَحْيَى بْنُ يَحْيَى – وَاللَّفْظُ لَهُ – قَالَ: قُلْتُ لِسُفْيَانَ بْنِ عُيَيْنَةَ: سَمِعْتَ الزُّهْرِيَّ يَذْكُرُ عَنْ عَطَاءِ بْنِ يَزِيدَ اللَّيْثِيِّ، عَنْ أَبِي أَيُّوبَ، أَنَّ النَّبِيَّ ﷺ قَالَ: ((إِذَا أَتَيْتُمْ الْغَائِطَ فَلاَ تَسْتَقْبِلُوا الْقِبْلَةَ وَلاَ تَسْتَدْبِرُوهَا بِبَوْلٍ وَلاَ غَائِطٍ، وَلَكِنْ شَرِّقُوا أَوْ غَرِّبُوا)).

قَالَ أَبُو أَيُّوبَ: فَقَدِمْنَا الشَّامَ، فَوَجَدْنَا مَرَاحِيضَ قَدْ بُنِيَتْ قِبَلَ الْقِبْلَةِ، فَنَنْحَرِفُ عَنْهَا وَنَسْتَغْفِرُ اللَّهَ؟ قَالَ: نَعَمْ.

**[609]-59-(264)** ........ Yəhya ibn Yəhya demişdir: “Mən Süfyan ibn Uyeynəyə dedim: “Sən Zuhrinin (belə bir hədis) rəvayət etdiyini eşitmisənmi? Zuhri Əta ibn Yezid əl-Leysidən, o da Əbu Əyyubdan, o da Peyğəmbərdən ﷺ rəvayət etmişdir ki, o, belə buyurmuşdur: “Ayaqyoluna getdiyiniz zaman təbii ehtiyacınızı rəf etdikdə üzünüzü və ya arxanızı qibləyə çevirməyin.[1] Üzünüzü şərqə və ya qərbə tərəf çevirin”[2].

Əbu Əyyub demişdir: “Biz Şama gəldik və ayaqyollarının üzü qibləyə tikildiyini gördük. Biz (onların içində) yana çevrilir, (sonra da) Allahdan bağışlanma diləyirdik”.

Süfyan (bu suala): “Bəli, (Zuhridən eşitmişəm)”– deyə cavab verdi.

---

[1] Buradakı qadağa, bu əməlin bəyənilməyən bir əməl olduğunu göstərir. Çünki başqa bir hədisdə Peyğəmbərin ﷺ üzü Şama və arxası Kəbəyə tərəf oturub təbii ehtiyacını rəf etdiyi xəbər verilmişdir. Bu rəvayətləri cəm edib demək olar ki, açıq yerdə qibləyə tərəf dönmək qadağan, bağlı yerdə bunu etmək isə caizdir. Mərvan əl-Əsğər rəvayət edir ki, mən ibn Ömərin, dəvəsini qibləyə doğru çökdürüb, o istiqamətə tərəf sidik ifraz etdiyini gördüm. Dedim: “Ey Əbu Əbdürrəhman! Məgər belə etmək qadağan olunmayıbmı?” O dedi: “Bəli!.. Yalnız açıq yerdə bunu etmək qadağandır. Əgər səninlə qiblə arasında səni örtəcək bir şey vardırsa, onda su başına çıxmaq eyib etməz”. Hədisi Əbu Davud, İbn Xüzeymə və Hakim rəvayət etmişdir. “Fəthul Bari” əsərində hədisin isnadının “həsən” olduğu qeyd edilmişdir (“Fiqh əs-Sunnə”).

[2] “Bu yalnız Mədinə əhalisinə və onun səmtində yerləşən məmləkətlərin əhalisinə aiddir. Şərqdə və qərbdə yaşayanlara isə bunun heç bir aidiyyəti yoxdur. Çünki şərqdə yaşayanların qibləsi qərbə, qərbdə yaşayanların qibləsi isə şərqə tərəfdir.” (Belə olduğu təqdirdə, onlar üzlərini cənub və ya şimal istiqamətinə çevirməlidirlər) “Fəth əl-Bari”, 2/109.

**[٦١٠] ٦٠**-(**٢٦٥**) و حَدَّثَنَا أَحْمَدُ بْنُ الْحَسَنِ بْنِ خِرَاشٍ: حَدَّثَنَا عُمَرُ بْنُ عَبْدِ الْوَهَّابِ: حَدَّثَنَا يَزِيدُ يَعْنِي ابْنَ زُرَيْعٍ: حَدَّثَنَا رَوْحٌ عَنْ سُهَيْلٍ، عَنْ الْقَعْقَاعِ، عَنْ أَبِي صَالِحٍ، عَنْ أَبِي هُرَيْرَةَ عَنْ رَسُولِ اللَّهِ ﷺ قَالَ: ((إِذَا جَلَسَ أَحَدُكُمْ عَلَى حَاجَتِهِ، فَلاَ يَسْتَقْبِلْ الْقِبْلَةَ وَلاَ يَسْتَدْبِرْهَا)).

**[610]-60-(265)** ........ Əbu Hureyrə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Biriniz təbii ehtiyacını rəf etmək üçün oturduğu zaman üzünü və ya arxasını qibləyə çevirməsin!"

**[٦١١] ٦١**-(**٢٦٦**) حَدَّثَنَا عَبْدُ اللَّهِ بْنُ مَسْلَمَةَ بْنِ قَعْنَبٍ: حَدَّثَنَا سُلَيْمَانُ يَعْنِي ابْنَ بِلاَلٍ، عَنْ يَحْيَى بْنِ سَعِيدٍ، عَنْ مُحَمَّدِ بْنِ يَحْيَى، عَنْ عَمِّهِ وَاسِعِ بْنِ حَبَّانَ قَالَ: كُنْتُ أُصَلِّي فِي الْمَسْجِدِ، وَعَبْدُ اللَّهِ بْنُ عُمَرَ مُسْنِدٌ ظَهْرَهُ إِلَى الْقِبْلَةِ، فَلَمَّا قَضَيْتُ صَلاَتِي انْصَرَفْتُ إِلَيْهِ مِنْ شِقِّي، فَقَالَ عَبْدُ اللَّهِ: يَقُولُ نَاسٌ: إِذَا قَعَدْتَ لِلْحَاجَةِ تَكُونُ لَكَ، فَلاَ تَقْعُدْ مُسْتَقْبِلَ الْقِبْلَةِ وَلاَ بَيْتِ الْمَقْدِسِ. قَالَ عَبْدُ اللَّهِ: وَلَقَدْ رَقِيتُ عَلَى ظَهْرِ بَيْتٍ، فَرَأَيْتُ رَسُولَ اللَّهِ ﷺ قَاعِدًا عَلَى لَبِنَتَيْنِ مُسْتَقْبِلاً بَيْتَ الْمَقْدِسِ، لِحَاجَتِهِ.

**[611]-61-(266)** ........ Vasi ibn Həbban demişdir: "Mən məsciddə namaz qılırdım. Abdullah ibn Ömər də kürəyini qibləyə tərəf söykəyib oturmuşdu. Mən namazımı bitirdikdən sonra bir yanımdan[1] dönüb onun yanına getdim. Abdullah dedi: "Bəzi adamlar deyirlər ki, təbii ehtiyacını rəf etmək üçün oturduğun zaman üzü qibləyə və ya Beytul-Məqdisə oturmamalısan".

Abdullah (sözünə davam edib) dedi: "(Bir dəfə) mən bir evin damına çıxdım[2] və Peyğəmbərin ﷺ üzü Beytul-Məqdisə tərəf, iki kərpic üstündə oturub təbii ehtiyacını rəf etdiyini gördüm".

**[٦١٢] ٦٢**-(...) حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا مُحَمَّدُ بْنُ بِشْرٍ الْعَبْدِيُّ: حَدَّثَنَا عُبَيْدُ اللَّهِ بْنُ عُمَرَ، عَنْ مُحَمَّدِ بْنِ يَحْيَى بْنِ حَبَّانَ، عَنْ عَمِّهِ وَاسِعِ بْنِ حَبَّانَ، عَنْ ابْنِ عُمَرَ قَالَ: رَقِيتُ عَلَى بَيْتِ أُخْتِي حَفْصَةَ، فَرَأَيْتُ رَسُولَ اللَّهِ ﷺ قَاعِدًا لِحَاجَتِهِ، مُسْتَقْبِلَ الشَّامِ، مُسْتَدْبِرَ الْقِبْلَةِ.

**[612]-62-(...)** ........ İbn Ömər ﷺ demişdir: "(Bir gün) mən bacım Həfsənin evinin üstünə çıxdım və Rəsulullahın ﷺ üzü Şama və arxası qibləyə tərəf oturub təbii ehtiyacını rəf etdiyini gördüm".

---

[1] Burada o, sağ və ya sol tərəfini qəsd edirdi.
[2] İbn Ömərin ﷺ evin damına çıxmaqda məqsədi Peyğəmbəri ﷺ güdmək deyildi.

## (١٨) – بَابُ النَّهْيِ عَنْ الاِسْتِنْجَاءِ بِالْيَمِينِ

## 18-ci fəsil. Ayaqyolunda sağ əllə təmizlənməyin qadağan olunması

**[٦١٣] ٦٣–(٢٦٧)** حَدَّثَنَا يَحْيَى بْنُ يَحْيَى: أَخْبَرَنَا عَبْدُ الرَّحْمَنِ بْنُ مَهْدِيٍّ عَنْ هَمَّامٍ، عَنْ يَحْيَى بْنِ أَبِي كَثِيرٍ، عَنْ عَبْدِ اللَّهِ بْنِ أَبِي قَتَادَةَ، عَنْ أَبِيهِ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((لاَ يُمْسِكَنَّ أَحَدُكُمْ ذَكَرَهُ بِيَمِينِهِ وَهُوَ يَبُولُ، وَلاَ يَتَمَسَّحْ مِنْ الْخَلاَءِ بِيَمِينِهِ، وَلاَ يَتَنَفَّسْ فِي الإِنَاءِ)).

**[613]-63-(267)** ........ Əbu Qətadə[1] ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Sizdən biriniz subaşına çıxdıqda cinsiyyət orqanını sağ əli ilə tutmasın, habelə ayaqyolunda sağ əli ilə silinməsin. Bir də ki (su və s.) içdikdə qabın içinə üfürməsin".

**[٦١٤] ٦٤**–(...) حَدَّثَنَا يَحْيَى بْنُ يَحْيَى: أَخْبَرَنَا وَكِيعٌ عَنْ هِشَامٍ الدَّسْتَوَائِيِّ، عَنْ يَحْيَى بْنِ أَبِي كَثِيرٍ، عَنْ عَبْدِ اللَّهِ بْنِ أَبِي قَتَادَةَ، عَنْ أَبِيهِ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((إِذَا دَخَلَ أَحَدُكُمْ الْخَلاَءَ، فَلاَ يَمَسَّ ذَكَرَهُ بِيَمِينِهِ)).

**[614]-64-(...)** ........ Əbu Qətadə ﷺ rəvayət edir ki, Rəsulullah ﷺ demişdir: "Sizdən biriniz ayaqyoluna girdiyi zaman tənasül orqanını sağ əli ilə tutmasın!"

**[٦١٥] ٦٥**–(...) حَدَّثَنَا ابْنُ أَبِي عُمَرَ: حَدَّثَنَا الثَّقَفِيُّ عَنْ أَيُّوبَ عَنْ يَحْيَى بْنِ أَبِي كَثِيرٍ، عَنْ عَبْدِ اللَّهِ بْنِ أَبِي قَتَادَةَ، عَنْ أَبِي قَتَادَةَ أَنَّ النَّبِيَّ ﷺ نَهَى أَنْ يَتَنَفَّسَ فِي الإِنَاءِ، وَأَنْ يَمَسَّ ذَكَرَهُ بِيَمِينِهِ، وَأَنْ يَسْتَطِيبَ بِيَمِينِهِ.

**[615]-65-(...)** ........ Əbu Qətadə ﷺ demişdir: "Peyğəmbər ﷺ qabın içinə üfürməyi, tənasül orqanını sağ əllə tutmağı və (ayaqyolunda) sağ əllə təmizlənməyi qadağan etmişdir".

---

[1] Əbu Qətadə əl-Ənsari ﷺ Peyğəmbərin ﷺ səhabəsidir. Adı: Haris (yaxud Nomən və ya Amr) ibn Ribidir. Hicrətin 54-cü ilində vəfat etmişdir.

## (١٩) – بَابُ التَّيَمُّنِ فِي الطُّهُورِ وَغَيْرِهِ

## 19-cu fəsil. Paklandıqda[1] və digər işlərdə sağdan başlamaq

**[٦١٦] ٦٦**–(**٢٦٨**) و حَدَّثَنَا يَحْيَى بْنُ يَحْيَى التَّمِيمِيُّ: أَخْبَرَنَا أَبُو الأَحْوَصِ عَنْ أَشْعَثَ، عَنْ أَبِيهِ، عَنْ مَسْرُوقٍ، عَنْ عَائِشَةَ قَالَتْ: إِنْ كَانَ رَسُولُ اللَّهِ ﷺ لَيُحِبُّ التَّيَمُّنَ فِي طُهُورِهِ إِذَا تَطَهَّرَ، وَفِي تَرَجُّلِهِ إِذَا تَرَجَّلَ، وَفِي انْتِعَالِهِ إِذَا انْتَعَلَ.

**[616]-66-(268)** ........ Aişə ﵂ demişdir: "Rəsulullah ﷺ yuyunduğu zaman yuyunmağında, darandığı zaman daranmağında və ayaqqabı geyindiyi zaman geyinməyində sağdan başlamağı xoşlayardı[2]".

**[٦١٧] ٦٧**–(...) و حَدَّثَنَا عُبَيْدُ اللَّهِ بْنُ مُعَاذٍ: حَدَّثَنَا أَبِي: حَدَّثَنَا شُعْبَةُ عَنِ الأَشْعَثِ، عَنْ أَبِيهِ، عَنْ مَسْرُوقٍ، عَنْ عَائِشَةَ قَالَتْ: كَانَ رَسُولُ اللَّهِ ﷺ يُحِبُّ التَّيَمُّنَ فِي شَأْنِهِ كُلِّهِ، فِي نَعْلَيْهِ، وَتَرَجُّلِهِ، وَطُهُورِهِ.

**[617]-67-(...)** ........ Aişə ﵂ demişdir: "Peyğəmbər ﷺ ayaqqabılarını geyindikdə, saçını daradıqda, yuyunduqda və bütün işlərində sağdan başlamağı sevərdi".

## (٢٠) – بَابُ النَّهْيِ عَنْ التَّخَلِّي فِي الطُّرُقِ وَالظِّلاَلِ

## 20-ci fəsil. Yollarda və kölgəliklərdə[3] təbii ehtiyacı rəf etməyin qadağan olunması

**[٦١٨] ٦٨**–(**٢٦٩**) حَدَّثَنَا يَحْيَى بْنُ أَيُّوبَ وَقُتَيْبَةُ وَابْنُ حُجْرٍ، جَمِيعًا عَنْ إِسْمَعِيلَ بْنِ جَعْفَرٍ، قَالَ ابْنُ أَيُّوبَ: حَدَّثَنَا إِسْمَعِيلُ: أَخْبَرَنِي الْعَلاَءُ، عَنْ أَبِيهِ، عَنْ أَبِي هُرَيْرَةَ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: ((اتَّقُوا اللَّعَّانَيْنِ)) قَالُوا: وَمَا اللَّعَّانَانِ يَا رَسُولَ اللَّهِ؟ قَالَ: ((الَّذِي يَتَخَلَّى فِي طَرِيقِ النَّاسِ أَوْ فِي ظِلِّهِمْ)).

---

[1] Burada paklanmaq deyildikdə dəstəmaz almaq və qüsl etmək nəzərdə tutulur.

[2] Şəriətin qoyduğu qaydaya görə, məscidə daxil olmaq, namazda salam vermək, dəstəmaz əzalarını yumaq, əl sıxıb salam vermək, köynək, şalvar, ayaqqabı və s. geyinmək, misvakla dişləri təmizləmək, gözə sürmə çəkmək, dırnaq tutmaq, bığları qısaltmaq, saşları daramaq, qoltuqaltı tükləri təmizləmək, saç qırxmaq, yemək yemək, su içmək və başqa bu kimi pak və gözəl işlərdə sağ tərəfdən başlamaq bəyənilir. Bunun əksi olan – ayaqyolunda yuyunmaq, ayaqyoluna daxil olmaq, köynəyi, şalvarı, ayaqqabını və s. soyunmaq, yerə tüpürmək və başqa bu kimi işlərdə isə sol tərəfdən başlamaq sünnədir.

Alimlər yekdil fikirdədirlər ki, dəstəmaz aldıqda sağ tərəfdən başlamaq sünnədir. Və əgər bu sünnə tərk edilərsə, dəstəmazın sadəcə savabı azalar, özü isə qəbul olar. Biləsiniz ki, dəstəmaz aldıqda sol tərəfdən başlamaq caiz olsa da, bu, məkruh əməllərdən sayılır. Onu da qeyd etmək lazımdır ki, dəstəmaz əzalarının bəzilərində sağ tərəfdən başlamaq, əksinə, sünnəyə ziddir. Belə ki, qulaqlara məsh etdikdə, dəstəmazın əvvəlində əlləri yuduqda, həmçinin yanaqları yuduqda sağ tərəfdən başlamaq olmaz, hər ikisini birdən etmək gərəkdir.

[3] Yəni istirahət yerlərində.

**[618]-68-(269)** ........ Əbu Hureyrə ﷺ rəvayət edir ki, (bir dəfə) Peyğəmbər ﷺ buyurdu: "Çoxlu lənətə bais olan iki şeydən çəkinin!" (Səhabələr) soruşdular: "Çoxlu lənətə bais olan iki şey nədir, ya Rəsulullah?" (Peyğəmbər ﷺ) buyurdu: "İnsanların yolunda, yaxud kölgələndikləri yerdə[1] təbii ehtiyacını rəf edən kimsənin (etdiyi bu əməldir)".

## (٢١) – بَابُ الاسْتِنْجَاءِ بِالْمَاءِ مِنْ التَّبَرُّزِ

## 21-ci fəsil. Böyük bayıra çıxdıqdan sonra su ilə təmizlənmək

**[٦١٩] ٦٩–(٢٧٠)** حَدَّثَنَا يَحْيَى بْنُ يَحْيَى: أَخْبَرَنَا خَالِدُ بْنُ عَبْدِ اللَّهِ عَنْ خَالِدٍ، عَنْ عَطَاءِ بْنِ أَبِي مَيْمُونَةَ، عَنْ أَنَسِ بْنِ مَالِكٍ، أَنَّ رَسُولَ اللَّهِ ﷺ دَخَلَ حَائِطًا، وَتَبِعَهُ غُلَامٌ مَعَهُ مِيضَأَةٌ، هُوَ أَصْغَرُنَا، فَوَضَعَهَا عِنْدَ سِدْرَةٍ، فَقَضَى رَسُولُ اللَّهِ ﷺ حَاجَتَهُ، فَخَرَجَ عَلَيْنَا وَقَدْ اسْتَنْجَى بِالْمَاءِ.

**[619]-69-(270)** ........ Ənəs ibn Malik ﷺ belə rəvayət etmişdir: "(Bir gün) Peyğəmbər ﷺ bir bostana girdi. Əlində aftafa tutmuş bir uşaq da onun arxasınca getdi. O, bizim ən kiçiyimiz idi. Uşaq aftafanı bir sidr ağacının[2] yanına qoydu. Peyğəmbər ﷺ təbii ehtiyacını rəf etdikdən və su ilə təmizləndikdən sonra yanımıza gəldi".

**[٦٢٠] ٧٠–(٢٧١)** و حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا وَكِيعٌ، وَغُنْدَرٌ عَنْ شُعْبَةَ؛ ح: و حَدَّثَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى – وَاللَّفْظُ لَهُ –: حَدَّثَنَا مُحَمَّدُ بْنُ جَعْفَرٍ: حَدَّثَنَا شُعْبَةُ عَنْ عَطَاءِ بْنِ أَبِي مَيْمُونَةَ، أَنَّهُ سَمِعَ أَنَسَ بْنَ مَالِكٍ يَقُولُ: كَانَ رَسُولُ اللَّهِ ﷺ يَدْخُلُ الْخَلَاءَ، فَأَحْمِلُ أَنَا، وَغُلَامٌ نَحْوِي، إِدَاوَةً مِنْ مَاءٍ، وَعَنَزَةً فَيَسْتَنْجِي بِالْمَاءِ.

**[620]-70-(271)** ........ Əta, Ənəs ibn Malikin ﷺ belə rəvayət etdiyini eşitmişdir: "Peyğəmbər ﷺ ayaqyoluna getdikdə mən və mənim kimi bir uşaq ona bir cürdək su və ağac parçası[3] aparardıq. Peyğəmbər ﷺ də su ilə təmizlənərdi".

---

[1] Burada kölgəlik deyildikdə kölgə düşən yerlərin hamısı nəzərdə tutulmur. Məsələn, meşədə və ya səhrada bitən bir ağacın kölgəsində subaşına çıxmaq olar. Belə ki, bu yerlər istirahət üçün ayrılmış yerlərdən sayılmır. Neçə-neçə hədisdə Peyğəmbərin ﷺ bəzən xurmalıqlarda – xurma ağacının kölgəsində durub subaşına çıxdığı xəbər verilir. ("əl-Mustədrək", 2485; "Səhih ət-Tərğib vət-Tərhib", 2269).

[2] Şam fəsiləsindən həmişəyaşıl, iynəyarpaqlı ağacdır.

[3] Bu, çox uzun olmayan nizəyəbənzər bir ağacdır. Peyğəmbərin ﷺ bu ağac parçasını özü ilə aparması ona görə idi ki, o, dəstəmaz aldıqdan sonra namaz qılardı və namaz əsnasında onun qarşısından keçib namazını pozan olmasın deyə, həmin ağac parçasını yerə sancıb ona doğru namaz qılardı.

**[٦٢١] ٧١**-(...) و حَدَّثَنِي زُهَيْرُ بْنُ حَرْبٍ وَأَبُو كُرَيْبٍ – وَاللَّفْظُ لِزُهَيْرٍ – حَدَّثَنَا إِسْمَعِيلُ يَعْنِي ابْنَ عُلَيَّةَ: حَدَّثَنِي رَوْحُ بْنُ الْقَاسِمِ عَنْ عَطَاءِ بْنِ أَبِي مَيْمُونَةَ، عَنْ أَنَسِ بْنِ مَالِكٍ قَالَ: كَانَ رَسُولُ اللَّهِ ﷺ يَتبَرَّزُ لِحَاجَتِهِ، فَآتِيهِ بِالْمَاءِ، فَيَتَغَسَّلُ بِهِ.

**[621]-71-(...)** ........ Ənəs ibn Malik ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ təbii ehtiyacını rəf etmək üçün səhraya çıxardı. Bu əsnada mən ona su gətirərdim və o, bu su ilə yuyunardı.

## (٢٢) – بَابُ الْمَسْحِ عَلَى الْخُفَّيْنِ

## 22-ci fəsil. Məstlər[1] üzərinə məsh çəkmək

**[٦٢٢] ٧٢**-(٢٧٢) حَدَّثَنَا يَحْيَى بْنُ يَحْيَى التَّمِيمِيُّ وَإِسْحَقُ بْنُ إِبْرَاهِيمَ وَأَبُو كُرَيْبٍ، جَمِيعًا عَنْ أَبِي مُعَاوِيَةَ؛ ح: و حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا أَبُو مُعَاوِيَةَ وَوَكِيعٌ – وَاللَّفْظُ لِيَحْيَى – قَالَ أَخْبَرَنَا أَبُو مُعَاوِيَةَ عَنْ الأَعْمَشِ، عَنْ إِبْرَاهِيمَ، عَنْ هَمَّامٍ قَالَ: بَالَ جَرِيرٌ، ثُمَّ تَوَضَّأَ، وَمَسَحَ عَلَى خُفَّيْهِ، فَقِيلَ: تَفْعَلُ هَذَا؟ فَقَالَ: نَعَمْ، رَأَيْتُ رَسُولَ اللَّهِ ﷺ بَالَ، ثُمَّ تَوَضَّأَ وَمَسَحَ عَلَى خُفَّيْهِ.

قَالَ الأَعْمَشُ: قَالَ إِبْرَاهِيمُ: كَانَ يُعْجِبُهُمْ هَذَا الْحَدِيثُ؛ لأَنَّ إِسْلاَمَ جَرِيرٍ كَانَ بَعْدَ نُزُولِ الْمَائِدَةِ.

**[622]-72-(272)** ........ Həmmam rəvayət edir ki, (bir dəfə) Cərir bövl etdikdən[2] sonra dəstəmaz aldı və məstləri üzərinə məsh çəkdi.[3] Ona: "Sən beləmi edirsən?"– deyildikdə, o belə cavab verdi: "Bəli, mən Rəsulullahın ﷺ bövl etdikdən sonra dəstəmaz aldığını və məstləri üzərinə məsh çəkdiyini görmüşəm".

Aməş xəbər vermişdir ki, İbrahim demişdir: "Bu hədis onların çox xoşuna gəlirdi. Çünki Cəririn İslamı qəbul etməsi "əl-Maidə" surəsi nazil olduqdan sonra[4] baş vermişdir".

---

[1] Məst – dəridən və ya başqa yumşaq materialdan tikilən yüngül ayaqqabı.

[2] Bövl etmək – sidik ifraz etmək, təbii ehtiyacı rəf etmək deməkdir.

[3] Şəriətə görə məsh ayağın ancaq üst tərəfinə çəkilir. Bu xüsusda İmam Əli ibn Əbu Talib ﷺ demişdir: "Əgər din rəy ilə olsaydı (yəni ağılnan ölçülüb-biçilsəydi), xuffun altına məsh etmək daha münasib olardı. Lakin mən Peyğəmbərin ﷺ xufların üstünə məsh etdiyini gördüm" ("Səhih Əbu Davud", 162).

[4] Cərir ibn Abdullah ﷺ İslamı "əl-Maidə" surəsinin altıncı ayəsi nazil olduqdan çox sonra qəbul etmişdir. Bu da məsh çəkməklə bağlı bütün mübahisələrə son qoymuşdur.

**[٦٢٣]** (...) و حَدَّثَنَاه إِسْحَقُ بْنُ إِبْرَاهِيمَ وَعَلِيُّ بْنُ خَشْرَمٍ قَالاَ: أَخْبَرَنَا عِيسَى بْنُ يُونُسَ؛ **ح**: و حَدَّثَنَاه مُحَمَّدُ بْنُ أَبِي عُمَرَ قَالَ: حَدَّثَنَا سُفْيَانُ؛ **ح**: و حَدَّثَنَا مِنْجَابُ بْنُ الْحَارِثِ التَّمِيمِيُّ: أَخْبَرَنَا ابْنُ مُسْهِرٍ، كُلُّهُمْ عَنْ الأَعْمَشِ فِي هَذَا الإِسْنَادِ، بِمَعْنَى حَدِيثِ أَبِي مُعَاوِيَةَ. غَيْرَ أَنَّ فِي حَدِيثِ عِيسَى وَسُفْيَانَ، قَالَ: فَكَانَ أَصْحَابُ عَبْدِ اللَّهِ يُعْجِبُهُمْ هَذَا الْحَدِيثُ؛ لأَنَّ إِسْلاَمَ جَرِيرٍ كَانَ بَعْدَ نُزُولِ الْمَائِدَةِ.

**[623] (...)** ........ İsa ibn Yunus, Süfyan və İbn Mushir – onların hamısı (bu hədisi) Aməşdən bu isnadla, Əbu Müaviyənin hədisinə yaxın mənada rəvayət etmişlər. Fəqət İsanın və Süfyanın rəvayətində deyilir ki: “Bu hədis Abdullahın[1] dostlarının ürəyincə idi. Belə ki, Cəririn İslamı qəbul etməsi “əl-Maidə” surəsi nazil olduqdan sonra baş vermişdi”.

**[٦٢٤] ٧٣–(٢٧٣)** حَدَّثَنَا يَحْيَى بْنُ يَحْيَى التَّمِيمِيُّ: أَخْبَرَنَا أَبُو خَيْثَمَةَ، عَنْ الأَعْمَشِ، عَنْ شَقِيقٍ، عَنْ حُذَيْفَةَ قَالَ: كُنْتُ مَعَ النَّبِيِّ ﷺ فَانْتَهَى إِلَى سُبَاطَةِ قَوْمٍ فَبَالَ قَائِمًا، فَتَنَحَّيْتُ فَقَالَ: ((ادْنُهْ)) فَدَنَوْتُ حَتَّى قُمْتُ عِنْدَ عَقِبَيْهِ، فَتَوَضَّأَ، فَمَسَحَ عَلَى خُفَّيْهِ.

**[624]-73-(273)** ........ Huzeyfə ﷺ demişdir: “Mən Peyğəmbərin ﷺ yanında idim. O, bir qövmün zibilxanasına gəlib orada ayaq üstə bövl etdi. (Həmin vaxt) mən kənara çəkilmişdim. O: “Yaxın gəl!”– deyə buyurdu. Mən (ona) yaxınlaşdım. Nəhayət, gəlib onun arxa tərəfində durdum. Peyğəmbər ﷺ dəstəmaz aldı və məstlərinin üzərinə məsh çəkdi”.

**[٦٢٥] ٧٤–(...)** حَدَّثَنَا يَحْيَى بْنُ يَحْيَى: أَخْبَرَنَا جَرِيرٌ عَنْ مَنْصُورٍ، عَنْ أَبِي وَائِلٍ قَالَ: كَانَ أَبُو مُوسَى يُشَدِّدُ فِي الْبَوْلِ، وَيَبُولُ فِي قَارُورَةٍ وَيَقُولُ: إِنَّ بَنِي إِسْرَائِيلَ كَانَ إِذَا أَصَابَ جِلْدَ أَحَدِهِمْ بَوْلٌ قَرَضَهُ بِالْمَقَارِيضِ، فَقَالَ حُذَيْفَةُ: لَوَدِدْتُ أَنَّ صَاحِبَكُمْ لاَ يُشَدِّدُ هَذَا التَّشْدِيدَ، فَلَقَدْ رَأَيْتُنِي أَنَا وَرَسُولُ اللَّهِ ﷺ نَتَمَاشَى، فَأَتَى سُبَاطَةً خَلْفَ حَائِطٍ، فَقَامَ كَمَا يَقُومُ أَحَدُكُمْ، فَبَالَ، فَانْتَبَذْتُ مِنْهُ، فَأَشَارَ إِلَيَّ فَجِئْتُ، فَقُمْتُ عِنْدَ عَقِبِهِ حَتَّى فَرَغَ.

**[625]-74-(...)** ........ Əbu Vail rəvayət edir ki, Əbu Musa bövl xüsusunda çox sərt mövqe tutmuşdur. O, bir qabın içinə bövl edər və deyərdi: “İsrail oğullarından birinin dərisinə[2] sidik bulaşdığı zaman, (həmin yeri) qayçı ilə kəsib atardı”.

---

[1] Burada Abdullah ibn Cərir ﷺ qəsd edilir.

[2] Qurtubi demişdir: “Hədisdə “dəri” deyildikdə dəridən olan libas nəzərdə tutulur” (“Mişkatul-Məsabih”, 2/151).

(Bunu eşidəndə) Huzeyfə dedi: “İstərdim ki, dostunuz bu qədər sərtlik göstərməsin. Bir gün mən Peyğəmbərlə ﷺ birgə (Mədinədə) gəzib-dolaşırdıq. Bu əsnada o, bostanın arxasında yerləşən zibilxanaya gəldi, sonra da birinizin ayaq üstə durduğu kimi durub bövl etdi. (Həmin vaxt) mən ondan kənara çəkilmişdim. Peyğəmbər ﷺ mənə (“gəl” deyə) işarə etdi, mən də (onun) yanına gəldim və o, işini bitirincəyədək onun arxasında durdum”.

**[٦٢٦] ٧٥-(٢٧٤)** حَدَّثَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ: حَدَّثَنَا لَيْثٌ؛ ح: و حَدَّثَنَا مُحَمَّدُ بْنُ رُمْحِ بْنِ الْمُهَاجِرِ: أَخْبَرَنَا اللَّيْثُ عَنْ يَحْيَى بْنِ سَعِيدٍ، عَنْ سَعْدِ بْنِ إِبْرَاهِيمَ، عَنْ نَافِعِ بْنِ جُبَيْرٍ، عَنْ عُرْوَةَ بْنِ الْمُغِيرَةِ، عَنْ أَبِيهِ الْمُغِيرَةِ بْنِ شُعْبَةَ عَنْ رَسُولِ اللَّهِ ﷺ أَنَّهُ خَرَجَ لِحَاجَتِهِ، فَاتَّبَعَهُ الْمُغِيرَةُ بِإِدَاوَةٍ فِيهَا مَاءٌ، فَصَبَّ عَلَيْهِ حِينَ فَرَغَ مِنْ حَاجَتِهِ، فَتَوَضَّأَ وَمَسَحَ عَلَى الْخُفَّيْنِ. وَفِي رِوَايَةِ ابْنِ رُمْحٍ: مَكَانَ حِينَ: حَتَّى.

**[626]-75-(274)** ........ Muğirə ibn Şobədən ؓ rəvayət edilir ki, (bir dəfə) Peyğəmbər ﷺ təbii ehtiyacını rəf etmək üçün çölə çıxdı. Muğirə bir cürdək su ilə onu təqib etdi. Peyğəmbər ﷺ təbii ehtiyacını rəf etdiyi zaman Muğirə onun əlinə su tökdü. Peyğəmbər ﷺ dəstəmaz aldı və məstlərinin üzərinə məsh çəkdi”.

İbn Rumhun rəvayətində “hiynə” yerinə “hətta” deyilir ki, bunun da mənası: “dəstəmazını bitirənədək” deməkdir.[1]

**[٦٢٧]** (...) و حَدَّثَنَاه مُحَمَّدُ بْنُ الْمُثَنَّى: حَدَّثَنَا عَبْدُ الْوَهَّابِ قَالَ: سَمِعْتُ يَحْيَى بْنَ سَعِيدٍ، بِهَذَا الإِسْنَادِ، وَقَالَ: فَغَسَلَ وَجْهَهُ وَيَدَيْهِ وَمَسَحَ بِرَأْسِهِ ثُمَّ مَسَحَ عَلَى الْخُفَّيْنِ.

**[627] (...)** ........ Abdul-Vəhhab (bu hədisi rəvayət edərkən) demişdir: “Mən (hədisi) Yəhya ibn Səiddən bu isnadla eşitdim. Muğirə demişdir: “Peyğəmbər ﷺ üzünü və əllərini yudu, başına məsh etdi, sonra da məstləri üzərinə məsh çəkdi”.

**[٦٢٨] ٧٦-(...)** و حَدَّثَنَا يَحْيَى بْنُ يَحْيَى التَّمِيمِيُّ: أَخْبَرَنَا أَبُو الأَحْوَصِ، عَنْ أَشْعَثَ، عَنْ الأَسْوَدِ بْنِ هِلاَلٍ، عَنْ الْمُغِيرَةِ بْنِ شُعْبَةَ قَالَ: بَيْنَا أَنَا مَعَ رَسُولِ اللَّهِ ﷺ ذَاتَ لَيْلَةٍ، إِذْ نَزَلَ فَقَضَى حَاجَتَهُ، ثُمَّ جَاءَ فَصَبَبْتُ عَلَيْهِ مِنْ إِدَاوَةٍ كَانَتْ مَعِي، فَتَوَضَّأَ وَمَسَحَ عَلَى خُفَّيْهِ.

**[628]-76-(...)** ........ Muğirə ibn Şobə ؓ demişdir: “Bir gecə mən Peyğəmbərin ﷺ yanında ikən, o, çölə çıxdı və təbii ehtiyacını rəf etdi. Sonra (yanıma) gəldi və mən özümlə gətirdiyim cürdəkdən onun əlinə su tökdüm. O, dəstəmaz aldı və məstləri üzərinə məsh çəkdi.

---

[1] 952-ci hədisə bax.

**[٦٢٩]** ٧٧-(...) و حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ وَأَبُو كُرَيْبٍ قَالَ أَبُو بَكْرٍ: حَدَّثَنَا أَبُو مُعَاوِيَةَ عَنْ الأَعْمَشِ، عَنْ مُسْلِمٍ، عَنْ مَسْرُوقٍ، عَنْ الْمُغِيرَةِ بْنِ شُعْبَةَ قَالَ: كُنْتُ مَعَ النَّبِيِّ ﷺ فِي سَفَرٍ، فَقَالَ: ((يَا مُغِيرَةُ! خُذْ الإِدَاوَةَ)) فَأَخَذْتُهَا، ثُمَّ خَرَجْتُ مَعَهُ، فَانْطَلَقَ رَسُولُ اللَّهِ ﷺ حَتَّى تَوَارَى عَنِّي، فَقَضَى حَاجَتَهُ، ثُمَّ جَاءَ وَعَلَيْهِ جُبَّةٌ شَامِيَّةٌ ضَيِّقَةُ الْكُمَّيْنِ، فَذَهَبَ يُخرِجُ يَدَهُ مِنْ كُمِّهَا فَضَاقَتْ عَلَيْهِ فَأَخْرَجَ يَدَهُ مِنْ أَسْفَلِهَا، فَصَبَبْتُ عَلَيْهِ فَتَوَضَّأَ وُضُوءَهُ لِلصَّلَاةِ، ثُمَّ مَسَحَ عَلَى خُفَّيْهِ ثُمَّ صَلَّى.

**[629]-77-(...)** ........ Muğirə ibn Şobə ﷺ demişdir: "Səfərlərin birində mən Peyğəmbərin ﷺ yanında idim. (Mənə): "Ey Muğirə! Cürdəyi götür (dalımca gəl)!"– deyə buyurdu. Mən qabı götürüb onunla birlikdə (çölə) çıxdım. Peyğəmbər ﷺ (məndən) uzaqlaşdı və nəhayət, gözdən itdi. O, təbii ehtiyacını rəf etdikdən sonra (yanıma) gəldi. Onun əynində qolları dar bir Şam cübbəsi var idi. Peyğəmbər ﷺ əlini cübbənin qolundan çıxartmağa çalışdı, lakin qolları dar olduğundan çıxarda bilmədi. Belə olduqda o, əllərini cübbənin aşağısından çıxartdı. Mən onun əlinə su tökdüm və o, namaz üçün dəstəmaz aldığı kimi dəstəmaz aldı. Sonra məstləri üzərinə məsh çəkdi. Sonra da namaz qıldı".

**[٦٣٠]** ٧٨-(...) و حَدَّثَنَا إِسْحَقُ بْنُ إِبْرَاهِيمَ وَعَلِيُّ بْنُ خَشْرَمٍ، جَمِيعًا عَنْ عِيسَى بْنِ يُونُسَ. قَالَ إِسْحَقُ: أَخْبَرَنَا عِيسَى: حَدَّثَنَا الأَعْمَشُ عَنْ مُسْلِمٍ، عَنْ مَسْرُوقٍ، عَنْ الْمُغِيرَةِ بْنِ شُعْبَةَ قَالَ: خَرَجَ رَسُولُ اللَّهِ ﷺ لِيَقْضِيَ حَاجَتَهُ، فَلَمَّا رَجَعَ تَلَقَّيْتُهُ بِالإِدَاوَةِ، فَصَبَبْتُ عَلَيْهِ فَغَسَلَ يَدَيْهِ، ثُمَّ غَسَلَ وَجْهَهُ، ثُمَّ ذَهَبَ لِيَغْسِلَ ذِرَاعَيْهِ فَضَاقَتْ الْجُبَّةُ فَأَخْرَجَهُمَا مِنْ تَحْتِ الْجُبَّةِ، فَغَسَلَهُمَا، وَمَسَحَ رَأْسَهُ وَمَسَحَ عَلَى خُفَّيْهِ، ثُمَّ صَلَّى بِنَا.

**[630]-78-(...)** ........ Muğirə ibn Şobə ﷺ demişdir: "(Bir dəfə) Peyğəmbər ﷺ təbii ehtiyacını rəf etmək üçün (çölə) çıxdı. (Nəhayət,) geri qayıtdıqda mən bir cürdək su ilə onu qarşıladım. Onun əlinə su tökdüm. O, (əvvəlcə) əllərini, sonra da üzünü yudu. Sonra da qollarını yumaq istədi, lakin (əllərini) cübbənin qolundan çıxarda bilmədi. Belə olduqda o, əllərini cübbənin aşağısından çıxardıb onları yudu. Sonra başına məsh etdi və məstlərinin üzərinə məsh çəkdi. Sonra da bizimlə namaz qıldı".

**[٦٣١]** ٧٩-(...) حَدَّثَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللَّهِ بْنِ نُمَيْرٍ: حَدَّثَنَا أَبِي: حَدَّثَنَا زَكَرِيَّاءُ، عَنْ عَامِرٍ، قَالَ: أَخْبَرَنِي عُرْوَةُ بْنُ الْمُغِيرَةِ، عَنْ أَبِيهِ قَالَ: كُنْتُ مَعَ النَّبِيِّ ﷺ ذَاتَ لَيْلَةٍ فِي مَسِيرٍ، فَقَالَ لِي: ((أَمَعَكَ مَاءٌ؟)) قُلْتُ: نَعَمْ، فَنَزَلَ عَنْ رَاحِلَتِهِ، فَمَشَى حَتَّى تَوَارَى فِي سَوَادِ اللَّيْلِ، ثُمَّ جَاءَ فَأَفْرَغْتُ عَلَيْهِ مِنْ الإِدَاوَةِ، فَغَسَلَ

وَجْهَهُ، وَعَلَيْهِ جُبَّةٌ مِنْ صُوفٍ، فَلَمْ يَسْتَطِعْ أَنْ يُخْرِجَ ذِرَاعَيْهِ مِنْهَا، حَتَّى أَخْرَجَهُمَا مِنْ أَسْفَلِ الْجُبَّةِ، فَغَسَلَ ذِرَاعَيْهِ، وَمَسَحَ بِرَأْسِهِ، ثُمَّ أَهْوَيْتُ لأَنْزِعَ خُفَّيْهِ فَقَالَ: ((دَعْهُمَا، فَإِنِّي أَدْخَلْتُهُمَا طَاهِرَتَيْنِ)) وَمَسَحَ عَلَيْهِمَا.

**[631]-79-(...)** ........ Muğirə ibn Şobə ﵁ demişdir: “Səfər əsnasında bir gecə Peyğəmbərin ﷺ yanında durmuşdum. Məndən: “Yanında su varmı?”– deyə soruşdu. Mən: “Bəli!”– deyə cavab verdim. O, miniyindən yerə endi və (təbii ehtiyacını rəf etməyə) getdi. Nəhayət, gecənin qaranlığında gözdən itdi. Sonra (mənim yanıma) gəldi və mən onun əlinə su tökdüm. O, üzünü yudu. Əynində yun cübbə var idi. O, qollarını cübbənin qolundan çıxarda bilmədi. Nəhayət, qollarını cübbənin aşağısından çıxardıb onları yudu və başına məsh etdi. Sonra mən onun məstlərini çıxartmaq üçün aşağı əyildim. (O mənə): “Dəymə onlara! Mən onları (ayaqlarım) pak olduğu halda geyinmişəm[1]”– dedi və (məstlərinin üzərinə) məsh çəkdi”.

**[٦٣٢]** ٨٠–(...) و حَدَّثَنِي مُحَمَّدُ بْنُ حَاتِمٍ: حَدَّثَنَا إِسْحَقُ بْنُ مَنْصُورٍ: حَدَّثَنَا عُمَرُ بْنُ أَبِي زَائِدَةَ عَنْ الشَّعْبِيِّ، عَنْ عُرْوَةَ بْنِ الْمُغِيرَةِ، عَنْ أَبِيهِ أَنَّهُ وَضَّأَ النَّبِيَّ ﷺ، فَتَوَضَّأَ وَمَسَحَ عَلَى خُفَّيْهِ، فَقَالَ لَهُ. فَقَالَ: ((إِنِّي أَدْخَلْتُهُمَا طَاهِرَتَيْنِ)).

**[632]-80-(...)** ........ Urva ibn Muğirə atası Muğirədən rəvayət etmişdir ki, o, Peyğəmbərin ﷺ əlinə su tökmüş, o da dəstəmaz almışdır. Peyğəmbər ﷺ dəstəmaz alıb məstlərinin üzərinə məsh çəkdikdən sonra (Muğirəyə): “Mən onları (ayaqlarım) pak olduğu halda geyinmişəm”– deyə buyurmuşdur”.

## (٢٣) – بَابُ الْمَسْحِ عَلَى النَّاصِيَةِ وَالْعِمَامَةِ

## 23-cü fəsil. Kəkilə və əmmaməyə məsh çəkmək

**[٦٣٣]** ٨١–(...) و حَدَّثَنِي مُحَمَّدُ بْنُ عَبْدِ اللَّهِ بْنِ بَزِيعٍ: حَدَّثَنَا يَزِيدُ يَعْنِي ابْنَ زُرَيْعٍ: حَدَّثَنَا حُمَيْدٌ الطَّوِيلُ: حَدَّثَنَا بَكْرُ بْنُ عَبْدِ اللَّهِ الْمُزَنِيُّ، عَنْ عُرْوَةَ بْنِ الْمُغِيرَةِ بْنِ شُعْبَةَ، عَنْ أَبِيهِ قَالَ: تَخَلَّفَ رَسُولُ اللَّهِ ﷺ وَتَخَلَّفْتُ مَعَهُ، فَلَمَّا قَضَى حَاجَتَهُ قَالَ: ((أَمَعَكَ مَاءٌ؟)) فَأَتَيْتُهُ بِمِطْهَرَةٍ، فَغَسَلَ كَفَّيْهِ وَوَجْهَهُ، ثُمَّ ذَهَبَ يَحْسِرُ عَنْ ذِرَاعَيْهِ فَضَاقَ كُمُّ الْجُبَّةِ، فَأَخْرَجَ يَدَهُ مِنْ تَحْتِ الْجُبَّةِ، وَأَلْقَى الْجُبَّةَ عَلَى مَنْكِبَيْهِ، وَغَسَلَ ذِرَاعَيْهِ، وَمَسَحَ

---

[1] Peyğəmbərin ﷺ bu sözü dəlildir ki, dəstəmazını tamamlamadan məstlərini ayağına geyən kimsəyə, sonradan məstləri üzərinə məsh çəkmək caiz deyildir.

بِنَاصِيَتِهِ وَعَلَى الْعِمَامَةِ وَعَلَى خُفَّيْهِ، ثُمَّ رَكِبَ وَرَكِبْتُ، فَانْتَهَيْنَا إِلَى الْقَوْمِ وَقَدْ قَامُوا فِي الصَّلاَةِ، يُصَلِّي بِهِمْ عَبْدُ الرَّحْمَنِ بْنُ عَوْفٍ وَقَدْ رَكَعَ بِهِمْ رَكْعَةً، فَلَمَّا أَحَسَّ بِالنَّبِيِّ ﷺ ذَهَبَ يَتَأَخَّرُ، فَأَوْمَأَ إِلَيْهِ، فَصَلَّى بِهِمْ، فَلَمَّا سَلَّمَ قَامَ النَّبِيُّ ﷺ وَقُمْتُ، فَرَكَعْنَا الرَّكْعَةَ الَّتِي سَبَقَتْنَا.

**[633]-81-(...)** ........ Muğirə ibn Şobə ﷺ demişdir: “Səfərlərin birində Peyğəmbər ﷺ (camaatdan) geri qaldı. Mən də onunla birgə geri qaldım. O, təbii ehtiyacını rəf etdikdən sonra (məndən): “Yanında su varmı?”– deyə soruşdu, mən də ona bir cürdək su gətirdim. O, əllərini və üzünü yudu. Sonra (cübbəsinin) qollarını çırmalamağa çalışdı, lakin onun qolları dar gəldi. Odur ki, əllərini cübbənin aşağısından çıxartdı və cübbəni çiyninə saldı. Sonra qollarını yudu, kəkilinə və əmmamənin üzərinə məsh etdi, habelə məstlərin üzərinə də məsh çəkdi. Sonra o, (dəvəsinə) mindi, mən də (öz heyvanıma) mindim. Biz gəlib camaata (o vaxt) yetişdik ki, artıq namaza durmuşdular. Namazı onlara Abdur-Rəhman ibn Auf qıldırırdı. Artıq bir rükət qıldırmışdı. O, Peyğəmbərin ﷺ gəldiyini hiss etdikdə (Peyğəmbər ﷺ önə keçsin deyə) arxaya çəkilməyə başladı. Peyğəmbər ﷺ əli ilə ona işarə etdi ki, yerində qal. Beləliklə, namazı camaata (Abdur-Rəhman ibn Auf) qıldırdı. O, salam verdikdə Peyğəmbər ﷺ (salam vermədən) ayağa qalxdı, mən də onunla bərabər ayağa qalxdım və buraxdığımız rükəti qıldıq”.[1]

**[٦٣٤] ٨٢**–(...) حَدَّثَنَا أُمَيَّةُ بْنُ بِسْطَامَ وَمُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى قَالاَ: حَدَّثَنَا الْمُعْتَمِرُ عَنْ أَبِيهِ قَالَ: حَدَّثَنِي بَكْرُ بْنُ عَبْدِ اللَّهِ، عَنِ ابْنِ الْمُغِيرَةِ عَنْ أَبِيهِ، أَنَّ النَّبِيَّ ﷺ مَسَحَ عَلَى الْخُفَّيْنِ، وَمُقَدَّمِ رَأْسِهِ، وَعَلَى عِمَامَتِهِ.

**[634]-82-(...)** ........ Muğirə ibn Şobə ﷺ rəvayət etmişdir ki, Peyğəmbər ﷺ məstlərinə məsh çəkmiş, habelə kəkilinə və əmmaməsinin üzərinə məsh etmişdir.

---

[1] Bu hədisdən aşağıdakı nəticələr çıxır:

– Hörmətli adamın, hörməti daha az olan kimsənin arxasında durub namaz qılması; doğrudan da, Allah Rəsulunun ﷺ Abdur-Rəhman ibn Aufun ﷺ arxasında namaz qılması Abdur-Rəhman ﷺ üçün şərəfdir.

– namazı başlanğıc vaxtında qılmağın əfzəl sayılması; belə ki, səhabələr namazın vaxtı girən kimi onu qılmış və Peyğəmbəri ﷺ gözləməmişlər. Peyğəmbər ﷺ də buna görə onlara etiraz etməmişdir.

– imam namaza gecikdiyi təqdirdə, camaatın arasından Quran və Sünnənin yaxşı bilən əxlaqlı bir adamın onlara imamlıq etməsi – camaat namazını qıldırması;

– camaat namazına qoşulan kimsənin imam salam verdikdən sonra qalxıb buraxdığı rükətləri tamamlaması.

**[٦٣٥]** (...) و حَدَّثَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى: حَدَّثَنَا الْمُعْتَمِرُ عَنْ أَبِيهِ، عَنْ بَكْرٍ، عَنْ الْحَسَنِ، عَنْ ابْنِ الْمُغِيرَةِ، عَنْ أَبِيهِ عَنْ النَّبِيِّ ﷺ بِمِثْلِهِ.

**[635] (...)** ........ Motəmir atasından, o da Bəkrdən, o da Həsəndən, o da Muğirənin oğlundan, o da Muğirədən, o da Peyğəmbərdən ﷺ bu hədisin bənzərini rəvayət etmişdir.

**[٦٣٦] ٨٣**–(...) و حَدَّثَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ وَمُحَمَّدُ بْنُ حَاتِمٍ، جَمِيعًا عَنْ يَحْيَى الْقَطَّانِ، قَالَ ابْنُ حَاتِمٍ: حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ عَنْ التَّيْمِيِّ، عَنْ بَكْرِ بْنِ عَبْدِ اللَّهِ، عَنْ الْحَسَنِ، عَنْ ابْنِ الْمُغِيرَةِ بْنِ شُعْبَةَ، عَنْ أَبِيهِ – قَالَ بَكْرٌ، وَقَدْ سَمِعْتَ مِنَ ابْنِ الْمُغِيرَةِ: أَنَّ النَّبِيَّ ﷺ تَوَضَّأَ، فَمَسَحَ بِنَاصِيَتِهِ، وَعَلَى الْعِمَامَةِ، وَعَلَى الْخُفَّيْنِ.

**[636]-83-(...)** ........ Bəkr (ibn Abdullah) demişdir: "Mən Muğirənin oğlunun belə dediyini eşitmişəm: "Peyğəmbər ﷺ dəstəmaz alıb kəkilinə və əmmaməsinə, (sonra da) məstlərinin üzərinə məsh çəkdi".

**[٦٣٧] ٨٤**–(**٢٧٥**) و حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ وَمُحَمَّدُ بْنُ الْعَلَاءِ قَالَا: حَدَّثَنَا أَبُو مُعَاوِيَةَ؛ **ح**: و حَدَّثَنَا إِسْحَقُ: أَخْبَرَنَا عِيسَى بْنُ يُونُسَ، كِلَاهُمَا عَنْ الأَعْمَشِ، عَنْ الْحَكَمِ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ أَبِي لَيْلَى، عَنْ كَعْبِ بْنِ عُجْرَةَ، عَنْ بِلَالٍ: أَنَّ رَسُولَ اللَّهِ ﷺ مَسَحَ عَلَى الْخُفَّيْنِ وَالْخِمَارِ.

وَفِي حَدِيثِ عِيسَى: حَدَّثَنِي الْحَكَمُ، حَدَّثَنِي بِلَالٌ.

**[637]-84-(275)** ........ Əbu Müaviyə və İsa ibn Yunus – hər ikisi Aməşdən, o da Həkəmdən, o da Abdur-Rəhman ibn Əbu Leyladan o da Kəb ibn Ücrədən, o da Bilaldan rəvayət etmişdir ki, Peyğəmbər ﷺ əmmaməsinin və məstlərinin üzərinə məsh çəkdi.

İsanın hədisində deyilir: "(Hədisi) mənə Həkəm rəvayət etmişdir" O da: "(Onu) mənə Bilal rəvayət etmişdir"– demişdir.

**[٦٣٨]** و حَدَّثَنِيهِ سُوَيْدُ بْنُ سَعِيدٍ: حَدَّثَنَا عَلِيٌّ يَعْنِي ابْنَ مُسْهِرٍ، عَنْ الأَعْمَشِ، بِهَذَا الإِسْنَادِ.

وَقَالَ فِي الْحَدِيثِ: رَأَيْتُ رَسُولَ اللَّهِ ﷺ.

**[638]** ........ (Hədisi) mənə Suveyd ibn Səid rəvayət etmişdir. O da: (Hədisi) bizə Əli ibn Mushir, o da Aməşdən bu isnadla rəvayət etmişdir. Bu hədisdə (Bilal): "Mən Peyğəmbəri ﷺ (belə edərkən) gördüm"– demişdir.

# (٢٤) – بَابُ التَّوْقِيتِ فِي الْمَسْحِ عَلَى الْخُفَّيْنِ

## 24-cü fəsil. Məstlər üzərinə məsh çəkmək üçün təyin edilmiş vaxt

**[٦٣٩]** ٨٥–(٢٧٦) و حَدَّثَنَا إِسْحَقُ بْنُ إِبْرَاهِيمَ الْحَنْظَلِيُّ: أَخْبَرَنَا عَبْدُ الرَّزَّاقِ: أَخْبَرَنَا الثَّوْرِيُّ، عَنْ عَمْرِو بْنِ قَيْسٍ الْمُلاَئِيِّ، عَنْ الْحَكَمِ بْنِ عُتَيْبَةَ، عَنْ الْقَاسِمِ بْنِ مُخَيْمِرَةَ، عَنْ شُرَيْحِ بْنِ هَانِئٍ قَالَ: أَتَيْتُ عَائِشَةَ أَسْأَلُهَا عَنْ الْمَسْحِ عَلَى الْخُفَّيْنِ، فَقَالَتْ: عَلَيْكَ بِابْنِ أَبِي طَالِبٍ فَسَلْهُ، فَإِنَّهُ كَانَ يُسَافِرُ مَعَ رَسُولِ اللَّهِ ﷺ، فَسَأَلْنَاهُ فَقَالَ: جَعَلَ رَسُولُ اللَّهِ ﷺ ثَلاَثَةَ أَيَّامٍ وَلَيَالِيَهُنَّ لِلْمُسَافِرِ، وَيَوْمًا وَلَيْلَةً لِلْمُقِيمِ.

قَالَ: وَكَانَ سُفْيَانُ إِذَا ذَكَرَ عَمْرًا أَثْنَى عَلَيْهِ.

**[639]-85-(276)** ........ Şureyh ibn Hani demişdir: “Mən Aişədən ﵂ məstlərin üzərinə məsh çəkmək barədə soruşmaq üçün onun yanına gəldim. Aişə ﵂ dedi: “Sən Əbu Talibin oğlunun yanına get, ondan soruş. Çünki o, Peyğəmbərlə ﷺ birgə səfərə çıxardı”. Biz (gedib) Əlidən ﵁ (məsh barədə) soruşduq. O dedi: “Peyğəmbər ﷺ üç gün üç gecə müsafir üçün, bir gün bir gecə[1] də yerli sakin üçün (vaxt) təyin etmişdir”.

(Ravi) demişdir: “Süfyan hər dəfə Amrın adını çəkəndə onu tərifləyərdi”.

**[٦٤٠]** (...) و حَدَّثَنَا إِسْحَقُ: أَخْبَرَنَا زَكَرِيَّاءُ بْنُ عَدِيٍّ، عَنْ عُبَيْدِ اللَّهِ بْنِ عَمْرٍو، عَنْ زَيْدِ بْنِ أَبِي أُنَيْسَةَ، عَنْ الْحَكَمِ بِهَذَا الإِسْنَادِ، مِثْلَهُ.

**[640] (...)** ........ İshaq bizə belə rəvayət etmişdir: “Zəkəriyya ibn Adiy bizə Ubeydullah ibn Amrdan, o da Zeyd ibn Əbu Uneysədən, o da Həkəmdən bu isnadla hədisin bənzərini rəvayət etmişdir”.

**[٦٤١]** (...) و حَدَّثَنِي زُهَيْرُ بْنُ حَرْبٍ: حَدَّثَنَا أَبُو مُعَاوِيَةَ، عَنْ الأَعْمَشِ، عَنْ الْحَكَمِ، عَنْ الْقَاسِمِ بْنِ مُخَيْمِرَةَ، عَنْ شُرَيْحِ بْنِ هَانِئٍ قَالَ: سَأَلْتُ عَائِشَةَ عَنْ الْمَسْحِ عَلَى الْخُفَّيْنِ. فَقَالَتْ: ائْتِ عَلِيًّا، فَإِنَّهُ أَعْلَمُ بِذَلِكَ مِنِّي، فَأَتَيْتُ عَلِيًّا، فَذَكَرَ عَنْ النَّبِيِّ ﷺ، بِمِثْلِهِ.

---

[1] Qeyd etmək lazımdır ki, məshin müddəti məsh çəkilən vaxtdan hesab edilir. Həmçinin onu da qeyd etmək lazımdır ki, məshin müddətinin başa çatması dəstəmazı pozmur. Deyək ki, bir adam zöhr namazında dəstəmaz alıb məstləri üzərinə məsh etmiş və növbəti gün zöhr namazınadək hər dəfə dəstəmaz aldıqda bunu təkrar etmişdir. Nəhayət, zöhr namazının vaxtı yetişdikdə, yəni bir gün tamam olduqda, dəstəmazlı halda olarsa, onun dəstəmazı öz qüvvəsində qalar və həmin dəstəmazla namazını qıla bilər.

**[641] (...)** ........ Şureyh ibn Hani demişdir: “Mən Aişədən məstlərin üzərinə məsh çəkmək barədə soruşdum. Dedi: “Əlinin yanına get. Çünki o, bu məsələni məndən yaxşı bilir”. Mən Əlinin yanına gəldim. O, Peyğəmbərdən ﷺ (yuxarıdakı) hədisin bənzərini rəvayət etdi”.

## (٢٥) – بَابُ جَوَازِ الصَّلَوَاتِ كُلِّهَا بِوُضُوءٍ وَاحِدٍ

## 25-ci fəsil. Namazların hamısını bir dəstəmazla qılmağın caiz olması

**[٦٤٢] ٨٦–(٢٧٧)** حَدَّثَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللَّهِ بْنِ نُمَيْرٍ: حَدَّثَنَا أَبِي: حَدَّثَنَا سُفْيَانُ، عَنْ عَلْقَمَةَ بْنِ مَرْثَدٍ؛ ح: و حَدَّثَنِي مُحَمَّدُ بْنُ حَاتِمٍ – وَاللَّفْظُ لَهُ –: حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ، عَنْ سُفْيَانَ قَالَ: حَدَّثَنِي عَلْقَمَةُ بْنُ مَرْثَدٍ، عَنْ سُلَيْمَانَ بْنِ بُرَيْدَةَ، عَنْ أَبِيهِ أَنَّ النَّبِيَّ ﷺ صَلَّى الصَّلَوَاتِ يَوْمَ الْفَتْحِ بِوُضُوءٍ وَاحِدٍ، وَمَسَحَ عَلَى خُفَّيْهِ. فَقَالَ لَهُ عُمَرُ: لَقَدْ صَنَعْتَ الْيَوْمَ شَيْئًا لَمْ تَكُنْ تَصْنَعُهُ. قَالَ: ((عَمْدًا صَنَعْتُهُ يَا عُمَرُ!)).

**[642]-86-(277)** ........ Bureydə ﷺ demişdir: “Peyğəmbər ﷺ (Məkkənin) fəthi günü bütün namazları bir dəstəmazla qıldı və məstlərinin üzərinə məsh çəkdi”. (Bunu görən) Ömər Peyğəmbərə ﷺ: “Sən heç vaxt etmədiyin bir şeyi bu gün etdin”– dedi. Peyğəmbər ﷺ buyurdu: “Mən qəsdən belə etdim, ey Ömər![1]”

## (٢٦) – بَابُ كَرَاهَةِ غَمْسِ الْمُتَوَضِّئِ وَغَيْرِهِ يَدَهُ الْمَشْكُوكُ فِي نَجَاسَتِهَا فِي الإِنَاءِ قَبْلَ غَسْلِهَا ثَلاَثًا

## 26-cı fəsil. Dəstəmaz alanın, habelə qeyrisinin, murdar olduğuna şübhə etdiyi əlini üç dəfə yumadan su qabının içinə salmağın bəyənilməməsi

**[٦٤٣] ٨٧–(٢٧٨)** و حَدَّثَنَا نَصْرُ بْنُ عَلِيٍّ الْجَهْضَمِيُّ، وَحَامِدُ بْنُ عُمَرَ الْبَكْرَاوِيُّ قَالاَ: حَدَّثَنَا بِشْرُ بْنُ الْمُفَضَّلِ، عَنْ خَالِدٍ عَنْ عَبْدِ اللَّهِ بْنِ شَقِيقٍ، عَنْ أَبِي هُرَيْرَةَ، أَنَّ النَّبِيَّ ﷺ قَالَ: ((إِذَا اسْتَيْقَظَ أَحَدُكُمْ مِنْ نَوْمِهِ، فَلاَ يَغْمِسْ يَدَهُ فِي الإِنَاءِ حَتَّى يَغْسِلَهَا ثَلاَثًا، فَإِنَّهُ لاَ يَدْرِي أَيْنَ بَاتَتْ يَدُهُ)).

---

[1] Ömərin ﷺ: “Sən heç vaxt etmədiyin bir şeyi bu gün etdin” sözü onu bildirir ki, Peyğəmbər ﷺ həmişə hər namaz üçün dəstəmaz alarmış. Düzdür, hər namazdan əvvəl dəstəmaz almaq əfzəldir, lakin bir dəstəmazla (həmin dəstəmaz pozulanadək) növbəti namazları qılmaq caizdir.

**[643]-87-(278)** ........ Əbu Hureyrə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurmuşdur: "Biriniz yuxudan oyandığı zaman əlini üç dəfə yumayınca su qabının içinə salmasın. Çünki o, əlinin haralara dəydiyini bilmir".

**[٦٤٤]** (...) حَدَّثَنَا أَبُو كُرَيْبٍ وَأَبُو سَعِيدٍ الأَشَجُّ قَالاَ: حَدَّثَنَا وَكِيعٌ؛ ح: و حَدَّثَنَا أَبُو كُرَيْبٍ: حَدَّثَنَا أَبُو مُعَاوِيَةَ، كِلاَهُمَا عَنْ الأَعْمَشِ، عَنْ أَبِي رَزِينٍ وَأَبِي صَالِحٍ، عَنْ أَبِي هُرَيْرَةَ فِي حَدِيثِ أَبِي مُعَاوِيَةَ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ. وَفِي حَدِيثِ وَكِيعٍ قَالَ: يَرْفَعُهُ، بِمِثْلِهِ.

**[644] (...)** ........ Vəki və Əbu Müaviyə – hər ikisi (bu hədisi) Aməşdən, o da Əbu Rəzindən, o da Əbu Hureyrədən rəvayət etmişdir. Əbu Müaviyə öz rəvayətində: "Peyğəmbər ﷺ belə buyurmuşdur"– demişdir. Vəkinin hədisində isə: "O, (bu hədisi) Peyğəmbərdən ﷺ rəvayət etmişdir" deyilir.

**[٦٤٥]** (...) و حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ وَعَمْرٌو النَّاقِدُ وَزُهَيْرُ بْنُ حَرْبٍ قَالُوا: حَدَّثَنَا سُفْيَانُ بْنُ عُيَيْنَةَ عَنْ الزُّهْرِيِّ، عَنْ أَبِي سَلَمَةَ؛ ح: و حَدَّثَنِيهِ مُحَمَّدُ بْنُ رَافِعٍ: حَدَّثَنَا عَبْدُ الرَّزَّاقِ: أَخْبَرَنَا مَعْمَرٌ عَنْ الزُّهْرِيِّ، عَنْ ابْنِ الْمُسَيَّبِ، كِلاَهُمَا عَنْ أَبِي هُرَيْرَةَ عَنْ النَّبِيِّ ﷺ بِمِثْلِهِ.

**[645] (...)** ........ Əbu Sələmə və İbn Museyyib – hər ikisi Əbu Hureyrədən, o da Peyğəmbərdən ﷺ bu hədisin bənzərini rəvayət etmişdir.

**[٦٤٦]** ٨٨–(...) و حَدَّثَنِي سَلَمَةُ بْنُ شَبِيبٍ قَالَ: حَدَّثَنَا الْحَسَنُ بْنُ أَعْيَنَ: حَدَّثَنَا مَعْقِلٌ عَنْ أَبِي الزُّبَيْرِ، عَنْ جَابِرٍ، عَنْ أَبِي هُرَيْرَةَ أَنَّهُ أَخْبَرَهُ أَنَّ النَّبِيَّ ﷺ قَالَ: ((إِذَا اسْتَيْقَظَ أَحَدُكُمْ فَلْيُفْرِغْ عَلَى يَدِهِ ثَلاَثَ مَرَّاتٍ قَبْلَ أَنْ يُدْخِلَ يَدَهُ فِي إِنَائِهِ فَإِنَّهُ لاَ يَدْرِي فِيمَ بَاتَتْ يَدُهُ)).

**[646]-88-(...)** ........ Əbu Hureyrə ﷺ Peyğəmbərin ﷺ belə dediyini xəbər vermişdir: "Biriniz yuxudan oyandığı zaman, əlini su qabının içinə salmamışdan əvvəl əlinə üç dəfə su töküb (onu yusun). Çünki o, əlinin haralara dəydiyini bilmir".

**[٦٤٧]** (...) و حَدَّثَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ: حَدَّثَنَا الْمُغِيرَةُ يَعْنِي الْحِزَامِيَّ، عَنْ أَبِي الزِّنَادِ، عَنْ الأَعْرَجِ، عَنْ أَبِي هُرَيْرَةَ؛ ح: و حَدَّثَنَا نَصْرُ بْنُ عَلِيٍّ: حَدَّثَنَا عَبْدُ الأَعْلَى عَنْ هِشَامٍ، عَنْ مُحَمَّدٍ، عَنْ أَبِي هُرَيْرَةَ؛ ح: و حَدَّثَنِي أَبُو كُرَيْبٍ: حَدَّثَنَا خَالِدٌ يَعْنِي ابْنَ مَخْلَدٍ، عَنْ مُحَمَّدِ بْنِ جَعْفَرٍ، عَنْ الْعَلاَءِ، عَنْ أَبِيهِ، عَنْ أَبِي هُرَيْرَةَ؛ ح: و حَدَّثَنَا مُحَمَّدُ بْنُ رَافِعٍ، حَدَّثَنَا عَبْدُ الرَّزَّاقِ، حَدَّثَنَا مَعْمَرٌ، عَنْ هَمَّامِ بْنِ مُنَبِّهٍ، عَنْ أَبِي هُرَيْرَةَ؛ ح: و حَدَّثَنِي مُحَمَّدُ بْنُ حَاتِمٍ: حَدَّثَنَا مُحَمَّدُ بْنُ بَكْرٍ؛ ح: و حَدَّثَنَا الْحُلْوَانِيُّ وَابْنُ رَافِعٍ قَالاَ: حَدَّثَنَا عَبْدُ الرَّزَّاقِ قَالاَ جَمِيعًا: أَخْبَرَنَا ابْنُ جُرَيْجٍ أَخْبَرَنِي زِيَادٌ: أَنَّ ثَابِتًا مَوْلَى عَبْدِ الرَّحْمَنِ بْنِ زَيْدٍ أَخْبَرَهُ، أَنَّهُ سَمِعَ أَبَا هُرَيْرَةَ فِي

رِوَايَتِهِمْ، جَمِيعًا عَنْ النَّبِيِّ ﷺ، بِهَذَا الْحَدِيثِ. كُلُّهُمْ يَقُولُ: حَتَّى يَغْسِلَهَا، وَلَمْ يَقُلْ وَاحِدٌ مِنْهُمْ: ثَلاَثًا. إِلاَّ مَا قَدَّمْنَا مِنْ رِوَايَةِ جَابِرٍ، وَابْنِ الْمُسَيَّبِ، وَأَبِي سَلَمَةَ، وَعَبْدِ اللَّهِ بْنِ شَقِيقٍ، وَأَبِي صَالِحٍ، وَأَبِي رَزِينٍ. فَإِنَّ فِي حَدِيثِهِمْ ذِكْرَ الثَّلاَثِ.

**[647] (...)** Muslim bu hədisi ayrı-ayrı beş isnadla Əbu Hureyrədən ﷺ, o da Peyğəmbərdən ﷺ (yuxarıdakı) hədisi rəvayət etmişdir. Ravilərin hamısı: "əlini yumadıqca" sözünü rəvayət etmiş, lakin heç biri: "üç dəfə" sözünü deməmişdir. Ancaq yuxarıda təqdim etdiyimiz Cabirin, İbn Museyyibin, Əbu Sələmənin, Abdullah ibn Şəqiqin, Əbu Salehin və Əbu Rəzinin rəvayətləri isə belə deyildir. Onların rəvayətlərində "üç dəfə" sözü zikr edilmişdir.

## (٢٧) – بَابُ حُكْمِ وُلُوغِ الْكَلْبِ

## 27-ci fəsil. İt yalamasının hökmü[1]

**[٦٤٨] ٨٩-(٢٧٩)** و حَدَّثَنِي عَلِيُّ بْنُ حُجْرٍ السَّعْدِيُّ: حَدَّثَنَا عَلِيُّ بْنُ مُسْهِرٍ: أَخْبَرَنَا الأَعْمَشُ عَنْ أَبِي رَزِينٍ وَأَبِي صَالِحٍ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((إِذَا وَلَغَ الْكَلْبُ فِي إِنَاءِ أَحَدِكُمْ فَلْيُرِقْهُ ثُمَّ لِيَغْسِلْهُ سَبْعَ مِرَارٍ)).

**[648]-89-(279)** ........ Əbu Hureyrə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "İt sizdən birinizin qabından yalasa, onu boşaltsın, sonra o qabı yeddi dəfə yusun".

**[٦٤٩]** (...) و حَدَّثَنِي مُحَمَّدُ بْنُ الصَّبَّاحِ: حَدَّثَنَا إِسْمَعِيلُ بْنُ زَكَرِيَّاءَ عَنْ الأَعْمَشِ بِهَذَا الإِسْنَادِ، مِثْلَهُ. وَلَمْ يَقُلْ: فَلْيُرِقْهُ.

**[649] (...)** ........ Mənə Muhəmməd ibn Səbbah belə rəvayət etmişdir: "Bizə İsmail ibn Zəkəriyya (bu hədisi) Aməşdən bu isnadla rəvayət etmiş, ancaq: "qabı boşaltsın"– deməmişdir.

**[٦٥٠] ٩٠-**(...) حَدَّثَنَا يَحْيَى بْنُ يَحْيَى قَالَ: قَرَأْتُ عَلَى مَالِكٍ عَنْ أَبِي الزِّنَادِ، عَنْ الأَعْرَجِ، عَنْ أَبِي هُرَيْرَةَ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: ((إِذَا شَرِبَ الْكَلْبُ فِي إِنَاءِ أَحَدِكُمْ فَلْيَغْسِلْهُ سَبْعَ مَرَّاتٍ)).

---

[1] Bu fəsildə zikr edilmiş hədislərin hamısı həm itin, həm də onun ağız suyunun murdar olduğuna dəlalət edir.

**[650]-90-(...)** ........ Əbu Hureyrə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “İt sizdən birinizin qabından (su və s.) içsə, o qabı yeddi dəfə yusun”.

**[٦٥١] ٩١**–(...) و حَدَّثَنَا زُهَيْرُ بْنُ حَرْبٍ: حَدَّثَنَا إِسْمَعِيلُ بْنُ إِبْرَاهِيمَ عَنْ هِشَامِ بْنِ حَسَّانَ، عَنْ مُحَمَّدِ بْنِ سِيرِينَ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((طَهُورُ إِنَاءِ أَحَدِكُمْ، إِذَا وَلَغَ فِيهِ الْكَلْبُ، أَنْ يَغْسِلَهُ سَبْعَ مَرَّاتٍ، أُولاَهُنَّ بِالتُّرَابِ)).

**[651]-91-(...)** ........ Əbu Hureyrə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “İt, sizdən birinizin qabından yalayarsa, o qabın pak olması üçün, onu – birincisini torpaqla yumaq şərtilə – yeddi dəfə yumaq lazımdır”.

**[٦٥٢] ٩٢**–(...) حَدَّثَنَا مُحَمَّدُ بْنُ رَافِعٍ: حَدَّثَنَا عَبْدُ الرَّزَّاقِ: حَدَّثَنَا مَعْمَرٌ عَنْ هَمَّامِ بْنِ مُنَبِّهٍ قَالَ: هَذَا مَا حَدَّثَنَا أَبُو هُرَيْرَةَ عَنْ مُحَمَّدٍ رَسُولِ اللَّهِ ﷺ. فَذَكَرَ أَحَادِيثَ مِنْهَا. وَقَالَ رَسُولُ اللَّهِ ﷺ: ((طَهُورُ إِنَاءِ أَحَدِكُمْ، إِذَا وَلَغَ الْكَلْبُ فِيهِ، أَنْ يَغْسِلَهُ سَبْعَ مَرَّاتٍ)).

**[652]-92-(...)** ........ Həmmam ibn Munəbbih: “Bu, Əbu Hureyrənin bizə Allahın elçisi Muhəmməddən ﷺ rəvayət etdikləridir...”– demiş və bir neçə hədis rəvayət etmişdir. Bu hədislərdən biri də budur. “Rəsulullah ﷺ demişdir: “İt sizdən birinizin qabından yalayarsa, o qabın pak olması üçün onu yeddi dəfə yumaq lazımdır”.

**[٦٥٣] ٩٣**–(٢٨٠) و حَدَّثَنَا عُبَيْدُ اللَّهِ بْنُ مُعَاذٍ: حَدَّثَنَا أَبِي: حَدَّثَنَا شُعْبَةُ عَنْ أَبِي التَّيَّاحِ، سَمِعَ مُطَرِّفَ بْنَ عَبْدِ اللَّهِ يُحَدِّثُ عَنِ ابْنِ الْمُغَفَّلِ قَالَ: أَمَرَ رَسُولُ اللَّهِ ﷺ بِقَتْلِ الْكِلاَبِ، ثُمَّ قَالَ: ((مَا بَالُهُمْ وَبَالُ الْكِلاَبِ؟)) ثُمَّ رَخَّصَ فِي كَلْبِ الصَّيْدِ وَكَلْبِ الْغَنَمِ، وَقَالَ: ((إِذَا وَلَغَ الْكَلْبُ فِي الإِنَاءِ فَاغْسِلُوهُ سَبْعَ مَرَّاتٍ، وَعَفِّرُوهُ الثَّامِنَةَ فِي التُّرَابِ)).

**[653]-93-(280)** ........ İbn Muğəffəl demişdir: “Peyğəmbər ﷺ (əvvəlcə) itləri öldürməyi əmr etdi, sonra isə: “Onların itlərdə nə işi var?”– deyə buyurdu.[1] Daha sonra onlara ov iti ilə çoban iti saxlamağa rüsxət verdi və belə buyurdu: “İt, (hər hansı) bir qabı yalasa, onu yeddi dəfə – səkkizincisini də torpaqla sürtərək[2] – yusun”.

---

[1] Peyğəmbər ﷺ əvvəlcə itləri öldürməyi əmr etmiş, sonra da bu hökmü ləğv etmişdir.

[2] Burada yeddisindən birini torpaqla yumaq qəsd edilir. Bundan əvvəlki hədisdə Peyğəmbərin ﷺ: “birincisini torpaqla yumaq şərtilə” sözünə əsasən, birincisini torpaqla yumaq daha münasibdir. Onu da qeyd etmək lazımdır ki, qabı yalayan itin çoban iti, yaxud ov iti, yaxud da tarla iti olması və ya qara rəngdə olub-olmaması heç bir əhəmiyyət kəsb etmir, istənilən halda həmin qab yuyulmalıdır.

**[٦٥٤]** (...) و حَدَّثَنِيهِ يَحْيَى بْنُ حَبِيبٍ الْحَارِثِيُّ: حَدَّثَنَا خَالِدٌ يَعْنِي ابْنَ الْحَارِثِ؛ **ح:** و حَدَّثَنِي مُحَمَّدُ بْنُ حَاتِمٍ: حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ؛ **ح:** و حَدَّثَنِي مُحَمَّدُ بْنُ الْوَلِيدِ: حَدَّثَنَا مُحَمَّدُ بْنُ جَعْفَرٍ، كُلُّهُمْ عَنْ شُعْبَةَ فِي هَذَا الإِسْنَادِ بِمِثْلِهِ، غَيْرَ أَنَّ فِي رِوَايَةِ يَحْيَى بْنِ سَعِيدٍ مِنْ الزِّيَادَةِ: وَرَخَّصَ فِي كَلْبِ الْغَنَمِ وَالصَّيْدِ وَالزَّرْعِ وَلَيْسَ ذَكَرَ الزَّرْعَ فِي الرِّوَايَةِ غَيْرُ يَحْيَى.

**[654] (...)** ........ Xalid ibn Haris, Yəhya ibn Səid və Muhəmməd ibn Cəfər – onların hamısı Şobədən bu isnadla bundan əvvəlki hədisin bənzərini rəvayət etmişdir. Yalnız Yəhya ibn Səidin rəvayətində: "Peyğəmbər ﷺ çoban iti, ov iti və tarla iti[1] saxlamağa rüsxət verdi" əlavəsi vardır. "Tarla iti" isə yalnız Yəhya-nın rəvayətində zikr edilmişdir.

## (٢٨) – بَابُ النَّهْيِ عَنْ الْبَوْلِ فِي الْمَاءِ الرَّاكِدِ

## 28-ci fəsil. Durğun suya bövl etməyin[2] qadağan edilməsi

**[٦٥٥] ٩٤**–(٢٨١) و حَدَّثَنَا يَحْيَى بْنُ يَحْيَى وَمُحَمَّدُ بْنُ رُمْحٍ قَالاَ: أَخْبَرَنَا اللَّيْثُ؛ **ح:** و حَدَّثَنَا قُتَيْبَةُ: حَدَّثَنَا اللَّيْثُ عَنْ أَبِي الزُّبَيْرِ، عَنْ جَابِرٍ عَنْ رَسُولِ اللَّهِ ﷺ أَنَّهُ نَهَى أَنْ يُبَالَ فِي الْمَاءِ الرَّاكِدِ.

**[655]-94-(281)** ........ Cabir ﷺ rəvayət etmişdir ki, Peyğəmbər ﷺ durğun suya bövl etməyi qadağan etmişdir.[3]

**[٦٥٦] ٩٥**–(٢٨٢) و حَدَّثَنِي زُهَيْرُ بْنُ حَرْبٍ: حَدَّثَنَا جَرِيرٌ عَنْ هِشَامٍ، عَنْ ابْنِ سِيرِينَ، عَنْ أَبِي هُرَيْرَةَ عَنْ النَّبِيِّ ﷺ قَالَ: ((لاَ يَبُولَنَّ أَحَدُكُمْ فِي الْمَاءِ الدَّائِمِ ثُمَّ يَغْتَسِلُ مِنْهُ)).

**[656]-95-(282)** ........ Əbu Hureyrə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Heç biriniz durğun suya bövl etməsin. (Ola bilsin ki,) sonra ondan yuyunmaq üçün istifadə etsin".

---

[1] Burada meyvə bağlarını və əkin sahələrini qoruyan it nəzərdə tutulur. Rəvayətlərdən görünür ki, bu üç növ iti – çoban iti, ov iti və tarla iti saxlamaq caizdir.

[2] Bövl etmək – sidik ifraz etmək, təbii ehtiyacı rəf etmək deməkdir.

[3] Bu qadağa, hər cür – istər yüngül, istərsə ağır olsun, – təbii ehtiyacı rəf etməyə aiddir. Həmçinin bir qabın içinə sidik və ya nəcis ifraz edib sonra həmin qabı durğun suya boşaltmaq da bu qadağaya aiddir. Demək, durğun suyun miqdarı az olduğu təqdirdə, onu batırmaq haram sayılır. Hədisdən elə başa düşülür ki, axar çaya sidik və ya nəcis ifraz etmək olar. Buna icazə verilmiş olsa belə, bundan çəkinmək, kənardan baxana ədəbsiz kimi görünməmək daha yaxşıdır.

**[٦٥٧] ٩٦**–(...) و حَدَّثَنَا مُحَمَّدُ بْنُ رَافِعٍ: حَدَّثَنَا عَبْدُ الرَّزَّاقِ: حَدَّثَنَا مَعْمَرٌ عَنْ هَمَّامِ بْنِ مُنَبِّهٍ قَالَ: هَذَا مَا حَدَّثَنَا أَبُو هُرَيْرَةَ عَنْ مُحَمَّدٍ رَسُولِ اللَّهِ ﷺ فَذَكَرَ أَحَادِيثَ مِنْهَا. وَقَالَ رَسُولُ اللَّهِ ﷺ: ((لاَ تَبُلْ فِي الْمَاءِ الدَّائِمِ الَّذِي لاَ يَجْرِي، ثُمَّ تَغْتَسِلُ مِنْهُ)).

**[657]-96-(...)** ........ Həmmam ibn Munəbbih: "Bu, Əbu Hureyrənin bizə Allahın elçisi Muhəmməddən ﷺ rəvayət etdikləridir..."– demiş və bir neçə hədis rəvayət etmişdir. Bu hədislərdən biri də budur. "Rəsulullah ﷺ demişdir: "Heç biriniz axarı olmayan, durğun suya bövl etməsin. (Ola bilsin ki,) sonra ondan yuyunmaq üçün istifadə etsin".

## (٢٩) – بَابُ النَّهْيِ عَنْ الاِغْتِسَالِ فِي الْمَاءِ الرَّاكِدِ

## 29-cu fəsil. Durğun suda qüsl etməyin qadağan olunması

**[٦٥٨] ٩٧**–(٢٨٣) و حَدَّثَنَا هَارُونُ بْنُ سَعِيدٍ الأَيْلِيُّ وَأَبُو الطَّاهِرِ وَأَحْمَدُ بْنُ عِيسَى، جَمِيعًا عَنْ ابْنِ وَهْبٍ، قَالَ هَارُونُ: حَدَّثَنَا ابْنُ وَهْبٍ: أَخْبَرَنِي عَمْرُو بْنُ الْحَارِثِ عَنْ بُكَيْرِ بْنِ الأَشَجِّ أَنَّ أَبَا السَّائِبِ، مَوْلَى هِشَامِ بْنِ زُهْرَةَ حَدَّثَهُ أَنَّهُ سَمِعَ أَبَا هُرَيْرَةَ يَقُولُ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((لاَ يَغْتَسِلْ أَحَدُكُمْ فِي الْمَاءِ الدَّائِمِ وَهُوَ جُنُبٌ)) فَقَالَ: كَيْفَ يَفْعَلُ يَا أَبَا هُرَيْرَةَ؟ قَالَ يَتَنَاوَلُهُ تَنَاوُلاً.

**[658]-97-(283)** ........ Əbu Hureyrə ؓ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Heç biriniz cunub ikən durğun suda qüsl etməsin".

Əbu Saib: "Bəs necə etsin, ey Əbu Hureyrə?"– deyə soruşdu. Əbu Hureyrə dedi: "Bu sudan götürüb (kənarda) yuyunsun".

## (٣٠) – بَابُ وُجُوبِ غَسْلِ الْبَوْلِ وَغَيْرِهِ مِنْ النَّجَاسَاتِ إِذَا حَصَلَتْ فِي الْمَسْجِدِ وَأَنَّ الأَرْضَ تَطْهُرُ بِالْمَاءِ مِنْ غَيْرِ حَاجَةٍ إِلَى حَفْرِهَا

## 30-cu fəsil. Məscidə bulaşan sidiyi və digər nəcasətləri yumağın vacibliyi və (sidik) batmış yerin qazılmasına lüzum olmadan su ilə təmizlənməsi

**[٦٥٩] ٩٨**–(٢٨٤) و حَدَّثَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ: حَدَّثَنَا حَمَّادٌ وَهُوَ ابْنُ زَيْدٍ عَنْ ثَابِتٍ، عَنْ أَنَسٍ أَنَّ أَعْرَابِيًّا بَالَ فِي الْمَسْجِدِ، فَقَامَ إِلَيْهِ بَعْضُ الْقَوْمِ. فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: ((دَعُوهُ [وَ]لاَ تُزْرِمُوهُ)) قَالَ: فَلَمَّا فَرَغَ دَعَا بِدَلْوٍ مِنْ مَاءٍ، فَصَبَّهُ عَلَيْهِ.

**[659]-98-(284)** ........ Ənəs ﷺ demişdir: "(Bir dəfə) bir bədəvi gəlib məscidə bövl etdi. Camaatın bir qismi dərhal qalxıb ona tərəf getdi. (Bunu görəndə) Peyğəmbər ﷺ buyurdu: "Buraxın onu, təbii ehtiyacını rəf etməyə mane olmayın!" Bədəvi işini bitirdikdən sonra (Peyğəmbər ﷺ) bir çəllək su gətizdirib həmin yerə tökdü[1]".

**[٦٦٠] ٩٩**–(...) حَدَّثَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى: حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ الْقَطَّانُ عَنْ يَحْيَى بْنِ سَعِيدٍ الأَنْصَارِيِّ؛ ح: و حَدَّثَنَا يَحْيَى بْنُ يَحْيَى وَقُتَيْبَةُ بْنُ سَعِيدٍ، جَمِيعًا عَنْ الدَّرَاوَرْدِيِّ قَالَ يَحْيَى بْنُ يَحْيَى: أَخْبَرَنَا عَبْدُ الْعَزِيزِ بْنُ مُحَمَّدٍ الْمَدَنِيُّ عَنْ يَحْيَى بْنِ سَعِيدٍ أَنَّهُ سَمِعَ أَنَسَ بْنَ مَالِكٍ يَذْكُرُ: أَنَّ أَعْرَابِيًّا قَامَ إِلَى نَاحِيَةٍ فِي الْمَسْجِدِ، فَبَالَ فِيهَا، فَصَاحَ بِهِ النَّاسُ. فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: ((دَعُوهُ)) فَلَمَّا فَرَغَ أَمَرَ رَسُولُ اللَّهِ ﷺ بِذَنُوبٍ فَصُبَّ عَلَى بَوْلِهِ.

**[660]-99-(...)** ........ Ənəs ibn Malik ﷺ rəvayət etmişdir ki, bir bədəvi məscidin bir tərəfinə çəkilib orada bövl etdi. Camaat (bunu görəndə onun üstünə) qışqırmağa başladı. Onda Peyğəmbər ﷺ: "Buraxın onu!"– deyə buyurdu. Bədəvi təbii ehtiyacını rəf etdikdən sonra Peyğəmbər ﷺ bir qab su gətizdirib sidik bulaşmış yerə tökdürdü.

**[٦٦١] ١٠٠**–(**٢٨٥**) حَدَّثَنَا زُهَيْرُ بْنُ حَرْبٍ: حَدَّثَنَا عُمَرُ بْنُ يُونُسَ الْحَنَفِيُّ: حَدَّثَنَا عِكْرِمَةُ بْنُ عَمَّارٍ: حَدَّثَنَا إِسْحَقُ بْنُ أَبِي طَلْحَةَ: حَدَّثَنِي أَنَسُ بْنُ مَالِكٍ وَهُوَ عَمُّ إِسْحَقَ قَالَ: بَيْنَمَا نَحْنُ فِي الْمَسْجِدِ مَعَ رَسُولِ اللَّهِ ﷺ إِذْ جَاءَ أَعْرَابِيٌّ، فَقَامَ يَبُولُ فِي الْمَسْجِدِ، فَقَالَ أَصْحَابُ رَسُولِ اللَّهِ ﷺ: مَهْ مَهْ، قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((لاَ تُزْرِمُوهُ، دَعُوهُ)) فَتَرَكُوهُ حَتَّى بَالَ، ثُمَّ إِنَّ رَسُولَ اللَّهِ ﷺ دَعَاهُ فَقَالَ لَهُ: ((إِنَّ هَذِهِ الْمَسَاجِدَ لاَ تَصْلُحُ لِشَيْءٍ مِنْ هَذَا الْبَوْلِ وَلاَ الْقَذَرِ، إِنَّمَا هِيَ لِذِكْرِ اللَّهِ عَزَّ وَجَلَّ، وَالصَّلاَةِ، وَقِرَاءَةِ الْقُرْآنِ))، أَوْ كَمَا قَالَ رَسُولُ اللَّهِ ﷺ، قَالَ: فَأَمَرَ رَجُلاً مِنْ الْقَوْمِ، فَجَاءَ بِدَلْوٍ مِنْ مَاءٍ، فَشَنَّهُ عَلَيْهِ.

**[661]-100-(285)** ........ Ənəs ibn Malik ﷺ demişdir: "Bir dəfə biz Peyğəmbərlə ﷺ birlikdə məsciddə olarkən bir bədəvi gəldi və məscidin içində bövl etməyə

---

[1] Bu hədis, insan sidiyinin və nəcisinin murdar olduğuna, habelə məscidin təmiz saxlanılmasının vacib olmasına dəlalət edir. Və əgər məscidin yeri torpaqdırsa, sidik bulaşmış yerə su tökməklə həmin yeri təmizləmək olar. *Nəcasətə bulaşmış* yer və yerlə əlaqəsi olan bina, ağacuğac və s. qurumaqla da təmizlənir. Əbu Qilabə ﷺ demişdir: "Yerin quruması onun təmizlənməsidir". Aişə ﷺ də belə demişdir: "Yer qurumaqla təmizlənir". Hədisi İbn Əbu Şeybə rəvayət etmişdir. Bütün bunlar maye halında olan nəcasətə aiddir. Əgər nəcasət qatı bir şey olarsa, bulaşdığı yeri yalnız nəcasəti yox etməklə, silib təmizləməklə və ya onu götürüb başqa yerə atmaqla təmizləmək olar ("Fiqh əs-Sunnə").

başladı. Peyğəmbərin ﷺ səhabələri (ona): "Dayan, dayan!"– deyə qışqırdılar. Peyğəmbər ﷺ (səhabələrinə): "Ona təbii ehtiyacını rəf etməyə mane olmayın, onu sərbəst buraxın!"– deyə buyurdu. Bədəvi bövl edib qurtaranadək səhabələr ona dəymədilər.[1] Sonra Peyğəmbər ﷺ onu yanına çağırdı və ona belə buyurdu: "Sidik və murdar olan heç bir şey bu məscidlərə bulaşmamalıdır. Bu yerlər İzzətli və Qüdrətli Allahı zikr etmək, namaz qılmaq və Quran oxumaq üçündür".

Yaxud Peyğəmbər ﷺ dediyi kimidir. Sonra Peyğəmbər ﷺ səhabələrdən birinə bir çəllək su gətirməyi əmr etdi və onu sidiyin üstünə tökdü".

## (٣١) – بَابُ حُكْمِ بَوْلِ الطِّفْلِ الرَّضِيعِ وَكَيْفِيَّةِ غَسْلِهِ

## 31-ci fəsil. Südəmər körpənin sidiyinin hökmü və onu yumağın qaydası

**[٦٦٢] ١٠١–(٢٨٦)** حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ وَأَبُو كُرَيْبٍ قَالاَ: حَدَّثَنَا عَبْدُ اللَّهِ بْنُ نُمَيْرٍ: حَدَّثَنَا هِشَامٌ عَنْ أَبِيهِ، عَنْ عَائِشَةَ زَوْجِ النَّبِيِّ ﷺ: أَنَّ رَسُولَ اللَّهِ ﷺ كَانَ يُؤْتَى بِالصِّبْيَانِ فَيُبَرِّكُ عَلَيْهِمْ وَيُحَنِّكُهُمْ، فَأُتِيَ بِصَبِيٍّ فَبَالَ عَلَيْهِ، فَدَعَا بِمَاءٍ، فَأَتْبَعَهُ بَوْلَهُ: وَلَمْ يَغْسِلْهُ.

**[662]-101-(286)** ........ Peyğəmbərin ﷺ zövcəsi Aişə رضي الله عنها demişdir: "(Səhabələr) körpə uşaqları Peyğəmbərin ﷺ yanına gətirərdilər. O da (Allahdan) onlar üçün bərəkət diləyər və xurmanı ağzında əzib körpənin damağına sürtərdi. (Bir dəfə) onun yanına bir körpə gətirdilər və bu uşaq onun üstünü batırdı. Peyğəmbər ﷺ bir qab su gətizdirib körpənin sidiyi bulaşmış yerə tökdü və onu yumadı[2]".

---

[1] Bu hədis cahil ilə mülayim rəftar etməyə, ona bilmədiklərini öyrətməyə və bilmədən etdiyi səhf bir hərəkətə görə onu dərhal cəzalandırmamağa dəlalət edir. Həmçinin hədisdən görünür ki, iki zərərdən birini seçmək qarşısında qaldıqda, zərəri daha az olanı seçmək gərəkdir. Belə ki, əgər səhabələr onu təntitsəydilər, o, məscidin içində qaçmağa başlayar və daha çox yeri batırardı. Elə bu səbəbdən də, Peyğəmbər ﷺ onlara ona dəyməməyi buyurdu.

[2] Burada südəmər oğlan uşağı nəzərdə tutulur. Belə ki, onun sidiyinin bulaşdığı yerin təmizlənməsi üçün həmin yerə su səpmək kifayətdir. Yemək yeyən körpənin, habelə qız uşağının sidiyinin bulaşdığı yeri isə yumaq vacibdir. Əli ibn Əbu Talib رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Oğlan uşağının sidiyinin üstünə su çilənməli, qız uşağının sidiyi *bulaşdığı yer* isə yuyulmalıdır". Qətadə dedi: "Bu, yemək yeməyən körpələrə aiddir. Elə ki, yemək yeməyə başladılar, hər ikisinin sidiyi yuyulmalıdır" ("Musnəd İmam Əhməd", 757; "Sunən Əbu Davud", 376; "Sunən ət-Tirmizi", 71; "Sünən ən-Nəsai", 304). Körpə oğlan uşağı süd əmdiyi müddətdə onun *sidiyinin üstünə* su səpmək bəs edir. Yemək yeməyə başladıqda isə artıq onun yuyulması vacib olur.

**[٦٦٣] ١٠٢**–(...) و حَدَّثَنَا زُهَيْرُ بْنُ حَرْبٍ: حَدَّثَنَا جَرِيرٌ عَنْ هِشَامٍ، عَنْ أَبِيهِ، عَنْ عَائِشَةَ قَالَتْ: أُتِيَ رَسُولُ اللَّهِ ﷺ بِصَبِيٍّ يَرْضَعُ فَبَالَ فِي حَجْرِهِ: فَدَعَا بِمَاءٍ فَصَبَّهُ عَلَيْهِ.

**[663]-102-(...)** ........ Aişə ؓ demişdir: "(Bir dəfə) Peyğəmbərin ﷺ yanına südəmər bir körpə gətirdilər. Uşaq onun qucağına bövl etdi. Peyğəmbər ﷺ bir qab su gətizdirdi və onu sidiyin üzərinə tökdü".

**[٦٦٤]** (...) و حَدَّثَنَا إِسْحَقُ بْنُ إِبْرَاهِيمَ: أَخْبَرَنَا عِيسَى: حَدَّثَنَا هِشَامٌ بِهَذَا الإِسْنَادِ، مِثْلَ حَدِيثِ ابْنِ نُمَيْرٍ.

**[664] (...)** ........ Hişam bu isnadla İbn Numeyrin hədisinin bənzərini rəvayət etmişdir.[1]

**[٦٦٥] ١٠٣**–(٢٨٧) حَدَّثَنَا مُحَمَّدُ بْنُ رُمْحِ بْنِ الْمُهَاجِرِ: أَخْبَرَنَا اللَّيْثُ عَنْ ابْنِ شِهَابٍ، عَنْ عُبَيْدِ اللَّهِ بْنِ عَبْدِ اللَّهِ، عَنْ أُمِّ قَيْسٍ بِنْتِ مِحْصَنٍ أَنَّهَا أَتَتْ رَسُولَ اللَّهِ ﷺ بِابْنٍ لَهَا لَمْ يَأْكُلْ الطَّعَامَ فَوَضَعَتْهُ فِي حَجْرِهِ فَبَالَ قَالَ: فَلَمْ يَزِدْ عَلَى أَنْ نَضَحَ بِالْمَاءِ.

**[665]-103-(287)** ........ Ubeydullah ibn Abdullah demişdir: "Ummu Qeys bint Mihsən hələ yemək yeməyən körpə oğlunu Peyğəmbərin ﷺ yanına gətirdi və uşağı onun qucağına qoydu. Uşaq da (onun üstünə) bövl etdi. Peyğəmbər ﷺ (su gətizdirdi və sidiyin bulaşdığı yerə) su səpməkdən əlavə heç nə etmədi".[2]

**[٦٦٦]** (...) و حَدَّثَنَاه يَحْيَى بْنُ يَحْيَى وَأَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ وَعَمْرٌو النَّاقِدُ وَزُهَيْرُ بْنُ حَرْبٍ، جَمِيعًا عَنْ ابْنِ عُيَيْنَةَ، عَنْ الزُّهْرِيِّ بِهَذَا الإِسْنَادِ، وَقَالَ: فَدَعَا بِمَاءٍ فَرَشَّهُ.

**[666] (...)** ........ Bu hədisi bizə Yəhya ibn Yəhya, Əbu Bəkr ibn Əbu Şeybə, Amr ən-Naqid və Zuheyr ibn Hərb – hamısı ibn Uyeynədən, o da Zuhridən bu isnadla rəvayət etmişlər. (Bu rəvayətdə) o: "Peyğəmbər ﷺ su gətizdirdi və onu (sidiyin üzərinə) çilədi"– demişdir.

**[٦٦٧] ١٠٤**–(...) و حَدَّثَنِيهِ حَرْمَلَةُ بْنُ يَحْيَى: أَخْبَرَنَا ابْنُ وَهْبٍ: أَخْبَرَنِي يُونُسُ بْنُ يَزِيدَ: أَنَّ ابْنَ شِهَابٍ أَخْبَرَهُ قَالَ: أَخْبَرَنِي عُبَيْدُ اللَّهِ بْنُ عَبْدِ اللَّهِ بْنِ عُتْبَةَ بْنِ مَسْعُودٍ أَنَّ أُمَّ قَيْسٍ بِنْتَ مِحْصَنٍ – وَكَانَتْ مِنْ الْمُهَاجِرَاتِ الأُوَلِ اللاَّتِي بَايَعْنَ رَسُولَ اللَّهِ ﷺ، وَهِيَ أُخْتُ عُكَّاشَةَ بْنِ مِحْصَنٍ، أَحَدُ بَنِي أَسَدِ بْنِ خُزَيْمَةَ –

[1] Yəni 662 saylı hədisin bənzərini.

[2] 5762-ci hədisə bax.

قَالَ: أَخْبَرَتْنِي أَنَّهَا أَتَتْ رَسُولَ اللَّهِ ﷺ بِابْنٍ لَهَا لَمْ يَبْلُغْ أَنْ يَأْكُلَ الطَّعَامَ قَالَ عُبَيْدُ اللَّه: أَخْبَرَتْنِي، أَنَّ ابْنَهَا ذَاكَ بَالَ فِي حَجْرِ رَسُولِ اللَّهِ ﷺ فَدَعَا رَسُولُ اللَّهِ ﷺ بِمَاءٍ فَنَضَحَهُ عَلَى ثَوْبِهِ، وَلَمْ يَغْسِلْهُ غَسْلاً.

**[667]-104-(...)** ........ İbn Şihab demişdir: “Ubeydullah ibn Abdullah ibn Utbə ibn Məsud mənə belə rəvayət etmişdir: “(Rəsulullaha ﷺ beyət edən ilk mühacir[1] qadınlardan olmuş, habelə Əsəd ibn Xuzeymənin oğullarından Ukkaşə ibn Mihsənin bacısı) Ummu Qeys bint Mihsən mənə xəbər vermişdir ki, (bir dəfə) o, hələ yemək yeməyən körpə oğlunu Rəsulullahın ﷺ yanına gətirmiş və uşaq da onun qucağına bövl etmişdir. Onda Rəsulullah ﷺ bir qab su gətizdirib onu paltarının üstünə səpmiş və onu yumamışdır”.

## (٣٢) – بَابُ حُكْمِ الْمَنِيِّ

## 32-ci fəsil. Məninin[2] hökmü

**[٦٦٨] ١٠٥–(٢٨٨)** و حَدَّثَنَا يَحْيَى بْنُ يَحْيَى: أَخْبَرَنَا خَالِدُ بْنُ عَبْدِ اللَّه عَنْ خَالِد، عَنْ أَبِي مَعْشَرٍ، عَنْ إِبْرَاهِيمَ، عَنْ عَلْقَمَةَ وَالأَسْوَدِ أَنَّ رَجُلاً نَزَلَ بِعَائِشَةَ، فَأَصْبَحَ يَغْسِلُ ثَوْبَهُ، فَقَالَتْ عَائِشَةُ: إِنَّمَا كَانَ يُجْزِئُكَ، إِنْ رَأَيْتَهُ، أَنْ تَغْسِلَ مَكَانَهُ، فَإِنْ لَمْ تَرَهُ، نَضَحْتَ حَوْلَهُ، وَلَقَدْ رَأَيْتُنِي أَفْرُكُهُ مِنْ ثَوْبِ رَسُولِ اللَّهِ ﷺ فَرْكًا، فَيُصَلِّي فِيهِ.

**[668]-105-(288)** ........ Əlqəmə və Əsvəd belə rəvayət etmişlər: “Bir nəfər Aişənin yanına gəldi və paltarını yumağa başladı. Aişə (bu adama) belə dedi: “Məni̇ni gördüyün təqdirdə sadəcə onun bulaşdığı yeri yumağın sənə yetərdi. Görmədiyin təqdirdə isə onun ətrafına su çilə. Yadıma gəlir ki, mən onu Peyğəmbərin ﷺ libasından ovxalayıb təmizləyərdim.[3] Sonra da Peyğəmbər ﷺ bu libasda namazını qılardı”.

---

[1] Məkkə fəth edilənə qədər, digər şəhərlərdən və vilayətlərdən Mədinəyə köçmüş (hicrət etmiş) Muhəmməd Peyğəmbərin ﷺ səhabələridir.

[2] Məni (sperma) – tənasül vəzilərinin hasil etdiyi mayedir.

[3] Bəzi alimlər məninin murdar olduğunu söyləmişlər. Əslində isə məni təmizdir. Əli ibn Əbu Talib ﷺ, Səd ibn Əbu Vəqqas ﷺ, İbn Ömər ﷺ, Aişə ﷺ, Şafii, Əhməd və əksər mühəddislər onun təmiz olduğunu söyləmişlər. Lakin yaş olduğu halda onu yumaq, quru olduğu halda isə onu ovxalamaq müstəhəbdir. Rəvayət edilir ki, Aişə ﷺ demişdir: “Peyğəmbərin ﷺ paltarına bulaşmış məni quru olduqda, mən onu ovxalayar, yaş olduqda isə onu yuyardım” (“Sunən əd-Daraqutni”, 3; “İrva əl-Gəlil”, 1/196). Bu hədis həmçinin qadının cinsiyyət üzvünün daxilindəki rütubətin murdar olmadığına da dəlalət edir. Belə ki, qadını ilə cinsi əlaqəyə girmiş və tənasül orqanı bu rütubətə bulaşmış kimsəyə, tənasül orqanını yumaq vacib deyildir.

**[٦٦٩] ١٠٦**-(...) و حَدَّثَنَا عُمَرُ بْنُ حَفْصِ بْنِ غِيَاثٍ: حَدَّثَنَا أَبِي عَنْ الأَعْمَشِ، عَنْ إِبْرَاهِيمَ، عَنْ الأَسْوَدِ وَهَمَّامٍ، عَنْ عَائِشَةَ فِي الْمَنِيِّ، قَالَتْ: كُنْتُ أَفْرُكُهُ مِنْ ثَوْبِ رَسُولِ اللَّهِ ﷺ.

**[669]-106-(...)** ........ Həfs ibn Ğiyas Aməşdən, o da İbrahimdən, o da Əsvəd və Həmmamdan, onlar da Aişədən məni haqqında rəvayət etmişlər ki, Aişə demişdir: "Mən (qurumuş) mənini Peyğəmbərin ﷺ libasından ovxalayıb təmizləyərdim".

**[٦٧٠] ١٠٧**-(...) حَدَّثَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ: حَدَّثَنَا حَمَّادٌ يَعْنِي ابْنَ زَيْدٍ، عَنْ هِشَامِ بْنِ حَسَّانَ؛ ح: و حَدَّثَنَا إِسْحَقُ بْنُ إِبْرَاهِيمَ: أَخْبَرَنَا عَبْدَةُ بْنُ سُلَيْمَانَ: حَدَّثَنَا ابْنُ أَبِي عَرُوبَةَ، جَمِيعًا عَنْ أَبِي مَعْشَرٍ؛ ح: و حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا هُشَيْمٌ عَنْ مُغِيرَةَ؛ ح: و حَدَّثَنِي مُحَمَّدُ بْنُ حَاتِمٍ: حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ بْنُ مَهْدِيٍّ عَنْ مَهْدِيِّ بْنِ مَيْمُونٍ، عَنْ وَاصِلٍ الأَحْدَبِ؛ ح: و حَدَّثَنِي ابْنُ حَاتِمٍ: حَدَّثَنَا إِسْحَقُ بْنُ مَنْصُورٍ: حَدَّثَنَا إِسْرَائِيلُ، عَنْ مَنْصُورٍ وَمُغِيرَةَ، كُلُّ هَؤُلاَءِ عَنْ إِبْرَاهِيمَ، عَنْ الأَسْوَدِ، عَنْ عَائِشَةَ فِي حَتِّ الْمَنِيِّ مِنْ ثَوْبِ رَسُولِ اللَّهِ ﷺ، نَحْوَ حَدِيثِ خَالِدٍ عَنْ أَبِي مَعْشَرٍ.

**[670]-107-(...)** Muslim burada, Hişam ibn Həssana, Əbu Məşərə, Muğirəyə, Vasil əl-Əhdəbə, Mənsura və Muğirəyə istinad edilmiş isnadları bir yerə cəm etmişdir. Onların hamısı İbrahimdən, o da Əsvəddən, o da Aişədən, Peyğəmbərin ﷺ paltarındakı (qurumuş) mənini sürtüb təmizlədiyinə dair hədisi rəvayət etmişlər. Bu hədis Xalidin Əbu Məşərdən rəvayət etdiyi hədisə bənzəyir.

**[٦٧١]** (...) و حَدَّثَنِي مُحَمَّدُ بْنُ حَاتِمٍ: حَدَّثَنَا ابْنُ عُيَيْنَةَ عَنْ مَنْصُورٍ، عَنْ إِبْرَاهِيمَ، عَنْ هَمَّامٍ، عَنْ عَائِشَةَ بِنَحْوِ حَدِيثِهِمْ.

**[671] (...)** ........ İbn Uyeynə Mənsurdan, o da İbrahimdən, o da Həmmamdan, o da Aişədən yuxarıdakı hədisin bənzərini rəvayət etmişdir.

**[٦٧٢] ١٠٨**-(**٢٨٩**) حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا مُحَمَّدُ بْنُ بِشْرٍ عَنْ عَمْرِو بْنِ مَيْمُونٍ قَالَ: سَأَلْتُ سُلَيْمَانَ بْنَ يَسَارٍ عَنْ الْمَنِيِّ يُصِيبُ ثَوْبَ الرَّجُلِ، أَيَغْسِلُهُ أَمْ يَغْسِلُ الثَّوْبَ؟ فَقَالَ: أَخْبَرَتْنِي عَائِشَةُ، أَنَّ رَسُولَ اللَّهِ ﷺ كَانَ يَغْسِلُ الْمَنِيَّ ثُمَّ يَخْرُجُ إِلَى الصَّلاَةِ فِي ذَلِكَ الثَّوْبِ، وَأَنَا أَنْظُرُ إِلَى أَثَرِ الْغَسْلِ فِيهِ.

**[672]-108-(289)** ........ Amr ibn Məymun demişdir: "Mən Süleyman ibn Yəsardan kişinin paltarına bulaşmış məni barədə soruşdum. (Dedim ki): "O kimsə məninin (bulaşdığı yerimi), yoxsa bütöv paltarımı yusun?" O belə cavab verdi: "Aişə mənə xəbər vermişdir ki, Peyğəmbər ﷺ (paltarına bulaşmış) mənini yuyar, sonra da həmin paltarda namaza gedərdi. Və mən o paltardakı yuyulmuş yeri görürdüm".

**[٦٧٣]** (...) و حَدَّثَنَا أَبُو كَامِلٍ الْجَحْدَرِيُّ: حَدَّثَنَا عَبْدُ الْوَاحِدِ يَعْنِي ابْنَ زِيَادٍ؛ ح: و حَدَّثَنَا أَبُو كُرَيْبٍ: أَخْبَرَنَا ابْنُ الْمُبَارَكِ وَابْنُ أَبِي زَائِدَةَ، كُلُّهُمْ عَنْ عَمْرِو بْنِ مَيْمُونٍ بِهَذَا الإِسْنَادِ، أَمَّا ابْنُ أَبِي زَائِدَةَ فَحَدِيثُهُ كَمَا قَالَ ابْنُ بِشْرٍ: أَنَّ رَسُولَ اللَّهِ ﷺ كَانَ يَغْسِلُ الْمَنِيَّ. وَأَمَّا ابْنُ الْمُبَارَكِ وَعَبْدُ الْوَاحِدِ فَفِي حَدِيثِهِمَا قَالَتْ: كُنْتُ أَغْسِلُهُ مِنْ ثَوْبِ رَسُولِ اللَّهِ ﷺ.

**[673] (...)** ........ Abdul-Vahid ibn Ziyad, İbn Mubarək və İbn Əbu Zaidə – onların hamısı (bu hədisi) Amr ibn Məymundan bu isnadla rəvayət etmişlər. İbn Əbu Zaidəyə gəlincə, onun rəvayət etdiyi hədis ibn Bişrin dediyi kimidir: "Peyğəmbər ﷺ (paltarına bulaşmış) məni yuyardı". İbn Mubarək və Abdul-Vahidə gəldikdə isə, onların hədislərində Aişə demişdir: "Mən, Peyğəmbərin ﷺ paltarına (bulaşmış) məni yuyardım".

**[٦٧٤] ١٠٩–(٢٩٠)** و حَدَّثَنَا أَحْمَدُ بْنُ جَوَّاسٍ الْحَنَفِيُّ أَبُو عَاصِمٍ: حَدَّثَنَا أَبُو الأَحْوَصِ عَنْ شَبِيبِ بْنِ غَرْقَدَةَ، عَنْ عَبْدِ اللَّهِ بْنِ شِهَابٍ الْخَوْلاَنِيِّ قَالَ: كُنْتُ نَازِلاً عَلَى عَائِشَةَ، فَاحْتَلَمْتُ فِي ثَوْبَيَّ، فَغَمَسْتُهُمَا فِي الْمَاءِ، فَرَأَتْنِي جَارِيَةٌ لِعَائِشَةَ، فَأَخْبَرَتْهَا، فَبَعَثَتْ إِلَيَّ عَائِشَةُ فَقَالَتْ: مَا حَمَلَكَ عَلَى مَا صَنَعْتَ بِثَوْبَيْكَ؟ قَالَ قُلْتُ: رَأَيْتُ مَا يَرَى النَّائِمُ فِي مَنَامِهِ، قَالَتْ: هَلْ رَأَيْتَ فِيهِمَا شَيْئًا؟ قَالَ لاَ، قَالَتْ: فَلَوْ رَأَيْتَ شَيْئًا غَسَلْتَهُ، لَقَدْ رَأَيْتُنِي وَإِنِّي لأَحُكُّهُ مِنْ ثَوْبِ رَسُولِ اللَّهِ ﷺ، يَابِسًا بِظُفُرِي.

**[674]-109-(290)** ........ Abdullah ibn Şihab əl-Xövlani demişdir: "(Bir dəfə) mən Aişənin evinə qonaq gəldim[1] və (orada) ehtilam[2] halına düşdüm. Hər iki paltarım bulaşdığından, mən onları (çıxardıb) suya saldım. Aişənin kənizi məni (qaldığım yerə gəlib nə etdiyimi) gördükdə (bu haqda) Aişəyə xəbər verdi. Aişə məni yanına çağırtdırdı və məndən: "Paltarlarını bu cür yumağa səni vadar edən nədir?"– deyə soruşdu. Dedim: "Yatan adamın yuxuda gördüyü şeyi gördüm". Aişə: "Paltarlarının üstündə bir şey gördünmü?"– deyə soruşdu. Mən: "Xeyr, (görmədim)"– deyə cavab verdim. Aişə dedi: "Əgər bir şey görmüş olsaydın, onu yuyardın. Yadıma gəlir ki, mən onu Peyğəmbərin ﷺ paltarından qurumuş ikən dırnaqlarımla sürtüb təmizləyərdim".

---

[1] Digər rəvayətdə deyilir ki, Aişə رضي الله عنها öz kənizinə, Abdullah ibn Şihaba (yatmaq üçün yer göstərməsini və) üstünü örtmək üçün ona bir bürüncək verməsini buyurdu ("Musnəd İmam Əhməd", 24204; "Sunən ibn Macə", 538).

[2] Ehtilam: ərəbcə ihtələmə (اِحْتَلَمَ) felindən əmələ gəlmiş məsdərdir, yuxuda ikən sperma axıtmaq deməkdir. Başqa cür buna pollyusiya da deyilir.

## (٣٣) – بَابُ نَجَاسَةِ الدَّمِ وَكَيْفِيَّةُ غَسْلِه

## 33-cü fəsil. Qanın murdar sayılması və onu yumağın qaydası

**[٦٧٥] ١١٠-(٢٩١)** و حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا وَكِيعٌ: حَدَّثَنَا هِشَامُ بْنُ عُرْوَةَ؛ ح: و حَدَّثَنِي مُحَمَّدُ بْنُ حَاتِمٍ – وَاللَّفْظُ لَهُ –: حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيد، عَنْ هِشَامِ بْنِ عُرْوَةَ قَالَ: حَدَّثَتْنِي فَاطِمَةُ، عَنْ أَسْمَاءَ، قَالَتْ: جَاءَتْ امْرَأَةٌ إِلَى النَّبِيِّ ﷺ، فَقَالَتْ: ((إِحْدَانَا يُصِيبُ ثَوْبَهَا مِنْ دَمِ الْحَيْضَةِ، كَيْفَ تَصْنَعُ بِهِ؟ قَالَ: تَحُتُّهُ، ثُمَّ تَقْرُصُهُ بِالْمَاءِ، ثُمَّ تَنْضَحُهُ، ثُمَّ تُصَلِّي فِيهِ)).

**[675]-110-(291)** ........ Hişam ibn Urva demişdir: "Fatimə mənə Əsmadan belə rəvayət etmişdir: "(Bir dəfə) bir qadın Peyğəmbərin ﷺ yanına gəlib soruşdu: "Bizdən birimizin paltarına heyz qanı bulaşsa, o, nə etməlidir?" Peyğəmbər ﷺ buyurdu: "Onu (əli ilə) ovxalasın, sonra suya salıb yaxşıca yusun, sonra üstünə su çiləsin, sonra da onunla namaz qılsın[1]".

**[٦٧٦]** (...) و حَدَّثَنَا أَبُو كُرَيْبٍ: حَدَّثَنَا ابْنُ نُمَيْرٍ؛ ح: و حَدَّثَنِي أَبُو الطَّاهِرِ: أَخْبَرَنِي ابْنُ وَهْبٍ: أَخْبَرَنِي يَحْيَى بْنُ عَبْدِ اللَّهِ بْنِ سَالِمٍ وَمَالِكُ بْنُ أَنَسٍ وَعَمْرُو بْنُ الْحَارِثِ، كُلُّهُمْ عَنْ هِشَامِ بْنِ عُرْوَةَ بِهَذَا الإِسْنَادِ، مِثْلَ حَدِيثِ يَحْيَى بْنِ سَعِيدٍ.

**[676] (...)** ........ İbn Numeyr, Yəhya ibn Abdullah ibn Salim, Malik ibn Ənəs və Amr ibn Haris – onların hamısı (bu hədisi) Hişam ibn Urvadan bu isnadla Yəhya ibn Səidin hədisinə bənzər rəvayət etmişlər.

## (٣٤) – بَابُ الدَّلِيلِ عَلَى نَجَاسَةِ الْبَوْلِ وَوُجُوبُ الاسْتِبْرَاءِ مِنْهُ

## 34-cü fəsil. Sidiyin murdar sayılmasına və ondan qorunmağın vacib olmasına dair dəlil

**[٦٧٧] ١١١-(٢٩٢)** حَدَّثَنِي أَبُو سَعِيد الأَشَجُّ وَأَبُو كُرَيْبٍ مُحَمَّدُ بْنُ الْعَلاَءِ وَإِسْحَقُ بْنُ إِبْرَاهِيمَ. قَالَ إِسْحَقُ: أَخْبَرَنَا، وَقَالَ الآخَرَانِ حَدَّثَنَا وَكِيعٌ: حَدَّثَنَا الأَعْمَشُ، قَالَ: سَمِعْتُ مُجَاهِدًا يُحَدِّثُ عَنْ طَاوُسٍ،

---

[1] Burada heyz qanı deyildikdə ona nifas qanı da aid edilir. Hədisdən o da başa düşülür ki, qana bulaşmış paltarı ancaq və ancaq su ilə yumaq gərəkdir və həmin paltar başqa maye ilə deyil, məhz su ilə təmizlənə bilər. Bundan da belə nəticə çıxır ki, cinsiyyət üzvündən çıxan qan murdar sayılır. Həmçinin onu da qeyd etmək lazımdır ki, itin ağzının suyundan fərqli olaraq, bu murdar qanın yuyulması üçün müəyyən say təyin edilməmişdir. Əsas məsələ, onun yaxşıca yuyulmasıdır. Və əgər bir dəfə yumaqla paltar təmizlənərsə, bununla kifayətlənmək yetər.

عَنْ ابْنِ عَبَّاسٍ قَالَ: مَرَّ رَسُولُ اللَّهِ ﷺ عَلَى قَبْرَيْنِ، فَقَالَ: ((أَمَا إِنَّهُمَا لَيُعَذَّبَانِ، وَمَا يُعَذَّبَانِ فِي كَبِيرٍ، أَمَّا أَحَدُهُمَا فَكَانَ يَمْشِي بِالنَّمِيمَةِ، وَأَمَّا الآخَرُ فَكَانَ لاَ يَسْتَتِرُ مِنْ بَوْلِهِ)) قَالَ: فَدَعَا بِعَسِيبٍ رَطْبٍ فَشَقَّهُ بِاثْنَيْنِ، ثُمَّ غَرَسَ عَلَى هَذَا وَاحِدًا، وَعَلَى هَذَا وَاحِدًا، ثُمَّ قَالَ: ((لَعَلَّهُ أَنْ يُخَفَّفُ عَنْهُمَا، مَا لَمْ يَيْبَسَا)).

**[677]-111-(292)** ........ İbn Abbas ﷺ demişdir: “(Bir dəfə) Peyğəmbər ﷺ iki qəbirin yanından keçdi[1] və belə buyurdu: “Bunlar əzab çəkirlər, amma böyük bir şeyə görə əzab çəkmirlər.[2] Onlardan biri söz gəzdirərdi, digəri isə sidiyindən qorunmazdı”. Sonra Peyğəmbər ﷺ yaş bir xurma budağı gətizdirdi. Budağı iki böldü. Bir yarısını (onlardan) birinin, digər yarısını da o birinin (qəbirinin üstünə) sancdı. Sonra buyurdu: “Ola bilsin ki, bunlar quruyanadək onların əzabı yüngülləşsin”.

**[٦٧٨]** (...) حَدَّثَنِيهِ أَحْمَدُ بْنُ يُوسُفَ الأَزْدِيُّ: حَدَّثَنَا مُعَلَّى بْنُ أَسَدٍ: حَدَّثَنَا عَبْدُ الْوَاحِدِ، عَنْ سُلَيْمَانَ الأَعْمَشِ بِهَذَا الإِسْنَادِ، غَيْرَ أَنَّهُ قَالَ: ((وَكَانَ الآخَرُ لاَ يَسْتَنْزِهُ عَنِ الْبَوْلِ - أَوْ مِنَ الْبَوْلِ)).

**[678] (...)** ........ Abdul-Vahid (bu hədisi) Süleyman əl-Aməşdən bu isnadla rəvayət etmişdir. Fəqət bu rəvayətdə (Peyğəmbər ﷺ) demişdir: “...digəri isə sidikdən qorunmazdı”.

[1] Digər rəvayətdə deyilir: “Peyğəmbər ﷺ Mədinə (və ya Məkkə) bostanlarından birinin yanından keçərkən qəbirlərində əzab çəkən iki adamın səsini eşitdi...” (“Səhih əl-Buxari”, 216).

[2] İbn Həcər demişdir: “Yəni söz gəzdirən və sidikdən qorunmayan həmin iki nəfərin iddiasına görə bunlar böyük bir şey deyil. Lakin şəriətə görə bu əməllərin hər ikisi böyük günahlardan sayılır. Bu fikir İbn Abbasdan nəql edilmiş rəvayətdə öz təsdiqini tapmışdır. Həmin rəvayətdə Peyğəmbər ﷺ belə buyurmuşdur: “Bunlar əzab çəkirlər, amma böyük bir şeyə görə əzab çəkmirlər. Əslində isə bu böyük günahdır...” (“Səhih əl-Buxari”, 6055; “Fəth əl-Bari”, 1/78).

# ١ – كِتابُ الحيض

# 1 – Heyz[1] kitabı

## (١) – بَابُ مُبَاشَرَةِ الْحَائِضِ فَوْقَ الإِزَارِ

## 1-ci fəsil. Paltar üstündən heyzli qadına yaxınlaşmaq

**[٦٧٩] ١–(٢٩٣)** حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ وَزُهَيْرُ بْنُ حَرْبٍ وَإِسْحَقُ بْنُ إِبْرَاهِيمَ. قَالَ إِسْحَقُ: أَخْبَرَنَا. وَقَالَ الآخَرَانِ: حَدَّثَنَا جَرِيرٌ عَنْ مَنْصُورٍ، عَنْ إِبْرَاهِيمَ، عَنْ الأَسْوَدِ، عَنْ عَائِشَةَ قَالَتْ: كَانَ إِحْدَانَا، إِذَا كَانَتْ حَائِضًا، أَمَرَهَا رَسُولُ اللَّهِ ﷺ فَتَأْتَزِرُ بِإِزَارٍ، ثُمَّ يُبَاشِرُهَا.

**[679]-1-(293)** ........ Aişə ﵂ demişdir: “Bizdən birimiz[2] heyzli olduğu zaman Peyğəmbər ﷺ ona (ayıb yerlərinə) fitə[3] bağlamağı əmr edər, sonra da onun bədəninə toxunardı[4]”.

**[٦٨٠] ٢–(...)** و حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا عَلِيُّ بْنُ مُسْهِرٍ عَنْ الشَّيْبَانِيِّ؛ ح: و حَدَّثَنِي عَلِيُّ بْنُ حُجْرٍ السَّعْدِيُّ – وَاللَّفْظُ لَهُ –: أَخْبَرَنَا عَلِيُّ بْنُ مُسْهِرٍ أَخْبَرَنَا أَبُو إِسْحَقَ عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ الأَسْوَدِ، عَنْ أَبِيهِ، عَنْ عَائِشَةَ قَالَتْ: كَانَ إِحْدَانَا، إِذَا كَانَتْ حَائِضًا، أَمَرَهَا رَسُولُ اللَّهِ ﷺ أَنْ تَأْتَزِرَ فِي فَوْرِ حَيْضَتِهَا، ثُمَّ يُبَاشِرُهَا، قَالَتْ: وَأَيُّكُمْ يَمْلِكُ إِرْبَهُ كَمَا كَانَ رَسُولُ اللَّهِ ﷺ يَمْلِكُ إِرْبَهُ.

**[680]-2-(...)** ........ Aişə ﵂ demişdir: “Bizdən birimiz heyzli olduğu zaman Peyğəmbər ﷺ ona heyz gördüyü andan (ayıb yerlərinə) fitə bağlamağı əmr edər, sonra da onun bədəninə toxunardı”.

---

[1] Həddi-büluğa çatmış qızlarda, həmçinin qadınlarda hər ay uşaqlıqdan qan ifrazı halıdır; buna adət, aybaşı da deyirlər. Uca Allah buyurur: **“Səndən heyz barəsində soruşurlar. De: “Bu, əziyyətverici bir haldır. Heyz vaxtı qadınlarla *yaxınlıq etməkdən* uzaq olun və pak olmayınca onlarla yaxınlıq etməyin. Onlar təmizləndikdən sonra isə Allahın sizə buyurduğu yerdən onlara yaxınlaşın”. Şübhəsiz ki, Allah tövbə edənləri də sevir, pak olanları da”** (“əl-Bəqərə” surəsi, 222).

Heyzin başlanğıc vaxtına gəlincə, bir çox alimlərin fikrincə qız uşağı doqquz yaşından tez heyz ola bilməz. Əgər bu yaşa çatmazdan əvvəl qan görsə, bu, heyz qanı sayılmaz. Əksinə, bu, xəstəlik qanı hesab edilər. Heyz qanı ömrün sonunadək davam edə bilər. Heyz qanının müəyyən yaş dövründə kəsilməsinə dair heç bir dəlil varid olmamışdır. Demək, yaşlı qadın belə, nə zaman qan görərsə, onu heyz hesab etməlidir.

[2] Burada “biz” deyildikdə Peyğəmbərin ﷺ zövcələri nəzərdə tutulur.

[3] Hamamda çimərkən və ya bir iş görərkən, belə bağlanan qumaş parça.

[4] Yəni əllərini, ayaqlarını və bədənini zövcəsinin bədəninə sürtərdi.

(Aişə ﵂ rəvayətinə davam edib) dedi: "Hansınız öz nəfsini Peyğəmbər ﷺ öz nəfsini saxladığı kimi saxlaya bilər?[1]"

**[٦٨١] ٣-(٢٩٤)** حَدَّثَنَا يَحْيَى بْنُ يَحْيَى: أَخْبَرَنَا خَالِدُ بْنُ عَبْدِ اللَّهِ عَنِ الشَّيْبَانِيِّ، عَنْ عَبْدِ اللَّهِ بْنِ شَدَّادٍ، عَنْ مَيْمُونَةَ قَالَتْ: كَانَ رَسُولُ اللَّهِ ﷺ يُبَاشِرُ نِسَاءَهُ فَوْقَ الإِزَارِ، وَهُنَّ حُيَّضٌ.

**[681]-3-(294)** ........ Məymunə ﵂ demişdir: "Peyğəmbərin ﷺ zövcələri heyzli olduqları zaman o, zövcələrinə fitənin üstündən toxunardı".

## (٢) – بَابُ الاِضْطِجَاعِ مَعَ الْحَائِضِ فِي لِحَافٍ وَاحِدٍ

## 2-ci fəsil. Heyzli qadınla birgə bir yorğan altında yatmaq

**[٦٨٢] ٤-(٢٩٥)** حَدَّثَنِي أَبُو الطَّاهِرِ: أَخْبَرَنَا ابْنُ وَهْبٍ عَنْ مَخْرَمَةَ؛ ح: و حَدَّثَنَا هَارُونُ بْنُ سَعِيدٍ الأَيْلِيُّ وَأَحْمَدُ بْنُ عِيسَى قَالاَ: حَدَّثَنَا ابْنُ وَهْبٍ: أَخْبَرَنِي مَخْرَمَةُ، عَنْ أَبِيهِ، عَنْ كُرَيْبٍ، مَوْلَى ابْنِ عَبَّاسٍ قَالَ: سَمِعْتُ مَيْمُونَةَ زَوْجَ النَّبِيِّ ﷺ قَالَتْ: كَانَ رَسُولُ اللَّهِ ﷺ يَضْطَجِعُ مَعِي وَأَنَا حَائِضٌ، وَبَيْنِي وَبَيْنَهُ ثَوْبٌ.

**[682]-4-(295)** ........ İbn Abbasın mövlası[2] Kureyb demişdir: "Mən Peyğəmbərin ﷺ zövcəsi Məymunənin belə dediyini eşitdim: "Mən heyzli ikən və aramızda bir paltar olduğu halda Peyğəmbər ﷺ mənimlə bir yerdə yatardı[3]".

**[٦٨٣] ٥-(٢٩٦)** حَدَّثَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى: حَدَّثَنَا مُعَاذُ بْنُ هِشَامٍ: حَدَّثَنِي أَبِي عَنْ يَحْيَى بْنِ أَبِي كَثِيرٍ: حَدَّثَنَا أَبُو سَلَمَةَ بْنُ عَبْدِ الرَّحْمَنِ: أَنَّ زَيْنَبَ بِنْتَ أُمِّ سَلَمَةَ حَدَّثَتْهُ أَنَّ أُمَّ سَلَمَةَ حَدَّثَتْهَا قَالَتْ: بَيْنَمَا أَنَا مُضْطَجِعَةٌ مَعَ رَسُولِ اللَّهِ ﷺ فِي الْخَمِيلَةِ إِذْ حِضْتُ، فَانْسَلَلْتُ فَأَخَذْتُ ثِيَابَ حِيضَتِي، فَقَالَ لِي رَسُولُ اللَّهِ ﷺ: ((أَنفِسْتِ؟)) قُلْتُ: نَعَمْ، فَدَعَانِي فَاضْطَجَعْتُ مَعَهُ فِي الْخَمِيلَةِ.

قَالَتْ: وَكَانَتْ هِيَ وَرَسُولُ اللَّهِ ﷺ يَغْتَسِلاَنِ فِي الإِنَاءِ الْوَاحِدِ مِنَ الْجَنَابَةِ.

**[683]-5-(296)** ........ Ummu Sələmə ﵂ demişdir: "Mən Peyğəmbərlə ﷺ bərabər (üzərində naxışlar olan) bir əbaya bürünüb uzandığım zaman gözlənmə-

---

[1] Digər rəvayətdə Aişə ﵂ demişdir: "Peyğəmbər ﷺ orucluqda *zövcələrini* qucaqlayıb öpərdi. *Təbii ki, nəfsini* saxlamaqda ən möhkəm iradəsi olanınız, o idi" ("Səhih əl-Buxari", 1927).

[2] Azad etdiyi köləsi.

[3] Deməк, **"Heyz vaxtı qadınlarla *yaxınlıq etməkdən* uzaq olun və pak olmayınca onlarla yaxınlıq etməyin..."** ayəsindəki qadağa ancaq cinsi əlaqəyə aiddir.

dən heyz oldum. Mən yavaşca qalxıb heyz paltarımı götürdüm. (Paltarımı geyindikdən sonra) Peyğəmbər ﷺ: "Olmaya heyz gördün?"– deyə soruşdu. Mən: "Bəli!"– deyə cavab verdim. O, məni yanına çağırdı və mən onunla birlikdə əbaya bürünüb yatdım".

Ummu Sələmənin qızı Zeynəb demişdir: "Ummu Sələmə Peyğəmbərlə ﷺ birlikdə, (ikisi də cunub olduğu halda) bir qabdan (su götürüb) qüsl edərdi[1]".

## (٣) – بَابُ جَوَازِ غَسْلِ الْحَائِضِ رَأْسَ زَوْجِهَا وَتَرْجِيلِهِ وَطَهَارَةِ سُؤْرِهَا وَالاتِّكَاءِ فِي حِجْرِهَا وَقِرَاءَةِ الْقُرْآنِ فِيهِ

## 3-cü fəsil. Heyzli qadının öz ərinin başını yuyub daramasının caiz olması, onun artığının[2] pak olması, habelə qucağına söykənib Quran oxumağın caiz olması

**[٦٨٤] ٦–(٢٩٧)** حَدَّثَنَا يَحْيَى بْنُ يَحْيَى قَالَ: قَرَأْتُ عَلَى مَالِكٍ عَنْ ابْنِ شِهَابٍ، عَنْ عُرْوَةَ عَنْ عَمْرَةَ، عَنْ عَائِشَةَ قَالَتْ: كَانَ النَّبِيُّ ﷺ، إِذَا اعْتَكَفَ، يُدْنِي إِلَيَّ رَأْسَهُ فَأُرَجِّلُهُ، وَكَانَ لاَ يَدْخُلُ الْبَيْتَ إِلاَّ لِحَاجَةِ الإِنْسَانِ.

**[684]-6-(297)** ........ Aişə رضي الله عنها demişdir: "Peyğəmbər ﷺ (məsciddə) etikaf[3] edərkən başını mənim (hücrəmə)[4] daxil edər və mən onun saçlarını darayardım. O, (etikaf edərkən) zəruri bir ehtiyacı olmadığı təqdirdə, əsla evə gəlməzdi[5]".

**[٦٨٥] ٧–(...)** و حَدَّثَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ: حَدَّثَنَا لَيْثٌ؛ ح: و حَدَّثَنَا مُحَمَّدُ بْنُ رُمْحٍ قَالَ: أَخْبَرَنَا اللَّيْثُ عَنْ ابْنِ شِهَابٍ، عَنْ عُرْوَةَ وَعَمْرَةَ بِنْتِ عَبْدِ الرَّحْمَنِ، أَنَّ عَائِشَةَ زَوْجَ النَّبِيِّ ﷺ قَالَتْ: إِنْ كُنْتُ لأَدْخُلُ الْبَيْتَ لِلْحَاجَةِ وَالْمَرِيضُ فِيهِ، فَمَا أَسْأَلُ عَنْهُ إِلاَّ وَأَنَا مَارَّةٌ وَإِنْ كَانَ رَسُولُ اللَّهِ ﷺ لَيُدْخِلُ عَلَيَّ رَأْسَهُ وَهُوَ فِي الْمَسْجِدِ فَأُرَجِّلُهُ، وَكَانَ لاَ يَدْخُلُ الْبَيْتَ إِلاَّ لِحَاجَةٍ إِذَا كَانَ مُعْتَكِفًا.
و قَالَ ابْنُ رُمْحٍ إِذَا كَانُوا مُعْتَكِفِينَ.

---

[1] Bu, ər-arvadın çılpaq vəziyyətdə bir yerdə çimməsinin caiz olmasına dəlalət edir.

[2] Burada artıq deyildikdə qadının yemək yedikdən və ya su içdikdən sonra qabda qalan artığı nəzərdə tutulur.

[3] Ramazan ayında ibadət məqsədilə məsciddə qalmaq.

[4] Peyğəmbərin ﷺ zövcələrinin hücrələri məscidə bitişik idi.

[5] Çünki etikafda ikən zəruriyyət olmadan məsciddən bayıra çıxmaq, həmin etikafı batil edir.

**[685]-7-(...)** ........ Peyğəmbərin ﷺ zövcəsi Aişə ﵂ demişdir: “Mən (etikaf edərkən), evdə xəstə olduğu halda ancaq zəruri bir ehtiyacım olduğu təqdirdə evə girərdim. Xəstənin halını yalnız onun yanından keçərkən soruşardım. Peyğəmbər ﷺ məsciddə (etikaf edərkən) başını mənim hücrəmə daxil edər və mən onun saçlarını darayardım. O, etikaf edərkən zəruri bir ehtiyacı olmadığı təqdirdə, əsla evə gəlməzdi”.

İbn Rumh demişdir: “etikafda olduqları zaman...”

**[٦٨٦]** ٨–(...) و حَدَّثَنِي هَارُونُ بْنُ سَعِيدٍ الأَيْلِيُّ: حَدَّثَنَا ابْنُ وَهْبٍ: أَخْبَرَنِي عَمْرُو بْنُ الْحَارِثِ عَنْ مُحَمَّدِ بْنِ عَبْدِ الرَّحْمَنِ بْنِ نَوْفَلٍ، عَنْ عُرْوَةَ بْنِ الزُّبَيْرِ، عَنْ عَائِشَةَ زَوْجِ النَّبِيِّ ﷺ أَنَّهَا قَالَتْ: كَانَ رَسُولُ اللَّهِ ﷺ يُخْرِجُ إِلَيَّ رَأْسَهُ مِنَ الْمَسْجِدِ، وَهُوَ مُجَاوِرٌ، فَأَغْسِلُهُ وَأَنَا حَائِضٌ.

**[686]-8-(...)** ........ Peyğəmbərin ﷺ zövcəsi Aişə ﵂ demişdir: “Peyğəmbər ﷺ etikafda ikən məsciddən başını mənə tərəf çıxardar və mən heyzli olduğum halda onu yuyardım”.

**[٦٨٧]** ٩–(...) و حَدَّثَنَا يَحْيَى بْنُ يَحْيَى: أَخْبَرَنَا أَبُو خَيْثَمَةَ عَنْ هِشَامٍ: أَخبَرَنَا عُرْوَةُ، عَنْ عَائِشَةَ [أَنَّهَا]قَالَتْ: كَانَ رَسُولُ اللَّهِ ﷺ يُدْنِي إِلَيَّ رَأْسَهُ وَأَنَا فِي حُجْرَتِي، فَأُرَجِّلُ رَأْسَهُ وَأَنَا حَائِضٌ.

**[687]-9-(...)** ........ Aişə ﵂ demişdir: “Mən hücrəmdə ikən Peyğəmbər ﷺ başını mənə tərəf çıxardar və mən heyzli olduğum halda onun saçlarını darayardım”.

**[٦٨٨]** ١٠–(...) حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا حُسَيْنُ بْنُ عَلِيٍّ عَنْ زَائِدَةَ، عَنْ مَنْصُورٍ، عَنْ إِبْرَاهِيمَ، عَنْ الأَسْوَدِ، عَنْ عَائِشَةَ قَالَتْ: كُنْتُ أَغْسِلُ رَأْسَ رَسُولِ اللَّهِ ﷺ وَأَنَا حَائِضٌ.

**[688]-10-(...)** ........ Aişə ﵂ demişdir: “Mən heyzli olduğum halda Peyğəmbərin ﷺ başını yuyardım”.

**[٦٨٩]** ١١–(٢٩٨) و حَدَّثَنَا يَحْيَى بْنُ يَحْيَى وَأَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ وَأَبُو كُرَيْبٍ، قَالَ يَحْيَى: أَخْبَرَنَا. وَقَالَ الآخَرَان: حَدَّثَنَا أَبُو مُعَاوِيَةَ عَنْ الأَعْمَشِ، عَنْ ثَابِتِ بْنِ عُبَيْدٍ، عَنْ الْقَاسِمِ بْنِ مُحَمَّدٍ، عَنْ عَائِشَةَ قَالَتْ: قَالَ لِي رَسُولُ اللَّهِ ﷺ: ((نَاوِلِينِي الْخُمْرَةَ)) مِنَ الْمَسْجِدِ، قَالَتْ فَقُلْتُ: إِنِّي حَائِضٌ، فَقَالَ: ((إِنَّ حَيْضَتَكِ لَيْسَتْ فِي يَدِكِ)).

**[689]-11-(298)** ........ Aişə ﵂ demişdir: "Rəsulullah ﷺ məsciddə ikən məni (çağırıb): "Səccadəni[1] mənə uzat[2]"– deyə buyurdu. "Mən heyzliyəm"– dedim. (Peyğəmbər ﷺ): "Şübhəsiz ki, sənin heyzin əlində deyildir[3]"– deyə buyurdu.

**[٦٩٠] ١٢**–(...) حَدَّثَنَا أَبُو كُرَيْبٍ: حَدَّثَنَا ابْنُ أَبِي زَائِدَةَ عَنْ حَجَّاجٍ وَابْنِ أَبِي غَنِيَّةَ، عَنْ ثَابِتِ بْنِ عُبَيْدٍ، عَنْ الْقَاسِمِ بْنِ مُحَمَّدٍ، عَنْ عَائِشَةَ قَالَتْ: أَمَرَنِي رَسُولُ اللَّهِ ﷺ أَنْ أُنَاوِلَهُ الْخُمْرَةَ مِنَ الْمَسْجِدِ، فَقُلْتُ: إِنِّي حَائِضٌ، فَقَالَ: ((تَنَاوَلِيهَا، فَإِنَّ الْحَيْضَةَ لَيْسَتْ فِي يَدِكِ)).

**[690]-12-(...)** ........ Aişə ﵂ demişdir: "Peyğəmbər ﷺ məsciddə ikən mənə səccadəni ona uzatmağı buyurdu. Dedim: "Mən heyzliyəm". (Peyğəmbər ﷺ) buyurdu: "Onu mənə uzat. Heç şübhəsiz ki, sənin heyzin əlində deyildir".

**[٦٩١] ١٣**–(٢٩٩) و حَدَّثَنِي زُهَيْرُ بْنُ حَرْبٍ وَأَبُو كَامِلٍ وَمُحَمَّدُ بْنُ حَاتِمٍ، كُلُّهُمْ عَنْ يَحْيَى بْنِ سَعِيدٍ. قَالَ زُهَيْرٌ: حَدَّثَنَا يَحْيَى عَنْ يَزِيدَ بْنِ كَيْسَانَ، عَنْ أَبِي حَازِمٍ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ: بَيْنَمَا رَسُولُ اللَّهِ ﷺ فِي الْمَسْجِدِ، فَقَالَ: ((يَا عَائِشَةُ! نَاوِلِينِي الثَّوْبَ)) فَقَالَتْ: إِنِّي حَائِضٌ. فَقَالَ: ((إِنَّ حَيْضَتَكِ لَيْسَتْ فِي يَدِكِ)) فَنَاوَلَتْهُ.

**[691]-13-(299)** ........ Əbu Hureyrə ﵁ demişdir: "Rəsulullah ﷺ məsciddə ikən (zövcəsinə) dedi: "Ey Aişə! Paltarı mənə uzat!" Aişə: "Mən heyzliyəm"– deyə cavab verdi. (Rəsulullah ﷺ): "Şübhəsiz ki, sənin heyzin əlində deyildir"– deyə buyurdu və Aişə paltarı ona verdi".

**[٦٩٢] ١٤**–(٣٠٠) حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ وَزُهَيْرُ بْنُ حَرْبٍ قَالاَ: حَدَّثَنَا وَكِيعٌ، عَنْ مِسْعَرٍ وَسُفْيَانَ، عَنْ الْمِقْدَامِ بْنِ شُرَيْحٍ، عَنْ أَبِيهِ، عَنْ عَائِشَةَ قَالَتْ: كُنْتُ أَشْرَبُ وَأَنَا حَائِضٌ، ثُمَّ أُنَاوِلُهُ النَّبِيَّ ﷺ، فَيَضَعُ فَاهُ عَلَى مَوْضِعِ فِيَّ، فَيَشْرَبُ، وَأَتَعَرَّقُ الْعَرْقَ وَأَنَا حَائِضٌ، ثُمَّ أُنَاوِلُهُ النَّبِيَّ ﷺ فَيَضَعُ فَاهُ عَلَى مَوْضِعِ فِيَّ. وَلَمْ يَذْكُرْ زُهَيْرٌ: فَيَشْرَبُ.

**[692]-14-(300)** ........ Aişə ﵂ demişdir: "Mən heyzli ikən (bir şey) içər, sonra da (qabı) Peyğəmbərə ﷺ uzadardım. O da ağzını mənim ağzımın dəydiyi yerə qoyub içərdi.[4] Yenə heyzli olduğum halda sümüklü soyutma ətdən dişləyər, sonra da onu Peyğəmbərə ﷺ uzadardım. O da ağzını mənim ağzımın dəydiyi yerə qoyub (ətdən dişləyərdi)".

Zuheyr: "içərdi" sözünü zikr etməmişdir.

---

[1] Müsəlmanların namaz qılanda istifadə etdikləri kiçik xalça, həsir, canamaz.

[2] Qazı İyad ﵀ demişdir: "Həmin vaxt səccadə Aişənin evində idi. Peyğəmbər ﷺ etikafda olduğu üçün məsciddən çıxmaq istəmədiyindən, ona belə buyurmuşdur".

[3] Yəni heyz qanı sənin əlinə bulaşmamışdır və bu halda əlini məscidə uzatmağının heç bir günahı yoxdur.

[4] Bununla, Peyğəmbər ﷺ heyzli qadının ağzının murdar olmadığını göstərir.

**[٦٩٣]** **١٥**–(**٣٠١**) حَدَّثَنَا يَحْيَى بْنُ يَحْيَى: أَخْبَرَنَا دَاوُدُ بْنُ عَبْدِ الرَّحْمَنِ الْمَكِّيُّ عَنْ مَنْصُورٍ، عَنْ أُمِّهِ، عَنْ عَائِشَةَ أَنَّهَا قَالَتْ: كَانَ رَسُولُ اللَّهِ ﷺ يَتَّكِئُ فِي حِجْرِي وَأَنَا حَائِضٌ، فَيَقْرَأُ الْقُرْآنَ.

**[693]-15-(301)** ........ Aişə ﷺ demişdir: "Mən heyzli ikən Peyğəmbər ﷺ başını qucağıma söykəyər, sonra da Quran oxuyardı".

**[٦٩٤]** **١٦**–(**٣٠٢**) و حَدَّثَنِي زُهَيْرُ بْنُ حَرْبٍ: حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ بْنُ مَهْدِيٍّ: حَدَّثَنَا حَمَّادُ بْنُ سَلَمَةَ: حَدَّثَنَا ثَابِتٌ عَنْ أَنَسٍ أَنَّ الْيَهُودَ كَانُوا، إِذَا حَاضَتْ الْمَرْأَةُ فِيهِمْ، لَمْ يُؤَاكِلُوهَا وَلَمْ يُجَامِعُوهُنَّ فِي الْبُيُوتِ، فَسَأَلَ أَصْحَابُ النَّبِيِّ ﷺ النَّبِيَّ ﷺ، فَأَنْزَلَ اللَّهُ تَعَالَى: ﴿ **وَيَسْـَٔلُونَكَ عَنِ ٱلْمَحِيضِ قُلْ هُوَ أَذًى فَٱعْتَزِلُوا۟ ٱلنِّسَآءَ فِى ٱلْمَحِيضِ** ﴾ إِلَى آخِرِ الآيَةِ. فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: ((اصْنَعُوا كُلَّ شَيْءٍ إِلاَّ النِّكَاحَ)) فَبَلَغَ ذَلِكَ الْيَهُودَ فَقَالُوا: مَا يُرِيدُ هَذَا الرَّجُلُ أَنْ يَدَعَ مِنْ أَمْرِنَا شَيْئًا إِلاَّ خَالَفَنَا فِيهِ، فَجَاءَ أُسَيْدُ بْنُ حُضَيْرٍ وَعَبَّادُ بْنُ بِشْرٍ فَقَالاَ: يَا رَسُولَ اللَّهِ! إِنَّ الْيَهُودَ تَقُولُ: كَذَا وَكَذَا. أَفَلاَ نُجَامِعُهُنَّ؟ فَتَغَيَّرَ وَجْهُ رَسُولِ اللَّهِ ﷺ حَتَّى ظَنَنَّا أَنْ قَدْ وَجَدَ عَلَيْهِمَا، فَخَرَجَا فَاسْتَقْبَلَهُمَا هَدِيَّةٌ مِنْ لَبَنٍ إِلَى النَّبِيِّ ﷺ. فَأَرْسَلَ فِي آثَارِهِمَا، فَسَقَاهُمَا، فَعَرَفَا أَنْ لَمْ يَجِدْ عَلَيْهِمَا.

**[694]-16-(302)** ........ Ənəs ﷺ demişdir: "Yəhudilər qadınları heyz olduqda onlarla (bir süfrədə) yemək yeməz və onlarla bir evdə qalmazdılar. Peyğəmbərin ﷺ səhabələri bunun haqqında ondan soruşdular və Uca Allah bu ayəni nazil etdi: **"Səndən heyz barəsində soruşurlar. De: "Bu, əziyyətverici bir haldır. Heyz vaxtı qadınlarla *yaxınlıq etməkdən* uzaq olun və pak olmayınca onlarla yaxınlıq etməyin. Onlar təmizləndikdən sonra isə Allahın sizə buyurduğu yerdən onlara yaxınlaşın". Şübhəsiz ki, Allah tövbə edənləri də sevir, pak olanları da".**[1]

(Ayə nazil olduqdan) sonra Rəsulullah ﷺ buyurdu: "(O halda qadınlarınızla) cinsi əlaqədən başqa, istədiyinizi edə bilərsiniz!" Bu xəbər yəhudilərə çatdıqda onlar dedilər: "Bu adam hər bir işdə bizim etdiklərimizin əksini edir". Useyd ibn Hudeyr və Abbad ibn Bişr (Peyğəmbərin ﷺ yanına) gəlib dedilər: "Ya Rəsulullah! Yəhudilər belə-belə deyirlər. (Onlara müxalif olmaq üçün) heyzli qadınlarla cinsi əlaqəyə girəkmi?" Peyğəmbərin ﷺ sifəti dəyişdi, hətta bizə elə gəldi ki, onun bu iki nəfərə qəzəbi tutmuşdur. Sonra onlar çıxıb getdilər. Onların ardınca Peyğəmbərə ﷺ hədiyyə olaraq süd gətirdilər. Peyğəmbər ﷺ (südü səhabələrdən birinə verib) onların dalınca göndərdi və o, bu

[1] "əl-Bəqərə" surəsi, 222.

süddən onlara içirtdi. Beləliklə də, o iki nəfər Peyğəmbərin ﷺ onlara acığı tutmadığını başa düşdü”[1].

## (٤) – بَابُ الْمَذْيِ

## 4-cü fəsil. Məzi[2] haqqında

**[٦٩٥] ١٧–(٣٠٣)** حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا وَكِيعٌ، وَأَبُو مُعَاوِيَةَ، وَهُشَيْمٌ عَنِ الأَعْمَشِ عَنْ مُنْذِرِ ابْنِ يَعْلَى – وَيُكْنَى أَبَا يَعْلَى – عَنِ ابْنِ الْحَنَفِيَّةِ، عَنْ عَلِيٍّ قَالَ: كُنْتُ رَجُلاً مَذَّاءً وَكُنْتُ أَسْتَحْيِي أَنْ أَسْأَلَ النَّبِيَّ ﷺ، لِمَكَانِ ابْنَتِهِ، فَأَمَرْتُ الْمِقْدَادَ بْنَ الأَسْوَدِ، فَسَأَلَهُ فَقَالَ: ((يَغْسِلُ ذَكَرَهُ وَيَتَوَضَّأُ)).

**[695]-17-(303)** ........ Əli ؓ demişdir: “Məndən tez-tez məzi axırdı. Peyğəmbərin ﷺ kürəkəni olduğumdan dolayı bunun haqqında ondan soruşmağa utanırdım. Bu səbəbdən də mən (bunun hökmünü soruşmağı) Miqdad ibn Əsvədə tapşırdım. Miqdad Peyğəmbərdən ﷺ bunun haqqında soruşduqda o: “Cinsiyyət üzvünü yusun və dəstəmaz alsın!”– deyə buyurdu”.

**[٦٩٦] ١٨–(...)** و حَدَّثَنَا يَحْيَى بْنُ حَبِيبٍ الْحَارِثِيُّ: حَدَّثَنَا خَالِدٌ يَعْنِي ابْنَ الْحَارِثِ: حَدَّثَنَا شُعْبَةُ: أَخْبَرَنِي سُلَيْمَانُ قَالَ: سَمِعْتُ مُنْذِرًا، عَنْ مُحَمَّدِ بْنِ عَلِيٍّ، عَنْ عَلِيٍّ أَنَّهُ قَالَ: اسْتَحْيَيْتُ أَنْ أَسْأَلَ النَّبِيَّ ﷺ عَنِ الْمَذْيِ مِنْ أَجْلِ فَاطِمَةَ، فَأَمَرْتُ الْمِقْدَادَ فَسَأَلَهُ، فَقَالَ: ((مِنْهُ الْوُضُوءُ)).

**[696]-18-(...)** ........ Əli ؓ demişdir: “Fatimə (zövcəm) olduğuna görə mən Peyğəmbərdən ﷺ məzi haqqında soruşmağa utanırdım. Odur ki, (bu işi) Miqdada tapşırdım, o da (bunun hökmünü) ondan soruşdu. Peyğəmbər ﷺ: “Məzi (axdıqda) dəstəmaz almaq gərəkdir!”– deyə buyurdu”.

---

[1] Hədisdən aşağıdakı nəticələr çıxır:
– cinsi əlaqəyə girməmək şərtilə heyzli qadınla yaxınlıq etmək, onunla bir süfrədə oturub yeyib-içmək caizdir;
– Allahın qadağan etdiyi şeylərə məhəl qoymayan kimsəyə qəzəblənmək gərəkdir;
– inciyən adamın ürəyini ələ almaq üçün ona hədiyyə vermək müstəhəbdir.

[2] Bu, cinsi əlaqə barədə düşünərkən və ya zövcə ilə oynaşarkən çıxan ağ rəngli yapışqan mayedir. Hərdən insan onun axdığını hiss eləmir. Məzi həm kişidən, həm də qadından gələ bilər. Məzinin murdar olmasında alimlər həmrəydirlər. Odur ki, bədən məziyə bulaşsa, onun bulaşdığı yeri yumaq vacibdir. Lakin paltar məziyə bulaşarsa, bulaşdığı yerə su səpmək yetərlidir. Çünki bundan qorunmaq çox çətindir. Subay oğlan və qızların paltarları tez-tez məziyə bulaşır. Odur ki, onun hökmünün südəmər körpə sidiyinin hökmündən yüngül olması daha münasibdir. Səhl ibn Hənif rəvayət edir ki, məndən tez-tez məzi gəlirdi. Buna görə də davamlı qüsl edirdim. Mən bunu Peyğəmbərə ﷺ bildirdim. O da belə buyurdu: “Bunun üçün dəstəmaz almaq kifayətdir!” Dedim: “Ey Allahın elçisi! Bəs paltarıma bulaşsa, nə edim?” Peyğəmbər ﷺ buyurdu: “Bir ovuc su götürüb paltarının bulaşdığı yerə səpmək yetər” (“Səhih Əbu Davud”, 210; “İrva əl-Ğəlil”, 1/196).

**[٦٩٧] ١٩**-(...) و حَدَّثَنِي هَارُونُ بْنُ سَعِيدٍ الأَيْلِيُّ وَأَحْمَدُ بْنُ عِيسَى قَالاَ: حَدَّثَنَا ابْنُ وَهْبٍ: أَخْبَرَنِي مَخْرَمَةُ بْنُ بُكَيْرٍ عَنْ أَبِيهِ، عَنْ سُلَيْمَانَ بْنِ يَسَارٍ، عَنْ ابْنِ عَبَّاسٍ قَالَ: قَالَ عَلِيُّ بْنُ أَبِي طَالِبٍ: أَرْسَلْنَا الْمِقْدَادَ بْنَ الأَسْوَدِ إِلَى رَسُولِ اللَّهِ ﷺ، فَسَأَلَهُ عَنْ الْمَذْيِ يَخْرُجُ مِنْ الإِنْسَانِ، كَيْفَ يَفْعَلُ بِهِ؟ فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: ((تَوَضَّأْ، وَانْضَحْ فَرْجَكَ)).

**[697]-19-(...)** ........ İbn Abbas رضي الله عنهما rəvayət edir ki, Əli ibn Əbu Talib رضي الله عنه demişdir: "Biz Miqdad ibn Əsvədi Peyğəmbərin ﷺ yanına yolladıq. Miqdad da ondan: "Adamdan məzi çıxdıqda, o nə etməlidir?"– deyə soruşdu. Peyğəmbər ﷺ: "Dəstəmaz al və tənasül orqanını yu!"– deyə buyurdu".

## (٥) – بَابُ غَسْلِ الْوَجْهِ وَالْيَدَيْنِ إِذَا اسْتَيْقَظَ مِنْ النَّوْمِ

## 5-ci fəsil. Yuxudan oyandıqda üzü və əlləri yumaq

**[٦٩٨] ٢٠**-(٣٠٤) حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ وَأَبُو كُرَيْبٍ قَالاَ: حَدَّثَنَا وَكِيعٌ عَنْ سُفْيَانَ، عَنْ سَلَمَةَ بْنِ كُهَيْلٍ، عَنْ كُرَيْبٍ، عَنْ ابْنِ عَبَّاسٍ: أَنَّ النَّبِيَّ ﷺ قَامَ مِنْ اللَّيْلِ فَقَضَى حَاجَتَهُ، ثُمَّ غَسَلَ وَجْهَهُ وَيَدَيْهِ، ثُمَّ نَامَ.

**[698]-20-(304)** ........ İbn Abbas رضي الله عنهما demişdir: "(Bir dəfə) Peyğəmbər ﷺ gecə yuxudan qalxdı və (gedib) təbii ehtiyacını rəf etdi. Sonra üzünü və əllərini yudu, sonra da (uzanıb) yatdı".

## (٦) – بَابُ جَوَازِ نَوْمِ الْجُنُبِ وَاسْتِحْبَابِ الْوُضُوءِ لَهُ وَغَسْلِ الْفَرْجِ إِذَا أَرَادَ أَنْ يَأْكُلَ أَوْ يَشْرَبَ أَوْ يَنَامَ أَوْ يُجَامِعَ

## 6-cı fəsil. Cunub ikən yatmağın caiz olması, (bu vəziyyətdə ikən) yatmaq üçün dəstəmaz almağın, habelə yemək və ya içmək, yaxud yatmaq, yaxud da cinsi əlaqəyə girmək istədiyi zaman tənasül orqanını yumağın müstəhəb sayılması haqqında

**[٦٩٩] ٢١**-(٣٠٥) حَدَّثَنَا يَحْيَى بْنُ يَحْيَى التَّمِيمِيُّ وَمُحَمَّدُ بْنُ رُمْحٍ قَالاَ: أَخْبَرَنَا اللَّيْثُ؛ ح: و حَدَّثَنَا قُتَيْبَةُ ابْنُ سَعِيدٍ: حَدَّثَنَا لَيْثٌ عَنْ ابْنِ شِهَابٍ، عَنْ أَبِي سَلَمَةَ بْنِ عَبْدِ الرَّحْمَنِ، عَنْ عَائِشَةَ أَنَّ رَسُولَ اللَّهِ ﷺ كَانَ إِذَا أَرَادَ أَنْ يَنَامَ، وَهُوَ جُنُبٌ، تَوَضَّأَ وُضُوءَهُ لِلصَّلاَةِ، قَبْلَ أَنْ يَنَامَ.

**[699]-21-(305)** ........ Aişə ﵂ demişdir: “Peyğəmbər ﷺ cunub ikən yatmaq istədikdə, yatmazdan əvvəl namaz üçün dəstəmaz aldığı kimi dəstəmaz alardı”.

**[٧٠٠] ٢٢**–(...) حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا ابْنُ عُلَيَّةَ، وَوَكِيعٌ، وَغُنْدَرٌ، عَنْ شُعْبَةَ، عَنْ الْحَكَمِ، عَنْ إِبْرَاهِيمَ، عَنْ الأَسْوَدِ، عَنْ عَائِشَةَ قَالَتْ: كَانَ رَسُولُ اللَّهِ ﷺ، إِذَا كَانَ جُنُبًا، فَأَرَادَ أَنْ يَأْكُلَ أَوْ يَنَامَ، تَوَضَّأَ وُضُوءَهُ [لِلصَّلَاةِ].

**[700]-22-(...)** ........ Aişə ﵂ demişdir: “Peyğəmbər ﷺ cunub ikən yemək və ya yatmaq istədikdə (namaz üçün) dəstəmaz aldığı kimi dəstəmaz alardı”.

**[٧٠١]** (...) حَدَّثَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى وَابْنُ بَشَّارٍ قَالاَ جَمِيعاً: حَدَّثَنَا مُحَمَّدُ بْنُ جَعْفَرٍ؛ **ح**: و حَدَّثَنَا عُبَيْدُ اللَّهِ بْنُ مُعَاذ قَالَ: حَدَّثَنَا أَبِي قَالَ: حَدَّثَنَا شُعْبَةُ بِهَذَا الإِسْنَاد.

قَالَ ابْنُ الْمُثَنَّى فِي حَدِيثِهِ: حَدَّثَنَا الْحَكَمُ سَمِعْتُ إِبْرَاهِيمَ يُحَدِّثُ.

**[701] (...)** ........ Muhəmməd ibn Cəfər və Şobə bu isnadla eyni hədisi rəvayət etmişlər. İbn Musənna öz rəvayətində demişdir: “Bizə Həkəm belə rəvayət etmişdir: “Mən İbrahimin belə rəvayət etdiyini eşitmişəm”.

**[٧٠٢] ٢٣**–(٣٠٦) و حَدَّثَنِي مُحَمَّدُ بْنُ أَبِي بَكْرٍ الْمُقَدَّمِيُّ وَزُهَيْرُ بْنُ حَرْبٍ قَالاَ: حَدَّثَنَا يَحْيَى وَهُوَ ابْنُ سَعِيدٍ عَنْ عُبَيْدِ اللَّهِ؛ **ح**: و حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ وَابْنُ نُمَيْرٍ – وَاللَّفْظُ لَهُمَا – قَالَ ابْنُ نُمَيْرٍ: حَدَّثَنَا أَبِي. وَقَالَ أَبُو بَكْرٍ: حَدَّثَنَا أَبُو أُسَامَةَ قَالاَ: حَدَّثَنَا عُبَيْدُ اللَّهِ عَنْ نَافِعٍ، عَنْ ابْنِ عُمَرَ، أَنَّ عُمَرَ قَالَ: يَا رَسُولَ اللَّهِ! أَيَرْقُدُ أَحَدُنَا وَهُوَ جُنُبٌ؟ قَالَ: ((نَعَمْ، إِذَا تَوَضَّأَ)).

**[702]-23-(306)** ........ İbn Ömər ﵄ rəvayət edir ki, (bir dəfə) Ömər: “Ya Rəsulullah! Bizdən birimiz cunub olduğu halda yata bilərmi?”– deyə soruşdu. Peyğəmbər ﷺ buyurdu: “Bəli! Əgər dəstəmaz alsa, (yata bilər)”.

**[٧٠٣] ٢٤**–(...) و حَدَّثَنَا مُحَمَّدُ بْنُ رَافِعٍ: حَدَّثَنَا عَبْدُ الرَّزَّاقِ عَنْ ابْنِ جُرَيْجٍ: أَخْبَرَنِي نَافِعٌ عَنْ ابْنِ عُمَرَ: أَنَّ عُمَرَ اسْتَفْتَى النَّبِيَّ ﷺ فَقَالَ: هَلْ يَنَامُ أَحَدُنَا وَهُوَ جُنُبٌ؟ قَالَ: ((نَعَمْ لِيَتَوَضَّأْ، ثُمَّ لِيَنَمْ، حَتَّى يَغْتَسِلَ إِذَا شَاءَ)).

**[703]-24-(...)** ........ İbn Ömər ﵄ rəvayət edir ki, (bir dəfə) Ömər Peyğəmbərdən ﷺ: “Bizdən birimiz cunub olduğu halda yata bilərmi?”– deyə fitva istədi. Peyğəmbər ﷺ buyurdu: “Bəli! Qoy dəstəmaz alsın, sonra da qüsl etmək istəyənədək (uzanıb) yatsın”.

**[٧٠٤] ٢٥**-(...) و حَدَّثَنِي يَحْيَى بْنُ يَحْيَى قَالَ: قَرَأْتُ عَلَى مَالِكٍ عَنْ عَبْدِ اللَّهِ بْنِ دِينَارٍ، عَنْ ابْنِ عُمَرَ قَالَ: ذَكَرَ عُمَرُ بْنُ الْخَطَّابِ لِرَسُولِ اللَّهِ ﷺ أَنَّهُ تُصِيبُهُ جَنَابَةٌ مِنْ اللَّيْلِ، فَقَالَ لَهُ رَسُولُ اللَّهِ ﷺ: ((تَوَضَّأْ وَاغْسِلْ ذَكَرَكَ ثُمَّ نَمْ)).

**[704]-25-(...)** ........ İbn Ömər رضي الله عنهما rəvayət edir ki, (bir dəfə) Ömər ibn Xəttab gecə cunub olduğunu Peyğəmbərə ﷺ xəbər verdi. Peyğəmbər ﷺ ona belə buyurdu: “Dəstəmaz al, cinsiyyət orqanını yu, sonra da (uzan) yat!”

**[٧٠٥] ٢٦**-(**٣٠٧**) حَدَّثَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ: حَدَّثَنَا لَيْثٌ عَنْ مُعَاوِيَةَ بْنِ صَالِحٍ، عَنْ عَبْدِ اللَّهِ بْنِ أَبِي قَيْسٍ قَالَ: سَأَلْتُ عَائِشَةَ عَنْ وِتْرِ رَسُولِ اللَّهِ ﷺ، فَذَكَرَ الْحَدِيثَ. قُلْتُ: كَيْفَ كَانَ يَصْنَعُ فِي الْجَنَابَةِ؟ أَكَانَ يَغْتَسِلُ قَبْلَ أَنْ يَنَامَ أَمْ يَنَامُ قَبْلَ أَنْ يَغْتَسِلَ؟ قَالَتْ: كُلُّ ذَلِكَ قَدْ كَانَ يَفْعَلُ، رُبَّمَا اغْتَسَلَ فَنَامَ، وَرُبَّمَا تَوَضَّأَ فَنَامَ. قُلْتُ: الْحَمْدُ لِلَّهِ الَّذِي جَعَلَ فِي الأَمْرِ سَعَةً.

**[705]-26-(307)** ........ Abdullah ibn Əbu Qeys demişdir: “Mən Aişədən Rəsulullahın ﷺ Vitr namazı barəsində soruşdum. (O da) hədisi zikr etdi. Dedim: “O, cunub ikən nə edərdi? Yatmazdan əvvəl qüsl edərdimi? Yoxsa qüsl etməzdən əvvəl yatardı?” Aişə dedi: “Hər ikisini edərdi. Bəzən qüsl edər, sonra yatar. Bəzən də dəstəmaz alar, sonra yatardı”. Mən dedim: “(Hər) işdə sərbəstlik verən Allaha həmd olsun!”

**[٧٠٦]** (...) و حَدَّثَنِيهِ زُهَيْرُ بْنُ حَرْبٍ: حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ بْنُ مَهْدِيٍّ؛ **ح**: و حَدَّثَنِيهِ هَارُونُ بْنُ سَعِيدٍ الأَيْلِيُّ: حَدَّثَنَا ابْنُ وَهْبٍ، جَمِيعًا عَنْ مُعَاوِيَةَ بْنِ صَالِحٍ، بِهَذَا الإِسْنَادِ مِثْلَهُ.

**[706] (...)** ........ Abdur-Rəhman ibn Mehdi və İbn Vəhb – hər ikisi Müaviyə ibn Salehdən bu isnadla (bundan öncəki) hədisin bənzərini rəvayət etmişdir.

**[٧٠٧] ٢٧**-(**٣٠٨**) و حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا حَفْصُ بْنُ غِيَاثٍ؛ **ح**: و حَدَّثَنَا أَبُو كُرَيْبٍ: أَخْبَرَنَا ابْنُ أَبِي زَائِدَةَ؛ **ح**: و حَدَّثَنِي عَمْرٌو النَّاقِدُ وَابْنُ نُمَيْرٍ قَالاَ: حَدَّثَنَا مَرْوَانُ بْنُ مُعَاوِيَةَ الْفَزَارِيُّ، كُلُّهُمْ عَنْ عَاصِمٍ، عَنْ أَبِي الْمُتَوَكِّلِ، عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((إِذَا أَتَى أَحَدُكُمْ أَهْلَهُ، ثُمَّ أَرَادَ أَنْ يَعُودَ، فَلْيَتَوَضَّأْ)).

زَادَ أَبُو بَكْرٍ فِي حَدِيثِهِ: بَيْنَهُمَا وُضُوءًا. وَقَالَ: ثُمَّ أَرَادَ أَنْ يُعَاوِدَ.

**[707]-27-(308)** ........ Əbu Səid əl-Xudri ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Sizlərdən biri zövcəsi ilə yaxınlıq etdikdən sonra təkrar yaxınlıq etmək istəsə, qoy dəstəmaz alsın[1]”.

Əbu Bəkr öz rəvayətində demişdir: “İki yaxınlıq arasında dəstəmaz (alsın)”, həmçinin demişdir: “Sonra yenə cinsi əlaqəyə girmək istəsə”.

**[٧٠٨] ٢٨-(٣٠٩)** و حَدَّثَنَا الْحَسَنُ بْنُ أَحْمَدَ بْنِ أَبِي شُعَيْبٍ الْحَرَّانِيُّ: حَدَّثَنَا مِسْكِينٌ يَعْنِي ابْنَ بُكَيْرٍ الْحَذَّاءَ، عَنْ شُعْبَةَ، عَنْ هِشَامِ بْنِ زَيْدٍ، عَنْ أَنَسٍ: أَنَّ النَّبِيَّ ﷺ كَانَ يَطُوفُ عَلَى نِسَائِهِ بِغُسْلٍ وَاحِدٍ.

**[708]-28-(309)** ........ Ənəs ﷺ demişdir: “Peyğəmbər ﷺ zövcələrinin hamısıyla yaxınlıq edər (və bu əsnada, yaxud axırda cəmi) bir dəfə qüsl edərdi”.

## (٧) – بَابُ وُجُوبِ الْغُسْلِ عَلَى الْمَرْأَةِ بِخُرُوجِ الْمَنِيِّ مِنْهَا

## 7-ci fəsil. Məni ifraz etmiş qadına qüsl etməyin vacib olması

**[٧٠٩] ٢٩-(٣١٠)** و حَدَّثَنِي زُهَيْرُ بْنُ حَرْبٍ: حَدَّثَنَا عُمَرُ بْنُ يُونُسَ الْحَنَفِيُّ: حَدَّثَنَا عِكْرِمَةُ بْنُ عَمَّارٍ قَالَ: قَالَ إِسْحَقُ بْنُ أَبِي طَلْحَةَ: حَدَّثَنِي أَنَسُ بْنُ مَالِكٍ قَالَ: جَاءَتْ أُمُّ سُلَيْمٍ وَهِيَ جَدَّةُ إِسْحَقَ، إِلَى رَسُولِ اللَّهِ ﷺ، فَقَالَتْ لَهُ، وَعَائِشَةُ عِنْدَهُ: يَا رَسُولَ اللَّهِ! الْمَرْأَةُ تَرَى مَا يَرَى الرَّجُلُ فِي الْمَنَامِ، فَتَرَى مِنْ نَفْسِهَا مَا يَرَى الرَّجُلُ مِنْ نَفْسِهِ، فَقَالَتْ عَائِشَةُ: يَا أُمَّ سُلَيْمٍ! فَضَحْتِ النِّسَاءَ، تَرِبَتْ يَمِينُكِ – قَوْلُهَا: تَرِبَتْ يَمِينُكِ خَيْرٌ – فَقَالَ لِعَائِشَةَ: ((بَلْ أَنْتِ، فَتَرِبَتْ يَمِينُكِ، نَعَمْ، فَلْتَغْتَسِلْ، يَا أُمَّ سُلَيْمٍ! إِذَا رَأَتْ ذَاكِ)).

**[709]-29-(310)** ........ Ənəs ibn Malik ﷺ demişdir: “(Bir dəfə) İshaqın nənəsi Ummu Suleym Peyğəmbərin ﷺ yanına gəldi. Aişə də orada idi. Ummu Suleym Peyğəmbərdən ﷺ soruşdu ki: “Ya Rəsulullah! Qadın yuxuda kişinin gördüyünü görür, kişinin nəfsində hiss etdiyini, qadın da öz nəfsində hiss edir.[2] (Belə olduqda o nə etməlidir)?” Aişə dedi: “Ey Ummu Suleym! Qadınların gizli saxladığını ifşa etdin, ay yazıq!” Peyğəmbər ﷺ Aişəyə dedi: “Əksinə, bu söz sənə aiddir, yazıq sənsən.[3] Bəli, ey Ummu Suleym! Qadın da bunu gördüyü (və məni axıtdığı) zaman qüsl etməlidir”.

---

[1] Bu hədisin zahirindən, yaxınlıq etdikdən sonra təkrar yaxınlıq etmək istəyən kimsəyə dəstəmaz almağın vacib olduğu görünsə də, digər rəvayətlər bunun müstəhəb olduğuna dəlalət edir. Rəvayətlərdən birində Peyğəmbər ﷺ demişdir: “Dəstəmaz almaq, təkrar yaxınlıq etmək fəallığını artırar” (“Səhih İbn Xuzeymə”, 221; “Mustədrək”, 1/152; “Səhih əl-Cami”, 263).

[2] Yəni yuxuda kişi ilə yaxınlıq etdiyini görür və məni axıtdığını hiss edir.

[3] Peyğəmbər ﷺ demək istəmişdir ki, dini öyrənmək məqsədilə sual verməkdə heç bir qəbahət yoxdur, habelə haqqı öyrənmək və öyrətmək xüsusunda utanmaq olmaz. 712-ci hədisə bax.

**[٧١٠] ٣٠-(٣١١)** حَدَّثَنَا عَبَّاسُ بْنُ الْوَلِيدِ: حَدَّثَنَا يَزِيدُ بْنُ زُرَيْعٍ: حَدَّثَنَا سَعِيدٌ عَنْ قَتَادَةَ، أَنَّ أَنَسَ بْنَ مَالِكٍ حَدَّثَهُمْ، أَنَّ أُمَّ سُلَيْمٍ حَدَّثَتْ، أَنَّهَا سَأَلَتْ نَبِيَّ اللَّهِ ﷺ عَنِ الْمَرْأَةِ تَرَى فِي مَنَامِهَا مَا يَرَى الرَّجُلُ؟ فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: ((إِذَا رَأَتْ ذَلِكِ الْمَرْأَةُ فَلْتَغْتَسِلْ)) فَقَالَتْ أُمُّ سُلَيْمٍ: وَاسْتَحْيَيْتُ مِنْ ذَلِكَ، قَالَتْ: وَهَلْ يَكُونُ هَذَا؟ فَقَالَ نَبِيُّ اللَّهِ ﷺ: ((نَعَمْ، فَمِنْ أَيْنَ يَكُونُ الشَّبَهُ؟ إِنَّ مَاءَ الرَّجُلِ غَلِيظٌ أَبْيَضُ. وَمَاءَ الْمَرْأَةِ رَقِيقٌ أَصْفَرُ، فَمِنْ أَيِّهِمَا عَلاَ، أَوْ سَبَقَ، يَكُونُ مِنْهُ الشَّبَهُ)).

**[710]-30-(311)** ........ Ənəs ibn Malik ﵁ Ummu Suleymdən rəvayət etmişdir ki, o, Peyğəmbərdən ﷺ, yuxusunda kişinin gördüyünü görən qadın haqqında soruşdu. Peyğəmbər ﷺ: "Qadın onu[1] gördüyü zaman qüsl etməlidir"– deyə buyurdu.

Ummu Suleym dedi: Mən onun bu sözündən utandım. (Ummu Suleym) soruşdu: "(Əcəba, qadın) su[2] görə bilərmi?" Peyğəmbər ﷺ buyurdu: "Bəli! Yoxsa oxşarlıq haradan olur?![3] (Biləsən ki,) kişinin suyu qatı və ağ rəngdə, qadınınki isə duru və sarı rəngdə olur. Və hansı birinin suyu digərini üstələsə, yaxud qabaqlasa, oxşarlıq da ondan olur".

**[٧١١] ٣١-(٣١٢)** حَدَّثَنَا دَاوُدُ بْنُ رُشَيْدٍ: حَدَّثَنَا صَالِحُ بْنُ عُمَرَ: حَدَّثَنَا أَبُو مَالِكٍ الأَشْجَعِيُّ، عَنْ أَنَسِ بْنِ مَالِكٍ قَالَ: سَأَلَتِ امْرَأَةٌ رَسُولَ اللَّهِ ﷺ، عَنِ الْمَرْأَةِ تَرَى فِي مَنَامِهَا مَا يَرَى الرَّجُلُ فِي مَنَامِهِ؟ فَقَالَ: ((إِذَا كَانَ مِنْهَا مَا يَكُونُ مِنَ الرَّجُلِ، فَلْتَغْتَسِلْ)).

**[711]-31-(312)** ........ Ənəs ibn Malik ﵁ demişdir: "Bir qadın Peyğəmbərdən ﷺ, kişinin yuxuda gördüyünü, öz yuxusunda görən qadın haqqında soruşdu. Peyğəmbər ﷺ buyurdu: "Əgər kişinin düşdüyü hala düşərsə, qüsl etsin".

**[٧١٢] ٣٢-(٣١٣)** و حَدَّثَنَا يَحْيَى بْنُ يَحْيَى التَّمِيمِيُّ: أَخْبَرَنَا أَبُو مُعَاوِيَةَ عَنْ هِشَامِ بْنِ عُرْوَةَ، عَنْ أَبِيهِ عَنْ زَيْنَبَ بِنْتِ أَبِي سَلَمَةَ، عَنْ أُمِّ سَلَمَةَ قَالَتْ: جَاءَتْ أُمُّ سُلَيْمٍ إِلَى النَّبِيِّ ﷺ، فَقَالَتْ: يَا رَسُولَ اللَّهِ! إِنَّ اللَّهَ لاَ يَسْتَحْيِي مِنَ الْحَقِّ فَهَلْ عَلَى الْمَرْأَةِ مِنْ غُسْلٍ إِذَا احْتَلَمَتْ؟ فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: ((نَعَمْ، إِذَا رَأَتِ الْمَاءَ)) فَقَالَتْ أُمُّ سَلَمَةَ: يَا رَسُولَ اللَّهِ! وَتَحْتَلِمُ الْمَرْأَةُ؟ فَقَالَ: ((تَرِبَتْ يَدَاكِ، فَبِمَ يُشْبِهُهَا وَلَدُهَا)).

**[712]-32-(313)** ........ Ummu Sələmə ﵂ rəvayət edir ki, Ummu Suleym Peyğəmbərin ﷺ yanına gəlib dedi: "Ya Rəsulullah! Allah haqqı deməkdən həya etməz.[4] Qadın ehtilam[5] halına düşdükdə qüsl etməlidirmi?" Peyğəmbər ﷺ buyur-

---

[1] Yəni sperma.

[2] Burada "su" deyildikdə məni, sperma nəzərdə tutulur.

[3] Qadına və ya kişiyə oxşarlıq qəsd edilir.

[4] Uca Allah buyurur: **"Həqiqətən, Allah ağcaqanadı və *istər böyüklükdə, istərsə də kiçiklikdə* ondan da üstün olanı məsəl çəkməkdən utanmaz"** ("əl-Bəqərə" surəsi, 26).

[5] 674-cü hədisin qeydlərinə bax.

du: “Bəli, əgər su görübsə (məni axıdıbsa,) etməlidir!” Ummu Sələmə dedi: “Ya Rəsulullah! Heç qadın da ehtilam halına düşə bilərmi?” Peyğəmbər ﷺ buyurdu: “Ay yazıq! Belə olmasa, övladı ona necə oxşaya bilər?”

**[٧١٣]** (...) حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ وَزُهَيْرُ بْنُ حَرْبٍ قَالاَ: حَدَّثَنَا وَكِيعٌ؛ ح: و حَدَّثَنَا ابْنُ أَبِي عُمَرَ: حَدَّثَنَا سُفْيَانُ، جَمِيعًا عَنْ هِشَامِ بْنِ عُرْوَةَ بِهَذَا الإِسْنَادِ، مِثْلَ مَعْنَاهُ. وَزَادَ: قَالَتْ قُلْتُ: فَضَحْتِ النِّسَاءَ.

**[713] (...)** ........ Vəki və Süfyan – hər ikisi bu isnadla Hişam ibn Urvadan həmin hədisin bənzərini rəvayət etmişdir. Burada: “Dedim: “Qadınların gizli saxladığını ifşa etdin...” sözü də əlavə edilmişdir.

**[٧١٤]** (٣١٤) و حَدَّثَنَا عَبْدُ الْمَلِكِ بْنُ شُعَيْبِ بْنِ اللَّيْثِ: حَدَّثَنِي أَبِي عَنْ جَدِّي: حَدَّثَنِي عُقَيْلُ بْنُ خَالِدٍ، عَنْ ابْنِ شِهَابٍ أَنَّهُ قَالَ: أَخْبَرَنِي عُرْوَةُ بْنُ الزُّبَيْرِ أَنَّ عَائِشَةَ زَوْجَ النَّبِيِّ ﷺ أَخْبَرَتْهُ أَنَّ أُمَّ سُلَيْمٍ – أُمَّ بَنِي أَبِي طَلْحَةَ – دَخَلَتْ عَلَى رَسُولِ اللَّهِ ﷺ، بِمَعْنَى حَدِيثِ هِشَامٍ، غَيْرَ أَنَّ فِيهِ قَالَ: قَالَتْ عَائِشَةُ: فَقُلْتُ لَهَا: أُفٍّ لَكِ أَتَرَى الْمَرْأَةُ ذَلِكِ؟

**[714] (314)** ........ Urva ibn Zubeyr Peyğəmbərin ﷺ zövcəsi Aişədən رضي الله عنها: “(Əbu Təlhə oğullarının anası) Ummu Suleym Peyğəmbərin ﷺ hüzuruna gəldi...” deyərək (bu hədisi) Hişamın hədisinə bənzər rəvayət etmişdir. Ancaq bu rəvayətdə Aişə demişdir: “Mən ona: “Uf, sənə! Heç qadın da su görə bilərmi?”– dedim”.

**[٧١٥] ٣٣**–(...) حَدَّثَنَا إِبْرَاهِيمُ بْنُ مُوسَى الرَّازِيُّ وَسَهْلُ بْنُ عُثْمَانَ وَأَبُو كُرَيْبٍ – وَاللَّفْظُ لأَبِي كُرَيْبٍ – قَالَ سَهْلٌ: حَدَّثَنَا. و قَالَ الآخَرَانِ: أَخْبَرَنَا ابْنُ أَبِي زَائِدَةَ عَنْ أَبِيهِ، عَنْ مُصْعَبِ بْنِ شَيْبَةَ، عَنْ مُسَافِعِ بْنِ عَبْدِ اللَّهِ، عَنْ عُرْوَةَ بْنِ الزُّبَيْرِ، عَنْ عَائِشَةَ؛ أَنَّ امْرَأَةً قَالَتْ لِرَسُولِ اللَّهِ ﷺ: هَلْ تَغْتَسِلُ الْمَرْأَةُ إِذَا احْتَلَمَتْ وَأَبْصَرَتْ الْمَاءَ؟ فَقَالَ: ((نَعَمْ)) فَقَالَتْ لَهَا عَائِشَةُ: تَرِبَتْ يَدَاكِ، وَأُلَّتْ. قَالَتْ: فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: ((دَعِيهَا، وَهَلْ يَكُونُ الشَّبَهُ إِلاَّ مِنْ قِبَلِ ذَلِكِ، إِذَا عَلاَ مَاؤُهَا مَاءَ الرَّجُلِ أَشْبَهَ الْوَلَدُ أَخْوَالَهُ، وَإِذَا عَلاَ مَاءُ الرَّجُلِ مَاءَهَا أَشْبَهَ أَعْمَامَهُ)).

**[715]-33-(...)** ........ Aişə رضي الله عنها belə rəvayət etmişdir: “Bir qadın Peyğəmbərdən ﷺ: “Qadın ehtilam halına düşsə və (paltarında) su görsə, qüsl etməlidirmi?”– deyə soruşdu. Peyğəmbər ﷺ: “Bəli!”– deyə cavab verdi. (Bunu eşidəndə) Aişə o qadına dedi: “Ay yazıq, ay biçarə!” Peyğəmbər ﷺ də (Aişəyə) belə dedi: “Onu sərbəst burax. Əlbəttə ki, oxşarlıq məhz bu sudan olur. (Biləsən,) qadının (köks sümüyündən axan) suyu kişinin (belindən gələn) suyu üstələdikdə uşaq dayılarına oxşayır. Kişinin suyu qadının suyunu üstələdikdə isə uşaq əmilərinə oxşayır”.

## (٨) – بَابُ بَيَانِ صِفَةِ مَنِيِّ الرَّجُلِ وَالْمَرْأَةِ وَأَنَّ الْوَلَدَ مَخْلُوقٌ مِنْ مَائِهِمَا

## 8-ci fəsil. Kişi və qadın mənilərinin nə şəkildə olduğunun, habelə uşağın, kişinin (bel sümüyündən) və qadının (köks sümüyündən çıxan) sudan yaranmış olduğunun bəyan edilməsi

**[٧١٦] ٣٤–(٣١٥)** حَدَّثَنِي الْحَسَنُ بْنُ عَلِيٍّ الْحُلْوَانِيُّ: حَدَّثَنَا أَبُو تَوْبَةَ – وَهُوَ الرَّبِيعُ بْنُ نَافِعٍ –: حَدَّثَنَا مُعَاوِيَةُ يَعْنِي ابْنَ سَلَّامٍ، عَنْ زَيْدٍ يَعْنِي أَخَاهُ، أَنَّهُ سَمِعَ أَبَا سَلَّامٍ، قَالَ: حَدَّثَنِي أَبُو أَسْمَاءَ الرَّحَبِيُّ: أَنَّ ثَوْبَانَ مَوْلَى رَسُولِ اللَّهِ ﷺ حَدَّثَهُ قَالَ: كُنْتُ قَائِمًا عِنْدَ رَسُولِ اللَّهِ ﷺ، فَجَاءَ حِبْرٌ مِنْ أَحْبَارِ الْيَهُودِ فَقَالَ: السَّلَامُ عَلَيْكَ يَا مُحَمَّدُ! فَدَفَعْتُهُ دَفْعَةً كَادَ يُصْرَعُ مِنْهَا. فَقَالَ: لِمَ تَدْفَعُنِي؟ فَقُلْتُ: أَلاَ تَقُولُ يَا رَسُولَ اللَّهِ؟ فَقَالَ الْيَهُودِيُّ: إِنَّمَا نَدْعُوهُ بِاسْمِهِ الَّذِي سَمَّاهُ بِهِ أَهْلُهُ. فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: ((إِنَّ اسْمِي مُحَمَّدٌ الَّذِي سَمَّانِي بِهِ أَهْلِي)) فَقَالَ الْيَهُودِيُّ: جِئْتُ أَسْأَلُكَ، فَقَالَ لَهُ رَسُولُ اللَّهِ ﷺ: ((أَيَنْفَعُكَ شَيْءٌ إِنْ حَدَّثْتُكَ؟)) قَالَ: أَسْمَعُ بِأُذُنَيَّ، فَنَكَتَ رَسُولُ اللَّهِ ﷺ بِعُودٍ مَعَهُ، فَقَالَ: ((سَلْ)) فَقَالَ الْيَهُودِيُّ: أَيْنَ يَكُونُ النَّاسُ يَوْمَ تُبَدَّلُ الأَرْضُ غَيْرَ الأَرْضِ وَالسَّمَوَاتُ؟ فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: ((هُمْ فِي الظُّلْمَةِ دُونَ الْجِسْرِ)) قَالَ: فَمَنْ أَوَّلُ النَّاسِ إِجَازَةً؟ قَالَ: ((فُقَرَاءُ الْمُهَاجِرِينَ)) قَالَ الْيَهُودِيُّ: فَمَا تُحْفَتُهُمْ حِينَ يَدْخُلُونَ الْجَنَّةَ؟ قَالَ: ((زِيَادَةُ كَبِدِ النُّونِ)) قَالَ: فَمَا غِذَاؤُهُمْ عَلَى إِثْرِهَا؟ قَالَ: ((يُنْحَرُ لَهُمْ ثَوْرُ الْجَنَّةِ الَّذِي كَانَ يَأْكُلُ مِنْ أَطْرَافِهَا)) قَالَ: فَمَا شَرَابُهُمْ عَلَيْهِ؟ قَالَ: ((مِنْ عَيْنٍ فِيهَا تُسَمَّى سَلْسَبِيلاً)) قَالَ: صَدَقْتَ، قَالَ: وَجِئْتُ أَسْأَلُكَ عَنْ شَيْءٍ لاَ يَعْلَمُهُ أَحَدٌ مِنْ أَهْلِ الأَرْضِ، إِلاَّ نَبِيٌّ أَوْ رَجُلٌ أَوْ رَجُلاَنِ. قَالَ: ((يَنْفَعُكَ إِنْ حَدَّثْتُكَ؟)) قَالَ: أَسْمَعُ بِأُذُنَيَّ. قَالَ جِئْتُ أَسْأَلُكَ عَنِ الْوَلَدِ؟ قَالَ: ((مَاءُ الرَّجُلِ أَبْيَضُ وَمَاءُ الْمَرْأَةِ أَصْفَرُ، فَإِذَا اجْتَمَعَا، فَعَلاَ مَنِيُّ الرَّجُلِ مَنِيَّ الْمَرْأَةِ، أَذْكَرَا بِإِذْنِ اللَّهِ، وَإِذَا عَلاَ مَنِيُّ الْمَرْأَةِ مَنِيَّ الرَّجُلِ، آنَثَا بِإِذْنِ اللَّهِ)) قَالَ الْيَهُودِيُّ: لَقَدْ صَدَقْتَ، وَإِنَّكَ لَنَبِيٌّ، ثُمَّ انْصَرَفَ فَذَهَبَ.
فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: ((لَقَدْ سَأَلَنِي هَذَا عَنِ الَّذِي سَأَلَنِي عَنْهُ، وَمَا لِي عِلْمٌ بِشَيْءٍ مِنْهُ، حَتَّى أَتَانِيَ اللَّهُ بِهِ)).

**[716]-34-(315)** ........ Rəsulullahın ﷺ mövlası Sovban ؓ demişdir: “Mən Peyğəmbərin ﷺ yanında durmuşdum. Bu vaxt yəhudilərin baş keşişlərindən biri gəlib dedi: “Sənə salam olsun, ey Muhəmməd!” Onda mən onu itələdim və o, az qaldı ki yıxıla. Yəhudi: “Niyə məni itələyirsən?”– dedi. Dedim: “Sən niyə “ey Allahın elçisi” demirsən?” Yəhudi: “Biz onu ancaq ailəsinin ona qoyduğu adla çağırırıq”– dedi. Peyğəmbər ﷺ buyurdu: “Şübhəsiz ki, mənim adım, ailəmin mənə verdiyi Muhəmməddir”. Yəhudi dedi: “Sənə (bir neçə) sual vermək üçün gəlmişəm”. Peyğəmbər ﷺ ona belə buyurdu: “Məgər mənim dediklərimin sənə bir faydası olacaqmı?” (Yəhudi) dedi: “Bu qulaqlarımla səni dinləyəcəyəm!” Peyğəmbər ﷺ əlindəki ağacı yerə vura-vura: “Soruş!”– deyə buyurdu. Yəhudi dedi: “Yer başqa bir yerlə, göylər də (başqa göylərlə) əvəz olunacağı gün insanlar harada olacaqlar?” Peyğəmbər ﷺ dedi: “Onlar (qıl) körpüsünün

qarşısında, zülmət içində olacaqlar". (Yəhudi) soruşdu: "İnsanlardan onu ilk əvvəl kimlər keçəcək?" (Peyğəmbər ﷺ): "Kasıb mühacirlər!"– deyə cavab verdi. Yəhudi soruşdu: "Cənnətə daxil olduqda onların ilk töhfəsi nə olacaq?" (Peyğəmbər ﷺ) buyurdu: "Balinanın qaraciyərinin (ən dadlı) yeri". (Yəhudi) soruşdu: "Bəs bunun ardınca onların yeməyi nə olacaq?" (Peyğəmbər ﷺ) buyurdu: "Onlar üçün Cənnətin ətrafında otlayan Cənnət öküzü kəsiləcəkdir". (Yəhudi) soruşdu: "Bunun üstündən nə içəcəklər?" Peyğəmbər ﷺ buyurdu: "(Onlar) Cənnətdəki Səlsəbil[1] adlanan bir bulaqdan (içəcəklər)". (Yəhudi): "Doğru söylədin!"– deyə (onun dediklərini təsdiqlədi, sonra da sözünə davam edib) dedi: "Səndən yer əhlindən heç kəsin bilmədiyi, yalnız peyğəmbərin, yaxud bir-iki kişinin də bildiyi bir şey haqqında soruşmağa gəlmişəm". (Peyğəmbər ﷺ) buyurdu: "Əcəba, mənim dediklərimin sənə bir faydası olacaqmı?" (Yəhudi) dedi: "Bu qulaqlarımla səni dinləyəcəyəm! Səndən uşağın (yaranışı) barəsində soruşmağa gəlmişəm". (Peyğəmbər ﷺ) buyurdu: "Kişinin mənisi ağ rəngdə, qadınınkı isə sarı rəngdə olur. Bunlar birləşdiyi zaman kişinin mənisi qadının mənisini üstələsə, Allahın izini ilə dünyaya oğlan uşağı gətirərlər. Və əgər qadının mənisi kişininkini üstələsə, Allahın izini ilə dünyaya qız uşağı gətirərlər". Yəhudi: "Doğru söylədin. Sən, həqiqətən də, peyğəmbərsən"– dedi və çıxıb getdi.

(O getdikdən sonra) Peyğəmbər ﷺ buyurdu: "Bu adam məndən soruşduğunu soruşdu. Halbuki buna dair mənim heç bir bilgim yox idi. Nəhayət, bu haqda bilgini Allah mənə vəhy etdi".

**[٧١٧]** (...) حَدَّثَنِيهِ عَبْدُ اللَّهِ بْنُ عَبْدِ الرَّحْمَنِ الدَّارِمِيُّ: أَخْبَرَنَا يَحْيَى بْنُ حَسَّانَ: حَدَّثَنَا مُعَاوِيَةُ بْنُ سَلَّامٍ فِي هَذَا الإِسْنَادِ، بِمِثْلِهِ، غَيْرَ أَنَّهُ قَالَ: كُنْتُ قَاعِدًا عِنْدَ رَسُولِ اللَّهِ ﷺ. وَقَالَ: زَائِدَةُ كَبِدِ النُّونِ. وَقَالَ أَذْكَرَ وَآنَثَ. وَلَمْ يَقُلْ أَذْكَرَا وَآنَثَا.

**[717] (...)** ........ Müaviyə ibn Səllam bu isnad sayəsində həmin hədisin bənzərini rəvayət etmişdir. Fəqət (bu rəvayətdə Sovban) demişdir: "Mən Peyğəmbərin ﷺ yanında oturmuşdum..."

(Həmçinin deyilir ki,) Peyğəmbər ﷺ buyurdu: "Balinanın qaraciyərinin (ən dadlı) tərəfi olacaq". Və bir də: "(Allahın izini ilə dünyaya) oğlan uşağı və ya qız uşağı gətirərlər" yerinə, "oğlan uşağı və ya qız uşağı gətirər"– deyilir.

---

[1] Uca Allah buyurur: **"Orada onlara zəncəfil qatılmış *şərab* badəsi içirdiləcək. *Bu elə* bir bulaqdandır ki, *o, Cənnətdə* Səlsəbil adlanır"** ("əl-İnsan" surəsi, 17-18).

## (٩) – بَابُ صِفَةِ غُسْلِ الْجَنَابَةِ

## 9-cu fəsil. Cənabətli ikən qüsl[1] etməyin qaydası

**[٧١٨] ٣٥-(٣١٦)** حَدَّثَنَا يَحْيَى بْنُ يَحْيَى التَّمِيمِيُّ: حَدَّثَنَا أَبُو مُعَاوِيَةَ عَنْ هِشَامِ بْنِ عُرْوَةَ، عَنْ أَبِيهِ عَنْ عَائِشَةَ قَالَتْ: كَانَ رَسُولُ اللَّهِ ﷺ، إِذَا اغْتَسَلَ مِنَ الْجَنَابَةِ، يَبْدَأُ فَيَغْسِلُ يَدَيْهِ، ثُمَّ يُفْرِغُ بِيَمِينِهِ عَلَى شِمَالِهِ،

---

[1] Qüsl: bədənin hər yerini su ilə yumaq deməkdir. Qüsl, şəriət tərəfindən vacib buyurulmuşdur. Uca Allah buyurur: ***"Yaxınlıq edib* natəmiz olmuşsunuzsa, qüsl edin"** ("əl-Maidə" surəsi, 6).

Aşağıdakı hallarda qüsl etmək vacibdir:

– yuxuda və ya ayıq ikən, qadından və ya kişidən şəhvətlə məni ifraz olunduqda; (683 və 718 saylı hədislərə bax.)

– kişilik əzasının başı qadının cinsiyyət orqanında qeyb olduqda (məni axıtmasalar belə, hər ikisinə qüsl etmək vacib olur); Bu xüsusda Peyğəmbər ﷺ: demişdir: "Kişinin tənasül orqanı qadının cinsi orqanına daxil olarsa, məni axıtmış olsa da, olmasa da, (hər ikisinə) qüsl etmək vacib olar" ("Sunən əl-Beyhəqi", 1/163; "Səhih əl-Cami", 387).

– qadınlara, heyz və ya nifasdan təmizləndikdə; (694-cü hədisə bax.)

– müsəlman bəndə vəfat etdikdə, onu yuyub qüsl etmək; Ummu Ətiyyə əl-Ənsariyyə رضي الله عنها rəvayət edir ki, Peyğəmbərin ﷺ qızı *Zeynəb* vəfat etdikdə, Peyğəmbər ﷺ bizim yanımıza gəldi və belə buyurdu: "Onu üç və ya beş dəfə yaxud məsləhət bilirsinizsə, bundan da çox su və sidr ilə yuyun..." ("Səhih əl-Buxari", 1253).

– kafir İslamı qəbul etdikdə. Əbu Hureyra رضي الله عنه demişdir: "(Bir vaxt) Peyğəmbər ﷺ Nəcdə bir dəstə atlı göndərdi. Onlar oradan Bəni Hənifə qəbiləsindən olan Sumamə ibn Usal adlı bir nəfəri (tutub Mədinəyə gətirdilər və onu) məsciddəki dirəklərdən birinə bağladılar. Bu əsnada Peyğəmbər ﷺ onun yanına gəlib dedi: "Nə düşünürsən, ey Sumamə?" Sumamə dedi: "(Hər şey) yaxşıdır, ey Muhəmməd! Məni öldürsən, əli qana batmış bir canini öldürmüş olarsan. Məni azad etsən, minnətdar olan bir adama yaxşılıq etmiş olarsan. Yox əgər pul istəyirsənsə, dilədiyin qədər istəyə bilərsən." Səhəri gün Peyğəmbər ﷺ (yenə) onun yanına gəlib dedi: "Nə fikirləşirsən, ey Sumamə?" Sumamə dedi: "(Dünən) sənə dediyim kimi, əgər məni azad etsən, minnətdar olan bir adama yaxşılıq etmiş olarsan". Peyğəmbər ﷺ onu qoyub getdi. Ertəsi gün (yenə) onun yanına gəlib dedi. "Nə düşünürsən, ey Sumamə?" Sumamə dedi: "(Dünən) sənə dediklərimi". Peyğəmbər ﷺ: "Sumaməni azad edin!"– dedi, sonra Sumamə məscidin yanındakı xurmalığa gedib **qüsl etdi** və gəlib məscidə daxil oldu. (Bu vaxt Sumamə ona yaxınlaşıb) dedi: "Mən şahidlik edirəm ki, Allahdan başqa (ibadətə layiq olan) məbud yoxdur və şahidlik edirəm ki, Muhəmməd Allahın elçisidir. Ey Muhəmməd, vallahi ki, yer üzündə sənin üzündən daha çox nifrət etdiyim bir üz yox idi. İndi isə sənin üzün mənim üçün ən əziz üzdür. Vallahi, sənin dinindən daha çox nifrət etdiyim bir din yox idi. İndi isə sənin dinin mənim üçün ən əziz bir dindir. Vallahi, sənin şəhərindən daha çox nifrət etdiyim bir şəhər yox idi. İndi isə sənin şəhərin mənim üçün ən əziz şəhərdir. Mən ümrə etmək istəyərkən sənin atlıların məni yaxaladılar. Bu haqda nə deyə bilərsən?" Peyğəmbər ﷺ onu müjdələdi və ona ümrəni yerinə yetirməyi əmr etdi. Sumamə Məkkəyə gəlib çatdıqda, bir nəfər ondan: "Sabiimi olmusan?"– deyə soruşdu. Dedi: "Xeyr, mən Allahın elçisi Muhəmmədlə ﷺ birgə Allaha təslim olmuşam. Allaha and olsun ki, Peyğəmbərin ﷺ izni olmadan Yəmamədən sizə bir buğda dənəsi belə gəlməyəcəkdir". ("Səhih əl-Buxari", 4372); İmam Əhmədin "Musnəd" əsərində deyilir: "...Peyğəmbər ﷺ onu azad edib Əbu Təlhənin bostanına göndərdi və ona qüsl etməyi əmr etdi. O da qüsl edib iki rükət namaz qıldı. Peyğəmbər ﷺ dedi: "Qardaşınızın İslamı qəbul etməsi çox gözəl oldu" (16/188).

فَيَغْسِلُ فَرْجَهُ، ثُمَّ يَتَوَضَّأُ وُضُوءَهُ لِلصَّلاَةِ، ثُمَّ يَأْخُذُ الْمَاءَ. فَيُدْخِلُ أَصَابِعَهُ فِي أُصُولِ الشَّعْرِ، حَتَّى إِذَا رَأَى أَنْ قَدْ اسْتَبْرَأَ، حَفَنَ عَلَى رَأْسِهِ ثَلاَثَ حَفَنَاتٍ، ثُمَّ أَفَاضَ عَلَى سَائِرِ جَسَدِهِ، ثُمَّ غَسَلَ رِجْلَيْهِ.

**[718]-35-(316)** ........ Aişə ﵂ rəvayət edir ki, Peyğəmbər ﷺ cunub olduqdan sonra qüsl etdikdə əvvəlcə əllərini yuyardı. Sonra sağ əli ilə su götürüb sol əlinin üstünə tökər və cinsiyyət orqanını yuyardı. Sonra namaz üçün dəstəmaz aldığı kimi dəstəmaz alardı. Sonra suyu ovuclayıb barmaqlarını saçlarının dibinə (qədər) salar və başının hər yerinə su dəydiyinə əmin oluncayadək (onu) yuyardı. (Sonra) suyu ovuclayıb başına üç ovuc su tökər, sonra da bütün bədəninə su əndərərdi. Axırda da ayaqlarını yuyardı".

**[٧١٩]** (...) و حَدَّثَنَاه قُتَيْبَةُ بْنُ سَعِيدٍ وَزُهَيْرُ بْنُ حَرْبٍ قَالاَ: حَدَّثَنَا جَرِيرٌ؛ ح: و حَدَّثَنَا عَلِيُّ بْنُ حُجْرٍ: حَدَّثَنَا عَلِيُّ بْنُ مُسْهِرٍ؛ ح: و حَدَّثَنَا أَبُو كُرَيْبٍ: حَدَّثَنَا ابْنُ نُمَيْرٍ، كُلُّهُمْ عَنْ هِشَامٍ فِي هَذَا الإِسْنَادِ، وَلَيْسَ فِي حَدِيثِهِمْ غَسْلُ الرِّجْلَيْنِ.

**[719] (...)** ........ Cərir, Əli ibn Mushir və İbn Numeyr – onların hamısı (bu hədisi) Hişamdan bu isnadla rəvayət etmişlər. Onların rəvayətində ayaqların yuyulması zikr edilməmişdir.

**[٧٢٠] ٣٦**-(...) و حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا وَكِيعٌ: حَدَّثَنَا هِشَامٌ، عَنْ أَبِيهِ، عَنْ عَائِشَةَ أَنَّ النَّبِيَّ ﷺ اغْتَسَلَ مِنْ الْجَنَابَةِ، فَبَدَأَ فَغَسَلَ كَفَّيْهِ ثَلاَثًا، ثُمَّ ذَكَرَ نَحْوَ حَدِيثِ أَبِي مُعَاوِيَةَ، وَلَمْ يَذْكُرْ غَسْلَ الرِّجْلَيْنِ.

**[720]-36-(...)** ........ (Burada Vəki, Hişamdan, o da atasından) : "Aişə rəvayət etmişdir ki, Peyğəmbər ﷺ cunub olduqdan sonra qüsl etdikdə əvvəlcə əllərini üç dəfə yudu..."– demiş və (hədisi) Əbu Müaviyənin rəvayət etdiyi hədisə bənzər rəvayət etmiş, lakin ayaqların yuyulmasını zikr etməmişdir.

**[٧٢١]** (...) و حَدَّثَنَاه عَمْرٌو النَّاقِدُ: حَدَّثَنَا مُعَاوِيَةُ بْنُ عَمْرٍو: حَدَّثَنَا زَائِدَةُ عَنْ هِشَامٍ، قَالَ: أَخْبَرَنِي عُرْوَةُ، عَنْ عَائِشَةَ، أَنَّ رَسُولَ اللَّهِ ﷺ كَانَ، إِذَا اغْتَسَلَ مِنْ الْجَنَابَةِ، بَدَأَ فَغَسَلَ يَدَيْهِ قَبْلَ أَنْ يُدْخِلَ يَدَهُ فِي الإِنَاءِ، ثُمَّ تَوَضَّأَ مِثْلَ وُضُوئِهِ لِلصَّلاَةِ.

**[721] (...)** ........ Aişə ﵂ rəvayət edir ki, Peyğəmbər ﷺ cunub olduqdan sonra qüsl etdikdə, əlini suya salmamışdan əvvəl əllərini yuyardı. Sonra namaz üçün dəstəmaz aldığı kimi dəstəmaz alardı.

**[٧٢٢] ٣٧-(٣١٧)** و حَدَّثَنِي عَلِيُّ بْنُ حُجْرٍ السَّعْدِيُّ: حَدَّثَنِي عِيسَى بْنُ يُونُسَ: حَدَّثَنَا الأَعْمَشُ، عَنْ سَالِمِ بْنِ أَبِي الْجَعْدِ، عَنْ كُرَيْبٍ، عَنْ ابْنِ عَبَّاسٍ قَالَ: حَدَّثَتْنِي خَالَتِي مَيْمُونَةُ قَالَتْ: أَدْنَيْتُ لِرَسُولِ اللَّهِ ﷺ غُسْلَهُ مِنْ الْجَنَابَةِ، فَغَسَلَ كَفَّيْهِ مَرَّتَيْنِ أَوْ ثَلاَثًا، ثُمَّ أَدْخَلَ يَدَهُ فِي الإِنَاءِ، ثُمَّ أَفْرَغَ بِهِ عَلَى فَرْجِهِ، وَغَسَلَهُ بِشِمَالِهِ، ثُمَّ ضَرَبَ بِشِمَالِهِ الأَرْضَ، فَدَلَكَهَا دَلْكًا شَدِيدًا، ثُمَّ تَوَضَّأَ وُضُوءَهُ لِلصَّلاَةِ ثُمَّ أَفْرَغَ عَلَى رَأْسِهِ ثَلاَثَ حَفَنَاتٍ مِلْءَ كَفِّهِ، ثُمَّ غَسَلَ سَائِرَ جَسَدِهِ، ثُمَّ تَنَحَّى عَنْ مَقَامِهِ ذَلِكَ فَغَسَلَ رِجْلَيْهِ ثُمَّ أَتَيْتُهُ بِالْمِنْدِيلِ فَرَدَّهُ.

**[722]-37-(317)** ........ İbn Abbas ﷺ demişdir: “Xalam Məymunə[1] mənə belə rəvayət etmişdir: “Peyğəmbər ﷺ cənabət[2] qüslünü alsın deyə mən ona su gətirdim. (Peyğəmbər ﷺ) əllərini iki və ya üç dəfə yudu. Sonra əlini qaba salıb (su götürdü), sonra da onu cinsiyyət orqanının üstünə tökdü və sol əli ilə onu yudu. Sonra sol əlini torpağa vurdu və onu yaxşıca ovxaladı.[3] Sonra namaz üçün dəstəmaz aldığı kimi dəstəmaz aldı. Sonra başına üç dolu ovuc su tökdü. Sonra da bədəninin qalan hissəsini yudu. Daha sonra dayandığı yerdən (azacıq) kənara çəkildi və ayaqlarını yudu. Sonra mən ona qətfə gətirdim, lakin o, qətfəni götürmədi”.

**[٧٢٣]** (...) و حَدَّثَنَا مُحَمَّدُ بْنُ الصَّبَّاحِ، وَأَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ، وَأَبُو كُرَيْبٍ، وَالأَشَجُّ، وَإِسْحَقُ، كُلُّهُمْ عَنْ وَكِيعٍ؛ ح: و حَدَّثَنَاه يَحْيَى بْنُ يَحْيَى وَأَبُو كُرَيْبٍ قَالاَ: حَدَّثَنَا أَبُو مُعَاوِيَةَ، كِلاَهُمَا عَنْ الأَعْمَشِ بِهَذَا الإِسْنَادِ، وَلَيْسَ فِي حَدِيثِهِمَا إِفْرَاغُ ثَلاَثِ حَفَنَاتٍ عَلَى الرَّأْسِ، وَفِي حَدِيثِ وَكِيعٍ وَصْفُ الْوُضُوءِ كُلِّهِ، يَذْكُرُ الْمَضْمَضَةَ وَالاِسْتِنْشَاقَ فِيهِ، وَلَيْسَ فِي حَدِيثِ أَبِي مُعَاوِيَةَ ذِكْرُ الْمِنْدِيلِ.

**[723] (...)** ........ Vəki və Əbu Müaviyə – hər ikisi (bu hədisi) Amaşdən bu isnadla rəvayət etmişdir. Onların rəvayətlərində üç ovuc suyun başa tökülməsi zikr edilməmişdir. Üstəlik Vəkinin rəvayətində dəstəmaz tamamilə vəsf edilmişdir, ağızı yaxalamaq və buruna su çəkmək də zikr edilmişdir. Bir də ki, Əbu Müaviyənin rəvayətində qətfə sözü zikr olunmamışdır.

**[٧٢٤] ٣٨-**(...) و حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا عَبْدُ اللَّهِ بْنُ إِدْرِيسَ عَنْ الأَعْمَشِ، عَنْ سَالِمٍ، عَنْ كُرَيْبٍ، عَنْ ابْنِ عَبَّاسٍ، عَنْ مَيْمُونَةَ: أَنَّ النَّبِيَّ ﷺ أُتِيَ بِمِنْدِيلٍ، فَلَمْ يَمَسَّهُ، وَجَعَلَ يَقُولُ بِالْمَاءِ هَكَذَا. يَعْنِي يَنْفُضُهُ.

---

[1] Peyğəmbərin ﷺ zövcəsidir.

[2] Qadınla yaxınlıq etdikdən, habelə şəhvət nəticəsində məni ifraz etdikdən sonrakı hal.

[3] Bunu etmək vacib deyil, müstəhəbdir.

**[724]-38-(...)** ........ İbn Abbas ﷻ rəvayət edir ki, Məymunə demişdir: “Peyğəmbərə ﷺ qətfə gətirdilər, amma o, qətfəyə toxunmadı və qollarını çırpmağa başladı”.

**[٧٢٥] ٣٩-(٣١٨)** و حَدَّثَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى الْعَنَزِيُّ: حَدَّثَنِي أَبُو عَاصِمٍ عَنْ حَنْظَلَةَ بْنِ أَبِي سُفْيَانَ، عَنْ الْقَاسِمِ، عَنْ عَائِشَةَ قَالَتْ: كَانَ رَسُولُ اللَّهِ ﷺ إِذَا اغْتَسَلَ مِنْ الْجَنَابَةِ، دَعَا بِشَيْءٍ نَحْوَ الْحِلاَبِ، فَأَخَذَ بِكَفِّهِ، بَدَأَ بِشِقِّ رَأْسِهِ الأَيْمَنِ، ثُمَّ الأَيْسَرِ، ثُمَّ أَخَذَ بِكَفَّيْهِ، فَقَالَ بِهِمَا عَلَى رَأْسِهِ.

**[725]-39-(318)** ........ Aişə ﷻ demişdir: “Peyğəmbər ﷺ cunub olduqdan sonra qüsl etdiyi zaman badyaya[1] bənzər bir şey gətizdirərdi. Sonra bir ovucu ilə (su götürüb) başının sağ tərəfindən başlayaraq (əvvəlcə başının sağ,) sonra da sol tərəfini yuyardı. Sonra da ovucları ilə su götürüb başına tökərdi”.

## (١٠) – بَابُ الْقَدْرِ الْمُسْتَحَبِّ مِنْ الْمَاءِ فِي غُسْلِ الْجَنَابَةِ وَغُسْلِ الرَّجُلِ وَالْمَرْأَةِ فِي إِنَاءٍ وَاحِدٍ فِي حَالَةٍ وَاحِدَةٍ وَغُسْلِ أَحَدِهِمَا بِفَضْلِ الآخَرِ

## 10-cu fəsil. Cənabət qüslü aldıqda müstəhəb sayılan su miqdarı, kişi ilə qadının bir qabdan, həm də bir yerdə qüsl etməsi, və bir də onlardan birinin digərinin artığı ilə yuyunması

**[٧٢٦] ٤٠-(٣١٩)** و حَدَّثَنَا يَحْيَى بْنُ يَحْيَى قَالَ: قَرَأْتُ عَلَى مَالِكٍ عَنْ ابْنِ شِهَابٍ، عَنْ عُرْوَةَ بْنِ الزُّبَيْرِ، عَنْ عَائِشَةَ: أَنَّ رَسُولَ اللَّهِ ﷺ كَانَ يَغْتَسِلُ مِنْ إِنَاءٍ هُوَ الْفَرَقُ، مِنْ الْجَنَابَةِ.

**[726]-40-(319)** ........ Aişə ﷻ demişdir: “Peyğəmbər ﷺ cunub olduqdan sonra "fərəq"[2] deyilən bir qabdan su götürüb qüsl edərdi”.

**[٧٢٧] ٤١-(...)** حَدَّثَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ: حَدَّثَنَا لَيْثٌ؛ ح: و حَدَّثَنَا ابْنُ رُمْحٍ: أَخْبَرَنَا اللَّيْثُ؛ ح: و حَدَّثَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ وَأَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ وَعَمْرٌو النَّاقِدُ وَزُهَيْرُ بْنُ حَرْبٍ قَالُوا: حَدَّثَنَا سُفْيَانُ، كِلاَهُمَا عَنْ الزُّهْرِيِّ، عَنْ عُرْوَةَ، عَنْ عَائِشَةَ قَالَتْ: كَانَ رَسُولُ اللَّهِ ﷺ يَغْتَسِلُ فِي الْقَدَحِ، وَهُوَ الْفَرَقُ، وَكُنْتُ أَغْتَسِلُ أَنَا وَهُوَ فِي الإِنَاءِ الْوَاحِدِ.

وَفِي حَدِيثِ سُفْيَانَ: مِنْ إِنَاءٍ وَاحِدٍ.

قَالَ قُتَيْبَةُ: قَالَ سُفْيَانُ: وَالْفَرَقُ ثَلاَثَةُ آصُعٍ.

---

[1] Badya – içinə süd sağmaq, yaxud maye tökmək üçün misdən, saxsıdan və sairədən düzəldilmiş altı gen böyük qab.

[2] Fərəq on iki mudd maye tutur. Bir mudd isə insanın iki ovucuna bərabərdir.

**[727]-41-(...)** ........ Aişə ﵂ demişdir: “Peyğəmbər ﷺ "fərəq" deyilən bir qabdan su götürüb qüsl edərdi. Mən onunla birlikdə eyni qabda qüsl edərdim”.

Süfyanın rəvayətində: “Bir qabdan” deyilir.

Quteybə rəvayət edir ki, Süfyan belə demişdir: “Fərəq üç saaya[1] bərabərdir”.

**[٧٢٨] ٤٢-(٣٢٠)** و حَدَّثَنِي عُبَيْدُ اللَّهِ بْنُ مُعَاذٍ الْعَنْبَرِيُّ قَالَ: حَدَّثَنَا أَبِي قَالَ: حَدَّثَنَا شُعْبَةُ عَنْ أَبِي بَكْرِ بْنِ حَفْصٍ، عَنْ أَبِي سَلَمَةَ بْنِ عَبْدِ الرَّحْمَنِ قَالَ: دَخَلْتُ عَلَى عَائِشَةَ، أَنَا وَأَخُوهَا مِنْ الرَّضَاعَةِ، فَسَأَلَهَا عَنْ غُسْلِ النَّبِيِّ ﷺ مِنْ الْجَنَابَةِ؟ فَدَعَتْ بِإِنَاءٍ قَدْرِ الصَّاعِ، فَاغْتَسَلَتْ، وَبَيْنَنَا وَبَيْنَهَا سِتْرٌ، وَأَفْرَغَتْ عَلَى رَأْسِهَا ثَلَاثًا، قَالَ: وَكَانَ أَزْوَاجُ النَّبِيِّ ﷺ يَأْخُذْنَ مِنْ رُءُوسِهِنَّ حَتَّى تَكُونَ كَالْوَفْرَةِ.

**[728]-42-(320)** ........ Əbu Sələmə ibn Abdur-Rəhman demişdir: “Mən Aişənin süd qardaşı ilə birgə onun yanına getdim. Süd qardaşı ondan Peyğəmbərin ﷺ cunub ikən nə cür qüsl etdiyini soruşdu. Aişə bir saa qədər su tutan bir qab gətizdirdi və özü ilə bizim aramızda pərdə tutub qüsl etdi.[2] (Qüsl əsnasında) başına üç dəfə su tökdü”.

Əbu Sələmə demişdir: “Peyğəmbərin ﷺ zövcələri öz saçlarından o qədər alardılar ki, başları vəfrə[3] kimi olardı”.

**[٧٢٩] ٤٣-(٣٢١)** حَدَّثَنَا هَارُونُ بْنُ سَعِيدٍ الْأَيْلِيُّ: حَدَّثَنَا ابْنُ وَهْبٍ: أَخْبَرَنِي مَخْرَمَةُ بْنُ بُكَيْرٍ، عَنْ أَبِيهِ، عَنْ أَبِي سَلَمَةَ بْنِ عَبْدِ الرَّحْمَنِ قَالَ: قَالَتْ عَائِشَةُ: كَانَ رَسُولُ اللَّهِ ﷺ إِذَا اغْتَسَلَ بَدَأَ بِيَمِينِهِ، فَصَبَّ عَلَيْهَا مِنْ الْمَاءِ فَغَسَلَهَا، ثُمَّ صَبَّ الْمَاءَ، عَلَى الْأَذَى الَّذِي بِهِ، بِيَمِينِهِ، وَغَسَلَ عَنْهُ بِشِمَالِهِ، حَتَّى إِذَا فَرَغَ مِنْ ذَلِكَ صَبَّ عَلَى رَأْسِهِ.

قَالَتْ عَائِشَةُ: كُنْتُ أَغْتَسِلُ أَنَا وَرَسُولُ اللَّهِ ﷺ مِنْ إِنَاءٍ وَاحِدٍ، وَنَحْنُ جُنُبَانِ.

**[729]-43-(321)** ........ Aişə ﵂ demişdir: “Peyğəmbər ﷺ qüsl etdikdə sağ tərəfindən başlayar, sağ əli ilə bədəninə su töküb onu yuyardı. Sonra sağ əli ilə (məniyə) bulaşmış əzaları üstünə su tökər və sol əli ilə onu yuyardı. Nəhayət, ayıb yerlərini yuyub qurtardıqdan sonra başından su əndərərdi”.

---

[1] Saa – ölçü vahididir və dörd mudda bərabərdir (“Səmər əl-Mustətab”, 1/28).

[2] Qazı İyad ﵀ demişdir: “Aişənin ﵂ yanına gələnlərdən biri onun süd qardaşı Abdullah ibn Yezid, digəri də onun süd bacısı oğlu Əbu Sələmə idi. Belə ki, Aişənin bacısı Ummu Gülsüm bint Əbu Bəkr onu əmizdirmişdi. Bundan aydın olur ki, Aişənin yanına gələn bu iki kişi onun məhrəmi idi. Aişənin onların gözü önündə qüsl etməsinə gəlincə, qeyd etmək lazımdır ki, o, bunu pərdə arxasında etmiş və yalnız başına su tökdüyünü onlara göstərmişdir.

[3] Yəni saçları qulaq mərcəyinə çatırdı.

Aişə ﵂ demişdir: "Mən Peyğəmbərlə ﷺ birgə – hər ikimiz cunub olduğumuz halda – bir qabdan (su götürüb) qüsl edərdik".

**[٧٣٠] ٤٤**–(...) و حَدَّثَنِي مُحَمَّدُ بْنُ رَافِعٍ: حَدَّثَنَا شَبَابَةُ: حَدَّثَنَا لَيْثٌ، عَنْ يَزِيدَ، عَنْ عِرَاكٍ، عَنْ حَفْصَةَ بِنْتِ عَبْدِ الرَّحْمَنِ بْنِ أَبِي بَكْرٍ – وَكَانَتْ تَحْتَ الْمُنْذِرِ بْنِ الزُّبَيْرِ – أَنَّ عَائِشَةَ أَخْبَرَتْهَا أَنَّهَا كَانَتْ تَغْتَسِلُ هِيَ وَالنَّبِيُّ ﷺ فِي إِنَاءٍ وَاحِدٍ، يَسَعُ ثَلَاثَةَ أَمْدَادٍ، أَوْ قَرِيبًا مِنْ ذَلِكَ.

**[730]-44-(...)** ........ Munzir ibn Zubeyrin zövcəsi Həfsə bint Abdur-Rəhman ibn Əbu Bəkr rəvayət etmişdir ki, Aişə ona Peyğəmbərlə ﷺ birgə üç mudd və ya buna yaxın miqdarda su tutan bir qabdan qüsl etdiyini xəbər vermişdir".

**[٧٣١] ٤٥**–(...) حَدَّثَنَا عَبْدُ اللَّهِ بْنُ مَسْلَمَةَ بْنِ قَعْنَبٍ قَالَ: حَدَّثَنَا أَفْلَحُ بْنُ حُمَيْدٍ عَنْ الْقَاسِمِ بْنِ مُحَمَّدٍ، عَنْ عَائِشَةَ قَالَتْ: كُنْتُ أَغْتَسِلُ أَنَا وَرَسُولُ اللَّهِ ﷺ مِنْ إِنَاءٍ وَاحِدٍ، تَخْتَلِفُ أَيْدِينَا فِيهِ، مِنْ الْجَنَابَةِ.

**[731]-45-(...)** ........ Aişə demişdir: "Mən Peyğəmbərlə ﷺ birlikdə cunub ikən bir qabdan (su götürüb) qüsl edərdik. Biz (suyu ovucladığımız zaman) əllərimiz o qabın içində bir-birinə dəyərdi".

**[٧٣٢] ٤٦**–(...) و حَدَّثَنَا يَحْيَى بْنُ يَحْيَى: أَخْبَرَنَا أَبُو خَيْثَمَةَ عَنْ عَاصِمٍ الأَحْوَلِ، عَنْ مُعَاذَةَ، عَنْ عَائِشَةَ قَالَتْ: كُنْتُ أَغْتَسِلُ أَنَا وَرَسُولُ اللَّهِ ﷺ مِنْ إِنَاءٍ – بَيْنِي وَبَيْنَهُ – وَاحِدٍ. فَيُبَادِرُنِي حَتَّى أَقُولَ: دَعْ لِي، دَعْ لِي، قَالَتْ: وَهُمَا جُنُبَانِ.

**[732]-46-(...)** ........ Aişə demişdir: "Mən Peyğəmbərlə ﷺ birgə – aramızda olan – bir qabdan (su götürüb) qüsl edərdik. (Suyu ovuclayarkən bəzən) o, məni qabaqlayar və mən ona: "(Sudan) mənə də saxla, mənə də saxla"– deyərdim.

Aişə: "(O zaman) hər ikisinin cunub olduğunu" söyləmişdir.

**[٧٣٣] ٤٧**–(**٣٢٢**) و حَدَّثَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ وَأَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ، جَمِيعًا عَنْ ابْنِ عُيَيْنَةَ، قَالَ قُتَيْبَةُ: حَدَّثَنَا سُفْيَانُ عَنْ عَمْرٍو، عَنْ أَبِي الشَّعْثَاءِ، عَنْ ابْنِ عَبَّاسٍ قَالَ: أَخْبَرَتْنِي مَيْمُونَةُ، أَنَّهَا كَانَتْ تَغْتَسِلُ، هِيَ وَالنَّبِيُّ ﷺ، فِي إِنَاءٍ وَاحِدٍ.

**[733]-47-(322)** ........ İbn Abbas ﵄ demişdir: "Məymunə mənə, Peyğəmbərlə ﷺ birgə bir qabdan (su götürüb) qüsl etdiyini xəbər vermişdir".

**[٧٣٤] ٤٨-(٣٢٣)** و حَدَّثَنَا إِسْحَقُ بْنُ إِبْرَاهِيمَ وَمُحَمَّدُ بْنُ حَاتِمٍ، قَالَ إِسْحَقُ: أَخْبَرَنَا. وَقَالَ ابْنُ حَاتِمٍ: حَدَّثَنَا مُحَمَّدُ بْنُ بَكْرٍ: أَخْبَرَنَا ابْنُ جُرَيْجٍ: أَخْبَرَنِي عَمْرُو بْنُ دِينَارٍ قَالَ: أَكْبَرُ عِلْمِي، وَالَّذِي يَخْطِرُ عَلَى بَالِي، أَنَّ أَبَا الشَّعْثَاءِ أَخْبَرَنِي، أَنَّ ابْنَ عَبَّاسٍ أَخْبَرَهُ أَنَّ رَسُولَ اللَّهِ ﷺ كَانَ يَغْتَسِلُ بِفَضْلِ مَيْمُونَةَ.

**[734]-48-(323)** ........ İbn Abbas ﵄ demişdir: "Rəsulullah ﷺ Məymunədən artıq qalan su ilə qüsl edərdi".

**[٧٣٥] ٤٩-(٣٢٤)** حَدَّثَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى: حَدَّثَنَا مُعَاذُ بْنُ هِشَامٍ قَالَ: حَدَّثَنِي أَبِي عَنْ يَحْيَى بْنِ أَبِي كَثِيرٍ: حَدَّثَنَا أَبُو سَلَمَةَ بْنُ عَبْدِ الرَّحْمَنِ، أَنَّ زَيْنَبَ بِنْتَ أُمِّ سَلَمَةَ حَدَّثَتْهُ، أَنَّ أُمَّ سَلَمَةَ حَدَّثَتْهَا قَالَتْ: كَانَتْ هِيَ وَرَسُولُ اللَّهِ ﷺ يَغْتَسِلاَنِ فِي الإِنَاءِ الْوَاحِدِ مِنَ الْجَنَابَةِ.

**[735]-49-(324)** ........ Zeynəb bint Ummu Sələmə rəvayət etmişdir ki, Ummu Sələmə ona Peyğəmbərlə ﷺ birgə cunub ikən bir qabdan (su götürüb) qüsl etdiyini xəbər vermişdir".

**[٧٣٦] ٥٠-(٣٢٥)** حَدَّثَنَا عُبَيْدُ اللَّهِ بْنُ مُعَاذٍ: حَدَّثَنَا أَبِي؛ ح: و حَدَّثَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى: حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ يَعْنِي ابْنَ مَهْدِيٍّ، قَالاَ: حَدَّثَنَا شُعْبَةُ عَنْ عَبْدِ اللَّهِ بْنِ عَبْدِ اللَّهِ بْنِ جَبْرٍ قَالَ: سَمِعْتُ أَنَسًا يَقُولُ: كَانَ رَسُولُ اللَّهِ ﷺ يَغْتَسِلُ بِخَمْسِ مَكَاكِيكَ، وَيَتَوَضَّأُ بِمَكُّوكٍ. و قَالَ ابْنُ الْمُثَنَّى: بِخَمْسِ مَكَاكِيَّ، و قَالَ ابْنُ مُعَاذٍ: عَنْ عَبْدِ اللَّهِ بْنِ عَبْدِ اللَّهِ، وَلَمْ يَذْكُرْ ابْنَ جَبْرٍ.

**[736]-50-(325)** ........ Abdullah ibn Abdullah ibn Cəbr demişdir: "Mən Ənəsin belə dediyini eşitmişəm: "Peyğəmbər ﷺ beş məkuk[1] (su) ilə qüsl edər, bir məkuk ilə də dəstəmaz alardı".

İbn Musənnə: "Beş məkaki"– demişdir.

İbn Muaz isə: "Abdullah ibn Abdullah"– demiş və "ibn Cəbr" (adını) zikr etməmişdir.

**[٧٣٧] ٥١-(...)** حَدَّثَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ: حَدَّثَنَا وَكِيعٌ عَنْ مِسْعَرٍ، عَنْ ابْنِ جَبْرٍ، عَنْ أَنَسٍ قَالَ: كَانَ النَّبِيُّ ﷺ يَتَوَضَّأُ بِالْمُدِّ وَيَغْتَسِلُ بِالصَّاعِ، إِلَى خَمْسَةِ أَمْدَادٍ.

**[737]-51-(...)** ........ Ənəs ﷺ demişdir: "Peyğəmbər ﷺ bir mudd su ilə dəstəmaz alar və bir saadan[2] beş mudda qədər su ilə qüsl edərdi".

---

[1] Əslində, məkuk bir saa yarıma bərabərdir. Lakin ola bilsin ki, burada məkuk deyildikdə mudd nəzərdə tutulur.

[2] 726-cı və 727-ci hədislərin qeydlərinə bax.

**[٧٣٨] ٥٢-(٣٢٦)** و حَدَّثَنَا أَبُو كَامِلٍ الْجَحْدَرِيُّ وَعَمْرُو بْنُ عَلِيٍّ، كِلَاهُمَا عَنْ بِشْرِ بْنِ الْمُفَضَّلِ، قَالَ أَبُو كَامِلٍ: حَدَّثَنَا بِشْرٌ: حَدَّثَنَا أَبُو رَيْحَانَةَ، عَنْ سَفِينَةَ قَالَ: كَانَ رَسُولُ اللَّهِ ﷺ يُغَسِّلُهُ الصَّاعُ مِنَ الْمَاءِ، مِنَ الْجَنَابَةِ، وَيُوَضِّئُهُ الْمُدُّ.

**[738]-52-(326)** ........ Səfinə demişdir: "Peyğəmbər ﷺ cunub ikən qüsl etdikdə bir saa su, dəstəmaz aldıqda isə bir mudd su ona yetərdi".

**[٧٣٩] ٥٣-(...)** و حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا ابْنُ عُلَيَّةَ؛ ح: و حَدَّثَنِي عَلِيُّ بْنُ حُجْرٍ: حَدَّثَنَا إِسْمَعِيلُ، عَنْ أَبِي رَيْحَانَةَ، عَنْ سَفِينَةَ - قَالَ: أَبُو بَكْرٍ - صَاحِبِ رَسُولِ اللَّهِ ﷺ - قَالَ: كَانَ رَسُولُ اللَّهِ ﷺ يَغْتَسِلُ بِالصَّاعِ وَيَتَطَهَّرُ بِالْمُدِّ. وَفِي حَدِيثِ ابْنِ حُجْرٍ، أَوْ قَالَ: وَيُطَهِّرُهُ الْمُدُّ. و قَالَ: وَقَدْ كَانَ كَبِرَ وَمَا كُنْتُ أَثِقُ بِحَدِيثِهِ.

**[739]-53-(...)** ........ Səfinə rəvayət edir ki, (Peyğəmbərin ﷺ səhabəsi Əbu Bəkr ﷺ demişdir): "Peyğəmbər ﷺ bir saa su ilə qüsl edər və bir mudd su ilə paklanardı".

İbn Hucrin rəvayətində: "Yaxud bir mudd su onun paklanmasına kifayət edərdi" (deyilir).

(Əbu Reyhanə) demişdir: "Səfinə çox qocalmışdı deyə, mən onun rəvayət etdiyi hədisi mötəbər saymırdım".

## (١١) - بَابُ اسْتِحْبَابِ إِفَاضَةِ الْمَاءِ عَلَى الرَّأْسِ وَغَيْرِهِ ثَلَاثًا

## 11-ci fəsil. Başa və bədənin digər (tərəflərinə) üç dəfə su tökməyin müstəhəb sayılması

**[٧٤٠] ٥٤-(٣٢٧)** حَدَّثَنَا يَحْيَى بْنُ يَحْيَى وَقُتَيْبَةُ بْنُ سَعِيدٍ وَأَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ، قَالَ يَحْيَى: أَخْبَرَنَا. وَقَالَ الآخَرَانِ: حَدَّثَنَا أَبُو الأَحْوَصِ، عَنْ أَبِي إِسْحَقَ، عَنْ سُلَيْمَانَ بْنِ صُرَدٍ، عَنْ جُبَيْرِ بْنِ مُطْعِمٍ، قَالَ: تَمَارَوْا فِي الْغُسْلِ عِنْدَ رَسُولِ اللَّهِ ﷺ، فَقَالَ بَعْضُ الْقَوْمِ: أَمَّا أَنَا، فَإِنِّي أَغْسِلُ رَأْسِي كَذَا وَكَذَا، فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: ((أَمَّا أَنَا فَإِنِّي أُفِيضُ عَلَى رَأْسِي ثَلَاثَ أَكُفٍّ)).

**[740]-54-(327)** ........ Cubeyr ibn Mut'im ﷺ demişdir: "(Bir dəfə səhabələr) Peyğəmbərin ﷺ hüzurunda qüsldə (sərf edilən su) xüsusunda mübahisə etdilər. Onlardan bəzisi: "Mənə gəlincə, mən başımı bu (qədər), bu (qədər su) ilə

yuyuram"– dedi. (Bunu eşidəndə) Peyğəmbər ﷺ buyurdu: "Mənə gəlincə, mən başıma üç ovuc su tökürəm".

**[٧٤١] ٥٥**–(...) و حَدَّثَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ: حَدَّثَنَا مُحَمَّدُ بْنُ جَعْفَرٍ: حَدَّثَنَا شُعْبَةُ عَنْ أَبِي إِسْحَقَ، عَنْ سُلَيْمَانَ بْنِ صُرَدٍ، عَنْ جُبَيْرِ بْنِ مُطْعِمٍ عَنِ النَّبِيِّ ﷺ أَنَّهُ ذُكِرَ عِنْدَهُ الْغُسْلُ مِنَ الْجَنَابَةِ، فَقَالَ: ((أَمَّا أَنَا، فَأُفْرِغُ عَلَى رَأْسِي ثَلاَثًا)).

**[741]-55-(...)** ........ Cubeyr ibn Mut′im ﷺ demişdir: "(Bir dəfə) Peyğəmbərin ﷺ yanında cənabət qüslündən söhbət açıldı. Peyğəmbər ﷺ buyurdu: "Mənə gəlincə, mən başıma üç kərə (su) tökürəm".

**[٧٤٢] ٥٦**–(٣٢٨) و حَدَّثَنَا يَحْيَى بْنُ يَحْيَى وَإِسْمَعِيلُ بْنُ سَالِمٍ قَالاَ: أَخْبَرَنَا هُشَيْمٌ، عَنْ أَبِي بِشْرٍ، عَنْ أَبِي سُفْيَانَ، عَنْ جَابِرِ بْنِ عَبْدِ اللَّهِ أَنَّ وَفْدَ ثَقِيفٍ سَأَلُوا النَّبِيَّ ﷺ فَقَالُوا: إِنَّ أَرْضَنَا أَرْضٌ بَارِدَةٌ، فَكَيْفَ بِالْغُسْلِ؟ فَقَالَ: ((أَمَّا أَنَا، فَأُفْرِغُ عَلَى رَأْسِي ثَلاَثًا)).

قَالَ ابْنُ سَالِمٍ فِي رِوَايَتِهِ: حَدَّثَنَا هُشَيْمٌ: أَخْبَرَنَا أَبُو بِشْرٍ، وَقَالَ: إِنَّ وَفْدَ ثَقِيفٍ قَالُوا: يَا رَسُولَ اللَّهِ!

**[742]-56-(328)** ........ Cabir ibn Abdullah ﷺ demişdir: "Səqif qəbiləsinin nümayəndələri Peyğəmbərdən ﷺ: "Bizim (qaldığımız) yer soyuq bir yerdir. (Belə şəraitdə) biz qüslü necə etməliyik?"– deyə soruşdular. Peyğəmbər ﷺ buyurdu: "Mənə gəlincə, mən başıma üç kərə (su) tökürəm".

İbn Salim öz rəvayətində demişdir: "Bizə Huşeym rəvayət etdi, bizə Əbu Bişr xəbər verdi və dedi: "Səqif qəbiləsinin nümayəndələri: "Ya Rəsulullah!"– dedilər.

**[٧٤٣] ٥٧**–(٣٢٩) و حَدَّثَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى: حَدَّثَنَا عَبْدُ الْوَهَّابِ يَعْنِي الثَّقَفِيَّ: حَدَّثَنَا جَعْفَرٌ، عَنْ أَبِيهِ، عَنْ جَابِرِ بْنِ عَبْدِ اللَّهِ قَالَ: كَانَ رَسُولُ اللَّهِ ﷺ إِذَا اغْتَسَلَ مِنْ جَنَابَةٍ صَبَّ عَلَى رَأْسِهِ ثَلاَثَ حَفَنَاتٍ مِنْ مَاءٍ فَقَالَ لَهُ الْحَسَنُ ابْنُ مُحَمَّدٍ: إِنَّ شَعْرِي كَثِيرٌ، قَالَ جَابِرٌ: فَقُلْتُ لَهُ: يَا ابْنَ أَخِي كَانَ شَعْرُ رَسُولِ اللَّهِ ﷺ أَكْثَرَ مِنْ شَعْرِكَ وَأَطْيَبَ.

**[743]-57-(329)** ........ Cabir ibn Abdullah ﷺ demişdir: "Peyğəmbər ﷺ cənabət qüslünü edərkən başına üç ovuc su tökərdi".

(Bunu eşidəndə) Həsən ibn Muhəmməd (Cabirə): "Mənim saçım çoxdur"– dedi. Cabir dedi: "Mən ona belə cavab verdim: "Ey qardaşım oğlu! Peyğəmbərin ﷺ saçı sənin saçından daha çox və daha xoşagəlimli idi".

## (١٢) – بَابُ حُكْمِ ضَفَائِرِ الْمُغْتَسِلَةِ

## 12-ci fəsil. Qüsl edən qadının saç hörüklərinin hökmü

**[٧٤٤] ٥٨–(٣٣٠)** حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ، وَعَمْرٌو النَّاقِدُ، وَإِسْحَقُ بْنُ إِبْرَاهِيمَ، وَابْنُ أَبِي عُمَرَ، كُلُّهُمْ عَنِ ابْنِ عُيَيْنَةَ. قَالَ إِسْحَقُ: أَخْبَرَنَا سُفْيَانُ عَنْ أَيُّوبَ بْنِ مُوسَى، عَنْ سَعِيدِ بْنِ أَبِي سَعِيدٍ الْمَقْبُرِيِّ، عَنْ عَبْدِ اللَّهِ بْنِ رَافِعٍ، مَوْلَى أُمِّ سَلَمَةَ، عَنْ أُمِّ سَلَمَةَ قَالَتْ: قُلْتُ يَا رَسُولَ اللَّهِ! إِنِّي امْرَأَةٌ أَشُدُّ ضَفْرَ رَأْسِي، فَأَنْقُضُهُ لِغُسْلِ الْجَنَابَةِ؟ قَالَ: ((لاَ، إِنَّمَا يَكْفِيكِ أَنْ تَحْثِيَ عَلَى رَأْسِكِ ثَلاَثَ حَثَيَاتٍ، ثُمَّ تُفِيضِينَ عَلَيْكِ الْمَاءَ فَتَطْهُرِينَ)).

**[744]-58-(330)** ........ Ummu Sələmə ﵂ belə rəvayət etmişdir: “(Mən Peyğəmbərə ﷺ) dedim: “Ya Rəsulullah! Mən saçları çox sıx hörülmüş bir qadınam. Cənabət qüslünü etdikdə hörüklərimi açımmı?” (Peyğəmbər ﷺ) buyurdu: “Xeyr, sadəcə başına üç ovuc su tökmək sənə bəs edər. Sonra da suyu bədəninə əndərirsən və (beləliklə də,) təmizlənirsən”.

**[٧٤٥]** (...) حَدَّثَنَا عَمْرٌو النَّاقِدُ:حَدَّثَنَا يَزِيدُ بْنُ هَارُونَ؛ ح: و حَدَّثَنَا عَبْدُ بْنُ حُمَيْدٍ: أَخْبَرَنَا عَبْدُ الرَّزَّاقِ. قَالاَ: أَخْبَرَنَا الثَّوْرِيُّ عَنْ أَيُّوبَ بْنِ مُوسَى فِي هَذَا الإِسْنَادِ، وَفِي حَدِيثِ عَبْدِ الرَّزَّاقِ: فَأَنْقُضُهُ لِلْحَيْضَةِ وَالْجَنَابَةِ؟ فَقَالَ: ((لاَ)). ثُمَّ ذَكَرَ بِمَعْنَى حَدِيثِ ابْنِ عُيَيْنَةَ.

**[745] (...)** ........ Yezid ibn Harun və Abdur-Rəzzaq – (hər ikisi) demişdir: “Sövri (bu hədisi) bizə Əyyub ibn Musadan bu isnadla rəvayət etmişdir. Abdur-Rəzzaqın rəvayətində: “(Ummu Sələmə dedi): “Heyz və cunub olduğum zaman hörüklərimi açımmı?” (Peyğəmbər ﷺ) buyurdu: “Xeyr....” Beləcə, Abdur-Rəzzaq hədisi İbn Uyeynənin hədisinə yaxın mənada rəvayət etmişdir.

**[٧٤٦]** (...) و حَدَّثَنِيهِ أَحْمَدُ الدَّارِمِيُّ: حَدَّثَنَا زَكَرِيَّاءُ بْنُ عَدِيٍّ: حَدَّثَنَا يَزِيدُ يَعْنِي ابْنَ زُرَيْعٍ، عَنْ رَوْحِ بْنِ الْقَاسِمِ: حَدَّثَنَا أَيُّوبُ بْنُ مُوسَى بِهَذَا الإِسْنَادِ، وَقَالَ: أَفَأَحُلُّهُ فَأَغْسِلُهُ مِنَ الْجَنَابَةِ؟ وَلَمْ يَذْكُرِ الْحَيْضَةَ.

**[746] (...)** ........ Əyyub ibn Musa (bu hədisi) bizə bu isnadla rəvayət etmiş və: “(Ummu Sələmə dedi): “Cunub olduğum zaman hörüklərimi açıb onları yuyummu?”– demiş, lakin “heyz” sözünü zikr etməmişdir.

**[٧٤٧] ٥٩–(٣٣١)** و حَدَّثَنَا يَحْيَى بْنُ يَحْيَى وَأَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ وَعَلِيُّ بْنُ حُجْرٍ، جَمِيعًا عَنِ ابْنِ عُلَيَّةَ. قَالَ يَحْيَى: أَخْبَرَنَا إِسْمَعِيلُ ابْنُ عُلَيَّةَ عَنْ أَيُّوبَ، عَنْ أَبِي الزُّبَيْرِ، عَنْ عُبَيْدِ بْنِ عُمَيْرٍ قَالَ: بَلَغَ عَائِشَةَ أَنَّ

عَبْدَ اللَّهِ بْنَ عَمْرٍو يَأْمُرُ النِّسَاءَ، إِذَا اغْتَسَلْنَ، أَنْ يَنْقُضْنَ رُءُوسَهُنَّ، فَقَالَتْ: يَا عَجَبًا لابْنِ عَمْرٍو هَذَا! يَأْمُرُ النِّسَاءَ، إِذَا اغْتَسَلْنَ، أَنْ يَنْقُضْنَ رُءُوسَهُنَّ، أَفَلاَ يَأْمُرُهُنَّ أَنْ يَحْلِقْنَ رُءُوسَهُنَّ! لَقَدْ كُنْتُ أَغْتَسِلُ أَنَا وَرَسُولُ اللَّهِ ﷺ مِنْ إِنَاءٍ وَاحِدٍ، وَلاَ أَزِيدُ عَلَى أَنْ أُفْرِغَ عَلَى رَأْسِي ثَلاَثَ إِفْرَاغَاتٍ.

**[747]-59-(331)** ........ Ubeyd ibn Umeyr demişdir: "Aişəyə xəbər çatdı ki, Abdullah ibn Amr qadınlara qüsl etdikləri zaman hörüklərini açmalarını əmr edir. Aişə dedi: "Əcəb (adamdır) bu Amrın oğlu! Qadınlara qüsl etdikləri zaman hörüklərini açmalarını əmr edir. Niyə onlara başlarını keçəl qırxdırmağı əmr etmir?![1] Düzünə qalsa, mən Peyğəmbərlə ﷺ birlikdə bir qabdan (su götürüb) qüsl edərdim. Mən başıma üç kərə su tökməkdən əlavə bir şey etməzdim".

## (١٣) – بَابُ اسْتِحْبَابِ اسْتِعْمَالِ الْمُغْتَسِلَةِ مِنَ الْحَيْضِ فِرْصَةً مِنْ مِسْكٍ فِي مَوْضِعِ الدَّمِ

## 13-cü fəsil. Heyz gördükdən sonra qüsl edən qadının, qan axan yeri (təmizləmək üçün) ətirlənmiş parçadan istifadə etməsinin müstəhəbliyi

**[٧٤٨] ٦٠–(٣٣٢)** حَدَّثَنَا عَمْرُو بْنُ مُحَمَّدٍ النَّاقِدُ وَابْنُ أَبِي عُمَرَ، جَمِيعًا عَنِ ابْنِ عُيَيْنَةَ، قَالَ عَمْرٌو: حَدَّثَنَا سُفْيَانُ بْنُ عُيَيْنَةَ عَنْ مَنْصُورِ بْنِ صَفِيَّةَ عَنْ أُمِّهِ، عَنْ عَائِشَةَ [قَالَتْ]: سَأَلَتِ امْرَأَةٌ النَّبِيَّ ﷺ: كَيْفَ تَغْتَسِلُ مِنْ حَيْضَتِهَا؟ قَالَ: فَذَكَرَتْ أَنَّهُ عَلَّمَهَا كَيْفَ تَغْتَسِلُ، ثُمَّ تَأْخُذُ فِرْصَةً مِنْ مِسْكٍ فَتَطَهَّرُ بِهَا، قَالَتْ: كَيْفَ أَتَطَهَّرُ بِهَا؟ قَالَ: ((تَطَهَّرِي بِهَا، سُبْحَانَ اللَّهِ)) وَاسْتَتَرَ – وَأَشَارَ لَنَا سُفْيَانُ بْنُ عُيَيْنَةَ بِيَدِهِ عَلَى وَجْهِهِ – قَالَ قَالَتْ عَائِشَةُ: وَاجْتَذَبْتُهَا إِلَيَّ، وَعَرَفْتُ مَا أَرَادَ النَّبِيُّ ﷺ. فَقُلْتُ تَتَبَّعِي بِهَا أَثَرَ الدَّمِ.

و قَالَ ابْنُ أَبِي عُمَرَ فِي رِوَايَتِهِ: فَقُلْتُ: تَتَبَّعِي بِهَا آثَارَ الدَّمِ.

**[748]-60-(332)** ........ Aişə رضي الله عنها rəvayət edir ki, bir qadın Peyğəmbərdən ﷺ heyzdən sonra yuyunması barədə soruşdu. Peyğəmbər ﷺ ona necə yuyunacağını başa saldı, (sonra da belə buyurdu): "Müşkə batırılmış bir parça götürüb onunla təmizlənirsən". (Qadın): "Onunla necə təmizlənim?"– deyə soruş-

[1] Aişə رضي الله عنها demək istəyir ki, əgər qadına hər qüsl etdikdə hörüklərini açmaq vacibdirsə, onda ona bu məşəqqətdən qurtarmaq üçün başını qırxdırmaq daha əlverişlidir. Bu söz bir kinayədir. Yoxsa qadına başını qırxdırmaq haram buyurulmuşdur.

du. (Peyğəmbər ﷺ): “Subhənallah! Onunla təmizlən!”– deyə buyurdu və üzünü örtdü. (Hədisin bu yerində Süfyan əlini üzünə tutmaqla onun üzünü necə örtdüyünü bizə göstərdi). Aişə dedi: “Mən Peyğəmbərin ﷺ nəyi nəzərdə tutduğunu anladım və qadını özümə tərəf çəkib dedim: “Onunla qan ləkəsi qalmış yerləri silib təmizlə”.

İbn Əbu Ömər öz rəvayətində demişdir: “(Aişə) dedi: “Onunla qan ləkələri qalmış yerləri silib təmizlə”.

**[٧٤٩]** (...) و حَدَّثَنِي أَحْمَدُ بْنُ سَعِيدٍ الدَّارِمِيُّ: حَدَّثَنَا حَبَّانُ: حَدَّثَنَا وُهَيْبٌ: حَدَّثَنَا مَنْصُورٌ، عَنْ أُمِّهِ، عَنْ عَائِشَةَ: أَنَّ امْرَأَةً سَأَلَتِ النَّبِيَّ ﷺ: كَيْفَ أَغْتَسِلُ عِنْدَ الطُّهْرِ؟ فَقَالَ: ((خُذِي فِرْصَةً مُمَسَّكَةً فَتَوَضَّئِي بِهَا)) ثُمَّ ذَكَرَ نَحْوَ حَدِيثِ سُفْيَانَ.

**[749] (...)** ........ Aişə رضي الله عنها demişdir: “Bir qadın Peyğəmbərdən ﷺ: “Heyzdən təmizləndikdə necə qüsl edim?”– deyə soruşdu. Peyğəmbər ﷺ buyurdu: “Ətirlənmiş bir parça götür və onunla təmizlən...” Sonra (ravi bu hədisi) Süfyanın hədisinə yaxın mənada rəvayət etdi.

**[٧٥٠] ٦١**–(...) حَدَّثَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى وَابْنُ بَشَّارٍ، قَالَ ابْنُ الْمُثَنَّى: حَدَّثَنَا مُحَمَّدُ بْنُ جَعْفَرٍ: حَدَّثَنَا شُعْبَةُ، عَنْ إِبْرَاهِيمَ بْنِ الْمُهَاجِرِ قَالَ: سَمِعْتُ صَفِيَّةَ تُحَدِّثُ عَنْ عَائِشَةَ أَنَّ أَسْمَاءَ سَأَلَتِ النَّبِيَّ ﷺ عَنْ غُسْلِ الْمَحِيضِ؟ فَقَالَ: ((تَأْخُذُ إِحْدَاكُنَّ مَاءَهَا وَسِدْرَتَهَا فَتَطَهَّرُ، فَتُحْسِنُ الطُّهُورَ، ثُمَّ تَصُبُّ عَلَى رَأْسِهَا فَتَدْلُكُهُ دَلْكًا شَدِيدًا، حَتَّى تَبْلُغَ شُؤُونَ رَأْسِهَا، ثُمَّ تَصُبُّ عَلَيْهَا الْمَاءَ، ثُمَّ تَأْخُذُ فِرْصَةً مُمَسَّكَةً فَتَطَهَّرُ بِهَا)) فَقَالَتْ أَسْمَاءُ: وَكَيْفَ تَطَهَّرُ بِهَا؟ فَقَالَ: ((سُبْحَانَ اللَّهِ تَطَهَّرِينَ بِهَا)) فَقَالَتْ عَائِشَةُ – كَأَنَّهَا تُخْفِي ذَلِكَ تَتَبَّعِينَ أَثَرَ الدَّمِ، وَسَأَلَتْهُ عَنْ غُسْلِ الْجَنَابَةِ؟ فَقَالَ: ((تَأْخُذُ مَاءً فَتَطَهَّرُ، فَتُحْسِنُ الطُّهُورَ، أَوْ تُبْلِغُ الطُّهُورَ، ثُمَّ تَصُبُّ عَلَى رَأْسِهَا فَتَدْلُكُهُ، حَتَّى تَبْلُغَ شُؤُونَ رَأْسِهَا، ثُمَّ تُفِيضُ عَلَيْهَا الْمَاءَ)) فَقَالَتْ عَائِشَةُ: نِعْمَ النِّسَاءُ نِسَاءُ الأَنْصَارِ! لَمْ يَكُنْ يَمْنَعُهُنَّ الْحَيَاءُ أَنْ يَتَفَقَّهْنَ فِي الدِّينِ.

**[750]-61-(...)** ........ İbrahim ibn Muhacir demişdir: “Mən Səfiyyənin Aişədən rəvayət etdiyi hədisi eşitdim. (Aişə demişdir): “Əsma Peyğəmbərdən ﷺ heyzdən sonrakı qüsl barəsində soruşdu. Peyğəmbər ﷺ buyurdu: “Sizdən biriniz (heyzdən təmizləndiyi zaman) suyunu və sidrini[1] götürüb təmizlənsin. Təmizlənməyi də gözəl şəkildə yerinə yetirsin. Sonra başına su töksün və su onun saç köklərinə çatana kimi başını yaxşıca ovxalasın. Sonra bədəninə su əndər-

---

[1] Şam fəsiləsindən həmişəyaşıl, iynəyarpaqlı ağacdır. Hədisdə “sidrini” deyildikdə həmin ağacın yarpaqları nəzərdə tutulur (“əl-Movsua əl-Fiqhiyyə”, 313/18).

sin. Sonra da ətirlənmiş bir parça götürüb onunla təmizlənsin". Əsma: "Onunla necə təmizlənsin?"– deyə soruşdu. (Peyğəmbər ﷺ) buyurdu: "Subhənallah! Onunla təmizlənirsən!" Aişə (oradakılara eşitdirməsin deyə) alçaq səslə (qadına): "Qan ləkəsi qalmış yerləri silib təmizlə"– dedi. (Sonra) qadın Peyğəmbərdən ﷺ cənabət qüslü barədə soruşdu. Peyğəmbər ﷺ buyurdu: "Su götürüb təmizlənsin və təmizlənməni gözəl şəkildə, yaxud tamam-kamal yerinə yetirsin. Sonra başına su töksün və (su) onun saç köklərinə çatana kimi başını ovxalasın. Sonra da bədəninə su əndərsin".

Aişə dedi: "Ənsar qadınları nə gözəl qadınlardır! Həyaları onlara dini öyrənməyə mane olmamışdır".

**[٧٥١]** (...) و حَدَّثَنَا عُبَيْدُ اللَّهِ بْنُ مُعَاذٍ: حَدَّثَنَا أَبِي: حَدَّثَنَا شُعْبَةُ فِي هَذَا الإِسْنَادِ، نَحْوَهُ. وَقَالَ: قَالَ: ((سُبْحَانَ اللَّهِ تَطَهَّرِي بِهَا)) وَاسْتَتَرَ.

**[751] (...)** ........ Şobə bu isnadla (həmin) hədisin bənzərini rəvayət etmişdir. (Bu rəvayətdə) deyilir ki, Peyğəmbər: "Subhənallah! Onunla təmizlən!"– deyə buyurdu və üzünü örtdü".

**[٧٥٢]** (...) و حَدَّثَنَا يَحْيَى بْنُ يَحْيَى وَأَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ، كِلاَهُمَا عَنْ أَبِي الأَحْوَصِ، عَنْ إِبْرَاهِيمَ بْنِ مُهَاجِرٍ، عَنْ صَفِيَّةَ بِنْتِ شَيْبَةَ، عَنْ عَائِشَةَ قَالَتْ: دَخَلَتْ أَسْمَاءُ بِنْتُ شَكَلٍ عَلَى رَسُولِ اللَّهِ ﷺ. فَقَالَتْ: يَا رَسُولَ اللَّهِ! كَيْفَ تَغْتَسِلُ إِحْدَانَا إِذَا طَهُرَتْ مِنَ الْحَيْضِ؟ وَسَاقَ الْحَدِيثَ، وَلَمْ يَذْكُرْ فِيهِ غُسْلَ الْجَنَابَةِ.

**[752] (...)** ........ Aişə رضي الله عنها demişdir: "Əsma bint Şəkəl Peyğəmbərin ﷺ yanına gəlib dedi: "Ya Rəsulullah! Bizdən birimiz heyzdən təmizləndikdən sonra necə qüsl almalıdır?..." Ravi hədisi nəql etmiş, lakin cənabət qüslünü zikr etməmişdir.

## (١٤) – بَابُ الْمُسْتَحَاضَةِ وَغُسْلِهَا وَصَلاَتِهَا

## 14-cü fəsil. İstihazəli[1] qadın, onun qüsl etməsi və namaz qılması (haqqında)

**[٧٥٣] ٦٢–(٣٣٣)** و حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ وَأَبُو كُرَيْبٍ قَالاَ: حَدَّثَنَا وَكِيعٌ عَنْ هِشَامِ بْنِ عُرْوَةَ، عَنْ أَبِيهِ، عَنْ عَائِشَةَ قَالَتْ: جَاءَتْ فَاطِمَةُ بِنْتُ أَبِي حُبَيْشٍ إِلَى النَّبِيِّ ﷺ. فَقَالَتْ: يَا رَسُولَ اللَّهِ! إِنِّي

---

[1] Bu, bakirəliyin itirilməsi, heyz və nifas istisna olmaqla, bəlli olmayan vaxtlarda qadının uşaqlığından gələn qandır.

امْرَأَةٌ أُسْتَحَاضُ فَلاَ أَطْهُرُ، أَفَأَدَعُ الصَّلاَةَ؟ فَقَالَ: ((لاَ، إِنَّمَا ذَلِكِ عِرْقٌ وَلَيْسَ بِالْحَيْضَةِ، فَإِذَا أَقْبَلَتْ الْحَيْضَةُ فَدَعِي الصَّلاَةَ، وَإِذَا أَدْبَرَتْ فَاغْسِلِي عَنْكِ الدَّمَ وَصَلِّي)).

**[753]-62-(333)** ........ Aişə ﵂ demişdir: “Fatimə bint Əbu Hubeyş Peyğəmbərin ﷺ yanına gəlib dedi: “Ya Rəsulullah! Mən istihazəyə mübtəla olmuş bir qadınam (məndən davamlı olaraq qan gəlir deyə) təmiz ola bilmirəm. (Bu halda) namazı buraxa bilərəmmi?” Peyğəmbər ﷺ buyurdu: “Xeyr, bu sadəcə damar qanıdır, heyz deyildir. Heyz qanı gəldikdə namazı burax. Heyz (müddəti) başa çatdıqda isə qüsl et, sonra da namazını qıl”.

**[٧٥٤]** (...) حَدَّثَنَا يَحْيَى بْنُ يَحْيَى: أَخْبَرَنَا عَبْدُ الْعَزِيزِ بْنُ مُحَمَّدٍ وَأَبُو مُعَاوِيَةَ؛ ح: و حَدَّثَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ: حَدَّثَنَا جَرِيرٌ؛ ح: و حَدَّثَنَا ابْنُ نُمَيْرٍ: حَدَّثَنَا أَبِي؛ ح: و حَدَّثَنَا خَلَفُ بْنُ هِشَامٍ: حَدَّثَنَا حَمَّادُ بْنُ زَيْدٍ، كُلُّهُمْ عَنْ هِشَامِ بْنِ عُرْوَةَ بِمِثْلِ حَدِيثِ وَكِيعٍ وَإِسْنَادِهِ. وَفِي حَدِيثِ قُتَيْبَةَ عَنْ جَرِيرٍ: جَاءَتْ فَاطِمَةُ بِنْتُ أَبِي حُبَيْشِ بْنِ عَبْدِ الْمُطَّلِبِ بْنِ أَسَدٍ، وَهِيَ امْرَأَةٌ مِنَّا، قَالَ: وَفِي حَدِيثِ حَمَّادِ بْنِ زَيْدٍ زِيَادَةُ حَرْفٍ، تَرَكْنَا ذِكْرَهُ.

**[754] (...)** ........ Əbu Müaviyə, Cərir, Numeyr və Həmmad ibn Zeyd – onların hamısı Hişam ibn Urvadan, Vəkinin hədisinin və isnadının bənzərini rəvayət etmişlər. Quteybənin Cərirdən rəvayət etdiyi hədisdə deyilir: “Fatimə bint Əbu Hubeyş ibn Abdul-Muttəlib ibn Əsəd gəldi. O, bizlərdən olan bir qadındır”. Həmmad ibn Zeydin rəvayətində isə əlavə söz vardır ki, biz onu zikr etməmişik.

**[٧٥٥] ٦٣-(٣٣٤)** حَدَّثَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ: حَدَّثَنَا لَيْثٌ؛ ح: و حَدَّثَنَا مُحَمَّدُ بْنُ رُمْحٍ: أَخْبَرَنَا اللَّيْثُ، عَنْ ابْنِ شِهَابٍ، عَنْ عُرْوَةَ، عَنْ عَائِشَةَ أَنَّهَا قَالَتْ: اسْتَفْتَتْ أُمُّ حَبِيبَةَ بِنْتُ جَحْشٍ رَسُولَ اللَّهِ ﷺ فَقَالَتْ: إِنِّي أُسْتَحَاضُ، فَقَالَ: ((إِنَّمَا ذَلِكِ عِرْقٌ فَاغْتَسِلِي، ثُمَّ صَلِّي)) فَكَانَتْ تَغْتَسِلُ عِنْدَ كُلِّ صَلاَةٍ.

قَالَ اللَّيْثُ بْنُ سَعْدٍ: لَمْ يَذْكُرْ ابْنُ شِهَابٍ: أَنَّ رَسُولَ اللَّهِ ﷺ أَمَرَ أُمَّ حَبِيبَةَ بِنْتَ جَحْشٍ أَنْ تَغْتَسِلَ عِنْدَ كُلِّ صَلاَةٍ، وَلَكِنَّهُ شَيْءٌ فَعَلَتْهُ هِيَ. و قَالَ ابْنُ رُمْحٍ فِي رِوَايَتِهِ: ابْنَةُ جَحْشٍ، وَلَمْ يَذْكُرْ أُمَّ حَبِيبَةَ.

**[755]-63-(334)** ........ Aişə ﵂ demişdir: “Ummu Həbibə bint Cəhş Peyğəmbərə ﷺ: “Məndən davamlı olaraq qan gəlir”– dedi və (ondan) fitva istədi. (Peyğəmbər ﷺ ona): “Bu sadəcə damar qanıdır. Sən yuyun, sonra da namazını qıl”– deyə buyurdu. Elə buna görə də Ummu Həbibə hər namazdan qabaq yuyunardı”.

Leys ibn Səd demişdir: "İbn Şihab Peyğəmbərin ﷺ, Cəhşin qızı Ummu Həbibəyə hər namazdan qabaq yuyunmağı buyurduğunu zikr etməmişdir. Lakin bu, Ummu Həbibənin öz istəyi ilə etdiyi bir şeydir".

İbn Rumh isə öz rəvayətində: "Cəhşin qızı"– demiş və "Ummu Həbibə" sözünü zikr etməmişdir.

**[٧٥٦] ٦٤**–(...) و حَدَّثَنَا مُحَمَّدُ بْنُ سَلَمَةَ الْمُرَادِيُّ: حَدَّثَنَا عَبْدُ اللَّهِ بْنُ وَهْبٍ عَنْ عَمْرِو بْنِ الْحَارِثِ، عَنْ ابْنِ شِهَابٍ، عَنْ عُرْوَةَ بْنِ الزُّبَيْرِ وَعَمْرَةَ بِنْتِ عَبْدِ الرَّحْمَنِ، عَنْ عَائِشَةَ زَوْجِ النَّبِيِّ ﷺ أَنَّ أُمَّ حَبِيبَةَ بِنْتَ جَحْشٍ – خَتَنَةَ رَسُولِ اللَّهِ ﷺ وَتَحْتَ عَبْدِ الرَّحْمَنِ بْنِ عَوْفٍ، اسْتُحِيضَتْ سَبْعَ سِنِينَ، فَاسْتَفْتَتْ رَسُولَ اللَّهِ ﷺ فِي ذَلِكَ، فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: ((إِنَّ هَذِهِ لَيْسَتْ بِالْحَيْضَةِ، وَلَكِنَّ هَذَا عِرْقٌ، فَاغْتَسِلِي وَصَلِّي)).

قَالَتْ عَائِشَةُ: فَكَانَتْ تَغْتَسِلُ فِي مِرْكَنٍ فِي حُجْرَةِ أُخْتِهَا زَيْنَبَ بِنْتِ جَحْشٍ حَتَّى تَعْلُوَ حُمْرَةُ الدَّمِ الْمَاءَ.

قَالَ ابْنُ شِهَابٍ: فَحَدَّثْتُ بِذَلِكَ أَبَا بَكْرِ بْنَ عَبْدِ الرَّحْمَنِ بْنِ الْحَارِثِ بْنِ هِشَامٍ، فَقَالَ: يَرْحَمُ اللَّهُ هِنْدًا، لَوْ سَمِعَتْ بِهَذِهِ الْفُتْيَا، وَاللَّهِ! إِنْ كَانَتْ لَتَبْكِي، لِأَنَّهَا كَانَتْ لاَ تُصَلِّي.

**[756]-64-(...)** ........ Peyğəmbərin ﷺ zövcəsi Aişə رضي الله عنها demişdir: "Peyğəmbərin ﷺ baldızı, həm də Abdur-Rəhman ibn Aufun həyat yoldaşı Ummu Həbibə bint Cəhş yeddi il istihazə gördü. O, bu xüsusda Peyğəmbərdən ﷺ fitva istədi. Peyğəmbər ﷺ də ona belə buyurdu: "Şübhəsiz ki, bu, heyz deyildir. Lakin bu damar qanıdır. Odur ki, yuyun və namazını qıl!"

Aişə demişdir: "Ummu Həbibə bacısı Zeynəb bint Cəhşin hücrəsində bir ləyən içində yuyunar, hətta qanın rəngi suyun üzünə çıxardı".

İbn Şihab demişdir: "Mən bunu Əbu Bəkr ibn Abdur-Rəhman ibn Haris ibn Hişama danışdım. O dedi: "Allah Hində rəhmət eləsin! Əgər o, bu fitvanı eşitsəydi, vallahi, ağlayardı. Çünki o, (bu səbəbdən) namaz qılmırdı".

**[٧٥٧]** (...) و حَدَّثَنِي أَبُو عِمْرَانَ مُحَمَّدُ بْنُ جَعْفَرِ بْنِ زِيَادٍ: أَخْبَرَنَا إِبْرَاهِيمُ يَعْنِي ابْنَ سَعْدٍ، عَنْ ابْنِ شِهَابٍ، عَنْ عَمْرَةَ بِنْتِ عَبْدِ الرَّحْمَنِ، عَنْ عَائِشَةَ قَالَتْ: جَاءَتْ أُمُّ حَبِيبَةَ بِنْتُ جَحْشٍ إِلَى رَسُولِ اللَّهِ ﷺ، وَكَانَتْ اسْتُحِيضَتْ سَبْعَ سِنِينَ، بِمِثْلِ حَدِيثِ عَمْرِو بْنِ الْحَارِثِ إِلَى قَوْلِهِ: تَعْلُوَ حُمْرَةُ الدَّمِ الْمَاءَ، وَلَمْ يَذْكُرْ مَا بَعْدَهُ.

**[757] (...)** ........ Aişə رضي الله عنها demişdir: "Ummu Həbibə bint Cəhş Peyğəmbərin ﷺ yanına gəldi. O, yeddi il idi ki, istihazə görürdü..." Ravi bu hədisi Amr ibn Harisin rəvayət etdiyi hədisə bənzər – "hətta qanın rəngi suyun üzünə çıxardı" sözünə kimi rəvayət etmiş, lakin bundan sonrasını zikr etməmişdir.

**[٧٥٨]** (...) و حَدَّثَنِي مُحَمَّدُ بْنُ الْمُثَنَّى: حَدَّثَنَا سُفْيَانُ بْنُ عُيَيْنَةَ عَنْ الزُّهْرِيِّ، عَنْ عَمْرَةَ، عَنْ عَائِشَةَ أَنَّ ابْنَةَ جَحْشٍ كَانَتْ تُسْتَحَاضُ سَبْعَ سِنِينَ بِنَحْوِ حَدِيثِهِمْ.

**[758] (...)** ........ Süfyan ibn Uyeynə Zuhridən, o da Amrədən, o da Aişədən: "Cəhşin qızı yeddi il istihazə görmüşdür..." deyib əvvəlki hədislərin bənzərini rəvayət etmişdir.

**[٧٥٩] ٦٥**–(...) و حَدَّثَنَا مُحَمَّدُ بْنُ رُمْحٍ: أَخْبَرَنَا اللَّيْثُ؛ **ح**: و حَدَّثَنَا قُتَيْبَةُ بْنُ سَعِيد: حَدَّثَنَا لَيْثٌ عَنْ يَزِيدَ بْنِ أَبِي حَبِيب، عَنْ جَعْفَر، عَنْ عِرَاك، عَنْ عُرْوَةَ، عَنْ عَائِشَةَ أَنَّهَا قَالَتْ: إِنَّ أُمَّ حَبِيبَةَ سَأَلَتْ رَسُولَ اللَّه ﷺ عَنْ الدَّمِ؟ فَقَالَتْ عَائِشَةُ: رَأَيْتُ مِرْكَنَهَا مَلآنَ دَمًا، فَقَالَ لَهَا رَسُولُ اللَّهِ ﷺ: ((امْكُثِي قَدْرَ مَا كَانَتْ تَحْبِسُكِ حَيْضَتُكِ، ثُمَّ اغْتَسِلِي وَصَلِّي)).

**[759]-65-(...)** ........ Aişə ؓ demişdir: "Ummu Həbibə Peyğəmbərdən ﷺ istihazə qanı barədə soruşdu. Mən onun ləyəninin qanla dolu olduğunu gördüm. Peyğəmbər ﷺ ona: "Heyzin səni saxladığı müddətə qədər gözlə. Sonra yuyun və namaz qıl!"– deyə buyurdu.

**[٧٦٠] ٦٦**–(...) حَدَّثَنِي مُوسَى بْنُ قُرَيْشٍ التَّمِيمِيُّ: حَدَّثَنَا إِسْحَقُ بْنُ بَكْرِ بْنِ مُضَرَ: حَدَّثَنِي أَبِي، حَدَّثَنِي جَعْفَرُ بْنُ رَبِيعَةَ، عَنْ عِرَاكِ بْنِ مَالِك، عَنْ عُرْوَةَ بْنِ الزُّبَيْرِ، عَنْ عَائِشَةَ زَوْجِ النَّبِيِّ ﷺ أَنَّهَا قَالَتْ: إِنَّ أُمَّ حَبِيبَةَ بِنْتَ جَحْشٍ، الَّتِي كَانَتْ تَحْتَ عَبْدِ الرَّحْمَنِ بْنِ عَوْف، شَكَتْ إِلَى رَسُولِ اللَّه ﷺ الدَّمَ. فَقَالَ لَهَا: ((امْكُثِي قَدْرَ مَا كَانَتْ تَحْبِسُكِ حَيْضَتُكِ، ثُمَّ اغْتَسِلِي)) فَكَانَتْ تَغْتَسِلُ عِنْدَ كُلِّ صَلَاةٍ.

**[760]-66-(...)** ........ Peyğəmbərin ﷺ zövcəsi Aişə ؓ demişdir: "Abdur-Rəhman ibn Aufun həyat yoldaşı Ummu Həbibə bint Cəhş Peyğəmbərə ﷺ istihazə qanından şikayət etdi. (Peyğəmbər ﷺ də) ona: "Heyzin səni saxladığı müddətə qədər gözlə, sonra yuyun"– deyə buyurdu. Beləcə, o, hər namazdan qabaq yuyunardı".

## (١٥) – بَابُ وُجُوبِ قَضَاءِ الصَّوْمِ عَلَى الْحَائِضِ دُونَ الصَّلَاةِ

## 15-ci fəsil. Heyz olmuş qadına namazın deyil, (ancaq) orucun qəzasını tutmağın vacib olması

**[٧٦١] ٦٧**–(**٣٣٥**) حَدَّثَنَا أَبُو الرَّبِيعِ الزَّهْرَانِيُّ: حَدَّثَنَا حَمَّادٌ عَنْ أَيُّوبَ، عَنْ أَبِي قِلَابَةَ، عَنْ مُعَاذَةَ؛ **ح**: و حَدَّثَنَا حَمَّادٌ، عَنْ يَزِيدَ الرِّشْك، عَنْ مُعَاذَةَ: أَنَّ امْرَأَةً سَأَلَتْ عَائِشَةَ فَقَالَتْ: أَتَقْضِي إِحْدَانَا الصَّلَاةَ أَيَّامَ مَحِيضِهَا؟ فَقَالَتْ عَائِشَةُ: أَحَرُورِيَّةٌ أَنْتِ؟ قَدْ كَانَتْ إِحْدَانَا تَحِيضُ عَلَى عَهْدِ رَسُولِ اللَّهِ ﷺ، ثُمَّ لَا تُؤْمَرُ بِقَضَاءٍ.

**[761]-67-(335)** ........ Muazə rəvayət edir ki, bir qadın Aişədən soruşdu: “Bizdən birimiz heyzdən təmizləndikdən sonra (heyz vaxtı buraxdığı namazları) qılmalıdırmı?” Aişə dedi: “Sən hərurilərdənsən?![1] Bizdən birimiz Peyğəmbərin ﷺ dövründə heyz olardı, lakin sonra ona (buraxdığı namazları) qılmaq əmr edilməzdi”.

**[٧٦٢] ٦٨**–(...) و حَدَّثَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى: حَدَّثَنَا مُحَمَّدُ بْنُ جَعْفَرٍ: حَدَّثَنَا شُعْبَةُ، عَنْ يَزِيدَ قَالَ: سَمِعْتُ مُعَاذَةَ، أَنَّهَا سَأَلَتْ عَائِشَةَ: أَتَقْضِي الْحَائِضُ الصَّلَاةَ؟ فَقَالَتْ عَائِشَةُ: أَحَرُورِيَّةٌ أَنْتِ؟ قَدْ كُنَّ نِسَاءُ رَسُولِ اللَّهِ ﷺ يَحِضْنَ أَفَأَمَرَهُنَّ أَنْ يَجْزِينَ؟

قَالَ مُحَمَّدُ بْنُ جَعْفَرٍ: تَعْنِي يَقْضِينَ.

**[762]-68-(...)** ........ Yezid demişdir: “Mən Muazənin belə rəvayət etdiyi eşitdim. Muazə Aişədən: “Heyzli qadın (buraxdığı) namazın qəzasını qılırmı?”– deyə soruşmuş, Aişə də ona (etirazını bildirib) belə cavab vermişdir: “Sən hərurilərdənsən?! Peyğəmbərin ﷺ qadınları heyzli olardılar. Məgər Peyğəmbər ﷺ onlara əvəzini çıxmağı əmr edərdimi?!”

Muhəmməd ibn Cəfər demişdir: “Yəni onun qəzasını qılardılarmı?!”

**[٧٦٣] ٦٩**–(...) و حَدَّثَنَا عَبْدُ بْنُ حُمَيْدٍ: أَخْبَرَنَا عَبْدُ الرَّزَّاقِ: أَخْبَرَنَا مَعْمَرٌ عَنْ عَاصِمٍ، عَنْ مُعَاذَةَ قَالَتْ: سَأَلْتُ عَائِشَةَ فَقُلْتُ: مَا بَالُ الْحَائِضِ تَقْضِي الصَّوْمَ وَلَا تَقْضِي الصَّلَاةَ؟ فَقَالَتْ: أَحَرُورِيَّةٌ أَنْتِ؟ قُلْتُ: لَسْتُ بِحَرُورِيَّةٍ، وَلَكِنِّي أَسْأَلُ، قَالَتْ: كَانَ يُصِيبُنَا ذَلِكَ فَنُؤْمَرُ بِقَضَاءِ الصَّوْمِ وَلَا نُؤْمَرُ بِقَضَاءِ الصَّلَاةِ.

**[763]-69-(...)** ........ Muazə demişdir: “Mən Aişədən: “Nəyə görə heyzli qadın orucun qəzasını tutur, amma namazın qəzasını qılmır?”– deyə soruşdum. (Aişə) dedi: “Sən hərurilərdənsən?!” Mən: “(Yox,) həruri deyiləm, lakin soruşuram (ki, səbəbini öyrənim)”– deyə cavab verdim. (Aişə) dedi: “Biz heyz gördükdə bizə orucun qəzasını tutmaq əmr edilər, namazın qəzasını qılmaq isə əmr edilməzdi”.[2]

---

[1] Hərura – Kufə şəhərinin yaxınlığında yerləşən kənddir. Əli ibn Əbu Talibdən ﵁ üz döndərib camaatdan ayrılmış on iki min xəvaric də məhz bu kənddə toplaşmış və camaata qarşı çıxmışlar. Onlar belə hesab edirdilər ki, heyzdən təmizlənmiş qadın heyz əsnasında buraxdığı namazlarını yenidən qılmalıdır.

[2] Heyz və ya nifas halında olan qadın qan kəsilənədək namazlarını və oruclarını buraxmalı, qan kəsildikdən və qüsl etdikdən sonra isə yalnız oruclarının qəzasını tutmalıdır.

## (١٦) – بَابُ تَسَتُّرِ الْمُغْتَسِلِ بِثَوْبٍ وَنَحْوِهِ

## 16-cı fəsil. Qüsl edən kimsənin paltar və ya buna bənzər bir şeylə pərdələnməsi

**[٧٦٤] ٧٠-(٣٣٦)** و حَدَّثَنَا يَحْيَى بْنُ يَحْيَى قَالَ: قَرَأْتُ عَلَى مَالِكٍ عَنْ أَبِي النَّضْرِ: أَنَّ أَبَا مُرَّةَ مَوْلَى أُمِّ هَانِئٍ بِنْتِ أَبِي طَالِبٍ أَخْبَرَهُ أَنَّهُ سَمِعَ أُمَّ هَانِئٍ بِنْتَ أَبِي طَالِبٍ تَقُولُ: ذَهَبْتُ إِلَى رَسُولِ اللَّهِ ﷺ عَامَ الْفَتْحِ، فَوَجَدْتُهُ يَغْتَسِلُ، وَفَاطِمَةُ ابْنَتُهُ تَسْتُرُهُ بِثَوْبٍ.

**[764]-70-(336)** ........ Yəhya ibn Yəhya demişdir: “Mən Malikin hüzurunda (bunu) oxudum: “Əbu Nədrdən, ona da Əbu Talibin qızı Ummu Haninin mövlası Əbu Murra xəbər vermişdir ki, o, Əbu Talibin qızı Ummu Haninin belə dediyini eşitmişdir: “(Məkkənin) fəthi ilində Peyğəmbərin ﷺ yanına getdim. (Gəlib) gördüm ki, o, qüsl edir, qızı Fatimə də ona bir örtüklə pərdə tutur”.[1]

**[٧٦٥] ٧١-(...)** حَدَّثَنَا مُحَمَّدُ بْنُ رُمْحِ بْنِ الْمُهَاجِرِ: أَخْبَرَنَا اللَّيْثُ عَنْ يَزِيدَ بْنِ أَبِي حَبِيبٍ، عَنْ سَعِيدِ بْنِ أَبِي هِنْدٍ، أَنَّ أَبَا مُرَّةَ مَوْلَى عَقِيلٍ حَدَّثَهُ، أَنَّ أُمَّ هَانِئٍ بِنْتَ أَبِي طَالِبٍ حَدَّثَتْهُ أَنَّهُ لَمَّا كَانَ عَامُ الْفَتْحِ، أَتَتْ رَسُولَ اللَّهِ ﷺ وَهُوَ بِأَعْلَى مَكَّةَ، قَامَ رَسُولُ اللَّهِ ﷺ إِلَى غُسْلِهِ، فَسَتَرَتْ عَلَيْهِ فَاطِمَةُ، ثُمَّ أَخَذَ ثَوْبَهُ فَالْتَحَفَ بِهِ، ثُمَّ صَلَّى ثَمَانَ رَكَعَاتٍ سُبْحَةَ الضُّحَى.

**[765]-71-(...)** ........ Əbu Talibin qızı Ummu Hani demişdir: “(Məkkənin) fəthi ilində mən Peyğəmbərin ﷺ yanına gəldim. (Həmin vaxt) o, Məkkənin yuxarı tərəfində idi. Peyğəmbər ﷺ qüsl etmək üçün ayağa qalxdı. (Qızı) Fatimə də ona pərdə tutdu. (Yuyunduqdan) sonra paltarını götürüb ona büründü, sonra da səkkiz rükət Duha namazı[2] qıldı”.

**[٧٦٦] ٧٢-(...)** و حَدَّثَنَاه أَبُو كُرَيْبٍ: حَدَّثَنَا أَبُو أُسَامَةَ عَنْ الْوَلِيدِ بْنِ كَثِيرٍ، عَنْ سَعِيدِ بْنِ أَبِي هِنْدٍ بِهَذَا الإِسْنَادِ، وَقَالَ: فَسَتَرَتْهُ ابْنَتُهُ فَاطِمَةُ بِثَوْبِهِ، فَلَمَّا اغْتَسَلَ أَخَذَهُ فَالْتَحَفَ بِهِ، ثُمَّ قَامَ فَصَلَّى ثَمَانَ سَجَدَاتٍ، وَذَلِكَ ضُحًى.

---

[1] 1667-ci hədisə bax.

[2] Duha: səhər, gündüzün başlanğıcı deməkdir. Duha namazının vaxtı: Günəş üfüqdən bir nizə hündürlüyündə qalxdıqdan sonra; yəni təqribən günəş çıxdıqdan on beş dəqiqə sonra günəş səmanın ortasına, zenitə yüksəlməsindən bir az əvvələdək – təqribən on dəqiqə qabaq (“Şərhu əl-Mumti”, 4/122-123).

**[766]-72-(...)** ........ Əbu Usamə (bu hədisi) Vəlid ibn Kəsirdən, o da Səid ibn Əbu Hinddən bu isnadla rəvayət etmişdir. Səid demişdir: “Qızı Fatimə onun paltarı ilə ona pərdə tutdu. O, (yuyunduqdan) sonra paltarını götürüb ona büründü, sonra da qalxıb səkkiz rükət namaz qıldı. Bu, Duha (namazı) idi”.

**[٧٦٧] ٧٣-(٣٣٧)** حَدَّثَنَا إِسْحَقُ بْنُ إِبْرَاهِيمَ الْحَنْظَلِيُّ: أَخْبَرَنَا مُوسَى الْقَارِئُ: حَدَّثَنَا زَائِدَةُ عَنْ الأَعْمَشِ، عَنْ سَالِمِ بْنِ أَبِي الْجَعْدِ، عَنْ كُرَيْبٍ، عَنْ ابْنِ عَبَّاسٍ، عَنْ مَيْمُونَةَ قَالَتْ: وَضَعْتُ لِلنَّبِيِّ ﷺ مَاءً وَسَتَرْتُهُ فَاغْتَسَلَ.

**[767]-73-(337)** ........ Zaidə Aməşdən, o da Salim ibn Əbu Cəddən, o da Kureybdən, o da İbn Abbasdan, o da Məymunədən rəvayət etmişdir. Məymunə demişdir: “Mən Peyğəmbər ﷺ üçün su qoydum və onun üçün pərdə tutdum, o da qüsl etdi”.

## (١٧) – بَابُ تَحْرِيمِ النَّظَرِ إِلَى الْعَوْرَاتِ

## 17-ci fəsil. Ayıb yerlərinə[1] baxmağın haram buyurulması

**[٧٦٨] ٧٤-(٣٣٨)** حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا زَيْدُ بْنُ الْحُبَابِ عَنْ الضَّحَّاكِ بْنِ عُثْمَانَ قَالَ: أَخْبَرَنِي زَيْدُ بْنُ أَسْلَمَ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ، عَنْ أَبِيهِ، أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: ((لاَ يَنْظُرُ الرَّجُلُ إِلَى عَوْرَةِ الرَّجُلِ وَلاَ الْمَرْأَةُ إِلَى عَوْرَةِ الْمَرْأَةِ، وَلاَ يُفْضِي الرَّجُلُ إِلَى الرَّجُلِ فِي ثَوْبٍ وَاحِدٍ، وَلاَ تُفْضِي الْمَرْأَةُ إِلَى الْمَرْأَةِ فِي الثَّوْبِ الْوَاحِدِ)).

---

[1] Kişi üçün göbəkdən dizə qədər, qadın üçün isə əl və üzdən başqa bədənin hər yeri ayıb yerləri sayılır. Qeyd etmək lazımdır ki, qadın öz məhrəmlərinin yanında qollarını, başını, boynunu və ayaqlarını dizə qədər aça bilər. Naməhrəmlərin yanında isə hicabda olmalıdır. Hicabın isə özünəməxsus şərtləri vardır ki, bunlar da aşağıdakılardır:

– qadının əl və üzdən başqa bütün bədən üzvlərini örtməli;
– zinətli, bərbəzəkli olmamalı;
– dar olmamalı;
– kişilərə və ya kafir qadınlara məxsus geyimlərə oxşamamalı;
– şəffaf, açıq-saçıq olmamalı;
– diqqət cəlb edici olmamalı;
– ətirlənmiş olmamalı.

**[768]-74-(338)** ........ Əbu Səid əl-Xudri ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurmuşdur: "Kişi kişinin, qadın da qadının ayıb yerlərinə baxmasın.[1] Kişi kişiyə bir bürüncək altında sürtüşməsin. Habelə qadın da qadına bir bürüncək altında sürtüşməsin[2]".

**[٧٦٩]** (...) و حَدَّثَنِيهِ هَارُونُ بْنُ عَبْدِ اللَّهِ وَمُحَمَّدُ بْنُ رَافِعٍ قَالاَ: حَدَّثَنَا ابْنُ أَبِي فُدَيْكٍ: أَخْبَرَنَا الضَّحَّاكُ بْنُ عُثْمَانَ بِهَذَا الإِسْنَادِ وَقَالاَ – مَكَانَ ((عَوْرَةِ – عُرْيَةِ الرَّجُلِ وَعُرْيَةِ الْمَرْأَةِ)).

**[769] (...)** ........ Dəhhak ibn Osman (hədisi) bu isnadla rəvayət etmişdir. Ravilər bu hədisdə "övrət" kəlməsi əvəzinə "kişinin üryəsi, qadının üryəsi[3]" kəlmələrini işlətmişlər.

## (١٨) – بَابُ جَوَازِ الاغْتِسَالِ عُرْيَانًا فِي الْخَلْوَةِ

## 18-ci fəsil. Xəlvətdə çılpaq vəziyyətdə çimməyin caiz olması

**[٧٧٠] ٧٥-(٣٣٩)** و حَدَّثَنَا مُحَمَّدُ بْنُ رَافِعٍ: حَدَّثَنَا عَبْدُ الرَّزَّاقِ: حَدَّثَنَا مَعْمَرٌ عَنْ هَمَّامِ بْنِ مُنَبِّهٍ قَالَ: هَذَا مَا حَدَّثَنَا أَبُو هُرَيْرَةَ عَنْ مُحَمَّدٍ رَسُولِ اللَّهِ ﷺ، فَذَكَرَ أَحَادِيثَ مِنْهَا، وَقَالَ رَسُولُ اللَّهِ ﷺ: ((كَانَتْ بَنُو إِسْرَائِيلَ يَغْتَسِلُونَ عُرَاةً، يَنْظُرُ بَعْضُهُمْ إِلَى سَوْأَةِ بَعْضٍ، وَكَانَ مُوسَى عَلَيْهِ السَّلاَمُ يَغْتَسِلُ وَحْدَهُ، فَقَالُوا: وَاللَّهِ! مَا يَمْنَعُ مُوسَى أَنْ يَغْتَسِلَ مَعَنَا إِلاَّ أَنَّهُ آدَرُ، قَالَ فَذَهَبَ مَرَّةً يَغْتَسِلُ، فَوَضَعَ ثَوْبَهُ عَلَى حَجَرٍ، فَفَرَّ الْحَجَرُ بِثَوْبِهِ، قَالَ فَجَمَحَ مُوسَى بِإِثْرِهِ يَقُولُ: ثَوْبِي حَجَرُ! ثَوْبِي حَجَرُ! حَتَّى نَظَرَتْ بَنُو إِسْرَائِيلَ إِلَى سَوْأَةِ مُوسَى قَالُوا: وَاللَّهِ! مَا بِمُوسَى مِنْ بَأْسٍ، فَقَامَ الْحَجَرُ حَتَّى نُظِرَ إِلَيْهِ. قَالَ فَأَخَذَ ثَوْبَهُ فَطَفِقَ بِالْحَجَرِ ضَرْبًا)).

قَالَ أَبُو هُرَيْرَةَ: وَاللَّهِ! إِنَّهُ بِالْحَجَرِ نَدَبٌ سِتَّةٌ أَوْ سَبْعَةٌ، ضَرْبُ مُوسَى بِالْحَجَرِ.

**[770]-75-(339)** ........ Həmmam: "Bu, Əbu Hureyrənin bizə Allahın elçisi Məhəmməddən ﷺ rəvayət etdikləridir" demiş və bir çox hədislər zikr etmişdir. Onlardan biri də budur: "Peyğəmbər ﷺ demişdir: "İsrail oğulları çılpaq olaraq, bir-birilərinin ayıb yerlərinə baxa-baxa çimərdilər. Musa ﷺ isə təklikdə çimərdi.[4]

---

[1] Həmçinin kişi qadının, qadın da kişinin ayıb yerlərinə baxmamalıdır. Yalnız ər-arvadın bir-birinə baxması müstəsnadır. Belə ki, kişi öz qadınının, qadın da öz ərinin bədəninin istənilən yerinə baxa bilər.

[2] Bu hədis iki kişinin və ya iki qadının bir örtük altında qalmasının haram olduğunu bildirir.

[3] Üryə – çılpaq deməkdir.

[4] Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Əyyub çılpaq çimərkən onun üstünə qızıldan çəyirtkələr töküldü. Əyyub *onları* paltarının *cibinə* yığmağa başladı. *Bu vaxt* Rəbbi onu çağırıb buyurdu: "Ey Əyyub! Məgər Mən səni bu gördüyündən *artığı ilə* zəngin etmədimmi?" Əyyub: "Bəli, Sənin izzətinə and olsun ki, *elədir*. Lakin mən *hər zaman* Sənin bərəkətinə möhtacam"– deyə cavab verdi" ("Səhih əl-Buxari", 279).

(İsrail oğulları): "Vallahi ki, Musaya bizimlə birlikdə çimməyə mane olan ancaq onun dəbə[1] olmasıdır"– dedilər. Bir dəfə Musa yenə çimməyə getdi və paltarını daşın üstünə qoydu. Qəfildən daş onun paltarını götürüb qaçdı. Musa: "Paltarımı (qaytar), ey daş! Paltarımı (qaytar), ey daş!"– deyə-deyə daşın arxasınca qaçdı. Nəhayət, İsrail oğulları Musanın ayıb yerini gördülər və: "Vallahi ki, Musada heç bir qüsur yox imiş"– dedilər. Nəhayət, daş dayandı və onu (tam surətdə) gördülər. Musa paltarını götürdü və daşı vurmağa başladı".

Əbu Hureyrə dedi: "Vallahi, Musa daşa altı, yaxud yeddi zərbə vurmaqla daşı tənbeh etdi".[2]

## (١٩) – بَابُ الاعْتِنَاءِ بِحِفْظِ الْعَوْرَةِ

## 19-cu fəsil. Ayıb yerlərini örtməyə diqqət yetirmək

**[٧٧١] ٧٦–(٣٤٠)** و حَدَّثَنَا إِسْحَقُ بْنُ إِبْرَاهِيمَ الْحَنْظَلِيُّ وَمُحَمَّدُ بْنُ حَاتِمِ بْنِ مَيْمُونٍ، جَمِيعًا عَنْ مُحَمَّدِ بْنِ بَكْرٍ، قَالاَ: أَخْبَرَنَا ابْنُ جُرَيْجٍ؛ ح: و حَدَّثَنَا إِسْحَقُ بْنُ مَنْصُورٍ وَمُحَمَّدُ بْنُ رَافِعٍ، وَاللَّفْظُ لَهُمَا – قَالَ إِسْحَقُ: أَخْبَرَنَا وَقَالَ ابْنُ رَافِعٍ: حَدَّثَنَا – عَبْدُ الرَّزَّاقِ: أَخْبَرَنَا ابْنُ جُرَيْجٍ: أَخْبَرَنِي عَمْرُو بْنُ دِينَارٍ، أَنَّهُ سَمِعَ جَابِرَ بْنَ عَبْدِ اللَّهِ يَقُولُ: لَمَّا بُنِيَتْ الْكَعْبَةُ ذَهَبَ النَّبِيُّ ﷺ وَعَبَّاسٌ يَنْقُلاَنِ حِجَارَةً، فَقَالَ الْعَبَّاسُ لِلنَّبِيِّ ﷺ: اجْعَلْ إِزَارَكَ عَلَى عَاتِقِكَ، مِنْ الْحِجَارَةِ، فَفَعَلَ، فَخَرَّ إِلَى الأَرْضِ، وَطَمَحَتْ عَيْنَاهُ إِلَى السَّمَاءِ، ثُمَّ قَامَ فَقَالَ: ((إِزَارِي، إِزَارِي)) فَشَدَّ عَلَيْهِ إِزَارَهُ.

قَالَ ابْنُ رَافِعٍ فِي رِوَايَتِهِ: عَلَى رَقَبَتِكَ، وَلَمْ يَقُلْ: عَلَى عَاتِقِكَ.

**[771]-76-(340)** ........ Cabir ibn Abdullah ﵁ demişdir: "Kəbə bina edildiyi zaman Peyğəmbər ﷺ və Abbas daş daşıyırdılar. (Bu əsnada) Abbas Peyğəmbərə ﷺ: "İzarını[3] çiyninə sal ki, səni daşdan (qorusun)"– dedi. O, bunu edən kimi yerə yıxıldı və gözləri səmaya dikildi. Sonra: "İzarım, izarım"– deyərək ayağa qalxdı və izarını belinə bağladı.[4]

İbn Rafi öz rəvayətində: "boynuna" – demiş, "çiyninə"– deməmişdir.

---

[1] Dəbə – qasıq yırtığı xəstəliyinə və ya bu cür xəstəliyi olan adama deyilir. Buna qrıja da deyirlər.

[2] 6146-cı hədisə bax.

[3] İzar – qurşaqdan aşağı bədən əzalarını örtmək üçün belə bağlanılan örtük.

[4] Bu dəlildir ki, Peyğəmbər ﷺ hələ cavan ikən Allah Subhanəhu və Təalə onu cahiliyyət dövrünün yaramaz əxlaqından qorumuşdur.

**[٧٧٢]** ٧٧-(...) و حَدَّثَنَا زُهَيْرُ بْنُ حَرْبٍ: حَدَّثَنَا رَوْحُ بْنُ عُبَادَةَ: حَدَّثَنَا زَكَرِيَّاءُ بْنُ إِسْحَقَ: حَدَّثَنَا عَمْرُو بْنُ دِينَارٍ قَالَ: سَمِعْتُ جَابِرَ بْنَ عَبْدِ اللَّهِ يُحَدِّثُ: أَنَّ رَسُولَ اللَّهِ ﷺ كَانَ يَنْقُلُ مَعَهُمُ الْحِجَارَةَ لِلْكَعْبَةِ، وَعَلَيْهِ إِزَارُهُ، فَقَالَ لَهُ الْعَبَّاسُ – عَمُّهُ –: يَا ابْنَ أَخِي! لَوْ حَلَلْتَ إِزَارَكَ، فَجَعَلْتَهُ عَلَى مَنْكِبِكَ، دُونَ الْحِجَارَةِ. قَالَ فَحَلَّهُ، فَجَعَلَهُ عَلَى مَنْكِبِهِ، فَسَقَطَ مَغْشِيًّا عَلَيْهِ. قَالَ: فَمَا رُئِيَ بَعْدَ ذَلِكَ الْيَوْمِ عُرْيَانًا.

**[772]-77-(...)** ........ Cabir ibn Abdullah ﷺ demişdir: "Rəsulullah ﷺ qureyşlilərlə birlikdə Kəbəni (bina etmək) üçün daş daşıyırdılar. Peyğəmbər ﷺ fitəsini belinə bağlamışdı. (Həmin vaxt əmisi) Abbas ona dedi: "Ey qardaşım oğlu! (Yaxşı olar ki,) fitəni açıb çiyninin üstünə, daşın altına qoyasan"– dedi. Peyğəmbər ﷺ fitəsini açıb çıyninə salan kimi bayılmış halda yerə yıxıldı. Artıq həmin gündən sonra o heç vaxt çılpaq görünməmişdir".

**[٧٧٣]** ٧٨-(٣٤١) حَدَّثَنَا سَعِيدُ بْنُ يَحْيَى الْأُمَوِيُّ: حَدَّثَنِي أَبِي: حَدَّثَنَا عُثْمَانُ بْنُ حَكِيمِ بْنِ عَبَّادِ بْنِ حُنَيْفٍ الْأَنْصَارِيُّ: أَخْبَرَنِي أَبُو أُمَامَةَ بْنُ سَهْلِ بْنِ حُنَيْفٍ عَنِ الْمِسْوَرِ بْنِ مَخْرَمَةَ قَالَ: أَقْبَلْتُ بِحَجَرٍ، أَحْمِلُهُ ثَقِيلٍ، وَعَلَيَّ إِزَارٌ خَفِيفٌ، قَالَ: فَانْحَلَّ إِزَارِي وَمَعِيَ الْحَجَرُ، لَمْ أَسْتَطِعْ أَنْ أَضَعَهُ حَتَّى بَلَغْتُ بِهِ إِلَى مَوْضِعِهِ، فَقَالَ رَسُولُ اللَّهِ ﷺ ((ارْجِعْ إِلَى ثَوْبِكَ فَخُذْهُ، وَلَا تَمْشُوا عُرَاةً)).

**[773]-78-(341)** ........ Misvər ibn Məxrəmə ﷺ demişdir: "Mən daşıdığım ağır bir daşı gətirib (yerə qoydum). Belimə də fitə bağlamışdım. Daşı apararkən birdən fitəm açılıb yerə düşdü. Mən fitəni (götürüb belimə) bağlaya bilmədim. Nəhayət, daşı aparıb yerinə qoydum. Peyğəmbər ﷺ (məni bu vəziyyətdə görüb) dedi: "Paltarının yanına qayıt, götür onu və lüt gəzməyin".

## (٢٠) – بَابُ مَا يُسْتَتَرُ بِهِ لِقَضَاءِ الْحَاجَةِ

## 20-ci fəsil. Təbii ehtiyac rəf etdikdə sütrə götürülən[1] şey

**[٧٧٤]** ٧٩-(٣٤٢) حَدَّثَنَا شَيْبَانُ بْنُ فَرُّوخَ وَعَبْدُ اللَّهِ بْنُ مُحَمَّدِ بْنِ أَسْمَاءَ الضُّبَعِيُّ قَالَا: حَدَّثَنَا مَهْدِيٌّ – وَهُوَ ابْنُ مَيْمُونٍ –: حَدَّثَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللَّهِ بْنِ أَبِي يَعْقُوبَ عَنِ الْحَسَنِ بْنِ سَعْدٍ، مَوْلَى الْحَسَنِ بْنِ

[1] Şəriətdə sütrə deyildikdə namaz üçün xüsusiləşdirilmiş, namaz qılan kimsənin namaz əsnasında qarşısına qoyduğu, təqribən dirsək hündürlüyündə olan ağac və ya ona bənzər əşya qəsd edilir. Peyğəmbər ﷺ demişdir: "Sizdən biriniz namaz qıldığı zaman önünə sütrə qoysun! Bundan sonra isə önündən keçmək istəyəni əli ilə dəf etsin, keçməyə cəhd edərsə ona müqavimət göstərsin, çünki artıq o, şeytandır" ("Səhih əl-Buxari", 509; "Səhih Muslim", 1128). Burada isə subaşına çıxmaq üçün sadəcə örtük tutmaq, pərdələnmək, yaxud ağac, dağ və buna bənzər şeylərin arxasına keçmək nəzərdə tutulur.

عَلِيٌّ عَنْ عَبْدِ اللَّهِ بْنِ جَعْفَرٍ قَالَ: أَرْدَفَنِي رَسُولُ اللَّهِ ﷺ ذَاتَ يَوْمٍ خَلْفَهُ، فَأَسَرَّ إِلَيَّ حَدِيثًا لاَ أُحَدِّثُ بِهِ أَحَدًا مِنْ النَّاسِ، وَكَانَ أَحَبَّ مَا اسْتَتَرَ بِهِ رَسُولُ اللَّهِ ﷺ لِحَاجَتِهِ، هَدَفٌ أَوْ حَائِشُ نَخْلٍ،

قَالَ ابْنُ أَسْمَاءَ فِي حَدِيثِهِ: يَعْنِي حَائِطَ نَخْلٍ.

**[774]-79-(342)** ........ Abdullah ibn Cəfər ﷺ demişdir: “Bir gün Peyğəmbər ﷺ məni tərkinə aldı və mənə gizlincə elə bir söz söylədi ki, mən onu insanlardan heç kəsə danışan deyiləm. Kiçicik dağ, yaxud xurmalıqlar Peyğəmbərin ﷺ təbii ehtiyacını rəf etmək üçün seçdiyi ən xoşladığı (yer) idi”.

İbn Əsma öz rəvayətində demişdir: “(burada “xurmalıqlar” deyildikdə) xurma bağçası nəzərdə tutulur”.

## (٢١) – بَابُ إِنَّمَا الْمَاءُ مِنْ الْمَاءِ

## 21-ci fəsil. Suyu - ancaq su vacib edir[1]

**[٧٧٥] ٨٠–(٣٤٣)** و حَدَّثَنَا يَحْيَى بْنُ يَحْيَى وَيَحْيَى بْنُ أَيُّوبَ، وَقُتَيْبَةُ، وَابْنُ حُجْرٍ – قَالَ يَحْيَى بْنُ يَحْيَى: أَخْبَرَنَا. وَقَالَ الآخَرُونَ: حَدَّثَنَا إِسْمَعِيلُ وَهُوَ ابْنُ جَعْفَرٍ، عَنْ شَرِيكٍ يَعْنِي ابْنَ أَبِي نَمِرٍ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ، عَنْ أَبِيهِ قَالَ: خَرَجْتُ مَعَ رَسُولِ اللَّهِ ﷺ يَوْمَ الاثْنَيْنِ إِلَى قُبَاءَ، حَتَّى إِذَا كُنَّا فِي بَنِي سَالِمٍ وَقَفَ رَسُولُ اللَّهِ ﷺ عَلَى بَابِ عِتْبَانَ، فَصَرَخَ بِهِ، فَخَرَجَ يَجُرُّ إِزَارَهُ، فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: ((أَعْجَلْنَا الرَّجُلَ)) فَقَالَ عِتْبَانُ: يَا رَسُولَ اللَّهِ! أَرَأَيْتَ الرَّجُلَ يُعْجَلُ عَنْ امْرَأَتِهِ وَلَمْ يُمْنِ مَاذَا عَلَيْهِ؟ قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((إِنَّمَا الْمَاءُ مِنْ الْمَاءِ)).

---

[1] Cümlənin əvvəlindəki “su” kəlməsi – qüsl etmək, ortasındakı isə sperma mənasında işlənmişdir. Yəni qüsl etmək ancaq məni ifraz olduqda vacib olur. Bu və bundan sonrakı hədislərdən belə başa düşülə bilər ki, cinsi əlaqədə olmuş və sperma axıtmamış adama qüsl etmək vacib deyil. Lakin İslam alimləri yekdil fikirdədirlər ki, cinsi əlaqəyə girmiş müsəlmana – məni axıtsa da, axıtmasa da – qüsl etmək vacibdir. “Suyu – ancaq su vacib edir” hədisinin izahı isə belədir:

– Bu və bu qəbildən olan hədisləri növbəti fəsildəki hədislər nəsx etmişdir. Həmin hədislərin birində Aişə ﷺ rəvayət edir ki, bir nəfər Peyğəmbərdən ﷺ, zövcəsi ilə cinsi əlaqəyə girən, sonra da məni ifraz etməyən kişi haqqında: “Onlara qüsl etmək vacibdirmi?”– deyə soruşdu”. Peyğəmbər ﷺ buyurdu: “Mən bu işi gördükdən *sonra* zövcəmlə birlikdə qüsl edirəm”. Əbul-Alə ibn Şixxirin: “Peyğəmbərin ﷺ hədislərindən bəzisi digərini nəsx edərdi. Necə ki, Quran ayələrinin bəzisi digərini nəsx edir” sözü buna dəlildir.

Bəzi alimlər isə bu hədisin nəsx olunmadığını, sadəcə olaraq bu hökmün, yuxuda ikən cinsi əlaqədə olan kimsəyə aid olduğunu söyləmişlər.

**[775]-80-(343)** ........ Əbu Səid əl-Xudri ﷺ demişdir: “Bazar ertəsi mən Peyğəmbərlə ﷺ birlikdə Qubaya[1] getdim. Nəhayət, gəlib Bənu Salim qəbiləsinə çatdığımız zaman Peyğəmbər ﷺ İtbanın[2] qapısı önündə durub onu çağırdı. O da fitəsini darta-darta bayıra çıxdı. Peyğəmbər ﷺ: “Adamı tələsdirdik?”– deyə soruşdu. İtban: “Ya Rəsulullah! Söylə görək, əgər kişi öz qadını ilə yaxınlıq etdikdə tələsdirilərsə və məni axıtmazsa, o nə etməlidir?”– deyə soruşdu. Peyğəmbər ﷺ buyurdu: “Suyu – ancaq su vacib edir”.

**[٧٧٦]** ٨١–(...) حَدَّثَنَا هَارُونُ بْنُ سَعِيدٍ الأَيْلِيُّ: حَدَّثَنَا ابْنُ وَهْبٍ: أَخْبَرَنِي عَمْرُو بْنُ الْحَارِثِ، عَنِ ابْنِ شِهَابٍ حَدَّثَهُ، أَنَّ أَبَا سَلَمَةَ بْنَ عَبْدِ الرَّحْمَنِ، حَدَّثَهُ عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ، عَنْ النَّبِيِّ ﷺ أَنَّهُ قَالَ: ((إِنَّمَا الْمَاءُ مِنْ الْمَاءِ)).

**[776]-81-(...)** ........ Əbu Sələmə ibn Abdur-Rəhman, Əbu Səid əl-Xudridən ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Suyu ancaq su vacib edir”.

**[٧٧٧]** ٨٢–(٣٤٤) حَدَّثَنَا عُبَيْدُ اللَّهِ بْنُ مُعَاذٍ الْعَنْبَرِيُّ: حَدَّثَنَا الْمُعْتَمِرُ: حَدَّثَنَا أَبِي: حَدَّثَنَا أَبُو الْعَلَاءِ بْنُ الشِّخِّيرِ قَالَ: كَانَ رَسُولُ اللَّهِ ﷺ يَنْسَخُ حَدِيثُهُ بَعْضُهُ بَعْضًا، كَمَا يَنْسَخُ الْقُرْآنُ بَعْضُهُ بَعْضًا.

**[777]-82-(344)** ........ Əbul-Alə ibn Şixxir demişdir: “Peyğəmbərin ﷺ hədislərindən bəzisi digərini nəsx edərdi. Necə ki, Quran ayələrinin bəzisi digərini nəsx edir”[3].

**[٧٧٨]** ٨٣–(٣٤٥) حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا غُنْدَرٌ عَنْ شُعْبَةَ؛ ح: و حَدَّثَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى وَابْنُ بَشَّارٍ قَالاَ: حَدَّثَنَا مُحَمَّدُ بْنُ جَعْفَرٍ: حَدَّثَنَا شُعْبَةُ عَنْ الْحَكَمِ، عَنْ ذَكْوَانَ، عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ: أَنَّ رَسُولَ اللَّهِ ﷺ مَرَّ عَلَى رَجُلٍ مِنْ الأَنْصَارِ، فَأَرْسَلَ إِلَيْهِ، فَخَرَجَ وَرَأْسُهُ يَقْطُرُ، فَقَالَ: ((لَعَلَّنَا أَعْجَلْنَاكَ؟)) قَالَ: نَعَمْ، يَا رَسُولَ اللَّهِ! قَالَ: ((إِذَا أُعْجِلْتَ أَوْ أَقْحَطْتَ)) فَلاَ غُسْلَ عَلَيْكَ، وَعَلَيْكَ الْوُضُوءُ)).
و قَالَ ابْنُ بَشَّارٍ: إِذَا أُعْجِلْتَ أَوْ أُقْحِطْتَ.

---

[1] Quba: Peyğəmbər ﷺ məscidindən bir fərsəx aralıda yerləşən bir yerdir. Bir fərsəx isə təxminən 5760 metrə bərabərdir.

[2] İtban ibn Malik ibn Amr ibn İclan əl-Ənsari əl-Xəzrəci Peyğəmbərin ﷺ səhabəsidir.

[3] Necə ki, şərab barəsindəki ayələr tədriclə bir-birinin hökmünü ləğv etmişdir. Belə ki, “ən-Nisa” surəsinin 43-cü ayəsi, “əl-Bəqərə” surəsinin 219-cu ayəsinin hökmünü, “əl-Maidə” surəsinin 90 və 91-ci ayələri də “ən-Nisa” surəsinin 43-cü ayəsinin hökmünü ləğv etmişdir. Nəsx və mənsux barədə daha ətraflı məlumat almaq üçün İman kitabındakı 9-cu fəslin qeydlərinə bax.

**[778]-83-(345)** ........ Əbu Səid əl-Xudri ﷺ demişdir: "(Bir dəfə) Peyğəmbər ﷺ ənsardan olan bir kişinin yanına gəldi və onu çağırtdırdı. O adam gəldikdə (biz onun) başından damcı-damcı su töküldüyünü (gördük). Peyğəmbər ﷺ: "Deyəsən, səni tələsdirdik?"– deyə soruşdu. O: "Bəli!"– deyə cavab verdikdə, Peyğəmbər ﷺ buyurdu: "Hərgah səni tələsdirsələr, yaxud yaxınlıq edib məni axıtmasan, sənə qüsl deyil, dəstəmaz almaq yetər".

İbn Bəşşar: "Tələsdirildiyin və ya yaxınlıq edib məni axıtmadığın zaman"– demişdir.

**[٧٧٩] ٨٤–(٣٤٦)** حَدَّثَنَا أَبُو الرَّبِيعِ الزَّهْرَانِيُّ: حَدَّثَنَا حَمَّادٌ: حَدَّثَنَا هِشَامُ بْنُ عُرْوَةَ؛ **ح:** و حَدَّثَنَا أَبُو كُرَيْبٍ مُحَمَّدُ بْنُ الْعَلاَءِ – وَاللَّفْظُ لَهُ –: حَدَّثَنَا أَبُو مُعَاوِيَةَ: حَدَّثَنَا هِشَامٌ عَنْ أَبِيه، عَنْ أَبِي أَيُّوبَ، عَنْ أُبَيِّ بْنِ كَعْبٍ قَالَ: سَأَلْتُ رَسُولَ اللَّهِ ﷺ عَنِ الرَّجُلِ يُصِيبُ مِنَ الْمَرْأَةِ ثُمَّ يُكْسِلُ؟ فَقَالَ: ((يَغْسِلُ مَا أَصَابَهُ مِنَ الْمَرْأَةِ، ثُمَّ يَتَوَضَّأُ وَيُصَلِّي)).

**[779]-84-(346)** ........ Ubey ibn Kəb ﷺ demişdir: "Mən Peyğəmbərdən ﷺ, zövcəsi ilə cinsi əlaqəyə girən, sonra da məni ifraz etməyən kişinin hökmünü soruşdum. Peyğəmbər ﷺ buyurdu: "Qadından ona bulaşmış şeyi yusun, sonra dəstəmaz alsın və namazını qılsın".

**[٧٨٠] ٨٥–(...)** و حَدَّثَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى: حَدَّثَنَا مَحَمَّدُ بْنُ جَعْفَرٍ: حَدَّثَنَا شُعْبَةُ عَنْ هِشَامِ بْنِ عُرْوَةَ: حَدَّثَنِي أَبِي عَنْ الْمَلِيِّ، عَنِ الْمَلِيِّ يَعْنِي بِقَوْلِهِ الْمَلِيِّ عَنِ الْمَلِيِّ، أَبُو أَيُّوبَ عَنْ أُبَيِّ بْنِ كَعْبٍ عَنْ رَسُولِ اللَّهِ ﷺ، أَنَّهُ قَالَ، فِي الرَّجُلِ يَأْتِي أَهْلَهُ ثُمَّ لاَ يُنْزِلُ قَالَ: ((يَغْسِلُ ذَكَرَهُ وَيَتَوَضَّأُ)).

**[780]-85-(...)** ........ Ubey ibn Kəb ﷺ Peyğəmbərdən ﷺ rəvayət etmişdir ki, o, zövcəsi ilə cinsi əlaqəyə girən, sonra da məni ifraz etməyən kişi haqqında belə buyurmuşdur: "Cinsiyyət orqanını yusun və dəstəmaz alsın".

**[٧٨١] ٨٦–(٣٤٧)** و حَدَّثَنِي زُهَيْرُ بْنُ حَرْبٍ وَعَبْدُ بْنُ حُمَيْدٍ قَالاَ: حَدَّثَنَا عَبْدُ الصَّمَدِ بْنُ عَبْدِ الْوَارِثِ؛ **ح:** و حَدَّثَنَا عَبْدُ الْوَارِثِ بْنُ عَبْدِ الصَّمَدِ – وَاللَّفْظُ لَهُ –: حَدَّثَنِي أَبِي عَنْ جَدِّي، عَنِ الْحُسَيْنِ بْنِ ذَكْوَانَ، عَنْ يَحْيَى بْنِ أَبِي كَثِيرٍ، أَخْبَرَنِي أَبُو سَلَمَةَ، أَنَّ عَطَاءَ بْنَ يَسَارٍ أَخْبَرَهُ أَنَّ زَيْدَ بْنَ خَالِدٍ الْجُهَنِيَّ أَخْبَرَهُ أَنَّهُ سَأَلَ عُثْمَانَ بْنَ عَفَّانَ، قَالَ قُلْتُ: أَرَأَيْتَ إِذَا جَامَعَ الرَّجُلُ امْرَأَتَهُ وَلَمْ يُمْنِ؟ قَالَ عُثْمَانُ: ((يَتَوَضَّأُ كَمَا يَتَوَضَّأُ لِلصَّلاَةِ وَيَغْسِلُ ذَكَرَهُ)). قَالَ عُثْمَانُ: سَمِعْتُهُ مِنْ رَسُولِ اللَّهِ ﷺ.

**[781]-86-(347)** ........ Rəvayət edilir ki, Zeyd ibn Xalid əl-Cuhəni Osman ibn Əffandan: “Zövcəsi ilə cinsi əlaqədə olub məni axıtmayan kişi barəsində nə deyə bilərsən?”– deyə soruşdu. Osman dedi: “Namaz üçün dəstəmaz aldığı kimi dəstəmaz alsın və cinsiyyət orqanını yusun”.

Osman dedi: “Mən bunu Peyğəmbərdən ﷺ eşitmişəm”.

**[٧٨٢]** (...) و حَدَّثَنا عَبْدُ الْوَارِثِ بْنُ عَبْدِ الصَّمَدِ: حَدَّثَنِي أَبِي عَنْ جَدِّي، عَنْ الْحُسَيْنِ قَالَ يَحْيَى: وَأَخْبَرَنِي أَبُو سَلَمَةَ، أَنَّ عُرْوَةَ بْنَ الزُّبَيْرِ أَخْبَرَهُ، أَنَّ أَبَا أَيُّوبَ أَخْبَرَهُ، أَنَّهُ سَمِعَ ذَلِكَ مِنْ رَسُولِ اللَّهِ ﷺ.

**[782] (...)** ........ Yəhya demişdir: “Mənə Əbu Sələmə xəbər vermişdir. Ona da Urva ibn Zubeyr xəbər vermişdir. Ona da Əbu Əyyub xəbər vermişdir. Əbu Əyyub bu hədisi Peyğəmbərdən ﷺ eşitmişdir.

## (٢٢) – بَابُ نَسْخِ الْمَاءُ مِنْ الْمَاءِ وَوُجُوبِ الْغُسْلِ بِالْتِقَاءِ الْخِتَانَيْنِ

## 22-ci fəsil. “Suyu su vacib edir” (hədisinin) nəsx edilməsi və(kişi ilə qadının) cinsiyyət üzvlərinin bir-birinə toxunmasıyla[1] qüsl etməyin vacib olması

**[٧٨٣]** ٨٧–(٣٤٨) و حَدَّثَنِي زُهَيْرُ بْنُ حَرْبٍ وَأَبُو غَسَّانَ الْمِسْمَعِيُّ؛ ح: و حَدَّثَنَاه مُحَمَّدُ بْنُ الْمُثَنَّى وَابْنُ بَشَّارٍ قَالُوا: حَدَّثَنَا مُعَاذُ بْنُ هِشَامٍ قَالَ: حَدَّثَنِي أَبِي عَنْ قَتَادَةَ، وَمَطَرٌ، عَنْ الْحَسَنِ، عَنْ أَبِي رَافِعٍ، عَنْ أَبِي هُرَيْرَةَ، أَنَّ نَبِيَّ اللَّهِ ﷺ قَالَ: ((إِذَا جَلَسَ بَيْنَ شُعَبِهَا الأَرْبَعِ ثُمَّ جَهَدَهَا فَقَدْ وَجَبَ عَلَيْهِ الْغُسْلُ)).

وَفِي حَدِيثِ مَطَرٍ: ((وَإِنْ لَمْ يُنْزِلْ))

قَالَ زُهَيْرٌ مِنْ بَيْنِهِمْ: ((بَيْنَ أَشْعُبِهَا الأَرْبَعِ)).

**[783]-87-(348)** ........ Əbu Hureyrə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “(Kişi) qadının dörd əzası[2] arasında oturub onunla cinsi əlaqəyə girərsə, (hər ikisinə) qüsl etmək vacib olar”.

Mətərin hədisində: “Məni axıtmasa belə” sözü qeyd edilmişdir.

(Hədisin) ravilərindən olan Zuheyr: “Qadının dörd əzası arasına” deyə rəvayət etmişdir.

---

[1] Söhbət cinsi əlaqədən gedir.

[2] Burada dörd əza deyildikdə ya qadının ayaqları və əlləri, ya da cinsiyyət üzvünün sağ və sol tərəfləri nəzərdə tutulur.

**[٧٨٤]** (...) حَدَّثَنَا مُحَمَّدُ بْنُ عَمْرِو بْنِ عَبَّادِ بْنِ جَبَلَةَ: حَدَّثَنَا مُحَمَّدُ بْنُ أَبِي عَدِيٍّ؛ ح: و حَدَّثَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى: حَدَّثَنِي وَهْبُ بْنُ جَرِيرٍ، كِلاَهُمَا عَنْ شُعْبَةَ، عَنْ قَتَادَةَ بِهَذَا الإِسْنَادِ، مِثْلَهُ. غَيْرَ أَنَّ فِي حَدِيثِ شُعْبَةَ: ((ثُمَّ اجْتَهَدَ)) وَلَمْ يَقُلْ: ((وَإِنْ لَمْ يُنْزِلْ)).

**[784] (...)** ........ Muhəmməd ibn Əbu Adiy və Vəhb ibn Cərir – hər ikisi Şobədən, o da Qətadədən bu isnadla yuxarıdakı hədisin bənzərini rəvayət etmişdir. Fəqət Şobənin hədisində: "sonra cinsi əlaqəyə girərsə," sözü keçir, və: "məni axıtmasa belə" deməmişdir".

**[٧٨٥] ٨٨-(٣٤٩)** و حَدَّثَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى: حَدَّثَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللَّهِ الأَنْصَارِيُّ: حَدَّثَنَا هِشَامُ بْنُ حَسَّانَ: حَدَّثَنَا حُمَيْدُ بْنُ هِلاَلٍ عَنْ أَبِي بُرْدَةَ، عَنْ أَبِي مُوسَى الأَشْعَرِيِّ؛ ح: و حَدَّثَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى: حَدَّثَنَا عَبْدُ الأَعْلَى – وَهَذَا حَدِيثُهُ –: حَدَّثَنَا هِشَامٌ عَنْ حُمَيْدِ بْنِ هِلاَلٍ قَالَ – وَلاَ أَعْلَمُهُ إِلاَّ عَنْ أَبِي بُرْدَةَ – عَنْ أَبِي مُوسَى قَالَ: اخْتَلَفَ فِي ذَلِكَ رَهْطٌ مِنَ الْمُهَاجِرِينَ وَالأَنْصَارِ، فَقَالَ الأَنْصَارِيُّونَ: لاَ يَجِبُ الْغُسْلُ إِلاَّ مِنَ الدَّفْقِ أَوْ مِنَ الْمَاءِ، وَقَالَ الْمُهَاجِرُونَ: بَلْ إِذَا خَالَطَ فَقَدْ وَجَبَ الْغُسْلُ. قَالَ: قَالَ أَبُو مُوسَى: فَأَنَا أَشْفِيكُمْ مِنْ ذَلِكَ، فَقُمْتُ فَاسْتَأْذَنْتُ عَلَى عَائِشَةَ، فَأُذِنَ لِي، فَقُلْتُ لَهَا: يَا أُمَّاهْ – أَوْ يَا أُمَّ الْمُؤْمِنِينَ – إِنِّي أُرِيدُ أَنْ أَسْأَلَكِ عَنْ شَيْءٍ، وَإِنِّي أَسْتَحْيِيكِ، فَقَالَتْ: لاَ تَسْتَحْيِي أَنْ تَسْأَلَنِي عَمَّا كُنْتَ سَائِلاً عَنْهُ أُمَّكَ الَّتِي وَلَدَتْكَ، فَإِنَّمَا أَنَا أُمُّكَ، قُلْتُ: فَمَا يُوجِبُ الْغُسْلَ؟ قَالَتْ: عَلَى الْخَبِيرِ سَقَطْتَ. قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((إِذَا جَلَسَ بَيْنَ شُعَبِهَا الأَرْبَعِ، وَمَسَّ الْخِتَانُ الْخِتَانَ، فَقَدْ وَجَبَ الْغُسْلُ)).

**[785]-88-(349)** ........ Əbu Musa ﵁ demişdir: "Ənsardan və mühacirlərdən olan bir toplum bu məsələdə ixtilaf etdilər. Ənsar dedi: "Qüsl ancaq məni axıtdıqda və ya su[1] ifraz etdikdə vacib olur". Mühacirlər isə dedilər: "Xeyr, cinsiyyət üzvləri bir-birinə girdiyi zaman qüsl vacib olur".

Ravi deyir ki, Əbu Musa: "Mən sizə bu xüsusda dəyərli bilgilər verəcəyəm"– dedi (və bizə bunları anlatdı): "Mən qalxıb Aişənin hüzuruna daxil olmaq üçün izin istədim. Mənə izin verildi. Mən ona dedim: "Anacan! (Yaxud ey möminlərin anası!) Mən səndən bir şey barəsində soruşmaq istəyirəm, lakin səndən utanıram". Aişə dedi: "Səni dünyaya gətirən anandan soruşacağın bir şeyi məndən soruşmaqdan utanma. Həqiqətən, mən də sənin ananam![2]" Mən: "Qüslü vacib edən şey nədir?"– deyə soruşdum. Dedi: "Sən (bu sualın

[1] Burada "su" deyildikdə sperma nəzərdə tutulur.

[2] Bu xüsusda Uca Allah buyurur: **"Peyğəmbər möminlərə onların özlərindən daha yaxındır. Zövcələri isə möminlərin analarıdır..."** ("əl-Əhzab", surəsi, 6).

cavabını) bilən adama rast gəlmisən. Peyğəmbər ﷺ buyurmuşdur: "(Kişi) qadının dörd əzası arasında oturduğu və sünnət edilmiş əza sünnət edilmiş əzaya toxunduğu zaman[1] qüsl etmək vacib olar".

**[٧٨٦] ٨٩-(٣٥٠)** حَدَّثَنَا هَارُونُ بْنُ مَعْرُوفٍ وَهَارُونُ بْنُ سَعِيدٍ الأَيْلِيُّ قَالا: حَدَّثَنَا ابْنُ وَهْبٍ: أَخْبَرَنِي عِيَاضُ بْنُ عَبْدِ اللَّهِ عَنْ أَبِي الزُّبَيْرِ، عَنْ جَابِرِ بْنِ عَبْدِ اللَّهِ، عَنْ أُمِّ كُلْثُومٍ، عَنْ عَائِشَةَ زَوْجِ النَّبِيِّ ﷺ. قَالَتْ: إِنَّ رَجُلاً سَأَلَ رَسُولَ اللَّهِ ﷺ عَنِ الرَّجُلِ يُجَامِعُ أَهْلَهُ ثُمَّ يُكْسِلُ، هَلْ عَلَيْهِمَا الْغُسْلُ؟ وَعَائِشَةُ جَالِسَةٌ. فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: ((إِنِّي لأَفْعَلُ ذَلِكَ، أَنَا وَهَذِهِ ثُمَّ نَغْتَسِلُ)).

**[786]-89-(350)** ........ Peyğəmbərin ﷺ zövcəsi Aişə رضي الله عنها demişdir: "Bir nəfər Peyğəmbərdən ﷺ, zövcəsi ilə cinsi əlaqəyə girən, sonra da məni ifraz etməyən kişi haqqında: "Onlara qüsl etmək vacibdirmi?"– deyə soruşdu".

Həmin vaxt Aişə də orada oturmuşdu. Peyğəmbər ﷺ buyurdu: "Mən bu işi gördükdən (sonra) onunla[2] birlikdə qüsl edirəm".

## (٢٣) – بَابُ الْوُضُوءِ مِمَّا مَسَّتْ النَّارُ

## 23-cü fəsil. Odda bişmiş şeylərdən (yedikdən sonra) dəstəmaz almaq

**[٧٨٧] ٩٠-(٣٥١)** و حَدَّثَنَا عَبْدُ الْمَلِكِ بْنُ شُعَيْبِ بْنِ اللَّيْثِ قَالَ: حَدَّثَنِي أَبِي عَنْ جَدِّي: حَدَّثَنِي عُقَيْلُ بْنُ خَالِدٍ قَالَ: قَالَ ابْنُ شِهَابٍ: أَخْبَرَنِي عَبْدُ الْمَلِكِ بْنُ أَبِي بَكْرِ بْنِ عَبْدِ الرَّحْمَنِ بْنِ الْحَارِثِ بْنِ هِشَامٍ أَنَّ خَارِجَةَ بْنَ زَيْدٍ الأَنْصَارِيَّ أَخْبَرَهُ، أَنَّ أَبَاهُ زَيْدَ بْنَ ثَابِتٍ قَالَ: سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ: ((الْوُضُوءُ مِمَّا مَسَّتْ النَّارُ)).

**[787]-90-(351)** ........ Zeyd ibn Sabit رضي الله عنه demişdir: "Mən Peyğəmbərin ﷺ belə dediyini eşitdim: "Odda bişmiş şeylərdən (yedikdən sonra) dəstəmaz almaq gərəkdir[3]".

**[٧٨٨] (٣٥٢)** قَالَ ابْنُ شِهَابٍ: أَخْبَرَنِي عُمَرُ بْنُ عَبْدِ الْعَزِيزِ، أَنَّ عَبْدَ اللَّهِ بْنَ إِبْرَاهِيمَ بْنِ قَارِظٍ أَخْبَرَهُ، أَنَّهُ وَجَدَ أَبَا هُرَيْرَةَ يَتَوَضَّأُ عَلَى الْمَسْجِدِ. فَقَالَ: إِنَّمَا أَتَوَضَّأُ مِنْ أَثْوَارِ أَقِطٍ أَكَلْتُهَا، لأَنِّي سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ: ((تَوَضَّئُوا مِمَّا مَسَّتْ النَّارُ)).

---

[1] Burada cinsi əlaqəyə girmək qəsd edilir. (21-ci fəslin qeydlərinə bax.)
[2] Yəni Aişə ilə birgə.
[3] Bu və bu qəbildən olan hədislərin nəsx olunduğu, növbəti fəsildə öz əksini tapmışdır.

**[788] (352)** ........ Abdullah ibn İbrahim ibn Qariz rəvayət edir ki, o, Əbu Hureyrəni məsciddə dəstəmaz alarkən görmüşdür. (Onda) Əbu Hureyrə demişdir: "Mən yediyim qurut[1] tikələrindən dolayı dəstəmaz alıram. Çünki mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: "Odda bişmiş şeylərdən (yedikdən sonra) dəstəmaz alın".

**[٧٨٩]** **(٣٥٣)** قَالَ ابْنُ شِهَابٍ: أَخْبَرَنِي سَعِيدُ بْنُ خَالِدِ بْنِ عَمْرِو بْنِ عُثْمَانَ وَأَنَا أُحَدِّثُهُ هَذَا الْحَدِيثَ أَنَّهُ سَأَلَ عُرْوَةَ بْنَ الزُّبَيْرِ عَنْ الْوُضُوءِ مِمَّا مَسَّتْ النَّارُ؟ فَقَالَ عُرْوَةُ: سَمِعْتُ عَائِشَةَ، زَوْجَ النَّبِيِّ ﷺ تَقُولُ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((تَوَضَّئُوا مِمَّا مَسَّتْ النَّارُ)).

**[789] (353)** ........ İbn Şihab demişdir: "Səid ibn Xalid ibn Amr ibn Osman mənə xəbər verdi. Mən bu hədisi ona danışırdım. O, Urva ibn Zubeyrdən odda bişmiş şeylərdən (yedikdən sonra) dəstəmaz almaq barədə soruşmuş, Urva da ona belə cavab vermişdir: "Mən Peyğəmbərin ﷺ zövcəsi Aişənin belə dediyini eşitdim: "Peyğəmbər ﷺ demişdir: "Odda bişmiş şeylərdən (yedikdən sonra) dəstəmaz alın".

## (٢٤) – بَابُ نَسْخِ الْوُضُوءِ مِمَّا مَسَّتْ النَّارُ

## 24-cü fəsil. Odda bişmiş şeylərdən (yedikdən sonra) dəstəmaz almaq (hökmünün) nəsx edilməsi

**[٧٩٠]** **٩١–(٣٥٤)** حَدَّثَنَا عَبْدُ اللَّهِ بْنُ مَسْلَمَةَ بْنِ قَعْنَبٍ: حَدَّثَنَا مَالِكٌ عَنْ زَيْدِ بْنِ أَسْلَمَ، عَنْ عَطَاءِ بْنِ يَسَارٍ، عَنْ ابْنِ عَبَّاسٍ أَنَّ رَسُولَ اللَّهِ ﷺ أَكَلَ كَتِفَ شَاةٍ ثُمَّ صَلَّى وَلَمْ يَتَوَضَّأْ.

**[790]-91-(354)** ........ İbn Abbas رضي الله عنهما demişdir: "Peyğəmbər ﷺ (bişmiş) qoyunun kürəyindən yemiş, sonra dəstəmaz almadan namaz qılmışdır".

**[٧٩١]** (...) و حَدَّثَنَا زُهَيْرُ بْنُ حَرْبٍ: حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ، عَنْ هِشَامِ بْنِ عُرْوَةَ. أَخْبَرَنِي وَهْبُ بْنُ كَيْسَانَ، عَنْ مُحَمَّدِ بْنِ عَمْرِو بْنِ عَطَاءٍ عَنْ ابْنِ عَبَّاسٍ؛ ح: و حَدَّثَنِي الزُّهْرِيُّ عَنْ عَلِيِّ بْنِ عَبْدِ اللَّهِ بْنِ عَبَّاسٍ، عَنْ ابْنِ عَبَّاسٍ؛ ح: و حَدَّثَنِي مُحَمَّدُ بْنُ عَلِيٍّ، عَنْ أَبِيهِ، عَنْ ابْنِ عَبَّاسٍ: أَنَّ النَّبِيَّ ﷺ أَكَلَ عَرْقًا – أَوْ لَحْمًا – ثُمَّ صَلَّى وَلَمْ يَتَوَضَّأْ، وَلَمْ يَمَسَّ مَاءً.

---

[1] Yumru-yumru edilib qurudulmuş şor, kəsmik, süzmə.

**[791] (...)** ........ Burada üç isnadla İbn Abbasdan ﷺ rəvayət edilir ki, Peyğəmbər ﷺ sümüklü (soyutma) ətdən, yaxud sadəcə (bişmiş) ətdən yemiş, sonra dəstəmaz almadan və suya heç toxunmadan namaz qılmışdır.

**[٧٩٢] ٩٢-(٣٥٥)** و حَدَّثَنَا مُحَمَّدُ بْنُ الصَّبَّاحِ: حَدَّثَنَا إِبْرَاهِيمُ بْنُ سَعْدٍ: حَدَّثَنَا الزُّهْرِيُّ عَنْ جَعْفَرِ بْنِ عَمْرِو بْنِ أُمَيَّةَ الضَّمْرِيِّ، عَنْ أَبِيهِ: أَنَّهُ رَأَى رَسُولَ اللَّهِ ﷺ يَحْتَزُّ مِنْ كَتِفٍ يَأْكُلُ مِنْهَا ثُمَّ صَلَّى وَلَمْ يَتَوَضَّأْ.

**[792]-92-(...)** ........ Amr ibn Ümeyyə əd-Damri ﷺ Peyğəmbərin ﷺ (bişmiş) qoyunun kürəyindən kəsib yediyini gördüyünü, sonra dəstəmaz almadan namaz qıldığını rəvayət etmişdir.

**[٧٩٣] ٩٣-(...)** حَدَّثَنِي أَحْمَدُ بْنُ عِيسَى: حَدَّثَنَا ابْنُ وَهْبٍ: أَخْبَرَنِي عَمْرُو بْنُ الْحَارِثِ عَنْ ابْنِ شِهَابٍ، عَنْ جَعْفَرِ بْنِ عَمْرِو بْنِ أُمَيَّةَ الضَّمْرِيِّ، عَنْ أَبِيهِ قَالَ: رَأَيْتُ رَسُولَ اللَّهِ ﷺ يَحْتَزُّ مِنْ كَتِفِ شَاةٍ فَأَكَلَ مِنْهَا، فَدُعِيَ إِلَى الصَّلَاةِ، فَقَامَ وَطَرَحَ السِّكِّينَ وَصَلَّى وَلَمْ يَتَوَضَّأْ.

**[793]-93-(...)** ........ Amr ibn Ümeyyə əd-Damri ﷺ demişdir: "Mən Peyğəmbərin ﷺ (bişmiş) qoyunun kürəyindən kəsib (yediyini) gördüm. Bu əsnada Peyğəmbər ﷺ namaza çağırıldı. Peyğəmbər ﷺ ayağa qalxdı, əlindəki bıçağı yerə atdı və dəstəmaz almadan namaza durdu".

**[٧٩٤]** قَالَ ابْنُ شِهَابٍ: وَحَدَّثَنِي عَلِيُّ بْنُ عَبْدِ اللَّهِ بْنِ عَبَّاسٍ عَنْ أَبِيهِ عَنْ رَسُولِ اللَّهِ ﷺ [بِذَلِكَ].

**[794]** ........ İbn Şihab demişdir: "Əli ibn Abdullah ibn Abbas atasından, o da Rəsulullahdan ﷺ [bu hədisi] mənə rəvayət etmişdir".

**[٧٩٥] (٣٥٦)** قَالَ عَمْرٌو: وَحَدَّثَنِي بُكَيْرُ بْنُ الأَشَجِّ، عَنْ كُرَيْبٍ مَوْلَى ابْنِ عَبَّاسٍ، عَنْ مَيْمُونَةَ زَوْجِ النَّبِيِّ ﷺ أَنَّ النَّبِيَّ ﷺ أَكَلَ عِنْدَهَا كَتِفًا ثُمَّ صَلَّى وَلَمْ يَتَوَضَّأْ.

**[795] (356)** ........ Amr demişdir: "Mənə Bukeyr ibn Əşəc, İbn Abbasın mövlası Kureybdən, o da Peyğəmbərin ﷺ zövcəsi Məymunədən rəvayət etmişdir. Peyğəmbər ﷺ Məymunənin yanında (bişmiş) qoyunun kürəyindən kəsib yemiş, sonra da dəstəmaz almadan namaz qılmışdır.

**[٧٩٦]** (...) قَالَ عَمْرٌو: حَدَّثَنِي جَعْفَرُ بْنُ رَبِيعَةَ عَنْ يَعْقُوبَ بْنِ الأَشَجِّ، عَنْ كُرَيْبٍ [مَوْلَى ابْنِ عَبَّاسٍ]، عَنْ مَيْمُونَةَ زَوْجِ النَّبِيِّ ﷺ [بِذَلِكَ].

**[796] (...)** ........ Amr demişdir: “Cəfər ibn Rəbiə ibn Yəqub ibn Əşəcdən, o da [İbn Abbasın mövlası] Kureybdən, o da Peyğəmbərin ﷺ zövcəsi Məymunədən [bu hədisi] mənə rəvayət etmişdir.

**[٧٩٧] ٩٤-(٣٥٧)** قَالَ عَمْرٌو: وَحَدَّثَنِي سَعِيدُ بْنُ أَبِي هِلاَلٍ عَنْ عَبْدِ اللَّهِ بْنِ عُبَيْدِ اللَّهِ بْنِ أَبِي رَافِعٍ، عَنْ أَبِي غَطَفَانَ، عَنْ أَبِي رَافِعٍ قَالَ: أَشْهَدُ لَكُنْتُ أَشْوِي لِرَسُولِ اللَّهِ ﷺ بَطْنَ الشَّاةِ، ثُمَّ صَلَّى وَلَمْ يَتَوَضَّأْ.

**[797]-94-(357)** ........ Əbu Rafi demişdir: “Şahidlik edirəm ki, mən Peyğəmbər ﷺ üçün qoyunun içalatını qovurdum, (o da ondan yedi). Sonra da dəstəmaz almadan namaz qıldı”.

**[٧٩٨] ٩٥-(٣٥٨)** حَدَّثَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ: حَدَّثَنَا لَيْثٌ عَنْ عُقَيْلٍ، عَنْ الزُّهْرِيِّ، عَنْ عُبَيْدِ اللَّهِ بْنِ عَبْدِ اللَّهِ، عَنْ ابْنِ عَبَّاسٍ، أَنَّ النَّبِيَّ ﷺ شَرِبَ لَبَنًا، ثُمَّ دَعَا بِمَاءٍ فَتَمَضْمَضَ وَقَالَ: ((إِنَّ لَهُ دَسَمًا)).

**[798]-95-(358)** ........ İbn Abbas رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ süd içmiş, sonra su gətizdirib ağzını yaxalamış və: “Bu yağlıdır”– deyə buyurmuşdur.[1]

**[٧٩٩]** (...) و حَدَّثَنِي أَحْمَدُ بْنُ عِيسَى: حَدَّثَنَا ابْنُ وَهْبٍ: وَأَخْبَرَنِي عَمْرٌو؛ ح: و حَدَّثَنِي زُهَيْرُ بْنُ حَرْبٍ: حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ، عَنْ الأَوْزَاعِيِّ؛ ح: و حَدَّثَنِي حَرْمَلَةُ بْنُ يَحْيَى: أَخْبَرَنَا ابْنُ وَهْبٍ: حَدَّثَنِي يُونُسُ، كُلُّهُمْ عَنْ ابْنِ شِهَابٍ بِإِسْنَادِ عُقَيْلٍ، عَنْ الزُّهْرِيِّ، مِثْلَهُ.

**[799] (...)** ........ Amr, Əvzai və Yunus – onların hamısı İbn Şihabdan, Uqeylin isnadı ilə Zuhridən bu hədisin bənzərini rəvayət etmişlər.

**[٨٠٠] ٩٦-(٣٥٩)** و حَدَّثَنِي عَلِيُّ بْنُ حُجْرٍ: حَدَّثَنَا إِسْمَعِيلُ بْنُ جَعْفَرٍ: حَدَّثَنَا مُحَمَّدُ بْنُ عَمْرِو بْنِ حَلْحَلَةَ عَنْ مُحَمَّدِ بْنِ عَمْرِو بْنِ عَطَاءٍ، عَنْ ابْنِ عَبَّاسٍ، أَنَّ رَسُولَ اللَّهِ ﷺ جَمَعَ عَلَيْهِ ثِيَابَهُ ثُمَّ خَرَجَ إِلَى الصَّلاَةِ، فَأُتِيَ بِهَدِيَّةٍ خُبْزٍ وَلَحْمٍ، فَأَكَلَ ثَلاَثَ لُقَمٍ، ثُمَّ صَلَّى بِالنَّاسِ، وَمَا مَسَّ مَاءً.

**[800]-96-(359)** ........ İbn Abbas رضي الله عنهما demişdir: “Peyğəmbər ﷺ libasına bürünüb namaz qılmağa getdi. (Elə bu vaxt) ona çörək və ətdən ibarət hədiyyə[2] gətirdilər. O, bundan üç loxma yedi, sonra suya toxunmadan[3] camaata namaz qıldırdı”.

---

[1] Hədisdən belə nəticə çıxır ki, yemək yedikdən və ya süd və buna bənzər şeylər içdikdən sonra namaza durduqda, ağızı yaxalamaq müstəhəbdir.

[2] Məlumdur ki, Peyğəmbərə ﷺ və onun əhli-beytinə hədiyyə qəbul etmək caiz, sədəqə götürmək isə qadağan edilmişdir.

[3] Yəni dəstəmaz almadan.

**[٨٠١]** (...) و حَدَّثَنَاه أَبُو كُرَيْب: حَدَّثَنَا أَبُو أُسَامَةَ عَنْ الْوَلِيد بْنِ كَثِيرٍ: حَدَّثَنَا مُحَمَّدُ بْنُ عَمْرِو بْنِ عَطَاءِ قَالَ: كُنْتُ مَعَ ابْنِ عَبَّاسٍ. وَسَاقَ الْحَدِيثَ بِمَعْنَى حَدِيثِ ابْنِ حَلْحَلَةَ. وَفِيهِ أَنَّ ابْنَ عَبَّاسٍ شَهِدَ ذَلِكَ مِنْ النَّبِيِّ ﷺ، وَقَالَ: صَلَّى، وَلَمْ يَقُلْ: بِالنَّاسِ.

**[801] (...)** ........ Muhəmməd ibn Amr ibn Əta: "Mən İbn Abbasla bir yerdə idim"– demiş və hədisi ibn Həlhələnin hədisinə yaxın mənada rəvayət etmişdir. Bu rəvayətdə ibn Abbas Peyğəmbərin ﷺ belə etdiyinin şahidi olmuş, habelə "namaz qıldı" demiş, "camaata (namaz qıldırdı)" – deməmişdir".

## (٢٥) – بَابُ الْوُضُوءِ مِنْ لُحُومِ الإِبِلِ

## 25-ci fəsil. Dəvə əti yedikdən sonra dəstəmaz almaq

**[٨٠٢] ٩٧–(٣٦٠)** حَدَّثَنَا أَبُو كَامِلٍ فُضَيْلُ بْنُ حُسَيْنٍ الْجَحْدَرِيُّ: حَدَّثَنَا أَبُو عَوَانَةَ عَنْ عُثْمَانَ بْنِ عَبْدِ اللَّهِ بْنِ مَوْهَبٍ، عَنْ جَعْفَرِ بْنِ أَبِي ثَوْرٍ، عَنْ جَابِرِ بْنِ سَمُرَةَ، أَنَّ رَجُلاً سَأَلَ رَسُولَ اللَّهِ ﷺ: أَأَتَوَضَّأُ مِنْ لُحُومِ الْغَنَمِ؟ قَالَ: ((إِنْ شِئْتَ، فَتَوَضَّأْ، وَإِنْ شِئْتَ، فَلاَ تَوَضَّأْ)) قَالَ: أَتَوَضَّأُ مِنْ لُحُومِ الإِبِلِ؟ قَالَ: ((نَعَمْ، فَتَوَضَّأْ مِنْ لُحُومِ الإِبِلِ)) قَالَ: أُصَلِّي فِي مَرَابِضِ الْغَنَمِ؟ قَالَ: ((نَعَمْ)) قَالَ: أُصَلِّي فِي مَبَارِكِ الإِبِلِ؟ قَالَ: ((لاَ)).

**[802]-97-(360)** ........ Cabir ibn Səmura ﷺ rəvayət edir ki, bir nəfər Peyğəmbərdən ﷺ: "Qoyun əti yedikdən sonra dəstəmaz almalıyammı?"– deyə soruşdu. (Peyğəmbər ﷺ): "İstərsən al, istərsən alma"– deyə buyurdu. Adam (yenə) soruşdu: "Bəs, dəvə əti[1] yedikdən sonra dəstəmaz almalıyammı?" (Peyğəmbər ﷺ): "Bəli, dəvə ətindən sonra dəstəmaz almalısan"– deyə buyurdu. Adam: "Qoyun ağıllarında[2] namaz qıla bilərəmmi?"– deyə soruşdu. (Peyğəmbər ﷺ): "Bəli!"– deyə cavab verdi. Adam (yenə): "Bəs dəvə ağıllarında namaz qıla bilərəmmi?"– deyə soruşdu. (Peyğəmbər ﷺ): "Xeyr!"– deyə buyurdu".

**[٨٠٣]** (...) حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا مُعَاوِيَةُ بْنُ عَمْرٍو: حَدَّثَنَا زَائِدَةُ عَنْ سِمَاكٍ؛ ح: و حَدَّثَنِي الْقَاسِمُ بْنُ زَكَرِيَّاءَ: حَدَّثَنَا عُبَيْدُ اللَّهِ بْنُ مُوسَى عَنْ شَيْبَانَ، عَنْ عُثْمَانَ بْنِ عَبْدِ اللَّهِ بْنِ مَوْهَبٍ، وَأَشْعَثَ بْنِ أَبِي الشَّعْثَاءِ، كُلُّهُمْ عَنْ جَعْفَرِ بْنِ أَبِي ثَوْرٍ، عَنْ جَابِرِ بْنِ سَمُرَةَ عَنْ النَّبِيِّ ﷺ بِمِثْلِ حَدِيثِ أَبِي كَامِلٍ، عَنْ أَبِي عَوَانَةَ.

---

[1] Burada dəvə əti deyildikdə onun əti ilə yanaşı, içalatı, qarnı, piyi, hürgücü və başqa bu kimi yeyilən əzaları nəzərdə tutulur.

[2] Ağıl – içərisində dəvə, mal-qara və qoyun saxlamaq üçün ətrafı tikan və ya ağac ilə hasarlanmış üstüaçıq yer.

**[803] (...)** ........ Simak, Osman ibn Abdullah ibn Məvhəb və Əşəs ibn Əbu Şəsa – onların hamısı Cəfər ibn Əbu Sövrdən, o da Cabir ibn Səmuradan, o da Peyğəmbərdən ﷺ (bundan öncəki) Əbu Kamilin Əbu Əvanadan rəvayət etdiyi hədisin bənzərini rəvayət etmişlər.

## (٢٦) – بَابُ الدَّلِيلِ عَلَى أَنَّ مَنْ تَيَقَّنَ الطَّهَارَةَ ثُمَّ شَكَّ فِي الْحَدَثِ فَلَهُ أَنْ يُصَلِّيَ بِطَهَارَتِهِ تِلْكَ

## 26-cı fəsil. Dəstəmazlı olduğunu yəqin etdikdən sonra (onun) pozulduğuna şübhə edən kimsənin əvvəlki dəstəmazıyla namaz qıla biləcəyinə dair dəlil

**[٨٠٤] ٩٨–(٣٦١)** و حَدَّثَنِي عَمْرٌو النَّاقِدُ وَزُهَيْرُ بْنُ حَرْبٍ؛ ح: و حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ جَمِيعًا عَنْ ابْنِ عُيَيْنَةَ: قَالَ عَمْرٌو: حَدَّثَنَا سُفْيَانُ بْنُ عُيَيْنَةَ عَنْ الزُّهْرِيِّ، عَنْ سَعِيدٍ وَعَبَّادِ بْنِ تَمِيمٍ، عَنْ عَمِّهِ، شُكِيَ إِلَى النَّبِيِّ ﷺ: الرَّجُلُ، يُخَيَّلُ إِلَيْهِ أَنَّهُ يَجِدُ الشَّيْءَ فِي الصَّلَاةِ. قَالَ: ((لاَ يَنْصَرِفُ حَتَّى يَسْمَعَ صَوْتًا، أَوْ يَجِدَ رِيحًا)).

قَالَ أَبُو بَكْرٍ وَزُهَيْرُ بْنُ حَرْبٍ فِي رِوَايَتِهِمَا: هُوَ عَبْدُ اللَّهِ بْنُ زَيْدٍ.

**[804]-98-(361)** ........ Abbad ibn Təmimin əmisi demişdir: "Namaz əsnasında özündən sanki yel çıxdığını hiss edən kimsə barədə Peyğəmbərə ﷺ xəbər verildi. (Peyğəmbər ﷺ) buyurdu: "Bir səs eşitməyincə və ya bir iy duymayınca namazdan çıxmasın!"

Əbu Bəkr və Zuheyr ibn Hərb öz rəvayətlərində: "(Onun əmisi,) Abdullah ibn Zeyddir"– demişlər.

**[٨٠٥] ٩٩–(٣٦٢)** حَدَّثَنِي زُهَيْرُ بْنُ حَرْبٍ: حَدَّثَنَا جَرِيرٌ عَنْ سُهَيْلٍ، عَنْ أَبِيهِ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: ((إِذَا وَجَدَ أَحَدُكُمْ فِي بَطْنِهِ شَيْئًا فَأَشْكَلَ عَلَيْهِ، أَخَرَجَ مِنْهُ شَيْءٌ أَمْ لاَ، فَلاَ يَخْرُجَنَّ مِنْ الْمَسْجِدِ حَتَّى يَسْمَعَ صَوْتًا أَوْ يَجِدَ رِيحًا)).

**[805]-99-(362)** ........ Əbu Hureyrə رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurmuşdur: "Sizdən biriniz qarnında bir şey hiss etdiyi və ondan bir şey çıxıb-çıxmadığı özünə müəmmalı qaldığı təqdirdə, bir səs eşitməyincə və ya bir iy duymayınca məsciddən (bayıra) çıxmasın".

## (٢٧) – بَابُ طَهَارَةِ جُلُودِ الْمَيْتَةِ بِالدِّبَاغِ

## 27-ci fəsil. Ölmüş heyvan dərisinin aşılanma ilə təmizlənməsi

**[٨٠٦]** ١٠٠–(٣٦٣) و حَدَّثَنَا يَحْيَى بْنُ يَحْيَى، وَأَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ، وَعَمْرٌو النَّاقِدُ، وَابْنُ أَبِي عُمَرَ، جَمِيعًا عَنْ ابْنِ عُيَيْنَةَ قَالَ يَحْيَى: أَخْبَرَنَا سُفْيَانُ بْنُ عُيَيْنَةَ عَنْ الزُّهْرِيِّ، عَنْ عُبَيْدِ اللَّهِ بْنِ عَبْدِ اللَّهِ، عَنْ ابْنِ عَبَّاسٍ قَالَ: تُصُدِّقَ عَلَى مَوْلَاةٍ لِمَيْمُونَةَ بِشَاةٍ، فَمَاتَتْ، فَمَرَّ بِهَا رَسُولُ اللَّهِ ﷺ فَقَالَ: ((هَلَّا أَخَذْتُمْ إِهَابَهَا، فَدَبَغْتُمُوهُ، فَانْتَفَعْتُمْ بِهِ؟)) فَقَالُوا: إِنَّهَا مَيْتَةٌ، فَقَالَ: ((إِنَّمَا حَرُمَ أَكْلُهَا)).

قَالَ أَبُو بَكْرٍ وَابْنُ أَبِي عُمَرَ فِي حَدِيثِهِمَا: عَنْ مَيْمُونَةَ ﵂.

**[806]-100-(363)** ........ İbn Abbas ﵄ demişdir: "Meymunənin mövlasına bir qoyun verilmişdi. Bu qoyun öldü. Peyğəmbər ﷺ bu ölmüş qoyunun yanından keçdi və: "Nə üçün bu qoyunun dərisini götürüb, aşılayıb ondan istifadə etmirsiniz?"– deyə buyurdu. Onlar: "Axı o, murdar olub!"– dedilər. Peyğəmbər ﷺ buyurdu: "Murdar olmuş heyvanın yalnız yeyilməsi haram edilmişdir".

Əbu Bəkr və İbn Əbu Ömər öz rəvayətlərində: "Məymunədən ﵂"– demişlər.

**[٨٠٧]** ١٠١–(...) و حَدَّثَنِي أَبُو الطَّاهِرِ وَحَرْمَلَةُ قَالَا: حَدَّثَنَا ابْنُ وَهْبٍ: أَخْبَرَنِي يُونُسُ عَنْ ابْنِ شِهَابٍ، عَنْ عُبَيْدِ اللَّهِ بْنِ عَبْدِ اللَّهِ بْنِ عُتْبَةَ، عَنْ ابْنِ عَبَّاسٍ أَنَّ رَسُولَ اللَّهِ ﷺ وَجَدَ شَاةً مَيْتَةً، أُعْطِيَتْهَا مَوْلَاةٌ لِمَيْمُونَةَ، مِنْ الصَّدَقَةِ، فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: ((هَلَّا انْتَفَعْتُمْ بِجِلْدِهَا؟)) قَالُوا: إِنَّهَا مَيْتَةٌ، فَقَالَ: ((إِنَّمَا حَرُمَ أَكْلُهَا)).

**[807]-101-(...)** ........ İbn Abbas ﵄ rəvayət edir ki, Peyğəmbər ﷺ Meymunənin mövlasına sədəqə olaraq verilmiş qoyunun öldüyünü gördü və: "Nə üçün bu qoyunun dərisini (aşılayıb ondan) istifadə etmirsiniz?"– deyə buyurdu. Onlar: "Axı o, murdar olub!"– dedilər. Peyğəmbər ﷺ buyurdu: "Murdar olmuş heyvanın yalnız yeyilməsi haram edilmişdir".

**[٨٠٨]** (...) حَدَّثَنَا حَسَنٌ الْحُلْوَانِيُّ وَعَبْدُ بْنُ حُمَيْدٍ، جَمِيعًا عَنْ يَعْقُوبَ بْنِ إِبْرَاهِيمَ بْنِ سَعْدٍ: حَدَّثَنِي أَبِي عَنْ صَالِحٍ، عَنْ ابْنِ شِهَابٍ بِهَذَا الإِسْنَادِ، بِنَحْوِ رِوَايَةِ يُونُسَ.

**[808] (...)** ........ (Bu hədisi) bizə Həsən əl-Hülvani və Abd ibn Humeyd – (hər ikisi) Yəqub ibn İbrahim ibn Səddən rəvayət etmişlər. (O demişdir): "(Bu hədisi) mənə atam, Salehdən, o da İbn Şihabdan bu isnadla (yuxarıda keçən) Yunusun rəvayətinə yaxın mənada rəvayət etmişdir".

**[٨٠٩] ١٠٢**–(...) و حَدَّثَنَا ابْنُ أَبِي عُمَرَ وَعَبْدُ اللَّهِ بْنُ مُحَمَّدٍ الزُّهْرِيُّ – وَاللَّفْظُ لِابْنِ أَبِي عُمَرَ – قَالَا: حَدَّثَنَا سُفْيَانُ عَنْ عَمْرٍو، عَنْ عَطَاءٍ، عَنْ ابْنِ عَبَّاسٍ، أَنَّ رَسُولَ اللَّهِ ﷺ مَرَّ بِشَاةٍ مَطْرُوحَةٍ أُعْطِيَتْهَا مَوْلَاةٌ لِمَيْمُونَةَ، مِنْ الصَّدَقَةِ، فَقَالَ النَّبِيُّ ﷺ: ((أَلَّا أَخَذُوا إِهَابَهَا، فَدَبَغُوهُ، فَانْتَفَعُوا بِهِ؟)).

**[809]-102-(...)** ........ İbn Abbas ﷻ rəvayət edir ki, Peyğəmbər ﷺ kənara atılmış bir qoyun ölüsünü gördü. O qoyun sədəqə olaraq Meymunənin mövlasına verilmişdi. Peyğəmbər ﷺ: “Nə üçün bu qoyunun dərisini götürüb, aşılayıb ondan istifadə etmirsiniz?”– deyə buyurdu”.

**[٨١٠] ١٠٣**–(٣٦٤) حَدَّثَنَا أَحْمَدُ بْنُ عُثْمَانَ النَّوْفَلِيُّ: حَدَّثَنَا أَبُو عَاصِمٍ: حَدَّثَنَا ابْنُ جُرَيْجٍ: أَخْبَرَنِي عَمْرُو بْنُ دِينَارٍ: أَخْبَرَنِي عَطَاءٌ مُنْذُ حِينٍ، قَالَ: أَخْبَرَنِي ابْنُ عَبَّاسٍ، أَنَّ مَيْمُونَةَ أَخْبَرَتْهُ: أَنَّ دَاجِنَةً كَانَتْ لِبَعْضِ نِسَاءِ رَسُولِ اللَّهِ ﷺ فَمَاتَتْ، فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: ((أَلَّا أَخَذْتُمْ إِهَابَهَا فَاسْتَمْتَعْتُمْ بِهِ؟)).

**[810]-103-(364)** ........ Rəvayət edilir ki, Əta (ibn Əbu Rəbah) demişdir: “İbn Abbas mənə xəbər vermişdir ki, Məymunə ona belə rəvayət etmişdir: “Rəsulullahın ﷺ zövcələrindən birinin evə öyrəşmiş bir qoyunu var idi. Qoyun öldükdən sonra Peyğəmbər ﷺ buyurdu: “Nə üçün onun dərisini götürüb (aşılayıb ondan) istifadə etmirsiniz?”

**[٨١١] ١٠٤**–(٣٦٥) حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا عَبْدُ الرَّحِيمِ بْنُ سُلَيْمَانَ عَنْ عَبْدِ الْمَلِكِ بْنِ أَبِي سُلَيْمَانَ، عَنْ عَطَاءٍ، عَنْ ابْنِ عَبَّاسٍ أَنَّ النَّبِيَّ ﷺ مَرَّ بِشَاةٍ لِمَوْلَاةٍ لِمَيْمُونَةَ فَقَالَ: ((أَلَّا انْتَفَعْتُمْ بِإِهَابِهَا؟)).

**[811]-104-(365)** ........ İbn Abbas ﷻ rəvayət edir ki, Peyğəmbər ﷺ Meymunənin mövlasına aid bir qoyunun (ölüsünün) yanından keçdi və: “Nə üçün bunun dərisini (aşılayıb ondan) istifadə etmirsiniz?”– deyə buyurdu.

**[٨١٢] ١٠٥**–(٣٦٦) حَدَّثَنَا يَحْيَى بْنُ يَحْيَى: أَخْبَرَنَا سُلَيْمَانُ بْنُ بِلَالٍ عَنْ زَيْدِ بْنِ أَسْلَمَ، أَنَّ عَبْدَ الرَّحْمَنِ بْنَ وَعْلَةَ أَخْبَرَهُ عَنْ عَبْدِ اللَّهِ بْنِ عَبَّاسٍ قَالَ: سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ: ((إِذَا دُبِغَ الْإِهَابُ فَقَدْ طَهُرَ)).

**[812]-105-(366)** ........ Abdullah ibn Abbas ﷻ demişdir: “Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: “(Heyvan) dərisi aşılandığı zaman artıq pak olar!”

**[٨١٣]** (...) و حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ وَعَمْرٌو النَّاقِدُ قَالَا: حَدَّثَنَا ابْنُ عُيَيْنَةَ؛ ح: و حَدَّثَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ: حَدَّثَنَا عَبْدُ الْعَزِيزِ يَعْنِي ابْنَ مُحَمَّدٍ؛ ح: و حَدَّثَنَا أَبُو كُرَيْبٍ وَإِسْحَقُ بْنُ إِبْرَاهِيمَ، جَمِيعًا عَنْ وَكِيعٍ، عَنْ سُفْيَانَ، كُلُّهُمْ عَنْ زَيْدِ بْنِ أَسْلَمَ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ وَعْلَةَ، عَنْ ابْنِ عَبَّاسٍ عَنْ النَّبِيِّ ﷺ بِمِثْلِهِ، يَعْنِي حَدِيثَ يَحْيَى بْنِ يَحْيَى.

**[813] (...)** ........ İbn Uyeynə, Abdul-Əziz və Süfyan – onların hamısı Zeyd ibn Əsləmdən, o da Abdur-Rəhman ibn Vələdən, o da İbn Abbasdan, o da Peyğəmbərdən ﷺ, (yuxarıda keçən) Yəhya ibn Yəhyanın hədisinin bənzərini rəvayət etmişlər.

**[٨١٤] ١٠٦**–(...) حَدَّثَنِي إِسْحَقُ بْنُ مَنْصُورٍ وَأَبُو بَكْرِ بْنُ إِسْحَقَ – قَالَ أَبُو بَكْرٍ: حَدَّثَنَا. وَقَالَ ابْنُ مَنْصُورٍ: أَخْبَرَنَا – عَمْرُو بْنُ الرَّبِيعِ: أَخْبَرَنَا يَحْيَى بْنُ أَيُّوبَ، عَنْ يَزِيدَ بْنِ أَبِي حَبِيبٍ أَنَّ أَبَا الْخَيْرِ حَدَّثَهُ قَالَ: رَأَيْتُ عَلَى ابْنِ وَعْلَةَ السَّبَإِيِّ فَرْوًا، فَمَسِسْتُهُ، فَقَالَ: مَا لَكَ تَمَسُّهُ؟ قَدْ سَأَلْتُ عَبْدَ اللَّهِ بْنَ عَبَّاسٍ، قُلْتُ: إِنَّا نَكُونُ بِالْمَغْرِبِ، وَمَعَنَا الْبَرْبَرُ وَالْمَجُوسُ، نُؤْتَى بِالْكَبْشِ قَدْ ذَبَحُوهُ، وَنَحْنُ لاَ نَأْكُلُ ذَبَائِحَهُمْ، وَيَأْتُونَا بِالسِّقَاءِ يَجْعَلُونَ فِيهِ الْوَدَكَ، فَقَالَ ابْنُ عَبَّاسٍ: قَدْ سَأَلْنَا رَسُولَ اللَّهِ ﷺ عَنْ ذَلِكَ؟ فَقَالَ: ((دِبَاغُهُ طَهُورُهُ)).

**[814]-106-(...)** ........ Əbul-Xeyr demişdir: “Mən İbn Vələ əs-Səbainin əynində bir kürk gördüm və əlimi ona sürtdüm. İbn Vələ dedi: “Niyə əlini ona sürtürsən?! Mən Abdullah ibn Abbasdan soruşdum: “Biz məğribdə yaşayırıq. Bizim yanımızda bərbərlər[1] və məcusilər[2] yaşayır. Onlar qoyun kəsib bizə gətirirlər. Lakin biz onların kəsdikləri qoyunu yemirik. Bizə həmçinin içərisinə ərinmiş iç yağı qoyduqları tuluq da gətirirlər?” İbn Abbas dedi: “Biz bu haqda Peyğəmbərdən ﷺ soruşmuşuq. (O, bu xüsusda) belə buyurmuşdur: “Dərinin aşılanması, onun təmizləyicisidir”.

**[٨١٥] ١٠٧**–(...) و حَدَّثَنِي إِسْحَقُ بْنُ مَنْصُورٍ وَأَبُو بَكْرِ بْنُ إِسْحَقَ عَنْ عَمْرِو بْنِ الرَّبِيعِ: أَخْبَرَنَا يَحْيَى بْنُ أَيُّوبَ عَنْ جَعْفَرِ بْنِ رَبِيعَةَ، عَنْ أَبِي الْخَيْرِ حَدَّثَهُ قَالَ: حَدَّثَنِي ابْنُ وَعْلَةَ السَّبَإِيُّ قَالَ: سَأَلْتُ عَبْدَ اللَّهِ بْنَ عَبَّاسٍ، قُلْتُ: إِنَّا نَكُونُ بِالْمَغْرِبِ، فَيَأْتِينَا الْمَجُوسُ بِالأَسْقِيَةِ فِيهَا الْمَاءُ وَالْوَدَكُ، فَقَالَ: اشْرَبْ. فَقُلْتُ: أَرَأْيٌ تَرَاهُ؟ فَقَالَ ابْنُ عَبَّاسٍ: سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ: ((دِبَاغُهُ طَهُورُهُ)).

**[815]-107-(...)** ........ Əbul-Xeyr rəvayət edir ki, İbn Vələ əs-Səbai demişdir: “Mən Abdullah ibn Abbasdan soruşdum: “Biz məğribdə yaşayırıq. Məcusilər bizə içərisində su və ərinmiş iç yağı olan tuluqlar gətirirlər?” İbn Abbas: “İçə (bilərsən)”– deyə cavab verdi. Mən: “Bu sənin öz rəyindirmi?”– deyə soruşdum. İbn Abbas dedi: “Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: “Dərinin aşılanması onun təmizləyicisidir”.

---

[1] Vaxtı ilə Afrikanın şimalında yaşamış, indi isə ərəblərə qarışmış bir xalq.

[2] 603-cü hədisin qeydlərinə bax.

## (٢٨) – بَابُ التَّيَمُّمِ

## 28-ci fəsil. Təyəmmüm[1]

**[٨١٦] ١٠٨–(٣٦٧)** حَدَّثَنَا يَحْيَى بْنُ يَحْيَى قَالَ: قَرَأْتُ عَلَى مَالِكٍ عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ الْقَاسِمِ، عَنْ أَبِيهِ، عَنْ عَائِشَةَ أَنَّهَا قَالَتْ: خَرَجْنَا مَعَ رَسُولِ اللَّهِ ﷺ فِي بَعْضِ أَسْفَارِهِ، حَتَّى إِذَا كُنَّا بِالْبَيْدَاءِ – أَوْ بِذَاتِ الْجَيْشِ – انْقَطَعَ عِقْدٌ لِي، فَأَقَامَ رَسُولُ اللَّهِ ﷺ عَلَى الْتِمَاسِهِ، وَأَقَامَ النَّاسُ مَعَهُ، وَلَيْسُوا عَلَى مَاءٍ، وَلَيْسَ مَعَهُمْ مَاءٌ، فَأَتَى النَّاسُ إِلَى أَبِي بَكْرٍ فَقَالُوا: أَلاَ تَرَى إِلَى مَا صَنَعَتْ عَائِشَةُ؟ أَقَامَتْ بِرَسُولِ اللَّهِ ﷺ وَبِالنَّاسِ مَعَهُ، وَلَيْسُوا عَلَى مَاءٍ، وَلَيْسَ مَعَهُمْ مَاءٌ، فَجَاءَ أَبُو بَكْرٍ وَرَسُولُ اللَّهِ ﷺ وَاضِعٌ رَأْسَهُ عَلَى فَخِذِي قَدْ نَامَ، فَقَالَ: حَبَسْتِ رَسُولَ اللَّهِ ﷺ وَالنَّاسَ، وَلَيْسُوا عَلَى مَاءٍ وَلَيْسَ مَعَهُمْ مَاءٌ، قَالَتْ: فَعَاتَبَنِي أَبُو بَكْرٍ، وَقَالَ مَا شَاءَ اللَّهُ أَنْ يَقُولَ، وَجَعَلَ يَطْعُنُ بِيَدِهِ فِي خَاصِرَتِي، فَلاَ يَمْنَعُنِي مِنَ التَّحَرُّكِ إِلاَّ مَكَانُ رَسُولِ اللَّهِ ﷺ عَلَى فَخِذِي، فَنَامَ رَسُولُ اللَّهِ ﷺ حَتَّى أَصْبَحَ عَلَى غَيْرِ مَاءٍ، فَأَنْزَلَ اللَّهُ آيَةَ التَّيَمُّمِ فَتَيَمَّمُوا، فَقَالَ أُسَيْدُ بْنُ الْحُضَيْرِ – وَهُوَ أَحَدُ النُّقَبَاءِ – مَا هِيَ بِأَوَّلِ بَرَكَتِكُمْ يَا آلَ أَبِي بَكْرٍ! فَقَالَتْ عَائِشَةُ: فَبَعَثْنَا الْبَعِيرَ الَّذِي كُنْتُ عَلَيْهِ، فَوَجَدْنَا الْعِقْدَ تَحْتَهُ.

**[816]-108-(367)** ........ Aişə ﵂ demişdir: “Biz Peyğəmbərlə ﷺ birlikdə səfərə çıxdıq. Nəhayət, Beyda və ya Zətul Ceyş[2] deyilən yerə çatdıqda boyunbağım qırılıb yerə düşdü. (Boyunbağım) axtarılıb-tapılsın deyə Peyğəmbər ﷺ o yerdə dayandı. Camaat da onunla bərabər dayandı. Ətrafda su yox idi. Habelə onların yanlarında da su yox idi. Elə buna görə də camaat Əbu Bəkrin yanına gəlib dedi: “Aişənin nə etdiyini görürsənmi?! Allahın elçisini və bu qədər camaatı

---

[1] Lüğəti mənada: qəsd etmək, yönəlmək, istilahi mənada isə bu, namaz və buna bənzər ibadətlərin caiz olması niyyəti ilə üzü və əlləri məsh etmək üçün əlləri təmiz torpağa vurmaqdır.

Təyəmmüm Allahın bu ümmətə xüsusi olaraq bəxş etdiyi nemətlərdən biridir. Cabir ibn Abdullah ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Mənə beş (xislət) verilib ki, bunlar məndən əvvəl heç bir kəsə verilməmişdir: “Bir ay əvvəl düşmənin qəlbinə qorxu salaraq ona qalib gəlməyim; yer üzünün mənim üçün pak və namazgah olması, belə ki, ümmətimdən olan hər bir kəs istənilən yerdə vaxtı girmiş namazı qılmalıdır; qənimətlərin mənə halal olması, belə ki, bu, məndən qabaq heç bir peyğəmbərə halal olmamışdır; (Qiyamət günü tərifəlayiq məqamda) şəfaət etməyim; və bir də hər bir peyğəmbər yalnız öz qövmünə göndərilərdi, mən isə bütün insanlara göndərilmişəm” (“Səhih əl-Buxari”, 335).

Təyəmmüm etməyin qaydası**:** təyəmmüm edən kəs öncə niyyət etməli, sonra da “bismillah” deyib ovuclarının içini təyəmmüm üçün seçilmiş yerə bir dəfə vurmalı, sonra da əllərini üzünə çəkməli və biləyə qədər bir-birinə sürtməlidir.

[2] Bunlar, Məkkə ilə Mədinə və ya Mədinə ilə Xeybər arasındakı düzəngahlıqdır (“Dibac alə Muslim”, 2/107; “Mocəm əl-Buldan”, 1/523).

yoldan eləyib. Onlar su olmayan yerdə dayanıblar, özlərinin də su ehtiyatı qurtarıb". Əbu Bəkr (mənim yanıma) gəldi. Bu vaxt Peyğəmbər ﷺ başını dizimin üstünə qoyub yatmışdı. Əbu Bəkr dedi: "Allahın elçisini və bu qədər camaatı su olmayan bir yerdə, həm də su ehtiyatları olmadığı halda saxlamısan?!" Sonra Aişə dedi: "Əbu Bəkr məni danladı, xeyli söyləndi və barmağı ilə böyrümdən vurmağa başladı. Bu vaxt Peyğəmbərin ﷺ başı dizimin üstündə olduğuna görə mən tərpənmədim. Peyğəmbər ﷺ (elə oradaca) yatdı. Nəhayət, səhər açıldıqda o, (dəstəmaz almaq üçün) su tapmadı. (Elə bu səbəbdən[1] də) Uca Allah təyəmmüm ayəsini nazil etdi və onlar təyəmmüm etdilər.

(Nümayəndələrdən biri[2]) – Useyd ibn Hudeyr dedi: "Ey Əbu Bəkrin ailəsi! Bu sizin ilk bərəkətiniz deyildir[3]".

Aişə dedi: "Sonra üstündə oturduğum dəvəni qaldırdıq və boyunbağını onun altından tapdıq".

---

[1] Suyun tapılmaması təyəmmüm etmək üçün səbəbdir. Bundan başqa təyəmmüm etmək üçün digər səbəblər də vardır ki, bunlar aşağıdakılardır:

– tapılmış su təmizlənmək üçün yetərli olmazsa;

– qüsl etmək istəyən adamın bədənində yara varsa və ya canı xəstədirsə, üstəlik sudan istifadə edəciyi təqdirdə, xəstəliyinin artacağından yaxud gec sağalacağından qorxursa;

– su çox soyuq olduğundan qüsl etmək istəyən kimsənin ondan istifadə edəcəyi təqdirdə, zərər çəkəcəyini güman edərsə, üstəlik pul verib suyu isitmək və ya hamama girmək mümkün olmazsa;

– qüsl etmək istəyən şəxs, su yaxında ikən, özünə, malına və namusuna bir zərər toxunacağından, yaxud yoldaşlarının *onu qoyub* gedəcəklərindən ehtiyat etsə, yaxud onunla suyun arasında insan və ya başqa bir qorxulu düşmən varsa, yaxud həbs edilmişdirşə, yaxud ip və vedrə kimi su çıxartmaq üçün istifadə edilən alətlər olmadığından, su əldə etməyə aciz qalarsa;

– və nəhayət özünün və ya başqasının, hətta əhliləşdirilmiş itin belə içməsi üçün, yaxud xəmir yoğurmaq, yemək bişirmək və təmizlənməsi zəruri olan nəcasəti təmizləmək üçün qalan sudan artıq su yoxdursa, onda o suyu saxlayıb təyəmmüm edə bilər.

[2] Burada "nümayəndələr" deyildikdə ənsardan olmuş, Əqəbə gecəsi Peyğəmbərə ﷺ kömək edəcəklərinə dair beyət etmək üçün onun yanına gəlmiş kimsələr nəzərdə tutulur. Onların sayı on iki idi. Bunlar: Xəzrəc qəbiləsindən olan Əsəd ibn Zürarə, Auf ibn Haris, onun qardaşı Muaz, Zəkvan ibn Abdulqeys, Rafi ibn Malik əz-Zərqani, Ubadə ibn Samit, Abbas ibn Ubadə ibn Nədlə, Yezid ibn Sələbə, Uqbə ibn Amir və Qutbə ibn Amir, habelə Ovs qəbiləsindən olan Əbul-Heysəm ibn Teyhan və Uveym ibn Səadə". ("Umdətul-Qari", 1/416).

[3] Yəni Allah sizə bundan əvvəl də xeyir-bərəkət nəsib etmişdir. Bu hədis Aişənin və onun atasının nə qədər fəzilətli olduğunu göstərir. Amr ibn Harisin rəvayət etdiyi başqa bir hədisdə deyilir: "Allah sizin sayənizdə insanlara xeyir-bərəkət nəsib etmişdir!" Digər rəvayətdə deyilir: "Allah səni xeyirlə mükafatlandırsın! Vallahi, indiyədək sənin başına elə bir iş gəlməmişdir ki, Allah bu işdə sənə bir yol göstərməsin və bu işi müsəlmanlar üçün bərəkətli etməsin" ("Fəth əl-Bari", 2/22).

**[٨١٧] ١٠٩**–(...) حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا أَبُو أُسَامَةَ؛ ح: و حَدَّثَنَا أَبُو كُرَيْبٍ: حَدَّثَنَا أَبُو أُسَامَةَ وَابْنُ بِشْرٍ عَنْ هِشَامٍ، عَنْ أَبِيهِ، عَنْ عَائِشَةَ أَنَّهَا اسْتَعَارَتْ مِنْ أَسْمَاءَ قِلَادَةً، فَهَلَكَتْ، فَأَرْسَلَ رَسُولُ اللَّهِ ﷺ نَاسًا مِنْ أَصْحَابِهِ فِي طَلَبِهَا، فَأَدْرَكَتْهُمُ الصَّلَاةُ فَصَلَّوْا بِغَيْرِ وُضُوءٍ، فَلَمَّا أَتَوْا النَّبِيَّ ﷺ شَكَوْا ذَلِكَ إِلَيْهِ، فَنَزَلَتْ آيَةُ التَّيَمُّمِ، فَقَالَ أُسَيْدُ بْنُ حُضَيْرٍ: جَزَاكِ اللَّهُ خَيْرًا. فَوَاللَّهِ! مَا نَزَلَ بِكِ أَمْرٌ قَطُّ إِلاَّ جَعَلَ اللَّهُ لَكِ مِنْهُ مَخْرَجًا، وَجَعَلَ لِلْمُسْلِمِينَ فِيهِ بَرَكَةً.

**[817]-109-(...)** ........ Rəvayət edilir ki, (bir dəfə) Aişə ﵂ (doğma bacısı) Əsmadan burovuz[1] boyunbağı aldı. (Bir müddətdən) sonra o, boyunbağını itirdi. Buna görə də Peyğəmbər ﷺ səhabələrindən bir neçəsini göndərdi ki, onu axtarıb tapsınlar. Namaz vaxtı yetişdikdə onlar dəstəmazsız olduqları halda namaz qıldılar. Sonra Peyğəmbərin ﷺ yanına gəldikdə (su tapmadıqlarına görə) ona şikayət etdilər və (elə həmin vaxt) təyəmmüm ayəsi nazil oldu. Onda Useyd ibn Hudeyr (Aişəyə) dedi: "Allah səni xeyirlə mükafatlandırsın! Vallahi, indiyədək sənin başına elə bir iş gəlməmişdir ki, Allah bu işdə sənə bir yol göstərməsin və bu işi müsəlmanlar üçün bərəkətli etməsin".

**[٨١٨] ١١٠**–(٣٦٨) حَدَّثَنَا يَحْيَى بْنُ يَحْيَى وَأَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ وَابْنُ نُمَيْرٍ، جَمِيعًا عَنْ أَبِي مُعَاوِيَةَ قَالَ أَبُو بَكْرٍ: حَدَّثَنَا أَبُو مُعَاوِيَةَ عَنِ الأَعْمَشِ، عَنْ شَقِيقٍ قَالَ: كُنْتُ جَالِسًا مَعَ عَبْدِ اللَّهِ وَأَبِي مُوسَى، فَقَالَ أَبُو مُوسَى: يَا أَبَا عَبْدِ الرَّحْمَنِ! أَرَأَيْتَ لَوْ أَنَّ رَجُلاً أَجْنَبَ فَلَمْ يَجِدْ الْمَاءَ شَهْرًا، كَيْفَ يَصْنَعُ بِالصَّلَاةِ؟ فَقَالَ عَبْدُ اللَّهِ: لاَ يَتَيَمَّمُ وَإِنْ لَمْ يَجِدْ الْمَاءَ شَهْرًا. فَقَالَ أَبُو مُوسَى: فَكَيْفَ بِهَذِهِ الآيَةِ فِي سُورَةِ الْمَائِدَةِ: ﴿فَلَمْ تَجِدُواْ مَآءً فَتَيَمَّمُواْ صَعِيدًا طَيِّبًا﴾

فَقَالَ عَبْدُ اللَّهِ: لَوْ رُخِّصَ لَهُمْ فِي هَذِهِ الآيَةِ، لأَوْشَكَ، إِذَا بَرَدَ عَلَيْهِمْ الْمَاءُ، أَنْ يَتَيَمَّمُوا بِالصَّعِيدِ، فَقَالَ أَبُو مُوسَى لِعَبْدِ اللَّهِ: أَلَمْ تَسْمَعْ قَوْلَ عَمَّارٍ: بَعَثَنِي رَسُولُ اللَّهِ ﷺ فِي حَاجَةٍ فَأَجْنَبْتُ، فَلَمْ أَجِدْ الْمَاءَ، فَتَمَرَّغْتُ فِي الصَّعِيدِ كَمَا تَمَرَّغُ الدَّابَّةُ، ثُمَّ أَتَيْتُ النَّبِيَّ ﷺ فَذَكَرْتُ ذَلِكَ لَهُ، فَقَالَ: ((إِنَّمَا كَانَ يَكْفِيكَ أَنْ تَقُولَ بِيَدَيْكَ هَكَذَا)) ثُمَّ ضَرَبَ بِيَدَيْهِ الأَرْضَ ضَرْبَةً وَاحِدَةً، ثُمَّ مَسَحَ الشِّمَالَ عَلَى الْيَمِينِ، وَظَاهِرَ كَفَّيْهِ، وَوَجْهَهُ، فَقَالَ عَبْدُ اللَّهِ: أَوَلَمْ تَرَ عُمَرَ لَمْ يَقْنَعْ بِقَوْلِ عَمَّارٍ.

**[818]-110-(368)** ........ Şəqiq demişdir: "(Bir dəfə) mən Abdullah (ibn Məsud) və Əbu Musa (əl-Əşari) ilə birlikdə oturmuşdum. Əbu Musa (Abdullahdan): "Ey Əbu Abdur-Rəhman! De görək, əgər adam cunub olsa və bir ay su tapa

[1] Qaytarılmaq şərti ilə alınan; müvəqqəti istifadə üçün alınan.

bilməsə, namazı necə qılmalıdır?"– deyə soruşdu. Abdullah dedi: "Bir ay su tapmasa belə təyəmmüm etməməlidir". Əbu Musa soruşdu: "Bəs onda "əl-Maidə" surəsindəki bu: **"su tapmasanız, təmiz torpaqla təyəmmüm edin"**[1] ayəsini necə izah edərsən?" Abdullah dedi: "Əgər insanlara bu ayəyə əsasən rüsxət veriləsə, onlar suyun soyuq olduğunu gördükdə, onu qoyub torpaqla təyəmmüm etməyə başlayacaqlar". Əbu Musa Abdullaha dedi: "Məgər sən Əmmarın bu sözünü eşitməmisənmi? (O demişdir ki,) Peyğəmbər ﷺ məni bir iş dalınca göndərmişdi. (Səfər əsnasında) mən cunub oldum və su tapa bilmədim. Bu səbəbdən də mən, heyvanın ağnadığı kimi, yerdə o üzə-bu üzə çevrilib bədənimi torpağa sürtməyə başladım. Sonra Peyğəmbərin ﷺ yanına gəldim və bunu ona danışdım. Peyğəmbər ﷺ: "Sadəcə iki əlinlə belə etməyin sənə kifayət edərdi"– dedi, sonra əllərini bir kərə yerə vurdu, sonra da sol əlini sağ əlinə (sürtərək), əllərinin üst tərəfinə və üzünə məsh etdi".

Abdullah (ona etirazını bildirib) dedi: "Məgər sən Ömərin, Əmmarın bu sözü ilə razılaşmadığını görmədinmi?!"

**[٨١٩] ١١١**–(...) و حَدَّثَنَا أَبُو كَامِلٍ الْجَحْدَرِيُّ: حَدَّثَنَا عَبْدُ الْوَاحِدِ: حَدَّثَنَا الأَعْمَشُ عَنْ شَقِيقٍ قَالَ: قَالَ أَبُو مُوسَى لِعَبْدِ اللَّهِ: وَسَاقَ الْحَدِيثَ بِقِصَّتِهِ، نَحْوَ حَدِيثِ أَبِي مُعَاوِيَةَ، غَيْرَ أَنَّهُ قَالَ: فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: ((إِنَّمَا كَانَ يَكْفِيكَ أَنْ تَقُولَ هَكَذَا)) وَضَرَبَ بِيَدَيْهِ إِلَى الأَرْضِ، فَنَفَضَ يَدَيْهِ فَمَسَحَ وَجْهَهُ وَكَفَّيْهِ.

**[819]-111-(...)** ........ Şəqiq: "Əbu Musa Abdullaha belə dedi..." söyləyərək (bu hədisi) tamamilə Əbu Müaviyənin hədisi kimi rəvayət etmişdir. Fəqət (bu rəvayətdə Əbu Musa) demişdir ki, Peyğəmbər ﷺ (Əmmara): "Sənə belə etmək kifayət edərdi"– deyib əllərini yerə vurdu, sonra əllərinin çırpdı, sonra da ovuclarını üzünə və biləyə qədər (əllərinə) sürtdü".

**[٨٢٠] ١١٢**–(...) حَدَّثَنِي عَبْدُ اللَّهِ بْنُ هَاشِمٍ الْعَبْدِيُّ: حَدَّثَنَا يَحْيَى يَعْنِي ابْنَ سَعِيدٍ الْقَطَّانَ، عَنْ شُعْبَةَ. قَالَ: حَدَّثَنِي الْحَكَمُ عَنْ ذَرٍّ عَنْ سَعِيدِ بْنِ عَبْدِ الرَّحْمَنِ بْنِ أَبْزَى، عَنْ أَبِيهِ أَنَّ رَجُلاً أَتَى عُمَرَ فَقَالَ: إِنِّي أَجْنَبْتُ فَلَمْ أَجِدْ مَاءً. فَقَالَ: لاَ تُصَلِّ، فَقَالَ عَمَّارٌ: أَمَا تَذْكُرُ، يَا أَمِيرَ الْمُؤْمِنِينَ إِذْ أَنَا وَأَنْتَ فِي سَرِيَّةٍ فَأَجْنَبْنَا، فَلَمْ نَجِدْ مَاءً: فَأَمَّا أَنْتَ فَلَمْ تُصَلِّ، وَأَمَّا أَنَا فَتَمَعَّكْتُ فِي التُّرَابِ وَصَلَّيْتُ، فَقَالَ النَّبِيُّ ﷺ: ((إِنَّمَا كَانَ يَكْفِيكَ أَنْ تَضْرِبَ بِيَدَيْكَ الأَرْضَ، ثُمَّ تَنْفُخَ، ثُمَّ تَمْسَحَ بِهِمَا وَجْهَكَ وَكَفَّيْكَ)) فَقَالَ عُمَرُ: اتَّقِ اللَّهَ، يَا عَمَّارُ! فَقَالَ: إِنْ شِئْتَ لَمْ أُحَدِّثْ بِهِ.

[1] "ən-Nisa" surəsi, 43 və "əl-Maidə" surəsi, 6.

قَالَ الْحَكَمُ: وَحَدَّثَنِيهِ ابْنُ عَبْدِ الرَّحْمَنِ بْنِ أَبْزَى عَنْ أَبِيهِ، مِثْلَ حَدِيثِ ذَرٍّ قَالَ: وَحَدَّثَنِي سَلَمَةُ عَنْ ذَرٍّ، فِي هَذَا الإِسْنَادِ الَّذِي ذَكَرَ الْحَكَمُ. فَقَالَ عُمَرُ: نُوَلِّيكَ مَا تَوَلَّيْتَ.

**[820]-112-(...)** ........ Abdur-Rəhman ibn Əbzə (əl-Xüzai) demişdir: "(Bir dəfə) bir nəfər Ömərin yanına gəlib dedi: "Mən cunub oldum və su tapa bilmədim. (İndi nə edim?)" Ömər: "Namaz qılma!"– deyə buyurdu. (Bunu eşidəndə) Əmmar (ibn Yasir) dedi: "Yadındadırmı? Ey möminlərin əmiri! O vaxt ki ikimiz səfərdə ikən cunub olduq və su tapa bilmədik. Sən namaz qılmadın. Mən isə yerə uzanıb o üzə-bu üzə çevrilərək bədənimi torpağa sürtdüm və (qalxıb) namazımı qıldım. (Mən bunu Peyğəmbərə ﷺ xəbər verdikdə) o (mənə): "Sadəcə əllərini yerə vurmağın, ovuclarına üfürməyin, sonra da ovuclarını üzünə və biləyə qədər (əllərinə) sürtməyin sənə kifayət edərdi"– deyə buyurmuşdu". Ömər dedi: "Allahdan qorx, ey Əmmar!" Əmmar dedi: "İstəyirsən, bunu heç kəsə danışmayım!"[1]

Həkəm demişdir: "Bu hədisi mənə Səid ibn Abdur-Rəhman ibn Əbzə öz atasından, Zərin hədisinə bənzər şəkildə rəvayət edib demişdir: "(Bu hədisi) mənə Sələmə, Zərdən Həkəmin zikr etdiyi bu isnadla rəvayət etmişdir. (Bu rəvayətdə) Ömər demişdir: "Boynuna götürdüyün bu məsuliyyəti sənin öhdənə buraxırıq".

**[٨٢١] ١١٣**–(...) و حَدَّثَنِي إِسْحَقُ بْنُ مَنْصُورٍ: حَدَّثَنَا النَّضْرُ بْنُ شُمَيْلٍ: أَخْبَرَنَا شُعْبَةُ عَنْ الْحَكَمِ قَالَ: سَمِعْتُ ذَرًّا عَنْ ابْنِ عَبْدِ الرَّحْمَنِ بْنِ أَبْزَى، قَالَ: قَالَ الْحَكَمُ: وَقَدْ سَمِعْتُهُ مِنْ ابْنِ عَبْدِ الرَّحْمَنِ بْنِ أَبْزَى عَنْ أَبِيهِ، أَنَّ رَجُلاً أَتَى عُمَرَ فَقَالَ: إِنِّي أَجْنَبْتُ فَلَمْ أَجِدْ مَاءً، وَسَاقَ الْحَدِيثَ، وَزَادَ فِيهِ، قَالَ عَمَّارٌ: يَا أَمِيرَ الْمُؤْمِنِينَ! إِنْ شِئْتَ، لِمَا جَعَلَ اللَّهُ عَلَيَّ مِنْ حَقِّكَ، لاَ أُحَدِّثُ بِهِ أَحَدًا. وَلَمْ يَذْكُرْ حَدَّثَنِي سَلَمَةُ عَنْ ذَرٍّ.

**[821]-113-(...)** ........ Həkəm demişdir: "Mən bu hədisi Abdur-Rəhman ibn Əbzənin oğlundan, o da atasından eşitmişdir. (O): "Bir nəfər Ömərin yanına gəlib: "Mən cunub oldum və su tapa bilmədim. (İndi nə edim?)"– deyə soruşdu..." deyərək hədisi nəql etmiş və hədisdə bunu əlavə etmişdir: "Əmmar dedi: "Ey möminlərin əmiri! Allah mənim üzərimə sənə itaət etmək haqqını vacib buyurduğu üçün, istəyirsənsə, mən bunu heç kəsə danışmayım". Bir də ki, o: "Mənə Sələmə, Zərdən rəvayət etmişdir"– deməmişdir.

**[٨٢٢] ١١٤**–(٣٦٩) **قَالَ مُسْلِم**: وَرَوَى اللَّيْثُ بْنُ سَعْدٍ عَنْ جَعْفَرِ بْنِ رَبِيعَةَ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ هُرْمُزَ، عَنْ عُمَيْرٍ مَوْلَى ابْنِ عَبَّاسٍ أَنَّهُ سَمِعَهُ يَقُولُ: أَقْبَلْتُ أَنَا وَعَبْدُ الرَّحْمَنِ بْنُ يَسَارٍ، مَوْلَى مَيْمُونَةَ، زَوْجِ

[1] Yəni məsləhət deyilsə, bu hədisi danışmayım.

النَّبِيِّ ﷺ، حَتَّى دَخَلْنَا عَلَى أَبِي الْجَهْمِ بْنِ الْحَارِثِ بْنِ الصِّمَّةِ الأَنْصَارِيِّ. فَقَالَ أَبُو الْجَهْمِ: أَقْبَلَ رَسُولُ اللَّهِ ﷺ مِنْ نَحْوِ بِئْرِ جَمَلٍ، فَلَقِيَهُ رَجُلٌ فَسَلَّمَ عَلَيْهِ، فَلَمْ يَرُدَّ رَسُولُ اللَّهِ ﷺ [عَلَيْهِ] حَتَّى أَقْبَلَ عَلَى الْجِدَارِ فَمَسَحَ وَجْهَهُ وَيَدَيْهِ، ثُمَّ رَدَّ عَلَيْهِ السَّلاَمَ.

**[822]-114-(369) Muslim demişdir:** "Leys ibn Səd, Cəfər ibn Rəbiədən, o da Abdur-Rəhman ibn Hurmuzdan, o da İbn Abbasın mövlası Umeyrdən rəvayət etmişdir ki, o, İbn Abbasın belə dediyini eşitmişdir: "Mən Peyğəmbərin ﷺ zövcəsi Məymunənin mövlası Abdur-Rəhman ibn Yəsarla birlikdə gəlib Əbu Cəhm[1] ibn Haris ibn Simmə əl-Ənsarinin yanına girdik. Əbu Cəhm dedi: "(Bir dəfə) Peyğəmbər ﷺ Birul-Cəməl[2] tərəfdən gəlirdi. Bu vaxt bir nəfər onun qarşısına çıxdı və ona salam verdi. Peyğəmbər ﷺ (onun) salamını almadı. Nəhayət, bir divara yaxınlaşıb (əllərini ona vurdu,) sonra üzünə və əllərinə məsh etdi, sonra da onun salamını aldı[3]".

**[٨٢٣] ١١٥-(٣٧٠)** حَدَّثَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللَّهِ بْنِ نُمَيْرٍ: حَدَّثَنَا أَبِي: حَدَّثَنَا سُفْيَانُ عَنْ الضَّحَّاكِ بْنِ عُثْمَانَ، عَنْ نَافِعٍ، عَنْ ابْنِ عُمَرَ أَنَّ رَجُلاً مَرَّ، وَرَسُولُ اللَّهِ ﷺ يَبُولُ، فَسَلَّمَ، فَلَمْ يَرُدَّ عَلَيْهِ.

**[823]-115-(370)** ........ İbn Ömər رضي الله عنهما demişdir: "Peyğəmbər ﷺ bövl edərkən bir nəfər onun yanından keçdi və ona salam verdi. Lakin Peyğəmbər ﷺ onun salamını almadı[4]".

## (٢٩) – بَابُ الدَّلِيلِ عَلَى أَنَّ الْمُسْلِمَ لاَ يَنْجُسُ

## 29-cu fəsil. Müsəlmanın murdar olmadığına dair dəlil

**[٨٢٤]** (٣٧١) حَدَّثَنِي زُهَيْرُ بْنُ حَرْبٍ: حَدَّثَنَا يَحْيَى يَعْنِي ابْنَ سَعِيدٍ، قَالَ حُمَيْدٌ: حَدَّثَنَا؛ ح: و حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ – وَاللَّفْظُ لَهُ – حَدَّثَنَا إِسْمَعِيلُ ابْنُ عُلَيَّةَ عَنْ حُمَيْدٍ الطَّوِيلِ، قَالَ حَدَّثَنَا بَكْرُ بْنُ عَبْدِ اللَّهِ

---

[1] Düzünə qalsa, onun kunyəsi Əbu Cuheymdir. Əbu Cuheym ibn Haris əl-Ənsari رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ Birul-Cəməldən gələrkən qarşısına çıxan bir nəfər ona salam verdi, lakin Peyğəmbər ﷺ onun salamını almadı. Nəhayət, divara yaxınlaşdı, *əllərini divara vurub* üzünə və əllərinə sürtdükdən sonra o kimsənin salamını aldı ("Səhih əl-Buxari", 337).

[2] Mədinənin yaxınlığında yerləşən bir yer adıdır.

[3] Bu hədis divardan təyəmmüm etməyin caiz olmasına dəlalət edir. Bir şərtlə ki, gərək divar toz-torpaqlı olsun.

[4] Hədisdən açıq-aydın görünür ki, ayaqyolunda olan adama salam vermək olmaz. Və əgər ona salam verilmişsə, o, bu salamı almamalıdır.

عَنْ أَبِي رَافِعٍ، عَنْ أَبِي هُرَيْرَةَ أَنَّهُ لَقِيَهُ النَّبِيُّ ﷺ فِي طَرِيقٍ مِنْ طُرُقِ الْمَدِينَةِ وَهُوَ جُنُبٌ، فَانْسَلَّ فَذَهَبَ فَاغْتَسَلَ، فَتَفَقَّدَهُ النَّبِيُّ ﷺ فَلَمَّا جَاءَهُ قَالَ: ((أَيْنَ كُنْتَ يَا أَبَا هُرَيْرَةَ؟)) قَالَ: يَا رَسُولَ اللَّهِ! لَقِيتَنِي وَأَنَا جُنُبٌ، فَكَرِهْتُ أَنْ أُجَالِسَكَ حَتَّى أَغْتَسِلَ، فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: ((سُبْحَانَ اللَّهِ! إِنَّ الْمُؤْمِنَ لاَ يَنْجُسُ)).

**[824] (371)** ........ Əbu Hureyrə ﷺ rəvayət edir ki, (bir gün) o, cunub olduğu halda Mədinənin küçələrindən birində Peyğəmbərə ﷺ rast gəlmişdir. Əbu Hureyrə sakitcə aradan çıxmış və gedib qüsl etmişdir. Peyğəmbər ﷺ onu axtarmış, (lakin tapa bilməmişdir). O, Peyğəmbərin ﷺ yanına gəldikdə o: "Harada idin, ey Əbu Hureyrə?"– deyə soruşmuşdur. (Əbu Hureyrə): "Ya Rəsulullah! Sən mənə rast gəldiyin zaman mən cunub idim. Elə buna görə də, qüsl edənədək sənin yanında oturmaq istəmədim"– deyə cavab verdi. Peyğəmbər ﷺ buyurdu: "Subhanəllah! Mömin murdar olmaz[1]".

**[٨٢٥] ١١٦-(٣٧٢)** و حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ وَأَبُو كُرَيْبٍ قَالاَ: حَدَّثَنَا وَكِيعٌ عَنْ مِسْعَرٍ، عَنْ وَاصِلٍ، عَنْ أَبِي وَائِلٍ، عَنْ حُذَيْفَةَ، أَنَّ رَسُولَ اللَّهِ ﷺ لَقِيَهُ وَهُوَ جُنُبٌ، فَحَادَ عَنْهُ فَاغْتَسَلَ، ثُمَّ جَاءَ فَقَالَ: كُنْتُ جُنُبًا قَالَ: ((إِنَّ الْمُسْلِمَ لاَ يَنْجُسُ)).

**[825]-116-(372)** ........ Huzeyfə ﷺ rəvayət edir ki, (bir gün) o, cunub olduğu halda Peyğəmbərə ﷺ rast gəlmişdir. Sonra Huzeyfə sakitcə aradan çıxıb getmiş və qüsl etmişdir. Sonra geri qayıdıb (Peyğəmbərə ﷺ): "Mən cunub idim"– demişdir. (Peyğəmbər ﷺ də ona): "Müsəlman murdar olmaz"– deyə buyurmuşdur.

## (٣٠) – بَابُ ذِكْرِ اللَّهِ تَعَالَى فِي حَالِ الْجَنَابَةِ وَغَيْرِهَا

## 30-cu fəsil. Cunub halında və başqa hallarda Uca Allahı zikr etmək

**[٨٢٦] ١١٧-(٣٧٣)** حَدَّثَنَا أَبُو كُرَيْبٍ مُحَمَّدُ بْنُ الْعَلاَءِ، وَإِبْرَاهِيمُ بْنُ مُوسَى قَالاَ: حَدَّثَنَا ابْنُ أَبِي زَائِدَةَ عَنْ أَبِيهِ، عَنْ خَالِدِ بْنِ سَلَمَةَ، عَنْ الْبَهِيِّ، عَنْ عُرْوَةَ، عَنْ عَائِشَةَ قَالَتْ: كَانَ النَّبِيُّ ﷺ يَذْكُرُ اللَّهَ عَلَى كُلِّ أَحْيَانِهِ.

---

[1] Müsəlmanın dirisi də, ölüsü də pakdır. Müşriklər, kafirlər və münafiqlər isə murdardırlar. Uca Allah buyurur: **"Ey iman gətirənlər! Həqiqətən də, müşriklər murdardırlar"** ("ət-Tovbə" surəsi, 28); **"Qəlbində xəstəlik olanlara gəlincə, *o surə* onların murdarlığı üstünə bir murdarlıq da artırır və onlar kafir olaraq ölürlər"** ("ət-Tovbə" surəsi, 125); **"Murdar qadınlar murdar kişilərə, murdar kişilər isə murdar qadınlara, eləcə də təmiz qadınlar təmiz kişilərə, təmiz kişilər də təmiz qadınlara layiqdirlər"** ("ən-Nur" surəsi, 26); **"Kafir olanları Cəhənnəmə toplayacaqlar ki, Allah murdarı pakdan ayırsın, murdarları bir-birinin üstünə qoyub bir yerə yığsın və onları Cəhənnəmdə yerləşdirsin. Ziyana uğrayanlar da məhz onlardır"** ("əl-Ənfal" surəsi, 36-37).

**[826]-117-(373)** ........ Aişə ﵂ belə demişdir: "Peyğəmbər ﷺ hər bir halında Allahı zikr edərdi".

## (٣١) – بَابُ جَوَازِ أَكْلِ الْمُحْدِثِ الطَّعَامَ وَأَنَّهُ لاَ كَرَاهَةَ فِي ذَلِكَ وَأَنَّ الْوُضُوءَ لَيْسَ عَلَى الْفَوْرِ

## **31-ci fəsil. Dəstəmazsız halda yemək yeməyin caiz olması, bunun xoşagəlməz bir şey sayılmaması və dəstəmaz** (pozulduqdan sonra onu) **dərhal almağa** (lüzum olmaması barədə)

**[٨٢٧] ١١٨**–(٣٧٤) حَدَّثَنَا يَحْيَى بْنُ يَحْيَى التَّمِيمِيُّ وَأَبُو الرَّبِيعِ الزَّهْرَانِيُّ – قَالَ يَحْيَى: أَخْبَرَنَا حَمَّادُ بْنُ زَيْدٍ. وَقَالَ أَبُو الرَّبِيعِ: حَدَّثَنَا حَمَّادٌ –، عَنْ عَمْرِو بْنِ دِينَارٍ، عَنْ سَعِيدِ بْنِ الْحُوَيْرِثِ، عَنِ ابْنِ عَبَّاسٍ، أَنَّ النَّبِيَّ ﷺ خَرَجَ مِنَ الْخَلاَءِ، فَأُتِيَ بِطَعَامٍ، فَذَكَرُوا لَهُ الْوُضُوءَ فَقَالَ: ((أُرِيدُ أَنْ أُصَلِّيَ فَأَتَوَضَّأَ؟)).

**[827]-118-(374)** ........ İbn Abbas ﵄ rəvayət edir ki, (bir dəfə) Peyğəmbər ﷺ ayaqyolundan çıxdı və ona yemək gətirdilər. (Sonra) dəstəmaz almağı onun yadına saldılar. Peyğəmbər ﷺ buyurdu: "Məgər mən namaz qılmaq istəyirəm ki, dəstəmaz alım?!"

**[٨٢٨] ١١٩**–(...) و حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ: حَدَّثَنَا سُفْيَانُ بْنُ عُيَيْنَةَ، عَنْ عَمْرٍو، عَنْ سَعِيدِ بْنِ الْحُوَيْرِثِ، سَمِعْتُ ابْنَ عَبَّاسٍ يَقُولُ: كُنَّا عِنْدَ النَّبِيِّ ﷺ، فَجَاءَ مِنَ الْغَائِطِ، وَأُتِيَ بِطَعَامٍ، فَقِيلَ لَهُ: أَلاَ تَوَضَّأُ؟ فَقَالَ: ((لِمَ أَأُصَلِّي فَأَتَوَضَّأَ؟)).

**[828]-119-(...)** ........ İbn Abbas ﵄ demişdir: "Biz Peyğəmbərin ﷺ yanında idik. O, ayaqyolundan gəldi və ona yemək gətirdilər. (Sonra) ondan: "Dəstəmaz almırsanmı?"– deyə soruşdular. Peyğəmbər ﷺ buyurdu: "Nə üçün? Məgər mən namaz qılmaq istəyirəm ki, dəstəmaz alım?!"

**[٨٢٩] ١٢٠**–(...) و حَدَّثَنَا يَحْيَى بْنُ يَحْيَى: أَخْبَرَنَا مُحَمَّدُ بْنُ مُسْلِمٍ الطَّائِفِيُّ عَنْ عَمْرِو بْنِ دِينَارٍ، عَنْ سَعِيدِ بْنِ الْحُوَيْرِثِ مَوْلَى آلِ السَّائِبِ أَنَّهُ سَمِعَ عَبْدَ اللَّهِ بْنَ عَبَّاسٍ قَالَ: ذَهَبَ رَسُولُ اللَّهِ ﷺ إِلَى الْغَائِطِ، فَلَمَّا جَاءَ، قُدِّمَ لَهُ طَعَامٌ، فَقِيلَ: يَا رَسُولَ اللَّهِ! أَلاَ تَوَضَّأُ؟ قَالَ: ((لِمَ أَلِلصَّلاَةِ؟)).

**[829]-120-(...)** ........ Abdullah ibn Abbas ﷄ demişdir: “(Bir dəfə) Peyğəmbər ﷺ ayaqyoluna getdi. Geri qayıtdıqdan sonra ona yemək gətirdilər və (ondan): “Ya Rəsulullah! Dəstəmaz almayacaqsanmı?”– deyə soruşdular. Peyğəmbər ﷺ buyurdu: “Nə üçün? Namaz qılmaq istəyirəm ki, (dəstəmaz alım)?!”

**[٨٣٠] ١٢١**–(...) و حَدَّثَنِي مُحَمَّدُ بْنُ عَمْرِو بْنِ عَبَّادِ بْنِ جَبَلَةَ: حَدَّثَنَا أَبُو عَاصِمٍ عَنْ ابْنِ جُرَيْجٍ قَالَ: حَدَّثَنَا سَعِيدُ بْنُ حُوَيْرِثٍ، أَنَّهُ سَمِعَ ابْنَ عَبَّاسٍ يَقُولُ: إِنَّ النَّبِيَّ ﷺ قَضَى حَاجَتَهُ مِنْ الْخَلَاءِ، فَقُرِّبَ إِلَيْهِ طَعَامٌ فَأَكَلَ وَلَمْ يَمَسَّ مَاءً.

قَالَ: وَزَادَنِي عَمْرُو بْنُ دِينَارٍ عَنْ سَعِيدِ بْنِ الْحُوَيْرِثِ، أَنَّ النَّبِيَّ ﷺ قِيلَ لَهُ: إِنَّكَ لَمْ تَوَضَّأْ؟ قَالَ: ((مَا أَرَدْتُ صَلَاةً فَأَتَوَضَّأَ)) وَزَعَمَ عَمْرٌو أَنَّهُ سَمِعَ مِنْ سَعِيدِ بْنِ الْحُوَيْرِثِ.

**[830]-121-(...)** ........ İbn Abbas ﷄ demişdir: “Peyğəmbər ﷺ ayaqyolunda təbii ehtiyacını rəf etdikdən sonra ona yemək gətirdilər və o, suya toxunmadan[1] (həmin yeməkdən) yedi”.

Amr ibn Dinar, Səid ibn Huveyrisdən rəvayət edərək bunu əlavə etmişdir: “Peyğəmbərə ﷺ dedilər: “Sən dəstəmaz almadın, (elə deyilmi)?” Peyğəmbər ﷺ buyurdu: “Mən namaz qılmaq istəmirdim ki, dəstəmaz alım”.

Amr bunu Səid ibn Huveyrisdən eşitdiyini təkidlə söyləmişdir.

## (٣٢) – بَابُ مَا يَقُولُ إِذَا أَرَادَ دُخُولَ الْخَلَاءِ

## 32-ci fəsil. Ayaqyoluna girmək istədikdə nə deyilməlidir?

**[٨٣١] ١٢٢**–(**٣٧٥**) حَدَّثَنَا يَحْيَى بْنُ يَحْيَى: أَخْبَرَنَا حَمَّادُ بْنُ زَيْدٍ. وَقَالَ يَحْيَى أَيْضًا: أَخْبَرَنَا هُشَيْمٌ، كِلَاهُمَا عَنْ عَبْدِ الْعَزِيزِ بْنِ صُهَيْبٍ عَنْ أَنَسٍ – فِي حَدِيثِ حَمَّادٍ: كَانَ رَسُولُ اللَّهِ ﷺ إِذَا دَخَلَ الْخَلَاءَ، وَفِي حَدِيثِ هُشَيْمٍ: أَنَّ رَسُولَ اللَّهِ ﷺ كَانَ إِذَا دَخَلَ الْكَنِيفَ – قَالَ: ((اللَّهُمَّ! إِنِّي أَعُوذُ بِكَ مِنْ الْخُبْثِ وَالْخَبَائِثِ)).

**[831]-122-(375)** ........ Həmmad ibn Zeyd və Huşeym – hər ikisi Abdul-Əziz ibn Suheybdən, o da Ənəsdən rəvayət etmişdir. Həmmadın hədisində: Peyğəmbər ﷺ ayaqyoluna daxil olduğu zaman...”, Huşeymin hədisində isə: “Pey-

---

[1] Yəni dəstəmaz almadan.

ğəmbər ﷺ rahatxanaya girdiyi zaman belə deyərdi: “Allahummə inni əuzu bikə minəl-xubsi vəl-xəbais”[1].

**[٨٣٢]** (...) و حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ وَزُهَيْرُ بْنُ حَرْبٍ قَالاَ: حَدَّثَنَا إِسْمَعِيلُ وَهُوَ ابْنُ عُلَيَّةَ، عَنْ عَبْدِ الْعَزِيزِ بِهَذَا الإِسْنَادِ، وَقَالَ: ((أَعُوذُ بِاللَّهِ مِنْ الْخُبْثِ وَالْخَبَائِثِ)).

**[832] (...)** ........ Bizə Əbu Bəkr ibn Əbu Şeybə və Zuheyr ibn Hərb rəvayət etmiş – hər ikisi demişdir: “Bizə İsmail ibn Uleyyə (hədisi) Abdul-Əzizdən bu isnadla rəvayət etmişdir. (Həmin rəvayətdə Peyğəmbər ﷺ) demişdir: “Əuzu billahi minəl-xubsi vəl-xəbais[2]”.

## (٣٣) – بَابُ الدَّلِيلِ عَلَى أَنَّ نَوْمَ الْجَالِسِ لاَ يَنْقُضُ الْوُضُوءَ

## 33-cü fəsil. Oturmuş vəziyyətdə yatmış kimsənin dəstəmazının pozulmamasına dair dəlil

**[٨٣٣] ١٢٣–(٣٧٦)** حَدَّثَنِي زُهَيْرُ بْنُ حَرْبٍ: حَدَّثَنَا إِسْمَعِيلُ ابْنُ عُلَيَّةَ؛ ح: و حَدَّثَنَا شَيْبَانُ بْنُ فَرُّوخَ: حَدَّثَنَا عَبْدُ الْوَارِثِ، كِلاَهُمَا عَنْ عَبْدِ الْعَزِيزِ، عَنْ أَنَسٍ قَالَ: أُقِيمَتْ الصَّلاَةُ وَرَسُولُ اللَّهِ ﷺ نَجِيٌّ لِرَجُلٍ، وَفِي حَدِيثِ عَبْدِ الْوَارِثِ: وَنَبِيُّ اللَّهِ ﷺ يُنَاجِي الرَّجُلَ فَمَا قَامَ إِلَى الصَّلاَةِ حَتَّى نَامَ الْقَوْمُ.

**[833]-123-(376)** ........ Ənəs ﷺ demişdir: “(Bir dəfə) namaza iqamə verildi. Allahın elçisi ﷺ isə hələ də bir adamla xəlvətcə söhbət edirdi. (Abdul-Varisin rəvayətində isə: “Allahın peyğəmbəri ﷺ (məscidin bir tərəfində) bir nəfərlə gizlicə söhbət edirdi”). O, namaz qılmaq üçün ayağa qalxanda (səhabələrdən) bəziləri artıq yuxulamışdı”.

**[٨٣٤] ١٢٤**–(...) حَدَّثَنَا عُبَيْدُ اللَّهِ بْنُ مُعَاذٍ الْعَنْبَرِيُّ: حَدَّثَنَا أَبِي: حَدَّثَنَا شُعْبَةُ عَنْ عَبْدِ الْعَزِيزِ بْنِ صُهَيْبٍ سَمِعَ أَنَسَ بْنَ مَالِكٍ قَالَ: أُقِيمَتْ الصَّلاَةُ وَالنَّبِيُّ ﷺ يُنَاجِي رَجُلاً، فَلَمْ يَزَلْ يُنَاجِيهِ حَتَّى نَامَ أَصْحَابُهُ، ثُمَّ جَاءَ فَصَلَّى بِهِمْ.

---

[1] Tərcüməsi: “Allahım, pislikdən və pis əməllərdən (erkək və dişi cinlərdən) Sənə sığınıram!” Bundan başqa qeyd etmək lazımdır ki, cinlər, Uca Allahın oddan yaratdığı məxluqdurlar. İnsanlar kimi cinlər də yer üzündə sakin olmuş və indi də mövcuddurlar. Onlardan da müsəlman və ya kafir olanı vardır. İnsanlar bəzən onları görə bilir. Allahın qadağan etdiyinə baxmayaraq, cadugərlər və baxıcılar onlarla əlaqəyə girirlər.

[2] Tərcüməsi: “Pislikdən və pis əməllərdən Allaha sığınıram!”

**[834]-124-(...)** ........ Ənəs ibn Malik ﷺ demişdir: "Peyğəmbər ﷺ bir nəfərlə xəlvətcə söhbət edərkən iqamə verildi. Səhabələr yuxulayana qədər (Peyğəmbər ﷺ) o adamla söhbətinə davam etdi. Sonra gəlib onlara namaz qıldırdı".

**[٨٣٥] ١٢٥**-(...) و حَدَّثَنِي يَحْيَى بْنُ حَبِيبٍ الْحَارِثِيُّ: حَدَّثَنَا خَالِدٌ وَهُوَ ابْنُ الْحَارِثِ: حَدَّثَنَا شُعْبَةُ عَنْ قَتَادَةَ قَالَ: سَمِعْتُ أَنَسًا يَقُولُ: كَانَ أَصْحَابُ رَسُولِ اللَّهِ ﷺ يَنَامُونَ، ثُمَّ يُصَلُّونَ وَلاَ يَتَوَضَّئُونَ. قَالَ قُلْتُ: سَمِعْتَهُ مِنْ أَنَسٍ؟ قَالَ: إِي وَاللَّهِ!

**[835]-125-(...)** ........ Qətadə demişdir: "Mən Ənəsin belə dediyini eşitdim: "Peyğəmbərin ﷺ səhabələri (namazdan qabaq) yuxulayar, sonra da qalxıb dəstəmaz almadan namaz qılardılar".

Şobə deyir ki: "Mən Qətadədən: "Sən bunu Ənəsdən eşitmisənmi?"– deyə soruşdum. O: "Bəli, vallahi ki, (eşitmişəm)"– dedi".

**[٨٣٦] ١٢٦**-(...) حَدَّثَنِي أَحْمَدُ بْنُ سَعِيدِ بْنِ صَخْرٍ الدَّارِمِيُّ: حَدَّثَنَا حَبَّانُ: حَدَّثَنَا حَمَّادٌ عَنْ ثَابِتٍ، عَنْ أَنَسٍ أَنَّهُ قَالَ: أُقِيمَتْ صَلاَةُ الْعِشَاءِ، فَقَالَ رَجُلٌ: لِي حَاجَةٌ، فَقَامَ النَّبِيُّ ﷺ يُنَاجِيهِ، حَتَّى نَامَ الْقَوْمُ - أَوْ بَعْضُ الْقَوْمِ - ثُمَّ صَلَّوْا.

**[836]-126-(...)** ........ Ənəs ﷺ demişdir: "İşa namazının iqaməsi verildi. Bu vaxt bir nəfər: "Mənim (Peyğəmbərə ﷺ deyiləsi) sözüm var"– dedi. Peyğəmbər ﷺ qalxıb onunla gizlicə söhbət etməyə başladı. İş o yerə gəlib çatdı ki, səhabələr (yaxud onlardan bəzisi) artıq yuxulayırdı. Sonra hamısı qalxıb namaz qıldı".

## *Mündəricat*

